# سُنَنُ النَّسَائِي

أَبُو عَبْدِ الرَّحْمَنِ أَحْمَدَ بْنِ شُعَيْبِ النَّسَائِيِّ

# Sunən ən-Nəsəi

**(ən-Nəsəinin “əs-Sunən” əsəri)**

**Əbu Abdur-Rahmən Əhməd ibn Şueyb ən-Nəsəi**

(215-303 hicri / 830-915 miladi)



# II

**CİLD**

**Kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin 06 iyul 2022-ci il tarixli DK – 1138/ M saylı məktubu əsasında nəşr edilmişdir.**

Sunən ən-Nəsəi II, Bakı,
"Elm və təhsil", 2022, 412 səh.

| | |
|---|---|
| Tərcümə: | Həbib İbrahimoğlu |
| İxtisas redaktoru: | Mansur İbadətoğlu |
| Redaktor: | Kənan Zamanzadə |
| Hazırladı: | Ramin İsbarxanlı |

**ISBN 978-9952-8175-0-7**

**Kitabda olan simvolların izahı**

عَزَّ وَجَلَّ işarəsi "azzə və cəllə" oxunur və "izzət və cəlal sahibi" mənasını verir;

ﷺ işarəsi "sallallahu aleyhi və səlləm" oxunur və "ona Allahın salavatı və salamı olsun!" mənasını verir;

رَضِيَ اللهُ عَنْهُ işarəsi "radiyallahu anhu" oxunur və "Allah ondan razı olsun!" mənasını verir (kişi cinsinə aid edilir);

رَضِيَ اللهُ عَنْهَا işarəsi "radiyallahu anhə" oxunur və "Allah ondan razı olsun!" mənasını verir (qadın cinsinə aid edilir);

رَضِيَ اللهُ عَنْهُمَا işarəsi "radiyallahu anhumə" oxunur və "Allah onların ikisindən də razı olsun!" mənasını verir;

عَلَيْهِ السَّلَامُ işarəsi "aleyhissəlam" oxunur və "ona Allahın salamı olsun!" mənasını verir (kişi cinsinə aid edilir);

رَحِمَهُ اللهُ işarəsi "rahiməhullah" oxunur və "Allah ona rəhmət etsin!" mənasını verir.

Kitabın ikinci cildində olan bablar
(içində fəsillər olan kitablar)

12. Tətbiq kitabı;
13. Səhv kitabı;
14. Cümə kitabı;
15. Səfərdə namazı qısaltmaq kitabı;
16. Kusuf (günəşin və ayın tutulması) kitabı;
17. İstisqa (yağışın yağması üçün dua etmək) kitabı;
18. Qorxu namazı kitabı;
19. Bayram namazları kitabı;
20. Gecə namazı və gündüz edilən əlavə ibadətlər kitabı;
21. Cənazələr kitabı;
22. Oruc kitabı.

**Qeyd:** Hədis kitablarında Peyğəmbərdən ﷺ hədis rəvayət edən və "Abdullah" kimi qeyd edilən səhabə Abdullah ibn Məsuddur. Onu Abdullah ibn Ömər və Abdullah ibn Abbas kimi səhabələrlə qarışıq salmamaq üçün yalnız adını qeyd etmişlər. Allah onlardan razı olsun!

## Ön söz

Həmd ancaq Allahadır. Ona həmd edir, Ondan yardım və məğfirət diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Allaha sığınırıq. Allah kimi hidayətə yönəltmişsə, onu heç kəs azdıra bilməz, kimi də azdırmışsa, onu heç kəs hidayətə yönəldə bilməz. Şəhadət edirik ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, şəriki də yoxdur və şəhadət edirikk ki, Muhəmməd Onun qulu və elçisidir.

Əziz oxucu! Bu kitab Peyğəmbərimizin ﷺ hədislərinin toplandığı və "Kutubus-Sittə" (Altı Kitab) adlanan kitablardan biridir. Səhihliyinə görə Muhəmməd ibn İsmail əl-Buxarinin və Muslim ibn Həccəcin ﵏ topladığı "Səhih" kitablarından sonra gələn "Sunən" adlı kitablardan biridir. Bu kitablar Əhməd ibn Şueyb ən-Nəsəinin, Əbu Davud Süleyman ibn əl-Əşəsin, Muhəmməd ibn İsa ət-Tirmizinin və Muhəmməd ibn Məcənin ﵏ toplayaraq "Sunən" adlandırdıqları kitablardır. Bunlardan başqa da "Sunən" kitabları var, lakin məşhur olanları və insanlar arasında yayılanı əsas bu dörd "Sunən" kitablarıdır. Biz də Allahın müvəffəqiyyəti ilə İmam ən-Nəsəinin "Sunən" əsərinin ikinci cildini xalqımızın oxuyub faydalanması üçün hazırlamışıq. Sözsüz ki, bu tərcümə insan əməyi olduğuna görə naqisdir. Əgər hər hansı xətalar varsa, onlara görə Allahdan bağışlanma diləyirik. Allah bu əsərin tərcüməsini xalqımız üçün faydalı etsin!

Hörmətlə, redaksiya heyəti.

## ١٢ - كِتَابُ التَّطْبِيق

## 12. Tətbiq kitabı

### بَابُ التَّطْبِيق

### Tətbiq fəsli

١٠٢٩ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ ، قَالَ : سَمِعْتُ إِبْرَاهِيمَ يُحَدِّثُ ، عَنْ عَلْقَمَةَ ، وَالأَسْوَدِ ، أَنَّهُمَا كَانَا مَعَ عَبْدِ اللهِ فِي بَيْتِهِ فَقَالَ : أَصَلَّى هَؤُلاَءِ ؟ قُلْنَا : نَعَمْ ، فَأَمَّهُمَا وَقَامَ بَيْنَهُمَا بِغَيْرِ أَذَانٍ وَلاَ إِقَامَةٍ ، قَالَ : إِذَا كُنْتُمْ ثَلاَثَةً فَاصْنَعُوا هَكَذَا ، وَإِذَا كُنْتُمْ أَكْثَرَ مِنْ ذَلِكَ فَلْيَؤُمَّكُمْ أَحَدُكُمْ وَلْيَفْرِشْ كَفَّيْهِ عَلَى فَخِذَيْهِ ، فَكَأَنَّمَا أَنْظُرُ إِلَى اخْتِلاَفِ أَصَابِعِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1030. …Rəvayət edilir ki, Alqamə və əl-Əsvəd ﵄ Abdullahın evində olarkən, o dedi: “Onlar namaz qılıblarmı?” Biz: “Bəli”- dedik. Abdullah onların arasında durub azansız və iqaməsiz onlara imamlıq etdi və dedi: “Üç nəfər olduqda belə edin. Üç nəfərdən çox olduqda, biriniz imam olsun və (rukuda ikən) əllərini baldırlarının üzərinə qoysun. Mən, sanki indiki kimi – Allah Elçisinin ﷺ barmaqlarını bitişdirib dizlərinin üzərinə qoyduğunu görürəm”.

١٠٣٠ - أَخْبَرَنِي أَحْمَدُ بْنُ سَعِيدٍ الرُّبَاطِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ابْنُ عَبْدِ اللهِ ، قَالَ : أَنْبَأَنَا عَمْرٌو وَهُوَ ابْنُ أَبِي قَيْسٍ ، عَنِ الزُّبَيْرِ بْنِ عَدِيٍّ ، عَنْ إِبْرَاهِيمَ ، عَنِ الأَسْوَدِ ، وَعَلْقَمَةَ ، قَالاَ : صَلَّيْنَا مَعَ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ فِي بَيْتِهِ فَقَامَ بَيْنَنَا ، فَوَضَعْنَا أَيْدِيَنَا عَلَى رُكَبِنَا فَنَزَعَهَا فَخَالَفَ بَيْنَ أَصَابِعِنَا ، وَقَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُهُ.

1030. ...Rəvayət edilir ki, əl-Əsvəd və Alqamə ﵄ demişlər: “Biz Abdullah ibn Məsudla onun evində namaz qıldıq. O, bizim aramızda dayandı. Biz əllərimizi (barmaqlar bitişik şəkildə) dizlərimizə qoymuşduq. O, əllərimizi dartdı, barmaqlarımızı araladı və dedi: “Mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm”.

١٠٣١ - أَخْبَرَنَا نُوحُ بْنُ حَبِيبٍ ، قَالَ : أَنْبَأَنَا ابْنُ إِدْرِيسَ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ قَالَ : عَلَّمَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الصَّلاَةَ فَقَامَ فَكَبَّرَ ، فَلَمَّا أَرَادَ أَنْ يَرْكَعَ طَبَّقَ يَدَيْهِ بَيْنَ رُكْبَتَيْهِ وَرَكَعَ ، فَبَلَغَ ذَلِكَ سَعْدًا ، فَقَالَ : صَدَقَ أَخِي قَدْ كُنَّا نَفْعَلُ هَذَا ثُمَّ أُمِرْنَا بِهَذَا يَعْنِي : الإِمْسَاكَ بِالرُّكَبِ.

1031. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ bizə namaz qılmağı öyrətdi. O, qalxıb təkbir etdi. Ruku etmək istədikdə əllərini dizlərinin arasına qoyub ruku etdi”. Bu məsələ Sədə çatdıqda o dedi:

“Mənim qardaşım düz dedi. Əvvəllər biz belə edərdik. Sonra əlləri dizlərə qoymaqla əmr olunduq”.

## ١ - نسخ ذلك
## 1-ci fəsil: Əlləri dizlərin arasına qoymağın hökmünün ləğv edilməsi

١٠٣٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ أَبِي يَعْفُورٍ ، عَنْ مُصْعَبِ بْنِ سَعْدٍ ، قَالَ : صَلَّيْتُ إِلَى جَنْبِ أَبِي وَجَعَلْتُ يَدَيَّ بَيْنَ رُكْبَتَيَّ ، فَقَالَ لِيَ : اضْرِبْ بِكَفَّيْكَ عَلَى رُكْبَتَيْكَ ، قَالَ : ثُمَّ فَعَلْتُ ذَلِكَ مَرَّةً أُخْرَى ، فَضَرَبَ يَدِي ، وَقَالَ : إِنَّا قَدْ نُهِينَا عَنْ هَذَا وَأُمِرْنَا أَنْ نَضْرِبَ بِالأَكُفِّ عَلَى الرُّكَبِ.

1032. ...Rəvayət edilir ki, Musab ibn Səd ﷺ demişdir: “Atamın yanında namaz qılırdım, əllərimi dizlərimin arasına qoyduqda, o mənə dedi: “Əllərinin ovcunu dizlərinin üst hissəsinə qoy!” Mən bunu bir də etdikdə o, mənim əllərimə vurub dedi: “Artıq bizə bunu etmək qadağan olundu və ovuclarımızı dizlərimizin üzərinə qoymaq əmr olundu”.

١٠٣٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ إِسْمَعِيلَ بْنِ أَبِي خَالِدٍ ، عَنِ الزُّبَيْرِ بْنِ عَدِيٍّ ، عَنْ مُصْعَبِ بْنِ سَعْدٍ ، قَالَ : رَكَعْتُ فَطَبَّقْتُ ، فَقَالَ أَبِي : إِنَّ هَذَا شَيْءٌ كُنَّا نَفْعَلُهُ ثُمَّ ارْتَفَعْنَا إِلَى الرُّكَبِ

1033. ...Rəvayət edilir ki, Musab ibn Səd ﷺ demişdir: “Mən ruku edib əllərimi dizlərimin iç tərəfinə qoydum. Atam mənə dedi: “Biz bunu əvvəllər edirdik. Sonra bu əmr ləğv edildi. Biz də əllərimizi dizlərimizə qoymaqla əmr olunduq”.

## ٢ - الإِمْسَاكُ بِالرُّكَبِ فِي الرُّكُوعِ
## 2-ci fəsil: Rukuda dizlərdən tutmaq

١٠٣٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنِي أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ أَبِي عَبْدِ الرَّحْمَنِ ، عَنْ عُمَرَ قَالَ : سُنَّتْ لَكُمُ الرُّكَبُ ، فَأَمْسِكُوا بِالرُّكَبِ.

1034. ...Rəvayət edilir ki, Ömər ﷺ demişdir: “Sizin üçün dizlərdən tutmaq sünnə edildi. Siz də dizlərinizdən tutun”.

١٠٣٥ – أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي حَصِينٍ ، عَنْ أَبِي عَبْدِ الرَّحْمَنِ السُّلَمِيِّ قَالَ : قَالَ عُمَرُ : إِنَّمَا السُّنَّةُ الأَخْذُ بِالرُّكَبِ.

1035. ...Rəvayət edilir ki, Ömər ﵁ demişdir: “Həqiqətən, rukuda dizlərdən tutmaq sünnədir”.

### ٣ - بَابُ مَوَاضِعِ الرَّاحَتَيْنِ فِي الرُّكُوعِ
### 3-cü fəsil: Rukuda ovucların yeri

١٠٣٦ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ فِي حَدِيثِهِ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ سَالِمٍ ، قَالَ : أَتَيْنَا أَبَا مَسْعُودٍ فَقُلْنَا لَهُ : حَدِّثْنَا عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَامَ بَيْنَ أَيْدِينَا وَكَبَّرَ ، فَلَمَّا رَكَعَ وَضَعَ رَاحَتَيْهِ عَلَى رُكْبَتَيْهِ ، وَجَعَلَ أَصَابِعَهُ أَسْفَلَ مِنْ ذَلِكَ ، وَجَافَى بِمِرْفَقَيْهِ حَتَّى اسْتَوَى كُلُّ شَيْءٍ مِنْهُ ، ثُمَّ قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَقَامَ حَتَّى اسْتَوَى كُلُّ شَيْءٍ مِنْهُ

1036. ...Rəvayət edilir ki, Səlim ﵁ demişdir: “Biz Əbu Məsudun yanına gəlib ona dedik: “Bizə Allah Elçisinin ﷺ namazı haqda danış”. O da qalxıb bizim aramızda təkbir etdi. Ruku etdikdə əllərinin içini dizlərinin üstünə qoydu və barmaqlarını aşağı tərəfə tutdu. Dirsəklərini (böyürlərindən aralı tutaraq) şax olana qədər düz tutdu. Sonra: “Səmi Alla:hu limən həmidəh!”[1]- dedi və qalxıb dik durdu”.[2]

### ٤ - بَابُ مَوَاضِعِ أَصَابِعِ الْيَدَيْنِ فِي الرُّكُوعِ
### 4-cü fəsil: Rukuda əl barmaqlarının yeri

١٠٣٧ – أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ الرَّهَاوِيُّ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ زَائِدَةَ ، عَنْ عَطَاءٍ ، عَنْ سَالِمٍ أَبِي عَبْدِ اللهِ ، عَنْ عُقْبَةَ بْنِ عَمْرٍو قَالَ : أَلاَ أُصَلِّي لَكُمْ كَمَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي ؟ فَقُلْنَا : بَلَى ، فَقَامَ فَلَمَّا رَكَعَ وَضَعَ رَاحَتَيْهِ عَلَى رُكْبَتَيْهِ ، وَجَعَلَ أَصَابِعَهُ مِنْ وَرَاءِ رُكْبَتَيْهِ ، وَجَافَى إِبْطَيْهِ حَتَّى اسْتَقَرَّ كُلُّ شَيْءٍ مِنْهُ ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَقَامَ حَتَّى اسْتَوَى كُلُّ شَيْءٍ مِنْهُ ، ثُمَّ سَجَدَ فَجَافَى إِبْطَيْهِ حَتَّى اسْتَقَرَّ كُلُّ شَيْءٍ مِنْهُ ، ثُمَّ قَعَدَ حَتَّى اسْتَقَرَّ كُلُّ شَيْءٍ مِنْهُ ، ثُمَّ سَجَدَ حَتَّى اسْتَقَرَّ كُلُّ شَيْءٍ مِنْهُ ، ثُمَّ صَنَعَ كَذَلِكَ أَرْبَعَ رَكَعَاتٍ ، ثُمَّ قَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي وَهَكَذَا كَانَ يُصَلِّي بِنَا.

1037. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﵁ demişdir: “Mən sizə Allah Elçisinin ﷺ namazı necə qıldığını gördüyüm haqda deyimmi?” Biz: “Bəli”- dedik. O qalxıb namaz qıldı. Ruku etdikdə, ovuclarını dizlərinin üstünə, barmaqlarını isə dizlərinin ətrafına qoydu. Rukuda qollarını (böyürlərindən aralı tutaraq) dümdüz tutdu və bütün bədənini şax saxladı. Sonra başını qaldıraraq dik durdu və bütün bədənini şax tutdu. Sonra səcdə

[1] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi!
[2] “Barmaqlarını” sözü səhih deyil.

edərək qollarını dümdüz tutdu və bütün bədənin şax tutdu. Sonra bunları dörd rükətdə edib dedi: "Mən Allah Elçisinin ﷺ belə namaz qıldığını gördüm və o, bizə bu cür namaz qıldırardı".[1]

### ٥ - بَابُ التَّجَافِي فِي الرُّكُوعِ

### 5-ci fəsil: Rukuda qolları dümdüz tutmaq

١٠٣٨ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنِ ابْنِ عُلَيَّةَ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ سَالِمٍ الْبَرَّادِ ، قَالَ : قَالَ أَبُو مَسْعُودٍ : أَلاَ أُرِيكُمْ كَيْفَ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي ؟ قُلْنَا : بَلَى فَقَامَ فَكَبَّرَ ، فَلَمَّا رَكَعَ جَافَى بَيْنَ إِبْطَيْهِ ، حَتَّى لَمَّا اسْتَقَرَّ كُلُّ شَيْءٍ مِنْهُ رَفَعَ رَأْسَهُ فَصَلَّى أَرْبَعَ رَكَعَاتٍ هَكَذَا ، وَقَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي.

1038. ...Rəvayət edilir ki, Səlim əl-Bərrad ﵁ demişdir: "Əbu Məsud buyurdu: "Allah Elçisinin ﷺ necə namaz qıldığını göstərməyimi istəyirsinizmi?" Biz: "Bəli"- dedik. O, qalxıb təkbir etdi. Ruku etdikdə qollarını düz açılacaq qədər (böyürlərindən aralı) tutdu. Dizini tutduqda, başını qaldırdı. Beləcə dörd rükət qıldı və dedi: "Mən Allah Elçisinin ﷺ belə namaz qıldığını gördüm".

### ٦ - بَابُ الِاعْتِدَالِ فِي الرُّكُوعِ

### 6-cı fəsil: Rukuda qaməti düz tutmaq

١٠٣٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ عَطَاءٍ ، عَنْ أَبِي حُمَيْدٍ السَّاعِدِيِّ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا رَكَعَ اعْتَدَلَ ، فَلَمْ يَنْصِبْ رَأْسَهُ ، وَلَمْ يُقْنِعْهُ ، وَوَضَعَ يَدَيْهِ عَلَى رُكْبَتَيْهِ.

1039. ...Rəvayət edilir ki, Əbu Humeyd əs-Səidi ﵁ demişdir: "Peyğəmbər ﷺ ruku etdikdə qamətini düz tutardı. Başını nə yuxarı, nə də aşağıya (doğru əyməz) tutmaz, düz tutardı. Əllərini də dizlərinin üzərinə qoyardı".

### ٧ - النَّهْيُ عَنِ الْقِرَاءَةِ فِي الرُّكُوعِ

### 7-ci fəsil: Rukuda Quran oxumağın qadağan olunması

١٠٤٠ – أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، حَدَّثَنَا حَمَّادُ بْنُ مَسْعَدَةَ ، عَنْ أَشْعَثَ ، عَنْ مُحَمَّدٍ ، عَنْ عَبِيدَةَ ، عَنْ عَلِيٍّ قَالَ : نَهَانِي النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْقَسِّيِّ وَالْحَرِيرِ ، وَخَاتَمِ الذَّهَبِ ، وَأَنْ أَقْرَأَ وَأَنَا رَاكِعٌ ، وَقَالَ مَرَّةً أُخْرَى : وَأَنْ أَقْرَأَ رَاكِعًا.

---

[1] "Barmaqlarını" sözü səhih deyil.

1040. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Peyğəmbər ﷺ mənə ipək və kətanla qarışığı olan ipək paltar geyinməyi, qızıl üzük taxmağı və rukuda Quran oxumağı qadağan etdi”. Hədisi rəvayət edənlərdən biri dedi ki, Əli buyurdu: “Başqa vaxt isə rukuda Quran oxumağı qadağan etdi”.

١٠٤١ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ ابْنِ عَجْلاَنَ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ حُنَيْنٍ ، عَنْ أَبِيهِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنْ عَلِيٍّ قَالَ : نَهَانِي النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ خَاتَمِ الذَّهَبِ ، وَعَنِ الْقِرَاءَةِ رَاكِعًا ، وَعَنِ الْقَسِّيِّ وَالْمُعَصْفَرِ.

1041. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Peyğəmbər ﷺ mənə qızıl üzük taxmağı, rukuda Quran oxumağı, kətanla qarışığı olan ipək və zəfəranla rənglənmiş paltarlar geyinməyi qadağan etdi”.

١٠٤٢ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ دَاوُدَ الْمُنْكَدِرِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي فُدَيْكٍ ، عَنِ الضَّحَّاكِ بْنِ عُثْمَانَ ، عَنْ إِبْرَاهِيمَ بْنِ حُنَيْنٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، عَنْ عَلِيٍّ قَالَ : نَهَانِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَلاَ أَقُولُ نَهَاكُمْ عَنْ تَخَتُّمِ الذَّهَبِ ، وَعَنْ لُبْسِ الْقَسِّيِّ ، وَعَنْ لُبْسِ الْمُفْدَمِ ، وَالْمُعَصْفَرِ وَعَنِ الْقِرَاءَةِ فِي الرُّكُوعِ.

1042. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Allah Elçisi ﷺ şəxsən mənə qızıl üzük taxmağı, kətanla qarışığı olan ipək, al qırmızı və zəfəranla rənglənmiş paltarları geyinməyi, rukuda Quran oxumağı qadağan etdi”.[1]

١٠٤٣ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ زُغْبَةُ ، عَنِ اللَّيْثِ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، أَنَّ إِبْرَاهِيمَ بْنَ عَبْدِ اللهِ بْنِ حُنَيْنٍ حَدَّثَهُ ، أَنَّ أَبَاهُ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ عَلِيًّا يَقُولُ : نَهَانِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ خَاتَمِ الذَّهَبِ ، وَعَنْ لَبُوسِ الْقَسِّيِّ ، وَالْمُعَصْفَرِ ، وَقِرَاءَةِ الْقُرْآنِ وَأَنَا رَاكِعٌ.

1043. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Allah Elçisi ﷺ mənə qızıl üzük taxmağı, kətanla qarışığı olan ipək və zəfəranla rənglənmiş paltarları geyinməyi, rukuda Quran oxumağı qadağan etdi”.

١٠٤٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ حُنَيْنٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَلِيٍّ قَالَ : نَهَانِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ لُبْسِ الْقَسِّيِّ وَالْمُعَصْفَرِ ، وَعَنْ تَخَتُّمِ الذَّهَبِ ، وَعَنِ الْقِرَاءَةِ فِي الرُّكُوعِ.

1044. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Allah Elçisi ﷺ mənə kətanla qarışığı olan ipək və zəfəranla rənglənmiş paltarları geyinməyi, qızıl üzük taxmağı və rukuda Quran oxumağı qadağan etdi”.

[1] Peyğəmbər ﷺ bu sözləri şəxsən Əliyə ﵁ desə də, hökm ümumidir və bütün müsəlman kişilərinə aiddir.

٨- تَعْظِيمُ الرَّبِّ فِي الرُّكُوعِ

8-ci fəsil: Rukuda Rəbbi təzim etmək

١٠٤٥ – أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ سُلَيْمَانَ بْنِ سُحَيْمٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ مَعْبَدِ بْنِ عَبَّاسٍ ، عَنْ أَبِيهِ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : كَشَفَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ السِّتَارَةَ وَالنَّاسُ صُفُوفٌ خَلْفَ أَبِي بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ ، فَقَالَ : أَيُّهَا النَّاسُ ، إِنَّهُ لَمْ يَبْقَ مِنْ مُبَشِّرَاتِ النُّبُوَّةِ إِلاَّ الرُّؤْيَا الصَّالِحَةُ يَرَاهَا الْمُسْلِمُ أَوْ تُرَى لَهُ ثُمَّ قَالَ : أَلاَ إِنِّي نُهِيتُ أَنْ أَقْرَأَ رَاكِعًا أَوْ سَاجِدًا ، فَأَمَّا الرُّكُوعُ فَعَظِّمُوا فِيهِ الرَّبَّ ، وَأَمَّا السُّجُودُ فَاجْتَهِدُوا فِي الدُّعَاءِ قَمِنٌ أَنْ يُسْتَجَابَ لَكُمْ.

1045. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ pərdəni açdı. İnsanlar Əbu Bəkrin arxasında saf tutaraq namaz qılırdılar. Peyğəmbər ﷺ dedi: "Ey insanlar! Peyğəmbərlik müjdələrindən yalnız saleh yuxu qalıb. Bir müsəlman ya özü yuxu görər, ya da onu yuxuda görərlər". Sonra Peyğəmbər ﷺ dedi: "Bilin ki, mənə ruku və səcdədə Quran oxumaq qadağan edildi. Rukuya gəldikdə, rukuda Rəbbinizi təzim edin. Səcdəyə gəldikdə isə, səcdədə duanı çoxaldın. Bu duanın qəbul olunmaq ehtimalı daha çoxdur".

٩ - بَابُ الذِّكْرِ فِي الرُّكُوعِ

9-cu fəsil: Rukuda deyilən zikr

١٠٤٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا أَبُو مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ سَعْدِ بْنِ عُبَيْدَةَ ، عَنِ الْمُسْتَوْرِدِ بْنِ الأَحْنَفِ ، عَنْ صِلَةَ بْنِ زُفَرَ ، عَنْ حُذَيْفَةَ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَكَعَ فَقَالَ فِي رُكُوعِهِ : سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، وَفِي سُجُودِهِ : سُبْحَانَ رَبِّيَ الأَعْلَى.

1046. ...Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə namaz qıldım. O, ruku etdi və rukusunda: "Subhə:nə Rabbiyəl-azi:m![1]", səcdələrində isə: "Subhə:nə Rabiyəl-Ə'lə![2]" dedi".

١٠ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ فِي الرُّكُوعِ

10-cu fəsil: Rukuda deyilən başqa bir zikr

١٠٤٧ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، وَيَزِيدُ ، قَالاَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي الضُّحَى ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُكْثِرُ أَنْ يَقُولَ فِي رُكُوعِهِ وَسُجُودِهِ : سُبْحَانَكَ رَبَّنَا وَبِحَمْدِكَ اللَّهُمَّ اغْفِرْ لِي.

[1] Tərcüməsi: Əzəmətli Rəbbim pak və müqəddəsdir!
[2] Tərcüməsi: Ən Uca Rəbbim pak və müqəddəsdir!

1047. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ ruku və səcdələrində: "Sən pak və müqəddəssən! Ey Rəbbimiz, Sənə həmd olsun! Allahım, məni bağışla!"[1]- zikrini çox deyərdi".

### ١١ - نَوْعٌ آخَرُ مِنْهُ

### 11-ci fəsil: Rukuda deyilən başqa bir zikr

١٠٤٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : أَنْبَأَنِي قَتَادَةُ ، عَنْ مُطَرِّفٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ فِي رُكُوعِهِ : سُبُّوحٌ قُدُّوسٌ رَبُّ الْمَلاَئِكَةِ وَالرُّوحِ.

1048. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ rukuda: "Pakdır, müqəddəsdir, mələklərin və Ruhun Rəbbidir!"[2]- deyərdi".

### ١٢ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ فِي الرُّكُوعِ

### 12-ci fəsil: Rukuda deyilən başqa bir zikr

١٠٤٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ يَعْنِي النَّسَائِيَّ ، قَالَ : حَدَّثَنَا آدَمُ بْنُ أَبِي إِيَاسٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ مُعَاوِيَةَ ، يَعْنِي ابْنَ صَالِحٍ ، عَنِ ابْنِ قَيْسٍ الْكِنْدِيِّ وَهُوَ عَمْرُو بْنُ قَيْسٍ ، قَالَ : سَمِعْتُ عَاصِمَ بْنَ حُمَيْدٍ ، قَالَ : سَمِعْتُ عَوْفَ بْنَ مَالِكٍ يَقُولُ : قُمْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةً ، فَلَمَّا رَكَعَ مَكَثَ قَدْرَ سُورَةِ الْبَقَرَةِ يَقُولُ فِي رُكُوعِهِ : سُبْحَانَ ذِي الْجَبَرُوتِ وَالْمَلَكُوتِ وَالْكِبْرِيَاءِ وَالْعَظَمَةِ.

1049. ...Rəvayət edilir ki, Auf ibn Malik ﵁ demişdir: "Bir dəfə gecə vaxtı Allah Elçisi ﷺ ilə namaza durdum. O, ruku etdikdə tukuda əl-Bəqərə surəsi qədər dayandı və dedi: "Qüdrət, səltənət, böyüklük və əzəmət Sahibi pak və müqəddəsdir!"[3]

### ١٣ - نَوْعٌ آخَرُ مِنْهُ

### 13-cü fəsil: Rukuda deyilən başqa bir zikr

١٠٥٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ أَبِي سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا عَمِّي الْمَاجِشُونُ بْنُ أَبِي سَلَمَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ أَبِي رَافِعٍ ، عَنْ عَلِيٍّ بْنِ أَبِي طَالِبٍ ، أَنَّ رَسُولَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا رَكَعَ قَالَ : اللَّهُمَّ لَكَ رَكَعْتُ ، وَلَكَ أَسْلَمْتُ ، وَبِكَ آمَنْتُ ، خَشَعَ لَكَ سَمْعِي وَبَصَرِي وَعِظَامِي وَمُخِّي وَعَصَبِي.

---

[1] Transkripsiyası: Subhə:nəkə Rabbənə: va bihəmdik, Alla:hummə-ğfirli:!

[2] Transkripsiyası: Subbu:hun, Quddu:sun Rabbul-mələ:ikəti var-Ru:h!

[3] Transkripsiyası: Subhə:nə zil-cəbəru:ti, val-mələku:ti, val-kibriyə:i, val-azaməti!

1050. ...Əli ibn Əbu Talib ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ ruku etdikdə deyərdi: “Allahım! Sənə ruku etdim, Sənə təslim oldum, Sənə iman gətirdim! Qulağım, gözüm, sümüyüm, beynim və sinirim Sənə tabe oldu!”[1]

١٤ - نَوْعٌ آخَرُ

14-cü fəsil: Rukuda deyilən başqa bir zikr

١٠٥١ - أَخْبَرَنَا يَحْيَى بْنُ عُثْمَانَ الْحِمْصِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو حَيْوَةَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا رَكَعَ قَالَ : اللَّهُمَّ لَكَ رَكَعْتُ ، وَبِكَ آمَنْتُ ، وَلَكَ أَسْلَمْتُ ، وَعَلَيْكَ تَوَكَّلْتُ ، أَنْتَ رَبِّي ، خَشَعَ سَمْعِي وَبَصَرِي ، وَدَمِي وَلَحْمِي ، وَعَظْمِي وَعَصَبِي لِلَّهِ رَبِّ الْعَالِمِينَ.

1051. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ruku etdikdə deyərdi: “Allahım! Sənə ruku etdim, Sənə iman gətirdim, Sənə təslim oldum, Sənə təvəkkül etdim! Qulağım, gözüm, qanım, ətim, sümüyüm və sinirim aləmlərin Rəbbi Allaha tabe oldu!”[2]

١٠٥٢ - أَخْبَرَنَا يَحْيَى بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ حِمْيَرٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ ، وَذَكَرَ آخَرَ قَبْلَهُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ مُحَمَّدِ بْنِ مَسْلَمَةَ ، أَنَّ رَسُولَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا قَامَ يُصَلِّي تَطَوُّعًا يَقُولُ إِذَا رَكَعَ : اللَّهُمَّ لَكَ رَكَعْتُ ، وَبِكَ آمَنْتُ ، وَلَكَ أَسْلَمْتُ ، وَعَلَيْكَ تَوَكَّلْتُ أَنْتَ رَبِّي ، خَشَعَ سَمْعِي وَبَصَرِي ، وَلَحْمِي وَدَمِي ، وَمُخِّي وَعَصَبِي لِلَّهِ رَبِّ الْعَالَمِينَ.

1052. ...Muhamməd ibn Məsləmə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ nafilə[3] namazında rukuda deyərdi: “Allahım, Sənə ruku etdim, Sənə iman gətirdim, Sənə təslim oldum, Sənə təvvəkkül etdim! Sən mənim Rəbbimsən. Qulağım, gözüm, ətim, qanım, beynim və sinirim aləmlərin Rəbbi Allaha tabe oldu!”[4]

---

[1] Transkripsiyası: Alla:hummə, ləkə rakə'tu va ləkə əsləmtu va bikə ə:məntu, xaşəa ləkə səm'i: va bəsari: va i'za:mi: va muxxi: va asabi:!

[2] Transkripsiyası: Alla:hummə, ləkə rakə'tu va bikə ə:məntu va ləkə əsləmtu va aleykə təvakkəltu, Əntə Rabbi:, xaşəa səm'i: va bəsari: va dəmi: va ləhmi: va azmi: va asabi: lillə:hi Rabbil-a:ləmi:n!

[3] Vacib olan beş namazdan başqa könüllü olaraq qılınan namazlar.

[4] Transkripsiyası: Alla:hummə, ləkə rakə'tu va bikə ə:məntu va ləkə əsləmtu va aleykə təvakkəltu, Əntə Rabbi: xaşəa səm'i: va bəsari: va ləhmi: va dəmi: va muxxi: va asabi: lillə:hi Rabbil-a:ləmi:n!

١٥ - بَابُ الرُّخْصَةِ فِي تَرْكِ الذِّكْرِ فِي الرُّكُوعِ

## 15-ci fəsil: Rukuda zikri tərk etməyin icazəli olması

١٠٥٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا بَكْرُ بْنُ مُضَرَ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ عَلِيِّ بْنِ يَحْيَى الزُّرَقِيِّ ، عَنْ أَبِيهِ ، عَنْ عَمِّهِ ، وَكَانَ بَدْرِيًّا ، قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ رَجُلٌ الْمَسْجِدَ فَصَلَّى وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْمُقُهُ وَلاَ يَشْعُرُ ، ثُمَّ انْصَرَفَ ، فَأَتَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَسَلَّمَ عَلَيْهِ ، فَرَدَّ عَلَيْهِ السَّلاَمَ ، ثُمَّ قَالَ : ارْجِعْ فَصَلِّ فَإِنَّكَ لَمْ تُصَلِّ ، قَالَ : لاَ أَدْرِي فِي الثَّانِيَةِ أَوْ فِي الثَّالِثَةِ قَالَ : وَالَّذِي أَنْزَلَ عَلَيْكَ الْكِتَابَ لَقَدْ جَهِدْتُ فَعَلِّمْنِي وَأَرِنِي ، قَالَ : إِذَا أَرَدْتَ الصَّلاَةَ فَتَوَضَّأْ فَأَحْسِنِ الْوُضُوءَ ، ثُمَّ قُمْ فَاسْتَقْبِلِ الْقِبْلَةَ ، ثُمَّ كَبِّرْ ، ثُمَّ اقْرَأْ ، ثُمَّ ارْكَعْ حَتَّى تَطْمَئِنَّ رَاكِعًا ، ثُمَّ ارْفَعْ حَتَّى تَعْتَدِلَ قَائِمًا ، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا ، ثُمَّ ارْفَعْ رَأْسَكَ حَتَّى تَطْمَئِنَّ قَاعِدًا ، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا ، فَإِذَا صَنَعْتَ ذَلِكَ فَقَدْ قَضَيْتَ صَلاَتَكَ وَمَا انْتَقَصْتَ مِنْ ذَلِكَ فَإِنَّمَا تَنْقُصُهُ مِنْ صَلاَتِكَ.

1053. ...Əli ibn Yəhyə əz-Zuraqi atasından və Bədr əhlindən olan əmisindən ﵄ rəvayət edərək demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə idik. Məscidə bir kişi gəldi və namaz qıldı. Onun bundan xəbəri olmadan Allah Elçisi ﷺ onu müşahidə edirdi. Sonra Allah Elçisinin ﷺ yanına gəlib salam verdi. Allah Elçisi ﷺ onun salamını aldıqdan sonra ona dedi: “Qayıt namaz qıl, çünki sən namaz qılmadın”. O dedi: “Mən başqa cür namaz qıla bilmirəm”. Kişi ikinci və ya üçüncü dəfə də belə dedi: “Sənə Kitabı nazil edənə and olsun ki, mən bacardığımı etdim. Mənə öyrət və göstər”. Allah Elçisi ﷺ dedi: “Namaz qılmaq istədikdə dəstəmaz al və bunu gözəl şəkildə et! Sonra qalx, qibləyə yönəl və təkbir et! Sonra Qurandan oxu, sonra ruku et və rukuda rahatlanana qədər qal! Sonra qamətin tam düzələnə qədər qalx! Sonra səcdə et və səcdədə rahatlanana qədər qal! Sonra başını qaldır və rahatlanana qədər otur! Sonra yenə səcdə et və səcdədə rahatlanana qədər qal! Belə etsən, artıq namazını qılmış olarsan. Bundan nə əskiltsən, namazından da o qədər əskilər”.

١٦ - بَابُ الأَمْرِ بِإِتْمَامِ الرُّكُوعِ

## 16-cı fəsil: Rukunu tam etmək əmri

١٠٥٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، قَالَ : سَمِعْتُ أَنَسًا يُحَدِّثُ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَتِمُّوا الرُّكُوعَ وَالسُّجُودَ إِذَا رَكَعْتُمْ وَسَجَدْتُمْ.

1054. ...Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Ruku və səcdə etdikdə tam edin!”

١٧ - بَابُ رَفْعِ الْيَدَيْنِ عِنْدَ الرَّفْعِ مِنَ الرُّكُوعِ

## 17-ci fəsil: Rukudan qalxdıqda əllərin qaldırılması

١٠٥٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ قَيْسِ بْنِ سُلَيْمٍ الْعَنْبَرِيِّ ، قَالَ : حَدَّثَنِي عَلْقَمَةُ بْنُ وَائِلٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : صَلَّيْتُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَأَيْتُهُ يَرْفَعُ يَدَيْهِ إِذَا افْتَتَحَ الصَّلاَةَ ، وَإِذَا رَكَعَ ، وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ هَكَذَا ، وَأَشَارَ قَيْسٌ إِلَى نَحْوِ الأُذُنَيْنِ

1055. ...Alqamə ibn Vail atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Allah Elçisinin ﷺ arxasında namaz qıldım. Gördüm ki, o, namaza başladıqda, ruku etdikdə, “Səmi Alla:hu limən həmidəh!”- dedikdə, belə edərdi” – ravi[1] Qeys əllərini qulaqlarına qədər qaldırdı”.

١٨ - بَابُ رَفْعِ الْيَدَيْنِ حَذْوَ فُرُوعِ الأُذُنَيْنِ عِنْدَ الرَّفْعِ مِنَ الرُّكُوعِ

## 18-ci fəsil: Rukudan qalxdıqda əlləri qulaqlar ucuna qədər qaldırmaq

١٠٥٦ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ نَصْرِ بْنِ عَاصِمٍ أَنَّهُ حَدَّثَهُمْ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ ، أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْفَعُ يَدَيْهِ إِذَا رَكَعَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ حَتَّى يُحَاذِيَ بِهِمَا فُرُوعَ أُذُنَيْهِ.

1056. ...Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﷺ Allah Elçisinin ﷺ ruku etdikdə və başını rukudan qaldırdıqda, əllərini qulaqların ucuna qədər qaldırdığını görmüşdür.

١٩ - بَابُ رَفْعِ الْيَدَيْنِ حَذْوَ الْمَنْكِبَيْنِ عِنْدَ الرَّفْعِ مِنَ الرُّكُوعِ

## 19-cu fəsil: Rukudan qalxdıqda əlləri çiyinlərin səviyyəsinə qaldırmaq

١٠٥٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا مَالِكُ بْنُ أَنَسٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَرْفَعُ يَدَيْهِ إِذَا دَخَلَ فِي الصَّلاَةِ حَذْوَ مَنْكِبَيْهِ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ ، فَعَلَ مِثْلَ ذَلِكَ ، وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، قَالَ : رَبَّنَا لَكَ الْحَمْدُ ، وَكَانَ لاَ يَرْفَعُ يَدَيْهِ بَيْنَ السَّجْدَتَيْنِ.

1057. ...Səlim atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namaza başladıqda, əllərini çiyinləri səviyyəsində qaldırardı. Başını rukudan qaldırdıqda da belə edərdi. “Səmi Alla:hu limən həmidəh”- dedikdə “Rabbənə: ləkəlhəmd[2]” deyər, iki səcdə arasında isə əllərini qaldırmazdı.

[1] Ravi - hədisi rəvayət edənlər zəncirində olan rəvayətçilər.
[2] Tərcüməsi: Ey Rəbbimiz, Sənə həmd olsun!

٢٠ - الرُّخْصَةُ فِي تَرْكِ ذَلِكَ

## 20-ci fəsil: Namazda təkbir edərkən əlləri qaldırmamağın icazəli olması

١٠٥٨ - قَالَ الْبُخَارِي : أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ الْمَرْوَزِيُّ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ أَنَّهُ قَالَ : أَلاَ أُصَلِّي بِكُمْ صَلاَةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ فَصَلَّى فَلَمْ يَرْفَعْ يَدَيْهِ إِلاَّ مَرَّةً وَاحِدَةً.

1058. ...Alqamə ﷺ rəvayət edir ki, bir dəfə Abdullah dedi: "Sizə Allah Elçisinin ﷺ qıldığı kimi namaz qıldırımmı?" O, bizə namaz qıldırdı və əllərini namazda yalnız bir dəfə qaldırdı".

٢١ - بَابُ مَا يَقُولُ الإِمَامُ إِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ

## 21-ci fəsil: İmam başını rukudan qaldırdıqda nə deyir?

١٠٥٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا افْتَتَحَ الصَّلاَةَ رَفَعَ يَدَيْهِ حَذْوَ مَنْكِبَيْهِ ، وَإِذَا كَبَّرَ لِلرُّكُوعِ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ رَفَعَهُمَا كَذَلِكَ أَيْضًا ، وَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ ، وَكَانَ لاَ يَفْعَلُ ذَلِكَ فِي السُّجُودِ

1059. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namaza başladıqda və ruku üçün təkbir etdikdə, əllərini çiyinləri səviyyəsində qaldırardı. Həmçinin başını rukudan qaldırdıqda əllərini qaldırar və "Səmi Alla:hu limən həmidəh, Rabbənə: va ləkəl-həmd"- deyərdi. Səcdədə isə belə etməzdi.

١٠٦٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ ، قَالَ : اللَّهُمَّ رَبَّنَا وَلَكَ الْحَمْدُ.

1060. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ başını rukudan qaldırdıqda dedi: "Alla:hummə, Rabbənə: va ləkəl-həmd".

٢٢ - بَابُ مَا يَقُولُ الْمَأْمُومُ

## 22-ci fəsil: İmamın arxasında namaz qılan nə deyir?

١٠٦١ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ ابْنِ عُيَيْنَةَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَقَطَ مِنْ فَرَسٍ عَلَى شِقِّهِ الأَيْمَنِ ، فَدَخَلُوا عَلَيْهِ يَعُودُونَهُ ، فَحَضَرَتِ الصَّلاَةُ ، فَلَمَّا قَضَى الصَّلاَةَ قَالَ : إِنَّمَا جُعِلَ الإِمَامُ لِيُؤْتَمَّ بِهِ ، فَإِذَا رَكَعَ فَارْكَعُوا ، وَإِذَا رَفَعَ فَارْفَعُوا وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَقُولُوا : رَبَّنَا وَلَكَ الْحَمْدُ.

1061. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ atdan sağ tərəfi üstə yıxılmışdı. Səhabələr onu ziyarətə gəldilər. Namazın vaxtı girdi. Peyğəmbər ﷺ namazı bitirdikdən sonra dedi: "Həqiqətən, imam ona tabe olunmaq üçündür. O, ruku etdikdə, siz də ruku edin. O, səcdə etdikdə, siz də səcdə edin. O: "Səmi Alla:hu limən həmidəh"- dedikdə siz: "Rabbənə: va ləkəl-həmd"- deyin".

١٠٦٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْقَاسِمِ ، عَنْ مَالِكٍ ، قَالَ : حَدَّثَنِي نُعَيْمُ بْنُ عَبْدِ اللهِ ، عَنْ عَلِيِّ بْنِ يَحْيَى الزُّرَقِيِّ ، عَنْ أَبِيهِ ، عَنْ رِفَاعَةَ بْنِ رَافِعٍ قَالَ : كُنَّا يَوْمًا نُصَلِّي وَرَاءَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا رَفَعَ رَأْسَهُ مِنَ الرَّكْعَةِ قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، قَالَ رَجُلٌ وَرَاءَهُ : رَبَّنَا وَلَكَ الْحَمْدُ حَمْدًا كَثِيرًا طَيِّبًا مُبَارَكًا فِيهِ ، فَلَمَّا انْصَرَفَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنِ الْمُتَكَلِّمُ آنِفًا ؟ فَقَالَ الرَّجُلُ : أَنَا يَا رَسُولَ اللهِ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَقَدْ رَأَيْتُ بِضْعَةً وَثَلاَثِينَ مَلَكًا يَبْتَدِرُونَهَا أَيُّهُمْ يَكْتُبُهَا أَوَّلاً.

1062. ...Rəvayət edilir ki, Rifəa ibn Rafi ﷺ demişdir: "Bir gün biz Allah Elçisinin ﷺ arxasında namaz qılırdıq. O, rukudan qalxdıqda dedi: "Səmi Alla:hu limən həmidəh". Onun arxasında bir kişi isə belə dedi: "Rabbənə: va ləkəl-həmd, həmdən kəsi:ran tayyibən mubə:rakən fi:hi![1]" Allah Elçisi ﷺ namazı bitirdikdən sonra dedi: "Bir az öncə danışan kim idi?" O kişi dedi: "Mən idim, ey Allahın Elçisi". Allah Elçisi ﷺ dedi: "Mən artıq otuzdan çox mələyin bu kəlmələri hansının birinci yazması üçün yarışdığını gördüm".

### ٢٣ - بَابُ قَوْلِهِ رَبَّنَا وَلَكَ الْحَمْدُ

### 23-cü fəsil: "Rabbənə: va ləkəl-həmd" sözü haqda

١٠٦٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا قَالَ الإِمَامُ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَقُولُوا : رَبَّنَا وَلَكَ الْحَمْدُ فَإِنَّ مَنْ وَافَقَ قَوْلُهُ قَوْلَ الْمَلاَئِكَةِ غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

1063. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "İmam: "Səmi Alla:hu limən həmidəh"- dedikdə, siz: "Rabbənə: va ləkəl-həmd" deyin. Kimin sözü mələklərin sözünə müvafiq olarsa, onun keçmiş günahları bağışlanar".

١٠٦٤ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ يُونُسَ بْنِ جُبَيْرٍ ، عَنْ حِطَّانَ بْنِ عَبْدِ اللهِ أَنَّهُ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَبَا مُوسَى قَالَ : إِنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَطَبَنَا وَبَيَّنَ لَنَا سُنَّتَنَا وَعَلَّمَنَا صَلاَتَنَا ، فَقَالَ : إِذَا صَلَّيْتُمْ فَأَقِيمُوا صُفُوفَكُمْ ، ثُمَّ لِيَؤُمَّكُمْ أَحَدُكُمْ ، فَإِذَا كَبَّرَ الإِمَامُ فَكَبِّرُوا ، وَإِذَا قَرَأَ **{غَيْرِ الْمَغْضُوبِ عَلَيْهِمْ وَلاَ الضَّالِّينَ}** ، فَقُولُوا

[1] Tərcüməsi: Ey Rəbbimiz, Sənə həmd olsun; (özü də) çoxlu, xoş, mübarək bir həmd!

: آمِينَ ، يُجِبْكُمُ اللَّهُ ، وَإِذَا كَبَّرَ وَرَكَعَ ، فَكَبِّرُوا وَارْكَعُوا ، فَإِنَّ الإِمَامَ يَرْكَعُ قَبْلَكُمْ وَيَرْفَعُ قَبْلَكُمْ ، قَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَتِلْكَ بِتِلْكَ ، وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَقُولُوا : اللَّهُمَّ رَبَّنَا وَلَكَ الْحَمْدُ يَسْمَعِ اللَّهُ لَكُمْ ، فَإِنَّ اللَّهَ قَالَ عَلَى لِسَانِ نَبِيِّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَإِذَا كَبَّرَ وَسَجَدَ ، فَكَبِّرُوا وَاسْجُدُوا ، فَإِنَّ الإِمَامَ يَسْجُدُ قَبْلَكُمْ وَيَرْفَعُ قَبْلَكُمْ ، قَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَتِلْكَ بِتِلْكَ ، فَإِذَا كَانَ عِنْدَ الْقَعْدَةِ فَلْيَكُنْ مِنْ أَوَّلِ قَوْلِ أَحَدِكُمُ التَّحِيَّاتُ الطَّيِّبَاتُ الصَّلَوَاتُ لِلَّهِ ، سَلاَمٌ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، سَلاَمٌ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، سَبْعُ كَلِمَاتٍ وَهِيَ تَحِيَّةُ الصَّلاَةِ.

1064. ...Rəvayət edilir ki, Əbu Musa ؓ demişdir: “Allahın Peyğəmbəri ﷺ bizə xütbə verdi, bizə sünnəni və namazı öyrətdi. O dedi: “Namaz qıldıqda, səflərinizi düz tutun. Sonra biriniz imamlıq etsin. İmam təkbir etdikdə siz də təkbir edin. İmam “Ğayril-məğdu:bi aleyhim valədda:lli:n!”[1]- dedikdə, siz “Ə:min!”[2]- deyin, Allah sizə cavab verər. O, təkbir edib ruku etdikdə siz də təkbir edib ruku edin. Həqiqətən, imam sizdən qabaq ruku edir və sizdən qabaq rukudan başını qaldırır”. Allahın Peyğəmbəri ﷺ davam edərək dedi: “(Namazda olan) bütün başqa əməllərdə də belədir. İmam: “Səmi Alla:hu limən həmidəh![3]”- dedikdə, siz də: “Alla:hummə, Rabbənə: va ləkəl-həmd![4]”- deyin, Allah sizi eşidər. Həqiqətən Allah Öz Peyğəmbərinin ﷺ dili ilə dedi: “Səmi Alla:hu limən həmidəh”. O, təkbir edib səcdə etdikdə, siz də təkbir edib səcdə edin. Həqiqətən imam sizdən qabaq ruku edir və sizdən qabaq rukudan başını qaldırır”. Allahın Peyğəmbəri ﷺ davam edərək dedi: “(Namazda olan) bütün başqa əməllərdə də belədir. Oturduqda sizin ilk sözünüz “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir” sözləri olsun. Bu, yeddi kəlmədir və onlar namazın təhiyyətidir[5]”.[6]

---

[1] Tərcüməsi: Nemət bəxş etdiyin şəxslərin yoluna, qəzəbə uğramışların və azmışların yoluna yox!

[2] Tərcüməsi: Allahım, duamı qəbul et!

[3] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi!

[4] Tərcüməsi: Allahım! Ey Rəbbimiz, Sənə həmd olsun!

[5] Transkripsiyası: ət-Təhiyyə:tut-tayyibə:tus-saləva:tu, lillə:h, sələ:mun aleykə əyyu:hən-nəbiy-yu va rahmətulla:hi va bərakə:tuhu, sələ:mun aleynə: va alə: ibə:dillə:his-sa:lihi:n. Əşhədu ən lə: ilə:hə illəllah va əşhədu ənnə Muhəmmədən abduhu və rasu:luhu!

[6] “Yeddi” sözü səhih deyil.

## ٢٤ - قَدْرُ الْقِيَامِ بَيْنَ الرَّفْعِ مِنَ الرُّكُوعِ وَالسُّجُودِ

## 24-cü fəsil: Rukudan və səcdədən qalxdıqda, dik durmağın müddəti

١٠٦٥ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ رُكُوعُهُ وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ وَسُجُودُهُ وَمَا بَيْنَ السَّجْدَتَيْنِ قَرِيبًا مِنَ السَّوَاءِ.

1065. ...əl-Bəra ibn Azib ﷺ rəvayət edir ki, Allah Elçisinin ﷺ (namaz qılarkən) rukuda, rukudan dikəldikdə, səcdədə və səcdələr arasında olan vaxtları bir-birinə yaxın vaxtlar idi.

## ٢٥ - باب ما يقول في قيامه ذلك

## 25-ci fəsil: Rukudan qalxdıqdan sonra nə deyilir?

١٠٦٦ - أَخْبَرَنَا أَبُو دَاوُدَ سُلَيْمَانُ بْنُ سَيْفٍ الْحَرَّانِيُّ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَامِرٍ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ حَسَّانَ ، عَنْ قَيْسِ بْنِ سَعْدٍ ، عَنْ عَطَاءٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، قَالَ : اللَّهُمَّ لَكَ الْحَمْدُ مِلْءَ السَّمَوَاتِ ، وَمِلْءَ الأَرْضِ ، وَمِلْءَ مَا شِئْتَ مِنْ شَيْءٍ بَعْدُ.

1066. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ "Allah Ona həmd edəni eşitdi"[1]- dedikdən sonra deyərdi: "Ey Allahım, göylər dolusu, yer dolusu və bundan sonra istədiyin şeylər dolusu Sənə həmd olsun!"[2]

١٠٦٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي بُكَيْرٍ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ نَافِعٍ ، عَنْ وَهْبِ بْنِ مِينَاسٍ الْعَدَنِيِّ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا أَرَادَ السُّجُودَ بَعْدَ الرَّكْعَةِ يَقُولُ : اللَّهُمَّ رَبَّنَا وَلَكَ الْحَمْدُ مِلْءَ السَّمَوَاتِ وَمِلْءَ الأَرْضِ وَمِلْءَ مَا شِئْتَ مِنْ شَيْءٍ بَعْدُ.

1067. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ rukudan sonra səcdə etmək istədikdə, deyirdi: "Ey Allahım, Rəbbimiz, göylər dolusu, yer dolusu və bundan sonra istədiyin şeylər dolusu Sənə həmd olsun!"[3]

١٠٦٨ - أَخْبَرَنِي عَمْرُو بْنُ هِشَامٍ أَبُو أُمَيَّةَ الْحَرَّانِيُّ ، قَالَ : حَدَّثَنَا مَخْلَدٌ ، عَنْ سَعِيدِ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ عَطِيَّةَ بْنِ قَيْسٍ ، عَنْ قَزَعَةَ بْنِ يَحْيَى ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ حِينَ يَقُولُ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ : رَبَّنَا لَكَ

---

[1] Transkripsiyası: Səmi Alla:hu limən həmidəh.

[2] Transkripsiyası: Alla:hummə ləkəl-həmd, mil əs-səmə:və:ti va mil əl-ərdi, va mil ə mə: şi'tə min şey in bə'd!

[3] Transkripsiyası: Alla:hummə Rabbənə: va ləkəl-həmd, mil əs-səmə:və:ti va mil əl-ərdi, va mil ə mə: şi'tə min şey in bə'd!

الْحَمْدُ مِلْءَ السَّمَوَاتِ وَمِلْءَ الأَرْضِ وَمِلْءَ مَا شِئْتَ مِنْ شَيْءٍ بَعْدُ أَهْلَ الثَّنَاءِ وَالْمَجْدِ خَيْرُ ، مَا قَالَ الْعَبْدُ وَكُلُّنَا لَكَ عَبْدٌ ، لاَ مَانِعَ لِمَا أَعْطَيْتَ وَلاَ يَنْفَعُ ذَا الْجَدِّ مِنْكَ الْجَدُّ.

1068. ...Əbu Səid ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə deyərdi: "Allah Ona həmd edəni eşitdi! Rəbbimiz, göylər dolusu, yer dolusu və bundan sonra istədiyin şeylər dolusu Sənə həmd olsun! Bəndənin – hamımız Sənin qulunuq – söylədiyi ən xeyirli söz budur: Sənin verdiyinə mane olacaq bir kəs yoxdur. Sənin yanında heç bir hörmət sahibinə hörməti fayda verməz".[1]

١٠٦٩ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ أَبِي حَمْزَةَ ، عَنْ رَجُلٍ مِنْ بَنِي عَبْسٍ ، عَنْ حُذَيْفَةَ ، أَنَّهُ صَلَّى مَعَ رَسُولِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ فَسَمِعَهُ حِينَ كَبَّرَ قَالَ : اللَّهُ أَكْبَرُ ذَا الْجَبَرُوتِ وَالْمَلَكُوتِ وَالْكِبْرِيَاءِ وَالْعَظَمَةِ ، وَكَانَ يَقُولُ فِي رُكُوعِهِ : سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ قَالَ : لِرَبِّيَ الْحَمْدُ ، لِرَبِّيَ الْحَمْدُ ، وَفِي سُجُودِهِ : سُبْحَانَ رَبِّيَ الأَعْلَى ، وَبَيْنَ السَّجْدَتَيْنِ : رَبِّي اغْفِرْ لِي ، رَبِّي اغْفِرْ لِي ، وَكَانَ قِيَامُهُ وَرُكُوعُهُ وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ وَسُجُودُهُ وَمَا بَيْنَ السَّجْدَتَيْنِ قَرِيبًا مِنَ السَّوَاءِ.

1069. ...Rəvayət edilir ki, bir dəfə Huzeyfə ﷺ Allah Elçisi ﷺ ilə gecə vaxtı namaz qıldı. O, Allah Elçisinin ﷺ təkbir edib bu duanı etdiyini eşitdi: "Allah ən böyükdür! Qüdrət, səltənət, böyüklük və əzəmət sahibi pak və müqəddəsdir!"[2] Rukuda isə belə dedi: "Böyük Rəbbim pak və müqəddəsdir!"[3] Rukudan başını qaldırdıqda dedi: "Həmd Rəbbimə məxsusdur! Həmd Rəbbimə məxsusdur!"[4] Səcdədə isə dedi: "Uca Rəbbim pak və müqəddəsdir!"[5] İki səcdə arasında dedi: "Rəbbim, məni bağışla, Rəbbim, məni bağışla!"[6] Onun qiyamı, rukusu, rukudan dikəlməsi, səcdəsi və səcdələr arasındakı vaxt bir-birinə yaxın idi".

## ٢٦ - بَابُ الْقُنُوتِ بَعْدَ الرُّكُوعِ

## 26-cı fəsil: Rukudan sonra qunut tutmaq

١٠٧٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ سُلَيْمَانَ التَّيْمِيِّ ، عَنْ أَبِي مِجْلَزٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : قَنَتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَهْرًا بَعْدَ الرُّكُوعِ يَدْعُو عَلَى رِعْلٍ وَذَكْوَانَ وَعُصَيَّةَ عَصَتِ اللَّهَ وَرَسُولَهُ.

---

[1] Transkripsiyası: Səmi Alla:hu limən-həmidəh, Rabbənə: ləkəl-həmd, mil əs-səmə:və:ti va mil əl-ərdi va mil ə mə: şi'tə min şey in bə'd, əhləs-sənə:i val-məcdi xayru, mə: qa:ləl-abdu va kullunə: ləkə abdun, lə: mə:ni'a limə: ə'taytə va lə: yənfə'u zəl-cəddi minkəl-cədd!

[2] Transkripsiyası: Alla:hu Əkbər! Subhə:nə zil-cəbəru:ti, val-mələku:ti, val-kibriyə:i, val-azaməti!

[3] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Azi:m!

[4] Transkripsiyası: Li-Rabbiyəl-həmd, li-Rabbiyəl-həmd!

[5] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Ə'lə!

[6] Transkripsiyası: Rabbiğfirli:, Rabbiğfirli:!

1070. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Allah Elçisi ﷺ bir ay müddətində rukudan sonra Allaha və Onun Elçisinə asi olan Ril, Zəkvan və Usayyə adlı qəbilələrə bəddua edərək qunut tutdu”.

٢٧ - بَابُ الْقُنُوتِ فِي صَلاَةِ الصُّبْحِ

27-ci fəsil: Sübh namazında qunut tutmaq

١٠٧١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ ابْنِ سِيرِينَ ، أَنَّ أَنَسَ بْنَ مَالِكٍ سُئِلَ : هَلْ قَنَتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي صَلاَةِ الصُّبْحِ ؟ قَالَ : نَعَمْ ، فَقِيلَ لَهُ : قَبْلَ الرُّكُوعِ أَوْ بَعْدَهُ ؟ قَالَ : بَعْدَ الرُّكُوعِ

1071. ...İbn Sirin ﵀ rəvayət edir ki, Ənəs ibn Malikdən soruşuldu: “Allah Elçisi ﷺ Sübh namazında qunut tutardımı?” O: “Bəli”- dedi. Ona deyildi: “Rukudan əvvəl, yoxsa sonra?” O da: “Rukudan sonra”- dedi.

١٠٧٢ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، عَنْ يُونُسَ ، عَنْ ابْنِ سِيرِينَ ، قَالَ : حَدَّثَنِي بَعْضُ مَنْ صَلَّى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الصُّبْحِ فَلَمَّا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ فِي الرَّكْعَةِ الثَّانِيَةِ قَامَ هُنَيْهَةً.

1072. ...Rəvayət edilir ki, İbn Sirin ﵀ demişdir: “Mənə Allah Elçisi ﷺ ilə birlikdə Sübh namazını qılan bəzi səhabələr danışdı ki, Peyğəmbər ﷺ ikinci rukuda: “Səmi Allahu limən həmidəh” - dedikdə, bir qədər dayanardı”.

١٠٧٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَفِظْنَاهُ مِنَ الزُّهْرِيِّ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : لَمَّا رَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَأْسَهُ مِنَ الرَّكْعَةِ الثَّانِيَةِ مِنْ صَلاَةِ الصُّبْحِ ، قَالَ : اللَّهُمَّ أَنْجِ الْوَلِيدَ بْنَ الْوَلِيدِ وَسَلَمَةَ بْنَ هِشَامٍ وَعَيَّاشَ بْنَ أَبِي رَبِيعَةَ وَالْمُسْتَضْعَفِينَ بِمَكَّةَ ، اللَّهُمَّ اشْدُدْ وَطْأَتَكَ عَلَى مُضَرَ وَاجْعَلْهَا عَلَيْهِمْ سِنِينَ كَسِنِي يُوسُفَ.

1073. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Bir dəfə Allah Elçisi ﷺ Sübh namazının ikinci rukusundan başını qaldıraraq belə dedi: “Allahım, Vəlid ibn Vəlidə, Sələmə ibn Hişama, Ayyəş ibn Əbu Rabia və Məkkədə qalan zəiflərə kömək et! Allahım, Mudar tayfasını alçalt və onlara Yusufun (dövründə olan) quraqlıq illəri kimi quraqlıq illəri nəsib et!”

١٠٧٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنْ ابْنِ أَبِي حَمْزَةَ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ ، وَأَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ أَبَا هُرَيْرَةَ كَانَ يُحَدِّثُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَدْعُو فِي الصَّلاَةِ حِينَ يَقُولُ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ ، ثُمَّ يَقُولُ وَهُوَ قَائِمٌ قَبْلَ أَنْ يَسْجُدَ : اللَّهُمَّ أَنْجِ الْوَلِيدَ بْنَ الْوَلِيدِ ، وَسَلَمَةَ بْنَ هِشَامٍ ، وَعَيَّاشَ بْنَ أَبِي رَبِيعَةَ ، وَالْمُسْتَضْعَفِينَ مِنَ الْمُؤْمِنِينَ ، اللَّهُمَّ اشْدُدْ وَطْأَتَكَ عَلَى مُضَرَ وَاجْعَلْهَا عَلَيْهِمْ كَسِنِي يُوسُفَ ، ثُمَّ يَقُولُ : اللَّهُ أَكْبَرُ ، فَيَسْجُدُ ، وَضَاحِيَةُ مُضَرَ يَوْمَئِذٍ مُخَالِفُونَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1074. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ namazda dua edərək belə dedi: "Allah Ona həmd edəni eşitdi! Rəbbimiz, Sənə həmd olsun!" [1] Sonra səcdə etməzdən qabaq dik duraraq dua etdi: "Allahım, Vəlid ibn Vəlidə, Sələmə ibn Hişama, Ayyəş ibn Əbu Rabia və zəif möminlərə kömək et! Allahım, Mudar tayfasını alçalt və onlara Yusufun (dövründə olan) quraqlıq illəri kimi quraqlıq illəri nəsib et!" Sonra: "Allahu Əkbər"- deyib səcdə etdi. Bu vaxtlarda Mudar və ətrafda yaşayan (tayfalar) Allah Elçisinə ﷺ qarşı idilər".

٢٨ - بَابُ الْقُنُوتِ فِي صَلاَةِ الظُّهْرِ

## 28-ci fəsil: Zöhr namazında qunut tutmaq haqda

١٠٧٥ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ سَلْمٍ الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا النَّضْرُ ، قَالَ : أَنْبَأَنَا هِشَامٌ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : لأُقَرِّبَنَّ لَكُمْ صَلاَةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : فَكَانَ أَبُو هُرَيْرَةَ يَقْنُتُ فِي الرَّكْعَةِ الآخِرَةِ مِنْ صَلاَةِ الظُّهْرِ ، وَصَلاَةِ الْعِشَاءِ الآخِرَةِ ، وَصَلاَةِ الصُّبْحِ ، بَعْدَ مَا يَقُولُ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ فَيَدْعُو لِلْمُؤْمِنِينَ وَيَلْعَنُ الْكَفَرَةَ.

1075. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisinin ﷺ namazını ən yaxşı bilən mənəm". Əbu Hureyra Zöhr, İşa və Sübh namazlarının axırıncı rukusundan sonra: "Səmi Allahu limən həmidəh"- deyərək qunut tutub möminlərə dua etdi, kafirləri isə lənətlədi".

٢٩ - بَابُ الْقُنُوتِ فِي صَلاَةِ الْمَغْرِبِ

## 29-cu fəsil: Məğrib namazında qunut tutmaq

١٠٧٦ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، وَشُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ (ح) وأَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ شُعْبَةَ ، وَسُفْيَانَ ، قَالاَ : حَدَّثَنَا عَمْرُو بْنُ مُرَّةَ ، عَنِ ابْنِ أَبِي لَيْلَى ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْنُتُ فِي الصُّبْحِ وَالْمَغْرِبِ ، وَقَالَ عُبَيْدُ اللهِ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1076. ...əl-Bəra ibn Azib ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Sübh və Məğrib namazlarında qunut tutardı.

٣٠ - بَابُ اللَّعْنِ فِي الْقُنُوتِ

## 30-cu fəsil: Qunut duasında lənət etmək

١٠٧٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ (ح) وَهِشَامٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَنَتَ شَهْرًا - قَالَ شُعْبَةُ : لَعَنَ رِجَالاً ، وَقَالَ هِشَامٌ : يَدْعُو عَلَى أَحْيَاءٍ مِنْ أَحْيَاءِ

[1] Transkripsiyası: Səmi Alla:hu limən həmidəh, Rabbənə: va ləkəl-həmd!

الْعَرَبِ ، ثُمَّ تَرَكَهُ بَعْدَ الرُّكُوعِ ، هَذَا قَوْلُ هِشَامٍ - وَقَالَ شُعْبَةُ : عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَنَتَ شَهْرًا يَلْعَنُ رِعْلاً ، وَذَكْوَانَ ، وَلِحْيَانَ.

1077. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bir ay qunut tutdu. Ravi Şubə dedi: “O, bəzi kimsələri lənətlədi”. Digər ravi Hişam dedi: “O, ərəb tayfalarından olan (bəzi) tayfalara lənət etdi. Sonra bunu rukudan sonra etməyi tərk etdi”. Bu, Hişamın sözü idi. Şöbə dedi: “Qatədə Ənəsdən rəvayət etdi ki, Peyğəmbər ﷺ bir ay qunut tutdu. O, Ril, Zəkvan və Lihyən tayfalarına lənət oxudu”.

١٠٧٨ - بَابُ لَعْنِ الْمُنَافِقِينَ فِي الْقُنُوتِ

31-ci fəsil: Qunutda münafiqlərə lənət etmək

١٠٧٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّهُ سَمِعَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ رَفَعَ رَأْسَهُ مِنْ صَلَاةِ الصُّبْحِ مِنَ الرَّكْعَةِ الآخِرَةِ قَالَ : اللَّهُمَّ الْعَنْ فُلاَنًا وَفُلاَنًا يَدْعُو عَلَى أُنَاسٍ مِنَ الْمُنَافِقِينَ ، فَأَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ : {**لَيْسَ لَكَ مِنَ الأَمْرِ شَيْءٌ أَوْ يَتُوبَ عَلَيْهِمْ أَوْ يُعَذِّبَهُمْ فَإِنَّهُمْ ظَالِمُونَ**}.

1078. ...Rəvayət edilir ki, Səlim atasının Sübh namazının axırıncı rükətində Peyğəmbərin ﷺ dikəldikdən sonra belə dediyini eşitmişdir: “Allahım, filankəsə və filankəsə lənət et!” İnsanlardan münafiq olanlara bəddua etdi. (Bundan sonra) Allah ﷻ bu ayəni nazil etdi: **“Bu işin sənə aidiyyəti yoxdur. Allah ya onların tövbəsini qəbul edər, ya da onlara əzab verər. Çünki onlar zalımdırlar”** (Ali-İmran, 128)”.

٣٢ - تَرْكُ الْقُنُوتِ

32-ci fəsil: Qunut tutmağı tərk etmək

١٠٧٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَنَتَ شَهْرًا يَدْعُو عَلَى حَيٍّ مِنْ أَحْيَاءِ الْعَرَبِ ثُمَّ تَرَكَهُ.

1079. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bir ay müddətində ərəb qəbilələrindən bəzilərinə bəddua edərək qunut tutdu, sonra isə bunu tərk etdi.

١٠٨٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ خَلَفٍ وَهُوَ ابْنُ خَلِيفَةَ ، عَنْ أَبِي مَالِكٍ الأَشْجَعِيِّ ، عَنْ أَبِيهِ ، قَالَ : صَلَّيْتُ خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَلَمْ يَقْنُتْ ، وَصَلَّيْتُ خَلْفَ أَبِي بَكْرٍ فَلَمْ يَقْنُتْ ، وَصَلَّيْتُ خَلْفَ عُمَرَ فَلَمْ يَقْنُتْ ، وَصَلَّيْتُ خَلْفَ عُثْمَانَ فَلَمْ يَقْنُتْ ، وَصَلَّيْتُ خَلْفَ عَلِيٍّ فَلَمْ يَقْنُتْ ، ثُمَّ قَالَ : يَا بُنَيَّ إِنَّهَا بِدْعَةٌ

1080. ...Əbu Malik əl-Əşcəi atasının ﷺ belə dediyini rəvayət edir: "Mən Allah Elçisinin ﷺ arxasında namaz qıldım, qunut tutmadı. Əbu Bəkrin arxasında namaz qıldım, qunut tutmadı. Ömərin arxasında namaz qıldım, qunut tutmadı. Osmanın arxasında namaz qıldım, qunut tutmadı. Əlinin arxasında namaz qıldım, o da qunut tutmadı. Sonra dedi: "Oğlum, bu bidətdir!"

٣٣ - بَابُ تَبْرِيدِ الْحَصَى لِلسُّجُودِ عَلَيْهِ

## 33-cü fəsil: Səcdə etmək üçün xırda daşları soyutmaq

١٠٨١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبَّادٌ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ سَعِيدِ بْنِ الْحَارِثِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ قَالَ : كُنَّا نُصَلِّي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ فَآخُذُ قَبْضَةً مِنْ حَصًى فِي كَفِّي أُبَرِّدُهُ ، ثُمَّ أُحَوِّلُهُ فِي كَفِّي الآخَرِ ، فَإِذَا سَجَدْتُ وَضَعْتُهُ لِجَبْهَتِي.

1081. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə Zöhr namazını qılırdıq. Mən bir ovuc xırda daşları götürüb, ovucumda onları soyudardım. Sonra onları o biri ovucuma götürüb, səcdə etdikdə alnım olan yerə qoyardım".

٣٤ - بَابُ التَّكْبِيرِ لِلسُّجُودِ

## 34-cü fəsil: Səcdəyə getdikdə təkbir etmək

١٠٨٢ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ غَيْلاَنَ بْنِ جَرِيرٍ ، عَنْ مُطَرِّفٍ ، قَالَ : صَلَّيْتُ أَنَا وَعِمْرَانُ بْنُ حُصَيْنٍ خَلْفَ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ ، فَكَانَ إِذَا سَجَدَ كَبَّرَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ السُّجُودِ كَبَّرَ ، وَإِذَا نَهَضَ مِنَ الرَّكْعَتَيْنِ كَبَّرَ ، فَلَمَّا قَضَى أَخَذَ عِمْرَانُ بِيَدِي ، فَقَالَ : لَقَدْ ذَكَّرَنِي هَذَا - قَالَ كَلِمَةً يَعْنِي - صَلاَةَ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1082. ...Rəvayət edilir ki, Mutarrif ﷺ demişdir: "Mən və İmran ibn Husayn Əli ibn Əbu Talibin arxasında namaz qıldıq. O, səcdə etdikdə və başını səcdədən qaldırdıqda, təkbir etdi. İkinci rükətdən qalxdıqda, yenə təkbir etdi. (Namazını bitirdikdə) İmran mənim əlimdən tutdu və dedi: "Artıq bu mənə Muhəmmədin ﷺ namazını xatırlatdı".

١٠٨٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا مُعَاذٌ ، وَيَحْيَى ، قَالاَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنِي أَبُو إِسْحَاقَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ عَلْقَمَةَ ، وَالأَسْوَدِ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُكَبِّرُ فِي كُلِّ خَفْضٍ وَرَفْعٍ ، وَيُسَلِّمُ عَنْ يَمِينِهِ وَعَنْ يَسَارِهِ ، وَكَانَ أَبُو بَكْرٍ وَعُمَرُ رَضِيَ اللَّهُ عَنْهُمَا يَفْعَلاَنِهِ

1083. ...Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Allah Elçisi ﷺ hər dəfə (namazda) aşağı əyilib-dikəldikdə təkbir edər, sağına və soluna salam verərdi. Əbu Bəkr və Ömər də belə edərdi".

٣٥ - بَابُ كَيْفَ يَخِرُّ لِلسُّجُودِ

35-ci fəsil: Səcdələr necə edilir?

١٠٨٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي بِشْرٍ ، قَالَ : سَمِعْتُ يُوسُفَ وَهُوَ ابْنُ مَاهَكَ يُحَدِّثُ ، عَنْ حَكِيمٍ قَالَ : بَايَعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ لاَ أَخِرَّ إِلاَّ قَائِمًا.

1084. ...Rəvayət edilir ki, Həkim ﷺ demişdir: "Mən Allah Elçisinə ﷺ rukudan tam qalxdıqdan sonra səcdə etməyə beyət etdim".[1]

٣٦ - بَابُ رَفْعِ الْيَدَيْنِ لِلسُّجُودِ

36-cı fəsil: Səcdə etmək üçün əlləri qaldırmaq

١٠٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ شُعْبَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ نَصْرِ بْنِ عَاصِمٍ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ أَنَّهُ رَأَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَفَعَ يَدَيْهِ فِي صَلاَتِهِ ، وَإِذَا رَكَعَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ ، وَإِذَا سَجَدَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ السُّجُودِ حَتَّى يُحَاذِيَ بِهِمَا فُرُوعَ أُذُنَيْهِ

1085. ...Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﷺ Allah Elçisinin ﷺ namazda ruku etdikdə, rukudan başını qaldırdıqda, səcdə etdikdə və səcdədən başını qaldırdıqda əllərini qulaqlarına qədər qaldırdığını görmüşdür.

١٠٨٦ - حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ نَصْرِ بْنِ عَاصِمٍ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ ، أَنَّهُ رَأَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَفَعَ يَدَيْهِ ، فَذَكَرَ مِثْلَهُ.

1086. ...Eyni hədisdir.

١٠٨٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ نَصْرِ بْنِ عَاصِمٍ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ ، أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا دَخَلَ فِي الصَّلاَةِ ، فَذَكَرَ نَحْوَهُ وَزَادَ فِيهِ : وَإِذَا رَكَعَ فَعَلَ مِثْلَ ذَلِكَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ فَعَلَ مِثْلَ ذَلِكَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ السُّجُودِ فَعَلَ مِثْلَ ذَلِكَ.

1087. ...Malik ibn əl-Huveyris ﷺ rəvayət edir ki, Allahın Peyğəmbəri ﷺ

[1] Alimlər bu hədisi digər mənada belə şərh etmişlər: İslamda sabit olaraq və dindən yapışaraq öləcəyimə beyət etdim.

namaza başladıqda... - yuxarıdakıları zikr edərək bunları əlavə etdi: “Ruku etdikdə, rukudan başını qaldırdıqda, səcdə etdikdə və səcdədən başını qaldırdıqda əllərini qulaqlarına qədər qaldırardı”.

### ٣٧ - تَرْكُ رَفْعِ الْيَدَيْنِ عِنْدَ السُّجُودِ

### 37-ci fəsil: Səcdəyə getdikdə əlləri qaldırmağı tərk etmək

١٠٨٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ الْكُوفِيُّ الْمُحَارِبِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ الْمُبَارَكِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْفَعُ يَدَيْهِ إِذَا افْتَتَحَ الصَّلاَةَ ، وَإِذَا رَكَعَ ، وَإِذَا رَفَعَ ، وَكَانَ لاَ يَفْعَلُ ذَلِكَ فِي السُّجُودِ.

1088. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: “Allah Elçisi ﷺ namaza başladıqda, ruku etdikdə və rukudan başını qaldırdıqda (təkbir edərək) əllərini qaldırardı. Səcdə etdikdə isə bunu etməzdi”.

### ٣٨ - بَابُ أَوَّلِ مَا يَصِلُ إِلَى الأَرْضِ مِنَ الإِنْسَانِ فِي سُجُودِهِ

### 38-ci fəsil: Səcdə etdikdə yerə insanın birinci hansı əzası dəyməlidir?

١٠٨٩ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ عِيسَى الْقُومَسِيُّ الْبَسْطَامِيُّ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا سَجَدَ وَضَعَ رُكْبَتَيْهِ قَبْلَ يَدَيْهِ ، وَإِذَا نَهَضَ رَفَعَ يَدَيْهِ قَبْلَ رُكْبَتَيْهِ.

1089. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﷺ demişdir: “Allah Elçisinin ﷺ səcdə edərkən əllərindən qabaq dizlərini yerə qoyduğunu, səcdədən qalxarkən də dizlərindən qabaq əllərini yerdən qaldırdığını gördüm”.[1]

١٠٩٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ نَافِعٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ اللهِ بْنِ حَسَنٍ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَعْمِدُ أَحَدُكُمْ فِي صَلاَتِهِ فَيَبْرُكَ كَمَا يَبْرُكُ الْجَمَلُ.

1090. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən biriniz namazda (səcdə etdikdə) dəvənin oturduğu kimi oturur”.

١٠٩١ - أَخْبَرَنَا هَارُونُ بْنُ مُحَمَّدِ بْنِ بَكَّارِ بْنِ بِلاَلٍ مِنْ كِتَابِهِ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَسَنِ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى

[1] Hədis zəifdir.

اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا سَجَدَ أَحَدُكُمْ فَلْيَضَعْ يَدَيْهِ قَبْلَ رُكْبَتَيْهِ وَلاَ يَبْرُكْ بُرُوكَ الْبَعِيرِ.

1091. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz səcdə etdikdə əllərini dizlərindən qabaq yerə qoysun və dəvələrin əllərini qoyduğu kimi qoymasın!"

٣٩ - بَابُ وَضْعِ الْيَدَيْنِ مَعَ الْوَجْهِ فِي السُّجُودِ

39-cu fəsil: Səcdədə əlləri üz ilə birlikdə yerə qoymaq

١٠٩٢ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ دَلُّوَيْهِ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ رَفَعَهُ ، قَالَ : إِنَّ الْيَدَيْنِ تَسْجُدَانِ كَمَا يَسْجُدُ الْوَجْهُ ، فَإِذَا وَضَعَ أَحَدُكُمْ وَجْهَهُ فَلْيَضَعْ يَدَيْهِ ، وَإِذَا رَفَعَهُ فَلْيَرْفَعْهُمَا.

1092. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ Peyğəmbərə ﷺ nisbət edərək belə buyurdu: "Həqiqətən, əllər də üz kimi səcdə edir. Sizdən biriniz üzünü yerə qoyduqda əllərini də qoysun. Üzünü qaldırdıqda, əllərini də qaldırsın".

٤٠ - بَابُ عَلَى كَمِ السُّجُودُ

40-cı fəsil: Səcdə neçə əza üzərində edilir?

١٠٩٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَمْرٍو ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : أُمِرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَسْجُدَ عَلَى سَبْعَةِ أَعْضَاءٍ ، وَلاَ يَكُفَّ شَعْرَهُ وَلاَ ثِيَابَهُ.

1093. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Peyğəmbər ﷺ saçını və paltarını yığmadan yeddi əza üzərində səcdə etməklə əmr olundu".

٤١ - تَفْسِيرُ ذَلِكَ

41-ci fəsil: Hansı əzalar üzərinə səcdə etməyin izahı

١٠٩٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا بَكْرٌ ، عَنْ ابْنِ الْهَادِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ عَامِرِ بْنِ سَعْدٍ ، عَنِ الْعَبَّاسِ بْنِ عَبْدِ الْمُطَّلِبِ ، أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا سَجَدَ الْعَبْدُ سَجَدَ مِنْهُ سَبْعَةُ آرَابٍ : وَجْهُهُ ، وَكَفَّاهُ ، وَرُكْبَتَاهُ ، وَقَدَمَاهُ.

1094. ...Rəvayət edilir ki, Abbas ibn Abdulmuttalib ﷺ Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişdir: "Bəndə səcdə etdikdə, onun yeddi əzası səcdə edir; üzü, ovucları, dizləri və ayaqları".

## ٤٢ - السُّجُودُ عَلَى الْجَبِينِ

## 42-ci fəsil: Alın üzərinə səcdə etmək

١٠٩٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ بْنِ الْهَادِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ بْنِ الْحَارِثِ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ : بَصُرَتْ عَيْنَايَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى جَبِينِهِ وَأَنْفِهِ أَثَرُ الْمَاءِ وَالطِّينِ مِنْ صُبْحِ لَيْلَةِ إِحْدَى وَعِشْرِينَ مُخْتَصَرٌ.

1095. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Allah Elçisi ﷺ səcdə etdiyinə görə alnında və burnunda suyun və palçığın izinin olmasını bu gözlərimlə gördüm. Bu da Sübh vaxtı (Ramazan ayının) iyirmi birinci gecəsində idi".

## ٤٣ - السُّجُودُ عَلَى الأَنْفِ

## 43-cü fəsil: Burun üzərinə səcdə etmək

١٠٩٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، وَيُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أُمِرْتُ أَنْ أَسْجُدَ عَلَى سَبْعَةٍ لاَ أَكُفُّ الشَّعْرَ وَلاَ الثِّيَابَ : الْجَبْهَةِ ، وَالأَنْفِ ، وَالْيَدَيْنِ ، وَالرُّكْبَتَيْنِ ، وَالْقَدَمَيْنِ.

1096. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Mən saç və paltarı yığmamaq şərti ilə yeddi əzanı - üz, burun, iki əl, iki diz və iki ayağı yerə qoyaraq səcdə etməklə əmr olundum".

## ١٠٩٧ - السُّجُودُ عَلَى الْيَدَيْنِ

## 44-cü fəsil: Əllər ilə səcdə etmək

١٠٩٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ النَّسَائِيُّ ، قَالَ : حَدَّثَنَا الْمُعَلَّى بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أُمِرْتُ أَنْ أَسْجُدَ عَلَى سَبْعَةِ أَعْظُمٍ : عَلَى الْجَبْهَةِ ، وَأَشَارَ بِيَدِهِ عَلَى الأَنْفِ ، وَالْيَدَيْنِ وَالرُّكْبَتَيْنِ ، وَأَطْرَافِ الْقَدَمَيْنِ.

1097. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Mənə yeddi əza - alın - əli ilə burnuna da işarə etdi - əllər, dizlər və ayaq barmaqlarının ucları ilə səcdə etmək əmr edildi".

## ٤٥ - بَابُ السُّجُودِ عَلَى الرُّكْبَتَيْنِ

## 45-ci fəsil: Dizlərin üzəri ilə səcdə etmək

١٠٩٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ الْمَكِّيُّ ، وَعَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ الزُّهْرِيُّ ، قَالاَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ ابْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أُمِرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَسْجُدَ عَلَى سَبْعٍ ، وَنُهِيَ أَنْ يَكْفِتَ الشَّعْرَ وَالثِّيَابَ عَلَى يَدَيْهِ وَرُكْبَتَيْهِ وَأَطْرَافِ أَصَابِعِهِ ، قَالَ سُفْيَانُ : قَالَ لَنَا ابْنُ طَاوُوسٍ : وَوَضَعَ يَدَيْهِ عَلَى جَبْهَتِهِ وَأَمَرَّهَا عَلَى أَنْفِهِ ، قَالَ : هَذَا وَاحِدٌ وَاللَّفْظُ لِمُحَمَّدٍ.

1098. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ yeddi əza ilə səcdə etməklə əmr olundu. Ona saçlarını və paltarını namazda yığmaq qadağan olundu. Səcdə əzaları əllər, dizlər, ayaq barmaqlarının uclarıdır". Sufyan dedi: "Tavusun oğlu bizə belə nəql etdi: "Əllərini alnına və burnuna qoyub belə dedi: "Bu, bir sayılır. Hədisin mətni ravi olan Muhəmməd ibn Mənsurundur".

## ٤٦ - بَابُ السُّجُودِ عَلَى الْقَدَمَيْنِ

## 46-cı fəsil: Ayaqları ilə səcdə etmək

١٠٩٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْهَادِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ بْنِ الْحَارِثِ ، عَنْ عَامِرِ بْنِ سَعْدِ بْنِ أَبِي وَقَّاصٍ ، عَنْ عَبَّاسِ بْنِ عَبْدِ الْمُطَّلِبِ ، أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا سَجَدَ الْعَبْدُ سَجَدَ مَعَهُ سَبْعَةُ آرَابٍ : وَجْهُهُ ، وَكَفَّاهُ ، وَرُكْبَتَاهُ ، وَقَدَمَاهُ.

1099. ...Rəvayət edilir ki, Abbas ibn Abdulmuttalib ﷺ Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişdir: "Bəndə səcdə etdikdə, onunla birlikdə yeddi əzası səcdə edir; üzü, ovucları, dizləri və ayaqları".

## ٤٧ - بَابُ نَصْبِ الْقَدَمَيْنِ فِي السُّجُودِ

## 47-ci fəsil: Səcdədə ayaqları dik tutmaq

١١٠٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدَةُ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ بْنُ عُمَرَ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : فَقَدْتُ رَسُولَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ فَانْتَهَيْتُ إِلَيْهِ وَهُوَ سَاجِدٌ وَقَدَمَاهُ مَنْصُوبَتَانِ وَهُوَ يَقُولُ : اللَّهُمَّ إِنِّي أَعُوذُ بِرِضَاكَ مِنْ سَخَطِكَ ، وَبِمُعَافَاتِكَ مِنْ عُقُوبَتِكَ ، وَبِكَ مِنْكَ ، لاَ أُحْصِي ثَنَاءً عَلَيْكَ أَنْتَ كَمَا أَثْنَيْتَ عَلَى نَفْسِكَ.

1100. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Bir dəfə gecə vaxtı mən otaqda Allah Elçisini ﷺ axtardım, onu tapa bilmədim. Sonra onu səcdə

halında tapdım. O, ayaqları dikili halda belə deyirdi: "Allahım! Sənin qəzəbindən razılığına, cəzandan əfvinə, Səndən Sənə sığınıram! Mən Səni layiqincə tərif edə bilmərəm. Sən Özün Özünü tərif etdiyin kimisən!"[1]

٤٨ - بَابُ فَتْخِ أَصَابِعِ الرِّجْلَيْنِ فِي السُّجُودِ

## 48-ci fəsil: Səcdədə ayaq barmaqlarını dik tutmaq

١١٠١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَطَاءٍ ، عَنْ أَبِي حُمَيْدٍ السَّاعِدِيِّ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا أَهْوَى إِلَى الأَرْضِ سَاجِدًا جَافَى عَضُدَيْهِ عَنْ إِبطَيْهِ ، وَفَتَخَ أَصَابِعَ رِجْلَيْهِ مُخْتَصَرٌ

1101. ...Rəvayət edilir ki, Əbu Humeyd əs-Səidi ﵁ demişdir: "Peyğəmbər ﷺ səcdə edərək yerə əyildikdə, qollarını yana açaraq qoltuqlarından aralayar və ayaq barmaqlarını dik tutardı".

٤٩ - بَابُ مَكَانِ الْيَدَيْنِ مِنَ السُّجُودِ

## 49-cu fəsil: Səcdədə əllərin yeri

١١٠٢ - أَخْبَرَنِي أَحْمَدُ بْنُ نَاصِحٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ إِدْرِيسَ ، قَالَ : سَمِعْتُ عَاصِمَ بْنَ كُلَيْبٍ يَذْكُرُ ، عَنْ أَبِيهِ ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ قَالَ : قَدِمْتُ الْمَدِينَةَ فَقُلْتُ : لأَنْظُرَنَّ إِلَى صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَكَبَّرَ وَرَفَعَ يَدَيْهِ حَتَّى رَأَيْتُ إِبْهَامَيْهِ قَرِيبًا مِنْ أُذُنَيْهِ ، فَلَمَّا أَرَادَ أَنْ يَرْكَعَ كَبَّرَ وَرَفَعَ يَدَيْهِ ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ كَبَّرَ وَسَجَدَ ، فَكَانَتْ يَدَاهُ مِنْ أُذُنَيْهِ عَلَى الْمَوْضِعِ الَّذِي اسْتَقْبَلَ بِهِمَا الصَّلاَةَ

1102. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﵁ demişdir: "Mədinəyə gəldim və öz-özümə: "Mütləq Allah Elçisinin ﷺ necə namaz qıldığına baxacağam"- dedim. O, təkbir edib əllərini qaldırdı və baş barmaqlarını qulaqlarına yaxınlaşdırdığını gördüm. Ruku etmək istədikdə, təkbir etdi və əllərini qaldırdı. Sonra dikələrək: "Səmi Alla:hu limən həmidəh"- dedi. Sonra təkbir edərək səcdə etdi və namaza başladığı halda olduğu kimi əlləri qulaqlarının istiqamətində idi".

٥٠ - بَابُ النَّهْيِ عَنْ بَسْطِ الذِّرَاعَيْنِ فِي السُّجُودِ

## 50-ci fəsil: Səcdədə dirsəkləri (yerə dayayıb) uzatmağın qadağan olması

١١٠٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا أَبُو الْعَلاَءِ وَاسْمُهُ أَيُّوبُ بْنُ أَبِي مِسْكِينٍ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَفْتَرِشْ أَحَدُكُمْ ذِرَاعَيْهِ فِي السُّجُودِ افْتِرَاشَ الْكَلْبِ.

---

[1] Transkripsiyası: Alla:hummə inni: əu:zu birida:kə min səxatik, va bimu'a:fə:tikə min u'qu:bə-tik, va bikə minkə, lə: uhsi: sənə:ən aleykə əntə kəmə: əsneytə alə: nəfsik!

1103. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Heç biriniz səcdədə dirsəklərini (yerə dayayıb) it kimi uzatmasın".

٥١ - بَابُ صِفَةِ السُّجُودِ

## 51-ci fəsil: Səcdə etmək qaydası

١١٠٤ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ الْمَرْوَزِيُّ ، قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، قَالَ : وَصَفَ لَنَا الْبَرَاءُ السُّجُودَ فَوَضَعَ يَدَيْهِ بِالأَرْضِ ، وَرَفَعَ عَجِيزَتَهُ ، وَقَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُ.

1104. ...Rəvayət edilir ki, Əbu İshaq ﷺ demişdir: "əl-Bəra bizə səcdənin necə edilməsini vəsf edərək əllərini yerə qoydu, yanını qaldırdı və dedi: "Mən Allah Elçisinin ﷺ belə etdiyini gördüm".[1]

١١٠٥ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ الرَّحِيمِ الْمَرْوَزِيُّ ، قَالَ : أَنْبَأَنَا ابْنُ شُمَيْلٍ هُوَ النَّضْرُ ، قَالَ : أَنْبَأَنَا يُونُسُ بْنُ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الْبَرَاءِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا صَلَّى جَخَّى.

1105. ...əl-Bəra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namaz qıldıqda qollarını qoltuqlarından aralı tutardı.

١١٠٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا بَكْرٌ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنِ الأَعْرَجِ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَالِكٍ ابْنِ بُحَيْنَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا صَلَّى فَرَّجَ بَيْنَ يَدَيْهِ حَتَّى يَبْدُوَ بَيَاضُ إِبْطَيْهِ.

1106. ...Abdullah ibn Malik ibn Buheynə ﷺ rəvayət edirki, Allah Elçisi ﷺ namaz qıldıqda (səcdə vəziyyətində) qollarını aralayar və onun qoltuq altı görünərdi.

١١٠٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ بَزِيعٍ ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرُ بْنُ سُلَيْمَانَ ، عَنْ عِمْرَانَ ، عَنْ أَبِي مِجْلَزٍ ، عَنْ بَشِيرِ بْنِ نَهِيكٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : لَوْ كُنْتُ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَبْصَرْتُ إِبْطَيْهِ ، قَالَ أَبُو مِجْلَزٍ : كَأَنَّهُ قَالَ ذَلِكَ لأَنَّهُ فِي صَلاَةٍ.

1107. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Əgər mən Allah Elçisinin ﷺ önündə olsaydım, (namazda əllərini çox aralı tutduğu üçün) onun qoltuqaltını görərdim". Hədisin ravisi Əbu Micləz dedi: "Sanki namazda olduğunu demək istəmişdi".

[1] Hədis zəifdir.

١١٠٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ بْنُ قَيْسٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ أَقْرَمَ ، عَنْ أَبِيهِ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَكُنْتُ أَرَى عُفْرَةَ إِبْطَيْهِ إِذَا سَجَدَ.

1108. ...Ubeydullah ibn Abdullah ibn Əqram atasının ﷺ belə dediyini rəvayət edir: “Allah Elçisi ﷺ ilə birlikdə namaz qıldım. O, səcdə etdikdə, onun qoltuqaltını gördüm”.

٥٢ - بَابُ التَّجَافِي فِي السُّجُودِ

52-ci fəsil: Səcdədə qollarıqoltuq altlarından aralı tutmaq

١١٠٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عُبَيْدِ اللهِ وَهُوَ ابْنُ عَبْدِ اللهِ بْنِ الأَصَمِّ ، عَنْ عَمِّهِ يَزِيدَ وَهُوَ ابْنُ الأَصَمِّ ، عَنْ مَيْمُونَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا سَجَدَ جَافَى يَدَيْهِ ، حَتَّى لَوْ أَنَّ بَهْمَةً أَرَادَتْ أَنْ تَمُرَّ تَحْتَ يَدَيْهِ مَرَّتْ.

1109. ...Məymunə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ səcdə etdikdə, qollarını elə aralı tutardı ki, balaca bir quzu onun qoltuqaltından keçmək istəsə keçərdi.

٥٣ - بَابُ الاِعْتِدَالِ فِي السُّجُودِ

53-cü fəsil: Səcdədə bədəni düz tutmaq

١١١٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدَةُ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ (ح) وأَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ خَالِدٍ ، عَنْ شُعْبَةَ ، عَنْ قَتَادَةَ ، قَالَ : سَمِعْتُ أَنَسًا ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : اعْتَدِلُوا فِي السُّجُودِ ، وَلاَ يَبْسُطْ أَحَدُكُمْ ذِرَاعَيْهِ انْبِسَاطَ الْكَلْبِ ، اللَّفْظُ لِإِسْحَقَ.

1110. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Səcdədə bədəninizi düz tutun! Sizdən biriniz (səcdədə) əllərini itin uzatdığı kimi uzatmasın”.

٥٤ - بَابُ إِقَامَةِ الصُّلْبِ فِي السُّجُودِ

54-cü fəsil: Səcdədə qaməti düz tutmaq

١١١١ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ الْمَرْوَزِيُّ ، قَالَ : أَنْبَأَنَا عِيسَى وَهُوَ ابْنُ يُونُسَ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ ، عَنْ أَبِي مَعْمَرٍ ، عَنْ أَبِي مَسْعُودٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تُجْزِئُ صَلاَةٌ لاَ يُقِيمُ الرَّجُلُ فِيهَا صُلْبَهُ فِي الرُّكُوعِ وَالسُّجُودِ.

1111. ...Rəvayət edilir ki, Əbu Məsud ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Rukuda və səcdədə qamətini (onurğasını) düz tutnayanın namazının əvəzi verilməz”.

٥٥ - بَابُ النَّهْيِ عَنْ نَقْرَةِ الْغُرَابِ

## 55-ci fəsil: Qarğanın yeməyi dimdikləməsi kimi səcdə etməyin qadağan olması

١١١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنِ ابْنِ أَبِي هِلاَلٍ ، عَنْ جَعْفَرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ تَمِيمَ بْنَ مَحْمُودٍ أَخْبَرَهُ ، أَنَّ عَبْدَ الرَّحْمَنِ بْنَ شِبْلٍ أَخْبَرَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَى عَنْ ثَلاَثٍ : عَنْ نَقْرَةِ الْغُرَابِ ، وَافْتِرَاشِ السَّبُعِ ، وَأَنْ يُوَطِّنَ الرَّجُلُ الْمَقَامَ لِلصَّلاَةِ كَمَا يُوَطِّنُ الْبَعِيرُ.

1112. ...Abdur-Rahmən ibn Şibl ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ üç şeyi qadağan etdi; qarğanın yemi dimdiklədiyi kimi səcdə etmək, (səcdədə) əlləri heyvanın əllərini uzatdığı kimi uzatmaq və dəvə özü üçün yer tutduğu kimi bir kişinin də namaz qılması üçün (məsciddə) özünə yer tutması".

٥٦ - بَابُ النَّهْيِ عَنْ كَفِّ الشَّعْرِ فِي السُّجُودِ

## 56-cı fəsil: Səcdədə olarkən saçları yığmaq

١١١٣ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ الْبَصْرِيُّ ، عَنْ يَزِيدَ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، وَرَوْحٌ ، يَعْنِي ابْنَ الْقَاسِمِ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أُمِرْتُ أَنْ أَسْجُدَ عَلَى سَبْعَةٍ ، وَلاَ أَكُفَّ شَعْرًا ، وَلاَ ثَوْبًا.

1113. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Mən yeddi əza ilə səcdə etməklə, (bu əsnada) saçları və paltarı yığmamaqla əmr olundum".

٥٧ - بَابُ مَثَلِ الَّذِي يُصَلِّي وَرَأْسُهُ مَعْقُوصٌ

## 57-ci fəsil: Namazda saçlarını yığanın məsəli

١١١٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو السَّرْحِيُّ ، مِنْ وَلَدِ عَبْدِ اللهِ بْنِ سَعْدِ بْنِ أَبِي سَرْحٍ قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَنْبَأَنَا عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ بُكَيْرًا حَدَّثَهُ ، أَنَّ كُرَيْبًا مَوْلَى ابْنِ عَبَّاسٍ حَدَّثَهُ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، أَنَّهُ رَأَى عَبْدَ اللهِ بْنَ الْحَارِثِ يُصَلِّي وَرَأْسُهُ مَعْقُوصٌ مِنْ وَرَائِهِ ، فَقَامَ فَجَعَلَ يَحُلُّهُ ، فَلَمَّا انْصَرَفَ أَقْبَلَ إِلَى ابْنِ عَبَّاسٍ فَقَالَ : مَا لَكَ وَرَأْسِي ؟ قَالَ : إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِنَّمَا مَثَلُ هَذَا مَثَلُ الَّذِي يُصَلِّي وَهُوَ مَكْتُوفٌ.

1114. ...Rəvayət edilir ki, Abdullah ibn Abbas ﷺ Abdullah ibn əl-Harisinin saçını arxadan yığılmış şəkildə namaz qıldığını gördü. O, qalxıb onun saçının yığılmış hissəsini açdı. (Abdullah ibn əl-Haris) namazı bitir-

dikdə, İbn Abbasa doğru çevrilib dedi: "Mənim saçımdan sənə nə?!" İbn Abbas dedi: "Həqiqətən, mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "(Namazda) saçını bağlayanın məsəli, əllərini arxadan iplə bağlayıb namaz qılanın məsəli kimidir".

٥٨ - النَّهْيُ عَنْ كَفِّ الثِّيَابِ فِي السُّجُودِ

### 58-ci fəsil: Səcdədə paltarı yığmağın qadağan olması

١١١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ الْمَكِّيُّ ، عَنْ سُفْيَانَ ، عَنْ عَمْرٍو ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : أُمِرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يَسْجُدَ عَلَى سَبْعَةِ أَعْظُمٍ ، وَنُهِيَ أَنْ يَكُفَّ الشَّعْرَ وَالثِّيَابَ.

1115. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ yeddi əza ilə səcdə etmək, (namazda) saçını və paltarını yığmamaqla əmr olundu".

٥٩ - بَابُ السُّجُودِ عَلَى الثِّيَابِ

### 59-cu fəsil: Paltar üzərinə səcdə etmək

١١١٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ خَالِدِ بْنِ عَبْدِ الرَّحْمَنِ هُوَ السُّلَمِيُّ ، قَالَ : حَدَّثَنِي غَالِبٌ الْقَطَّانُ ، عَنْ بَكْرِ بْنِ عَبْدِ اللهِ الْمُزَنِيِّ ، عَنْ أَنَسٍ قَالَ : كُنَّا إِذَا صَلَّيْنَا خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالظَّهَائِرِ سَجَدْنَا عَلَى ثِيَابِنَا اتِّقَاءَ الْحَرِّ.

1116. ...Rəvayət edilir ki, Ənəs رضي الله عنه demişdir: "Biz Zöhr namazını Allah Elçisinin ﷺ arxasında qıldıqda, istidən qorunmaq üçün paltarımızın üst tərəfinə səcdə edərdik".

٦٠ - بَابُ الأَمْرِ بِإِتْمَامِ السُّجُودِ

### 60-cı fəsil: Səcdəni tam etməyin əmr edilməsi

١١١٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدَةُ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَتِمُّوا الرُّكُوعَ وَالسُّجُودَ ، فَوَاللَّهِ إِنِّي لأَرَاكُمْ مِنْ خَلْفِ ظَهْرِي فِي رُكُوعِكُمْ وَسُجُودِكُمْ.

1117. ...Ənəs رضي الله عنه rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Ruku və səcdələri tam edin! Allaha and olsun ki, mən arxa tərəfimdə sizin (necə) ruku və səcdə etdiyinizi görürəm".

٦١ - بَابُ النَّهْيِ عَنِ الْقِرَاءَةِ فِي السُّجُودِ

### 61-ci fəsil: Səcdədə Quran oxumağın qadağan olunması

١١١٨ - أَخْبَرَنَا أَبُو دَاوُدَ سُلَيْمَانُ بْنُ سَيْفٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَلِيٍّ الْحَنَفِيُّ ، وَعُثْمَانُ بْنُ عُمَرَ ، قَالَ أَبُو عَلِيٍّ : حَدَّثَنَا ، وَقَالَ عُثْمَانُ : أَنْبَأَنَا دَاوُدُ بْنُ قَيْسٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ حُنَيْنٍ ، عَنْ أَبِيهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ رَضِيَ اللَّهُ

عَنْهُ قَالَ : نَهَانِي حِبِّي صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ثَلاَثٍ : لاَ أَقُولُ نَهَى النَّاسَ نَهَانِي عَنْ تَخَتُّمِ الذَّهَبِ ، وَعَنْ لُبْسِ الْقَسِّيِّ ، وَعَنِ الْمُعَصْفَرِ الْمُفَدَّمَةِ ، وَلاَ أَقْرَأُ سَاجِدًا وَلاَ رَاكِعًا.

1118. ...Rəvayət edilir ki, Əli ibn Əbu Talib ﵁ demişdir: "Sevdiyim (Allah Elçisi) ﷺ mənə üç şeyi qadağan etdi. Peyğəmbər ﷺ bunu mən tək olanda şəxsən mənə deməsinə baxmayaraq, hökm ümumidir. Mənə qızıl üzük taxmağı, qarışığı ipək olan paltar geyinməyi, səcdə və rukuda Quran oxumağı qadağan etdi".

١١١٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ (ح) وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ عَبْدِ اللهِ ، أَنَّ أَبَاهُ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ عَلِيًّا قَالَ : نَهَانِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ أَقْرَأَ رَاكِعًا أَوْ سَاجِدًا.

1119. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: "Allah Elçisi ﷺ mənə rukuda və səcdədə Quran oxumağı qadağan etdi".

## ٦٢ - بَابُ الأَمْرِ بِالاِجْتِهَادِ فِي الدُّعَاءِ فِي السُّجُودِ

## 62-ci fəsil: Səcdədə dua etdikdə duanı artırmaq

١١٢٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ الْمَرْوَزِيُّ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ هُوَ ابْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ سُحَيْمٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ عَبْدِ اللهِ بْنِ مَعْبَدِ بْنِ عَبَّاسٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ قَالَ : كَشَفَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ السِّتْرَ وَرَأْسُهُ مَعْصُوبٌ فِي مَرَضِهِ الَّذِي مَاتَ فِيهِ فَقَالَ : اللَّهُمَّ قَدْ بَلَّغْتُ ـــ ثَلاَثَ مَرَّاتٍ ـــ إِنَّهُ لَمْ يَبْقَ مِنْ مُبَشِّرَاتِ النُّبُوَّةِ إِلاَّ الرُّؤْيَا الصَّالِحَةُ يَرَاهَا الْعَبْدُ أَوْ تُرَى لَهُ ، أَلاَ وَإِنِّي قَدْ نُهِيتُ عَنِ الْقِرَاءَةِ فِي الرُّكُوعِ وَالسُّجُودِ ، فَإِذَا رَكَعْتُمْ فَعَظِّمُوا رَبَّكُمْ ، وَإِذَا سَجَدْتُمْ فَاجْتَهِدُوا فِي الدُّعَاءِ فَإِنَّهُ قَمِنٌ أَنْ يُسْتَجَابَ لَكُمْ.

1120. ...Rəvayət edilir ki, Abdullah ibn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ ölümü ilə nəticələnən xəstəlik vaxtı başını örtdüyü örtüyü götürüb dedi: "Allahım, mən çatdırdım!" O, bunu üç dəfə təkrar etdi. "Həqiqətən, peyğəmbərlikdən yalnız bəndənin gördüyü və ya ona göstərildiyi saleh yuxu qalmışdır. Agah olun ki, mən ruku və səcdədə Quran oxumaqdan qadağan olundum. Rukunuzda Rəbbinizi təzim edin, səcdələrinizdə isə dua etmək üçün çalışın. Həqiqətən, bu, cavab verilməyə daha layiqdir".

## ٦٣ - بَابُ الدُّعَاءِ فِي السُّجُودِ

## 63-cü fəsil: Səcdədə dua etmək

١١٢١ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ سَعِيدِ بْنِ مَسْرُوقٍ ، عَنْ سَلَمَةَ بْنِ كُهَيْلٍ ، عَنْ أَبِي رِشْدِينَ وَهُوَ كُرَيْبٌ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : بِتُّ عِنْدَ خَالَتِي مَيْمُونَةَ بِنْتِ الْحَارِثِ وَبَاتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عِنْدَهَا ، فَرَأَيْتُهُ قَامَ لِحَاجَتِهِ

فَأَتَى الْقِرْبَةَ فَحَلَّ شِنَاقَهَا ، ثُمَّ تَوَضَّأَ وُضُوءًا بَيْنَ الْوُضُوءَيْنِ ، ثُمَّ أَتَى فِرَاشَهُ فَنَامَ ، ثُمَّ قَامَ قَوْمَةً أُخْرَى فَأَتَى الْقِرْبَةَ فَحَلَّ شِنَاقَهَا ، ثُمَّ تَوَضَّأَ وُضُوءًا هُوَ الْوُضُوءُ ، ثُمَّ قَامَ يُصَلِّي وَكَانَ يَقُولُ فِي سُجُودِهِ : اللَّهُمَّ اجْعَلْ فِي قَلْبِي نُورًا ، وَاجْعَلْ فِي سَمْعِي نُورًا ، وَاجْعَلْ فِي بَصَرِي نُورًا ، وَاجْعَلْ مِنْ تَحْتِي نُورًا ، وَاجْعَلْ مِنْ فَوْقِي نُورًا ، وَعَنْ يَمِينِي نُورًا ، وَعَنْ يَسَارِي نُورًا ، وَاجْعَلْ أَمَامِي نُورًا ، وَاجْعَلْ خَلْفِي نُورًا ، وَأَعْظِمْ لِي نُورًا ، ثُمَّ نَامَ حَتَّى نَفَخَ ، فَأَتَاهُ بِلَالٌ فَأَيْقَظَهُ لِلصَّلَاةِ.

1121. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Mən gecə xalam Məymunə bint əl-Harisin yanında qaldım. Allah Elçisi ﷺ də onun yanında qalmışdı. Gördüm ki, Allah Elçisi ﷺ təbii ehtiyacı üçün qalxdı və su tuluğunun yanına getdi. Onun ağzını açıb dəstəmaz aldı. Sonra yatağına girib yatdı. Sonra qalxıb su tuluğunun yanına getdi və onun ağzını açıb dəstəmaz aldı. Bu, əsl dəstəmaz idi. Sonra o, namaz qılaraq səcdələrdə belə deyirdi: “Allahım! Qəlbimə nur saç! Qulağıma nur saç! Gözümə nur saç! Ayağımın altından və başımın üstündən nur saç! Sağımdan və solumdan nur saç! Önümə və arxama nur saç! Mənim üçün böyük bir nur saç!”[1] Sonra elə yatmışdı ki, xoruldayırdı. Sonra isə Bilal gəldi və onu namaz üçün oyatdı”.

٦٤ - نَوْعٌ آخَرُ

## 64-cü fəsil: Səcdədə edilən başqa bir dua

١١٢٢ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي الضُّحَى ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ فِي رُكُوعِهِ وَسُجُودِهِ : سُبْحَانَكَ اللَّهُمَّ رَبَّنَا وَبِحَمْدِكَ ، اللَّهُمَّ اغْفِرْ لِي يَتَأَوَّلُ الْقُرْآنَ.

1122. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ ruku və səcdədə Qurana əməl edərək[2] deyərdi: “Sən pak və müqəddəssən, Allahım! Ey Rəbbimiz, həmd Sənə məxsusdur! Allahım məni bağışla!”[3]

٦٥ - نَوْعٌ آخَرُ

## 65-ci fəsil: Səcdədə edilən başqa bir dua

١١٢٣ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلَانَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي الضُّحَى ، عَنْ مَسْرُوقٍ ، عَنْ

[1] Transkripsiyası: Alla:humməc-al fi: qalbi: nu:ran, vac-al fi: səm'i: nu:ran, vac-al fi: bəsari: nu:ran, vac-al min təhti: nu:ran, vac-al min fəvqi: nu:ran, va an yəmi:ni: nu:ran, va an yəsə:ri: nu:ran, vac-al əmə:mi: nu:ran, vac-al xalfi: nu:ran, va ə'zim li: nu:ran!

[2] Digər rəvayətdə **“Həmd ilə Rəbbini təriflə və Ondan bağışlanmağını dilə. Həqiqətən, O, tövbələri qəbul edəndir!”** (ən-Nəsr, 3) ayəsi nazil olduqdan sonra Peyğəmbər ﷺ yuxarıdakı hədisdə qeyd edildiyi kimi rukuda və səcdədə belə deməyə başlamışdır.

[3] Transkripsiyası: Subhə:nəkə Alla:hummə, Rabbənə: va bihəmdikə, Alla:humməğfirli:!

عَائِشَةَ ، قَالَتْ : كَانَ رَسُولُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ فِي رُكُوعِهِ وَسُجُودِهِ : سُبْحَانَكَ اللَّهُمَّ رَبَّنَا وَبِحَمْدِكَ ، اللَّهُمَّ اغْفِرْ لِي يَتَأَوَّلُ الْقُرْآنَ

1123. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ ruku və səcdədə Qurana əməl edərək deyərdi: “Sən pak və müqəddəssən, Allahım! Ey Rəbbimiz, həmd Sənə məxsusdur! Allahım məni bağışla!”

٦٦ - نَوْعٌ آخَرُ

66-cı fəsil: Səcdədə edilən başqa bir dua

١١٢٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلاَلِ بْنِ يَسَافٍ ، قَالَ : قَالَتْ عَائِشَةُ رَضِيَ عَنْهَا : فَقَدْتُ رَسُولَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ مَضْجَعِهِ فَجَعَلْتُ أَلْتَمِسُهُ ، وَظَنَنْتُ أَنَّهُ أَتَى بَعْضَ جَوَارِيهِ ، فَوَقَعَتْ يَدِي عَلَيْهِ وَهُوَ سَاجِدٌ وَهُوَ يَقُولُ : اللَّهُمَّ اغْفِرْ لِي مَا أَسْرَرْتُ وَمَا أَعْلَنْتُ.

1124. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Gecə vaxtı Allah Elçisini ﷺ yatağında tapmayaraq onu axtarmağa başladım. Onun zövcələrinin hansınınsa yanına getdiyini zənn etdim. (Qaranlıqda əlimlə onu axtarakən) əlim ona toxundu. O, səcdədə idi və belə deyirdi: “Allahım, mənim gizlində və aşkarda olan günahlarımı bağışla!”[1]

١١٢٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلاَلِ بْنِ يَسَافٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : فَقَدْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَظَنَنْتُ أَنَّهُ أَتَى بَعْضَ جَوَارِيهِ ، فَطَلَبْتُهُ فَإِذَا هُوَ سَاجِدٌ يَقُولُ : رَبِّ اغْفِرْ لِي مَا أَسْرَرْتُ وَمَا أَعْلَنْتُ.

1125. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Gecə vaxtı Allah Elçisini ﷺ yatağında tapmadım və elə zənn etdim ki, zövcələrinin hansınınsa yanına gedib. Onu axtarmağa başladım. Gördüm ki, səcdədədir və belə deyir: “Rəbbim, mənim gizlində və aşkarda olan günahlarımı bağışla!”[2]

٦٧ - نَوْعٌ آخَرُ

67-ci fəsil: Səcdədə edilən başqa bir dua

١١٢٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ هُوَ ابْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ أَبِي سَلَمَةَ ، قَالَ :

[1] Transkripsiyası: Alla:humməğfirli:, mə: əsrartu va mə: ə'ləntu!
[2] Transkripsiyası: Rabbiğfirli:, mə: əsrartu va mə: ə'ləntu!

حَدَّثَنِي عَمِّي الْمَاجِشُونُ بْنُ أَبِي سَلَمَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ أَبِي رَافِعٍ ، عَنْ عَلِيٍّ ، أَنَّ رَسُولَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا سَجَدَ يَقُولُ : اللَّهُمَّ لَكَ سَجَدْتُ ، وَلَكَ أَسْلَمْتُ ، وَبِكَ آمَنْتُ ، سَجَدَ وَجْهِي لِلَّذِي خَلَقَهُ وَصَوَّرَهُ فَأَحْسَنَ صُورَتَهُ وَشَقَّ سَمْعَهُ وَبَصَرَهُ ، تَبَارَكَ اللَّهُ أَحْسَنُ الْخَالِقِينَ.

1126. ...Əli ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ səcdədə dua edərək belə deyirdi: “Allahım! Sənə səcdə etdim, Sənə təslim oldum, Sənə iman gətirdim! Üzüm onu yaradana, ona surət verənə və ona ən gözəl surət verənə, onda göz və qulaq açana səcdə etdi. Yaradanların ən gözəli olan Allah nə qədər xeyirxahdır!”[1]

٦٨ - نَوْعٌ آخَرُ

## 68-ci fəsil: Səcdədə edilən başqa bir dua

١١٢٧ - أَخْبَرَنَا يَحْيَى بْنُ عُثْمَانَ ، قَالَ : أَنْبَأَنَا أَبُو حَيْوَةَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ أَبِي حَمْزَةَ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ فِي سُجُودِهِ : اللَّهُمَّ لَكَ سَجَدْتُ ، وَبِكَ آمَنْتُ ، وَلَكَ أَسْلَمْتُ ، وَأَنْتَ رَبِّي ، سَجَدَ وَجْهِي لِلَّذِي خَلَقَهُ وَصَوَّرَهُ وَشَقَّ سَمْعَهُ وَبَصَرَهُ ، تَبَارَكَ اللَّهُ أَحْسَنُ الْخَالِقِينَ.

1127. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ səcdələrdə belə deyirdi: “Allahım! Sənə səcdə etdim, Sənə iman gətirdim, Sənə təslim oldum! Sən mənim Rəbbimsən! Üzüm onu yaradana, ona surət verənə, onda göz və qulaq açana səcdə etdi. Yaradanların ən gözəli olan Allah nə qədər xeyirxahdır!”[2]

٦٩ - نَوْعٌ آخَرُ

## 69-cu fəsil: Səcdədə edilən başqa bir dua

١١٢٨ - أَخْبَرَنَا يَحْيَى بْنُ عُثْمَانَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ حِمْيَرٍ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ أَبِي حَمْزَةَ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ - وَذَكَرَ آخَرَ قَبْلَهُ - عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ هُرْمُزَ الأَعْرَجِ ، عَنْ مُحَمَّدِ بْنِ مَسْلَمَةَ ، أَنَّ رَسُولَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا قَامَ مِنَ اللَّيْلِ يُصَلِّي تَطَوُّعًا قَالَ إِذَا سَجَدَ : اللَّهُمَّ لَكَ سَجَدْتُ ، وَبِكَ آمَنْتُ ، وَلَكَ أَسْلَمْتُ ، اللَّهُمَّ أَنْتَ رَبِّي ، سَجَدَ وَجْهِي لِلَّذِي خَلَقَهُ وَصَوَّرَهُ وَشَقَّ سَمْعَهُ وَبَصَرَهُ ، تَبَارَكَ اللَّهُ أَحْسَنُ الْخَالِقِينَ.

---

[1] Transkripsiyası: Alla:hummə ləkə səcədtu va ləkə əsləmtu va bikə ə:məntu, səcədə vachiyə lilləzi: xaləqahu, va savvərahu, fə əhsənə su:ratəhu va şəqqa səm'ahu va bəsarahu, təbə:rakəlla:hu əhsənul-xa:liqi:n!

[2] Transkripsiyası: Alla:hummə ləkə səcədtu va bikə ə:məntu va ləkə əsləmtu, va əntə Rabbi:, səcədə vachiyə lilləzi: xaləqahu, va savvərahu, va şəqqa səm'ahu va bəsarahu, təbə:rakəlla:hu əhsənul-xa:liqi:n!

1128. ...Muhəmməd ibn Məsləmə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ nafilə olan gecə namazını qıldıqda, səcdədə belə deyərdi: "Allahım! Sənə səcdə etdim, Sənə iman gətirdim, Sənə təslim oldum! Allahım, Sən mənim Rəbbimsən! Üzüm onu yaradana, ona surət verənə, onda göz və qulaq açana səcdə etdi. Yaradanların ən gözəli olan Allah nə qədər xeyirxahdır!"[1]

٧٠ - نَوْعٌ آخَرُ

70-ci fəsil: Səcdədə edilən başqa bir dua

١١٢٩ - أَخْبَرَنَا سَوَّارُ بْنُ عَبْدِ اللهِ بْنِ سَوَّارٍ الْقَاضِي ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ عَبْدِ الْوَهَّابِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ أَبِي الْعَالِيَةِ ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ فِي سُجُودِ الْقُرْآنِ بِاللَّيْلِ : سَجَدَ وَجْهِي لِلَّذِي خَلَقَهُ ، وَشَقَّ سَمْعَهُ وَبَصَرَهُ بِحَوْلِهِ وَقُوَّتِهِ.

1129. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə vaxtı Quranda (səcdə ayəsini) oxuyub səcdə etdikdə belə deyirdi: "Üzüm onu Yaradana, Öz qüdrət və gücü ilə onda göz və qulaq açana səcdə etdi!"[2]

٧١ - نَوْعٌ آخَرُ

71-ci fəsil: Səcdədə edilən başqa bir dua

١١٣٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ عَائِشَةَ قَالَتْ : فَقَدْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ فَوَجَدْتُهُ وَهُوَ سَاجِدٌ وَصُدُورُ قَدَمَيْهِ نَحْوَ الْقِبْلَةِ ، فَسَمِعْتُهُ يَقُولُ : أَعُوذُ بِرِضَاكَ مِنْ سَخَطِكَ ، وَأَعُوذُ بِمُعَافَاتِكَ مِنْ عُقُوبَتِكَ ، وَأَعُوذُ بِكَ مِنْكَ ، لاَ أُحْصِي ثَنَاءً عَلَيْكَ أَنْتَ كَمَا أَثْنَيْتَ عَلَى نَفْسِكَ.

1130. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Bir gecə Allah Elçisinin ﷺ yanımda olmadığını hiss etdim. Onun səcdədə, ayaq barmaqları qibləyə tərəf yönəldiyi halda belə dediyini eşitdim: "Sənin qəzəbindən razılığına, cəzandan əfvinə sığınıram. Səndən Sənə pənah aparıram. Mən Səni (layiqincə) tərif edə bilmərəm. Sən Özün Özünü tərif etdiyin kimisən!"[3]

---

[1] Transkripsiyası: Alla:hummə ləkə səcədtu va bikə ə:məntu va ləkə əsləmtu, Alla:hummə əntə Rabbi:, səcədə vachiyə lilləzi: xaləqahu, va savvərahu, va şəqqa səm'ahu va bəsarahu, təbə:rakəlla:hu əhsənul-xa:liqi:n!

[2] Transkripsiyası: Səcədə vachiyə lilləzi: xaləqahu, va şəqqa səm'ahu, va bəsarahu bihəulihi va quvvətihi!

[3] Transkripsiyası: Əu:zu birı:dakə min səxatik, va əu:zu bimua:fə:tikə min uqu:bətik, va əu:zu bikə minkə, lə: uhsi: sənə:ən aleykə əntə kəmə: əsneytə alə: nəfsik!

### ٧٢ - نَوْعٌ آخرُ

### 72-ci fəsil: Səcdədə edilən başqa bir dua

١١٣١ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ الْمِصِّيصِيُّ الْمِقْسَمِيُّ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنْ ابْنِ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، قَالَ : أَخْبَرَنِي ابْنُ أَبِي مُلَيْكَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : فَقَدْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ فَظَنَنْتُ أَنَّهُ ذَهَبَ إِلَى بَعْضِ نِسَائِهِ ، فَتَحَسَّسْتُهُ فَإِذَا هُوَ رَاكِعٌ أَوْ سَاجِدٌ ، يَقُولُ : سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ لاَ إِلَهَ إِلاَّ أَنْتَ ، فَقَالَتْ : بِأَبِي أَنْتَ وَأُمِّي إِنِّي لَفِي شَأْنٍ ، وَإِنَّكَ لَفِي آخَرَ

1131. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bir gecə Allah Elçisini ﷺ yatağında tapmadım və elə zənn etdim ki, digər qadınlarının yanına gedib. Onu axtarıb gördüm ki, ruku və ya səcdədə belə deyir: “Sən pak və müqəddəssən! Allahım, həmd Sənə məxsusdur! Səndən başqa ibadətə layiq məbud yoxdur!”[1] Aişə dedi: “Atam-anam sənə fəda olsun! Mən başqa bir haldayam (yatmışam), sən isə ibadət edirsən”.

### ٧٣ - نَوْعٌ آخرُ

### 73-cü fəsil: Səcdədə edilən başqa bir dua

١١٣٢ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ سَوَّارٍ ، قَالَ : حَدَّثَنَا لَيْثُ بْنُ سَعْدٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، عَنْ عَمْرِو بْنِ قَيْسٍ الْكِنْدِيِّ ، أَنَّهُ سَمِعَ عَاصِمَ بْنَ حُمَيْدٍ يَقُولُ : سَمِعْتُ عَوْفَ بْنَ مَالِكٍ يَقُولُ : قُمْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَبَدَأَ فَاسْتَاكَ وَتَوَضَّأَ ، ثُمَّ قَامَ فَصَلَّى فَبَدَأَ فَاسْتَفْتَحَ مِنَ الْبَقَرَةِ ، لاَ يَمُرُّ بِآيَةِ رَحْمَةٍ إِلاَّ وَقَفَ وَسَأَلَ ، وَلاَ يَمُرُّ بِآيَةِ عَذَابٍ إِلاَّ وَقَفَ يَتَعَوَّذُ ، ثُمَّ رَكَعَ فَمَكَثَ رَاكِعًا بِقَدْرِ قِيَامِهِ ، يَقُولُ فِي رُكُوعِهِ : سُبْحَانَ ذِي الْجَبَرُوتِ وَالْمَلَكُوتِ وَالْكِبْرِيَاءِ وَالْعَظَمَةِ ، ثُمَّ سَجَدَ بِقَدْرِ رُكُوعِهِ يَقُولُ فِي سُجُودِهِ : سُبْحَانَ ذِي الْجَبَرُوتِ وَالْمَلَكُوتِ وَالْكِبْرِيَاءِ وَالْعَظَمَةِ ، ثُمَّ قَرَأَ آلَ عِمْرَانَ ، ثُمَّ سُورَةً ، ثُمَّ سُورَةً ، فَعَلَ مِثْلَ ذَلِكَ.

1132. ...Rəvayət edilir ki, Asim ibn Humeyd ﵀ demişdir: “Mən Auf ibn Malikin belə dediyini eşitdim: “Mən Peyğəmbərlə ﷺ birlikdə gecə namazına qalxdım. O, əvvəlcə dişlərini misvakla təmizlədi, sonra dəstəmaz aldı, daha sonra namaza durdu və əl-Bəqərə surəsini oxumağa başladı. Mərhəmət ayəsinə çatdıqda, dayanıb mərhəmət dilədi. Əzab ayəsinə çatdıqda, dayanıb Allaha sığındı. Sonra ruku edib ayaq üstə qaldığı qədər rukuda qaldı. Rukuda belə deyirdi: “Qüdrət, səltənət, böyüklük və əzəmət Sahibi pak və müqəddəsdir!”[2] Sonra səcdə edib rukuda qaldığı qədər səcdədə də qaldı. Səcdədə belə dedi: “Qüdrət, səltənət, böyüklük və

[1] Transkripsiyası: Subhə:nəkə Alla:hummə va bihəmdik, lə: ilə:hə illə: Ənt!

[2] Transkripsiyası: Subhə:nə zil-Cəbəru:ti, val-Mələku:ti, val-Kibriyə:i, val-Azaməti!

əzəmət Sahibi pak və müqəddəsdir!" Sonra Ali-İmran surəsini, sonra digər surə və digər surə oxudu və onlarda da bunun kimi etdi".

٧٤ - نَوْعٌ آخَرُ

74-cü fəsil: Səcdədə edilən başqa bir dua

١١٣٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ سَعْدِ بْنِ عُبَيْدَةَ ، عَنِ الْمُسْتَوْرِدِ بْنِ الأَحْنَفِ ، عَنْ صِلَةَ بْنِ زُفَرَ ، عَنْ حُذَيْفَةَ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ فَاسْتَفْتَحَ بِسُورَةِ الْبَقَرَةِ ، فَقَرَأَ بِمِائَةِ آيَةٍ لَمْ يَرْكَعْ ، فَمَضَى قُلْتُ : يَخْتِمُهَا فِي الرَّكْعَتَيْنِ ، فَمَضَى قُلْتُ : يَخْتِمُهَا ثُمَّ يَرْكَعُ ، فَمَضَى حَتَّى قَرَأَ سُورَةَ النِّسَاءِ ، ثُمَّ قَرَأَ سُورَةَ آلِ عِمْرَانَ ، ثُمَّ رَكَعَ نَحْوًا مِنْ قِيَامِهِ يَقُولُ فِي رُكُوعِهِ : سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا لَكَ الْحَمْدُ وَأَطَالَ الْقِيَامَ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ يَقُولُ فِي سُجُودِهِ : سُبْحَانَ رَبِّيَ الأَعْلَى ، سُبْحَانَ رَبِّيَ الأَعْلَى ، سُبْحَانَ رَبِّيَ الأَعْلَى لاَ يَمُرُّ بِآيَةِ تَخْوِيفٍ أَوْ تَعْظِيمٍ لِلَّهِ عَزَّ وَجَلَّ إِلاَّ ذَكَرَهُ

1133. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: "Bir gecə Allah Elçisi ﷺ ilə gecə namazı qıldım. Namazı əl-Bəqərə surəsi ilə başladı və yüz ayə oxudu, lakin ruku etməyərək oxumağa davam etdi. Öz-özümə dedim: "Yəqin iki rükətdə ("əl-Bəqərə" surəsini) tamamlayacaq". Sonra yenə davam etdi. Yenə öz-özümə dedim: "Yəqin surəni tamamlayacaq, sonra ruku edəcək". Sonra yenə davam etdi və ən-Nisa surəsini oxudu. Sonra Ali-İmran surəsini oxudu. Sonra ruku etdi və rukuda belə deyirdi: "Böyük Rəbbim pak və müqəddəsdir! Böyük Rəbbim pak və müqəddəsdir! Böyük Rəbbim pak və müqəddəsdir!"[1] Sonra başını qaldırdı və dedi: "Allah Ona həmd edəni eşitdi, Ey Rəbbimiz, həmd Sənə məxsusdur!"[2] və qiyamı uzatdı. Sonra səcdə etdi, səcdələrini uzatdı və səcdələrdə belə deyirdi: "Ən Uca Rəbbim pak və müqəddəsdir! Ən Uca Rəbbim pak və müqəddəsdir! Ən Uca Rəbbim pak və müqəddəsdir!"[3] Hər dəfə Allahdan ﷻ qorxmaq və təzim ayələrini oxuduqda, Onu zikr edərdi".

٧٤ - نَوْعٌ آخَرُ

75-ci fəsil: Səcdədə edilən başqa bir dua

١١٣٤ - أَخْبَرَنَا بُنْدَارٌ مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ الْقَطَّانُ ، وَابْنُ أَبِي عَدِيٍّ ، عَنْ شُعْبَةَ ، قَالاَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ مُطَرِّفٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ فِي رُكُوعِهِ وَسُجُودِهِ : سُبُّوحٌ قُدُّوسٌ رَبُّ الْمَلاَئِكَةِ وَالرُّوحِ.

[1] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Azi:m!

[2] Transkripsiyası: Səmi Alla:hu limən həmidəh, Rabbə:nə ləkəl-həmd!

[3] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Ə'lə!

1134. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ ruku və səcdələrdə belə deyərdi: “Pakdır, müqəddəsdir, mələklərin və Ruhun Rəbbidir!”[1]

### ٧٦ - عَدَدُ التَّسْبِيحِ فِي السُّجُودِ

### 76-cı fəsil: Səcdədə təsbihin sayı

١١٣٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ إِبْرَاهِيمَ بْنِ عُمَرَ بْنِ كَيْسَانَ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ وَهْبِ بْنِ مَانُوسَ ، قَالَ : سَمِعْتُ سَعِيدَ بْنَ جُبَيْرٍ ، قَالَ : سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : مَا رَأَيْتُ أَحَدًا أَشْبَهَ صَلاَةً بِصَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ هَذَا الْفَتَى يَعْنِي عُمَرَ بْنَ عَبْدِ الْعَزِيزِ فَحَزَرْنَا فِي رُكُوعِهِ عَشْرَ تَسْبِيحَاتٍ ، وَفِي سُجُودِهِ عَشْرَ تَسْبِيحَاتٍ.

1135. ...Rəvayət edilir ki, Səid ibn Cubeyr ﵀ demişdir: “Mən Ənəs ibn Malikin belə dediyini eşitdim: “Mən Allah Elçisinin ﷺ namazına ən çox oxşayan bu cavan oğlanın namazı olduğunu gördüm”. O, Ömər ibn Abdul-Əzizi qəsd edirdi. Biz də onun namazına baxdıqda, rukusunda və səcdəsində on dəfə təsbih etdiyini təxmin etdik”.

### ٧٧ - بَابُ الرُّخْصَةِ فِي تَرْكِ الذِّكْرِ فِي السُّجُودِ

### 77-ci fəsil: Səcdələrdə zikrləri tərk etməyin icazəli olması

١١٣٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِئُ أَبُو يَحْيَى بِمَكَّةَ وَهُوَ بَصْرِيٌّ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا هَمَّامٌ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، أَنَّ عَلِيَّ بْنَ يَحْيَى بْنِ خَلاَّدِ بْنِ رَافِعِ بْنِ مَالِكٍ حَدَّثَهُ ، عَنْ أَبِيهِ ، عَنْ عَمِّهِ رِفَاعَةَ بْنِ رَافِعٍ قَالَ : بَيْنَمَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَالِسٌ وَنَحْنُ حَوْلَهُ إِذْ دَخَلَ رَجُلٌ فَأَتَى الْقِبْلَةَ فَصَلَّى ، فَلَمَّا قَضَى صَلاَتَهُ جَاءَ فَسَلَّمَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعَلَى الْقَوْمِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَعَلَيْكَ ، اذْهَبْ فَصَلِّ فَإِنَّكَ لَمْ تُصَلِّ ، فَذَهَبَ فَصَلَّى فَجَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْمُقُ صَلاَتَهُ ، وَلاَ يَدْرِي مَا يَعِيبُ مِنْهَا ، فَلَمَّا قَضَى صَلاَتَهُ جَاءَ فَسَلَّمَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعَلَى الْقَوْمِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَعَلَيْكَ ، اذْهَبْ فَصَلِّ فَإِنَّكَ لَمْ تُصَلِّ ، فَأَعَادَهَا مَرَّتَيْنِ أَوْ ثَلاَثًا ، فَقَالَ الرَّجُلُ : يَا رَسُولَ اللهِ ، مَا عِبْتَ مِنْ صَلاَتِي ؟ فَقَالَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّهَا لَمْ تَتِمَّ صَلاَةُ أَحَدِكُمْ حَتَّى يُسْبِغَ الْوُضُوءَ كَمَا أَمَرَهُ اللَّهُ عَزَّ وَجَلَّ ، فَيَغْسِلَ وَجْهَهُ وَيَدَيْهِ إِلَى الْمِرْفَقَيْنِ ، وَيَمْسَحَ بِرَأْسِهِ وَرِجْلَيْهِ إِلَى الْكَعْبَيْنِ ، ثُمَّ يُكَبِّرَ اللَّهَ عَزَّ وَجَلَّ وَيَحْمَدَهُ وَيُمَجِّدَهُ - قَالَ هَمَّامٌ : وَسَمِعْتُهُ يَقُولُ : وَيَحْمَدَ اللَّهَ ، وَيُمَجِّدَهُ ، وَيُكَبِّرَهُ قَالَ : فَكِلاَهُمَا قَدْ سَمِعْتُهُ يَقُولُ - قَالَ : وَيَقْرَأَ مَا تَيَسَّرَ مِنَ الْقُرْآنِ مِمَّا عَلَّمَهُ اللَّهُ وَأَذِنَ لَهُ فِيهِ ، ثُمَّ يُكَبِّرَ وَيَرْكَعَ حَتَّى تَطْمَئِنَّ مَفَاصِلُهُ وَتَسْتَرْخِيَ ، ثُمَّ يَقُولَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ يَسْتَوِيَ قَائِمًا حَتَّى يُقِيمَ صُلْبَهُ ، ثُمَّ يُكَبِّرَ وَيَسْجُدَ حَتَّى يُمَكِّنَ وَجْهَهُ ، وَقَدْ سَمِعْتُهُ يَقُولُ : جَبْهَتَهُ حَتَّى تَطْمَئِنَّ مَفَاصِلُهُ ، وَتَسْتَرْخِيَ ، وَيُكَبِّرَ فَيَرْفَعَ حَتَّى يَسْتَوِيَ قَاعِدًا عَلَى مَقْعَدَتِهِ وَيُقِيمَ صُلْبَهُ ، ثُمَّ يُكَبِّرَ فَيَسْجُدَ حَتَّى يُمَكِّنَ وَجْهَهُ وَيَسْتَرْخِيَ ، فَإِذَا لَمْ يَفْعَلْ هَكَذَا لَمْ تَتِمَّ صَلاَتُهُ.

[1] Transkripsiyası: Subbu:hun, Quddu:sun, Rabbul-mələ:ikəti var-Ru:h!

1136. ...Rəvayət edilir ki, Rifəa ibn Rafi ﵁ demişdir: “Biz Allah Elçisinin ﷺ ətrafında oturmuşduq. Bir kişi gəlib qibləyə dönərək namaz qıldı. Namazını bitirikdən sonra gəlib Allah Elçisinə ﷺ və ətrafında olan insanlara salam verdi. Allah Elçisi ﷺ ona dedi: “Sənə də (salam olsun). Get, namazını yenidən qıl, çünki sən namaz qılmadın”. O gedib namaz qıldı. Allah Elçisi ﷺ onun namazına diqqət edirdi. Həmin adam namazın harasında səhv etdiyini bilmədi. Namazını bitirikdən sonra gəlib Allah Elçisinə ﷺ və ətrafında olan insanlara salam verdi. Allah Elçisi ﷺ ona dedi: “Sənə də (salam olsun). Get, namazını yenidən qıl, çünki sən namaz qılmadın”. O kişi iki və ya üç dəfə (təkrarən namazını) qıldı, sonra dedi: “Ey Allahın Elçisi, mənim namazımda nə naqislik var?” Allah Elçisi ﷺ dedi: ”Allahın ﷻ əmr etdiyi kimi gözəl şəkildə dəstəmaz almadıqca, üzünü və əllərini dirsəklərinə qədər yumadıqca, başına məsh edib ayaqlarını topuqlarına qədər yumadıqca, Allaha ﷻ təkbir edib, Ona həmd və səna etmədikcə sizdən birinizin namazı tam olmaz”. Hədisin ravisi Həmməm dedi: “Onun belə dediyini eşitdim: “Allaha həmd və səna edib, Ona təkbir etsin! Qurandan Allahın öyrətdiyindən ona asan olanını oxusun. Sonra təkbir etsin və bədən oynaqları rahat olana qədər ruku etsin”. Sonra: “Səmi Alla:hu limən həmidəh![1]”- deyib dikəlsin və qamətini düz tutsun. Sonra təkbir edib səcdə etsin və üzünü səcdədə yerə qoysun. Səcdədə alnı (yerə qoyulduğu halda) bədən oynaqları rahat olana qədər qalsın. Sonra təkbir edib qalxıb otursun, qamətini düzəltsin və rahat olsun. Sonra təkbir edib səcdə etsin və üzünü səcdədə yerə qoysun. Belə etməsə onun namazı tam olmaz”.

٧٨ - أَقْرَبُ مَا يَكُونُ الْعَبْدُ مِنَ اللهِ عَزَّ وَجَلَّ

78-ci fəsil: Bəndənin Allaha ﷻ ən yaxın olan halı

١١٣٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْب ، عَنْ عَمْرو ، يَعْنِي ابْنَ الْحَارِثِ ، عَنْ عُمَارَةَ بْنِ غَزِيَّةَ ، عَنْ سُمَيٍّ ، أَنَّهُ سَمِعَ أَبَا صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَقْرَبُ مَا يَكُونُ الْعَبْدُ مِنْ رَبِّهِ عَزَّ وَجَلَّ وَهُوَ سَاجِدٌ فَأَكْثِرُوا الدُّعَاءَ.

1137. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Bəndənin Rəbbinə ﷻ ən yaxın olduğu halı onun səcdə vəziyyətidir. Odur ki, (səcdədə) duaları çoxaldın!”

[1] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi!

٧٩ - فَضْلُ السُّجُودِ

79-cu fəsil: Səcdələrin fəziləti

١١٣٨ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَمَّارٍ ، عَنْ هِقْلِ بْنِ زِيَادٍ الدِّمَشْقِيِّ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنِي رَبِيعَةُ بْنُ كَعْبٍ الأَسْلَمِيُّ قَالَ : كُنْتُ آتِي رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِوَضُوئِهِ وَبِحَاجَتِهِ ، فَقَالَ : سَلْنِي ، قُلْتُ : مُرَافَقَتَكَ فِي الْجَنَّةِ ، قَالَ : أَوَ غَيْرَ ذَلِكَ ، قُلْتُ : هُوَ ذَاكَ ، قَالَ : فَأَعِنِّي عَلَى نَفْسِكَ بِكَثْرَةِ السُّجُودِ.

1138. ...Rabi ibn Kəb əl-Əsləmi ﷺ demişdir: "Mən Allah Elçisinə ﷺ dəstəmaz almaq və təbii ehtiyacını ödəmək üçün su gətirərdim. O dedi: "Məndən bir şey istə!" Mən dedim: "Mən Cənnətdə səninlə dost olmaq istəyirəm". O dedi: "Başqa bir şey istə!" Mən dedim: "İstədiyim ancaq budur". O dedi: "Mənə bu işdə çoxlu səcdə etməklə kömək et".

٨٠ - بَابُ ثَوَابِ مَنْ سَجَدَ لِلَّهِ عَزَّ وَجَلَّ سَجْدَةً

80-ci fəsil: Səcdəni Allah ﷻ üçün etməyin savabı

١١٣٩ - أَخْبَرَنَا أَبُو عَمَّارٍ الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : أَنْبَأَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنِي الْوَلِيدُ بْنُ هِشَامٍ الْمُعَيْطِيُّ ، قَالَ : حَدَّثَنِي مَعْدَانُ بْنُ طَلْحَةَ الْيَعْمُرِيُّ ، قَالَ : لَقِيتُ ثَوْبَانَ مَوْلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقُلْتُ : دُلَّنِي عَلَى عَمَلٍ يَنْفَعُنِي ، أَوْ يُدْخِلُنِي الْجَنَّةَ ، فَسَكَتَ عَنِّي مَلِيًّا ، ثُمَّ الْتَفَتَ إِلَيَّ فَقَالَ : عَلَيْكَ بِالسُّجُودِ ، فَإِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَا مِنْ عَبْدٍ يَسْجُدُ لِلَّهِ سَجْدَةً إِلاَّ رَفَعَهُ اللَّهُ عَزَّ وَجَلَّ بِهَا دَرَجَةً ، وَحَطَّ عَنْهُ بِهَا خَطِيئَةً قَالَ مَعْدَانُ : ثُمَّ لَقِيتُ أَبَا الدَّرْدَاءِ ، فَسَأَلْتُهُ عَمَّا سَأَلْتُ عَنْهُ ثَوْبَانَ ، فَقَالَ لِي : عَلَيْكَ بِالسُّجُودِ ، فَإِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَا مِنْ عَبْدٍ يَسْجُدُ لِلَّهِ سَجْدَةً إِلاَّ رَفَعَهُ اللَّهُ بِهَا دَرَجَةً ، وَحَطَّ عَنْهُ بِهَا خَطِيئَةً.

1139. ...Rəvayət edilir ki, Mə'dən ibn Talhə əl-Yə'muri ؓ demişdir: "Mən Allah Elçisinin ﷺ azad etdiyi köləsi Səubanla qarşılaşdım və ona dedim: "Məni faydalandıracaq və ya Cənnətə salacaq bir əməl göstər". O, bir qədər susdu, sonra mənə tərəf çevrilib dedi: "Sənə səcdə etməyi tövsiyyə edirəm, çünki mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Allaha səcdə edən elə bir bəndə yoxdur ki, Allah ﷻ bu səcdəyə görə onu bir dərəcə yüksəltməsin və onun bir günahını silməsin". Mə'dən dedi: "Sonra mən Əbud-Dərdə ilə rastlaşdım və Səubənə verdiyim sualı ona da verdim. O mənə dedi: "Həqiqətən, mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Allaha səcdə edən elə bir bəndə yoxdur ki, Allah bu səcdəyə görə onu bir dərəcə yüksəltməsin və onun bir günahını silməsin".

٨١ - بَابُ مَوْضِعِ السُّجُودِ

## 81-ci fəsil: Səcdə yerlərinin (Cəhənnəm odunda yanmaması)

١١٤٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سُلَيْمَانَ لُوَيْنٌ بِالْمَصِّيْصَةِ ، عَنْ حَمَّادِ بْنِ زَيْدٍ ، عَنْ مَعْمَرٍ ، وَالنُّعْمَانُ بْنُ رَاشِدٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ ، قَالَ : كُنْتُ جَالِسًا إِلَى أَبِي هُرَيْرَةَ ، وَأَبِي سَعِيدٍ فَحَدَّثَ أَحَدُهُمَا حَدِيثَ الشَّفَاعَةِ وَالآخَرُ مُنْصِتٌ ، قَالَ : فَتَأْتِي الْمَلاَئِكَةُ فَتَشْفَعُ وَتَشْفَعُ الرُّسُلُ وَذَكَرَ الصِّرَاطَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَأَكُونُ أَوَّلَ مَنْ يُجِيزُ ، فَإِذَا فَرَغَ اللَّهُ عَزَّ وَجَلَّ مِنَ الْقَضَاءِ بَيْنَ خَلْقِهِ وَأَخْرَجَ مِنَ النَّارِ مَنْ يُرِيدُ أَنْ يُخْرِجَ أَمَرَ اللَّهُ الْمَلاَئِكَةَ وَالرُّسُلَ أَنْ تَشْفَعَ ، فَيُعْرَفُونَ بِعَلاَمَاتِهِمْ إِنَّ النَّارَ تَأْكُلُ كُلَّ شَيْءٍ مِنَ ابْنِ آدَمَ إِلاَّ مَوْضِعَ السُّجُودِ ، فَيُصَبُّ عَلَيْهِمْ مِنْ مَاءِ الْجَنَّةِ فَيَنْبُتُونَ كَمَا تَنْبُتُ الْحِبَّةُ فِي حَمِيلِ السَّيْلِ.

1140. ...Rəvayət edilir ki, Əta ibn Yəzid ﷺ demişdir: "Bir dəfə mən Əbu Hureyra və Əbu Səidlə birlikdə oturmuşdum. Onlardan biri şəfaət hədisini danışdı, digəri isə sakit durmuşdu. O dedi: "Mələklər gəlib şəfaət edəcəklər, Allahın elçiləri şəfaət edəcəklər". Sonra sırat körpüsü haqda danışaraq dedi: "Allah Elçisi ﷺ belə buyurdu: "Mən sıratı keçmək üçün icazə verilənlərin ilki olacam. Allah ﷻ yaratdıqları arasında haqq-hesabı bitirdikdən və Cəhənnəmdən istədiklərini çıxardıqdan sonra mələklərə və elçilərə şəfaət etmələri üçün əmr edəcək. Onlar Cəhənnəmdən əlamətlərlə tanınanları çıxaracaqlar. Cəhənnəm odu Adəm övladlarının səcdə yerindən başqa hər yerini yeyəcək. Onların üzərinə Cənnətdən olan su töküləcək. Onlar selin gətirdiyi toxumların yetişdiyi kimi yerdən bitəcəklər".

٨٢ - بَابُ هَلْ يَجُوزُ أَنْ تَكُونَ سَجْدَةٌ أَطْوَلَ مِنْ سَجْدَةٍ

## 82-ci fəsil: Bir səcdənin digərinə nisbətən uzun olmasının icazəli olub-olmaması

١١٤١ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مُحَمَّدِ بْنِ سَلاَّمٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرُ بْنُ حَازِمٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ أَبِي يَعْقُوبَ الْبَصْرِيُّ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَدَّادٍ ، عَنْ أَبِيهِ قَالَ : خَرَجَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي إِحْدَى صَلاَتَيِ الْعِشَاءِ وَهُوَ حَامِلٌ حَسَنًا أَوْ حُسَيْنًا ، فَتَقَدَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَوَضَعَهُ ، ثُمَّ كَبَّرَ لِلصَّلاَةِ فَصَلَّى فَسَجَدَ بَيْنَ ظَهْرَانَيْ صَلاَتِهِ سَجْدَةً أَطَالَهَا ، قَالَ أَبِي : فَرَفَعْتُ رَأْسِي وَإِذَا الصَّبِيُّ عَلَى ظَهْرِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَهُوَ سَاجِدٌ فَرَجَعْتُ إِلَى سُجُودِي ، فَلَمَّا قَضَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الصَّلاَةَ قَالَ النَّاسُ : يَا رَسُولَ اللهِ ، إِنَّكَ سَجَدْتَ بَيْنَ ظَهْرَانَيْ صَلاَتِكَ سَجْدَةً أَطَلْتَهَا حَتَّى ظَنَنَّا أَنَّهُ قَدْ حَدَثَ أَمْرٌ أَوْ أَنَّهُ يُوحَى إِلَيْكَ ، قَالَ : كُلُّ ذَلِكَ لَمْ يَكُنْ وَلَكِنَّ ابْنِي ارْتَحَلَنِي فَكَرِهْتُ أَنْ أُعَجِّلَهُ حَتَّى يَقْضِيَ حَاجَتَهُ.

1141. ...Abdullah ibn Şəddad atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Bir gün Allah Elçisi ﷺ İşa namazının birində Həsən və ya Hüseyni əlində tutaraq gəldi. Allah Elçisi önə keçərək uşağı yerə qoydu, sonra namaz

üçün təkbir etdi. Namaz qılaraq səcdə etdi və namaz əsnasında bir səcdəni uzatdı". Atam dedi: "Başımı səcdədən qaldırdım və uşağın Allah Elçisinin ﷺ belində olduğunu və onun da səcdədə qaldığını gördüm. Mən yenidən səcdəyə qayıtdım. Allah Elçisi ﷺ namazı bitirdikdə, insanlar dedilər: "Ey Allahın Elçisi, həqiqətən sən namaz əsnasında səcdənin birini uzatdın, biz də nəyinsə baş verdiyini və ya sənə vəhy nazil olduğunu zənn etdik. Allah Elçisi ﷺ dedi: "Mənə heç nə olmamışdı, lakin nəvəm kürəyimə minmişdi. Mən də onu bu oyunundan ayırmaq istəmədim".

٨٣ - بَابُ التَّكْبِيرِ عِنْدَ الرَّفْعِ مِنَ السُّجُودِ

## 83-cü fəsil: Səcdələrdən qalxdıqda təkbir etmək

١١٤٢ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ دُكَيْنٍ ، وَيَحْيَى بْنُ آدَمَ ، قَالاَ : حَدَّثَنَا زُهَيْرٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ أَبِيهِ ، وَعَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُكَبِّرُ فِي كُلِّ خَفْضٍ وَرَفْعٍ وَقِيَامٍ وَقُعُودٍ ، وَيُسَلِّمُ عَنْ يَمِينِهِ وَعَنْ شِمَالِهِ : السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ حَتَّى يُرَى بَيَاضُ خَدِّهِ ، قَالَ : وَرَأَيْتُ أَبَا بَكْرٍ وَعُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا يَفْعَلاَنِ ذَلِكَ.

1142. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: "Allah Elçisi ﷺ hər dəfə namazda əyildikdə, qalxdıqda, ayaq üstə durduqda və oturduqda təkbir edərdi. Sonda sağına və soluna salam verərək: "əs-Sələ:mu aleykum va rahmətullah![1]"- elə deyərdi ki, onun yanağının ağlığı görünərdi. Əbu Bəkrin və Ömərin ﵄ də belə etdiyini gördüm".

٨٤ - بَابُ رَفْعِ الْيَدَيْنِ عِنْدَ الرَّفْعِ مِنَ السَّجْدَةِ الأُولَى

## 84-cü fəsil: İlk səcdədən qalxdıqda əlləri qaldırmaq

١١٤٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ نَصْرِ بْنِ عَاصِمٍ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ ، أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا دَخَلَ فِي الصَّلاَةِ رَفَعَ يَدَيْهِ ، وَإِذَا رَكَعَ فَعَلَ مِثْلَ ذَلِكَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ فَعَلَ مِثْلَ ذَلِكَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ السُّجُودِ فَعَلَ مِثْلَ ذَلِكَ كُلَّهُ يَعْنِي : رَفْعَ يَدَيْهِ

1143. ...Malik ibn əl-Huveyris ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ namaza başladıqda, ruku etdikdə, rukudan dikəldikdə və səcdələrdən başını qaldırdıqda - hər yerdə - əllərini qaldırardı".

[1] Tərcüməsi: Sizə salam olsun və Allahın rəhməti yetişsin!

٨٥ - تَرْكُ ذَلِكَ بَيْنَ السَّجْدَتَيْنِ

## 85-ci fəsil: Səcdələr arasında əlləri qaldırmamaq

١١٤٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا افْتَتَحَ الصَّلاَةَ كَبَّرَ وَرَفَعَ يَدَيْهِ ، وَإِذَا رَكَعَ ، وَبَعْدَ الرُّكُوعِ ، وَلاَ يَرْفَعُ بَيْنَ السَّجْدَتَيْنِ.

1144. ...Səlim atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Peyğəmbər ﷺ namaza başladıqda, ruku etdikdə, rukudan sonra (yəni rukudan qalxdıqda) əllərini qaldıraraq təkbir edərdi. Səcdələr arasında isə əllərini qaldırmazdı".

٨٦ - بَابُ الدُّعَاءِ بَيْنَ السَّجْدَتَيْنِ

## 86-cı fəsil: İki səcdə arasında dua etmək

١١٤٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ أَبِي حَمْزَةَ سَمِعَهُ يُحَدِّثُ ، عَنْ رَجُلٍ مِنْ عَبْسٍ ، عَنْ حُذَيْفَةَ ، أَنَّهُ انْتَهَى إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَامَ إِلَى جَنْبِهِ ، فَقَالَ : اللَّهُ أَكْبَرُ ذُو الْمَلَكُوتِ وَالْجَبَرُوتِ وَالْكِبْرِيَاءِ وَالْعَظَمَةِ ، ثُمَّ قَرَأَ بِالْبَقَرَةِ ، ثُمَّ رَكَعَ فَكَانَ رُكُوعُهُ نَحْوًا مِنْ قِيَامِهِ ، فَقَالَ فِي رُكُوعِهِ : سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، وَقَالَ حِينَ رَفَعَ رَأْسَهُ : لِرَبِّيَ الْحَمْدُ ، لِرَبِّيَ الْحَمْدُ ، وَكَانَ يَقُولُ فِي سُجُودِهِ : سُبْحَانَ رَبِّيَ الأَعْلَى ، سُبْحَانَ رَبِّيَ الأَعْلَى ، وَكَانَ يَقُولُ بَيْنَ السَّجْدَتَيْنِ : رَبِّ اغْفِرْ لِي ، رَبِّ اغْفِرْ لِي.

1145. ...Rəvayət edilir ki, Huzeyfə ﷺ Peyğəmbərin ﷺ yanına gedib onun yanında dayandı. Peyğəmbər ﷺ dedi: "Allah Böyükdür! Səltənət, Qüdrət, Böyüklük və Əzəmət Sahibi pak və müqəddəsdir!"[1] Sonra əl-Bəqərə surəsini oxudu. Sonra ruku etdi və rukusu qiyamı qədər oldu. Rukuda dedi: "Böyük Rəbbim pak və müqəddəsdir! Böyük Rəbbim pak və müqəddəsdir!"[2] Başını rukudan qaldırdıqda dedi: "Həmd Allaha məxsusdur! Həmd Allaha məxsusdur!"[3] Səcdələrdə isə deyirdi: "Ən Uca Rəbim pak və müqəddəsdir! Ən Uca Rəbim pak və müqəddəsdir!"[4] Səcdələr arasında isə deyirdi: "Rəbbim, məni bağışla! Rəbbim, məni bağışla!"[5]

[1] Transkripsiyası: Alla:hu Əkbər, zul-Mələku:ti val-Cəbəru:ti val-Kibriyə:i val-Azaməti!
[2] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Azi:m!
[3] Transkripsiyası: Li-Rabbiyəl-həmd, li-Rabbiyəl-həmd!
[4] Transkripsiyası: Subhə:nə Rabbiyəl-Ə'lə!
[5] Transkripsiyası: Rabbiğfirli:!

٨٧ - بَابُ رَفْعِ الْيَدَيْنِ بَيْنَ السَّجْدَتَيْنِ تِلْقَاءَ الْوَجْهِ

## 87-ci fəsil: İki səcdə arasında əlləri üz istiqamətində qaldırmaq

١١٤٦ - أَخْبَرَنَا مُوسَى بْنُ عَبْدِ اللهِ بْنِ مُوسَى الْبَصْرِيُّ ، قَالَ : حَدَّثَنَا النَّضْرُ بْنُ كَثِيرٍ أَبُو سَهْلٍ الأَزْدِيُّ ، قَالَ : صَلَّى إِلَى جَنْبِي عَبْدُ اللهِ بْنُ طَاوُوسٍ بِمِنًى فِي مَسْجِدِ الْخَيْفِ ، فَكَانَ إِذَا سَجَدَ السَّجْدَةَ الأُولَى فَرَفَعَ رَأْسَهُ مِنْهَا ، رَفَعَ يَدَيْهِ تِلْقَاءَ وَجْهِهِ فَأَنْكَرْتُ أَنَا ذَلِكَ ، فَقُلْتُ لِوُهَيْبِ بْنِ خَالِدٍ : إِنَّ هَذَا يَصْنَعُ شَيْئًا لَمْ أَرَ أَحَدًا يَصْنَعُهُ ، فَقَالَ لَهُ وَهَيْبٌ : تَصْنَعُ شَيْئًا لَمْ نَرَ أَحَدًا يَصْنَعُهُ ، فَقَالَ عَبْدُ اللهِ بْنُ طَاوُوسٍ : رَأَيْتُ أَبِي يَصْنَعُهُ ، وَقَالَ أَبِي : رَأَيْتُ ابْنَ عَبَّاسٍ يَصْنَعُهُ ، وَقَالَ عَبْدُ اللهِ بْنُ عَبَّاسٍ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُهُ

1146. ...Rəvayət edilir ki, ən-Nadr ibn Kəsir Əbu Səhl əl-Əzdi ﷺ demişdir: “Mən Minada[1] əl-Xayf məscidində Abdullah ibn Tavusun yanında namaz qıldım. O, ilk səcdəni edib başını qaldırdıqda, əllərini üz istiqamətində qaldırdı. Mən buna qarşı çıxaraq Vuheyb ibn Xalidə: “Bu, heç kimin etmədiyi bir əməli edir”- dedim. Vuheyb ona dedi: “Sən bizim heç birimizin etmədiyi bir şeyi edirsən?!” Abdullah ibn Tavus dedi: “Mən atamın belə etdiyini gördüm. Atam dedi: “Mən İbn Abbasın belə etdiyini gördüm. Abdullah ibn Abbas da belə demişdi: “Mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm”.

٨٨ - بَابُ كَيْفَ الْجُلُوسُ بَيْنَ السَّجْدَتَيْنِ

## 88-ci fəsil: İki səcdə arasında necə oturmaq lazımdır?

١١٤٧ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ إِبْرَاهِيمَ دُحَيْمٌ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ بْنُ مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ الأَصَمِّ ، قَالَ : حَدَّثَنِي يَزِيدُ بْنُ الأَصَمِّ ، عَنْ مَيْمُونَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا سَجَدَ خَوَّى بِيَدَيْهِ حَتَّى يُرَى وَضَحَ إِبْطَيْهِ مِنْ وَرَائِهِ ، وَإِذَا قَعَدَ اطْمَأَنَّ عَلَى فَخِذِهِ الْيُسْرَى.

1147. ...Rəvayət edilir ki, Məymunə ﷺ demişdir: “Allah Elçisi ﷺ səcdə etdikdə, əllərini qoltuqlarının ağlığı görünənə qədər aralayardı. Oturduqda da sol yanı üzərinə oturardı”.

٨٩ - قَدْرُ الْجُلُوسِ بَيْنَ السَّجْدَتَيْنِ

## 89-cu fəsil: İki səcdə arasında oturmağın müddəti

١١٤٨ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ أَبُو قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ شُعْبَةَ ، قَالَ : حَدَّثَنِي الْحَكَمُ ، عَنِ ابْنِ أَبِي لَيْلَى ، عَنِ

[1] Mina - Həcc ziyarətinə gedən zəvvarlar Zil-Hiccə ayının 10-dan 12-dək Məkkənin yaxınlığında yerləşən “Mina” adlı vadidə qalırlar. Həcc ziyarətinin rükünlərindən olan böyük, orta və kiçik cəmərələrə daş atma, eləcə də Qurban bayramına aid əməllər burada yerinə yetirilir.

الْبَرَاءِ قَالَ : كَانَ صَلاَةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رُكُوعُهُ وَسُجُودُهُ وَقِيَامُهُ بَعْدَ مَا يَرْفَعُ رَأْسَهُ مِنَ الرُّكُوعِ وَبَيْنَ السَّجْدَتَيْنِ قَرِيبًا مِنَ السَّوَاءِ.

1148. ...Rəvayət edilir ki, əl-Bəra ﷛ demişdir: "Allah Elçisinin ﷺ rukusu, səcdəsi rukudan qalxdıqdan sonrakı duruşu və səcdələr arası müddət bir-birinə yaxın müddət idi".

## ٩٠ - بَابُ التَّكْبِيرِ لِلسُّجُودِ

## 90-cı fəsil: Səcdə etdikdə təkbir etmək haqda

١١٤٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنِ الأَسْوَدِ ، وَعَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُكَبِّرُ فِي كُلِّ رَفْعٍ ، وَوَضْعٍ وَقِيَامٍ وَقُعُودٍ ، وَأَبُو بَكْرٍ ، وَعُمَرُ ، وَعُثْمَانُ رَضِيَ اللَّهُ عَنْهُمْ

1149. ...Rəvayət edilir ki, Abdullah ﷛ demişdir: "Allah Elçisi ﷺ namazda hər dəfə əyildikdə, qalxdıqda, ayaq üstə durduqda və oturduqda təkbir edərdi. Əbu Bəkr, Ömər və Osman ﷡ da belə edərdi".

١١٥٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا حُجَيْنٌ وَهُوَ ابْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا لَيْثٌ ، عَنْ عُقَيْلٍ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو بَكْرِ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ بْنِ هِشَامٍ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا قَامَ إِلَى الصَّلاَةِ يُكَبِّرُ حِينَ يَقُومُ ، ثُمَّ يُكَبِّرُ حِينَ يَرْكَعُ ، ثُمَّ يَقُولُ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ حِينَ يَرْفَعُ صُلْبَهُ مِنَ الرَّكْعَةِ ، ثُمَّ يَقُولُ وَهُوَ قَائِمٌ : رَبَّنَا لَكَ الْحَمْدُ ، ثُمَّ يُكَبِّرُ حِينَ يَهْوِي سَاجِدًا ، ثُمَّ يُكَبِّرُ حِينَ يَرْفَعُ رَأْسَهُ ، ثُمَّ يُكَبِّرُ حِينَ يَسْجُدُ ، ثُمَّ يُكَبِّرُ حِينَ يَرْفَعُ رَأْسَهُ ، ثُمَّ يَفْعَلُ ذَلِكَ فِي الصَّلاَةِ كُلِّهَا حَتَّى يَقْضِيَهَا ، وَيُكَبِّرُ حِينَ يَقُومُ مِنَ الثِّنْتَيْنِ بَعْدَ الْجُلُوسِ

1150. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: "Allah Elçisi ﷺ namaza qalxaraq qiyamda durduqda təkbir edər, sonra ruku etdikdə təkbir edər, sonra: "Allah Ona həmd edəni eşitdi"- deyərək belini rukudan qaldırardı. Sonra ayaq üstə olduqda deyərdi: "Ey Rəbbimiz, həmd Sənə məxsusdur". Sonra təkbir edərək səcdəyə gedər, sonra təkbir edib (səcdədən qalxaraq) başını qaldırar, sonra yenidən təkbir edərək səcdəyə gedər, sonra təkbir edərək (səcdədən qalxaraq) başını qaldırardı. Sonra bunları namazı bitirənə qədər bütün namazda edərdi. İkinci rükətdə oturduqdan sonra qalxanda da təkbir edərdi".

٩١ - بَابُ الِاسْتِوَاءِ لِلْجُلُوسِ عِنْدَ الرَّفْعِ مِنَ السَّجْدَتَيْنِ

## 91-ci fəsil: Səcdələrdən sonra qalxmamış oturmaq

١١٥١ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ أَبِي قِلاَبَةَ ، قَالَ : جَاءَنَا أَبُو سُلَيْمَانَ مَالِكُ بْنُ الْحُوَيْرِثِ إِلَى مَسْجِدِنَا فَقَالَ : أُرِيدُ أَنْ أُرِيَكُمْ كَيْفَ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي قَالَ : فَقَعَدَ فِي الرَّكْعَةِ الأُولَى حِينَ رَفَعَ رَأْسَهُ مِنَ السَّجْدَةِ الآخِرَةِ.

1151. ...Rəvayət edilir ki, Əbu Qiləbə ﷺ demişdir: “Əbu Suleyman Malik ibn əl-Huveyris bizim məscidə gəldi və dedi: “Mən sizə Allah Elçisinin ﷺ necə namaz qıldığını göstərmək istəyirəm”. O, birinci rükətdə başını son səcdədən qaldırdıqdan sonra oturdu”.

١١٥٢ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا هُشَيْمٌ ، عَنْ خَالِدٍ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ مَالِكِ بْنِ الْحُوَيْرِثِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فَإِذَا كَانَ فِي وَتْرٍ مِنْ صَلاَتِهِ لَمْ يَنْهَضْ حَتَّى يَسْتَوِيَ جَالِسًا.

1152. ...Rəvayət edilir ki, Malik ibn əl-Huveyris ﷺ demişdir: “Mən Allah Elçisini ﷺ namaz qılarkən gördüm. O, namazın tək rükətində birbaşa ayağa qalxmaz, (bir qədər) oturub sonra ayağa qalxardı”.

٩٢ - بَابُ الِاعْتِمَادِ عَلَى الأَرْضِ عِنْدَ النُّهُوضِ

## 92-ci fəsil: Namaz qılarkən yerdən qalxdıqda, əlləri dayayıb qalxmaq

١١٥٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ أَبِي قِلاَبَةَ ، قَالَ : كَانَ مَالِكُ بْنُ الْحُوَيْرِثِ يَأْتِينَا فَيَقُولُ : أَلاَ أُحَدِّثُكُمْ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَيُصَلِّي فِي غَيْرِ وَقْتِ الصَّلاَةِ فَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ السَّجْدَةِ الثَّانِيَةِ فِي أَوَّلِ الرَّكْعَةِ اسْتَوَى قَاعِدًا ، ثُمَّ قَامَ فَاعْتَمَدَ عَلَى الأَرْضِ.

1153. ...Rəvayət edilir ki, Əbu Qiləbə ﷺ demişdir: “Malik ibn əl-Huveyris bizim yanımıza gəlib: “Sizə Allah Elçisinin ﷺ namazı haqda xəbər verim-mi?”- dedikdən sonra namaz vaxtı olmayan zaman namaz qıldı. Başını birinci rükətin ikinci səcdəsindən qaldırdıqda, tam dikələrək oturdu, sonra əllərini yerə dayayıb ayağa qalxdı”.

٩٣ - بَابُ رَفْعِ الْيَدَيْنِ عَنِ الأَرْضِ قَبْلَ الرُّكْبَتَيْنِ

## 93-cü fəsil: Namazın oturuşundan qalxdıqda, dizlərdən qabaq əlləri yerdən qaldırmaq

١١٥٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : أَنْبَأَنَا يَزِيدُ بْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا شَرِيكٌ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ

وَائِلِ بْنِ حُجْرٍ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا سَجَدَ وَضَعَ رُكْبَتَيْهِ قَبْلَ يَدَيْهِ ، وَإِذَا نَهَضَ رَفَعَ يَدَيْهِ قَبْلَ رُكْبَتَيْهِ ، قَالَ : أَبُو عَبْدِ الرَّحْمَنِ : لَمْ يَقُلْ هَذَا عَنْ شَرِيكٍ غَيْرُ يَزِيدَ بْنِ هَارُونَ وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

1154. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﵁ demişdir: "Allah Elçisinin ﷺ səcdə etdikdə, əllərindən qabaq dizlərini qoyduğunu, səcdədən qalxdıqda isə dizlərindən qabaq əllərini qaldırdığını görmüşəm".[1]

٩٤ - بَابُ التَّكْبِيرِ لِلنُّهُوضِ

94-cü fəsil: Səcdədən və təşəhhüddən qalxarkən təkbir etmək

١١٥٥ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، كَانَ يُصَلِّي بِهِمْ فَيُكَبِّرُ كُلَّمَا خَفَضَ وَرَفَعَ ، فَإِذَا انْصَرَفَ قَالَ : وَاللَّهِ إِنِّي لأَشْبَهُكُمْ صَلاَةً بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1155. ...Əbu Sələmə ﵀ rəvayət edir ki, Əbu Hureyra onlarla namaz qıldıqda hər dəfə enib qalxdıqda təkbir edirdi. Bunu bitirdikdən sonra dedi: "Allaha and olsun ki, sizin aranızda Allah Elçisinin ﷺ namazına ən çox oxşar namaz qılan mənəm".

١١٥٦ - أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيٍّ ، وَسَوَّارُ بْنُ عَبْدِ اللهِ بْنِ سَوَّارٍ ، قَالاَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، وَعَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، أَنَّهُمَا صَلَّيَا خَلْفَ أَبِي هُرَيْرَةَ رَضِيَ اللَّهُ عَنْهُ ، فَلَمَّا رَكَعَ كَبَّرَ ، فَلَمَّا رَفَعَ رَأْسَهُ قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ ، ثُمَّ سَجَدَ وَكَبَّرَ وَرَفَعَ رَأْسَهُ وَكَبَّرَ ، ثُمَّ كَبَّرَ حِينَ قَامَ مِنَ الرَّكْعَةِ ، ثُمَّ قَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ إِنِّي لأَقْرَبُكُمْ شَبَهًا بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَا زَالَتْ هَذِهِ صَلاَتُهُ حَتَّى فَارَقَ الدُّنْيَا وَاللَّفْظُ لِسَوَّارٍ

1156. ...Əbu Sələmə ibn Abdur-Rahmən ﵀ rəvayət edir ki, bir dəfə onlar Əbu Hureyranın arxasında namaz qıldılar. O, ruku etdikdə təkbir etdi. Başını (rukudan) qaldırdıqda dedi: "Allah Ona həmd edəni eşitdi, ey Rəbbimiz, həmd sənə məxsusdur!" Sonra səcdə edərək təkbir etdi. Başını (səcdədən) qaldırdıqda da təkbir etdi. Sonra birinci rükətdən qalxdıqda təkbir etdi. Sonra isə dedi: "Canım Əlində Olana and olsun ki, aranızda Allah Elçisinin ﷺ namazına ən çox bənzəyən mənim namazımdır. Bu dünyadan ayrılana qədər onun namazı belə idi".

٩٥ - بَابُ كَيْفَ الْجُلُوسُ لِلتَّشَهُّدِ الأَوَّلِ

95-ci fəsil: İlk təşəhhüddə necə oturmaq lazımdır?

١١٥٧ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَحْيَى ، عَنِ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ أَنَّهُ قَالَ : إِنَّ مِنْ سُنَّةِ الصَّلاَةِ أَنْ تُضْجِعَ رِجْلَكَ الْيُسْرَى وَتَنْصِبَ الْيُمْنَى.

[1] Hədis zəifdir.

1157. ...Abdullah ibn Abdullah ibn Ömər atasının رضي الله عنهما belə dediyini rəvayət etmişdir: “Sol ayağı büküb sağ ayağı dikərək oturmaq namazın sünnələrindəndir”.

٩٦ - بَابُ الاِسْتِقْبَالِ بِأَطْرَافِ أَصَابِعِ الْقَدَمِ الْقِبْلَةَ عِنْدَ الْقُعُودِ لِلتَّشَهُّدِ

## 96-cı fəsil: Təşəhhüddə oturduqda ayaq barmaqlarının ucunu qibləyə yönəltmək

١١٥٨ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ بْنِ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ بَكْرِ بْنِ مُضَرَ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ يَحْيَى ، أَنَّ الْقَاسِمَ حَدَّثَهُ ، عَنْ عَبْدِ اللهِ وَهُوَ ابْنُ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ قَالَ : مِنْ سُنَّةِ الصَّلاَةِ أَنْ تَنْصِبَ الْقَدَمَ الْيُمْنَى ، وَاسْتِقْبَالُهُ بِأَصَابِعِهَا الْقِبْلَةَ وَالْجُلُوسُ عَلَى الْيُسْرَى.

1158. ...Abdullah ibn Abdullah ibn Ömər atasının رضي الله عنهما belə dediyini rəvayət etmişdir: “Sağ ayağı dikili saxlayıb barmaqları qibləyə yönəltmək və ağırlığı sol ayağın üzərinə yıxmaq namazın sünnələrindəndir”.

٩٧ - بَابُ مَوْضِعِ الْيَدَيْنِ عِنْدَ الْجُلُوسِ لِلتَّشَهُّدِ الأَوَّلِ

## 97-ci fəsil: İlk təşəhhüddə oturduqda əllərin yeri

١١٥٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِئُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا عَاصِمُ بْنُ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ قَالَ : أَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَأَيْتُهُ يَرْفَعُ يَدَيْهِ إِذَا افْتَتَحَ الصَّلاَةَ حَتَّى يُحَاذِيَ مَنْكِبَيْهِ ، وَإِذَا أَرَادَ أَنْ يَرْكَعَ ، وَإِذَا جَلَسَ فِي الرَّكْعَتَيْنِ أَضْجَعَ الْيُسْرَى وَنَصَبَ الْيُمْنَى ، وَوَضَعَ يَدَهُ الْيُمْنَى عَلَى فَخِذِهِ الْيُمْنَى ، وَنَصَبَ أُصْبُعَهُ لِلدُّعَاءِ ، وَوَضَعَ يَدَهُ الْيُسْرَى عَلَى فَخِذِهِ الْيُسْرَى ، قَالَ : ثُمَّ أَتَيْتُهُمْ مِنْ قَابِلٍ فَرَأَيْتُهُمْ يَرْفَعُونَ أَيْدِيَهُمْ فِي الْبَرَانِسِ.

1159. ...Rəvayət edilir ki, Vail ibn Hucr رضي الله عنه demişdir: “Mən Allah Elçisinin ﷺ yanına gəldikdə onun namaza başladıqda və ruku etmək istədikdə, əllərini çiyinləri səviyyəsində qaldırdığını, ikinci rükətdə oturduqda, sol ayağını altına qoyduğunu, sağ ayağını dik tutduğunu, sağ əlini sağ budu üzərinə qoyub barmağını dua etmək üçün dik tutduğunu, sol əlini də sol budu üzərinə qoyduğunu gördüm”. Vail ibn Hucr davam edərək dedi: “Sonra mən başqa vaxt onların yanına gəldikdə (namazda) əllərini geniş olan geyimlərinin içində yuxarı qaldırdıqlarını gördüm”.

٩٨ - بَابُ مَوْضِعِ الْبَصَرِ فِي التَّشَهُّدِ

## 98-ci fəsil: Təşəhhüddə hara baxmaq lazımdır?

١١٦٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ وَهُوَ ابْنُ جَعْفَرٍ ، عَنْ مُسْلِمِ بْنِ أَبِي مَرْيَمَ ، عَنْ عَلِيِّ بْنِ عَبْدِ الرَّحْمَنِ الْمُعَاوِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّهُ رَأَى رَجُلاً يُحَرِّكُ الْحَصَى بِيَدِهِ وَهُوَ فِي الصَّلاَةِ ، فَلَمَّا انْصَرَفَ ، قَالَ لَهُ عَبْدُ اللهِ : لاَ تُحَرِّكِ

الْحَصَى وَأَنْتَ فِي الصَّلاَةِ فَإِنَّ ذَلِكَ مِنَ الشَّيْطَانِ ، وَلَكِنِ اصْنَعْ كَمَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ ، قَالَ : وَكَيْفَ كَانَ يَصْنَعُ ؟ قَالَ : فَوَضَعَ يَدَهُ الْيُمْنَى عَلَى فَخِذِهِ الْيُمْنَى ، وَأَشَارَ بِأُصْبُعِهِ الَّتِي تَلِي الإِبْهَامَ فِي الْقِبْلَةِ ، وَرَمَى بِبَصَرِهِ إِلَيْهَا أَوْ نَحْوِهَا ، ثُمَّ قَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ.

1160. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ bir kişinin namazda xırda daşlarla oynadığını gördü. Namazı bitirdikdə, Abdullah ona dedi: "Namazda olduqda xırda daşları oynatma! Həqiqətən, bu, şeytandandır. Allah Elçisi ﷺ necə edibsə, elə et!" O dedi: "O, necə edib?" Abdullah dedi: "Sağ əlini sağ budu üzərinə qoyub sağ əlinin işarə barmağını qibləyə tərəf yönəltdi, nəzərini də barmağına və ya o tərəfə yönəltdi". Sonra Abdullah dedi: "Mən Allah Elçisinin ﷺ belə etdiyini gördüm".

### ٩٩ - بَابُ الإِشَارَةِ بِالأُصْبُعِ فِي التَّشَهُّدِ الأَوَّلِ

### 99-cu fəsil: İlk təşəhhüddə barmaqla işarə etmək

١١٦١ - أَخْبَرَنَا زَكَرِيَّا بْنُ يَحْيَى السِّجْزِيُّ ، يُعْرَفُ بِخَيَّاطِ السُّنَّةِ نَزَلَ بِدِمَشْقَ أَحَدُ الثِّقَاتِ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ عِيسَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا مَخْرَمَةُ بْنُ بُكَيْرٍ ، قَالَ : أَنْبَأَنَا عَامِرُ بْنُ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ أَبِيهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا جَلَسَ فِي الثِّنْتَيْنِ أَوْ فِي الأَرْبَعِ يَضَعُ يَدَيْهِ عَلَى رُكْبَتَيْهِ ، ثُمَّ أَشَارَ بِأُصْبُعِهِ.

1161. ...Abdullah ibn əz-Zubeyr atasının ﵄ belə dediyini rəvayət edir: "Allah Elçisi ﷺ ikinci və ya dördüncü rükətdə oturduqda əllərini dizlərinin üzərinə qoyar, sonra barmağı ilə işarə edərdi".

### ١٠٠ - كَيْفَ التَّشَهُّدُ الأَوَّلُ

### 100-cü fəsil: İlk təşəhhüd necədir?

١١٦٢ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، عَنِ الأَشْجَعِيِّ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَبْدِ اللهِ قَالَ : عَلَّمَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ نَقُولَ إِذَا جَلَسْنَا فِي الرَّكْعَتَيْنِ : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1162. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: "Allah Elçisi ﷺ bizə ikinci rükətdə oturduqda, belə deməyi öyrətdi: "Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik

edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!”[1]

١١٦٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ أَبَا إِسْحَاقَ يُحَدِّثُ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَبْدِ اللهِ قَالَ : كُنَّا لاَ نَدْرِي مَا نَقُولُ فِي كُلِّ رَكْعَتَيْنِ غَيْرَ أَنْ نُسَبِّحَ وَنُكَبِّرَ وَنَحْمَدَ رَبَّنَا ، وَإِنَّ مُحَمَّدًا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَّمَ فَوَاتِحَ الْخَيْرِ وَخَوَاتِمَهُ ، فَقَالَ : إِذَا قَعَدْتُمْ فِي كُلِّ رَكْعَتَيْنِ ، فَقُولُوا : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، وَلْيَتَخَيَّرْ أَحَدُكُمْ مِنَ الدُّعَاءِ أَعْجَبَهُ إِلَيْهِ فَلْيَدْعُ اللَّهَ عَزَّ وَجَلَّ.

1163. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Biz hər iki rükətdə təsbih, təkbir və Rəbbimizə təhmid edir və nəyin deyilməli olduğunu bilmirdik. Həqiqətən, Muhəmməd ﷺ bizə xeyrin əvvəlini də, sonunu da öyrətdi və dedi: “Hər ikinci rükətdə oturduqda, belə deyin: “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!”[2] Sizdən biriniz xoşuna gələn duanı seçsin və onunla Allaha ﷻ dua etsin”.

١١٦٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْثَرٌ ، عَنِ الأَعْمَشِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَبْدِ اللهِ قَالَ : عَلَّمَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ التَّشَهُّدَ فِي الصَّلاَةِ وَالتَّشَهُّدَ فِي الْحَاجَةِ ، فَأَمَّا التَّشَهُّدُ فِي الصَّلاَةِ : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ إِلَى آخِرِ التَّشَهُّدِ.

1164. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ bizə namazdakı təşəhhüdlə ehtiyac anında olan təşəhhüdü öyrətdi. Namazda olan təşəhhüdə gəldikdə, (o belədir): “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik

[1] Transkripsiyası: ət-Təhiyyə:tu lillə:hi vas-salənə:tu vat-tayyibə:tu, əs-Sələ:mu aleykə əyyu:hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-Sələ:mu aleynə: va alə: ibə:d-İllə:his-sa:lihi:n, əşhədu ən lə: ilə:hə illəllah, va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

[2] Yuxarıdakı təşəhhüdlə eynidir.

edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!”[1]- təşəhhüdün axırına kimi”.

١١٦٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى وَهُوَ ابْنُ آدَمَ ، قَالَ : سَمِعْتُ سُفْيَانَ ، يَتَشَهَّدُ بِهَذَا فِي الْمَكْتُوبَةِ وَالتَّطَوُّعِ ، وَيَقُولُ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ (ح) وَحَدَّثَنَا مَنْصُورٌ ، وَحَمَّادٌ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

1165. ...Eyni hədisdir.

١١٦٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ زَيْدَ بْنَ أَبِي أُنَيْسَةَ الْجَزَرِيَّ حَدَّثَهُ ، أَنَّ أَبَا إِسْحَاقَ حَدَّثَهُ ، عَنِ الأَسْوَدِ ، وَعَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ نَعْلَمُ شَيْئًا ، فَقَالَ لَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قُولُوا فِي كُلِّ جَلْسَةٍ التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1166. ...Rəvayət edilir ki, Abdullah ibn Məsud ﵁ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə idik və (namazda deyiləcək) heç bir şey bilmirdik. Allah Elçisi ﷺ bizə dedi: “Hər namazda oturuşda deyin: “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!”[2]

١١٦٧ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ جَبَلَةَ الرَّافِقِيُّ ، قَالَ : حَدَّثَنَا الْعَلاَءُ بْنُ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ وَهُوَ ابْنُ عَمْرٍو ، وَعَنْ زَيْدِ بْنِ أَبِي أُنَيْسَةَ ، عَنْ حَمَّادٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ بْنِ قَيْسٍ ، عَنْ عَبْدِ اللهِ قَالَ : كُنَّا لاَ نَدْرِي مَا نَقُولُ إِذَا صَلَّيْنَا فَعَلَّمَنَا نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَوَامِعَ الْكَلِمِ فَقَالَ لَنَا : قُولُوا : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ قَالَ عُبَيْدُ اللهِ : قَالَ زَيْدٌ : عَنْ حَمَّادٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، قَالَ : لَقَدْ رَأَيْتُ ابْنَ مَسْعُودٍ يُعَلِّمُنَا هَؤُلاَءِ الْكَلِمَاتِ كَمَا يُعَلِّمُنَا الْقُرْآنَ.

1167. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Biz namazda deyiləcək heç bir şey bilmirdik. Allahın Peyğəmbəri ﷺ əhatəli sözləri ilə bizi öyrədərək dedi: “Belə deyin: “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki,

---

[1] Yuxarıdakı təşəhhüdlə eynidir.
[2] Yuxarıdakı təşəhhüdlə eynidir.

Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!”[1] Ravi Alqamə dedi: “Mən İbn Məsudun bu kəlmələri bizə Quranı öyrətdiyi kimi öyrətdiyini gördüm”.

١١٦٨ - أَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ خَالِدٍ الرَّقِّيُّ ، قَالَ : حَدَّثَنَا حَارِثُ بْنُ عَطِيَّةَ ، وَكَانَ مِنْ زُهَّادِ النَّاسِ ، عَنْ هِشَامٍ ، عَنْ حَمَّادٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنِ ابْنِ مَسْعُودٍ قَالَ : كُنَّا إِذَا صَلَّيْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَقُولُ : السَّلاَمُ عَلَى اللهِ ، السَّلاَمُ عَلَى جِبْرِيلَ ، السَّلاَمُ عَلَى مِيكَائِيلَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَقُولُوا : السَّلاَمُ عَلَى اللهِ فَإِنَّ اللَّهَ هُوَ السَّلاَمُ ، وَلَكِنْ قُولُوا : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1168. ...Rəvayət edilir ki, İbn Məsud ﵁ demişdir: “Biz Allah Elçisi ﷺ ilə namaz qıldıqda, deyirdik: “Allaha salam olsun! Cəbrailə salam olsun! Mikailə salam olsun!” Allah Elçisi ﷺ belə dedi: “Belə: “Allaha salam olsun!”- deməyin. Həqiqətən, Salam Allahın Özüdür. Siz belə deyin: “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur və Onun şəriki yoxdur! Şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir![2]”[3]

١١٦٩ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ هُوَ الدَّسْتَوَائِيُّ ، عَنْ حَمَّادٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ ابْنِ مَسْعُودٍ قَالَ : كُنَّا نُصَلِّي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَنَقُولُ : السَّلاَمُ عَلَى اللهِ ، السَّلاَمُ عَلَى جِبْرِيلَ ، السَّلاَمُ عَلَى مِيكَائِيلَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَقُولُوا : السَّلاَمُ عَلَى اللهِ ، فَإِنَّ اللَّهَ هُوَ السَّلاَمُ ، وَلَكِنْ قُولُوا : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1169. ...Rəvayət edilir ki, İbn Məsud ﵁ demişdir: “Biz Allah Elçisi ﷺ ilə namaz qıldıqda, deyirdik: “Allaha salam olsun! Cəbrailə salam olsun! Mikailə salam olsun!” Allah Elçisi ﷺ belə dedi: “Belə: “Allaha salam olsun!”- deməyin. Həqiqətən, Salam Allahın Özüdür. Siz belə deyin: “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə

[1] Yuxarıdakı təşəhhüdlə eynidir.

[2] Transkripsiyası: ət-Təhiyyə:tu lillə:hi vas-saləvə:tu vat-tayyibə:tu, əs-Sələ:mu aleykə əyyu:hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-Sələ:mu aleynə: va alə: ibə:d-illə:his-sa:lihi:n, əşhədu ən lə: ilə:hə illəllah, vahdəhu lə: şəri:kə ləh va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

[3] “Onun şəriki yoxdur” əlavəsi səhih deyil.

Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"[1]

١١٧٠ - أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ الْعَسْكَرِيُّ ، قَالَ : حَدَّثَنَا غُنْدَرٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ ، وَمَنْصُورٍ ، وَحَمَّادٍ ، وَمُغِيرَةَ ، وَأَبِي هَاشِمٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ فِي التَّشَهُّدِ : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : أَبُو هَاشِمٍ غَرِيبٌ

1170. ...Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ təşəhhüddə belə dedi: "Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"[2]

١١٧١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ دُكَيْنٍ ، قَالَ : حَدَّثَنَا سَيْفٌ الْمَكِّيُّ ، قَالَ : سَمِعْتُ مُجَاهِدًا ، يَقُولُ : حَدَّثَنِي أَبُو مَعْمَرٍ ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ يَقُولُ : عَلَّمَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ التَّشَهُّدَ كَمَا يُعَلِّمُنَا السُّورَةَ مِنَ الْقُرْآنِ وَكَفُّهُ بَيْنَ يَدَيْهِ التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1171. ...Rəvayət edilir ki, Əbu Mə'mər ﷺ demişdir: "Mən Abdullahın belə dediyini eşitdim: "Allah Elçisi ﷺ təşəhhüdü bizə Qurandan bir surə öyrətdiyi kimi öyrətdi və (dua edərkən) ovucları öz önündə idi. O dedi: "Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"[3]

---

[1] Transkripsiyası: ət-Təhiyyə:tu lillə:hi vas-saləvə:tu vat-tayyibə:tu, əs-Sələ:mu aleykə əyyu:hənnəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-Sələ:mu aleynə: va alə: ibə:d-illə:his-sa:lihi:n, əşhədu ən lə: ilə:hə illəllah, va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

[2] Yuxarıdakı təşəhhüdlə eynidir.

[3] Yuxarıdakı təşəhhüdlə eynidir.

## ١٠١ - نَوْعٌ آخَرُ مِنَ التَّشَهُّدِ

## 101-ci fəsil: Təşəhhüdün başqa bir növü

١١٧٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ أَبُو قُدَامَةَ السَّرْخَسِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، قَالَ : حَدَّثَنِي قَتَادَةُ ، عَنْ يُونُسَ بْنِ جُبَيْرٍ ، عَنْ حِطَّانَ بْنِ عَبْدِ اللهِ ، أَنَّ الأَشْعَرِيَّ قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَطَبَنَا فَعَلَّمَنَا سُنَّتَنَا وَبَيَّنَ لَنَا صَلاتَنَا فَقَالَ : أَقِيمُوا صُفُوفَكُمْ ، ثُمَّ لِيَؤُمَّكُمْ أَحَدُكُمْ ، فَإِذَا كَبَّرَ فَكَبِّرُوا ، وَإِذَا قَالَ : **{وَلاَ الضَّالِّينَ}** ، فَقُولُوا : آمِينَ ، يُجِبْكُمُ اللَّهُ ، وَإِذَا كَبَّرَ الإِمَامُ وَرَكَعَ فَكَبِّرُوا وَارْكَعُوا فَإِنَّ الإِمَامَ يَرْكَعُ قَبْلَكُمْ وَيَرْفَعُ قَبْلَكُمْ ، قَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَتِلْكَ بِتِلْكَ ، وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَقُولُوا : رَبَّنَا لَكَ الْحَمْدُ ، يَسْمَعِ اللَّهُ لَكُمْ فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ قَالَ عَلَى لِسَانِ نَبِيِّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ إِذَا كَبَّرَ الإِمَامُ وَسَجَدَ ، فَكَبِّرُوا وَاسْجُدُوا ، فَإِنَّ الإِمَامَ يَسْجُدُ قَبْلَكُمْ وَيَرْفَعُ قَبْلَكُمْ ، قَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَتِلْكَ بِتِلْكَ ، فَإِذَا كَانَ عِنْدَ الْقَعْدَةِ فَلْيَكُنْ مِنْ أَوَّلِ قَوْلِ أَحَدِكُمْ أَنْ يَقُولَ : التَّحِيَّاتُ الطَّيِّبَاتُ الصَّلَوَاتُ لِلَّهِ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1172. ...Rəvayət edilir ki, əl-Əşari ﵁ demişdir: "Allah Elçisi ﷺ bizə xütbə verdi, sünnəmizi və namazımızı öyrətdi və dedi: "Saflarınızı düz tutun! Sonra sizdən biriniz imamlıq etsin. O, təkbir etdikdə, siz də təkbir edin. O: "Vələdda:lli:n![1]"- dedikdə, siz də "Amin"[2]- deyin. Allah sizə cavab verər. İmam təkbir edib ruku etdikdə, siz də təkbir edib ruku edin. Həqiqətən, imam sizdən qabaq ruku edir və sizdən qabaq rukudan qalxır". Sonra Allahın Peyğəmbəri ﷺ buyurdu: "Belə-belə edin. O: "Səmi Alla:hu limən həmidəh"- dedikdə, siz: "Rabbənə: ləkəl-həmd"- deyin. Allah sizi eşidir. Həqiqətən, Allah ﷻ Öz Peyğəmbərinin ﷺ dili ilə: "Səmi Alla:hu limən həmidəh"- dedi. Sonra imam təkbir edib səcdə etdikdə, siz də təkbir edib səcdə edin. Həqiqətən, imam sizdən qabaq ruku edir və sizdən qabaq rukudan qalxır". Daha sonra Allahın Peyğəmbəri ﷺ buyurdu: "Belə-belə edin. O, oturduqda, sizin ilk sözünüz: "Salamlar, gözəl şeylər və dualar Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur, şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"- olsun".[3]

---

[1] Tərcüməsi: **"Azmışların yoluna yox"** (əl-Fatihə, 7).

[2] Amin - Allahım, dualarmızı qəbul et!

[3] Transkripsiyası: ət-Təhiyyə:tut-tayyibə:tus-saləvə:tu lilləh, əs-Sələ:mu aleykə əyyu:hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-Sələ:mu aleynə: va alə: ibə:d-İllə:his-sa:lihi:n, əşhədu ən lə: ilə:hə illəllah, va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

## ١٠٢ - نَوْعٌ آخَرُ مِنَ التَّشَهُّدِ

## 102-ci fəsil: Təşəhhüdün başqa bir növü

١١٧٣ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ أَحْمَدُ بْنُ الْمِقْدَامِ الْعِجْلِيُّ الْبَصْرِيُّ ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ : حَدَّثَنَا أَبِي يُحَدِّثُ ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي غَلاَّبٍ وَهُوَ يُونُسُ بْنُ جُبَيْرٍ ، عَنْ حِطَّانَ بْنِ عَبْدِ اللهِ ، أَنَّهُمْ صَلَّوْا مَعَ أَبِي مُوسَى فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا كَانَ عِنْدَ الْقَعْدَةِ فَلْيَكُنْ مِنْ أَوَّلِ قَوْلِ أَحَدِكُمُ التَّحِيَّاتُ لِلَّهِ الطَّيِّبَاتُ الصَّلَوَاتُ لِلَّهِ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1173. ...Hittan ibn Abdullah ﷺ rəvayət edir ki, onlar Əbu Musa ilə birlikdə namaz qıldıqda, o dedi: "Allah Elçisi ﷺ belə buyurdu: "(Namaz qılarkən) oturuşda sizin ilk sözünüz bu olsun: "Salamlar, gözəl şeylər və dualar Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və Onun şəriki yoxdur! Şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"[1]

## ١٠٣ - نَوْعٌ آخَرُ مِنَ التَّشَهُّدِ

## 103-cü fəsil: Təşəhhüddün başqa bir növü

١١٧٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، وَطَاوُسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُعَلِّمُنَا التَّشَهُّدَ كَمَا يُعَلِّمُنَا الْقُرْآنَ وَكَانَ يَقُولُ : التَّحِيَّاتُ الْمُبَارَكَاتُ الصَّلَوَاتُ الطَّيِّبَاتُ لِلَّهِ ، سَلاَمٌ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، سَلاَمٌ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1174. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ bizə təşəhhüdü Quranı öyrətdiyi kimi öyrədirdi. O deyirdi: "Mübarək salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"[2]

[1] Transkripsiyası: ət-Təhiyyə:tu lillə:hit-tayyibə:tus-saləvə:tu lilləh, əs-Sələ:mu aleykə əyyu:hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-Sələ:mu aleynə: va alə: ibə:d-İllə:his-sa:lihi:n, əşhədu ən lə: ilə:hə illəllah, vahdəhu lə: şəri:kə ləh va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

[2] Transkripsiyası: ət-Təhiyyə:tul-mubə:rakə:tus-saləvə:tut-tayyibə:tu lilləh, sələ:mun aleykə əyyu:hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, sələ:mun aleynə: va alə: ibə:dillə:hissa:li-hi:n, əşhədu ən lə: ilə:hə illəllah va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

١٠٤ - نَوْعٌ آخَرُ مِنَ التَّشَهُّدِ

## 104-cü fəsil: Təşəhhüdün başqa bir növü

١١٧٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ : سَمِعْتُ أَيْمَنَ وَهُوَ ابْنُ نَابِلٍ ، يَقُولُ : حَدَّثَنِي أَبُو الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُعَلِّمُنَا التَّشَهُّدَ كَمَا يُعَلِّمُنَا السُّورَةَ مِنَ الْقُرْآنِ بِسْمِ اللهِ وَبِاللَّهِ ، التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، أَسْأَلُ اللَّهَ الْجَنَّةَ وَأَعُوذُ بِاللَّهِ مِنَ النَّارِ.

1175. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Allah Elçisi ﷺ bizə təşəhhüdü Qurandan bir surə öyrətdiyi kimi öyrətdi. Allahın adı və Allahın yardımı ilə salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir! Allahdan Cənnəti diləyirəm və Cəhənnəm əzabından Allaha sığınıram![1]”[2]

١٠٥ - بَابُ التَّخْفِيفِ فِي التَّشَهُّدِ الأَوَّلِ

## 105-ci fəsil: İlk təşəhhüdü qısa etmək

١١٧٦ - أَخْبَرَنَا الْهَيْثَمُ بْنُ أَيُّوبَ الطَّالَقَانِيُّ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ أَبِي عُبَيْدَةَ بْنِ مَسْعُودٍ ، عَنْ أَبِيهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الرَّكْعَتَيْنِ كَأَنَّهُ عَلَى الرَّضْفِ ، قُلْتُ : حَتَّى يَقُومَ ؟ قَالَ : ذَلِكَ يُرِيدُ.

1176. ...Əbu Ubeydə ibn Məsud atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ ilk iki rükətin sonunda sanki qızmar daş üzərində otururmuş kimi tez qalxardı”. Mən dedim: “Tez qalxardı?” O dedi: “Bəli, (tez qalxardı)”.[3]

---

[1] Transkripsiyası: ət-Təhiyyə:tu lillə:hi vas-salələ:tu vat-tayyibə:tu, əs-Sələ:mu aleykə əyyu:hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-Sələ:mu aleynə: va alə: ibə:d-İllə:his-sa:lihi:n, əşhədu ən lə: ilə:hə illəllah, va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu! Əs əlulla:həl-Cənnətə va əu:zu billə:hi minən-Nə:r!

[2] Hədis zəifdir.

[3] Hədis zəifdir.

## ١٠٤ - بَابُ تَرْكِ التَّشَهُّدِ الأَوَّلِ

## 106-cı fəsil: İlk təşəhhüdü (səhvən) tərk etmək haqda

١١٧٧ - أَخْبَرَنِي يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ الْبَصْرِيُّ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ يَحْيَى ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ ابْنِ بُحَيْنَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى فَقَامَ فِي الشَّفْعِ الَّذِي كَانَ يُرِيدُ أَنْ يَجْلِسَ فِيهِ ، فَمَضَى فِي صَلاَتِهِ حَتَّى إِذَا كَانَ فِي آخِرِ صَلاَتِهِ سَجَدَ سَجْدَتَيْنِ قَبْلَ أَنْ يُسَلِّمَ ثُمَّ سَلَّمَ.

1177. ...İbn Buheynə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ namaz qıldı, ikinci rükətdə oturmamış qalxdı və namazına davam etdi. Namazın sonunda salam vermədən iki dəfə səcdə etdi, sonra salam verdi.

١١٧٨ - أَخْبَرَنَا أَبُو دَاوُدَ سُلَيْمَانُ بْنُ سَيْفٍ ، قَالَ : حَدَّثَنَا وَهْبُ بْنُ جَرِيرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ ابْنِ بُحَيْنَةَ ، أَنَّ النَّبِيَّ اللَّهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى فَقَامَ فِي الرَّكْعَتَيْنِ فَسَبَّحُوا فَمَضَى فَلَمَّا فَرَغَ مِنْ صَلاَتِهِ سَجَدَ سَجْدَتَيْنِ ثُمَّ سَلَّمَ.

1178. ...İbn Buheynə ﷺ rəvayət edir ki, Allahın Peyğəmbəri ﷺ (namaz qılarkən) iki rükətdən sonra ayağa qalxdı, (camaat onun səhvini bildirmək üçün) təsbih etdilər. Peyğəmbər ﷺ namaza davam etdi. O, namazını bitirdikdə iki dəfə səcdə edib salam verdi.

# ١٣ - كِتَابُ السَّهْوِ

# 13. Səhv kitabı

## ١ - التَّكْبِيرُ إِذَا قَامَ مِنَ الرَّكْعَتَيْنِ

## 1-ci fəsil: İkinci rükətdən qalxdıqda təkbir etmək

١١٧٩ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَصَمِّ قَالَ : سُئِلَ أَنَسُ بْنُ مَالِكٍ عَنِ التَّكْبِيرِ فِي الصَّلاَةِ فَقَالَ : يُكَبِّرُ إِذَا رَكَعَ ، وَإِذَا سَجَدَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ السُّجُودِ ، وَإِذَا قَامَ مِنَ الرَّكْعَتَيْنِ ، فَقَالَ حُطَيْمٌ : عَمَّنْ تَحْفَظُ هَذَا ؟ فَقَالَ : عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَبِي بَكْرٍ ، وَعُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا ، ثُمَّ سَكَتَ ، فَقَالَ لَهُ حُطَيْمٌ : وَعُثْمَانُ ؟ قَالَ : وَعُثْمَانُ.

1179. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn əl-Əsam ﷺ demişdir: “Ənəs ibn Malikdən namazda təkbir etmək barəsində soruşdular. O dedi: “Ruku və səcdə etdikdə, başı səcdədən qaldırdıqda və ikinci rükətdən qalxdıqda təkbir edilir”. Huteym dedi: “Sən bunu kimdən əzbərlədin?” O dedi: “Peyğəmbər ﷺ, Əbu Bəkr və Ömərdən”, sonra susdu. Huteym ona dedi: “Bəs Osmandan?” O dedi: “Həmçinin Osmandan”.

١١٨٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، قَالَ : حَدَّثَنَا غَيْلاَنُ بْنُ جَرِيرٍ ، عَنْ مُطَرِّفِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : صَلَّى عَلِيُّ بْنُ أَبِي طَالِبٍ ، فَكَانَ يُكَبِّرُ فِي كُلِّ خَفْضٍ ، وَرَفْعٍ يُتِمُّ التَّكْبِيرَ ، فَقَالَ عِمْرَانُ بْنُ حُصَيْنٍ : لَقَدْ ذَكَّرَنِي هَذَا صَلاَةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1180. ...Rəvayət edilir ki, Mutarrif ibn Abdullah ﷺ demişdir: “Əli ibn Əbu Talib namaz qıldı və hər dəfə əyilib durduqda təkbiri tam edirdi”. İmran ibn Husayn dedi: “Bu mənə Allah Elçisinin ﷺ namazını xatırlatdı”.

## ٢ - بَابُ رَفْعِ الْيَدَيْنِ فِي الْقِيَامِ إِلَى الرَّكْعَتَيْنِ الأُخْرَيَيْنِ

## 2-ci fəsil: Axırıncı iki rükət üçün qalxıqda, əllərin qaldırılması

١١٨١ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ عَطَاءٍ ، عَنْ أَبِي حُمَيْدٍ السَّاعِدِيِّ قَالَ : سَمِعْتُهُ يُحَدِّثُ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا قَامَ مِنَ السَّجْدَتَيْنِ كَبَّرَ وَرَفَعَ يَدَيْهِ حَتَّى يُحَاذِيَ بِهِمَا مَنْكِبَيْهِ كَمَا صَنَعَ حِينَ افْتَتَحَ الصَّلاَةَ.

1181. ...Rəvayət edilir ki, Əbu Humeyd əs-Səidi ﷺ demişdir: “Peyğəmbər ﷺ iki səcdədən qalxdıqda namaza başladıqda etdiyi kimi əllərini çiyinləri səviyyəsində qaldıraraq təkbir edərdi”.

٣ - بَابُ رَفْعِ الْيَدَيْنِ لِلْقِيَامِ إِلَى الرَّكْعَتَيْنِ الأُخْرَيَيْنِ حَذْوَ الْمَنْكِبَيْنِ

## 3-cü fəsil: İkinci rükətdən qalxdıqda əlləri çiyinlər səviyyəsində qaldıraraq təkbir etmək

١١٨٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى الصَّنْعَانِيُّ ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ : سَمِعْتُ عُبَيْدَ اللهِ وَهُوَ ابْنُ عُمَرَ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنِ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ كَانَ يَرْفَعُ يَدَيْهِ إِذَا دَخَلَ فِي الصَّلاَةِ ، وَإِذَا أَرَادَ أَنْ يَرْكَعَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ ، وَإِذَا قَامَ مِنَ الرَّكْعَتَيْنِ يَرْفَعُ يَدَيْهِ كَذَلِكَ حَذْوَ الْمَنْكِبَيْنِ.

1182. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ namaza başladıqda, ruku etmək istədikdə, başını rukudan qaldırdıqda, eləcə də ikinci rükətdən qalxdıqda əllərini çiyinləri səviyyəsində qaldırardı.

٤ - بَابُ رَفْعِ الْيَدَيْنِ وَحَمْدِ اللهِ وَالثَّنَاءِ عَلَيْهِ فِي الصَّلاَةِ

## 4-cü fəsil: Namazda əlləri qaldırıb Allaha həmd və səna etmək

١١٨٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ بَزِيعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ وَهُوَ ابْنُ عُمَرَ ، عَنْ أَبِي حَازِمٍ ، عَنْ سَهْلِ بْنِ سَعْدٍ قَالَ : انْطَلَقَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصْلِحُ بَيْنَ بَنِي عَمْرِو بْنِ عَوْفٍ ، فَحَضَرَتِ الصَّلاَةُ ، فَجَاءَ الْمُؤَذِّنُ إِلَى أَبِي بَكْرٍ فَأَمَرَهُ أَنْ يَجْمَعَ النَّاسَ وَيَؤُمَّهُمْ ، فَجَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَخَرَقَ الصُّفُوفَ حَتَّى قَامَ فِي الصَّفِّ الْمُقَدَّمِ ، وَصَفَّحَ النَّاسُ بِأَبِي بَكْرٍ لِيُؤْذِنُوهُ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَكَانَ أَبُو بَكْرٍ لاَ يَلْتَفِتُ فِي الصَّلاَةِ ، فَلَمَّا أَكْثَرُوا عَلِمَ أَنَّهُ قَدْ نَابَهُمْ شَيْءٌ فِي صَلاَتِهِمْ ، فَالْتَفَتَ فَإِذَا هُوَ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَوْمَأَ إِلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَيْ كَمَا أَنْتَ ، فَرَفَعَ أَبُو بَكْرٍ يَدَيْهِ فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ لِقَوْلِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ رَجَعَ الْقَهْقَرَى ، وَتَقَدَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى ، فَلَمَّا انْصَرَفَ قَالَ لأَبِي بَكْرٍ : مَا مَنَعَكَ إِذْ أَوْمَأْتُ إِلَيْكَ أَنْ تُصَلِّيَ ؟ فَقَالَ أَبُو بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ : مَا كَانَ يَنْبَغِي لاِبْنِ أَبِي قُحَافَةَ أَنْ يَؤُمَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ قَالَ لِلنَّاسِ : مَا بَالُكُمْ صَفَّحْتُمْ ؟ إِنَّمَا التَّصْفِيحُ لِلنِّسَاءِ ، ثُمَّ قَالَ : إِذَا نَابَكُمْ شَيْءٌ فِي صَلاَتِكُمْ فَسَبِّحُوا.

1183. ...Rəvayət edilir ki, Səhl ibn Səd ﵁ demişdir: “Allah Elçisi ﷺ Bəni Amr və Bəni Auf arasında sülh yaratmaq üçün getmişdi. Bu əsnada artıq namazın vaxtı idi. Müəzzin Əbu Bəkrin yanına gəldi və ona insanları cəm edib onlara imamlıq etməyi dedi. Sonra Allah Elçisi ﷺ gəlib səfləri yararaq ilk səfə keçdi. İnsanlar Allah Elçisinin ﷺ gəldiyini Əbu Bəkrə bildirmək üçün əllərini bir-birinə vurmağa başladılar. Əbu Bəkr namazda heç nəyə fikir vermədi. İnsanlar əllərini bir-birinə vurmağı artırdıqda, Əbu Bəkr namazda onları nəyinsə narahat etdiyini başa düşdü. Çevrilib Allah Elçisini ﷺ gördü. Allah Elçisi ﷺ ona olduğu yerdə qalıb namazı davam etdirməyi işarə etdi. Əbu Bəkr Allah Elçisinin ﷺ bu sözünə görə əllərini

qaldırıb Allaha həmd və səna etdi. Sonra geriyə çəkildi. Allah Elçisi ﷺ önə keçdi və insanlara namaz qıldırdı. Namazı bitirdikdən sonra Əbu Bəkrə dedi: "Mən sənə işarə etdikdə, insanlar üçün namaz qıldırmağa sənə nə mane oldu?" Əbu Bəkr dedi: "İbn Əbu Quhafəyə Allah Elçisinin ﷺ önünə keçib ona imamlıq etmək yaraşmaz". Sonra Allah Elçisi ﷺ insanlara dedi: "Sizə nə olub ki, əllərinizi bir-birinə vurursunuz? Həqiqətən, əlləri bir-birinə vurmaq qadınlar üçündür". Sonra da buyurdu: "Sizi (camaat) namazında bir şey narahat etdikdə, Allahı təsbih edin ("Subhən-Allah" deyin)".

٥ - بَابُ السَّلَامِ بِالأَيْدِي فِي الصَّلَاةِ.

## 5-ci fəsil: Namazda əl ilə salamlaşmaq

١١٨٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْثَرٌ ، عَنِ الأَعْمَشِ ، عَنِ الْمُسَيَّبِ بْنِ رَافِعٍ ، عَنْ تَمِيمِ بْنِ طَرَفَةَ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : خَرَجَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَنَحْنُ رَافِعُو أَيْدِينَا فِي الصَّلَاةِ فَقَالَ : مَا بَالُهُمْ رَافِعِينَ أَيْدِيَهُمْ فِي الصَّلَاةِ كَأَنَّهَا أَذْنَابُ الْخَيْلِ الشُّمُسِ ، اسْكُنُوا فِي الصَّلَاةِ.

1184. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﷺ demişdir: "Allah Elçisi ﷺ (məscidə birləşik olan evindən) bizim yanımıza çıxdı. Biz də namazda əllərimizi qaldırmışdıq. O dedi: "Onlara nə olub ki, əllərini tərpənən at quyruqları kimi göyə qaldırıblar?! Namazda sükunətdə olun!"

١١٨٥ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ مِسْعَرٍ ، عَنْ عُبَيْدِ اللهِ ابْنِ الْقِبْطِيَّةِ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : كُنَّا نُصَلِّي خَلْفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَنُسَلِّمُ بِأَيْدِينَا فَقَالَ : مَا بَالُ هَؤُلَاءِ يُسَلِّمُونَ بِأَيْدِيهِمْ كَأَنَّهَا أَذْنَابُ خَيْلٍ شُمُسٍ ؟ أَمَا يَكْفِي أَحَدُهُمْ أَنْ يَضَعَ يَدَهُ عَلَى فَخِذِهِ ثُمَّ يَقُولَ : السَّلَامُ عَلَيْكُمْ ، السَّلَامُ عَلَيْكُمْ.

1185. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﷺ demişdir: "Biz Allahın Peyğəmbərinin ﷺ arxasında namaz qılırdıq və namazda əllərimizlə salamlaşardıq. O dedi: "Onlara nə olub ki, tərpənən at quyruqları kimi əlləri ilə namazda salamlaşırlar. Onlardan birinə əllərini budlarının üstünə qoyub sonra: "əs-Sələ:mu aleykum, əs-Sələ:mu aleykum" – demək kifayət etmirmi?!.

٦ - بَابُ رَدِّ السَّلَامِ بِالإِشَارَةِ فِي الصَّلَاةِ.

## 6-cı fəsil: Namazda işarə edərək salam almaq

١١٨٦ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ بُكَيْرٍ ، عَنْ نَابِلٍ ، صَاحِبِ الْعَبَاءِ ، عَنِ ابْنِ عُمَرَ ، عَنْ صُهَيْبٍ

صَاحِبِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَرَرْتُ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يُصَلِّي فَسَلَّمْتُ عَلَيْهِ ، فَرَدَّ عَلَيَّ إِشَارَةً ، وَلاَ أَعْلَمُ إِلاَّ أَنَّهُ قَالَ بِإِصْبَعِهِ.

1186. ...Rəvayət edilir ki, Allah Elçisinin ﷺ səhabəsi Suheyb ﷺ demişdir: "Mən Allah Elçisi ﷺ namaz qılarkən yanından keçdim və ona salam verdim. O da işarə ilə mənim salamımı aldı. Mənim salamımı almasını yalnız barmağı ilə işarə etməsindən bildim".

١١٨٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ الْمَكِّيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ زَيْدِ ابْنِ أَسْلَمَ قَالَ : قَالَ ابْنُ عُمَرَ : دَخَلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَسْجِدَ قُبَاءَ لِيُصَلِّيَ فِيهِ ، فَدَخَلَ عَلَيْهِ رِجَالٌ يُسَلِّمُونَ عَلَيْهِ ، فَسَأَلْتُ صُهَيْبًا وَكَانَ مَعَهُ : كَيْفَ كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ إِذَا سُلِّمَ عَلَيْهِ ؟ قَالَ : كَانَ يُشِيرُ بِيَدِهِ.

1187. ...Rəvayət edilir ki, İbn Ömər رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Qubə məscidinə namaz qılmaq üçün gəlmişdi. Bu zaman ora başqa insanlar gələr və ona salam verərdilər. Mən onun yanında olan Suheybdən soruşdum: "Peyğəmbər ﷺ ona verilən salamları necə alırdı?" O dedi: "Əli ilə işarə edərdi".

١١٨٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا وَهْبٌ ، يَعْنِي ابْنَ جَرِيرٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ قَيْسِ بْنِ سَعْدٍ ، عَنْ عَطَاءٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَلِيٍّ ، عَنْ عَمَّارِ بْنِ يَاسِرٍ ، أَنَّهُ سَلَّمَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يُصَلِّي فَرَدَّ عَلَيْهِ.

1188. ...Muhəmməd ibn Əli رحمه الله rəvayət edir ki, Əmmar ibn Yasir Allah Elçisinə ﷺ namazda olduğu halda salam vermiş, o da onun salamını qaytarmışdı.

١١٨٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : بَعَثَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِحَاجَةٍ ثُمَّ أَدْرَكْتُهُ وَهُوَ يُصَلِّي ، فَسَلَّمْتُ عَلَيْهِ فَأَشَارَ إِلَيَّ ، فَلَمَّا فَرَغَ دَعَانِي فَقَالَ : إِنَّكَ سَلَّمْتَ عَلَيَّ آنِفًا وَأَنَا أُصَلِّي ، وَإِنَّمَا هُوَ مُوَجَّهٌ يَوْمَئِذٍ إِلَى الْمَشْرِقِ.

1189. ...Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: "Allah Elçisi ﷺ məni bir iş üçün göndərmişdi. Sonra mən ona çatdım. O, namaz qılırdı və mən ona salam verdim. O, mənim salamımı işarə ilə aldı. Namazı bitirdikdən sonra məni çağırıb dedi: "Bir qədər əvvəl mən namaz qıldığım halda sən mənə salam verdin". Həqiqətən, bu vaxt o, üzünü məşriqə tutub (namaz qılırdı)".

١١٩٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ هَاشِمٍ الْبَعْلَبَكِّيُّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ شُعَيْبِ بْنِ شَابُورَ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : بَعَثَنِي النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَتَيْتُهُ وَهُوَ يَسِيرُ مُشَرِّقًا أَوْ مُغَرِّبًا ، فَسَلَّمْتُ عَلَيْهِ ، فَأَشَارَ بِيَدِهِ ، ثُمَّ سَلَّمْتُ عَلَيْهِ ، فَأَشَارَ بِيَدِهِ ، فَانْصَرَفْتُ ، فَنَادَانِي : يَا جَابِرُ ، فَنَادَانِي النَّاسُ : يَا جَابِرُ ، فَأَتَيْتُهُ فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنِّي سَلَّمْتُ عَلَيْكَ فَلَمْ تَرُدَّ عَلَيَّ ، قَالَ : إِنِّي كُنْتُ أُصَلِّي.

1190. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Peyğəmbər ﷺ məni bir iş dalınca göndərmişdi. (Qayıtdıqda) o, məşriq və ya məğrib tərəfə yönəlmişdi. Ona salam verdikdə, əli ilə işarə etdi. Sonra yenə salam verdim. O, yenə əli ilə işarə etdi. Mən dönüb getdikdə, məni çağırıb dedi: “Ey Cabir!” Camaat da: “Ey Cabir!”- deyərək məni çağırdılar: Mən qayıdıb dedim: “Ey Allahın Elçisi, mən sənə salam verdikdə, sən mənim salamımı almadın”. O dedi: “(Həmin vaxt) mən namaz qılırdım”.

٧ - النَّهْيُ عَنْ مَسْحِ الْحَصَى فِي الصَّلاَةِ.

## 7-ci fəsil: Namazda xırda daşlara əl sürtmək

١١٩١ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، وَالْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، وَاللَّفْظُ لَهُ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ أَبِي ذَرٍّ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا قَامَ أَحَدُكُمْ فِي الصَّلاَةِ فَلاَ يَمْسَحِ الْحَصَى ، فَإِنَّ الرَّحْمَةَ تُوَاجِهُهُ.

1191. ...Rəvayət edilir ki, Əbu Zərr ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən biriniz namaza durduqda, səcdə yerində və ya səcdə edərkən üzünə yapışan daşlarla məşğul olmasın, çünki Allahın rəhməti onunla üzbəüzdür”.[1]

٨ - بَابُ الرُّخْصَةِ فِيهِ مَرَّةً.

## 8-ci fəsil: Namazda səcdə vaxtı mane olan daşları bir dəfə uzaqlaşdırmağın icazəli olması

١١٩٢ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنِي مُعَيْقِيبٌ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنْ كُنْتَ لاَ بُدَّ فَاعِلاً فَمَرَّةً.

1192. ...Muayqib ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Əgər bunu etmək (namazda səcdə vaxtı mane olan daşları bir dəfə uzaqlaşdırmaq) labüddürsə, bunu bir dəfə et”.

---

[1] Hədis zəifdir.

٩ - النَّهْيُ عَنْ رَفْعِ الْبَصَرِ إِلَى السَّمَاءِ فِي الصَّلاَةِ.

## 9-cu fəsil: Namazda göyə baxmağın qadağan olması

١١٩٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، وَشُعَيْبُ بْنُ يُوسُفَ ، عَنْ يَحْيَى وَهُوَ ابْنُ سَعِيدٍ الْقَطَّانُ ، عَنْ ابْنِ أَبِي عَرُوبَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَا بَالُ أَقْوَامٍ يَرْفَعُونَ أَبْصَارَهُمْ إِلَى السَّمَاءِ فِي صَلاَتِهِمْ ، فَاشْتَدَّ قَوْلُهُ فِي ذَلِكَ حَتَّى قَالَ : لَيَنْتَهُنَّ عَنْ ذَلِكَ أَوْ لَتُخْطَفَنَّ أَبْصَارُهُمْ.

1193. ...Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Bu camaata nə olur ki, namazda göyə baxırlar?!” Onun bu məsələyə aid sözü şiddətləndi və o dedi: “Ya onlar bu işi tərk edəcəklər, ya da onlar kor olacaqlar”.

١١٩٤ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ يُونُسَ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ رَجُلاً مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا كَانَ أَحَدُكُمْ فِي الصَّلاَةِ فَلاَ يَرْفَعْ بَصَرَهُ إِلَى السَّمَاءِ أَنْ يُلْتَمَعَ بَصَرُهُ.

1194. ...Rəvayət edilir ki, Ubeydullah ibn Abdullah ﵀ Peyğəmbərin ﷺ səhabələrindən bir kişi Allah Elçisinin ﷺ belə dediyini eşitmişdir: “Sizdən biriniz namazda olarkən gözlərini səmaya qaldırmasın, yoxsa kor olar”.

١٠ - بَابُ التَّشْدِيدِ فِي الاِلْتِفَاتِ فِي الصَّلاَةِ

## 10-cu fəsil: Namazda sağa və sola baxmağın qınanması

١١٩٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ قَالَ : سَمِعْتُ أَبَا الأَحْوَصِ يُحَدِّثُنَا فِي مَجْلِسِ سَعِيدِ ابْنِ الْمُسَيَّبِ وَابْنُ الْمُسَيَّبِ جَالِسٌ ، أَنَّهُ سَمِعَ أَبَا ذَرٍّ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَزَالُ اللَّهُ عَزَّ وَجَلَّ مُقْبِلاً عَلَى الْعَبْدِ فِي صَلاَتِهِ مَا لَمْ يَلْتَفِتْ ، فَإِذَا صَرَفَ وَجْهَهُ انْصَرَفَ عَنْهُ.

1195. ...Rəvayət edilir ki, Əbu Zərr ﵁ demişdir: “Bəndə namazında üzünü başqa tərəfə çevirmədikcə, Allah ﷻ ona yönəlmiş olar. Əgər bəndə namazında üzünü çevirsə, Allah da Üzünü ondan çevirər”.[1]

١١٩٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا زَائِدَةُ ، عَنْ أَشْعَثَ بْنِ أَبِي الشَّعْثَاءِ ، عَنْ أَبِيهِ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الاِلْتِفَاتِ فِي الصَّلاَةِ ، فَقَالَ : اخْتِلاَسٌ يَخْتَلِسُهُ الشَّيْطَانُ مِنَ الصَّلاَةِ

[1] Hədis zəifdir.

1196. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisindən ﷺ namazda o yan bu yana baxmaq barəsində soruşdum. O dedi: ”Bu, şeytanın namazdan oğurluq etməsidir”.

١١٩٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَشْعَثَ ، عَنْ أَبِيهِ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بِمِثْلِهِ.

1197. ...Eyni hədisdir.

١١٩٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا إِسْرَائِيلُ ، عَنْ أَشْعَثَ بْنِ أَبِي الشَّعْثَاءِ ، عَنْ أَبِي عَطِيَّةَ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بِمِثْلِهِ.

1198. ...Eyni hədisdir.

١١٩٩ - أَخْبَرَنَا هِلاَلُ بْنُ الْعَلاَءِ بْنِ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا الْمُعَافَى بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا الْقَاسِمُ وَهُوَ ابْنُ مَعْنٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ عُمَارَةَ ، عَنْ أَبِي عَطِيَّةَ قَالَ : قَالَتْ عَائِشَةُ : إِنَّ الاِلْتِفَاتَ فِي الصَّلاَةِ اخْتِلاَسٌ يَخْتَلِسُهُ الشَّيْطَانُ مِنَ الصَّلاَةِ.

1199. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Namazda o yan bu yana baxmaq şeytanın namazdan oğurluq etməsidir”.

١١ - بَابُ الرُّخْصَةِ فِي الاِلْتِفَاتِ فِي الصَّلاَةِ يَمِينًا وَشِمَالاً.

## 11-ci fəsil: Namaz əsnasında ehtiyac olarsa, (boynu çevirmədən) sağa və sola çevrilməyin icazəli olması

١٢٠٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ أَنَّهُ قَالَ : اشْتَكَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَصَلَّيْنَا وَرَاءَهُ وَهُوَ قَاعِدٌ ، وَأَبُو بَكْرٍ يُكَبِّرُ يُسْمِعُ النَّاسَ تَكْبِيرَهُ ، فَالْتَفَتَ إِلَيْنَا فَرَآنَا قِيَامًا ، فَأَشَارَ إِلَيْنَا فَقَعَدْنَا ، فَصَلَّيْنَا بِصَلاَتِهِ قُعُودًا ، فَلَمَّا سَلَّمَ قَالَ : إِنْ كُنْتُمْ آنِفًا تَفْعَلُونَ فِعْلَ فَارِسَ وَالرُّومِ يَقُومُونَ عَلَى مُلُوكِهِمْ وَهُمْ قُعُودٌ فَلاَ تَفْعَلُوا ، ائْتَمُّوا بِأَئِمَّتِكُمْ إِنْ صَلَّى قَائِمًا فَصَلُّوا قِيَامًا ، وَإِنْ صَلَّى قَاعِدًا فَصَلُّوا قُعُودًا.

1200. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Allah Elçisi ﷺ xəstələnmişdi. Biz onun arxasında namaz qılırdıq. O, (xəstə olduğu üçün) oturduğu halda namaz qılırdı. Əbu Bəkr təkbir edər və təkbir etməyini insanlara eşitdirərdi. Allah Elçisi ﷺ bizə tərəf çevrildi və bizim ayaq üstə namaz qıldığımızı gördü. O, bizə oturmağımız üçün işarə etdi. Biz də oturduq və onun arxasında oturmuş halda namaz qıldıq. Allah Elçisi ﷺ salam verib namazı

bitirdikdə dedi: “Siz Farsların və Rumluların etdiyi kimi edirdiniz. Onların padşahları oturduqları halda onlar ayaq üstə dayanardılar. Belə etməyin! Öz imamlarınıza tabe olun. Əgər o, ayaq üstə namaz qılsa, siz də ayaq üstə namaz qılın. O, oturaraq namaz qılsa, siz də oturaraq namaz qılın”.

١٢٠١ - أَخْبَرَنَا أَبُو عَمَّارٍ الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ عَبْدِ اللهِ بْنِ سَعِيدِ بْنِ أَبِي هِنْدٍ ، عَنْ ثَوْرِ بْنِ زَيْدٍ ، عَنْ عِكْرِمَةَ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَلْتَفِتُ فِي صَلاَتِهِ يَمِينًا وَشِمَالاً ، وَلاَ يَلْوِي عُنُقَهُ خَلْفَ ظَهْرِهِ.

1201. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisi ﷺ namazda sağa və sola tərəf çevrilib baxar, lakin boynunu arxaya tərəf çevirməzdi”.

١٢ - بَابُ قَتْلِ الْحَيَّةِ وَالْعَقْرَبِ فِي الصَّلاَةِ.

## 12-ci fəsil: Namaz əsnasında ilan və əqrəbin öldürülməsi

١٢٠٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ سُفْيَانَ ، وَيَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، عَنْ مَعْمَرٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ ضَمْضَمِ بْنِ جَوْسٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : أَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِقَتْلِ الأَسْوَدَيْنِ فِي الصَّلاَةِ.

1202. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ namaz əsnasında iki qaranı (ilan və əqrəb) öldürməyi əmr etdi”.

١٢٠٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ وَهُوَ ابْنُ أَبِي عَبْدِ اللهِ ، عَنْ مَعْمَرٍ ، عَنْ يَحْيَى ، عَنْ ضَمْضَمٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمَرَ بِقَتْلِ الأَسْوَدَيْنِ فِي الصَّلاَةِ.

1203. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ namaz əsnasında iki qaranı (ilan və əqrəb) öldürməyi əmr etdi.

١٣ - حَمْلُ الصَّبَايَا فِي الصَّلاَةِ وَوَضْعُهُنَّ فِي الصَّلاَةِ.

## 13-cü fəsil: Namazda kiçik uşaqları qucağa alıb yerə qoymaq

١٢٠٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ ، عَنْ عَامِرِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ عَمْرِو بْنِ سُلَيْمٍ ، عَنْ أَبِي قَتَادَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي وَهُوَ حَامِلٌ أُمَامَةَ ، فَإِذَا سَجَدَ وَضَعَهَا ، وَإِذَا قَامَ رَفَعَهَا.

1204. ...Qatədə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ qucağında Umamə olduğu halda namaz qılar, səcdə etdikdə onu yerə qoyar, ayağa qalxdıqda isə onu qucağına götürərdi.

١٢٠٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عُثْمَانَ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَامِرِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ عَمْرِو بْنِ سُلَيْمٍ ، عَنْ أَبِي قَتَادَةَ قَالَ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَؤُمُّ النَّاسَ وَهُوَ حَامِلٌ أُمَامَةَ بِنْتَ أَبِي الْعَاصِ عَلَى عَاتِقِهِ ، فَإِذَا رَكَعَ وَضَعَهَا ، فَإِذَا فَرَغَ مِنْ سُجُودِهِ أَعَادَهَا.

1205. ...Rəvayət ediir ki, Qatədə ﷺ demişdir: “Peyğəmbərin ﷺ insanlara namaz qıldırdığını və çiynində də Umənə bint Əbul-Ası tutduğunu gördüm. Ruku etdikdə, onu yerə qoydu. Səcdəni bitirdikdə isə yenidən onu çiyninə götürdü”.

١٤ - بَابُ الْمَشْيِ أَمَامَ الْقِبْلَةِ خُطًى يَسِيرَةً.

## 14-cü fəsil: Qibləyə doğru az miqdarda addım atmaq

١٢٠٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ وَرْدَانَ ، قَالَ : حَدَّثَنَا بُرْدُ بْنُ سِنَانٍ أَبُو الْعَلَاءِ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : اسْتَفْتَحْتُ الْبَابَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي تَطَوُّعًا وَالْبَابُ عَلَى الْقِبْلَةِ فَمَشَى عَنْ يَمِينِهِ أَوْ عَنْ يَسَارِهِ ، فَفَتَحَ الْبَابَ ثُمَّ رَجَعَ إِلَى مُصَلاَّهُ.

1206. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: “Mən evin qapısının açılmasını istədikdə, Allah Elçisi ﷺ nafilə namaz qılırdı. Qapı onun qibləsi istiqamətində idi. O, sağ və ya sol tərəfdən bir neçə addım atıb qapını açdı, sonra da namaza qayıtdı”.

١٥ - بَابُ التَّصْفِيقِ فِي الصَّلَاةِ.

## 15-ci fəsil: Namazda əli ələ vurmaq

١٢٠٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : التَّسْبِيحُ لِلرِّجَالِ ، وَالتَّصْفِيقُ لِلنِّسَاءِ ، زَادَ ابْنُ الْمُثَنَّى : فِي الصَّلاَةِ.

1207. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurdu: “(İmam namazda xəta etdikdə) təsbih etmək (“Subhən-Allah” demək) kişilərə, əli ələ vurmaq isə qadınlara aiddir”. İbn Musənnənin rəvayətində: “Namazda”- deyilir.

١٢٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ قَالَ : أَخْبَرَنِي سَعِيدُ بْنُ الْمُسَيَّبِ ، وَأَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، أَنَّهُمَا سَمِعَا أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ التَّسْبِيحُ لِلرِّجَالِ وَالتَّصْفِيقُ لِلنِّسَاءِ.

1208. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "(İmam namazda xəta etdikdə) təsbih etmək kişilərə, əli ələ vurmaq isə qadınlara aiddir".

١٦ - بَابُ التَّسْبِيحِ فِي الصَّلاَةِ.

16-cı fəsil: Namazda təsbih etmək

١٢٠٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ بْنُ عِيَاضٍ ، عَنِ الأَعْمَشِ (ح) وَأَنْبَأَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُلَيْمَانَ الأَعْمَشِ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : التَّسْبِيحُ لِلرِّجَالِ وَالتَّصْفِيقُ لِلنِّسَاءِ.

1209. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "(İmam namazda xəta etdikdə) təsbih etmək kişilərə, əli ələ vurmaq isə qadınlara aiddir".

١٢١٠ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ عَوْفٍ قَالَ : حَدَّثَنِي مُحَمَّدٌ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : التَّسْبِيحُ لِلرِّجَالِ وَالتَّصْفِيقُ لِلنِّسَاءِ.

1210. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "(İmam namazda xəta etdikdə) təsbih etmək kişilərə, əli ələ vurmaq isə qadınlara aiddir".

١٧ - التَّنَحْنُحُ فِي الصَّلاَةِ

17-cı fəsil: Namazda öskürmək haqda

١٢١١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنِ الْمُغِيرَةِ ، عَنِ الْحَارِثِ الْعُكْلِيِّ ، عَنْ أَبِي زُرْعَةَ بْنِ عَمْرِو بْنِ جَرِيرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ نُجَيٍّ ، عَنْ عَلِيٍّ قَالَ : كَانَ لِي مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَاعَةٌ آتِيهِ فِيهَا ، فَإِذَا أَتَيْتُهُ اسْتَأْذَنْتُ إِنْ وَجَدْتُهُ يُصَلِّي فَتَنَحْنَحَ دَخَلْتُ ، وَإِنْ وَجَدْتُهُ فَارِغًا أَذِنَ لِي.

1211. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: "Mənim Allah Elçisinin ﷺ yanına gəldiyim müəyyən vaxtım var idi. Gəldiyim zaman izn istəyərdim. Əgər namazda olardısa, mənə işarə etmək üçün öskürərdi, mən də içəri girərdim. Əgər namazda olmazdısa, içəri girməyimə izn verərdi".[1]

١٢١٢ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَيَّاشٍ ، عَنْ مُغِيرَةَ ، عَنِ الْحَارِثِ الْعُكْلِيِّ ، عَنِ ابْنِ نُجَيٍّ ، قَالَ : قَالَ عَلِيٌّ : كَانَ لِي مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَدْخَلاَنِ : مَدْخَلٌ بِاللَّيْلِ ، وَمَدْخَلٌ بِالنَّهَارِ ، فَكُنْتُ إِذَا دَخَلْتُ بِاللَّيْلِ تَنَحْنَحَ لِي.

---

[1] Hədisin isnadı zəifdir.

1212. ...Rəvayət edilir ki, Əli ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ yanına iki vaxtda - gecə və gündüz gələrdim. Onun yanına gecə vaxtı gəldikdə (əgər namazda olardısa) işarə etmək üçün öskürərdi”.[1]

١٢١٣ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا بْنِ دِينَارٍ ، قَالَ : حَدَّثَنَا أَبُو أُسَامَةَ ، قَالَ : حَدَّثَنِي شُرَحْبِيلُ ، يَعْنِي ابْنَ مُدْرِكٍ ، قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ نُجَيٍّ ، عَنْ أَبِيهِ ، قَالَ : قَالَ لِي عَلِيٌّ : كَانَتْ لِي مَنْزِلَةٌ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمْ تَكُنْ لأَحَدٍ مِنَ الْخَلاَئِقِ ، فَكُنْتُ آتِيهِ كُلَّ سَحَرٍ ، فَأَقُولُ : السَّلاَمُ عَلَيْكَ يَا نَبِيَّ اللهِ ، فَإِنْ تَنَحْنَحَ انْصَرَفْتُ إِلَى أَهْلِي ، وَإِلاَّ دَخَلْتُ عَلَيْهِ.

1213. ...Abdullah ibn Nucey atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Əli mənə dedi: “Allah Elçisinin ﷺ yanında yaradılmışlardan heç kimdə olmayan xüsusi məqamım var idi. Hər səhər onun yanına gedər və: “Sənə salam olsun, ey Allahın Peyğəmbəri!”- deyərdim. Əgər öskürərdisə, geri qayıdar, öskürməzdisə, onun yanına içəri daxil olardım”.[2]

١٨ - بَابُ الْبُكَاءِ فِي الصَّلاَةِ

## 18-ci fəsil: Namazda ağlamaq

١٢١٤ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ حَمَّادِ بْنِ سَلَمَةَ ، عَنْ ثَابِتٍ الْبُنَانِيِّ ، عَنْ مُطَرِّفٍ ، عَنْ أَبِيهِ ، قَالَ : أَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَهُوَ يُصَلِّي وَلِجَوْفِهِ أَزِيزٌ كَأَزِيزِ الْمِرْجَلِ يَعْنِي : يَبْكِي.

1214. ...Mutarrif atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Mən Peyğəmbərin ﷺ yanına gəlmişdim. O, namaz qılır və hıçqıraraq ağlayırdı”.

١٩ - بَابُ لَعْنِ إِبْلِيسَ وَالتَّعَوُّذِ بِاللَّهِ مِنْهُ فِي الصَّلاَةِ

## 19-cu fəsil: Namazda İblisi lənətləmək və ondan Allaha sığınmaq

١٢١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، قَالَ : حَدَّثَنِي رَبِيعَةُ بْنُ يَزِيدَ ، عَنْ أَبِي إِدْرِيسَ الْخَوْلاَنِيِّ ، عَنْ أَبِي الدَّرْدَاءِ ، قَالَ : قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فَسَمِعْنَاهُ يَقُولُ : أَعُوذُ بِاللَّهِ مِنْكَ ، ثُمَّ قَالَ : أَلْعَنُكَ بِلَعْنَةِ اللهِ ثَلاَثًا ، وَبَسَطَ يَدَهُ كَأَنَّهُ يَتَنَاوَلُ شَيْئًا ، فَلَمَّا فَرَغَ مِنَ الصَّلاَةِ قُلْنَا : يَا رَسُولَ اللهِ ، قَدْ سَمِعْنَاكَ تَقُولُ فِي الصَّلاَةِ شَيْئًا لَمْ نَسْمَعْكَ تَقُولُهُ قَبْلَ ذَلِكَ ، وَرَأَيْنَاكَ بَسَطْتَ يَدَكَ ، قَالَ : إِنَّ عَدُوَّ اللهِ إِبْلِيسَ جَاءَ بِشِهَابٍ مِنْ نَارٍ لِيَجْعَلَهُ فِي وَجْهِي ، فَقُلْتُ : أَعُوذُ بِاللَّهِ مِنْكَ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ قُلْتُ : أَلْعَنُكَ بِلَعْنَةِ اللهِ ، فَلَمْ يَسْتَأْخِرْ ثَلاَثَ مَرَّاتٍ ، ثُمَّ أَرَدْتُ أَنْ آخُذَهُ ، وَاللَّهِ لَوْلاَ دَعْوَةُ أَخِينَا سُلَيْمَانَ لأَصْبَحَ مُوثَقًا بِهَا يَلْعَبُ بِهِ وِلْدَانُ أَهْلِ الْمَدِينَةِ.

---

[1] Hədisin isnadı zəifdir.
[2] Hədisin isnadı zəifdir.

1215. ...Rəvayət edilir ki, Əbud-Dərdə ﵁ demişdir: “Allah Elçisi ﷺ ayağa qalxıb namaza başladı və biz onun belə dediyini eşitdik: “Səndən Allaha sığınıram!” Sonra üç dəfə dedi: “Səni Allahın lənəti ilə lənətləyirəm!”- və əlini sanki qarşısındakı bir şeyi götürmək üçün uzatdı. Namazı bitirdikdən sonra biz ona dedik: “Ey Allahın Elçisi, bundan qabaq demədiyin şeyləri eşitdik və əlini nəyəsə uzatdığını gördük”. O dedi: “Həqiqətən, Allahın düşməni İblis oddan bir parça ilə onu üzümə vurmaq üçün gəlmişdi. Mən üç dəfə: “Səndən Allaha sığınıram!”- dedim. Sonra dedim: “Səni Allahın lənəti ilə lənətləyirəm!” Lakin o, çıxıb getmədi. Sonra onu tutmaq istədim. Allaha and olsun, qardaşım Süleymanın duası olmasaydı, onu tutub məscidin sütunlarına bağlayardım və Mədinə uşaqları onunla oynayaradılar”.

## ٢٠ - الْكَلاَمُ فِي الصَّلاَةِ

## 20-ci fəsil: Namazda danışmaq

١٢١٦ - أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ : قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الصَّلاَةِ وَقُمْنَا مَعَهُ ، فَقَالَ أَعْرَابِيٌّ وَهُوَ فِي الصَّلاَةِ : اللَّهُمَّ ارْحَمْنِي وَمُحَمَّدًا وَلاَ تَرْحَمْ مَعَنَا أَحَدًا ، فَلَمَّا سَلَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ لِلأَعْرَابِيِّ : لَقَدْ تَحَجَّرْتَ وَاسِعًا يُرِيدُ رَحْمَةَ اللهِ عَزَّ وَجَلَّ.

1216. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ namaz qılmaq üçün ayağa qalxdı və biz də onunla birlikdə ayağa qalxdıq. Bir bədəvi namazda dedi: “Allahım, mənə və Muhəmmədə rəhm et, bizdən başqa heç kimə rəhm etmə!” Allah Elçisi ﷺ namazı bitirdikdən sonra Allahın ﷻ rəhmətini qəsd edərək bədəviyə dedi: “Sən geniş olanı daraltdın”.

١٢١٧ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ الزُّهْرِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : أَحْفَظُهُ مِنَ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي سَعِيدٌ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ أَعْرَابِيًّا دَخَلَ الْمَسْجِدَ فَصَلَّى رَكْعَتَيْنِ ثُمَّ قَالَ : اللَّهُمَّ ارْحَمْنِي وَمُحَمَّدًا وَلاَ تَرْحَمْ مَعَنَا أَحَدًا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَقَدْ تَحَجَّرْتَ وَاسِعًا.

1217. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, bir bədəvi məscidə gəlib iki rükət namaz qıldı, sonra da dedi: “Allahım, mənə və Muhəmmədə rəhm et, bizdən başqa heç kimə rəhm etmə!” Allah Elçisi ﷺ dedi: “Sən geniş olanı daraltdın”.

١٢١٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ هِلاَلِ بْنِ أَبِي مَيْمُونَةَ ، قَالَ : حَدَّثَنِي عَطَاءُ بْنُ يَسَارٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ الْحَكَمِ السَّلَمِيِّ ، قَالَ : قُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنَّا حَدِيثُ عَهْدٍ بِجَاهِلِيَّةٍ فَجَاءَ اللَّهُ بِالإِسْلاَمِ ، وَإِنَّ رِجَالاً مِنَّا يَتَطَيَّرُونَ ، قَالَ : ذَاكَ شَيْءٌ يَجِدُونَهُ فِي صُدُورِهِمْ ، فَلاَ يَصُدَّنَّهُمْ وَرِجَالٌ مِنَّا يَأْتُونَ الْكُهَّانَ ، قَالَ : " فَلاَ تَأْتُوهُمْ ، قَالَ : يَا رَسُولَ اللهِ ، وَرِجَالٌ مِنَّا يَخُطُّونَ ، قَالَ : كَانَ نَبِيٌّ مِنَ الأَنْبِيَاءِ يَخُطُّ ، فَمَنْ وَافَقَ خَطَّهُ ، فَذَاكَ قَالَ : وَبَيْنَا أَنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الصَّلاَةِ إِذْ عَطَسَ رَجُلٌ مِنَ الْقَوْمِ ، فَقُلْتُ : يَرْحَمُكَ اللَّهُ ، فَحَدَّقَنِي الْقَوْمُ بِأَبْصَارِهِمْ ، فَقُلْتُ : وَاثُكْلَ أُمِّيَاهُ ، مَا لَكُمْ تَنْظُرُونَ إِلَيَّ ؟ قَالَ : فَضَرَبَ الْقَوْمُ بِأَيْدِيهِمْ عَلَى أَفْخَاذِهِمْ ، فَلَمَّا رَأَيْتُهُمْ يُسَكِّتُونِي لَكِنِّي سَكَتُّ ، فَلَمَّا انْصَرَفَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَعَانِي بِأَبِي وَأُمِّي ، هُوَ مَا ضَرَبَنِي ، وَلاَ كَهَرَنِي ، وَلاَ سَبَّنِي ، مَا رَأَيْتُ مُعَلِّمًا قَبْلَهُ وَلاَ بَعْدَهُ أَحْسَنَ تَعْلِيمًا مِنْهُ ، قَالَ : إِنَّ صَلاَتَنَا هَذِهِ لاَ يَصْلُحُ فِيهَا شَيْءٌ مِنْ كَلاَمِ النَّاسِ ، إِنَّمَا هُوَ التَّسْبِيحُ وَالتَّكْبِيرُ ، وَتِلاَوَةُ الْقُرْآنِ قَالَ : ثُمَّ اطَّلَعْتُ إِلَى غُنَيْمَةٍ لِي تَرْعَاهَا جَارِيَةٌ لِي فِي قِبَلِ أُحُدٍ وَالْجَوَّانِيَّةِ ، وَإِنِّي اطَّلَعْتُ فَوَجَدْتُ الذِّئْبَ قَدْ ذَهَبَ مِنْهَا بِشَاةٍ ، وَأَنَا رَجُلٌ مِنْ بَنِي آدَمَ آسَفُ كَمَا يَأْسَفُونَ ، فَصَكَكْتُهَا صَكَّةً ، ثُمَّ انْصَرَفْتُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَخْبَرْتُهُ ، فَعَظَّمَ ذَلِكَ عَلَيَّ فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، أَفَلاَ أَعْتِقُهَا ؟ قَالَ : ادْعُهَا ، فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَيْنَ اللَّهُ عَزَّ وَجَلَّ ؟ ، قَالَتْ : فِي السَّمَاءِ ، قَالَ : فَمَنْ أَنَا ؟ قَالَتْ : أَنْتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِنَّهَا مُؤْمِنَةٌ فَاعْتِقْهَا.

1218. ...Rəvayət edilir ki, Muaviyə ibn əl-Həkəm əs-Sələmi ﵁ demişdir: “Ey Allahın Elçisi! Biz cahiliyyə dövründə yaşayırdıq. Sonra Allah İslamı bizə bəxş etdi. Bəzilərimiz düşər-düşməzliyə inanırdıq”. O dedi: “Düşər-düşməzlik onların qəlblərinə sızan bir şeydir. Belə şeylər sizi işlərinizdən qoymasın”. Mən dedim: “Bizdən bəzilərimiz kahinlərin yanına gedərək onların dediklərinə inanırlar”. Allah Elçisi ﷺ dedi: “Onların yanına getməyin!” Mən dedim: “Bəzilərimiz yerdə xətlər çəkərək falçılıq edirlər”. O dedi: “Bəzi peyğəmbərlər də yerdə xətlər çəkirdi. Onların xətt çəkmələri peyğəmbərlərinkinə uyğun olsa, o da onlar kimidir”. Mən namazda Allah Elçisi ﷺ ilə birlikdə idim. Camaatdan bir nəfər asqırdı. Mən: “Allah sənə rəhm etsin!”[1]- dedim. Buna görə camaat mənə pis baxdı”. Mən də: “Analarınız sizin üçün ağlasın, nə baxırsız?!”- dedim. Bu dəfə hamısı əlləri ilə çiyinlərinə vurdular. Məni susdurmaq istədiklərini başa düşdüm və susdum. Allah Elçisi ﷺ namazını bitirən kimi məni çağırdı. Anam-atam ona fəda olsun! Məni nə vurdu, nə danladı, nə də söydü. Nə əvvəl, nə də sonralar onun kimi gözəl müəllim görmədim. Mənə belə dedi: “Bizim qıldığımız namazda insanlarla söhbət etmək olmaz. Burda təsbih və təkbir deyilir, Quran oxunur”. Sonra mən Uhud tərəfdə olan Cəvvaniyyə deyilən yerə cariyəmin otardığı qoyunlarımın yanına getdim. Bir də gördüm ki, qoyunlarımdan bir qoyunu canavar aparıb. Mən də Adəm övladı olduğum

[1] Transkripsiyası: Yərhəmuk-Allah!

üçün təəssüfləndim və cariyəni vurdum. Sonra Allah Elçisinin ﷺ yanına gələrək vəziyyəti ona xəbər verdim. Allah Elçisi ﷺ etdiyim əmələ görə məni qınadı. Mən dedim: "Ey Allahın Elçisi, onu azad edimmi?" Allah Elçisi ﷺ dedi: "Onu yanıma çağır." Allah Elçisi ﷺ ona dedi: "Allah ﷻ hardadır?" Cariyə: "Göydə!"- dedi O dedi: "Bəs mən kiməm?" Cariyə: "Sən Allahın Elçisisən!"- dedi. Allah Elçisi ﷺ dedi: "O, mömin qadındır. Onu azad et!"

١٢١٩ - أَخْبَرَنَا إِسْمَاعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَاعِيلُ بْنُ أَبِي خَالِدٍ ، قَالَ : حَدَّثَنِي الْحَارِثُ بْنُ شُبَيْلٍ ، عَنْ أَبِي عَمْرٍو الشَّيْبَانِيِّ ، عَنْ زَيْدِ بْنِ أَرْقَمَ ، قَالَ : كَانَ الرَّجُلُ يُكَلِّمُ صَاحِبَهُ فِي الصَّلاَةِ بِالْحَاجَةِ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى نَزَلَتْ هَذِهِ الآيَةُ **{حَافِظُوا عَلَى الصَّلَوَاتِ وَالصَّلاَةِ الْوُسْطَى وَقُومُوا لِلَّهِ قَانِتِينَ}** فأمرنا بالسكوت .

1219. ...Rəvayət edilir ki, Zeyd ibn Ərqam ﷺ demişdir: "Allah Elçisinin ﷺ vaxtında bizdən bir kişi namazda öz ehtiyacı olan şeylər haqda danışardı. Buna görə də bu ayə: **"Namazları və** (günortadan sonrakı) **orta namazı qoruyun və Allah qarşısında mütiliklə durun"** (əl-Bəqərə, 238) nazil olduqda, biz namazda sükut etməklə əmr olunduq".

١٢٢٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَمَّارٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي غَنِيَّةَ وَاسْمُهُ يَحْيَى بْنُ عَبْدِ الْمَلِكِ ، وَالْقَاسِمُ بْنُ يَزِيدَ الْجَرْمِيُّ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّبَيْرِ بْنِ عَدِيٍّ ، عَنْ كُلْثُومٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ، وَهَذَا حَدِيثُ الْقَاسِمِ ، قَالَ : كُنْتُ آتِي النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ يُصَلِّي فَأُسَلِّمُ عَلَيْهِ فَيَرُدُّ عَلَيَّ ، فَأَتَيْتُهُ فَسَلَّمْتُ عَلَيْهِ وَهُوَ يُصَلِّي فَلَمْ يَرُدَّ عَلَيَّ ، فَلَمَّا سَلَّمَ أَشَارَ إِلَى الْقَوْمِ ، فَقَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ ــ يَعْنِي ــ أَحْدَثَ فِي الصَّلاَةِ أَنْ لاَ تَكَلَّمُوا إِلاَّ بِذِكْرِ اللهِ ، وَمَا يَنْبَغِي لَكُمْ ، وَأَنْ تَقُومُوا لِلَّهِ قَانِتِينَ.

1220. ...Rəvayət edilir ki, Abdullah ibn Məsud ﷺ demişdir: "Mən Peyğəmbərin ﷺ yanına gələr, o, namaz qıldığı halda ona salam verirdim. O da mənim salamımı alırdı. Bir dəfə mən onun yanına gəldikdə, o, namaz qıldığı halda yenə ona salam verdim, lakin mənim salamımı almadı. Namazı bitirdikdə, camaata işarə etdi və dedi: "Həqiqətən, Allah ﷻ namazda danışmağa deyil, yalnız zikr etməyə icazə verdi. Bu, (yəni namazda danışmaq) sizə yaraşmaz. Allahın hüzurunda müti olaraq dayanın!"

١٢٢١ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ ابْنِ مَسْعُودٍ ، قَالَ : كُنَّا نُسَلِّمُ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَيَرُدُّ عَلَيْنَا السَّلاَمَ حَتَّى قَدِمْنَا مِنْ أَرْضِ الْحَبَشَةِ ، فَسَلَّمْتُ عَلَيْهِ ، فَلَمْ يَرُدَّ عَلَيَّ ، فَأَخَذَنِي مَا قَرُبَ وَمَا

بَعْدَ فَجَلَسْتُ حَتَّى إِذَا قَضَى الصَّلاَةَ ، قَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يُحْدِثُ مِنْ أَمْرِهِ مَا يَشَاءُ ، وَإِنَّهُ قَدْ أَحْدَثَ مِنْ أَمْرِهِ أَنْ لاَ يُتَكَلَّمَ فِي الصَّلاَةِ.

1221. ...Rəvayət edilir ki, İbn Məsud ﷺ demişdir: "Peyğəmbər ﷺ namazda olduqda, biz ona salam verər və o da salamımızı alardı. Biz Həbəşistana gedib gəldikdən sonra ona salam verdik, o isə namazda idi və salamımızı almadı. Məni (onun salamımızı almamasına görə) fikir apardı və mən oturub onun namazı bitirməsini gözlədim. Namazı bitirdikdən sonra Allah Elçisi ﷺ buyurdu: "Həqiqətən, Allah ﷻ istədiyi bir şeyi əmr edir. Allah namazda danışmamağı əmr etdi".

٢١ - مَا يَفْعَلُ مَنْ قَامَ مِنَ اثْنَتَيْنِ نَاسِيًا وَلَمْ يَتَشَهَّدْ.

21-ci fəsil: Təşəhhüdü unudaraq ikinci rükətdən qalxan nə etməlidir?

١٢٢٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ ، عَنْ عَبْدِ اللهِ ابْنِ بُحَيْنَةَ ، قَالَ : صَلَّى لَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَيْنِ ، ثُمَّ قَامَ فَلَمْ يَجْلِسْ ، فَقَامَ النَّاسُ مَعَهُ ، فَلَمَّا قَضَى صَلاَتَهُ وَنَظَرْنَا تَسْلِيمَهُ ، كَبَّرَ فَسَجَدَ سَجْدَتَيْنِ وَهُوَ جَالِسٌ قَبْلَ التَّسْلِيمِ ثُمَّ سَلَّمَ.

1222. ...Rəvayət edilir ki, Abdullah ibn Buheynə ﷺ demişdir: "Allah Elçisi ﷺ bizimlə iki rükət namaz qıldı, sonra oturmadan qalxdı. İnsanlar da onunla bilikdə qalxdılar. Namazı bitirdikdən sonra biz onun salam verməsini gözləyirdik. O isə təkbir edib salamdan qabaq iki dəfə səcdə etdi, sonra salam verdi".

١٢٢٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ هُرْمُزَ ، عَنْ عَبْدِ اللهِ ابْنِ بُحَيْنَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ قَامَ فِي الصَّلاَةِ وَعَلَيْهِ جُلُوسٌ فَسَجَدَ سَجْدَتَيْنِ وَهُوَ جَالِسٌ قَبْلَ التَّسْلِيمِ.

1223. ...Abdullah ibn Buheynə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namazda oturulası yerdə ayağa qalxdı, sonra namazda salam verməmişdən qabaq oturdu və iki dəfə səcdə etdi.

٢٢ - مَا يَفْعَلُ مَنْ سَلَّمَ مِنْ رَكْعَتَيْنِ نَاسِيًا وَتَكَلَّمَ.

22-ci fəsil: İki rükətdən sonra unudaraq namazı bitirən və danışan nə etməlidir?

١٢٢٤ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَوْنٍ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، قَالَ : قَالَ أَبُو هُرَيْرَةَ : صَلَّى بِنَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِحْدَى صَلاَتَيِ الْعَشِيِّ ، قَالَ : قَالَ أَبُو هُرَيْرَةَ : وَلَكِنِّي نَسِيتُ ، قَالَ : فَصَلَّى

بنَا رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، فَانْطَلَقَ إِلَى خَشَبَةٍ مَعْرُوضَةٍ فِي الْمَسْجِدِ ، فَقَالَ بِيَدِهِ عَلَيْهَا كَأَنَّهُ غَضْبَانُ ، وَخَرَجَتِ السَّرَعَانُ مِنْ أَبْوَابِ الْمَسْجِدِ ، فَقَالُوا : قُصِرَتِ الصَّلاَةُ وَفِي الْقَوْمِ أَبُو بَكْرٍ وَعُمَرُ رَضِيَ اللَّهُ عَنْهُمَا ، فَهَابَاهُ أَنْ يُكَلِّمَاهُ وَفِي الْقَوْمِ رَجُلٌ فِي يَدَيْهِ طُولٌ ، قَالَ : كَانَ يُسَمَّى ذَا الْيَدَيْنِ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، أَنَسِيتَ أَمْ قُصِرَتِ الصَّلاَةُ ؟ قَالَ : لَمْ أَنْسَ ، وَلَمْ تُقْصَرِ الصَّلاَةُ ، قَالَ : وَقَالَ : أَكَمَا قَالَ ذُو الْيَدَيْنِ ؟ ، قَالُوا : نَعَمْ ، فَجَاءَ فَصَلَّى الَّذِي كَانَ تَرَكَهُ ثُمَّ سَلَّمَ ، ثُمَّ كَبَّرَ فَسَجَدَ مِثْلَ سُجُودِهِ أَوْ أَطْوَلَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ وَكَبَّرَ ، ثُمَّ كَبَّرَ ، ثُمَّ سَجَدَ مِثْلَ سُجُودِهِ أَوْ أَطْوَلَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، ثُمَّ كَبَّرَ.

1224. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Peyğəmbər ﷺ bizə günorta namazlarından birini qıldırdı. Hansı namaz olduğunu unutdum. O, bizə iki rükət qıldırdı, sonra da salam verdi. Məscidin bir tərəfində yığılmış taxta parçalarına tərəf getdi, sanki qəzəbli halda olaraq əlini taxtaya qoydu. İnsanlar tələsik məscidin qapısından çıxıb: “Namaz qısaldı”- dedilər. Əbu Bəkr və Ömər bu camaatın arasında idi. Onlar bu haqda danışmaqdan çəkindilər. Camaat arasında Zul-Yədeyn adı ilə çağırılan uzun əli olan bir kişi dedi: “Ey Allahın Elçisi! Sən unutdun, yoxsa namaz qısaldı?” O dedi: “Nə unutdum, nə də namaz qısaldı”. Sonra camaatdan soruşdu: “Zul-Yədeyn dediyi kimidirmi?” Onlar: “Bəli!”- dedilər. Allah Elçisi ﷺ gəlib unutduğu hissəni qıldı, sonra salam verdi. Sonra təkbir edib onun kimi və ya ondan bir az uzun səcdə etdi. Sonra başını qaldırdı və təkbir etdi. Sonra təkbir edib onun kimi və ya ondan bir az uzun səcdə etdi. Sonra başını qaldırdı və təkbir etdi”.

١٢٢٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ الْقَاسِمِ ، عَنْ مَالِكٍ ، قَالَ : حَدَّثَنِي أَيُّوبُ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ انْصَرَفَ مِنَ اثْنَتَيْنِ ، فَقَالَ لَهُ ذُو الْيَدَيْنِ : أَقُصِرَتِ الصَّلاَةُ أَمْ نَسِيتَ يَا رَسُولَ اللهِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَصَدَقَ ذُو الْيَدَيْنِ ؟ فَقَالَ النَّاسُ : نَعَمْ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى اثْنَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ كَبَّرَ فَسَجَدَ مِثْلَ سُجُودِهِ أَوْ أَطْوَلَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ ثُمَّ سَجَدَ مِثْلَ سُجُودِهِ أَوْ أَطْوَلَ ثُمَّ رَفَعَ.

1225. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ iki rükətdən sonra namazı bitirdi. Zul-Yədeyn ona dedi: “Namaz qısaldı, yoxsa sən unutdun, ey Allahın Elçisi?” Allah Elçisi ﷺ dedi: “Zul-Yədeyn düz deyirmi?” İnsanlar: “Bəli!”- dedilər. Allah Elçisi ﷺ qalxıb iki rükət qıldı, sonra salam verdi, sonra təkbir edib əvvəl etdiyi kimi və ya ondan uzun səcdə etdi, sonra başını qaldırdı. Sonra yenə əvvəl etdiyi kimi və ya ondan uzun səcdə etdi, sonra da başını qaldırdı”.

١٢٢٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ دَاوُدَ بْنِ الْحُصَيْنِ ، عَنْ أَبِي سُفْيَانَ ، مَوْلَى ابْنِ أَبِي أَحْمَدَ أَنَّهُ قَالَ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : صَلَّى لَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْعَصْرِ ، فَسَلَّمَ فِي رَكْعَتَيْنِ ، فَقَامَ ذُو الْيَدَيْنِ ، فَقَالَ : أَقُصِرَتِ الصَّلاَةُ يَا

رَسُولَ اللهِ أَمْ نَسِيتَ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : كُلُّ ذَلِكَ لَمْ يَكُنْ ، فَقَالَ : قَدْ كَانَ بَعْضُ ذَلِكَ يَا رَسُولَ اللهِ ، فَأَقْبَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى النَّاسِ ، فَقَالَ : أَصَدَقَ ذُو الْيَدَيْنِ ؟ فَقَالُوا : نَعَمْ ، فَأَتَمَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَا بَقِيَ مِنَ الصَّلاَةِ ، ثُمَّ سَجَدَ سَجْدَتَيْنِ وَهُوَ جَالِسٌ بَعْدَ التَّسْلِيمِ.

1226. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ bizə Əsr namazını qıldırdı. İki rükət qılıb salam verdi. Zul-Yədeyn qalxıb dedi: “Namaz qısaldıldı, yoxsa unutdun, ey Allahın Elçisi?” Allah Elçisi ﷺ: “Bunlardan heç biri olmayıb”- dedi. O dedi: “Bunlardan biri baş verdi, ey Allahın Elçisi!” Allah Elçisi ﷺ insanlara tərəf çevrilib dedi: “Zul-Yədeyn düz deyir?” Onlar: “Bəli!”- dedilər. Allah Elçisi ﷺ namazdan qalan hissələri tamamladı. Sonra oturduğu halda salamdan sonra iki dəfə səcdə etdi”.

١٢٢٧ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ عُبَيْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، أَنَّهُ سَمِعَ أَبَا سَلَمَةَ يُحَدِّثُ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى صَلاَةَ الظُّهْرِ رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، فَقَالُوا : قُصِرَتِ الصَّلاَةُ ، فَقَامَ وَصَلَّى رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ سَجَدَ سَجْدَتَيْنِ.

1227. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Zöhr namazını iki rükət qıldı və salam verdi. Camaat dedi: “Namaz qısaldı”. Allah Elçisi ﷺ qalxıb iki rükət də namaz qıldı, sonra salam verdi, sonra da iki dəfə səhv səcdəsi etdi.

١٢٢٨ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ عِمْرَانَ بْنِ أَبِي أَنَسٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى يَوْمًا ، فَسَلَّمَ فِي رَكْعَتَيْنِ ، ثُمَّ انْصَرَفَ ، فَأَدْرَكَهُ ذُو الشِّمَالَيْنِ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، أَنُقِصَتِ الصَّلاَةُ أَمْ نَسِيتَ ؟ فَقَالَ : لَمْ تُنْقَصِ الصَّلاَةُ وَلَمْ أَنْسَ ، قَالَ : بَلَى وَالَّذِي بَعَثَكَ بِالْحَقِّ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَصَدَقَ ذُو الْيَدَيْنِ ؟ قَالُوا : نَعَمْ فَصَلَّى بِالنَّاسِ رَكْعَتَيْنِ.

1228. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ bir gün namaz qıldı, ikinci rükətdə salam verdi, sonra dönüb getdi. Zuş-Şiməleyn ona çatıb dedi: “Ey Allahın Elçisi, namaz qısaldı, yoxsa sən unutdun?” O dedi: “Nə namaz qısaldı, nə də mən unutdum”. Səhabə dedi: “Əksinə, səni haqq ilə Göndərənə and olsun ki, (sən qısaltdın və ya unutdun)”. Allah Elçisi ﷺ dedi: “Zul-Yədeyn düz deyirmi?” İnsanlar: “Bəli!”- dedilər. Allah Elçisi ﷺ də camaatla birlikdə qalan iki rükəti tamamladı.

١٢٢٩ - أَخْبَرَنَا هَارُونُ بْنُ مُوسَى الْفَرْوِيُّ ، قَالَ : حَدَّثَنِي أَبُو ضَمْرَةَ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : نَسِيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَسَلَّمَ فِي سَجْدَتَيْنِ ، فَقَالَ لَهُ ذُو الشِّمَالَيْنِ : أَقُصِرَتِ الصَّلاَةُ أَمْ

نَسِيتَ يَا رَسُولَ اللهِ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَصَدَقَ ذُو الْيَدَيْنِ ؟ قَالُوا : نَعَمْ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَتَمَّ الصَّلاَةَ.

1229. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Bir gün Allah Elçisi ﷺ unudaraq iki rükətdən sonra salam verdi. Zuş-Şiməleyn ona dedi: "Namaz qısaldı, yoxsa sən unutdun, ey Allahın Elçisi?" Allah Elçisi ﷺ dedi: "Zul-Yədeyn doğru deyirmi? Camaat: "Bəli!"- dedikdə, Allah Elçisi ﷺ də qalxıb namazı tamaladı".

١٢٣٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، وَأَبِي بَكْرِ بْنِ سُلَيْمَانَ بْنِ أَبِي حَثْمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ أَوِ الْعَصْرَ ، فَسَلَّمَ فِي رَكْعَتَيْنِ وَانْصَرَفَ ، فَقَالَ لَهُ ذُو الشِّمَالَيْنِ ابْنُ عَمْرٍو : أَنُقِصَتِ الصَّلاَةُ أَمْ نَسِيتَ ؟ قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا يَقُولُ ذُو الْيَدَيْنِ ؟ ، فَقَالُوا : صَدَقَ يَا نَبِيَّ اللهِ ، فَأَتَمَّ بِهِمُ الرَّكْعَتَيْنِ اللَّتَيْنِ نَقَصَ.

1230. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ Zöhr və ya Əsr namazını qıldırdı, iki rükətdən sonra salam verib bizə tərəf çevrildi. Zuş-Şiməleyn ibn Amr ona dedi: "Namaz qısaldı, yoxsa sən unutdun?" Peyğəmbər ﷺ dedi: "Zul-Yədeyn düz deyir?" Camaat dedi: "O, düz deyir, ey Allahın Peyğəmbəri!" Peyğəmbər ﷺ də əskik qıldığı iki rükəti tamamladı".

١٢٣١ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنْ ابْنِ شِهَابٍ ، أَنَّ أَبَا بَكْرِ بْنَ سُلَيْمَانَ بْنِ أَبِي حَثْمَةَ أَخْبَرَهُ أَنَّهُ بَلَغَهُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى رَكْعَتَيْنِ ، فَقَالَ لَهُ ذُو الشِّمَالَيْنِ نَحْوَهُ . قَالَ ابْنُ شِهَابٍ : أَخْبَرَنِي هَذَا الْخَبَرَ سَعِيدُ بْنُ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : وَأَخْبَرَنِيهِ أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، وَأَبُو بَكْرِ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ الْحَارِثِ ، وَعُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللَّهِ.

1231. Eyni hədisdir.

## ٢٣ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى أَبِي هُرَيْرَةَ فِي السَّجْدَتَيْنِ.

## 23-cü fəsil: Əbu Hureyranın ﷺ səhv səcdəsi haqda olan ixtilafı

١٢٣٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، قَالَ : حَدَّثَنَا شُعَيْبٌ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، قَالَ : حَدَّثَنِي ابْنُ شِهَابٍ ، عَنْ سَعِيدٍ ، وَأَبِي سَلَمَةَ ، وَأَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، وَابْنِ أَبِي حَثْمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ أَنَّهُ قَالَ : لَمْ يَسْجُدْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَئِذٍ قَبْلَ السَّلاَمِ وَلاَ بَعْدَهُ.

1232. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ bu günə qədər nə salamdan öncə, nə də salamdan sonra səcdə etməmişdir".[1]

١٢٣٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ وَهْبٍ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَجَدَ يَوْمَ ذِي الْيَدَيْنِ سَجْدَتَيْنِ بَعْدَ السَّلاَمِ

1233. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Zul-Yədeyn hadisəsi vaxtı salamdan sonra iki dəfə səcdə etdi.

١٢٣٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ ، قَالَ : أَخْبَرَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَنْبَأَنَا عَمْرُو بْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، بِمِثْلِهِ.

1234. ...Eyni hədisdir.

١٢٣٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرِ بْنِ دِينَارٍ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : وَحَدَّثَنِي ابْنُ عَوْنٍ ، وَخَالِدٌ الْحَذَّاءُ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَجَدَ فِي وَهْمِهِ بَعْدَ التَّسْلِيمِ.

1235. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ namazda səhv etdikdə salam verdikdən sonra səcdə etdi.

١٢٣٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ النَّيْسَابُورِيُّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ الأَنْصَارِيُّ ، قَالَ : أَخْبَرَنِي أَشْعَثُ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ خَالِدٍ الْحَذَّاءِ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَبِي الْمُهَلَّبِ ، عَنْ عِمْرَانَ ابْنِ حُصَيْنٍ ، أَنَّ النَّبِيَّ اللَّهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِهِمْ فَسَهَا ، فَسَجَدَ سَجْدَتَيْنِ ثُمَّ سَلَّمَ.

1236. ...İmran ibn Husayn ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ namaz qıldıqda səhv etdi və iki dəfə səcdə etdikdən sonra salam verdi.

١٢٣٧ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، عَنْ يَزِيدَ بْنِ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ الْحَذَّاءُ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَبِي الْمُهَلَّبِ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ، قَالَ : سَلَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي ثَلاَثِ رَكَعَاتٍ مِنَ الْعَصْرِ ، فَدَخَلَ مَنْزِلَهُ ، فَقَامَ إِلَيْهِ رَجُلٌ يُقَالُ لَهُ الْخِرْبَاقُ ، فَقَالَ : يَعْنِي نَقَصَتِ الصَّلاَةُ يَا رَسُولَ اللهِ ؟ فَخَرَجَ مُغْضَبًا يَجُرُّ رِدَاءَهُ ، فَقَالَ : أَصَدَقَ ؟ قَالُوا : نَعَمْ ، فَقَامَ فَصَلَّى تِلْكَ الرَّكْعَةَ ثُمَّ سَلَّمَ ، ثُمَّ سَجَدَ سَجْدَتَيْهَا ، ثُمَّ سَلَّمَ.

[1] Hədis zəifdir.

1237. ...Rəvayət edilir ki, İmran ibn Husayn ﵁ demişdir: "Allah Elçisi ﷺ Əsr namazında üçüncü rükətdən sonra salam verdi və öz evinə daxil oldu. əl-Xirbəq adlı bir kişi qalxıb dedi: "Namaz qısaldımı, ey Allah Elçisi?" Allah Elçisi ﷺ ridasını[1] çəkərək qəzəbli halda evindən çıxdı və dedi: "O, düz deyirmi?" Camaat da: "Bəli!"- dedi. Allah Elçisi ﷺ durub az qıldığı rükəti tamamladı, sonra salam verdi, sonra iki dəfə səcdə etdi və sonra da salam verdi".

٢٤ - بَابُ إِتْمَامِ الْمُصَلِّي عَلَى مَا ذَكَرَ إِذَا شَكَّ.

24-cü fəsil: Namazında şəkk edənin namazını tamamlaması

١٢٣٨ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ ابْنِ عَجْلاَنَ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي سَعِيدٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِذَا شَكَّ أَحَدُكُمْ فِي صَلاَتِهِ فَلْيُلْغِ الشَّكَّ وَلْيَبْنِ عَلَى الْيَقِينِ ، فَإِذَا اسْتَيْقَنَ بِالتَّمَامِ ، فَلْيَسْجُدْ سَجْدَتَيْنِ وَهُوَ قَاعِدٌ ، فَإِنْ كَانَ صَلَّى خَمْسًا شَفَعَتَا لَهُ صَلاَتَهُ ، وَإِنْ صَلَّى أَرْبَعًا كَانَتَا تَرْغِيمًا لِلشَّيْطَانِ.

1238. ...Əbu Səid ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sizdən biriniz namazında şəkk etdikdə, şəkk etdiyi şeyi kənara qoysun və yəqin olduğu şeyə əməl etsin. Namazını tamamladığını yəqin etsə, oturduğu yerdə iki dəfə səcdə etsin. Əgər namazı beş rükət olsa, etdiyi səcdələr onun namazının rükətlərini sanki cütləşdirmiş olar. Əgər dörd rükət olsa, etdiyi səcdələr şeytanı alçaldan səcdələr olar".

١٢٣٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا حُجَيْنُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ وَهُوَ ابْنُ أَبِي سَلَمَةَ ، عَنْ زَيْدِ بْنِ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا لَمْ يَدْرِ أَحَدُكُمْ صَلَّى ثَلاَثًا أَمْ أَرْبَعًا ، فَلْيُصَلِّ رَكْعَةً ، ثُمَّ يَسْجُدْ بَعْدَ ذَلِكَ سَجْدَتَيْنِ ، وَهُوَ جَالِسٌ ، فَإِنْ كَانَ صَلَّى خَمْسًا شَفَعَتَا لَهُ صَلاَتَهُ ، وَإِنْ صَلَّى أَرْبَعًا كَانَتَا تَرْغِيمًا لِلشَّيْطَانِ.

1239. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Sizdən biriniz üç və ya dörd rükət qıldığını bilmədikdə, qoy bir rükət qılsın, sonra oturduğu yerdə iki dəfə səcdə etsin. Əgər beş rükət qılmışdısa, bu iki səcdə onun namazının rükətlərinin sayını cütləşdirmiş olar. Əgər dörd rükət qılmışdısa, bu iki səcdə şeytanı alçaltmış olar".

[1] Rida - qurşaqdan yuxarı bədən əzalarını örtmək üçün çiyinə atılan parça.

٢٥ - بَابُ التَّحَرِّي.

## 25-ci fəsil: Namazda düzgün olanı aydınlaşdırmaq haqda

١٢٤٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مُفَضَّلٌ وَهُوَ ابْنُ مُهَلْهَلٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، يَرْفَعُهُ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا شَكَّ أَحَدُكُمْ فِي صَلَاتِهِ فَلْيَتَحَرَّ الَّذِي يَرَى أَنَّهُ الصَّوَابُ فَيُتِمَّهُ ، ثُمَّ ــ يَعْنِي ــ يَسْجُدُ سَجْدَتَيْنِ وَلَمْ أَفْهَمْ بَعْضَ حُرُوفِهِ كَمَا أَرَدْتُ.

1240. ...Abdullah ﵁ bu sözü Peyğəmbərə ﷺ isnad edərək demişdir: “Sizdən biriniz namazında şəkk-şübhəyə düşsə, qoy hansının düz olmasını aydınlaşdırsın və onu da tamamlasın. Sonra iki dəfə səcdə etsin”. Mən Allah Elçisinin ﷺ bundan sonra dediklərini başa düşə bilmədim.

١٢٤١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ مِسْعَرٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا شَكَّ أَحَدُكُمْ فِي صَلَاتِهِ فَلْيَتَحَرَّ ، وَيَسْجُدْ سَجْدَتَيْنِ بَعْدَ مَا يَفْرُغُ.

1241. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən biriniz namazında şəkk-şübhəyə düşsə, qoy aydınlaşdırsın. Namazı bitirdikdən sonra da iki dəfə səcdə etsin”.

١٢٤٢ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مِسْعَرٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَزَادَ أَوْ نَقَصَ ، فَلَمَّا سَلَّمَ قُلْنَا : يَا رَسُولَ اللهِ ، هَلْ حَدَثَ فِي الصَّلَاةِ شَيْءٌ ؟ قَالَ : لَوْ حَدَثَ فِي الصَّلَاةِ شَيْءٌ أَنْبَأْتُكُمُوهُ ، وَلَكِنِّي إِنَّمَا أَنَا بَشَرٌ أَنْسَى كَمَا تَنْسَوْنَ ، فَأَيُّكُمْ مَا شَكَّ فِي صَلَاتِهِ فَلْيَنْظُرْ أَحْرَى ذَلِكَ إِلَى الصَّوَابِ ، فَلْيُتِمَّ عَلَيْهِ ، ثُمَّ لِيُسَلِّمْ وَلْيَسْجُدْ سَجْدَتَيْنِ.

1242. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ namaz qıldı və namazında artırdı və ya əskiltdi. Sonra da salam verdi. Biz dedik: “Ey Allahın Elçisi, namazda bir dəyişiklik baş veribmi?” O dedi: “Əgər namazda bir şey baş versəydi, mən bunu sizə xəbər verərdim, lakin mən bəşərəm, sizin unutduğunuz kimi mən də unuduram. Sizdən biriniz namazında şəkk etsə, düzgün olanı müəyyənləşdirsin. Sonra namazını tamamlasın. Sonra salam verib iki dəfə səcdə etsin”.

١٢٤٣ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ إِسْمَعِيلَ بْنِ سُلَيْمَانَ الْمُجَالِدِيُّ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ ، يَعْنِي ابْنَ عِيَاضٍ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَاةً فَزَادَ فِيهَا أَوْ نَقَصَ ، فَلَمَّا سَلَّمَ قُلْنَا : يَا نَبِيَّ اللهِ ،

هَلْ حَدَثَ فِي الصَّلاَةِ شَيْءٌ ؟ قَالَ : وَمَا ذَاكَ ؟ فَذَكَرْنَا لَهُ الَّذِي فَعَلَ فَثَنَى رِجْلَهُ ، فَاسْتَقْبَلَ الْقِبْلَةَ ، فَسَجَدَ سَجْدَتَيِ السَّهْوِ ، ثُمَّ أَقْبَلَ عَلَيْنَا بِوَجْهِهِ ، فَقَالَ : لَوْ حَدَثَ فِي الصَّلاَةِ شَيْءٌ لأَنْبَأْتُكُمْ بِهِ ، ثُمَّ قَالَ : إِنَّمَا أَنَا بَشَرٌ أَنْسَى كَمَا تَنْسَوْنَ ، فَأَيُّكُمْ شَكَّ فِي صَلاَتِهِ شَيْئًا فَلْيَتَحَرَّ الَّذِي يَرَى أَنَّهُ صَوَابٌ ، ثُمَّ يُسَلِّمْ ، ثُمَّ يَسْجُدْ سَجْدَتَيِ السَّهْوِ.

1243. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: "Allah Elçisi ﷺ namaz qıldı və namazda artırdı və ya əskiltdi. O, salam verdikdən sonra biz dedik: "Ey Allahın Peyğəmbəri, namazda bir dəyişiklik baş veribmi?" O dedi: "Nə baş verib ki?" Biz də ona bundan qabaq etdiyini xatırlatdıq. O, ayaqlarını bitişdirərək qibləyə tərəf çevrildi və səhv səcdəsi etdi. Sonra bizə tərəf çevrilib dedi: "Əgər namazda bir dəyişiklik baş versəydi, mən onu sizə mütləq xəbər verərdim". Sonra dedi: "Həqiqətən, mən bəşərəm, sizin unutduğunuz kimi unuduram. Sizdən biriniz namazda şəkk etsə (artırsa və ya əskiltsə), hansının daha düzgün olduğunu müəyyənləşdirsin, sonra salam verib iki dəfə səhv səcdəsi etsin".

١٢٤٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، عَنْ شُعْبَةَ ، قَالَ : كَتَبَ إِلَيَّ مَنْصُورٌ ، وَقَرَأْتُهُ عَلَيْهِ وَسَمِعْتُهُ يُحَدِّثُ رَجُلاً ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى صَلاَةَ الظُّهْرِ ، ثُمَّ أَقْبَلَ عَلَيْهِمْ بِوَجْهِهِ ، فَقَالُوا : أَحَدَثَ فِي الصَّلاَةِ حَدَثٌ ؟ قَالَ : وَمَا ذَاكَ ؟ فَأَخْبَرُوهُ بِصَنِيعِهِ ، فَثَنَى رِجْلَهُ ، وَاسْتَقْبَلَ الْقِبْلَةَ ، فَسَجَدَ سَجْدَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ أَقْبَلَ عَلَيْهِمْ بِوَجْهِهِ ، فَقَالَ : إِنَّمَا أَنَا بَشَرٌ أَنْسَى كَمَا تَنْسَوْنَ ، فَإِذَا نَسِيتُ فَذَكِّرُونِي وَقَالَ : لَوْ كَانَ حَدَثَ فِي الصَّلاَةِ حَدَثٌ أَنْبَأْتُكُمْ بِهِ وَقَالَ : إِذَا أَوْهَمَ أَحَدُكُمْ فِي صَلاَتِهِ فَلْيَتَحَرَّ أَقْرَبَ ذَلِكَ مِنَ الصَّوَابِ ثُمَّ لِيُتِمَّ عَلَيْهِ ، ثُمَّ يَسْجُدْ سَجْدَتَيْنِ.

1244. ...Abdullah ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Zöhr namazını qılırdı, sonra camaata doğru çevrildi. Camaat ona dedi: "Namazda bir dəyişiklik baş verib?" O dedi: "Nə olub ki?" Onlar da Peyğəmbərə ﷺ namazda etdiyi səhvi bildirdikdə, o, ayaqlarını birləşdirib qibləyə yönəldi, iki dəfə səcdə etdi, sonra salam verdi. Sonra da camaata çevrilib dedi: "Həqiqətən, mən bəşərəm, sizin unutduğunuz kimi mən də unuduram. Əgər bir şeyi unutsam, mənim yadıma salın. Əgər namazda bir dəyişiklik baş versəydi, bunu sizə xəbər verərdim. Əgər sizdən biriniz namazında şəkk-şübhəyə düşsə, qoy doğruya daha yaxın olana əməl etsin, sonra namazını tamamlasın və iki dəfə səcdə etsin".

١٢٤٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، قَالَ : سَمِعْتُ أَبَا وَائِلٍ ، يَقُولُ : قَالَ عَبْدُ اللهِ : مَنْ أَوْهَمَ فِي صَلاَتِهِ فَلْيَتَحَرَّ الصَّوَابَ ، ثُمَّ يَسْجُدْ سَجْدَتَيْنِ بَعْدَ مَا يَفْرُغُ وَهُوَ جَالِسٌ.

1245. ...Rəvayət edilir ki, Abdullah ﵁ belə demişdir: “Sizdən biriniz namazında şəkk-şübhəyə düşsə, qoy düzgün olanı aydınlaşdırsın, sonra da oturduğu yerdə salam verdikdən sonra iki dəfə səcdə etsin”.

١٢٤٦ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مِسْعَرٍ ، عَنِ الْحَكَمِ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : مَنْ شَكَّ أَوْ أَوْهَمَ فَلْيَتَحَرَّ الصَّوَابَ ، ثُمَّ لِيَسْجُدْ سَجْدَتَيْنِ.

1246. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Sizdən biriniz (namaz qılarkən) şəkk-şübhəyə düşsə və ya nəyin düzgün olmasını bilməsə, qoy düzgün olanı aydınlaşdırsın, sonra da iki dəfə səcdə etsin”.

١٢٤٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنِ ابْنِ عَوْنٍ ، عَنْ إِبْرَاهِيمَ ، قَالَ : كَانُوا يَقُولُونَ : إِذَا أَوْهَمَ يَتَحَرَّى الصَّوَابَ ، ثُمَّ يَسْجُدُ سَجْدَتَيْنِ.

1247. ...Rəvayət edilir ki, İbrahim ﵁ demişdir: “Səhabələr deyərdilər: “Sizdən biriniz (namaz qılarkən) şəkk-şübhəyə düşsə, qoy düzgün olanı aydınlaşdırsın, sonra da iki dəfə səcdə etsin”.

١٢٤٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : قَالَ عَبْدُ اللهِ بْنُ مُسَافِعٍ ، عَنْ عُقْبَةَ بْنِ مُحَمَّدِ بْنِ الْحَارِثِ ، عَنْ عَبْدِ اللهِ بْنِ جَعْفَرٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ شَكَّ فِي صَلاَتِهِ فَلْيَسْجُدْ سَجْدَتَيْنِ بَعْدَ مَا يُسَلِّمُ.

1248. ...Rəvayət edilir ki, Abdullah ibn Cəfər ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim namazında (artıq və ya əskik hərəkət etməkdə) şəkk-şübhəyə düşsə, namazda salamdan sonra iki dəfə səcdə etsin”.[1]

١٢٤٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ هَاشِمٍ ، أَنْبَأَنَا الْوَلِيدُ ، أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ مُسَافِعٍ ، عَنْ عُقْبَةَ بْنِ مُحَمَّدِ بْنِ الْحَارِثِ ، عَنْ عَبْدِ اللهِ بْنِ جَعْفَرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ شَكَّ فِي صَلاَتِهِ فَلْيَسْجُدْ سَجْدَتَيْنِ بَعْدَ التَّسْلِيمِ.

1249. ...Abdullah ibn Cəfər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kim namazında şəkk-şübhəyə düşsə, namazda salamdan sonra iki dəfə səcdə etsin”.[2]

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.

١٢٥٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : ابْنُ جُرَيْجٍ ، أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ مُسَافِعٍ ، أَنَّ مُصْعَبَ بْنَ شَيْبَةَ أَخْبَرَهُ ، عَنْ عُقْبَةَ بْنِ مُحَمَّدِ بْنِ الْحَارِثِ ، عَنْ عَبْدِ اللهِ بْنِ جَعْفَرٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ شَكَّ فِي صَلاَتِهِ فَلْيَسْجُدْ سَجْدَتَيْنِ بَعْدَ مَا يُسَلِّمُ.

1250. ...Abdullah ibn Cəfər ﷠ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kim namazında şəkk-şübhəyə düşsə, namazda salamdan sonra iki dəfə səcdə etsin”.[1]

١٢٥١ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، وَرَوْحٌ هُوَ ابْنُ عُبَادَةَ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ مُسَافِعٍ ، أَنَّ مُصْعَبَ بْنَ شَيْبَةَ أَخْبَرَهُ ، عَنْ عُقْبَةَ بْنِ مُحَمَّدِ بْنِ الْحَارِثِ ، عَنْ عَبْدِ اللهِ بْنِ جَعْفَرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ شَكَّ فِي صَلاَتِهِ فَلْيَسْجُدْ سَجْدَتَيْنِ ، قَالَ حَجَّاجٌ : بَعْدَ مَا يُسَلِّمُ ، وَقَالَ رَوْحٌ : وَهُوَ جَالِسٌ.

1251. ...Abdullah ibn Cəfər ﷠ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kim namazında şəkk-şübhəyə düşsə, salamdan sonra iki dəfə səcdə etsin”. Həccac dedi: “Salam verdikdən sonra”. Ravi Ravh dedi: “Oturduğu halda”.[2]

١٢٥٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِنَّ أَحَدَكُمْ إِذَا قَامَ يُصَلِّي جَاءَهُ الشَّيْطَانُ ، فَلَبَسَ عَلَيْهِ صَلاَتَهُ حَتَّى لاَ يَدْرِيَ كَمْ صَلَّى ، فَإِذَا وَجَدَ أَحَدُكُمْ ذَلِكَ فَلْيَسْجُدْ سَجْدَتَيْنِ وَهُوَ جَالِسٌ.

1252. ...Əbu Hureyra ﷛ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, sizdən biriniz namaza durduqda, şeytan onun yanına gəlib onun namazını qarışdırmağa çalışır. Beləliklə, namaz qılan neçə rükət qıldığını bilmir. Sizdən biriniz bunu gördükdə, oturduğu yerdə iki dəfə səcdə etsin”.

١٢٥٣ - أَخْبَرَنَا بِشْرُ بْنُ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، عَنْ هِشَامٍ الدَّسْتَوَائِيِّ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا نُودِيَ لِلصَّلاَةِ أَدْبَرَ الشَّيْطَانُ لَهُ ضُرَاطٌ ، فَإِذَا قُضِيَ التَّثْوِيبُ أَقْبَلَ حَتَّى يَخْطُرَ بَيْنَ الْمَرْءِ وَقَلْبِهِ حَتَّى لاَ يَدْرِيَ كَمْ صَلَّى ، فَإِذَا رَأَى أَحَدُكُمْ ذَلِكَ فَلْيَسْجُدْ سَجْدَتَيْنِ.

1253. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷛ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Namaz üçün azan verildikdə, şeytan yel buraxaraq qaçıb gedər.

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.

İqamə bitdikdə isə qayıdar, adamla qəlbi arasına girər. Adam da namazda neçə rükət qıldığını bilməz. Sizdən biriniz belə bir şey gördükdə, qoy iki dəfə səcdə etsin".

٢٦ - بَابُ مَا يَفْعَلُ مَنْ صَلَّى خَمْسًا.

26-cı fəsil: Dördrükətli namazı beş rükət qılan nə etməlidir?

١٢٥٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، وَاللَّفْظُ لِابْنِ الْمُثَنَّى ، قَالاَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : صَلَّى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ خَمْسًا ، فَقِيلَ لَهُ : أَزِيدَ فِي الصَّلاَةِ ؟ قَالَ : وَمَا ذَاكَ ؟ قَالُوا : صَلَّيْتَ خَمْسًا فَثَنَى رِجْلَهُ وَسَجَدَ سَجْدَتَيْنِ.

1254. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Peyğəmbər ﷺ Zöhr namazını beş rükət qıldı. Ona dedilər: "Namaz artırıldı?" O dedi: "Nə olub ki?" Dedilər: "Namazı beş rükət qıldın". O da (oturduğu yerdə) ayaqlarını birləşdirib iki dəfə səcdə etdi".

١٢٥٥ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ الرَّحِيمِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ شُمَيْلٍ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، وَمُغِيرَةُ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ صَلَّى بِهِمُ الظُّهْرَ خَمْسًا ، فَقَالُوا : إِنَّكَ صَلَّيْتَ خَمْسًا ، فَسَجَدَ سَجْدَتَيْنِ بَعْدَ مَا سَلَّمَ وَهُوَ جَالِسٌ.

1255. ...Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Zöhr namazını beş rükət qıldı. Camaat ona dedi: "Həqiqətən, sən namazı beş rükət qıldın". O da salam verəndən sonra oturduğu yerdə iki dəfə səcdə etdi.

١٢٥٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مُفَضَّلُ بْنُ مُهَلْهَلٍ ، عَنِ الْحَسَنِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ إِبْرَاهِيمَ بْنِ سُوَيْدٍ ، قَالَ : صَلَّى عَلْقَمَةُ خَمْسًا ، فَقِيلَ لَهُ ، فَقَالَ : مَا فَعَلْتُ ، قُلْتُ بِرَأْسِي : بَلَى ، قَالَ : وَأَنْتَ يَا أَعْوَرُ ، فَقُلْتُ : نَعَمْ ، فَسَجَدَ سَجْدَتَيْنِ ، ثُمَّ حَدَّثَنَا ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ صَلَّى خَمْسًا فَوَشْوَشَ الْقَوْمُ بَعْضُهُمْ إِلَى بَعْضٍ ، فَقَالُوا لَهُ : أَزِيدَ فِي الصَّلاَةِ ؟ قَالَ : لاَ ، فَأَخْبَرُوهُ ، فَثَنَى رِجْلَهُ ، فَسَجَدَ سَجْدَتَيْنِ ، ثُمَّ قَالَ : إِنَّمَا أَنَا بَشَرٌ أَنْسَى كَمَا تَنْسَوْنَ.

1256. ...Rəvayət edilir ki, İbrahim ibn Suveyd ﷺ demişdir: "Alqamə namazı beş rükət qıldı. Bu ona bildirildikdə dedi: "Mən namazı beş rükət qıldırmamışam!" Mən başımla işarə edərək: "Beş rükət qıldırdın"- dedim. O dedi: "Sən də, ey Əura?!" Mən: "Bəli"- dedim. Bundan sonra o, iki dəfə səcdə etdi, sonra Abdullahdan rəvayət etdi ki, Peyğəmbər ﷺ beş rükət

namaz qılmışdı. Camaatdan bəziləri bir-biri ilə pıçıldaşmağa başladı. Peyğəmbərə ﷺ dedilər: "Namaz artırıldımı?" O: "Xeyr"- dedi. Bu hadisə ona bildirildikdən sonra (oturduğu yerdə) ayaqlarını birləşdirib iki dəfə səhv səcdəsi etdi, sonra da dedi: "Həqiqətən, mən bəşərəm, sizin unutduğunuz kimi mən də unuduram".

١٢٥٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مَالِكِ بْنِ مِغْوَلٍ ، قَالَ : سَمِعْتُ الشَّعْبِيَّ ، يَقُولُ : سَهَا عَلْقَمَةُ بْنُ قَيْسٍ فِي صَلاَتِهِ ، فَذَكَرُوا لَهُ بَعْدَ مَا تَكَلَّمَ ، فَقَالَ : أَكَذَلِكَ يَا أَعْوَرُ ؟ قَالَ : نَعَمْ ، فَحَلَّ حُبْوَتَهُ ، ثُمَّ سَجَدَ سَجْدَتَيِ السَّهْوِ ، وَقَالَ : هَكَذَا فَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : وَسَمِعْتُ الْحَكَمَ ، يَقُولُ : كَانَ عَلْقَمَةُ صَلَّى خَمْسًا.

1257. ...Rəvayət edilir ki, Şəbi ﷺ demişdir: "Alqamə ibn Qeys namazda səhv etdi. Namaz bitdikdən sonra camaat danışmağa başladıqda bunu ona bildirdilər. O dedi: "Mən belə etdimmi, ey Əuər?" O: "Bəli"- dedi. Alqamə üst-başını düzəltdi və iki dəfə səhv səcdəsi edib dedi: "Allah Elçisi ﷺ də belə etmişdi". Hədisin ravisi dedi: "əl-Həkəmin belə dediyini eşitdim: "Alqamə beş rükət qılmışdı".

١٢٥٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ سُفْيَانَ ، عَنِ الْحَسَنِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ إِبْرَاهِيمَ ، أَنَّ عَلْقَمَةَ ، صَلَّى خَمْسًا فَلَمَّا سَلَّمَ ، قَالَ إِبْرَاهِيمُ بْنُ سُوَيْدٍ : يَا أَبَا شِبْلٍ صَلَّيْتَ خَمْسًا ، فَقَالَ : أَكَذَلِكَ يَا أَعْوَرُ ؟ فَسَجَدَ سَجْدَتَيِ السَّهْوِ ، ثُمَّ قَالَ : هَكَذَا فَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1258. ...İbrahim ﷺ rəvayət edir ki, Alqamə ﷺ beş rükət namaz qıldı və salam verdi. İbrahim ibn Suveyd dedi: "Ey Əbu Şibl, namazı beş rükət qıldın!" O dedi: "Belədirmi, ey Əura?" O, iki dəfə səhv səcdəsi etdi, sonra isə dedi: "Allah Elçisi ﷺ belə etmişdi".

١٢٥٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ أَبِي بَكْرٍ النَّهْشَلِيِّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، صَلَّى إِحْدَى صَلاَتَيِ الْعَشِيِّ خَمْسًا ، فَقِيلَ لَهُ : أَزِيدَ فِي الصَّلاَةِ ؟ قَالَ : وَمَا ذَاكَ ؟ قَالُوا : صَلَّيْتَ خَمْسًا ، قَالَ : إِنَّمَا أَنَا بَشَرٌ ، أَنْسَى كَمَا تَنْسَوْنَ ، وَأَذْكُرُ كَمَا تَذْكُرُونَ ، فَسَجَدَ سَجْدَتَيْنِ ثُمَّ انْفَتَلَ.

1259. ...Abdullah ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ dördrükətli namazlardan birini beş rükət qıldı. Ona: "Namaz artırıldımı?"- deyildi. O: "Nə olub ki?"- dedi. Camaat dedi: "Sən beş rükət qıldın". Peyğəmbər ﷺ buyurdu: "Həqiqətən, mən bəşərəm. Sizin unutduğunuz kimi mən də unuduram. Siz xatırladığınız kimi mən də xatırlayıram". Sonra o, iki dəfə səcdə etdi və çıxıb getdi.

٢٧ - بَابُ مَا يَفْعَلُ مَنْ نَسِيَ شَيْئًا مِنْ صَلاَتِهِ

## 27-ci fəsil: Namazından bir şey unudanın nə etməsi haqda

١٢٦٠ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ اللَّيْثِ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ مُحَمَّدِ بْنِ عَجْلاَنَ ، عَنْ مُحَمَّدِ بْنِ يُوسُفَ ، مَوْلَى عُثْمَانَ ، عَنْ أَبِيهِ يُوسُفَ ، أَنَّ مُعَاوِيَةَ صَلَّى أَمَامَهُمْ ، فَقَامَ فِي الصَّلاَةِ وَعَلَيْهِ جُلُوسٌ ، فَسَبَّحَ النَّاسُ ، فَتَمَّ عَلَى قِيَامِهِ ، ثُمَّ سَجَدَ سَجْدَتَيْنِ وَهُوَ جَالِسٌ بَعْدَ أَنْ أَتَمَّ الصَّلاَةَ ، ثُمَّ قَعَدَ عَلَى الْمِنْبَرِ ، فَقَالَ : إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ نَسِيَ شَيْئًا مِنْ صَلاَتِهِ فَلْيَسْجُدْ مِثْلَ هَاتَيْنِ السَّجْدَتَيْنِ.

1260. ...Osmanın ﷺ azad etdiyi kölə Muhəmməd ibn Yusuf atası Əbu Yusufdan ﷺ rəvayət edir ki, Muaviyə onlara namaz qıldırdıqda, oturmaq lazım olan yerdə qalxdı. İnsanlar onun səhvini bildirmək üçün “Subhə:n-Allah” dedilər. O, namazı tamamladıqdan sonra həmin səhvinə görə oturduğu halda iki dəfə səcdə etdi. Sonra minbərdə oturaraq dedi: “Mən Allah Elçisinin ﷺ belə dediyini eşitdim: “Kim namazında bir şey unutsa, bu iki səcdə kimi səcdə etsin”.[1]

٢٨ - بَابُ التَّكْبِيرِ فِي سَجْدَتَيِ السَّهْوِ

## 28-ci fəsil: Səhv səcdəsi üçün təkbir etmək

١٢٦١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرٌو ، وَيُونُسُ ، وَاللَّيْثُ ، أَنَّ ابْنَ شِهَابٍ أَخْبَرَهُمْ ، عَنْ عَبْدِ الرَّحْمَنِ الأَعْرَجِ ، أَنَّ عَبْدَ اللهِ ابْنَ بُحَيْنَةَ حَدَّثَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَامَ فِي الثِّنْتَيْنِ مِنَ الظُّهْرِ فَلَمْ يَجْلِسْ ، فَلَمَّا قَضَى صَلاَتَهُ سَجَدَ سَجْدَتَيْنِ كَبَّرَ فِي كُلِّ سَجْدَةٍ وَهُوَ جَالِسٌ قَبْلَ أَنْ يُسَلِّمَ ، وَسَجَدَهُمَا النَّاسُ مَعَهُ مَكَانَ مَا نَسِيَ مِنَ الْجُلُوسِ.

1261. ...Abdullah ibn Buheynə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Zöhr namazının ikinci rükətində oturmadan ayağa qalxdı. Namazı bitirdikdən sonra iki dəfə səhv səcdəsi etdi və oturduğu halda salam verməzdən qabaq hər dəfə səcdə etdikdə təkbir etdi. Onun unutduğu şeyə görə insanlar onunla birlikdə səcdə etdilər.

٢٩ - بَابُ صِفَةِ الْجُلُوسِ فِي الرَّكْعَةِ الَّتِي يَقْضِي فِيهَا الصَّلاَةَ.

## 29-cu fəsil: Namazın sonuncu rükətində oturuş qaydası

١٢٦٢ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ بُنْدَارٌ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنِي مُحَمَّدُ بْنُ عَمْرِو بْنِ عَطَاءٍ ، عَنْ أَبِي حُمَيْدٍ السَّاعِدِيِّ ، قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ

---

[1] Hədis zəifdir.

وَسَلَّمَ إِذَا كَانَ فِي الرَّكْعَتَيْنِ اللَّتَيْنِ تَنْقَضِي فِيهِمَا الصَّلاَةُ أَخَّرَ رِجْلَهُ الْيُسْرَى ، وَقَعَدَ عَلَى شِقِّهِ مُتَوَرِّكًا ، ثُمَّ سَلَّمَ.

1262. ...Rəvayət edilir ki, Əbu Humeyd əs-Səidi ﷺ demişdir: "Peyğəmbər ﷺ namazın son rükətində oturduqda sol ayağını yan tərəfə çəkib üzərində oturar, yanı üzərində tavarruk[1] deyilən formada oturar, sonra salam verərdi".

١٢٦٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْفَعُ يَدَيْهِ إِذَا افْتَتَحَ الصَّلاَةَ ، وَإِذَا رَكَعَ ، وَإِذَا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ ، وَإِذَا جَلَسَ أَضْجَعَ الْيُسْرَى ، وَنَصَبَ الْيُمْنَى ، وَوَضَعَ يَدَهُ الْيُسْرَى عَلَى فَخِذِهِ الْيُسْرَى ، وَيَدَهُ الْيُمْنَى عَلَى فَخِذِهِ الْيُمْنَى ، وَعَقَدَ ثِنْتَيْنِ الْوُسْطَى وَالإِبْهَامَ وَأَشَارَ.

1263. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ namaza başladıqda, ruku etdikdə və başını rukudan qaldırdıqda əllərini qaldırdığını gördüm. Oturduqda sol ayağını yayar, sağ ayağını isə dik qoyardı. Sol əlini sol budunun üzərinə, sağ əlini sağ budunun üzərinə qoyar, orta və baş barmağını birləşdirər, (şəhadət barmağı ilə) işarə edərdi".

## ٣٠ - بَابُ مَوْضِعِ الذِّرَاعَيْنِ

## 30-cu fəsil: Təşəhhüd üçün oturduqda qolların yeri

١٢٦٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ مَيْمُونٍ الرَّقِّيُّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ وَهُوَ ابْنُ يُوسُفَ الْفِرْيَابِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ ، أَنَّهُ رَأَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَلَسَ فِي الصَّلاَةِ ، فَافْتَرَشَ رِجْلَهُ الْيُسْرَى ، وَوَضَعَ ذِرَاعَيْهِ عَلَى فَخِذَيْهِ ، وَأَشَارَ بِالسَّبَّابَةِ يَدْعُو بِهَا.

1264. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﷺ Peyğəmbərin ﷺ namazda sol ayağının üzərinə oturduğunu, dirsəklərini budlarının üzərinə qoyduğunu və şəhadət barmağı ilə işarə edərək dua etdiyini görmüşdür.

## ٣١ - مَوْضِعُ الْمِرْفَقَيْنِ

## 31-ci fəsil: Namaz qıldıqda dirsəklərin yeri

١٢٦٥ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : أَنْبَأَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا عَاصِمُ بْنُ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ وَائِلِ بْنِ حُجْرٍ ، قَالَ : قُلْتُ لأَنْظُرَنَّ إِلَى صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَيْفَ يُصَلِّي ؟ فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

[1] Tavarruk – üç və dörd rükətli vacib namazların son rükətlərindəki təşəhhüd oturuşunda sağ ayağı dik tutaraq ayaq barmaqlarını qıbləyə yönəltmək, sol ayağı sağ ayağın baldırının altına salaraq yanı yerə qoymaqdır.

فَاسْتَقْبَلَ الْقِبْلَةَ ، فَرَفَعَ يَدَيْهِ حَتَّى حَاذَتَا أُذُنَيْهِ ، ثُمَّ أَخَذَ شِمَالَهُ بِيَمِينِهِ ، فَلَمَّا أَرَادَ أَنْ يَرْكَعَ رَفَعَهُمَا مِثْلَ ذَلِكَ ، وَوَضَعَ يَدَيْهِ عَلَى رُكْبَتَيْهِ ، فَلَمَّا رَفَعَ رَأْسَهُ مِنَ الرُّكُوعِ رَفَعَهُمَا مِثْلَ ذَلِكَ ، فَلَمَّا سَجَدَ وَضَعَ رَأْسَهُ بِذَلِكَ الْمَنْزِلِ مِنْ يَدَيْهِ ، ثُمَّ جَلَسَ فَافْتَرَشَ رِجْلَهُ الْيُسْرَى ، وَوَضَعَ يَدَهُ الْيُسْرَى عَلَى فَخِذِهِ الْيُسْرَى ، وَحَدَّ مِرْفَقَهُ الأَيْمَنَ عَلَى فَخِذِهِ الْيُمْنَى ، وَقَبَضَ ثِنْتَيْنِ وَحَلَّقَ ، وَرَأَيْتُهُ يَقُولُ هَكَذَا ، وَأَشَارَ بِشْرٌ بِالسَّبَّابَةِ مِنَ الْيُمْنَى وَحَلَّقَ الإِبْهَامَ وَالْوُسْطَى.

1265. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﵁ demişdir: “Mən dedim: “Allah Elçisinin ﷺ necə namaz qılacağına baxacam!” Allah Elçisi ﷺ durub qibləyə tərəf yönəldi, qulaqlarına çatana qədər əllərini qaldırdı. Sonra sağ əli ilə sol əlini qapadı. Ruku etmək istədikdə əllərini əvvəlki kimi qaldırdı. Rukuda əllərini dizlərinə qoydu. Başını rukudan qaldırdıqda əllərini əvvəlki kimi qaldırdı. Səcdə etdikdə əllərini başına yaxın qoydu. Sonra sol ayağını altına qoyub üstündə oturdu. Sol əlini sol budunun üzərinə, sağ əlini də sağ budunun üzərinə qoydu, sonra iki barmağını halqa şəklində birləşdirdi. Mən onun belə etdiyini gördüm”. Bişr işarə etdi ki, Vail sağ əlinin şəhadət barmağını (düz) tutaraq baş və orta barmaqlarını halqa şəklində etdi”.

## ٣٢ - بَابُ مَوْضِعِ الْكَفَّيْنِ

## 32-ci fəsil: Təşəhhüddə ovucların yeri

١٢٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ مُسْلِمِ بْنِ أَبِي مَرْيَمَ — شَيْخٌ مِنْ أَهْلِ الْمَدِينَةِ — ثُمَّ لَقِيتُ الشَّيْخَ ، فَقَالَ : سَمِعْتُ عَلِيَّ بْنَ عَبْدِ الرَّحْمَنِ ، يَقُولُ : صَلَّيْتُ إِلَى جَنْبِ ابْنِ عُمَرَ ، فَقَلَّبْتُ الْحَصَى ، فَقَالَ لِي ابْنُ عُمَرَ : لاَ تُقَلِّبِ الْحَصَى ، فَإِنَّ تَقْلِيبَ الْحَصَى مِنَ الشَّيْطَانِ ، وَافْعَلْ كَمَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُ ، قُلْتُ : وَكَيْفَ رَأَيْتَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُ ؟ قَالَ : هَكَذَا وَنَصَبَ الْيُمْنَى ، وَأَضْجَعَ الْيُسْرَى ، وَوَضَعَ يَدَهُ الْيُمْنَى عَلَى فَخِذِهِ الْيُمْنَى ، وَيَدَهُ الْيُسْرَى عَلَى فَخِذِهِ الْيُسْرَى ، وَأَشَارَ بِالسَّبَّابَةِ.

1266. Rəvayət edilir ki, Əli ibn Abdur-Rahmən ﵀ demişdir: “İbn Ömərin yanında namaz qılırdım və namazda daşları qurdalayırdım. İbn Ömər dedi: “Namazda daşları qurdalama! Həqiqətən, namazda daşları qurdalamaq şeytandandır. Mənim Allah Elçisini ﷺ namazda gördüyüm kimi et!” Mən dedim: “Allah Elçisini ﷺ namazda necə görmüsən?” O: “Bu cür”- dedi və oturduqda sağ ayağını dik tutdu, sol ayağını yaydı. Sağ əlini sağ budu üzərinə, sol əlini də sol budu üzərinə qoydu. Şəhadət barmağı ilə də işarə etdi”.

٣٣ - بَابُ قَبْضِ الأَصَابِعِ مِنَ الْيَدِ الْيُمْنَى دُونَ السَّبَّابَةِ

## 33-cü fəsil: Təşəhhüddə şəhadət barmağından başqa digər barmaqları yummaq

١٢٦٧ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ مُسْلِمِ بْنِ أَبِي مَرْيَمَ ، عَنْ عَلِيِّ بْنِ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : رَآنِي ابْنُ عُمَرَ وَأَنَا أَعْبَثُ بِالْحَصَى فِي الصَّلاَةِ ، فَلَمَّا انْصَرَفَ نَهَانِي وَقَالَ : اصْنَعْ كَمَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ ، قُلْتُ : وَكَيْفَ كَانَ يَصْنَعُ ؟ قَالَ : كَانَ إِذَا جَلَسَ فِي الصَّلاَةِ وَضَعَ كَفَّهُ الْيُمْنَى عَلَى فَخِذِهِ ، وَقَبَضَ ــ يَعْنِي أَصَابِعَهُ كُلَّهَا ــ وَأَشَارَ بِإِصْبَعِهِ الَّتِي تَلِي الإِبْهَامَ ، وَوَضَعَ كَفَّهُ الْيُسْرَى عَلَى فَخِذِهِ الْيُسْرَى.

1267. ...Rəvayət edilir ki, Əli ibn Abdur-Rahmən ﷺ demişdir: “İbn Ömər mənim namazda daşlarla oynadığımı gördü. Namazı bitirdikdən sonra bunu mənə qadağan etdi və dedi: “Allah Elçisinin ﷺ etdiyi kimi et”. Mən dedim: “Allah Elçisi ﷺ necə edərdi?” O dedi: “Allah Elçisi ﷺ namazda oturduqda (təşəhhüddə) sağ ovcunu sağ budunun üzərinə qoyar, barmaqlarını yumar və şəhadət barmağı ilə işarə edərdi. Sol əlinin ovcunu isə sol budunun üzərinə qoyardı”.

٣٤ - بَابُ قَبْضِ الثِّنْتَيْنِ مِنْ أَصَابِعِ الْيَدِ الْيُمْنَى وَعَقْدِ الْوُسْطَى وَالإِبْهَامِ مِنْهَا

## 34-cü fəsil: Sağ əlin iki barmağını - orta və baş barmaqları bağlamaq

١٢٦٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ زَائِدَةَ ، قَالَ : حَدَّثَنَا عَاصِمُ بْنُ كُلَيْبٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، أَنَّ وَائِلَ بْنَ حُجْرٍ قَالَ : قُلْتُ : لأَنْظُرَنَّ إِلَى صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَيْفَ يُصَلِّي ؟ فَنَظَرْتُ إِلَيْهِ فَوَصَفَ ، قَالَ : ثُمَّ قَعَدَ وَافْتَرَشَ رِجْلَهُ الْيُسْرَى ، وَوَضَعَ كَفَّهُ الْيُسْرَى عَلَى فَخِذِهِ وَرُكْبَتِهِ الْيُسْرَى ، وَجَعَلَ حَدَّ مِرْفَقِهِ الأَيْمَنِ عَلَى فَخِذِهِ الْيُمْنَى ، ثُمَّ قَبَضَ اثْنَتَيْنِ مِنْ أَصَابِعِهِ ، وَحَلَّقَ حَلْقَةً ، ثُمَّ رَفَعَ أُصْبُعَهُ فَرَأَيْتُهُ يُحَرِّكُهَا يَدْعُو بِهَا ، مُخْتَصَرٌ.

1268. ...Rəvayət edilir ki, Vail ibn Hucr ﷺ demişdir: “Mən öz-özümə dedim: “Mən mütləq Allah Elçisinin ﷺ namazı necə qıldığına baxacağam”. Ona baxdım. O oturdu və sol ayağını altına qoydu, sol biləyini də sol dizinin və budunun üzərinə qoydu. Sağ dirsəyini sağ budunun üzərinə qoydu. Sonra barmaqlarının ikisini halqa şəklində bağladı və barmağını hərəkət etdirərək dua etdi”.

٣٥ - بَابُ بَسْطِ الْيُسْرَى عَلَى الرُّكْبَةِ

## 35-ci fəsil: Sağ əli dizin üzərinə qoymaq

١٢٦٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا جَلَسَ فِي الصَّلاَةِ وَضَعَ يَدَيْهِ عَلَى رُكْبَتَيْهِ ، وَرَفَعَ أُصْبُعَهُ الَّتِي تَلِي الإِبْهَامَ فَدَعَا بِهَا ، وَيَدُهُ

الْيُسْرَى عَلَى رُكْبَتِهِ بَاسِطُهَا عَلَيْهَا.

1269. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ namazda oturduqda əlini dizinin üzərinə qoyar, baş barmaqdan sonra gələn (şəhadət) barmağı qaldırar və dua edərdi. Sol əlini isə dizinin üzərinə qoyardı.

١٢٧٠ - أَخْبَرَنَا أَيُّوبُ بْنُ مُحَمَّدٍ الْوَزَّانُ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي زِيَادٌ ، عَنْ مُحَمَّدِ بْنِ عَجْلاَنَ ، عَنْ عَامِرِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُشِيرُ بِأُصْبُعِهِ إِذَا دَعَا ، وَلاَ يُحَرِّكُهَا ، قَالَ : ابْنُ جُرَيْجٍ : وَزَادَ عَمْرٌو ، قَالَ : أَخْبَرَنِي عَامِرُ بْنُ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ أَبِيهِ ، أَنَّهُ رَأَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدْعُو كَذَلِكَ ، وَيَتَحَامَلُ بِيَدِهِ الْيُسْرَى عَلَى رِجْلِهِ الْيُسْرَى.

1270. ...Abdullah ibn əz-Zubeyr ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ namazda dua etdikdə barmağı ilə işarə edər, lakin tərpətməzdi. İbn Cureyc deyir ki, Amr əlavə edib dedi: "Mənə Amir ibn Abdullah ibn əz-Zubeyr atasından rəvayət etdi ki, Peyğəmbərin ﷺ bu cür dua etdiyini və sol əlini sol ayağının üzərində sərbəst halda qoyduğunu görmüşdür".[1]

٣٦ - بَابُ الإِشَارَةِ بِالأُصْبُعِ فِي التَّشَهُّدِ

## 36-cı fəsil: Təşəhhüddə barmaqla işarə etmək

١٢٧١ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَمَّارٍ الْمَوْصِلِيُّ ، عَنِ الْمُعَافَى ، عَنْ عِصَامِ بْنِ قُدَامَةَ ، عَنْ مَالِكٍ وَهُوَ ابْنُ نُمَيْرٍ الْخُزَاعِيُّ ، عَنْ أَبِيهِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَاضِعًا يَدَهُ الْيُمْنَى عَلَى فَخِذِهِ الْيُمْنَى فِي الصَّلاَةِ ، وَيُشِيرُ بِأُصْبُعِهِ.

1271. ...Malik ibn Numeyr əl-Xuzəi atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Allah Elçisinin ﷺ namazda sağ əlini sağ budunun üzərinə qoyaraq barmağı ilə işarə etdiyini gördüm".

٣٧ - بَابُ النَّهْيِ عَنِ الإِشَارَةِ بِأُصْبُعَيْنِ ، وَبِأَيِّ أُصْبُعٍ يُشِيرُ

## 37-ci fəsil: Təşəhhüddə iki barmaqla işarə etməyin qadağan olması

١٢٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا صَفْوَانُ بْنُ عِيسَى ، قَالَ : حَدَّثَنَا ابْنُ عَجْلاَنَ ، عَنِ الْقَعْقَاعِ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَجُلاً كَانَ يَدْعُو بِأُصْبُعَيْهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَحِّدْ ، أَحِّدْ.

1272. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, bir kişi təşəhhüddə iki barmağı ilə işarə edərək dua etdi. Allah Elçisi ﷺ ona buyurdu: "Biri ilə, biri ilə!"

[1] "Lakin tərpətməzdi" hissəsi səhih deyil.

١٢٧٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ الْمُخَرِّمِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو مُعَاوِيَةَ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ سَعْدٍ قَالَ : مَرَّ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَنَا أَدْعُو بِأَصَابِعِي ، فَقَالَ : أَحِّدْ ، أَحِّدْ ، وَأَشَارَ بِالسَّبَّابَةِ.

1273. ...Rəvayət edilir ki, Səd ﷛ demişdir: “Allah Elçisi ﷺ məni təşəhhüddə ikən iki barmaqla dua edərkən gördü və: “Biri ilə, biri ilə!”- deyərək şəhadət barmağına işarə etdi”.

٣٨ - بَابُ إِحْنَاءِ السَّبَّابَةِ فِي الإِشَارَةِ

38-ci fəsil: Təşəhhüddə işarə barmağını əyərək işarə etmək

١٢٧٤ - أَخْبَرَنِي أَحْمَدُ بْنُ يَحْيَى الصُّوفِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا عِصَامُ بْنُ قُدَامَةَ الْجَدَلِيُّ ، قَالَ : حَدَّثَنِي مَالِكُ بْنُ نُمَيْرٍ الْخُزَاعِيُّ - مِنْ أَهْلِ الْبَصْرَةِ - أَنَّ أَبَاهُ حَدَّثَهُ ، أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَاعِدًا فِي الصَّلاَةِ ، وَاضِعًا ذِرَاعَهُ الْيُمْنَى عَلَى فَخِذِهِ الْيُمْنَى ، رَافِعًا أُصْبُعَهُ السَّبَّابَةَ ، قَدْ أَحْنَاهَا شَيْئًا وَهُوَ يَدْعُو.

1274. ...Rəvayət edilir ki, Bəsrədən olan Malik ibn Numeyr əl-Xuzəinin atası ﷛ Allah Elçisinin ﷺ namazda oturduğunu, sağ dirsəyini sağ budunun üzərinə qoyaraq işarə barmağını qaldırdığını və əyərək dua etdiyini görmüşdür.[1]

٣٩ - مَوْضِعُ الْبَصَرِ عِنْدَ الإِشَارَةِ وَتَحْرِيكِ السَّبَّابَةِ

39-cu fəsil: Təşəhhüddə şəhadət barmağı ilə işarə edib tərpətdikdə gözlərin baxdığı yer

١٢٧٥ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ ابْنِ عَجْلاَنَ ، عَنْ عَامِرِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا قَعَدَ فِي التَّشَهُّدِ وَضَعَ كَفَّهُ الْيُسْرَى عَلَى فَخِذِهِ الْيُسْرَى ، وَأَشَارَ بِالسَّبَّابَةِ لاَ يُجَاوِزُ بَصَرُهُ إِشَارَتَهُ.

1275. ...Amir ibn Abdullah ibn əz-Zubeyr atasından ﷠ rəvayət edir ki, Allah Elçisi ﷺ təşəhhüdə oturduqda sol ovucunu sol budunun üzərinə qoyar və şəhadət barmağı ilə işarə edib gözlərini ondan (barmağından) ayırmazdı.

[1] “Əyərək” əlavəsi səhih deyil.

٤٠ - بَابُ النَّهْيِ عَنْ رَفْعِ الْبَصَرِ إِلَى السَّمَاءِ عِنْدَ الدُّعَاءِ فِي الصَّلاَةِ

## 40-cı fəsil: Namazda dua vaxtı yuxarı baxmağın qadağan olması

١٢٧٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي اللَّيْثُ ، عَنْ جَعْفَرِ بْنِ رَبِيعَةَ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : لَيَنْتَهِيَنَّ أَقْوَامٌ عَنْ رَفْعِ أَبْصَارِهِمْ عِنْدَ الدُّعَاءِ فِي الصَّلاَةِ إِلَى السَّمَاءِ أَوْ لَتُخْطَفَنَّ أَبْصَارُهُمْ.

1276. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Toplum ya namazda dua etdikdə yuxarı baxmaqdan əl çəkəcək, ya da onların gözləri çıxacaq”.

٤١ - بَابُ إِيجَابِ التَّشَهُّدِ

## 41-ci fəsil: Təşəhhüddə nə deyilir?

١٢٧٧ - أَخْبَرَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ أَبُو عُبَيْدِ اللهِ الْمَخْزُومِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، وَمَنْصُورٌ ، عَنْ شَقِيقِ بْنِ سَلَمَةَ ، عَنِ ابْنِ مَسْعُودٍ قَالَ : كُنَّا نَقُولُ فِي الصَّلاَةِ قَبْلَ أَنْ يُفْرَضَ التَّشَهُّدُ : السَّلاَمُ عَلَى اللهِ ، السَّلاَمُ عَلَى جِبْرِيلَ وَمِيكَائِيلَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَقُولُوا هَكَذَا ، فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ هُوَ السَّلاَمُ ، وَلَكِنْ قُولُوا : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1277. ...Rəvayət edilir ki, İbn Məsud ﷺ demişdir: “Biz namazda təşəhhüd bizə öyrədilməmişdən qabaq: “Allaha salam olsun! Cəbrailə və Mikailə salam olsun!”- deyirdik. Bunu eşitdikdə Allah Elçisi ﷺ buyurdu: “Belə deməyin! Həqiqətən, Allah ﷻ Özü əs-Sələmdir. Belə deyin: “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!”[1]

[1] Transkripsiyası: ət-Təhiyyə:tu lillə:hi, vas-saləva:tu, vat-tayyibə:tu, əs-sələ:mu aleykə əyyu:-hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-sələ:mu aleynə: va alə: ibə:dillə:his-sa:lihi:n. Əşhədu ən lə: ilə:hə illəllah va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

٤٢ - تَعْلِيمُ التَّشَهُّدِ كَتَعْلِيمِ السُّورَةِ مِنَ الْقُرْآنِ

## 42-ci fəsil: Təşəhhüdün öyrədilməsi Quran surəsinin öyrədilməsi kimi olmuşdur

١٢٧٨ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ حُمَيْدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو الزُّبَيْرِ ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُعَلِّمُنَا التَّشَهُّدَ كَمَا يُعَلِّمُنَا السُّورَةَ مِنَ الْقُرْآنِ.

1278. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisi ﷺ təşəhhüdü Qurandan bir surəni öyrətdiyi kimi öyrətmişdir”.

٤٣ - بَابُ كَيْفَ التَّشَهُّدُ

## 43-ci fəsil: Təşəhhüdün necəliyi

١٢٧٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْفُضَيْلُ وَهُوَ ابْنُ عِيَاضٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ شَقِيقٍ ، عَنْ عَبْدِ اللهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ هُوَ السَّلاَمُ ، فَإِذَا قَعَدَ أَحَدُكُمْ فَلْيَقُلْ : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، ثُمَّ لِيَتَخَيَّرْ بَعْدَ ذَلِكَ مِنَ الْكَلاَمِ مَا شَاءَ.

1279. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, Allah ﷻ Özü əs-Sələmdir. Sizdən biriniz təşəhhüdə oturduqda desin: “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir![1] Bundan sonra istədiyi kəlamı (duanı) seçib desin”.

٤٤ - نَوْعٌ آخَرُ مِنَ التَّشَهُّدِ

## 44-cü fəsil: Təşəhhüddə oxunacaq başqa bir dua

١٢٨٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ هِشَامٍ ، عَنْ قَتَادَةَ (ح) وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ يُونُسَ بْنِ جُبَيْرٍ ، عَنْ حِطَّانَ بْنِ عَبْدِ اللهِ ، أَنَّ الأَشْعَرِيَّ قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَطَبَنَا فَعَلَّمَنَا سُنَّتَنَا وَبَيَّنَ لَنَا صَلاَتَنَا ، فَقَالَ : إِذَا قُمْتُمْ إِلَى الصَّلاَةِ فَأَقِيمُوا صُفُوفَكُمْ ، ثُمَّ لِيَؤُمَّكُمْ أَحَدُكُمْ ، فَإِذَا كَبَّرَ فَكَبِّرُوا ، وَإِذَا قَالَ : **{وَلاَ الضَّالِّينَ}** ، فَقُولُوا : آمِينَ ، يُجِبْكُمُ اللَّهُ ، ثُمَّ إِذَا كَبَّرَ وَرَكَعَ ، فَكَبِّرُوا وَارْكَعُوا ،

[1] Yuxarıdakı təşəhhüdlə eynidir.

فَإِنَّ الإِمَامَ يَرْكَعُ قَبْلَكُمْ وَيَرْفَعُ قَبْلَكُمْ ، قَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَتِلْكَ بِتِلْكَ ، وَإِذَا قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ فَقُولُوا : اللَّهُمَّ رَبَّنَا لَكَ الْحَمْدُ ، فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ قَالَ عَلَى لِسَانِ نَبِيِّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ إِذَا كَبَّرَ وَسَجَدَ ، فَكَبِّرُوا وَاسْجُدُوا ، فَإِنَّ الإِمَامَ يَسْجُدُ قَبْلَكُمْ وَيَرْفَعُ قَبْلَكُمْ ، قَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَتِلْكَ بِتِلْكَ ، وَإِذَا كَانَ عِنْدَ الْقَعْدَةِ فَلْيَكُنْ مِنْ قَوْلِ أَحَدِكُمْ أَنْ يَقُولَ : التَّحِيَّاتُ الطَّيِّبَاتُ الصَّلَوَاتُ لِلَّهِ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ.

1280. ...Rəvayət edilir ki, əl-Əşari ﷺ demişdir: "Allah Elçisi ﷺ bizə xütbə dedi, sünnəni və namazı öyrətdi. O dedi: "Namaza durduqda, saflarınızı düz tutun. Sonra sizdən biriniz namazda imamlıq etsin. İmam təkbir etdikdə, siz də təkbir edin. O: **"Vələdda:lli:n!**[1]**"**- dedikdə, siz: "Amin"- deyin. Allah sizə cavab verər. Sonra təkbir edib ruku etdikdə, siz də təkbir edib ruku edin. Həqiqətən, imam sizdən qabaq ruku edir və sizdən qabaq rukudan qalxır". Allahın Peyğəmbəri ﷺ dedi: "Siz də belə edin!" İmam: "Səmi Alla:hu limən həmidəh - (Allah Ona həmd edəni eşitdi)" dedikdə, siz deyin: "Alla:hummə, Rabbənə: ləkəl-həmd!"[2] Həqiqətən, Allah ﷻ Öz Peyğəmbərinin ﷺ dili ilə: "Allah Ona həmd edəni eşitdi" demişdir. Sonra imam təkbir edib səcdə etdikdə, siz də təkbir edib səcdə edin. İmam sizdən qabaq səcdə edir və sizdən qabaq səcdədən qalxır". Allahın Peyğəmbəri ﷺ dedi: "Siz də belə edin! Təşəhhüdə oturduqda sizin ilk sözünüz belə olsun: "Salamlar, gözəl şeylər və dualar Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"[3]

## ٤٥ - نَوْعٌ آخَرُ مِنَ التَّشَهُّدِ

## 45-ci fəsil: Təşəhhüddə oxunacaq başqa bir dua

١٢٨١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو عَاصِمٍ ، قَالَ : حَدَّثَنَا أَيْمَنُ ابْنُ نَابِلٍ ، قَالَ : حَدَّثَنَا أَبُو الزُّبَيْرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُعَلِّمُنَا التَّشَهُّدَ كَمَا يُعَلِّمُنَا السُّورَةَ مِنَ الْقُرْآنِ ، بِسْمِ اللهِ وَبِاللَّهِ ، التَّحِيَّاتُ لِلَّهِ

---

[1] Tərcüməsi: **"...azmışların yoluna yox!"** (əl-Fatihə, 7)

[2] Tərcüməsi: Allahım, ey Rəbbimiz, Sənə həmd olsun!

[3] Transkripsiyası: ət-Təhiyyə:tut-tayyibə:tus-saləvə:tu lilləh, əs-sələ:mu aleykə əyyu:hən-nəbiy-yu va rahmətulla:hi va bərakə:tuhu, əs-sələ:mu aleynə: va alə: ibə:dillə:his-sa:lihi:n. Əşhədu ən lə: ilə:hə illəllah va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَأَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، وَأَسْأَلُ اللَّهَ الْجَنَّةَ ، وَأَعُوذُ بِهِ مِنَ النَّارِ.

1281. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: “Allah Elçisi ﷺ bizə təşəhhüdü Qurandan bir surə öyrətdiyi kimi öyrətdi. Allahın adı ilə, Allah üçün! “Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və Muhəmməd Onun qulu və elçisidir! Allahdan Cənnəti diləyirəm və Cəhənnəm əzabından Allaha sığınıram!”[1]

٤٦ - بَابُ السَّلاَمِ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

46-cı fəsil: Peyğəmbərə ﷺ deyilən salavat haqda

١٢٨٢ - أَخْبَرَنَا عَبْدُ الْوَهَّابِ بْنُ عَبْدِ الْحَكَمِ الْوَرَّاقُ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ مُعَاذٍ ، عَنْ سُفْيَانَ بْنِ سَعِيدٍ (ح) وأَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، وَعَبْدُ الرَّزَّاقِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَبْدِ اللهِ بْنِ السَّائِبِ ، عَنْ زَاذَانَ ، عَنْ عَبْدِ اللهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ لِلَّهِ مَلاَئِكَةً سَيَّاحِينَ فِي الأَرْضِ يُبَلِّغُونِي مِنْ أُمَّتِي السَّلاَمَ.

1282. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Allahın yer üzündə səyyah mələkləri var. Onlar mənə ümmətimin göndərdiyi salamı (salavatı) çatdırırlar”.

٤٧ - فَضْلُ التَّسْلِيمِ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

47-ci fəsil: Peyğəmbərə ﷺ salavat deməyin fəziləti

١٢٨٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ الْكَوْسَجُ ، قَالَ : أَنْبَأَنَا عَفَّانُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا ثَابِتٌ ، قَالَ : قَدِمَ عَلَيْنَا سُلَيْمَانُ ، مَوْلَى الْحَسَنِ ابْنِ عَلِيٍّ زَمَنَ الْحَجَّاجِ فَحَدَّثَنَا ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَاءَ ذَاتَ يَوْمٍ وَالْبُشْرَى فِي وَجْهِهِ ، فَقُلْنَا : إِنَّا لَنَرَى الْبُشْرَى فِي وَجْهِكَ ، فَقَالَ : إِنَّهُ أَتَانِي الْمَلَكُ ، فَقَالَ : يَا مُحَمَّدُ ، إِنَّ رَبَّكَ يَقُولُ : أَمَا يُرْضِيكَ أَنَّهُ لاَ يُصَلِّي عَلَيْكَ أَحَدٌ إِلاَّ صَلَّيْتُ عَلَيْهِ عَشْرًا ، وَلاَ يُسَلِّمُ عَلَيْكَ أَحَدٌ ، إِلاَّ سَلَّمْتُ عَلَيْهِ عَشْرًا.

1283. ...Abdullah ibn Əbu Talhə atasından ﷺ rəvayət edir ki, bir gün Allah Elçisi ﷺ üzündə sevinc əlaməti olaraq gəldi. Biz ona dedik: “Biz sənin üzündə sevinc görürük”. O dedi: “Həqiqətən, bir mələk yanıma gəlib belə dedi: “Ey Muhəmməd, sənin Rəbbin buyurur: “Sənə bir dəfə salavat deyən

[1] Hədis zəifdir.

hər bir kəsə Mənim on dəfə xeyir-dua etməyim, sənə bir dəfə salam deyənə Mənim on dəfə salam deməyim səni məmnun edərmi?!"

٤٨ - بَابُ التَّمْجِيدِ وَالصَّلاَةِ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الصَّلاَةِ

48-ci fəsil: Namazda Allahı tərif etmək və Peyğəmbərə ﷺ salavat demək

١٢٨٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ أَبِي هَانِئٍ ، أَنَّ أَبَا عَلِيٍّ الْجَنْبِيَّ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ فَضَالَةَ بْنَ عُبَيْدٍ ، يَقُولُ : سَمِعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلاً يَدْعُو فِي صَلاَتِهِ لَمْ يُمَجِّدِ اللَّهَ ، وَلَمْ يُصَلِّ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عَجِلْتَ أَيُّهَا الْمُصَلِّي ، ثُمَّ عَلَّمَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَسَمِعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلاً يُصَلِّي ، فَمَجَّدَ اللَّهَ وَحَمِدَهُ ، وَصَلَّى عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : ادْعُ تُجَبْ ، وَسَلْ تُعْطَ.

1284. ...Rəvayət edilir ki, Fədalə ibn Ubeyd ؓ demişdir: "Allah Elçisi ﷺ bir kişinin namazda dua edərkən Allahı tərifləmədiyini və Peyğəmbərə ﷺ salavat demədiyini eşitdi. Allah Elçisi ﷺ dedi: "Ey namaz qılan, tələsdin". Sonra onlara (Allahı tərif etməyi və salavatı) öyrətdi. Daha sonra Allah Elçisi ﷺ bir kişinin namazda Allahı tərifləyib həmd etdiyini və Peyğəmbərə ﷺ də salavat dediyini eşitdi. Allah Elçisi ﷺ dedi: "Dua et, sənə cavab verilsin! İstə, sənə verilsin!"

٤٩ - بَابُ الأَمْرِ بِالصَّلاَةِ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

49-cu fəsil: Peyğəmbərə ﷺ salavat deməyin əmr edilməsi

١٢٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، وَاللَّفْظُ لَهُ ، عَنْ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ نُعَيْمِ بْنِ عَبْدِ اللهِ الْمُجْمِرِ ، أَنَّ مُحَمَّدَ بْنَ عَبْدِ اللهِ بْنِ زَيْدٍ الأَنْصَارِيَّ ، وَعَبْدُ اللهِ بْنُ زَيْدٍ - الَّذِي أُرِيَ النِّدَاءَ بِالصَّلاَةِ - أَخْبَرَهُ ، عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَارِيِّ أَنَّهُ قَالَ : أَتَانَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي مَجْلِسِ سَعْدِ بْنِ عُبَادَةَ ، فَقَالَ لَهُ بَشِيرُ بْنُ سَعْدٍ : أَمَرَنَا اللَّهُ عَزَّ وَجَلَّ أَنْ نُصَلِّيَ عَلَيْكَ يَا رَسُولَ اللهِ فَكَيْفَ نُصَلِّ عَلَيْكَ ؟ فَسَكَتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى تَمَنَّيْنَا أَنَّهُ لَمْ يَسْأَلْهُ ثُمَّ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ ، وَعَلَى آلِ مُحَمَّدٍ ، كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ ، وَبَارِكْ عَلَى مُحَمَّدٍ ، وَعَلَى آلِ مُحَمَّدٍ ، كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ فِي الْعَالَمِينَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، وَالسَّلاَمُ كَمَا عَلِمْتُمْ.

1285. ...Rəvayət edilir ki, Əbu Məsud əl-Ənsari ؓ demişdir: "Biz Səd ibn Ubadənin məclisində oturarkən Allah Elçisi ﷺ yanımıza gəldi. Bəşir ibn Səd ona dedi: "Allah ﷻ bizə sənə salavat deməyimizi əmr etdi, ey Allahın Elçisi! Bəs sənə salavatı necə deyək?" Allah Elçisi ﷺ susdu və biz də ona sual verməməsini təmənna etdik. Sonra o dedi: "Deyin: "Allahım!

İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən!"[1] Salam da bildiyiniz kimidir".

٥٠ - بَابُ كَيْفَ الصَّلاَةُ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

## 50-ci fəsil: Peyğəmbərə ﷺ salavat necə deyilir?

١٢٨٦ - أَخْبَرَنَا زِيَادُ بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ بْنُ عَبْدِ الْمَجِيدِ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ حَسَّانَ ، عَنْ مُحَمَّدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ بِشْرٍ ، عَنْ أَبِي مَسْعُودٍ الأَنْصَارِيِّ قَالَ : قِيلَ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أُمِرْنَا أَنْ نُصَلِّيَ عَلَيْكَ وَنُسَلِّمَ ، أَمَّا السَّلاَمُ فَقَدْ عَرَفْنَاهُ ، فَكَيْفَ نُصَلِّي عَلَيْكَ ؟ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ ، اللَّهُمَّ بَارِكْ عَلَى مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ.

1286. ...Rəvayət edilir ki, Əbu Məsud əl-Ənsari ؓ demişdir: "Peyğəmbərə ﷺ belə deyildi: "Biz sənə salavat və salam deməklə əmr olunduq. O ki qaldı salama, biz artıq onu bilirik. Bəs sənə salavatı necə deyək?" O dedi: "Deyin: "Allahım! İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi, Muhəmmədə də xeyir-dua ver! Allahım! İbrahimin ailəsinə bərəkət verdiyin kimi, Muhəmmədə də bərəkət ver!"[2]

٥١ - نَوْعٌ آخَرُ

## 51-ci fəsil: Salavatın başqa bir növü

١٢٨٧ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا بْنِ دِينَارٍ ، مِنْ كِتَابِهِ ، قَالَ : حَدَّثَنَا حُسَيْنُ بْنُ عَلِيٍّ ، عَنْ زَائِدَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ قَالَ : قُلْنَا : يَا رَسُولَ اللهِ ، السَّلاَمُ عَلَيْكَ قَدْ عَرَفْنَاهُ ، فَكَيْفَ الصَّلاَةُ ؟ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، اللَّهُمَّ بَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، قَالَ ابْنُ أَبِي لَيْلَى : وَنَحْنُ نَقُولُ ، وَعَلَيْنَا مَعَهُمْ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : حَدَّثَنَا بِهِ مِنْ كِتَابِهِ وَهَذَا خَطَأٌ.

---

[1] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə salleytə alə: ə:li İbra:hi:m! Va bə:rik alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə bə:raktə alə: ə:li İbra:hi:m, fil-a:ləmi:n innəkə həmi:dun məci:d!

[2] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin kəmə: salleytə alə: ə:li İbra:hi:m! Alla:hummə bə:rik alə: Muhəmmədin, kəmə: bə:raktə alə: ə:li İbra:hi:m!

1287. ...Rəvayət edilir ki, Kəb ibn Ucra ﵁ demişdir: “Biz dedik: “Ey Allahın Elçisi, sənə salam deməyi artıq bilirik. Bəs sənə salavatı necə deyək?” O dedi: “Deyin: “Allahım! İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən! Allahım! İbrahimin ailəsinə bərəkət verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən!” İbn Əbu Leyla dedi: “Biz də deyirik ki, onlarla bərabər bizim də üzərimizə (dualar olsun)”. Əbu Abdur-Rahmən dedi: “O, bunu bizə öz kitabından danışdı və bu, səhvdir”.[1]

١٢٨٨ - أَخْبَرَنَا الْقَاسِمُ بْنُ زَكَرِيَّا ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ زَائِدَةَ ، عَنْ سُلَيْمَانَ ، عَنِ الْحَكَمِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ قَالَ : قُلْنَا : يَا رَسُولَ اللهِ ، السَّلاَمُ عَلَيْكَ قَدْ عَرَفْنَاهُ ، فَكَيْفَ الصَّلاَةُ عَلَيْكَ ؟ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ كَمَا صَلَّيْتَ عَلَى إِبْرَاهِيمَ وَآلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، وَبَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ ، كَمَا بَارَكْتَ عَلَى إِبْرَاهِيمَ وَآلِ إِبْرَاهِيمَ ، إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، قَالَ عَبْدُ الرَّحْمَنِ : وَنَحْنُ نَقُولُ وَعَلَيْنَا مَعَهُمْ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : وَهَذَا أَوْلَى بِالصَّوَابِ مِنَ الَّذِي قَبْلَهُ ، وَلاَ نَعْلَمُ أَحَدًا قَالَ فِيهِ عَمْرُو بْنُ مُرَّةَ غَيْرَ هَذَا وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

1288. ...Rəvayət edilir ki, Kəb ibn Ucra ﵁ demişdir: “Ey Allahın Elçisi, sənə salam verməyi bildik, bəs sənə salavat necə olur?” O dedi: “Deyin: “Allahım! İbrahimə və İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən! İbrahimə və İbrahimin ailəsinə bərəkət verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən!”[2]

١٢٨٩ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنِ ابْنِ أَبِي لَيْلَى ، قَالَ : قَالَ لِي كَعْبُ بْنُ عُجْرَةَ : أَلاَ أُهْدِي لَكَ هَدِيَّةً ؟ قُلْنَا : يَا رَسُولَ اللهِ ، قَدْ عَرَفْنَا كَيْفَ السَّلاَمُ عَلَيْكَ ، فَكَيْفَ نُصَلِّي عَلَيْكَ ؟ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ ، كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، اللَّهُمَّ بَارِكْ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ.

1289. ...Rəvayət edilir ki, İbn Əbu Leyla ﵁ demişdir: “Kəb ibn Ucra mənə belə dedi: “Sənə bir hədiyyə edimmi?” (Sonra bu hədisi danışdı): “Biz

[1] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə salleytə alə: ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d! Alla:hummə bə:rik alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə bə:raktə alə: ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d!

[2] Alla:hummə salli alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə: salleytə alə: İbra:hi:mə va ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d! Va bə:rik alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə: bə:raktə alə: İbra:hi:mə va ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d!

dedik: “Ey Allahın Elçisi, biz sənə salam deməyin necə olduğunu bildik. Bəs sənə salavatı necə deyək?” O dedi: “Deyin: “Allahım! İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən! Allahım! İbrahimin ailəsinə bərəkət verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən!”[1]

## ٥٢ - نَوْعٌ آخَرُ

## 52-ci fəsil: Salavatın başqa bir növü

١٢٩٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا مُحَمَّدُ بْنُ بِشْرٍ ، قَالَ : حَدَّثَنَا مُجَمِّعُ بْنُ يَحْيَى ، عَنْ عُثْمَانَ بْنِ مَوْهَبٍ ، عَنْ مُوسَى بْنِ طَلْحَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : قُلْنَا : يَا رَسُولَ اللهِ ، كَيْفَ الصَّلاَةُ عَلَيْكَ ؟ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ ، كَمَا صَلَّيْتَ عَلَى إِبْرَاهِيمَ وَآلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، وَبَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ ، كَمَا بَارَكْتَ عَلَى إِبْرَاهِيمَ وَآلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ.

1290. ...Musa ibn Talhə atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Biz dedik: “Ey Allahın Elçisi, sənə salavatı necə edək?” O dedi: “Deyin: “Allahım! İbrahimə və İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən! İbrahimə və İbrahimin ailəsinə bərəkət verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən!”[2]

١٢٩١ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ عُثْمَانَ بْنِ مَوْهَبٍ ، عَنْ مُوسَى بْنِ طَلْحَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَجُلاً أَتَى نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : كَيْفَ نُصَلِّي عَلَيْكَ يَا نَبِيَّ اللهِ ؟ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ ، كَمَا صَلَّيْتَ عَلَى إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ ، وَبَارِكْ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ ، كَمَا بَارَكْتَ عَلَى إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ.

1291. ...Musa ibn Talhə atasından ﵁ rəvayət edir ki, bir kişi Allahın Peyğəmbərinin ﷺ yanına gəlib dedi: “Biz sənə salavatı necə deyək, ey Allahın

[1] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin va ə:li Muhəmməd, kəmə: salleytə alə: ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d! Alla:hummə bə:rik alə: Muhəmmədin va ə:li Muhəmməd, kəmə: bə:raktə alə: ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d!

[2] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə: salleytə alə: İbra:hi:mə va ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d. Va bə:rik alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə: bə:raktə alə: İbra:hi:mə va ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d!

Peyğəmbəri?" O dedi: "Deyin: "Allahım! İbrahimə xeyir-dua verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də xeyir-dua ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən! İbrahimə bərəkət verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən!"[1]

١٢٩٢ - أَخْبَرَنَا سَعِيدُ بْنُ يَحْيَى بْنِ سَعِيدٍ الأُمَوِيُّ ، فِي حَدِيثِهِ ، عَنْ أَبِيهِ ، عَنْ عُثْمَانَ بْنِ حَكِيمٍ ، عَنْ خَالِدِ بْنِ سَلَمَةَ ، عَنْ مُوسَى بْنِ طَلْحَةَ ، قَالَ : سَأَلْتُ زَيْدَ بْنَ خَارِجَةَ قَالَ : أَنَا سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : صَلُّوا عَلَيَّ وَاجْتَهِدُوا فِي الدُّعَاءِ ، وَقُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَعَلَى آلِ مُحَمَّدٍ.

1292. ...Rəvayət edilir ki, Əbu Musa ibn Talhə ﵁ demişdir: "Mən Zeyd ibn Xaricədən soruşdum: "Mən Allah Elçisinə ﷺ necə salavat edim?" O dedi: "Mən də bunu Peyğəmbərdən ﷺ soruşmuşdum. O dedi: "Mənə salavat deyin, duanı da çox etməyə çalışın və deyin: "Allahım! Muhəmmədə və Muhəmmədin ailəsinə xeyir-dua ver!"[2]

## ٥٣ - نَوْعٌ آخَرُ
## 53-cü fəsil: Salavatın başqa bir növü

١٢٩٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا بَكْرٌ وَهُوَ ابْنُ مُضَرَ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ عَبْدِ اللهِ بْنِ خَبَّابٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ قَالَ : قُلْنَا : يَا رَسُولَ اللهِ ، السَّلاَمُ عَلَيْكَ قَدْ عَرَفْنَاهُ ، فَكَيْفَ الصَّلاَةُ عَلَيْكَ ؟ قَالَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ عَبْدِكَ وَرَسُولِكَ كَمَا صَلَّيْتَ عَلَى إِبْرَاهِيمَ ، وَبَارِكْ عَلَى مُحَمَّدٍ وَآلِ مُحَمَّدٍ كَمَا بَارَكْتَ عَلَى إِبْرَاهِيمَ.

1293. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Biz dedik: "Ey Allahın Elçisi, sənə salamın necə olduğunu bildik. Bəs sənə salavatı necə deyək?" O dedi: "Deyin: "Allahım! İbrahimə xeyir-dua verdiyin kimi qulun və rəsulun Muhəmmədə də xeyir-dua ver! İbrahimə bərəkət verdiyin kimi Muhəmmədə və Muhəmmədin ailəsinə də bərəkət ver!"[3]

---

[1] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə: salleytə alə: İbra:hi:m, innəkə həmi:dun məci:d. Va bə:rik alə: Muhəmmədin va alə: ə:li Muhəmməd, kəmə: bə:raktə alə: İbra:hi:m, innəkə həmi:dun məci:d!

[2] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin va alə: ə:li Muhəmməd!

[3] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin abdikə va rasu:likə, kəmə: salleytə İbra:hi:m, va bə:rik alə: Muhəmmədin va ə:li Muhəmməd, kəmə: bə:raktə alə: İbra:hi:m!

٥٤ - نَوْعٌ آخَرُ

## 54-cü fəsil: Salavatın başqa bir növü

١٢٩٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، حَدَّثَنِي مَالِكٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرِ بْنِ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَزْمٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَمْرِو بْنِ سُلَيْمٍ الزُّرَقِيِّ ، قَالَ : أَخْبَرَنِي أَبُو حُمَيْدٍ السَّاعِدِيُّ ، أَنَّهُمْ قَالُوا : يَا رَسُولَ اللهِ ، كَيْفَ نُصَلِّي عَلَيْكَ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قُولُوا : اللَّهُمَّ صَلِّ عَلَى مُحَمَّدٍ وَأَزْوَاجِهِ وَذُرِّيَّتِهِ ، فِي حَدِيثِ الْحَارِثِ : كَمَا صَلَّيْتَ عَلَى آلِ إِبْرَاهِيمَ ، وَبَارِكْ عَلَى مُحَمَّدٍ ، وَأَزْوَاجِهِ ، وَذُرِّيَّتِهِ ، قَالاَ جَمِيعًا : كَمَا بَارَكْتَ عَلَى آلِ إِبْرَاهِيمَ إِنَّكَ حَمِيدٌ مَجِيدٌ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : أَنْبَأَنَا قُتَيْبَةُ بِهَذَا الْحَدِيثِ مَرَّتَيْنِ وَلَعَلَّهُ أَنْ يَكُونَ قَدْ سَقَطَ عَلَيْهِ مِنْهُ شَطْرٌ.

1294. ...Əbu Humeyd əs-Səidi ﷺ rəvayət edir ki, səhabələr dedilər: “Ey Allahın Elçisi, biz sənə salavatı (xeyir-duanı) necə deyək?” Allah Elçisi ﷺ dedi: “Deyin: “Allahım! Muhəmmədə, onun zövcələrinə və nəslinə xeyir-dua ver!”[1] əl-Harisin hədisində: “İbrahimin ailəsinə xeyir-dua verdiyin kimi Muhəmmədə, onun zövcələrinə və nəslinə bərəkət ver!”[2] Onlar ikisi isə birlikdə demişlər: “İbrahimin ailəsinə bərəkət verdiyin kimi! Şübhəsiz ki, Sən tərifəlayiqsən, şan-şöhrətlisən!”[3] Əbu Abdur-Rahmən (ən-Nəsəi) dedi: “Quteybə bu hədisi bizə iki dəfə danışıb. Ola bilsin ki, bir şey onun yadından çıxıb”.

٥٥ - بَابُ الْفَضْلِ فِي الصَّلاَةِ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

## 55-ci fəsil: Peyğəmbərə ﷺ salavat deməyin fəziləti

١٢٩٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، يَعْنِي ابْنَ الْمُبَارَكِ ، قَالَ : أَنْبَأَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ ثَابِتٍ ، عَنْ سُلَيْمَانَ ، مَوْلَى الْحَسَنِ بْنِ عَلِيٍّ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَاءَ ذَاتَ يَوْمٍ وَالْبِشْرُ يُرَى فِي وَجْهِهِ ، فَقَالَ : إِنَّهُ جَاءَنِي جِبْرِيلُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : أَمَا يُرْضِيكَ يَا مُحَمَّدُ أَنْ لاَ يُصَلِّيَ عَلَيْكَ أَحَدٌ مِنْ أُمَّتِكَ إِلاَّ صَلَّيْتُ عَلَيْهِ عَشْرًا ، وَلاَ يُسَلِّمَ عَلَيْكَ أَحَدٌ مِنْ أُمَّتِكَ إِلاَّ سَلَّمْتُ عَلَيْهِ عَشْرًا.

1295. ...Abdullah ibn Əbu Talhə atasından ﷺ rəvayət edir ki, bir gün Allah Elçisi ﷺ üzündə sevinclə gəlib dedi: “Həqiqətən, Cəbrail ﷺ yanıma gəlib dedi: “Ey Muhəmməd, ümmətindən sənə bir dəfə salavat deyən hər bir

[1] Transkripsiyası: Alla:hummə salli alə: Muhəmmədin va əzvə:cihi va zurriyyətihi!
[2] Transkripsiyası: Kəmə: salleytə alə: ə:li İbra:hi:m, va bə:rik alə: Muhəmmədin va əzvə:cihi va zurriyyətihi!
[3] Transkripsiyası: Kəmə: bə:raktə alə: ə:li İbra:hi:m, innəkə həmi:dun məci:d!

kəsə Mənim on xeyir-dua etməyim və ümmətindən sənə bir dəfə salam deyənə Mənim on dəfə salam deməyim səni məmnun edərmi?!"

١٢٩٦ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ ، عَنِ الْعَلاَءِ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ صَلَّى عَلَيَّ وَاحِدَةً صَلَّى اللَّهُ عَلَيْهِ عَشْرًا.

1296. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə dedi: "Kim mənə bir dəfə salavat deyərsə, Allah ona on dəfə xeyir-dua edər".

١٢٩٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا يُونُسُ بْنُ أَبِي إِسْحَاقَ ، عَنْ بُرَيْدِ بْنِ أَبِي مَرْيَمَ ، قَالَ : حَدَّثَنَا أَنَسُ بْنُ مَالِكٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَلَّى عَلَيَّ صَلاَةً وَاحِدَةً صَلَّى اللَّهُ عَلَيْهِ عَشْرَ صَلَوَاتٍ ، وَحُطَّتْ عَنْهُ عَشْرُ خَطِيئَاتٍ ، وَرُفِعَتْ لَهُ عَشْرُ دَرَجَاتٍ.

1297. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim mənə bir dəfə salavat edərsə, Allah ona on dəfə xeyir-dua edər, onun on günahını silər və onu on dərəcə yüksəldər".

## ٥٦ - بَابُ تَخْيِيرِ الدُّعَاءِ بَعْدَ الصَّلاَةِ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

## 56-cı fəsil: Peyğəmbərə ﷺ salavat dedikdən sonra istədiyin duanı seçmək

١٢٩٨ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ الدَّوْرَقِيُّ ، وَعَمْرُو بْنُ عَلِيٍّ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ الأَعْمَشُ ، قَالَ : حَدَّثَنِي شَقِيقٌ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : كُنَّا إِذَا جَلَسْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الصَّلاَةِ ، قُلْنَا : السَّلاَمُ عَلَى اللهِ مِنْ عِبَادِهِ ، السَّلاَمُ عَلَى فُلاَنٍ وَفُلاَنٍ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَقُولُوا السَّلاَمُ عَلَى اللهِ ، فَإِنَّ اللَّهَ هُوَ السَّلاَمُ ، وَلَكِنْ إِذَا جَلَسَ أَحَدُكُمْ فَلْيَقُلْ : التَّحِيَّاتُ لِلَّهِ وَالصَّلَوَاتُ وَالطَّيِّبَاتُ ، السَّلاَمُ عَلَيْكَ أَيُّهَا النَّبِيُّ وَرَحْمَةُ اللهِ وَبَرَكَاتُهُ ، السَّلاَمُ عَلَيْنَا وَعَلَى عِبَادِ اللهِ الصَّالِحِينَ ، فَإِنَّكُمْ إِذَا قُلْتُمْ ذَلِكَ أَصَابَتْ كُلَّ عَبْدٍ صَالِحٍ فِي السَّمَاءِ وَالأَرْضِ ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، ثُمَّ لِيَتَخَيَّرْ مِنَ الدُّعَاءِ بَعْدُ أَعْجَبَهُ إِلَيْهِ يَدْعُو بِهِ.

1298. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə namazda oturduqda deyirdik: "Allaha qullarından salam olsun, salam olsun filankəsə və filankəsə". Allah Elçisi ﷺ dedi: "Allaha salam olsun"- deməyin! Həqiqətən, Allah Özü əs-Sələmdir. Biriniz (namazda) oturduqda desin: "Salamlar, dualar və gözəl şeylər Allaha aiddir. Ey Peyğəmbər, sənə Allahın salamı, rəhməti və bərəkəti olsun! Bizə və Allahın əməlisaleh qullarına salam olsun! Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun

qulu və elçisidir!"[1] Əgər siz bunu desəniz bu, səmada və yerdə olan bütün əməlisaleh bəndələrə çatar. (Sonra deyin:) Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq olan məbud yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir![2] Sonra istədiyi duanı seçib Ona dua etsin!"

### ٥٧ - الذِّكْرُ بَعْدَ التَّشَهُّدِ

### 57-ci fəsil: Təşəhhüddən sonra edilən zikr

١٢٩٩ - أَخْبَرَنَا عُبَيْدُ بْنُ وَكِيعِ بْنِ الْجَرَّاحِ ، أَخُو سُفْيَانَ بْنِ وَكِيعٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ عِكْرِمَةَ بْنِ عَمَّارٍ ، عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي طَلْحَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : جَاءَتْ أُمُّ سُلَيْمٍ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، عَلِّمْنِي كَلِمَاتٍ أَدْعُو بِهِنَّ فِي صَلاَتِي ؟ قَالَ : سَبِّحِي اللَّهَ عَشْرًا ، وَاحْمَدِيهِ عَشْرًا ، وَكَبِّرِيهِ عَشْرًا ، ثُمَّ سَلِيهِ حَاجَتَكِ يَقُلْ : نَعَمْ ، نَعَمْ.

1299. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Ummu Suleym Peyğəmbərin ﷺ yanına gəlib belə dedi: "Ey Allahın Elçisi, mənə namazımda deyəcəyim bəzi kəlmələr öyrət!" Peyğəmbər ﷺ dedi: "Allahı on dəfə təsbih (Subhən-Allah), on dəfə təhmid (Əlhəmdulilləh) və on dəfə təkbir (Allahu Əkbər) et. Sonra ehtiyacını istə". Sonra (istədiklərin veriləcək mənasında): "Bəli, bəli"- dedi".

### ٥٨ - بَابُ الدُّعَاءِ بَعْدَ الذِّكْرِ

### 58-ci fəsil: Zikrdən sonra dua etmək

١٣٠٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا خَلَفُ بْنُ خَلِيفَةَ ، عَنْ حَفْصِ بْنِ أَخِي أَنَسٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : كُنْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَالِسًا - يَعْنِي - وَرَجُلٌ قَائِمٌ يُصَلِّي ، فَلَمَّا رَكَعَ وَسَجَدَ وَتَشَهَّدَ دَعَا ، فَقَالَ فِي دُعَائِهِ : اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ بِأَنَّ لَكَ الْحَمْدَ لاَ إِلَهَ إِلاَّ أَنْتَ الْمَنَّانُ بَدِيعُ السَّمَاوَاتِ وَالأَرْضِ ، يَا ذَا الْجَلاَلِ وَالإِكْرَامِ ، يَا حَيُّ يَا قَيُّومُ ، إِنِّي أَسْأَلُكَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لأَصْحَابِهِ : تَدْرُونَ بِمَا دَعَا ؟ قَالُوا : اللَّهُ وَرَسُولُهُ أَعْلَمُ ، قَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ ، لَقَدْ دَعَا اللَّهَ بِاسْمِهِ الْعَظِيمِ ، الَّذِي إِذَا دُعِيَ بِهِ أَجَابَ ، وَإِذَا سُئِلَ بِهِ أَعْطَى.

---

[1] Transkripsiyası: ət-Təhiyyə:tu lillə:hi, vas-saləva:tu, vat-tayyibə:tu, əs-sələ:mu aleykə əyyu:hən-nəbiyyu va rahmətulla:hi va bərakə:tuhu, əs-sələ:mu aleynə: va alə: ibə:dillə:his-sa:li-hi:n!

[2] Transkripsiyası: Əşhədu ən lə: ilə:hə illəllah va əşhədu ənnə Muhəmmədən abduhu va rasu:luhu!

1300. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allah Elçisi ﷺ ilə birlikdə oturmuşdum. Bir kişi namaz qılarkən ruku, səcdə və təşəhhüddə belə dua etdi: "Allahım, Sənə yalvarıram, həmd Sənə məxsusdur, Səndən başqa ibadətə layiq məbud yoxdur, Sən lütf edən, yeri göyü icad edənsən! Ey Ucalıq və Kəramət Sahibi, ey əbədi Yaşayan, ey Qəyyum olan, Səndən istəyirəm!"[1] Peyğəmbər ﷺ səhabələrinə buyurdu: "Onun necə dua etdiyini bilirsiniz?" Dedilər: "Allah və Onun Elçisi daha yaxşı bilir!" Peyğəmbər ﷺ buyurdu: "Canım əlində Olana and olsun ki, o, Allahın ən əzəmətli adı ilə dua etdi. Bu adla dua edənin duası qəbul edilər və istədiyi verilər".

١٣٠١ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ أَبُو بُرَيْدٍ الْبَصْرِيُّ ، عَنْ عَبْدِ الصَّمَدِ بْنِ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ الْمُعَلِّمُ ، عَنِ ابْنِ بُرَيْدَةَ ، قَالَ : حَدَّثَنِي حَنْظَلَةُ بْنُ عَلِيٍّ ، أَنَّ مِحْجَنَ بْنَ الأَدْرَعِ حَدَّثَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ الْمَسْجِدَ ، إِذَا رَجُلٌ قَدْ قَضَى صَلاَتَهُ وَهُوَ يَتَشَهَّدُ ، فَقَالَ : اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ يَا أَللَّهُ بِأَنَّكَ الْوَاحِدُ الأَحَدُ الصَّمَدُ ، الَّذِي لَمْ يَلِدْ وَلَمْ يُولَدْ وَلَمْ يَكُنْ لَهُ كُفُوًا أَحَدٌ ، أَنْ تَغْفِرَ لِي ذُنُوبِي ، إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قَدْ غُفِرَ لَهُ ، ثَلاَثًا.

1301. ...Mihcən ibn əl-Ədrai ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ məscidə girdikdə, bir kişi təşəhhüddə namazını bitirərkən belə dua etdi: "Allahım, Sənə yalvarıram, ey Allah! Sən Vahid, Tək, Möhtac olmayan, doğmayan, doğulmayan və bənzəri olmayansan! Günahlarımı bağışla, şübhəsiz ki, Sən Bağışlayansan, Rəhmlisən!"[2] Allah Elçisi ﷺ üç dəfə dedi: "Artıq o bağışlandı!"

## ٥٩ - نَوْعٌ آخَرُ مِنَ الدُّعَاءِ

## 59-cu fəsil: Zikrdən sonra edilən başqa bir dua

١٣٠٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ أَبِي الْخَيْرِ ، عَنْ عبْدِ اللهِ بْنِ عَمْرٍو ، عَنْ أَبِي بَكْرٍ الصِّدِّيقِ رَضِيَ اللَّهُ عَنْهُمَا ، أَنَّهُ قَالَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عَلِّمْنِي دُعَاءً أَدْعُو بِهِ فِي صَلاَتِي ، قَالَ : قُلِ : اللَّهُمَّ إِنِّي ظَلَمْتُ نَفْسِي ظُلْمًا كَثِيرًا وَلاَ يَغْفِرُ الذُّنُوبَ إِلاَّ أَنْتَ ، فَاغْفِرْ لِي مَغْفِرَةً مِنْ عِنْدِكَ وَارْحَمْنِي ، إِنَّكَ أَنْتَ الْغَفُورُ الرَّحِيمُ.

1302. ...Rəvayət edilir ki, Əbu Bəkr əs-Siddiq ﷺ Allah Elçisinə ﷺ dedi: "Mənə namazda oxuyacağım dua öyrət". O dedi: "Allahım, mən özümə

[1] Transkripsiyası: Alla:hummə inni: əsəlukə biənnə ləkəl-həmd, lə: ilə:hə illə: əntəl-Mənnə:n, bədi:us-səmə:və:ti val-ərd, yə: Zəl-Cələ:li val-İkra:m, yə: Həyyu, yə: Qayyu:m, inni: əsəlukə!

[2] Transkripsiyası: Alla:hummə inni: əs-əlukə yə: Alla:hu bi ənnəkəl-Va:hidul-Əhədus-Saməd, əlləzi: ləm yəlid va ləm yu:ləd va ləm yəkun ləhu kufuvən əhəd, ən təğfira li: zunu:bi:, innəkə Əntəl-Ğafu:rur-Rahi:m!

çox zülm etmişəm, Səndən başqa günahları bağışlayan yoxdur. Öz dərgahında olan bağışlanma ilə məni bağışla və rəhm et! Həqiqətən, Sən Bağışlayansan, Rəhmlisən!”[1]

٦٠ - نَوْعٌ آخَرُ مِنَ الدُّعَاءِ

60-cı fəsil: Zikrdən sonra edilən başqa bir dua

١٣٠٣ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : سَمِعْتُ حَيْوَةَ يُحَدِّثُ ، عَنْ عُقْبَةَ بْنِ مُسْلِمٍ ، عَنْ أَبِي عَبْدِ الرَّحْمَنِ الْحُبُلِيِّ ، عَنِ الصُّنَابِحِيِّ ، عَنْ مُعَاذِ بْنِ جَبَلٍ قَالَ : أَخَذَ بِيَدِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : إِنِّي لأُحِبُّكَ يَا مُعَاذُ ، فَقُلْتُ : وَأَنَا أُحِبُّكَ يَا رَسُولَ اللهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَلاَ تَدَعْ أَنْ تَقُولَ فِي كُلِّ صَلاَةٍ : رَبِّ أَعِنِّي عَلَى ذِكْرِكَ وَشُكْرِكَ وَحُسْنِ عِبَادَتِكَ.

1303. ...Rəvayət edilir ki, Muaz ibn Cəbəl ﵁ demişdir: “Allah Elçisi ﷺ mənim əlimdən tutub dedi: “Mən səni sevirəm, ey Muaz!” Mən dedim: “Mən də səni sevirəm, ey Allahın Elçisi!” Allah Elçisi ﷺ dedi: “Sən bu duanı hər namazında et: “Rəbbim! Səni zikr etmək, Sənə şükür etmək və Sənə gözəl tərzdə ibadət etmək üçün mənə yardım et!”[2]

٦١ - نَوْعٌ آخَرُ مِنَ الدُّعَاءِ

61-cı fəsil: Zikrdən sonra edilən başqa bir dua

١٣٠٤ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ سَعِيدٍ الْجُرَيْرِيِّ ، عَنْ أَبِي الْعَلاَءِ ، عَنْ شَدَّادِ بْنِ أَوْسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ فِي صَلاَتِهِ : اللَّهُمَّ إِنِّي أَسْأَلُكَ الثَّبَاتَ فِي الأَمْرِ ، وَالْعَزِيمَةَ عَلَى الرُّشْدِ ، وَأَسْأَلُكَ شُكْرَ نِعْمَتِكَ ، وَحُسْنَ عِبَادَتِكَ ، وَأَسْأَلُكَ قَلْبًا سَلِيمًا ، وَلِسَانًا صَادِقًا ، وَأَسْأَلُكَ مِنْ خَيْرِ مَا تَعْلَمُ ، وَأَعُوذُ بِكَ مِنْ شَرِّ مَا تَعْلَمُ ، وَأَسْتَغْفِرُكَ لِمَا تَعْلَمُ.

1304. ...Şəddad ibn Əus ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ namazında deyərdi: “Allahım, işimdə Səndən sabitlik, doğru yolda əzmkarlıq, Sənin nemətlərinə şükür etmək, Sənə gözəl şəkildə ibadət etmək, Səndən salamat qəlb və sadiq bir dil istəyirəm! Səndən Sənin bildiyin xeyirləri istəyirəm,

---

[1] Transkripsiyası: Alla:hummə inni: zaləmtu nəfsi: zulmən kəsi:ran va lə: yəğfiruz-zunu:bə illə: Ənt! Fəğfirli: məğfiratən min i'ndikə varhəmni:, innəkə Əntəl-Ğafu:rur-Rahi:m!

[2] Transkripsiyası: Rabbi, ə'inni: alə: zikrikə va şukrikə va husni ibə:dətik!

Sənin bildiyin şərlərdən Sənə sığınıram! Sənin bildiyin günahlarıma görə Səndən bağışlanma diləyirəm![1]"[2]

## ٦٢ - نَوْعٌ آخَرُ

## 62-ci fəsil: Zikrdən sonra edilən başqa bir dua

١٣٠٥ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا عَطَاءُ بْنُ السَّائِبِ ، عَنْ أَبِيهِ ، قَالَ : صَلَّى بِنَا عَمَّارُ بْنُ يَاسِرٍ صَلاَةً ، فَأَوْجَزَ فِيهَا ، فَقَالَ لَهُ بَعْضُ الْقَوْمِ : لَقَدْ خَفَّفْتَ أَوْ أَوْجَزْتَ الصَّلاَةَ ، فَقَالَ : أَمَّا عَلَى ذَلِكَ ، فَقَدْ دَعَوْتُ فِيهَا بِدَعَوَاتٍ سَمِعْتُهُنَّ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا قَامَ تَبِعَهُ رَجُلٌ مِنَ الْقَوْمِ هُوَ أُبَيٌّ غَيْرَ أَنَّهُ كَنَى عَنْ نَفْسِهِ ، فَسَأَلَهُ عَنِ الدُّعَاءِ ، ثُمَّ جَاءَ فَأَخْبَرَ بِهِ الْقَوْمَ : اللَّهُمَّ بِعِلْمِكَ الْغَيْبَ ، وَقُدْرَتِكَ عَلَى الْخَلْقِ ، أَحْيِنِي مَا عَلِمْتَ الْحَيَاةَ خَيْرًا لِي ، وَتَوَفَّنِي إِذَا عَلِمْتَ الْوَفَاةَ خَيْرًا لِي ، اللَّهُمَّ وَأَسْأَلُكَ خَشْيَتَكَ فِي الْغَيْبِ وَالشَّهَادَةِ ، وَأَسْأَلُكَ كَلِمَةَ الْحَقِّ فِي الرِّضَا وَالْغَضَبِ ، وَأَسْأَلُكَ الْقَصْدَ فِي الْفَقْرِ وَالْغِنَى ، وَأَسْأَلُكَ نَعِيمًا لاَ يَنْفَدُ ، وَأَسْأَلُكَ قُرَّةَ عَيْنٍ لاَ تَنْقَطِعُ ، وَأَسْأَلُكَ الرِّضَاءَ بَعْدَ الْقَضَاءِ ، وَأَسْأَلُكَ بَرْدَ الْعَيْشِ بَعْدَ الْمَوْتِ ، وَأَسْأَلُكَ لَذَّةَ النَّظَرِ إِلَى وَجْهِكَ ، وَالشَّوْقَ إِلَى لِقَائِكَ فِي غَيْرِ ضَرَّاءَ مُضِرَّةٍ ، وَلاَ فِتْنَةٍ مُضِلَّةٍ ، اللَّهُمَّ زَيِّنَّا بِزِينَةِ الإِيمَانِ ، وَاجْعَلْنَا هُدَاةً مُهْتَدِينَ.

1305. ...Əta ibn əs-Saib atasının ﵀ belə dediyini rəvayət edir: "Əmmar ibn Yasir bizə namaz qıldırdı və bu namazı qısa etdi. Camaatdan olan bəzi insanlar ona dedilər: "Sən namazı yüngül və qısa etdin!" O da dedi: "O ki qaldı mənə, mən namazda Allah Elçisindən ﷺ eşitdiyim bir duanı etdim". Qalxıb getdikdə, camaatdan bir kişi onun ardı ilə getdi. Onun adı Ubey idi. Əmmardan bu dua haqda soruşdu. Sonra gəlib camaata bu duanı xəbər verdi: "Allahım! Qeybi bilməyinlə və yaratma qüdrətinlə yaşamağın mənim üçün daha xeyirli olduğunu bilirsənsə, məni yaşat, ölümün mənim üçün daha xeyirli olduğunu bilirsənsə, məni öldür! Allahım, gizlində də, aşkarda da Səndən (layiqincə) qorxmağı diləyirəm! Səndən razılıq və qəzəb anında haqq söz söyləməyimi diləyirəm! Kasıblıqda da, zənginlikdə də Səndən mötədillik diləyirəm! Səndən tükənməz nemət və ardı kəsilməyən bir göz aydınlığı (sevinc) diləyirəm! Səndən (başıma gələn) qəzadan sonra ondan razı qalmağımı və ölümdən sonra olan gözəl həyatı diləyirəm! Səndən Sənin Üzünə baxmağın ləzzətini, zərər verən xəstəliyə və azğınlığa aparan fitnəyə uğramadıqca Səninlə qarşılaşmaq həsrətini di-

---

[1] Transkripsiyası: Alla:hummə inni: əs əlukəs-səbə:tə fil-əmri, val-azi:mətə alər-ruşdi va əs əlukə şukra ni'mətikə va husnə i'bə:datikə va əs əlukə qalbən səli:mən va lisə:nən sa:diqan va əs əlukə min xayri mə: tə'ləmu va əu:zu bikə min şərri mə: tə'ləmu, va əstəğfirukə limə: tə'ləm!

[2] Hədis zəifdir.

ləyirəm! Allahım, bizi imanın gözəlliyi ilə gözəlləşdir və bizi doğru yolda olan başçılardan et!”[1]

١٣٠٦ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ أَبِي هَاشِمٍ الْوَاسِطِيِّ ، عَنْ أَبِي مِجْلَزٍ ، عَنْ قَيْسِ بْنِ عُبَادٍ ، قَالَ : صَلَّى عَمَّارُ بْنُ يَاسِرٍ بِالْقَوْمِ صَلاَةً أَخَفَّهَا ، فَكَأَنَّهُمْ أَنْكَرُوهَا ، فَقَالَ : أَلَمْ أُتِمَّ الرُّكُوعَ وَالسُّجُودَ ؟ قَالُوا : بَلَى ، قَالَ : أَمَا إِنِّي دَعَوْتُ فِيهَا بِدُعَاءٍ كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدْعُو بِهِ : اللَّهُمَّ بِعِلْمِكَ الْغَيْبَ ، وَقُدْرَتِكَ عَلَى الْخَلْقِ ، أَحْيِنِي مَا عَلِمْتَ الْحَيَاةَ خَيْرًا لِي ، وَتَوَفَّنِي إِذَا عَلِمْتَ الْوَفَاةَ خَيْرًا لِي ، وَأَسْأَلُكَ خَشْيَتَكَ فِي الْغَيْبِ وَالشَّهَادَةِ ، وَكَلِمَةَ الإِخْلاَصِ فِي الرِّضَا وَالْغَضَبِ ، وَأَسْأَلُكَ نَعِيمًا لاَ يَنْفَدُ ، وَقُرَّةَ عَيْنٍ لاَ تَنْقَطِعُ ، وَأَسْأَلُكَ الرِّضَاءَ بِالْقَضَاءِ ، وَبَرْدَ الْعَيْشِ بَعْدَ الْمَوْتِ ، وَلَذَّةَ النَّظَرِ إِلَى وَجْهِكَ ، وَالشَّوْقَ إِلَى لِقَائِكَ ، وَأَعُوذُ بِكَ مِنْ ضَرَّاءَ مُضِرَّةٍ ، وَفِتْنَةٍ مُضِلَّةٍ ، اللَّهُمَّ زَيِّنَّا بِزِينَةِ الإِيمَانِ ، وَاجْعَلْنَا هُدَاةً مُهْتَدِينَ.

1306. ...Rəvayət edilir ki, Qeys ibn Ubad رحمه الله demişdir: “Əmmar ibn Yasir camaata bir qədər yüngül namaz qıldırdı. Camaat da bunu xoş qarşılamadı. Əmmar dedi: “Məgər mən ruku və səcdələri tam etmədimmi?” Camaat dedi: “Bəli”. Əmmar dedi: “Mən namazda Peyğəmbərin ﷺ etdiyi duanı etdim: “Allahım! Qeybi bilməyinlə və yaratma qüdrətinlə yaşamağın mənim üçün xeyirli olduğunu bildiyin qədər məni yaşat, ölümün mənim üçün daha xeyirli olduğunu bildikdə isə məni öldür! Gizlində də, aşkarda da Səndən (layiqincə) qorxmağı diləyirəm! Səndən razılıq və qəzəb anında ixlaslı söz söyləməyimi diləyirəm! Səndən tükənməz nemət və ardı kəsilməyən bir göz aydınlığı (sevinc) diləyirəm! Səndən (başıma gələn) qəzadan sonra ondan razı qalmağımı və ölümdən sonra olan gözəl həyatı diləyirəm! Səndən Sənin Üzünə baxmağın ləzzətini, zərər verən xəstəliyə və azğınlığa aparan fitnəyə uğramadıqca Səninlə qarşılaşmaq həsrətini diləyirəm! Allahım, bizi imanın gözəlliyi ilə gözəlləşdir və bizi doğru yolda olan başçılardan et!”[2]

---

[1] Transkripsiyası: Alla:hummə bi-i'lmikəl-ğayb, va qudratikə aləl-xalq, əhyini: mə: alimtəl-həyə:tə xayran li:, va təvaffəni: izə: alimtəl-vafə:tə xayran li:! Alla:hummə, va əs əlukə xaşyətəkə fil-ğaybi vaş-şəhə:də, va əs əlukə kəlimətəl-həqqi fir-rida: val-ğadab, va əs əlukəl-qasdə fil-fəqri val-ğinə:, va əs əlukə nəi:mən lə: yənfəd, va əs əlukə qurratə aynin lə tənqati'u, va əs əlukər-rida:ə bə'dəl-qada:i, va əs əlukə bərdəl-ayşi bə'dəl-məut, va əs əlukə ləzzətən-nəzari ilə: vachikə, vaş-şəuqa ilə: liqa:ikə fi: ğayri darra:ə mudirra, va lə: fitnətin mudillə! Alla:hummə zeyyinnə: bi-zi:nətil-i:mə:n, vac alnə: hudə:tən muhtədi:n!

[2] Transkripsiyası: Alla:hummə bi-i'lmikəl-ğayb, va qudratikə aləl-xalq, əhyini: mə: alimtəl-həyə:tə xayran li:, va təvaffəni: izə: alimtəl-vafə:tə xayran li:, va əs əlukə xaşyətəkə fil-ğaybi vaş-şəhə:də, va kəlimətəl-ixlə:si fir-rida: val-ğadab, va əs əlukə nəi:mən lə: yənfəd, va qurratə aynin lə tənqati'u, va əs əlukər-rida:ə bil-qada:i, va bərdəl-ayşi bə'dəl-mavt, va ləzzətən-nəzari ilə:

٦٣ - بَابُ التَّعَوُّذِ فِي الصَّلاَةِ

## 63-cü fəsil: Namazda Allaha sığınmaq

١٣٠٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ هِلاَلِ بْنِ يَسَافٍ ، عَنْ فَرْوَةَ بْنِ نَوْفَلٍ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ : حَدِّثِينِي بِشَيْءٍ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدْعُو بِهِ فِي صَلاَتِهِ ، فَقَالَتْ : نَعَمْ ، كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ شَرِّ مَا عَمِلْتُ وَمِنْ شَرِّ مَا لَمْ أَعْمَلْ.

1307. ...Rəvayət edilir ki, Urva ibn Nəufəl ﷺ demişdir: "Mən Aişəyə dedim: "Mənə Allah Elçisinin ﷺ namazda etdiyi dualardan birini deyə bilərsənmi?" O dedi: "Bəli. Allah Elçisi ﷺ dua edərək belə deyərdi: "Allahım, etdiyim və etmədiyim əməllərin şərindən Sənə sığınıram!"[1]

٦٤ - نَوْعٌ آخَرُ

## 64-cü fəsil: Başqa bir dua

١٣٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَشْعَثَ ، عَنْ أَبِيهِ ، عَنْ مَسْرُوق ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، قَالَتْ : سَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ عَذَابِ الْقَبْرِ ، فَقَالَ : نَعَمْ ، عَذَابُ الْقَبْرِ حَقٌّ ، قَالَتْ عَائِشَةُ : فَمَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي صَلاَةً بَعْدُ إِلاَّ تَعَوَّذَ مِنْ عَذَابِ الْقَبْرِ.

1308. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Qəbir əzabı haqda Allah Elçisindən ﷺ soruşduqda, o dedi: "Bəli, qəbir əzabı haqdır". Aişə dedi: "Mən Allah Elçisinin ﷺ qıldığı hər namazda qəbir əzabından Allaha sığındığını gördüm".

١٣٠٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّ عَائِشَةَ أَخْبَرَتْهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَدْعُو فِي الصَّلاَةِ : اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ ، اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْمَأْثَمِ وَالْمَغْرَمِ ، فَقَالَ لَهُ قَائِلٌ : مَا أَكْثَرَ مَا تَسْتَعِيذُ مِنَ الْمَغْرَمِ ، فَقَالَ : إِنَّ الرَّجُلَ إِذَا غَرِمَ حَدَّثَ فَكَذَبَ ، وَوَعَدَ فَأَخْلَفَ.

1309. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namazda belə dua edərdi: "Allahım, qəbir əzabından Sənə sığınıram! Məsih Dəccalın fitnəsindən Sənə sığınıram! Həyatın və ölümün fitnəsindən Sənə sığınıram! Allahım,

vachik, vaş-şəvqa ilə: liqa:ik, va əu:zu bikə min darra:ə mudirra, va fitnətin mudillə! Alla:hummə zeyyinnə: bi-zi:nətil-i:mə:n, vac alnə: hudə:tən muhtədi:n!

[1] Transkripsiyası: Alla:hummə, inni: əu:zu bikə min şərri mə: amiltu va min şərri mə: ləm ə'məl!

günah etməkdən və borcdan Sənə sığınıram!"[1] Səhabə ona dedi: "Nəyə görə sən borcdan Allaha çox sığınırsan?" O dedi: "Həqiqətən, adam borclu olduqda, yalan danışar və vədinə xilaf çıxar".

١٣١٠ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَمَّارٍ الْمَوْصِلِيُّ ، عَنِ الْمُعَافَى ، عَنِ الأَوْزَاعِيِّ وَأَنْبَأَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، عَنْ عِيسَى بْنِ يُونُسَ ، وَاللَّفْظُ لَهُ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنْ حَسَّانَ بْنِ عَطِيَّةَ ، عَنْ مُحَمَّدِ بْنِ أَبِي عَائِشَةَ ، قَالَ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا تَشَهَّدَ أَحَدُكُمْ فَلْيَتَعَوَّذْ بِاللَّهِ مِنْ أَرْبَعٍ : مِنْ عَذَابِ جَهَنَّمَ ، وَعَذَابِ الْقَبْرِ ، وَفِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ ، وَمِنْ شَرِّ الْمَسِيحِ الدَّجَّالِ ، ثُمَّ يَدْعُو لِنَفْسِهِ بِمَا بَدَا لَهُ.

1310. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz təşəhhüdə oturduqda, dörd şeydən Allaha sığınsın; Cəhənnəm əzabından, qəbir əzabından, həyatın və ölümün fitnəsindən və Məsih Dəccalın şərindən. Bundan sonra özü üçün istədiyi duanı etsin".

٦٥ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ بَعْدَ التَّشَهُّدِ

## 65-ci fəsil: Təşəhhüddən sonra oxunacaq başqa bir dua

١٣١١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ فِي صَلاَتِهِ بَعْدَ التَّشَهُّدِ : أَحْسَنُ الْكَلاَمِ كَلاَمُ اللهِ ، وَأَحْسَنُ الْهَدْيِ هَدْيُ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1311. ...Cabir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ namazda təşəhhüddən sonra belə deyərdi: "Kəlamların ən gözəli Allahın Kəlamı, yolların ən gözəli də Muhəmmədin ﷺ yoludur".

٦٦ - بَابُ تَطْفِيفِ الصَّلاَةِ

## 66-cı fəsil: Namazı tez qılmaq

١٣١٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مَالِكٌ وَهُوَ ابْنُ مِغْوَلٍ ، عَنْ طَلْحَةَ بْنِ مُصَرِّفٍ ، عَنْ زَيْدِ بْنِ وَهْبٍ ، عَنْ حُذَيْفَةَ ، أَنَّهُ رَأَى رَجُلاً يُصَلِّي فَطَفَّفَ ، فَقَالَ لَهُ حُذَيْفَةُ : مُنْذُ كَمْ تُصَلِّي هَذِهِ الصَّلاَةَ ؟ قَالَ : مُنْذُ أَرْبَعِينَ عَامًا ، قَالَ : مَا صَلَّيْتَ مُنْذُ أَرْبَعِينَ سَنَةً ، وَلَوْ مِتَّ وَأَنْتَ تُصَلِّي هَذِهِ الصَّلاَةَ لَمِتَّ عَلَى غَيْرِ فِطْرَةِ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ قَالَ : إِنَّ الرَّجُلَ لَيُخَفِّفُ وَيُتِمُّ وَيُحْسِنُ.

---

[1] Transkripsiyası: Alla:hummə, inni: əu:zu bikə min azə:bil-qabri, va əu:zu bikə min fitnətil-məsi:hid-dəccə:l, va əuzu bikə min fitnətil-məhyə: val-məmə:ti! Alla:hummə, inni: əu:zu bikə mənəl-mə'səmi val-məğram!

1312. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ namazı tez qılan bir kişini görüb ona dedi: "Sən neçə vaxtdır bu cür namaz qılırsan?" O dedi: "Qırx ildir". Huzeyfə dedi: "Sən qırx ildir ki, namaz qılmırsan. Əgər sən namazı bu cür qıldığın halda ölsəydin, Muhəmmədin ﷺ yolundan kənar (yolda) ölmüş kimi olardın". Sonra dedi: "Həqiqətən, kişi namazı yüngülləşdirsə də, tam və gözəl qılmalıdır".

٦٧ - بَابُ أَقَلِّ مَا يُجْزِي مِنْ عَمَلِ الصَّلاَةِ

## 67-ci fəsil: Namaz qılanın namazda ən az edəcəyi şey

١٣١٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ عَلِيٍّ وَهُوَ ابْنُ يَحْيَى ، عَنْ أَبِيهِ ، عَنْ عَمٍّ لَهُ بَدْرِيٍّ أَنَّهُ حَدَّثَهُ ، أَنَّ رَجُلاً دَخَلَ الْمَسْجِدَ فَصَلَّى وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْمُقُهُ ، وَنَحْنُ لاَ نَشْعُرُ ، فَلَمَّا فَرَغَ أَقْبَلَ فَسَلَّمَ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : ارْجِعْ فَصَلِّ ، فَإِنَّكَ لَمْ تُصَلِّ ، فَرَجَعَ فَصَلَّى ، ثُمَّ أَقْبَلَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : ارْجِعْ فَصَلِّ ، فَإِنَّكَ لَمْ تُصَلِّ ، مَرَّتَيْنِ أَوْ ثَلاَثًا ، فَقَالَ لَهُ الرَّجُلُ : وَالَّذِي أَكْرَمَكَ يَا رَسُولَ اللهِ ، لَقَدْ جَهِدْتُ ، فَعَلِّمْنِي ، فَقَالَ : إِذَا قُمْتَ تُرِيدُ الصَّلاَةَ فَتَوَضَّأْ ، فَأَحْسِنْ وُضُوءَكَ ، ثُمَّ اسْتَقْبِلِ الْقِبْلَةَ فَكَبِّرْ ، ثُمَّ اقْرَأْ ، ثُمَّ ارْكَعْ فَاطْمَئِنَّ رَاكِعًا ، ثُمَّ ارْفَعْ حَتَّى تَعْتَدِلَ قَائِمًا ، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا ، ثُمَّ ارْفَعْ حَتَّى تَطْمَئِنَّ قَاعِدًا ، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا ، ثُمَّ ارْفَعْ ، ثُمَّ افْعَلْ كَذَلِكَ حَتَّى تَفْرُغَ مِنْ صَلاَتِكَ.

1313. ...Əli ibn Yəhyə atasının Bədr əhli olan əmisindən ﵁ belə dediyini rəvayət etmişdir: "Bir kişi məscidə gəlib namaz qıldı. Allah Elçisi ﷺ onun namazına diqqət edirdi, biz isə buna fikir vermirdik. O, namazı bitirdikdən sonra bizə tərəf çevrildi və Allah Elçisinə ﷺ salam verdi. Allah Elçisi ﷺ dedi: "Qayıt, namaz qıl, çünki sən namaz qılmadın". O, qayıdıb namaz qıldı, sonra da Allah Elçisinə ﷺ tərəf çevrildi. Allah Elçisi ﷺ iki və ya üç dəfə dedi: "Qayıt, namaz qıl, çünki sən namaz qılmadın". O kişi Allah Elçisinə ﷺ dedi: "Sənə nemətlər verənə (Allaha) and olsun, ey Allahın Elçisi! Mən bacardığımı etdim, məni öyrət". Allah Elçisi ﷺ dedi: "Namaza durduqda, dəstəmaz al və bunu gözəl şəkildə et. Sonra qibləyə yönəl və təkbir et. Sonra (Qurandan) oxu, sonra ruku et və rukuda rahat ol. Sonra başını qaldır və qamətini düzəlt. Sonra səcdə et və səcdədə rahat ol. Sonra başını qaldır və rahat otur. Sonra səcdə et və səcdədə rahat ol. Sonra başını qaldır və namazı bitirənə qədər bu cür et".

١٣١٤ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ دَاوُدَ بْنِ قَيْسٍ ، قَالَ : حَدَّثَنِي عَلِيُّ بْنُ يَحْيَى بْنِ خَلاَّدِ بْنِ رَافِعِ بْنِ مَالِكٍ الأَنْصَارِيُّ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ عَمٍّ لَهُ بَدْرِيٍّ ، قَالَ : كُنْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَالِسًا فِي

الْمَسْجِدِ ، فَدَخَلَ رَجُلٌ فَصَلَّى رَكْعَتَيْنِ ، ثُمَّ جَاءَ فَسَلَّمَ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَدْ كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَرْمُقُهُ فِي صَلاَتِهِ ، فَرَدَّ عَلَيْهِ السَّلاَمَ ، ثُمَّ قَالَ لَهُ : ارْجِعْ فَصَلِّ فَإِنَّكَ لَمْ تُصَلِّ ، فَرَجَعَ فَصَلَّى ، ثُمَّ جَاءَ فَسَلَّمَ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَدَّ عَلَيْهِ السَّلاَمَ ، ثُمَّ قَالَ : ارْجِعْ فَصَلِّ فَإِنَّكَ لَمْ تُصَلِّ ، حَتَّى كَانَ عِنْدَ الثَّالِثَةِ أَوِ الرَّابِعَةِ ، فَقَالَ : وَالَّذِي أَنْزَلَ عَلَيْكَ الْكِتَابَ لَقَدْ جَهِدْتُ وَحَرَصْتُ فَأَرِنِي وَعَلِّمْنِي ، قَالَ : إِذَا أَرَدْتَ أَنْ تُصَلِّيَ فَتَوَضَّأْ فَأَحْسِنْ وُضُوءَكَ ، ثُمَّ اسْتَقْبِلِ الْقِبْلَةَ فَكَبِّرْ ، ثُمَّ اقْرَأْ ، ثُمَّ ارْكَعْ حَتَّى تَطْمَئِنَّ رَاكِعًا ، ثُمَّ ارْفَعْ حَتَّى تَعْتَدِلَ قَائِمًا ، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا ، ثُمَّ ارْفَعْ حَتَّى تَطْمَئِنَّ قَاعِدًا ، ثُمَّ اسْجُدْ حَتَّى تَطْمَئِنَّ سَاجِدًا ، ثُمَّ ارْفَعْ ، فَإِذَا أَتْمَمْتَ صَلاَتَكَ عَلَى هَذَا فَقَدْ تَمَّتْ ، وَمَا انْتَقَصْتَ مِنْ هَذَا فَإِنَّمَا تَنْتَقِصُهُ مِنْ صَلاَتِكَ.

1314. ...Rəvayət edilir ki, Əli ibn Yəhyə ﷺ demişdir: "Atam Bədr əhli olan əmimin belə dediyini rəvayət etmişdir: "Bir dəfə mən Allah Elçisi ﷺ ilə məsciddə oturmuşdum. Bir kişi gəlib iki rükət namaz qıldı. Sonra gəlib Peyğəmbərə ﷺ salam verdi. O kişi namaz qılarkən Peyğəmbər ﷺ ona diqqət edirdi. Peyğəmbər onun salamını alıb ona belə buyurdu: "Qayıt, namaz qıl, çünki sən namaz qılmadın". O, qayıdıb namaz qıldı, sonra da Peyğəmbərə ﷺ salam verdi. Peyğəmbər ﷺ onun salamını alıb dedi: "Qayıt, namaz qıl, çünki sən namaz qılmadın". Bu hal üç və ya dörd dəfə təkrar olundu. O kişi dedi: "Sənə haqq Kitabı nazil edənə (Allaha) and olsun! Mən bacardığımı etdim, mənə namaz qılmağı göstər və öyrət". Peyğəmbər ﷺ dedi: "Namaz qılmaq istədikdə, dəstəmaz al və bunu gözəl şəkildə et. Sonra qibləyə yönəl və təkbir et. Sonra (Qurandan) oxu, sonra ruku et və rukuda rahat ol. Sonra başını qaldır və qamətini düzəlt. Sonra səcdə et və səcdədə rahat ol. Sonra başını qaldır və rahat otur. Sonra səcdə et və səcdədə rahat ol. Sonra başını qaldır. Namazı bu cür qılsan, artıq namazı tamamlamış olarsan. Bundan nəyi əskiltsən, namazından əskiltmiş olarsan".

١٣١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ زُرَارَةَ بْنِ أَوْفَى ، عَنْ سَعْدِ بْنِ هِشَامٍ ، قَالَ : قُلْتُ : يَا أُمَّ الْمُؤْمِنِينَ أَنْبِئِينِي عَنْ وَتْرِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : كُنَّا نُعِدُّ لَهُ سِوَاكَهُ وَطَهُورَهُ ، فَيَبْعَثُهُ اللَّهُ لِمَا شَاءَ أَنْ يَبْعَثَهُ مِنَ اللَّيْلِ ، فَيَتَسَوَّكُ وَيَتَوَضَّأُ ، وَيُصَلِّي ثَمَانِ رَكَعَاتٍ لاَ يَجْلِسُ فِيهِنَّ إِلاَّ عِنْدَ الثَّامِنَةِ ، فَيَجْلِسُ ، فَيَذْكُرُ اللَّهَ عَزَّ وَجَلَّ وَيَدْعُو ، ثُمَّ يُسَلِّمُ تَسْلِيمًا يُسْمِعُنَا.

1315. ...Rəvayət edilir ki, Səd ibn Hişam ﷺ demişdir: "Mən dedim: "Ey möminlərin anası! Mənə Allah Elçisinin ﷺ vitr namazı haqda xəbər ver". O dedi: "Biz onun üçün misvakını və təharət üçün suyunu hazırlayardıq. Allah da gecənin istədiyi vaxtında onu oyadardı. O, misvakla (dişlərini)

təmizləyər, dəstəmaz alar və (təşəhhüdə) oturmadan səkkiz rükət namaz qılardı. Yalnız səkkizinci rükətdə oturar, Allahı ﷻ zikr edib Ona dua edər, sonra da bizə eşitdirəcək tərzdə salam verərdi”.

٦٨ - بَابُ السَّلَامِ

68-ci fəsil: (Namazda olan) salam

١٣١٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ ، يَعْنِي ابْنَ دَاوُدَ الْهَاشِمِيَّ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ وَهُوَ ابْنُ سَعْدٍ ، قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ جَعْفَرٍ وَهُوَ ابْنُ الْمِسْوَرِ الْمَخْرَمِيُّ ، عَنْ إِسْمَعِيلَ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنِي عَامِرُ بْنُ سَعْدٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُسَلِّمُ عَنْ يَمِينِهِ وَعَنْ يَسَارِهِ.

1316. ...Amir ibn Səd atasından ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ namazı bitirəndə sağına və soluna salam verərdi.

١٣١٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا أَبُو عَامِرٍ الْعَقَدِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ جَعْفَرٍ الْمَخْرَمِيُّ ، عَنْ إِسْمَعِيلَ بْنِ مُحَمَّدِ بْنِ سَعْدٍ ، عَنْ عَامِرِ بْنِ سَعْدٍ ، عَنْ سَعْدٍ قَالَ : كُنْتُ أَرَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُسَلِّمُ عَنْ يَمِينِهِ وَعَنْ يَسَارِهِ حَتَّى يُرَى بَيَاضُ خَدِّهِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : عَبْدُ اللهِ بْنُ جَعْفَرٍ هَذَا لَيْسَ بِهِ بَأْسٌ ، وَعَبْدُ اللهِ بْنُ جَعْفَرِ بْنِ نَجِيحٍ وَالِدُ عَلِيِّ بْنِ الْمَدِينِيِّ مَتْرُوكُ الْحَدِيثِ.

1317. ...Rəvayət edilir ki, Səd ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ namazı bitirdikdə yanağının ağlığı bilinən həddə sağına və soluna salam verdiyini gördüm”.

٦٩ - بَابُ مَوْضِعِ الْيَدَيْنِ عِنْدَ السَّلَامِ

69-cu fəsil: Namazda salam verdikdə əllərin qoyulduğu yer

١٣١٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، عَنْ مِسْعَرٍ ، عَنْ عُبَيْدِ اللهِ ابْنِ الْقِبْطِيَّةِ ، قَالَ : سَمِعْتُ جَابِرَ بْنَ سَمُرَةَ يَقُولُ : كُنَّا إِذَا صَلَّيْنَا خَلْفَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قُلْنَا : السَّلَامُ عَلَيْكُمْ ، السَّلَامُ عَلَيْكُمْ - وَأَشَارَ مِسْعَرٌ بِيَدِهِ عَنْ يَمِينِهِ وَعَنْ شِمَالِهِ - فَقَالَ : مَا بَالُ هَؤُلَاءِ الَّذِينَ يَرْمُونَ بِأَيْدِيهِمْ كَأَنَّهَا أَذْنَابُ الْخَيْلِ الشُّمُسِ ، أَمَا يَكْفِي أَنْ يَضَعَ يَدَهُ عَلَى فَخِذِهِ ، ثُمَّ يُسَلِّمُ عَلَى أَخِيهِ عَنْ يَمِينِهِ وَعَنْ شِمَالِهِ.

1318. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: “Biz Peyğəmbərin ﷺ arxasında namaz qılaraq “əs-Sələ:mu aleykum, əs-Sələ:mu aleykum” deyərdik. Bu zaman Mis'ar əli ilə sağa və sola işarə edirdi. Peyğəmbər ﷺ buyurdu: “Bu insanlara nə olur ki, əlləri ilə tərpənən at quyruğu kimi işarə

edirlər. Məgər onlara əllərini budlarının üzərinə qoymaq kifayət etməzdimi?! Sonra sağ və sol tərəfdə olan qardaşına salam versinlər".

٧٠ - كَيْفَ السَّلاَمُ عَلَى الْيَمِينِ ؟

70-ci fəsil: Sağ tərəfə necə salam verilir?

١٣١٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ مُعَاذٍ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الأَسْوَدِ ، عَنِ الأَسْوَدِ ، وَعَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُكَبِّرُ فِي كُلِّ خَفْضٍ وَرَفْعٍ ، وَقِيَامٍ وَقُعُودٍ ، وَيُسَلِّمُ عَنْ يَمِينِهِ ، وَعَنْ شِمَالِهِ : السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ ، السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ ، حَتَّى يُرَى بَيَاضُ خَدِّهِ ، وَرَأَيْتُ أَبَا بَكْرٍ وَعُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا يَفْعَلاَنِ ذَلِكَ.

1319. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Allah Elçisinin ﷺ hər dəfə əyilib-qalxanda, qiyamda və oturuşlarda təkbir etdiyini gördüm. O, sağına və soluna salam verərək: "əs-Sələ:mu aleykum va rahmətullah, əs-Sələ:mu aleykum va rahmətullah"- deyir, hətta yanağının ağlığı görsənirdi. Mən Əbu Bəkr və Ömərin də bu cür etdiyini gördüm".

١٣٢٠ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ الزَّعْفَرَانِيُّ ، عَنْ حَجَّاجٍ ، قَالَ ابْنُ جُرَيْجٍ ، أَنْبَأَنَا عَمْرُو بْنُ يَحْيَى ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنْ عَمِّهِ وَاسِعِ بْنِ حَبَّانَ ، أَنَّهُ سَأَلَ عَبْدَ اللهِ بْنَ عُمَرَ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : اللَّهُ أَكْبَرُ كُلَّمَا وَضَعَ ، اللَّهُ أَكْبَرُ كُلَّمَا رَفَعَ ، ثُمَّ يَقُولُ : السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ عَنْ يَمِينِهِ ، السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ عَنْ يَسَارِهِ.

1320. ...Rəvayət edilir ki, Vasi' ibn Həbbən ﷺ İbn Ömərdən Allah Elçisinin ﷺ namazı haqda soruşdu. İbn Ömər dedi: "O, hər dəfə qalxdıqda "Alla:hu Əkbər", oturduqda "Alla:hu Əkbər" deyərdi. Sonra da sağına: "əs-Sələ:mu aleykum va rahmətullah" və soluna "əs-Sələ:mu aleykum va rahmətullah"- deyərdi".

٧١ - كَيْفَ السَّلاَمُ عَلَى الشِّمَالِ؟

71-ci fəsil: Sol tərəfə necə salam verilir?

١٣٢١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ يَعْنِي الدَّرَاوَرْدِيَّ ، عَنْ عَمْرِو بْنِ يَحْيَى ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنْ عَمِّهِ وَاسِعِ بْنِ حَبَّانَ قَالَ : قُلْتُ لِابْنِ عُمَرَ : أَخْبِرْنِي عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَيْفَ كَانَتْ ؟ قَالَ : فَذَكَرَ التَّكْبِيرَ ، قَالَ : يَعْنِي وَذَكَرَ السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ عَنْ يَمِينِهِ ، السَّلاَمُ عَلَيْكُمْ عَنْ يَسَارِهِ.

1321. ...Rəvayət edilir ki, Vasi' ibn Həbbən ﷺ demişdir: "Mən İbn Ömərə dedim: "Mənə Allah Elçisinin ﷺ namazının necə olduğu haqda xəbər ver".

O, təkbiri zikr etdi və sağ tərəfinə: “əs-Sələ:mu aleykum va rahmətullah”, sol tərəfinə isə “əs-Sələ:mu aleykum” dedi“.

١٣٢٢ - أَخْبَرَنَا زَيْدُ بْنُ أَخْزَمَ ، عَنْ ابْنِ دَاوُدَ يَعْنِي عَبْدَ اللهِ بْنَ دَاوُدَ الْخُرَيْبِيَّ ، عَنْ عَلِيِّ بْنِ صَالِحٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : كَأَنِّي أَنْظُرُ إِلَى بَيَاضِ خَدِّهِ عَنْ يَمِينِهِ السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ ، وَعَنْ يَسَارِهِ السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللَّهِ.

1322. ...Abdullah ﵁ rəvayət edir ki, sanki Peyğəmbər ﷺ sağ tərəfinə “əs-Sələ:mu aleykum va rahmətullah”- deyir və onun yanağının ağlığını görürəm. Həmçinin sol tərəfinə “əs-Sələ:mu aleykum va rahmətullah”.

١٣٢٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ عُمَرَ بْنِ عُبَيْدٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَبْدِ اللهِ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُسَلِّمُ عَنْ يَمِينِهِ حَتَّى يَبْدُوَ بَيَاضُ خَدِّهِ ، وَعَنْ يَسَارِهِ حَتَّى يَبْدُوَ بَيَاضُ خَدِّهِ.

1323. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisi ﷺ sağ tərəfə salam verdikdə, sağ yanağının ağlığı görsənərdi. Həmçinin, soluna da salam verdikdə, sol yanağının ağlığı görsənərdi”.

١٣٢٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ كَانَ يُسَلِّمُ عَنْ يَمِينِهِ وَعَنْ يَسَارِهِ : السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ ، السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ ، حَتَّى يُرَى بَيَاضُ خَدِّهِ مِنْ هَاهُنَا ، وَبَيَاضُ خَدِّهِ مِنْ هَاهُنَا.

1324. ...Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ sağına və soluna “əs-Sələ:mu aleykum va rahmətullah, əs-Sələ:mu aleykum va rahmətullah” deyə salam verər, hətta onun yanağının ağlığı hər iki tərəfdən görsənərdi”.

١٣٢٥ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ الْحَسَنِ بْنِ شَقِيقٍ ، قَالَ : أَنْبَأَنَا الْحُسَيْنُ بْنُ وَاقِدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ ، عَنْ عَلْقَمَةَ ، وَالأَسْوَدِ ، وَأَبِي الأَحْوَصِ ، قَالُوا : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ مَسْعُودٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُسَلِّمُ عَنْ يَمِينِهِ : السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ حَتَّى يُرَى بَيَاضُ خَدِّهِ الأَيْمَنِ ، وَعَنْ يَسَارِهِ : السَّلاَمُ عَلَيْكُمْ وَرَحْمَةُ اللهِ حَتَّى يُرَى بَيَاضُ خَدِّهِ الأَيْسَرِ.

1325. ...Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ sağ tərəfə salam verərək “əs-Sələ:mu aleykum va rahmətullah” deyər və onun sağ yanağının ağlığı görsənərdi. Sol tərəfə salam verər: “əs-Sələ:mu aleykum va rahmətullah” deyər və onun sol yanağının ağlığı görsənərdi”.

٧٢ - بَابُ السَّلاَمِ بِالْيَدَيْنِ

## 72-ci fəsil: Namazda salam verdikdə əl ilə işarə etmək

١٣٢٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا إِسْرَائِيلُ ، عَنْ فُرَاتٍ الْقَزَّازِ ، عَنْ عُبَيْدِ اللهِ وَهُوَ ابْنُ الْقِبْطِيَّةِ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَكُنَّا إِذَا سَلَّمْنَا قُلْنَا بِأَيْدِينَا السَّلاَمُ عَلَيْكُمْ ، السَّلاَمُ عَلَيْكُمْ ، قَالَ : فَنَظَرَ إِلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : مَا شَأْنُكُمْ تُشِيرُونَ بِأَيْدِيكُمْ كَأَنَّهَا أَذْنَابُ خَيْلٍ شُمُسٍ ، إِذَا سَلَّمَ أَحَدُكُمْ فَلْيَلْتَفِتْ إِلَى صَاحِبِهِ وَلاَ يُومِئْ بِيَدِهِ.

1326. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﷺ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə namaz qıldım. Namazı bitirdikdə əlimizlə işarə edərək: "əs-Sələ:mu aleykum, əs-Sələ:mu aleykum"- deyirdik. Allah Elçisi ﷺ bizə nəzər yetirib dedi: "Sizə nə olur ki, əllərinizlə tərpənən at quyruğu kimi işarə edirsiniz?! Biriniz (namazda) salam verdikdə, yanındakı dostuna tərəf çevrilsin, lakin əli ilə işarə etməsin!"

٧٣ - تَسْلِيمُ الْمَأْمُومِ حِينَ يُسَلِّمُ الإِمَامُ.

## 73-cü fəsil: İmam salam verdikdə, ona tabe olanların da salam vermələri

١٣٢٧ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ الْمُبَارَكِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ أَخْبَرَهُ ، قَالَ : أَخْبَرَنِي مَحْمُودُ بْنُ الرَّبِيعِ ، قَالَ : سَمِعْتُ عِتْبَانَ بْنَ مَالِكٍ يَقُولُ : كُنْتُ أُصَلِّي بِقَوْمِي بَنِي سَالِمٍ ، فَأَتَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقُلْتُ : إِنِّي قَدْ أَنْكَرْتُ بَصَرِي ، وَإِنَّ السُّيُولَ تَحُولُ بَيْنِي وَبَيْنَ مَسْجِدِ قَوْمِي ، فَلَوَدِدْتُ أَنَّكَ جِئْتَ فَصَلَّيْتَ فِي بَيْتِي مَكَانًا أَتَّخِذُهُ مَسْجِدًا ، قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : سَأَفْعَلُ إِنْ شَاءَ اللَّهُ ، فَغَدَا عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبُو بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ مَعَهُ بَعْدَ مَا اشْتَدَّ النَّهَارُ ، فَاسْتَأْذَنَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَذِنْتُ لَهُ ، فَلَمْ يَجْلِسْ حَتَّى قَالَ : أَيْنَ تُحِبُّ أَنْ أُصَلِّيَ مِنْ بَيْتِكَ ؟ فَأَشَرْتُ لَهُ إِلَى الْمَكَانِ الَّذِي أُحِبُّ أَنْ يُصَلِّيَ فِيهِ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَصَفَفْنَا خَلْفَهُ ، ثُمَّ سَلَّمَ وَسَلَّمْنَا حِينَ سَلَّمَ.

1327. ...Rəvayət edilir ki, İtban ibn Malik ﷺ demişdir: "Mənim tayfam olan Bəni Səlim tayfasına namaz qıldırırdım. Bir dəfə Allah Elçisinin ﷺ yanına gəlib dedim: "Mən görmə qabiliyyətini itirmişəm, tayfamın məscidi ilə evimin arasından da sel axır. Mən istəyirəm ki, sən gəlib mənim evimdə namaz qılasan, mən də həmin yeri məscid edim". Peyğəmbər ﷺ dedi: "Allahın izni ilə mən bunu edərəm". Səhər açıldıqda Allah Elçisi ﷺ Əbu Bəkrlə birlikdə gəldi. Günorta olmuşdu. Peyğəmbər ﷺ məndən (evimə girmək üçün) izin istədi, mən də ona izin verdim. Oturmamışdan qabaq mənə dedi: "Sənin evinin harasında namaz qılmağımı istəyirsən?" Mən də ona namaz qılmağını istədiyim yeri göstərdim. Allah Elçisi ﷺ qalxdı, biz də

onun arxasında səfə düzüldük. O, (namazı bitirib) salam verdikdən sonra biz də salam verdik”.

٧٤ - بَابُ السُّجُودِ بَعْدَ الْفَرَاغِ مِنَ الصَّلاَةِ

74-cü fəsil: Fərz namazlarını bitirdikdən sonra qılınan (vitr) namazı

١٣٢٨ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ بْنِ حَمَّادِ بْنِ سَعْدٍ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي ابْنُ أَبِي ذِئْبٍ ، وَعَمْرُو بْنُ الْحَارِثِ ، وَيُونُسُ بْنُ يَزِيدَ ، أَنَّ ابْنَ شِهَابٍ أَخْبَرَهُمْ ، عَنْ عُرْوَةَ ، قَالَتْ عَائِشَةُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي فِيمَا بَيْنَ أَنْ يَفْرُغَ مِنْ صَلاَةِ الْعِشَاءِ إِلَى الْفَجْرِ إِحْدَى عَشْرَةَ رَكْعَةً ، وَيُوتِرُ بِوَاحِدَةٍ ، وَيَسْجُدُ سَجْدَةً قَدْرَ مَا يَقْرَأُ أَحَدُكُمْ خَمْسِينَ آيَةً قَبْلَ أَنْ يَرْفَعَ رَأْسَهُ ، وَبَعْضُهُمْ يَزِيدُ عَلَى بَعْضٍ فِي الْحَدِيثِ ، مُخْتَصَرٌ.

1328. Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ İşa namazını qıldıqdan sonra Sübh namazına qədər on bir rükət namaz qılar, onu tək rükətlə tamamlayardı. Sizin birinizin əlli ayə oxuduğu vaxt qədər səcdə edərdi”.

٧٥ - بَابُ سَجْدَتَيِ السَّهْوِ بَعْدَ السَّلاَمِ وَالْكَلاَمِ.

75-ci fəsil: Namazda salamdan və danışmaqdan sonra iki dəfə səhv səcdəsi etmək

١٣٢٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ حَفْصٍ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَلَّمَ ، ثُمَّ تَكَلَّمَ ، ثُمَّ سَجَدَ سَجْدَتَيِ السَّهْوِ.

1329. ...Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ (namazı bitirib) salam verdi, sonra ona (namazda səhv etdiyini) dedilər. Sonra iki dəfə səhv səcdəsi etdi.

٧٦ - السَّلاَمُ بَعْدَ سَجْدَتَيِ السَّهْوِ

76-cı fəsil: Namazda salam verdikdən sonra iki dəfə səhv səcdəsi etmək

١٣٣٠ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، عَنْ عِكْرِمَةَ بْنِ عَمَّارٍ ، قَالَ : حَدَّثَنَا ضَمْضَمُ بْنُ جَوْسٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَلَّمَ ، ثُمَّ سَجَدَ سَجْدَتَيِ السَّهْوِ وَهُوَ جَالِسٌ ، ثُمَّ سَلَّمَ ، قَالَ : ذَكَرَهُ فِي حَدِيثِ ذِي الْيَدَيْنِ.

1330. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ (namazı bitirib) salam verdi. Sonra oturduğu halda səhv səcdəsi etdi, sonra salam verdi. Ravi dedi: “Əbu Hureyra bunu Zul-Yədeynin hədisində xəbər vermişdir”.

١٣٣١ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ أَبِي قِلَابَةَ ، عَنْ أَبِي الْمُهَلَّبِ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى ثَلاَثًا ، ثُمَّ سَلَّمَ ، فَقَالَ الْخِرْبَاقُ : إِنَّكَ صَلَّيْتَ ثَلاَثًا ، فَصَلَّى بِهِمُ الرَّكْعَةَ الْبَاقِيَةَ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ سَجَدَ سَجْدَتَيِ السَّهْوِ ، ثُمَّ سَلَّمَ.

1331. İmran ibn Husayn ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ üç rükət namaz qılıb salam verdi. Xirbəq adlı səhabə dedi: "Sən üç rükət qıldın". Peyğəmbər ﷺ qalan bir rükəti də qıldı, sonra salam verdi. Sonra iki dəfə səhv səcdəsi etdi və yenə salam verdi.

## ٧٧ - جِلْسَةُ الإِمَامِ بَيْنَ التَّسْلِيمِ وَالاِنْصِرَافِ

## 77-ci fəsil: İmamın (namazı bitirib) salam verməklə durub getmək arasında oturması

١٣٣٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ عَوْنٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ هِلاَلٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنِ الْبَرَاءِ ابْنِ عَازِبٍ قَالَ : رَمَقْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي صَلاَتِهِ ، فَوَجَدْتُ قِيَامَهُ وَرَكْعَتَهُ وَاعْتِدَالَهُ بَعْدَ الرَّكْعَةِ ، فَسَجْدَتَهُ ، فَجِلْسَتَهُ بَيْنَ السَّجْدَتَيْنِ ، فَسَجْدَتَهُ ، فَجِلْسَتَهُ بَيْنَ التَّسْلِيمِ وَالاِنْصِرَافِ قَرِيبًا مِنَ السَّوَاءِ.

1332. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﷺ demişdir: "Allah Elçisi ﷺ namazını qılanda ona diqqət etdim. Onun namazında olan qiyamın, rukunun, rukudan sonra düz durmanın, səcdənin, iki səcdə arasında oturuşun, yenə səcdənin və salam ilə durub getmək arasında olan vaxtın təqribən bərabər olduğunu gördüm".

١٣٣٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، قَالَ ابْنُ شِهَابٍ : أَخْبَرَتْنِي هِنْدُ بِنْتُ الْحَارِثِ الْفِرَاسِيَّةُ ، أَنَّ أُمَّ سَلَمَةَ أَخْبَرَتْهَا ، أَنَّ النِّسَاءَ فِي عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كُنَّ إِذَا سَلَّمْنَ مِنَ الصَّلاَةِ قُمْنَ ، وَثَبَتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَمَنْ صَلَّى مِنَ الرِّجَالِ مَا شَاءَ اللَّهُ ، فَإِذَا قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَامَ الرِّجَالُ.

1333. ...Ummu Sələmə ﷺ rəvayət edir ki, Allah Elçisinin ﷺ vaxtında qadınlar camaatla namaz qıldıqda, namaz qurtaran kimi salam verib qalxardılar. Allah Elçisi ﷺ və onunla namaz qılan kişilər isə bir qədər gözləyərdilər. Allah Elçisi ﷺ qalxdıqda, kişilər də qalxardı.

## ٧٨ - بَابُ الاِنْحِرَافِ بَعْدَ التَّسْلِيمِ

## 78-ci fəsil: Namazdan sonra imamın camaata tərəf çevrilməsi

١٣٣٤ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنِي يَعْلَى بْنُ عَطَاءٍ ، عَنْ جَابِرِ بْنِ يَزِيدَ بْنِ الأَسْوَدِ ، عَنْ أَبِيهِ ، أَنَّهُ صَلَّى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الصُّبْحِ ، فَلَمَّا صَلَّى انْحَرَفَ.

1334. ...Rəvayət edilir ki, Cabir ibn Yəzid ibn əl-Əsvədin atası ﵁ bir dəfə Allah Elçisi ﷺ ilə birlikdə Sübh namazını qıldı. Peyğəmbər ﷺ namazı bitirən kimi camaata tərəf döndü".

٧٩ - التَّكْبِيرُ بَعْدَ تَسْلِيمِ الإِمَامِ

79-cu fəsil: Namazda imamın salam verməsindən sonra təkbir etmək

١٣٣٥ - أَخْبَرَنَا بِشْرُ بْنُ خَالِدٍ الْعَسْكَرِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ سُفْيَانَ بْنِ عُيَيْنَةَ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ أَبِي مَعْبَدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : إِنَّمَا كُنْتُ أَعْلَمُ انْقِضَاءَ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالتَّكْبِيرِ.

1335. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Mən Allah Elçisinin ﷺ namazını bitirməsini təkbir (zikr) səsi ilə bilərdim".

٨٠ - بَابُ الأَمْرِ بِقِرَاءَةِ الْمُعَوِّذَاتِ بَعْدَ التَّسْلِيمِ مِنَ الصَّلاَةِ

80-ci fəsil: Namazda salamdan sonra "əl-Muavvizəti"[1] oxumağın əmr edilməsi

١٣٣٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنِ اللَّيْثِ ، عَنْ حُنَيْنِ بْنِ أَبِي حَكِيمٍ ، عَنْ عَلِيِّ بْنِ رَبَاحٍ ، عَنْ عُقْبَةَ بْنِ عَامِرٍ ، قَالَ : أَمَرَنِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ أَقْرَأَ الْمُعَوِّذَاتِ دُبُرَ كُلِّ صَلاَةٍ.

1336. ...Rəvayət edilir ki, Uqbə ibn Amir ﵁ demişdir: "Allah Elçisi ﷺ hər namazdan sonra "əl-Muavvizəti" oxumağı əmr etdi".

٨١ - بَابُ الاِسْتِغْفَارِ بَعْدَ التَّسْلِيمِ

81-ci fəsil: Namazda salamdan sonra bağışlanma diləmək

١٣٣٧ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنْ أَبِي عَمْرٍو الأَوْزَاعِيِّ ، قَالَ : حَدَّثَنِي شَدَّادٌ أَبُو عَمَّارٍ ، أَنَّ أَبَا أَسْمَاءَ الرَّحَبِيَّ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ ثَوْبَانَ مَوْلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُحَدِّثُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ إِذَا انْصَرَفَ مِنْ صَلاَتِهِ اسْتَغْفَرَ ثَلاَثًا ، وَقَالَ : اللَّهُمَّ أَنْتَ السَّلاَمُ ، وَمِنْكَ السَّلاَمُ ، تَبَارَكْتَ يَا ذَا الْجَلاَلِ وَالإِكْرَامِ.

1337. ...Allah Elçisinin ﷺ azad etdiyi kölə Səuban ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ namazını bitirdikdən sonra üç dəfə "əstəğfirullah" deyər, sonra buyurardı: "Allahım! Salam (bütün nöqsanlardan və eyiblərdən uzaq)

[1] Muavvizat - əl-Fələq və ən-Nəs surələrinin ümumiləşmiş adıdır.

Sənsən və əmin-amanlıq Səndəndir! Ey əzəmət və ehtiram Sahibi, Sən xeyirxahsan!”[1]

٨٢ - الذِّكْرُ بَعْدَ الاِسْتِغْفَارِ

82-ci fəsil: Bağışlanma dilədikdən sonra zikr etmək

١٣٣٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، وَمُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ بْنِ صُدْرَانَ ، عَنْ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَاصِمٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ الْحَارِثِ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا سَلَّمَ قَالَ : اللَّهُمَّ أَنْتَ السَّلاَمُ ، وَمِنْكَ السَّلاَمُ ، تَبَارَكْتَ يَا ذَا الْجَلاَلِ وَالإِكْرَامِ.

1338. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ namazda salam verdikdən sonra dedi: “Allahım! Salam (bütün nöqsanlardan və eyiblərdən uzaq) Sənsən və əmin-amanlıq Səndəndir! Ey əzəmət və ehtiram Sahibi, Sən xeyirxahsan!”[2]

٨٣ - بَابُ التَّهْلِيلِ بَعْدَ التَّسْلِيمِ

83-cü fəsil: Namazda salam verdikdən sonra “Lə: ilə:hə illəllah” demək

١٣٣٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ شُجَاعٍ الْمَرُّوذِيُّ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ ، عَنِ الْحَجَّاجِ بْنِ أَبِي عُثْمَانَ ، قَالَ : حَدَّثَنِي أَبُو الزُّبَيْرِ ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ الزُّبَيْرِ يُحَدِّثُ عَلَى هَذَا الْمِنْبَرِ ، وَهُوَ يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا سَلَّمَ يَقُولُ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، لاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ ، لاَ إِلَهَ إِلاَّ اللَّهُ لاَ نَعْبُدُ إِلاَّ إِيَّاهُ ، أَهْلَ النِّعْمَةِ وَالْفَضْلِ وَالثَّنَاءِ الْحَسَنِ ، لاَ إِلَهَ إِلاَّ اللَّهُ مُخْلِصِينَ لَهُ الدِّينَ وَلَوْ كَرِهَ الْكَافِرُونَ.

1339. ...Abdullah ibn əz-Zubeyrin ﵄ minbərdə belə dediyi rəvayət olunur: “Allah Elçisi ﷺ namazı bitirib salam verdikdə, deyərdi: “Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur! Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir! Qüdrət və güc yalnız Allahdadır! Allahdan başqa ibadətə layiq məbud yoxdur! Biz yalnız Ona ibadət edirik! Nemət Onundur, lütf Onundur və gözəl tərif Onadır!

[1] Transkripsiyası: Alla:hummə Əntəs-Sələ:mu va minkəs-Sələ:mu, təbə:raktə yə: Zəl-Cələ:li val-İkra:m!

[2] Transkripsiyası: Alla:hummə Əntəs-Sələ:mu va minkəs-Sələ:mu, təbə:raktə yə: Zəl-Cələ:li val-İkra:m!

Allahdan başqa ibadətə layiq məbud yoxdur! Kafirlərə xoş gəlməsə də, biz dini yalnız Ona məxsus edirik!"[1]

٨٤ - عَدَدُ التَّهْلِيلِ وَالذِّكْرِ بَعْدَ التَّسْلِيمِ

## 84-cü fəsil: Namazdan sonra "lə: ilə:hə illəllah" sözünün sayı və salamdan sonra deyilməsi

١٣٤٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، قَالَ : كَانَ عَبْدُ اللهِ بْنُ الزُّبَيْرِ يُهَلِّلُ فِي دُبُرِ الصَّلاَةِ ، يَقُولُ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَلاَ نَعْبُدُ إِلاَّ إِيَّاهُ ، لَهُ النِّعْمَةُ وَلَهُ الْفَضْلُ وَلَهُ الثَّنَاءُ الْحَسَنُ ، لاَ إِلَهَ إِلاَّ اللَّهُ مُخْلِصِينَ لَهُ الدِّينَ وَلَوْ كَرِهَ الْكَافِرُونَ ، ثُمَّ يَقُولُ ابْنُ الزُّبَيْرِ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُهَلِّلُ بِهِنَّ فِي دُبُرِ الصَّلاَةِ.

1340. ...Rəvayət edilir ki, Əbuz-Zubeyr ﵁ demişdir: "Abdullah ibn əz-Zubeyr namazdan sonra lə: ilə:hə illəllah deyərdi: "Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur! Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir! Qüdrət və güc yalnız Allahdadır! Allahdan başqa ibadətə layiq məbud yoxdur! Biz yalnız Ona ibadət edirik! Nemət Onundur, lütf Onundur və gözəl tərif Onadır! Allahdan başqa ibadətə layiq məbud yoxdur! Kafirlərə xoş gəlməsə də, biz dini yalnız Ona məxsus edirik!"[2] Sonra İbn əz-Zubeyr belə deyərdi: "Allah Elçisi ﷺ hər namazdan sonra "lə: ilə:hə iləllah"ı bu cür deyərdi".

٨٥ - نَوْعٌ آخَرُ مِنَ الْقَوْلِ عِنْدَ انْقِضَاءِ الصَّلاَةِ

## 85-ci fəsil: Namazı bitirdikdən sonra edilən başqa bir zikr

١٣٤١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، عَنْ سُفْيَانَ ، قَالَ : سَمِعْتُهُ مِنْ عَبْدَةَ بْنِ أَبِي لُبَابَةَ ، وَسَمِعْتُهُ مِنْ عَبْدِ الْمَلِكِ بْنِ أَعْيَنَ ، كِلاَهُمَا سَمِعَهُ مِنْ وَرَّادٍ ، كَاتِبِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ ، قَالَ : كَتَبَ مُعَاوِيَةُ إِلَى الْمُغِيرَةِ بْنِ شُعْبَةَ : أَخْبِرْنِي بِشَيْءٍ سَمِعْتَهُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا قَضَى الصَّلاَةَ ، قَالَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ

[1] Transkripsiyası: Lə ilə:hə iləlla:hu vahdəhu lə: şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r, lə: həulə va lə: quvvətə illə: billəh, lə: ilə:hə illəllah, lə: nə'budu illə: iyyə:hu, əhlən-ni'məti val-fadli vas-sənə:il-həsəni, lə: ilə:hə illəlla:hu muxlisi:nə ləhud-di:nə valəu kərihəl-kə:firu:n!

[2] Transkripsiyası: Lə: ilə:hə iləlla:hu vahdəhu lə: şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r, lə: ilə:hə illəllah, va lə: nə'budu illə: iyyə:hu, ləhun-ni'mətu va ləhul-fadlu va ləhus-sənə:ul-həsənu, lə: ilə:hə illəlla:hu muxlisi:nə ləhud-di:nə valəu kərihəl-kə:firu:n!

، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، اللَّهُمَّ لاَ مَانِعَ لِمَا أَعْطَيْتَ ، وَلاَ مُعْطِيَ لِمَا مَنَعْتَ ، وَلاَ يَنْفَعُ ذَا الْجَدِّ مِنْكَ الْجَدُّ.

1341. ...Muğira ibn Şöbənin ﷺ katibi Varradın ﷺ belə dediyi rəvayət edilir: "Muaviyə əl-Muğira ibn Şöbəyə məktub yazaraq dedi: "Mənə Allah Elçisindən ﷺ eşitdiyin bir şey haqda xəbər ver". O da (yazaraq) dedi: "Allahdan başqa ibadətə layiq məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur! Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir! Allahım! Sənin verdiyinə mane olacaq, mane olduğunu da verəcək bir kəs yoxdur! Heç bir hörmət sahibinə Sənin yanında hörməti fayda verməz!"[1]

١٣٤٢- أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنِ الْمُسَيَّبِ أَبِي الْعَلاَءِ ، عَنْ وَرَّادٍ ، قَالَ : كَتَبَ الْمُغِيرَةُ بْنُ شُعْبَةَ إِلَى مُعَاوِيَةَ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ دُبُرَ الصَّلاَةِ إِذَا سَلَّمَ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، اللَّهُمَّ لاَ مَانِعَ لِمَا أَعْطَيْتَ ، وَلاَ مُعْطِيَ لِمَا مَنَعْتَ ، وَلاَ يَنْفَعُ ذَا الْجَدِّ مِنْكَ الْجَدُّ.

1342. ...Rəvayət edilir ki, Varrad demişdir: "əl-Muğira ibn Şöbə Muaviyəyə məktub yazaraq dedi: "Həqiqətən, Allah Elçisi namazda salamdan sonra deyərdi: "Allahdan başqa ibadətə layiq olan məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir! Allahım! Sənin verdiyinə mane olacaq, mane olduğunu da verəcək bir kəs yoxdur. Heç bir hörmət sahibinə Sənin yanında hörməti fayda verməz!"[2]

## ٨٦ - كَمْ مَرَّةً يَقُولُ ذَلِكَ ؟

## 86-ci fəsil: Peyğəmbər ﷺ bu zikri neçə dəfə deyərdi?

١٣٤٣ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ إِسْمَعِيلَ الْمُجَالِدِيُّ ، قَالَ : أَنْبَأَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا الْمُغِيرَةُ ، وَذَكَرَ آخَرَ (ح) وَأَنْبَأَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا غَيْرُ وَاحِدٍ ، مِنْهُمُ الْمُغِيرَةُ ، عَنِ الشَّعْبِيِّ ، عَنْ وَرَّادٍ ، كَاتِبِ الْمُغِيرَةِ ، أَنَّ مُعَاوِيَةَ ، كَتَبَ إِلَى الْمُغِيرَةِ ، أَنِ اكْتُبْ إِلَيَّ بِحَدِيثٍ سَمِعْتَهُ مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَكَتَبَ إِلَيْهِ الْمُغِيرَةُ : إِنِّي سَمِعْتُهُ يَقُولُ عِنْدَ انْصِرَافِهِ مِنَ الصَّلاَةِ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ ، لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ، ثَلاَثَ مَرَّاتٍ.

[1] Transkripsiyası: Lə: ilə:hə iləlla:hu vahdəhu lə: şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r. Alla:hummə, lə: mə:nia limə: ə'taytə va lə: mu'tiyə limə: mənə'tə valə yənfəu zəl-cəddi minkəl-cədd!

[2] Transkripsiyası: Lə ilə:hə iləlla:hu vahdəhu lə: şəri:kə ləhu, ləhul-mulku va ləhul-həmdu va huvə alə: kulli şey in qadi:r. Alla:hummə lə: mə:nia limə: ə'taytə və lə: mu'tiyə limə: mənə'tə va lə: yənfəu zəl-cəddi minkəl-cədd!

1343. ...Muğiranın katibi Vərrad ﷺ rəvayət edir ki, Muaviyə Muğiraya belə bir məktub yazmışdı: "Mənə Allah Elçisindən ﷺ eşitdiyin bir hədis yaz". Muğira da ona cavabında belə yazdı: "Mən Allah Elçisinin ﷺ namazı bitirdikdən sonra üç dəfə belə dediyini eşitdim: "Allahdan başqa ibadətə layiq olan məbud yoxdur, O, təkdir, Onun şəriki yoxdur. Mülk Onundur və həmd Onadır! O, hər şeyə Qadirdir![1]"[2]

٨٧ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ بَعْدَ التَّسْلِيمِ

## 87-ci fəsil: Namazda salam verdikdən sonra edilən başqa bir zikr

١٣٤٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْحَاقَ الصَّاغَانِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو سَلَمَةَ الْخُزَاعِيُّ مَنْصُورُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا خَلاَّدُ بْنُ سُلَيْمَانَ ، قَالَ أَبُو سَلَمَةَ وَكَانَ مِنَ الْخَائِفِينَ ، عَنْ خَالِدِ بْنِ أَبِي عِمْرَانَ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا جَلَسَ مَجْلِسًا أَوْ صَلَّى تَكَلَّمَ بِكَلِمَاتٍ ، فَسَأَلَتْهُ عَائِشَةُ عَنِ الْكَلِمَاتِ ، فَقَالَ : إِنْ تَكَلَّمَ بِخَيْرٍ كَانَ طَابِعًا عَلَيْهِنَّ إِلَى يَوْمِ الْقِيَامَةِ ، وَإِنْ تَكَلَّمَ بِغَيْرِ ذَلِكَ كَانَ كَفَّارَةً لَهُ سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ ، أَسْتَغْفِرُكَ وَأَتُوبُ إِلَيْكَ.

1344. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ bir məclisdə oturduqda və ya namaz qıldıqda bəzi kəlmələr deyərdi. Aişə Allah Elçisindən ﷺ bu haqda soruşduqda, o dedi: "Əgər bu kəlmələri bir xeyir etdikdən sonra desən, bu xeyir Qiyamət gününə qədər yazılar. Xeyir olmayan bir əməldən sonra desən, sənin üçün kəffarə olar. (Bu kəlmələr:) Allahım, Sən pak və müqəddəssən! Sənə həmd olsun! Səndən bağışlanma diləyir, Sənə tövbə edirəm!"[3]

٨٨ - نَوْعٌ آخَرُ مِنَ الذِّكْرِ وَالدُّعَاءِ بَعْدَ التَّسْلِيمِ

## 88-ci fəsil: Namazda salam verdikdən sonra edilən zikr və dua

١٣٤٥ – أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَعْلَى ، قَالَ : حَدَّثَنَا قُدَامَةُ ، عَنْ جَسْرَةَ ، قَالَتْ : حَدَّثَتْنِي عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا قَالَتْ : دَخَلَتْ عَلَيَّ امْرَأَةٌ مِنَ الْيَهُودِ ، فَقَالَتْ : إِنَّ عَذَابَ الْقَبْرِ مِنَ الْبَوْلِ ، فَقُلْتُ : كَذَبْتِ ، فَقَالَتْ : بَلَى ، إِنَّا لَنَقْرِضُ مِنْهُ الْجِلْدَ وَالثَّوْبَ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الصَّلاَةِ وَقَدِ ارْتَفَعَتْ أَصْوَاتُنَا ، فَقَالَ : مَا هَذَا ؟ فَأَخْبَرْتُهُ بِمَا قَالَتْ ، فَقَالَ : صَدَقَتْ ، فَمَا صَلَّى بَعْدَ يَوْمِئِذٍ صَلاَةً إِلاَّ قَالَ فِي دُبُرِ الصَّلاَةِ : رَبَّ جِبْرِيلَ وَمِيكَائِيلَ وَإِسْرَافِيلَ أَعِذْنِي مِنْ حَرِّ النَّارِ ، وَعَذَابِ الْقَبْرِ.

---

[1] Transkripsiyası: Lə: ilə:hə illəllah, vahdəhu lə: şəri:kə ləh, ləhul-mulk va ləhul-həmd va huva alə: kulli şey in qadi:r!

[2] "Üç dəfə" sözü səhih deyil.

[3] Transkripsiyası: Subhə:nəkə Alla:hummə va bi-həmdik, əstəğfirukə va ətu:bu ileyk!

1345. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Yəhudi bir qadın yanıma gəlib belə dedi: “Həqiqətən, sidikdən təmizlənməməyə görə qəbir əzabı var”. Mən dedim: “Yalan deyirsən”. O dedi: “Xeyr, biz paltarımıza və dərimizə düşən sidik damcılarına görə o hissəni kəsərdik”. Allah Elçisi ﷺ namaz qılmaq üçün evdən çıxmışdı. Bizim səsimiz yüksəldikdə, Peyğəmbər ﷺ dedi: “Nə olub?” Onun dediklərini Peyğəmbərə ﷺ xəbər verdikdə,[1] o dedi: “O, doğru söyləyir”. O gündən Peyğəmbər ﷺ hər namazın sonunda bu duanı deməyə başladı: “Cəbrailin, Mikailin və İsrafilin Rəbbi! Cəhənnəmin istisindən və qəbir əzabından Sənə sığınıram![2]”[3]

٨٩ - نَوْعٌ آخَرُ مِنَ الدُّعَاءِ عِنْدَ الاِنْصِرَافِ مِنَ الصَّلاَةِ

## 89-cu fəsil: Namazı bitirdikdən sonra edilən başqa bir dua

١٣٤٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي حَفْصُ بْنُ مَيْسَرَةَ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ عَطَاءِ بْنِ أَبِي مَرْوَانَ ، عَنْ أَبِيهِ ، أَنَّ كَعْبًا حَلَفَ لَهُ بِاللَّهِ الَّذِي فَلَقَ الْبَحْرَ لِمُوسَى إِنَّا لَنَجِدُ فِي التَّوْرَاةِ : أَنَّ دَاوُدَ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، كَانَ إِذَا انْصَرَفَ مِنْ صَلاَتِهِ قَالَ : اللَّهُمَّ أَصْلِحْ لِي دِينِي الَّذِي جَعَلْتَهُ لِي عِصْمَةً ، وَأَصْلِحْ لِي دُنْيَايَ الَّتِي جَعَلْتَ فِيهَا مَعَاشِي ، اللَّهُمَّ إِنِّي أَعُوذُ بِرِضَاكَ مِنْ سَخَطِكَ ، وَأَعُوذُ بِعَفْوِكَ مِنْ نِقْمَتِكَ ، وَأَعُوذُ بِكَ مِنْكَ ، لاَ مَانِعَ لِمَا أَعْطَيْتَ ، وَلاَ مُعْطِيَ لِمَا مَنَعْتَ ، وَلاَ يَنْفَعُ ذَا الْجَدِّ مِنْكَ الْجَدُّ ، قَالَ : وَحَدَّثَنِي كَعْبٌ ، أَنَّ صُهَيْبًا حَدَّثَهُ ، أَنَّ مُحَمَّدًا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُهُنَّ عِنْدَ انْصِرَافِهِ مِنْ صَلاَتِهِ.

1346. ...Əta ibn Mərvan atasının ﵀ belə dediyini rəvayət edir, Kəb and içərək ona belə dedi: “Musa üçün dənizi yaran Allaha and olsun ki, biz Tövratda Allahın Peyğəmbəri Davudun ﷺ namazı bitirdikdə belə deməsini tapmışıq: “Allahım, mənim dinimi islah et, yaşayışım olan dünyamı yoluna qoy! Sənin qəzəbindən Sənin razılığına sığınıram! Sənin cəzandan Sənin əfvinə sığınıram! Səndən Sənə sığınıram! Sənin verdiyinə mane olacaq, mane olduğunu da verəcək bir kəs yoxdur! Heç bir hörmət sahibinə Sənin yanında hörməti fayda verməz!”[4] Bunu mənə Kəb danışdı. Ona

[1] Peyğəmbərin ﷺ xanımlarının otaqları məscidə birləşik idi, ona görə otağın içərisində möhkəm danışdıqda məsciddə olan adam danışıq səsini eşidərdi.

[2] Transkripsiyası: Rabbə Cibri:lə va Mi:kə:i:lə va İsra:fil, əizni: min hərrin-nə:r va azə:bil-qabr!

[3] Hədisin isnadı zəifdir.

[4] Transkripsiyası: Alla:hummə, əslih li: di:nilləzi: cəaltəhu li: i'smətən, va əslih li: dunyə:yəl-ləti: cəaltə fi:hə: məa:şi:, Alla:hummə, inni: əu:zu birida:kə min səxatik, va əu:zu biafvikə min niqmətik, va əu:zu bikə minkə! Lə: mə:ni'a limə: ə'taytə va lə: mu'tiyə limə: mənə'tə va lə: yənfəu zəl-cəddi minkəl-cədd!

da Suheyb belə demişdir: “Həqiqətən, Muhəmməd ﷺ namazı bitirdikdən sonra bu sözləri deyərdi”.[1]

٩٠ - بَابُ التَّعَوُّذِ فِي دُبُرِ الصَّلاَةِ

### 90-cı fəsil: Namazdan sonra Allaha sığınmaq

١٣٤٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُثْمَانَ الشَّحَّامِ ، عَنْ مُسْلِمِ بْنِ أَبِي بَكْرَةَ ، قَالَ : كَانَ أَبِي يَقُولُ فِي دُبُرِ الصَّلاَةِ : اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْكُفْرِ وَالْفَقْرِ ، وَعَذَابِ الْقَبْرِ ، فَكُنْتُ أَقُولُهُنَّ ، فَقَالَ أَبِي : أَيْ بُنَيَّ ، عَمَّنْ أَخَذْتَ هَذَا ؟ قُلْتُ عَنْكَ ، قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُهُنَّ فِي دُبُرِ الصَّلاَةِ.

1347. ...Rəvayət edilir ki, Muslim ibn Əbu Bəkra ﵁ demişdir: “Atam namazın sonunda (və ya sonra) deyərdi: “Allahım, küfrdən, kasıblıqdan və qəbir əzabından Sənə sığınıram!”[2] Mən də bunları deyirdim. Atam dedi: “Ey oğlum, bu duanı kimdən öyrənmisən?” Mən: “Səndən”- dedikdə, o dedi: “Həqiqətən, Allah Elçisi ﷺ bu sözləri namazdan sonra deyərdi”.

٩١ - عَدَدُ التَّسْبِيحِ بَعْدَ التَّسْلِيمِ

### 91-ci fəsil: Namazda salam verdikdən sonra təsbihlərin sayı

١٣٤٨ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَلَّتَانِ لاَ يُحْصِيهِمَا رَجُلٌ مُسْلِمٌ إِلاَّ دَخَلَ الْجَنَّةَ ، وَهُمَا يَسِيرٌ ، وَمَنْ يَعْمَلُ بِهِمَا قَلِيلٌ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الصَّلَوَاتُ الْخَمْسُ ، يُسَبِّحُ أَحَدُكُمْ فِي دُبُرِ كُلِّ صَلاَةٍ عَشْرًا ، وَيَحْمَدُ عَشْرًا ، وَيُكَبِّرُ عَشْرًا ، فَهِيَ خَمْسُونَ وَمِائَةٌ فِي اللِّسَانِ ، وَأَلْفٌ وَخَمْسُ مِئَةٍ فِي الْمِيزَانِ ، وَأَنَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَعْقِدُهُنَّ بِيَدِهِ ، وَإِذَا أَوَى أَحَدُكُمْ إِلَى فِرَاشِهِ أَوْ مَضْجَعِهِ سَبَّحَ ثَلاَثًا وَثَلاَثِينَ ، وَحَمِدَ ثَلاَثًا وَثَلاَثِينَ ، وَكَبَّرَ أَرْبَعًا وَثَلاَثِينَ ، فَهِيَ مِئَةٌ عَلَى اللِّسَانِ ، وَأَلْفٌ فِي الْمِيزَانِ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَيُّكُمْ يَعْمَلُ فِي كُلِّ يَوْمٍ وَلَيْلَةٍ أَلْفَيْنِ وَخَمْسَ مِئَةِ سَيِّئَةٍ ؟ قِيلَ : يَا رَسُولَ اللهِ ، وَكَيْفَ لاَ نُحْصِيهِمَا ؟ فَقَالَ : إِنَّ الشَّيْطَانَ يَأْتِي أَحَدَكُمْ وَهُوَ فِي صَلاَتِهِ ، فَيَقُولُ : اذْكُرْ كَذَا ، اذْكُرْ كَذَا ، وَيَأْتِيهِ عِنْدَ مَنَامِهِ فَيُنِيمُهُ.

1348. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “İki xislət var ki, onlara əməl edən müsəlman mütləq Cənnətə girər. Bu iki şey çox asan şeylərdir, lakin onlara əməl edən çox azdır”. Sonra Allah Elçisi ﷺ sözünə davam edərək buyurdu: “Sizdən biriniz beş namazın ardı ilə on dəfə təsbih (Subhən-Allah), on dəfə təhmid

---

[1] Hədisin isnadı zəifdir.

[2] Transkripsiyası: Alla:hummə inni: əu:zu bikə minəl-kufri val-fəqri, va azə:bil-qabri!

(Əlhəmdulilləh) və on dəfə təkbir (Allahu Əkbər) deyərsə, bu deyilənlər dildə yüz əllidir, tərəzidə isə min beş yüzdür”. Mən Allah Elçisinin ﷺ bunları barmaqları ilə saydığını gördüm. Sonra Allah Elçisi ﷺ dedi: “Sizdən biriniz yatağına girdiyi zaman (otuz üç dəfə) “Subhən-Allah”, (otuz üç dəfə) “Əlhəmdulilləh” və (otuz dörd dəfə) “Allahu Əkbər” desin. Bu deyilənlər dildə yüzdür, tərəzidə isə mindir”. Allah Elçisi ﷺ buyurdu: “Elə isə sizdən hansı biriniz gecə-gündüz iki min beş yüz günah iş görür?” Səhabələrdən biri dedi: “Ey Allahın Elçisi! Necə ola bilər ki, biz onu qorumayaq?” O dedi: “Sizdən biriniz namaz qılarkən şeytan gəlib ona deyir: “Filan və filan işi xatırla”. O da bunları zikr etməz. Şeytan biriniz yatarkən yanına gəlib təsbih etmədən yatızdırır. Həmçinin namazında gəlib təsbih etmədən əvvəl bir ehtiyacını xatırladır”.

## ٩٢ - نَوْعٌ آخَرُ مِنْ عَدَدِ التَّسْبِيحِ

## 92-ci fəsil: Təsbihləri saymağın başqa növü

١٣٤٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ سَمُرَةَ ، عَنْ أَسْبَاطٍ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ قَيْسٍ ، عَنِ الْحَكَمِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مُعَقِّبَاتٌ لاَ يَخِيبُ قَائِلُهُنَّ : يُسَبِّحُ اللَّهَ فِي دُبُرِ كُلِّ صَلاَةٍ ثَلاَثًا وَثَلاَثِينَ ، وَيَحْمَدُهُ ثَلاَثًا وَثَلاَثِينَ ، وَيُكَبِّرُهُ أَرْبَعًا وَثَلاَثِينَ.

1349. ...Rəvayət edilir ki, Kəb ibn Ucra ؓ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Bir-birinin ardı ilə gələn kəlmələri deyənlər məhrum olmazlar. Bunlar hər namazdan sonra otuz üç dəfə subhən-Allah, otuz üç dəfə əlhəmulilləh və otuz dörd dəfə Allahu Əkbər deməkdir”.

## ٩٣ - نَوْعٌ آخَرُ مِنْ عَدَدِ التَّسْبِيحِ.

## 93-cü fəsil: Təsbihləri saymağın başqa növü

١٣٥٠ - أَخْبَرَنَا مُوسَى بْنُ حِزَامٍ التِّرْمِذِيُّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنِ ابْنِ إِدْرِيسَ ، عَنْ هِشَامِ بْنِ حَسَّانَ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ كَثِيرِ ابْنِ أَفْلَحَ ، عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ، قَالَ : أُمِرُوا أَنْ يُسَبِّحُوا دُبُرَ كُلِّ صَلاَةٍ ثَلاَثًا وَثَلاَثِينَ ، وَيَحْمَدُوا ثَلاَثًا وَثَلاَثِينَ ، وَيُكَبِّرُوا أَرْبَعًا وَثَلاَثِينَ ، فَأُتِيَ رَجُلٌ مِنَ الأَنْصَارِ فِي مَنَامِهِ ، فَقِيلَ لَهُ : أَمَرَكُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ تُسَبِّحُوا دُبُرَ كُلِّ صَلاَةٍ ثَلاَثًا وَثَلاَثِينَ ، وَتَحْمَدُوا ثَلاَثًا وَثَلاَثِينَ ، وَتُكَبِّرُوا أَرْبَعًا وَثَلاَثِينَ ؟ قَالَ : نَعَمْ ، قَالَ : فَاجْعَلُوهَا خَمْسًا وَعِشْرِينَ ، وَاجْعَلُوا فِيهَا التَّهْلِيلَ ، فَلَمَّا أَصْبَحَ أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَذَكَرَ ذَلِكَ لَهُ ، فَقَالَ : اجْعَلُوهَا كَذَلِكَ.

1350. ...Rəvayət edilir ki, Zeyd ibn Sabit ؓ demişdir: “Səhabələr hər namazın ardı ilə otuz üç dəfə təsbih (Subhən-Allah), otuz üç dəfə təhmid

(Əlhəmdulilləh) və otuz dörd dəfə təkbir (Allahu Əkbər) etməklə əmr olundular. Ənsardan olan bir kişi yuxuda ona belə deyildiyini gördü: "Sizə otuz üç dəfə təsbih (Subhən-Allah), otuz üç dəfə təhmid (Əlhəmdulilləh) və otuz dörd dəfə təkbir (Allahu Əkbər) etmək əmr olunubmu?" Kişi: "Bəli"- dedi. Adam ona dedi: "Bunları iyirmi beş dəfə edin və buna təhlili (Lə iləhə illəllah) də əlavə edin!" Səhər açıldıqda, o, bunu Peyğəmbərə ﷺ danışdı. Peyğəmbər ﷺ də buyurdu: "Belə də edin!"

١٣٥١ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ عَبْدِ الْكَرِيمِ أَبُو زُرْعَةَ الرَّازِيُّ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ عَبْدِ اللهِ بْنِ يُونُسَ ، قَالَ : حَدَّثَنِي عَلِيُّ بْنُ الْفُضَيْلِ بْنِ عِيَاضٍ ، عَنْ عَبْدِ الْعَزِيزِ بْنِ أَبِي رَوَّادٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَجُلاً رَأَى فِيمَا يَرَى النَّائِمُ ، قِيلَ لَهُ : بِأَيِّ شَيْءٍ أَمَرَكُمْ نَبِيُّكُمْ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : أَمَرَنَا أَنْ نُسَبِّحَ ثَلاثًا وَثَلاثِينَ ، وَنَحْمَدَ ثَلاثًا وَثَلاثِينَ ، وَنُكَبِّرَ أَرْبَعًا وَثَلاثِينَ ، فَتِلْكَ مِئَةٌ ، قَالَ : سَبِّحُوا خَمْسًا وَعِشْرِينَ ، وَاحْمَدُوا خَمْسًا وَعِشْرِينَ ، وَكَبِّرُوا خَمْسًا وَعِشْرِينَ ، وَهَلِّلُوا خَمْسًا وَعِشْرِينَ ، فَتِلْكَ مِئَةٌ ، فَلَمَّا أَصْبَحَ ذَكَرَ ذَلِكَ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : افْعَلُوا كَمَا قَالَ الأَنْصَارِيُّ.

1351. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, bir kişiyə yuxuda belə deyildi: "Peyğəmbəriniz sizə nəyi əmr etdi?" O da belə cavab verdi: "Otuz üç dəfə təsbih (Subhən-Allah), otuz üç dəfə təhmid (Əlhəmdulilləh) və otuz dörd dəfə təkbir (Allahu Əkbər) deməyimizi əmr etdi. Bununla sayı yüz olur". Adam dedi: "İyirmi beş dəfə təsbih (Subhən-Allah), iyirmi beş dəfə təhmid (Əlhəmdulilləh), iyirmi beş dəfə təkbir "Allahu Əkbər", iyirmi beş dəfə də təhlili (Lə iləhə illəllah) deyin ki, yüz olsun!" Səhər açıldıqda, o, bunu Peyğəmbərə ﷺ danışdı. Allah Elçisi ﷺ də belə buyurdu: "Ənsarın dediyi kimi edin!"

## ٩٤ - نَوْعٌ آخَرُ مِنْ عَدَدِ التَّسْبِيحِ

## 94-cü fəsil: Təsbihləri saymağın başqa növü

١٣٥٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، مَوْلَى آلِ طَلْحَةَ ، قَالَ : سَمِعْتُ كُرَيْبًا ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنْ جُوَيْرِيَةَ بِنْتِ الْحَارِثِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَرَّ عَلَيْهَا وَهِيَ فِي الْمَسْجِدِ تَدْعُو ، ثُمَّ مَرَّ بِهَا قَرِيبًا مِنْ نِصْفِ النَّهَارِ ، فَقَالَ لَهَا : مَا زِلْتِ عَلَى حَالِكِ ؟ قَالَتْ : نَعَمْ ، قَالَ : أَلاَ أُعَلِّمُكِ ــ يَعْنِي ــ كَلِمَاتٍ تَقُولِينَهُنَّ : سُبْحَانَ اللهِ عَدَدَ خَلْقِهِ ، سُبْحَانَ اللهِ عَدَدَ خَلْقِهِ ، سُبْحَانَ اللهِ عَدَدَ خَلْقِهِ ، سُبْحَانَ اللهِ رِضَا نَفْسِهِ ، سُبْحَانَ اللهِ رِضَا نَفْسِهِ ، سُبْحَانَ اللهِ رِضَا نَفْسِهِ ، سُبْحَانَ اللهِ زِنَةَ عَرْشِهِ ، سُبْحَانَ اللهِ زِنَةَ عَرْشِهِ ، سُبْحَانَ اللهِ زِنَةَ عَرْشِهِ ، سُبْحَانَ اللهِ مِدَادَ كَلِمَاتِهِ ، سُبْحَانَ اللهِ مِدَادَ كَلِمَاتِهِ ، سُبْحَانَ اللهِ مِدَادَ كَلِمَاتِهِ.

1352. ...Rəvayət edilir ki, Cuveyriyyə bint əl-Haris ﵂ məsciddə dua edərkən Peyğəmbər ﷺ onunla rastlaşdı. Peyğəmbər ﷺ günorta qayıtdıqda Cuveyriyyəyə dedi: “Sən indiyə qədər bu vəziyyətdə oturmusan?” O: “Bəli” dedi. Peyğəmbər ﷺ buyurdu: “Sənə deyəcəyin kəlmələr öyrədimmi?! “Yaratdıqlarının sayı qədər həmd edərək Allaha tariflər deyirik! Yaratdıqlarının sayı qədər həmd edərək Allaha tariflər deyirik! Yaratdıqlarının sayı qədər həmd edərək Allaha tariflər deyirik! Özünün razı olduğu qədər həmd edərək Allaha tariflər deyirik! Özünün razı olduğu qədər həmd edərək Allaha tariflər deyirik! Özünün razı olduğu qədər həmd edərək Allaha tariflər deyirik! Ərşinin ağırlığı qədər həmd edərək Allaha tariflər deyirik! Ərşinin ağırlığı qədər həmd edərək Allaha tariflər deyirik! Ərşinin ağırlığı qədər həmd edərək Allaha tariflər deyirik! Kəlmələrinin çoxluğu qədər həmd edərək Allaha tariflər deyirik! Kəlmələrinin çoxluğu qədər həmd edərək Allaha tariflər deyirik! Kəlmələrinin çoxluğu qədər həmd edərək Allaha tariflər deyirik!”[1]

## ٩٥ - نَوْعٌ آخَرُ

## 95-cü fəsil: Təsbihləri saymağın başqa növü

١٣٥٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا عَتَّابٌ هُوَ ابْنُ بَشِيرٍ ، عَنْ خُصَيْفٍ ، عَنْ عِكْرِمَةَ ، وَمُجَاهِدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : جَاءَ الْفُقَرَاءُ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالُوا : يَا رَسُولَ اللهِ ، إِنَّ الأَغْنِيَاءَ يُصَلُّونَ كَمَا نُصَلِّي ، وَيَصُومُونَ كَمَا نَصُومُ ، وَلَهُمْ أَمْوَالٌ يَتَصَدَّقُونَ وَيُنْفِقُونَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا صَلَّيْتُمْ فَقُولُوا : سُبْحَانَ اللهِ ثَلاَثًا وَثَلاَثِينَ ، وَالْحَمْدُ لِلَّهِ ثَلاَثًا وَثَلاَثِينَ ، وَاللَّهُ أَكْبَرُ ثَلاَثًا وَثَلاَثِينَ ، وَلاَ إِلَهَ إِلاَّ اللَّهُ عَشْرًا ، فَإِنَّكُمْ تُدْرِكُونَ بِذَلِكَ مَنْ سَبَقَكُمْ ، وَتَسْبِقُونَ مَنْ بَعْدَكُمْ.

1353. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Kasıblar Allah Elçisinin ﷺ yanına gəlib dedilər: “Ey Allahın Elçisi! Varlılar da bizim kimi namaz qılır, bizim kimi oruc tuturlar, lakin onların mal-dövlətləri də var və (ondan) sədəqə verirlər və (Allah yolunda) xərcləyirlər”. Allah Elçisi ﷺ dedi: “Namaz qıldıqda otuz üç dəfə “Subhən-Allah”, otuz üç dəfə “Əlhəmdulilləh”, otuz üç dəfə “Allahu Əkbər” və on dəfə “Lə iləhə

[1] Transkripsiyası: Subhə:n-Alla:hi adədə xalqihi! Subhə:n-Alla:hi adədə xalqihi! Subhə:n-Alla:hi adədə xalqihi! Subhə:n-Alla:hi rida nəfsihi! Subhə:n-Alla:hi rida nəfsihi! Subhə:n-Alla:hi rida nəfsihi! Subhə:n-Alla:hi zinətə arşihi! Subhə:n-Alla:hi zinətə arşihi! Subhə:n-Alla:hi zinətə arşihi! Subhə:n-Alla:hi midə:də kəlimə:tihi! Subhə:n-Alla:hi midə:də kəlimə:tihi! Subhə:n-Alla:hi midə:də kəlimə:tihi!

illəllah" deyin! Bununla həm savab qazanmaq cəhətdən sizdən qabaqda olanlara çatar, həm də sizdən sonrakıları keçərsiniz".[1]

٩٦ - نَوْعٌ آخَرُ

96-cı fəsil: Namazdan sonra ediləcək başqa bir dua

١٣٥٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَفْصِ بْنِ عَبْدِ اللهِ النَّيْسَابُورِيُّ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : حَدَّثَنِي إِبْرَاهِيمُ ، يَعْنِي ابْنَ طَهْمَانَ ، عَنِ الْحَجَّاجِ بْنِ الْحَجَّاجِ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ أَبِي عَلْقَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ سَبَّحَ فِي دُبُرِ صَلاَةِ الْغَدَاةِ مِئَةَ تَسْبِيحَةٍ ، وَهَلَّلَ مِئَةَ تَهْلِيلَةٍ ، غُفِرَتْ لَهُ ذُنُوبُهُ ، وَلَوْ كَانَتْ مِثْلَ زَبَدِ الْبَحْرِ.

1354. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Sübh namazından sonra yüz dəfə "Subhən-Allah" və yüz dəfə "Lə iləhə illəllah" deyərsə, dənizdə olan köpüklər qədər olsa belə, günahları bağışlanar".

٩٧ - بَابُ عَقْدِ التَّسْبِيحِ

97-cü fəsil: Təsbihləri saymaq

١٣٥٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى الصَّنْعَانِيُّ ، وَالْحُسَيْنُ بْنُ مُحَمَّدٍ الذَّارِعُ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا عَثَّامُ بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَعْقِدُ التَّسْبِيحَ.

1355. ...Rəvayət edilir ki, Abdullah ibn Amr رضي الله عنهما demişdir: "Mən Allah Elçisinin ﷺ təsbih etmək üçün barmaqlarını bükdüyünü gördüm".

٩٨ - بَابُ تَرْكِ مَسْحِ الْجَبْهَةِ بَعْدَ التَّسْلِيمِ

98-ci fəsil: Namazı bitirib salam verdikdən sonra alında olan torpağı silməmək

١٣٥٦ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا بَكْرٌ وَهُوَ ابْنُ مُضَرَ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُجَاوِرُ فِي الْعَشْرِ الَّذِي فِي وَسَطِ الشَّهْرِ ، فَإِذَا كَانَ مِنْ حِينِ يَمْضِي عِشْرُونَ لَيْلَةً وَيَسْتَقْبِلُ إِحْدَى وَعِشْرِينَ يَرْجِعُ إِلَى مَسْكَنِهِ ، وَيَرْجِعُ مَنْ كَانَ يُجَاوِرُ مَعَهُ ، ثُمَّ إِنَّهُ أَقَامَ فِي شَهْرٍ جَاوَرَ فِيهِ تِلْكَ اللَّيْلَةَ الَّتِي كَانَ يَرْجِعُ فِيهَا ، فَخَطَبَ النَّاسَ ، فَأَمَرَهُمْ بِمَا شَاءَ اللَّهُ ثُمَّ قَالَ : إِنِّي كُنْتُ أُجَاوِرُ هَذِهِ الْعَشْرَ ، ثُمَّ

[1] "On dəfə "lə iləhə illəllah" deyin" hissəsi səhih deyil.

بَدَا لِي أَنْ أُجَاوِرَ هَذِهِ الْعَشْرَ الأَوَاخِرَ ، فَمَنْ كَانَ اعْتَكَفَ مَعِي ، فَلْيَثْبُتْ فِي مُعْتَكَفِهِ ، وَقَدْ رَأَيْتُ هَذِهِ اللَّيْلَةَ فَأُنْسِيتُهَا ، فَالْتَمِسُوهَا فِي الْعَشْرِ الأَوَاخِرِ فِي كُلِّ وَتْرٍ ، وَقَدْ رَأَيْتُنِي أَسْجُدُ فِي مَاءٍ وَطِينٍ ، قَالَ أَبُو سَعِيدٍ : مُطِرْنَا لَيْلَةَ إِحْدَى وَعِشْرِينَ ، فَوَكَفَ الْمَسْجِدُ فِي مُصَلَّى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَنَظَرْتُ إِلَيْهِ وَقَدِ انْصَرَفَ مِنْ صَلاَةِ الصُّبْحِ ، وَوَجْهُهُ مُبْتَلٌّ طِينًا وَمَاءً.

1356. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: “Allah Elçisi ﷺ Ramazan ayının ortasında etikaf edərdi. İyirminci gecəni məsciddə keçirər, iyirmi birinci gün evinə qayıdardı. Onunla birlikdə etikaf edənlər də belə edərdilər. Sonra o, evinə qayıtdığı gecə qalxıb insanlara xütbə verdi və Allahın ona əmr etdiklərini insanlara xəbər verərək dedi: “Mən (Ramazan ayının) orta on günündə etikaf edirdim. Sonra mənə bildirildi ki, etikafı axırıncı on gündə edim. Mənimlə birlikdə etikaf edənlər öz etikaflarında qalsınlar. Mən bunu gecə (Qədr gecəsinin hansı gündə olduğunu yuxuda) gördüm, lakin bu mənə unutduruldu. Onu axırıncı on günün tək günlərində axtarın. Mən (yuxuda) su və palçıq üzərinə səcdə etdiyimi görmüşəm”. Əbu Səid deyir: “İyirmi birinci gecə yağış yağdı. Allah Elçisinin ﷺ məscidində namaz qıldığı yerə su yığılmışdı. Allah Elçisi ﷺ namazı bitirdikdən sonra onun üzünə diqqət etdim, onun alnı palçıq və suya bulaşmışdı”.

### ٩٩ - بَابُ قُعُودِ الإِمَامِ فِي مُصَلاَّهُ بَعْدَ التَّسْلِيمِ

### 99-cu fəsil: İmamın namazda salam verdikdən sonra namazgahında oturması

١٣٥٧ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا صَلَّى الْفَجْرَ قَعَدَ فِي مُصَلاَّهُ حَتَّى تَطْلُعَ الشَّمْسُ.

1357. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: “Allah Elçisi ﷺ Sübh namazını qıldıqdan sonra günəş çıxana qədər namaz qıldığı yerdə oturardı”.

١٣٥٨ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، وَذَكَرَ آخَرَ ، عَنْ سِمَاكِ بْنِ حَرْبٍ ، قَالَ : قُلْتُ لِجَابِرِ بْنِ سَمُرَةَ : كُنْتَ تُجَالِسُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : نَعَمْ ، كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا صَلَّى الْفَجْرَ جَلَسَ فِي مُصَلاَّهُ حَتَّى تَطْلُعَ الشَّمْسُ ، فَيَتَحَدَّثُ أَصْحَابُهُ يَذْكُرُونَ حَدِيثَ الْجَاهِلِيَّةِ ، وَيُنْشِدُونَ الشِّعْرَ وَيَضْحَكُونَ ، وَيَتَبَسَّمُ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1358. ...Rəvayət edilir ki, Səmmək ibn Hərb ﷺ demişdir: "Mən Cabir ibn Səmuraya dedim: "Sən Allah Elçisi ﷺ ilə birlikdə məclisdə olmusanmı?" O dedi: "Bəli. Allah Elçisi ﷺ Sübh namazını qıldıqdan sonra günəş çıxana qədər namaz qıldığı yerdə oturardı. Səhabələri ilə söhbət edər, səhabələri də cahillikdə olan hadisələr haqda söhbət edər və şeirlər deyərək gülərdilər. Allah Elçisi ﷺ də təbəssüm edərdi".

١٠٠ - بَابُ الاِنْصِرَافِ مِنَ الصَّلاَةِ

## 100-cü fəsil: Namazdan sonra arxaya çevrilmək

١٣٥٩ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنِ السُّدِّيِّ ، قَالَ : سَأَلْتُ أَنَسَ بْنَ مَالِكٍ ، كَيْفَ أَنْصَرِفُ إِذَا صَلَّيْتُ عَنْ يَمِينِي ، أَوْ عَنْ يَسَارِي ؟ قَالَ : أَمَّا أَنَا فَأَكْثَرُ مَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَنْصَرِفُ عَنْ يَمِينِهِ.

1359. ...Rəvayət edilir ki, əs-Suddi ﷺ demişdir: "Namazdan sonra hansı tərəfə - sağa, yoxsa sol tərəfə çevrilmək barəsində Ənəs ibn Malikdən soruşdum. O dedi: "Mən Allah Elçisinin ﷺ arxadakılara doğru çox vaxt sağ tərəfindən çevrildiyini görmüşəm".

١٣٦٠ - أَخْبَرَنَا أَبُو حَفْصٍ عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ عُمَارَةَ ، عَنِ الأَسْوَدِ ، قَالَ : قَالَ عَبْدُ اللهِ : لاَ يَجْعَلَنَّ أَحَدُكُمْ لِلشَّيْطَانِ مِنْ نَفْسِهِ جُزْءًا ، يَرَى أَنَّ حَتْمًا عَلَيْهِ أَنْ لاَ يَنْصَرِفَ إِلاَّ عَنْ يَمِينِهِ ، لَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَكْثَرَ انْصِرَافِهِ عَنْ يَسَارِهِ.

1360. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Sizdən heç kim "Namaz bitdikdə sağ tərəfdən dönmək vacibdir"- deyə nəfsində şeytana yer qoymasın, çünki mən Allah Elçisinin ﷺ namazdan sonra çox vaxt sol tərəfdən çevrildiyini görmüşəm".

١٣٦١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا بَقِيَّةُ ، قَالَ : حَدَّثَنَا الزُّبَيْدِيُّ ، أَنَّ مَكْحُولاً حَدَّثَهُ ، أَنَّ مَسْرُوقَ بْنَ الأَجْدَعِ حَدَّثَهُ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَشْرَبُ قَائِمًا وَقَاعِدًا ، وَيُصَلِّي حَافِيًا وَمُنْتَعِلاً ، وَيَنْصَرِفُ عَنْ يَمِينِهِ وَعَنْ شِمَالِهِ.

1361. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisinin ﷺ ayaq üstə də, oturduğu halda da su içdiyini, ayaqyalın və ayaqqabı ilə də namaz qıldığını, (namazdan sonra) arxadakılara doğru sağ tərəfdən də, sol tərəfdən də çevrildiyini görmüşəm".

١٠١ - بَابُ الْوَقْتِ الَّذِي يَنْصَرِفُ فِيهِ النِّسَاءُ مِنَ الصَّلاَةِ

## 101-ci fəsil: Qadınlar namaz qıldıqdan sonra məsciddən nə vaxt çıxırlar?

١٣٦٢ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَانَ النِّسَاءُ يُصَلِّينَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْفَجْرَ ، فَكَانَ إِذَا سَلَّمَ انْصَرَفْنَ مُتَلَفِّعَاتٍ بِمُرُوطِهِنَّ ، فَلاَ يُعْرَفْنَ مِنَ الْغَلَسِ.

1362. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Qadınlar Allah Elçisi ﷺ ilə birlikdə Sübh namazını qılar, namazda salam verdikdən sonra geyimlərinə bürünərək məsciddən çıxardılar. Hava qaranlıq olduğu üçün onlar tanınmazdılar".

١٠٢ - بَابُ النَّهْيِ عَنْ مُبَادَرَةِ الإِمَامِ بِالاِنْصِرَافِ مِنَ الصَّلاَةِ

## 102-ci fəsil: Namazda imamı qabaqlamağın qadağan olması

١٣٦٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ مُسْهِرٍ ، عَنِ الْمُخْتَارِ ابْنِ فُلْفُلٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ يَوْمٍ ، ثُمَّ أَقْبَلَ عَلَيْنَا بِوَجْهِهِ فَقَالَ : إِنِّي إِمَامُكُمْ ، فَلاَ تُبَادِرُونِي بِالرُّكُوعِ وَلاَ بِالسُّجُودِ ، وَلاَ بِالْقِيَامِ وَلاَ بِالاِنْصِرَافِ ، فَإِنِّي أَرَاكُمْ مِنْ أَمَامِي وَمِنْ خَلْفِي ، ثُمَّ قَالَ : وَالَّذِي نَفْسِي بِيَدِهِ ، لَوْ رَأَيْتُمْ مَا رَأَيْتُ لَضَحِكْتُمْ قَلِيلاً وَلَبَكَيْتُمْ كَثِيرًا قُلْنَا : مَا رَأَيْتَ يَا رَسُولَ اللهِ ؟ قَالَ : رَأَيْتُ الْجَنَّةَ وَالنَّارَ.

1363. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Bir gün Allah Elçisi ﷺ bizə namaz qıldırdı. Sonra üzünü bizə tərəf çevirib dedi: "Həqiqətən, mən sizin imamınızam. Məni ruku və səcdə etməkdə, qiyama qalxmaqda və namazı məndən öncə bitirməkdə qabaqlamayın! Mən önümdə və arxamda olanları görürəm". Sonra dedi: "Canım Əlində Olana and olsun! Mənim gördüyümü görsəydiniz, az gülüb çox ağlayardınız". Biz dedik: "Sən nə görmüsən, ey Allahın Elçisi?" O dedi: "Mən Cənnəti və Cəhənnəmi görmüşəm".

١٠٣ - بَابُ ثَوَابِ مَنْ صَلَّى مَعَ الإِمَامِ حَتَّى يَنْصَرِفَ

## 103-cü fəsil: İmam namazı bitirənə qədər onunla namaz qılmağın savabı

١٣٦٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ وَهُوَ ابْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ بْنُ أَبِي هِنْدٍ ، عَنِ الْوَلِيدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، عَنْ أَبِي ذَرٍّ ، قَالَ : صُمْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَمَضَانَ فَلَمْ يَقُمْ بِنَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى بَقِيَ سَبْعٌ مِنَ الشَّهْرِ ، فَقَامَ بِنَا حَتَّى ذَهَبَ نَحْوٌ مِنْ ثُلُثِ اللَّيْلِ ، ثُمَّ كَانَتْ سَادِسَةٌ فَلَمْ يَقُمْ بِنَا ، فَلَمَّا كَانَتِ الْخَامِسَةُ قَامَ بِنَا حَتَّى ذَهَبَ نَحْوٌ مِنْ شَطْرِ اللَّيْلِ ، قُلْنَا : يَا رَسُولَ اللهِ ، لَوْ نَفَلْتَنَا قِيَامَ هَذِهِ اللَّيْلَةِ ، قَالَ : إِنَّ الرَّجُلَ إِذَا صَلَّى مَعَ

الإِمَامِ حَتَّى يَنْصَرِفَ حُسِبَ لَهُ قِيَامُ لَيْلَةٍ ، قَالَ : ثُمَّ كَانَتِ الرَّابِعَةُ فَلَمْ يَقُمْ بِنَا ، فَلَمَّا بَقِيَ ثُلُثٌ مِنَ الشَّهْرِ أَرْسَلَ إِلَى بَنَاتِهِ وَنِسَائِهِ ، وَحَشَدَ النَّاسَ ، فَقَامَ بِنَا حَتَّى خَشِينَا أَنْ يَفُوتَنَا الْفَلاَحُ ، ثُمَّ لَمْ يَقُمْ بِنَا شَيْئًا مِنَ الشَّهْرِ ، قَالَ دَاوُدُ : قُلْتُ : مَا الْفَلاَحُ ؟ قَالَ : السُّحُورُ.

1364. ...Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə Ramazan ayının orucunu tutduq. Ramazan ayının son yeddi günü qalana qədər bizimlə (təravih) namazını qılmadı. O, bizimlə gecənin ilk üçdəbiri keçdikdən sonra namaz qıldı. Sonra (ayın axırına) altı gün qaldıqda, yenə bizimlə (təravih) namazını qılmadı. Beş gün qaldıqda və gecənin yarısı keçdikdə, bizimlə (təravih) namazını qıldı. Biz dedik: “Ey Allahın Elçisi, əgər sən istəsəydin, biz bütün gecəni səninlə namaz qıla bilərdik”. O dedi: “Həqiqətən, kim imam namazı bitirənə kimi onunla birlikdə namaz qılarsa, onun üçün bütün gecəni namaz qılmış kimi yazılar”. Sonra dördüncü gecə bizimlə (təravih) namazını qılmadı. Ramazan ayının bitməsinə üç gecə qaldıqda, öz qızlarına və qadınlarına xəbər göndərdi və insanları toplayıb bizimlə (təravih) namazını qıldı. Namazda o qədər dayandıq ki, fələhə gecikməkdən qorxduq. Bundan sonra həmin ay bizimlə (təravih) namazını qılmadı”. Hədisin ravisi Davud dedi: “Fələh nədir?” O dedi: “Sahurdur”.

١٠٤ - بَابُ الرُّخْصَةِ لِلإِمَامِ فِي تَخَطِّي رِقَابِ النَّاسِ

## 104-cü fəsil: İmamın insanların çiyinləri arasından keçərək getməsinin icazəli olması

١٣٦٥ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ بَكَّارٍ الْحَرَّانِيُّ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ السَّرِيِّ ، عَنْ عُمَرَ بْنِ سَعِيدِ بْنِ أَبِي حُسَيْنٍ النَّوْفَلِيِّ ، عَنْ ابْنِ أَبِي مُلَيْكَةَ ، عَنْ عُقْبَةَ بْنِ الْحَارِثِ ، قَالَ : صَلَّيْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْعَصْرَ بِالْمَدِينَةِ ، ثُمَّ انْصَرَفَ يَتَخَطَّى رِقَابَ النَّاسِ سَرِيعًا حَتَّى تَعَجَّبَ النَّاسُ لِسُرْعَتِهِ ، فَتَبِعَهُ بَعْضُ أَصْحَابِهِ ، فَدَخَلَ عَلَى بَعْضِ أَزْوَاجِهِ ، ثُمَّ خَرَجَ ، فَقَالَ : إِنِّي ذَكَرْتُ وَأَنَا فِي الْعَصْرِ شَيْئًا مِنْ تِبْرٍ كَانَ عِنْدَنَا ، فَكَرِهْتُ أَنْ يَبِيتَ عِنْدَنَا فَأَمَرْتُ بِقِسْمَتِهِ.

1365. ...Rəvayət edilir ki, Uqbə ibn əl-Haris ﷺ demişdir: “Mən Mədinədə Peyğəmbər ﷺ ilə Əsr namazını qıldım. Sonra o, insanların çiyinlərinin arasından sürətlə çıxıb getdi. Bəziləri onun sürətlə çıxıb getməsinə təəccüb etdilər. Bəzi səhabələr onun ardı ilə getdilər. O, zövcələrindən birinin evinə daxil oldu, sonra çıxıb dedi: “Namazda, evimdə (əmanət olaraq verilmiş) bir qədər qızılın olması yadıma düşdü. Mən istəmədim ki, o

bizim yanımızda qalsın və əmr etdim ki, onu insanlar arasında bölüşdürsünlər".

١٠٥ - بَابُ إِذَا قِيلَ لِلرَّجُلِ صَلَّيْتَ هَلْ يَقُولُ لاَ ؟

105-ci fəsil: Bir kəsə "Namaz qılmısan?"- deyildikdə, onun "Xeyr!"- deməsi

١٣٦٦ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالاَ : حَدَّثَنَا خَالِدٌ وَهُوَ ابْنُ الْحَارِثِ ، عَنْ هِشَامٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ عُمَرَ بْنَ الْخَطَّابِ ، يَوْمَ الْخَنْدَقِ بَعْدَ مَا غَرَبَتِ الشَّمْسُ جَعَلَ يَسُبُّ كُفَّارَ قُرَيْشٍ ، وَقَالَ : يَا رَسُولَ اللهِ ، مَا كِدْتُ أَنْ أُصَلِّيَ حَتَّى كَادَتِ الشَّمْسُ تَغْرُبُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَوَاللَّهِ مَا صَلَّيْتُهَا ، فَنَزَلْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى بُطْحَانَ فَتَوَضَّأَ لِلصَّلاَةِ وَتَوَضَّأْنَا لَهَا ، فَصَلَّى الْعَصْرَ بَعْدَ مَا غَرَبَتِ الشَّمْسُ ، ثُمَّ صَلَّى بَعْدَهَا الْمَغْرِبَ.

1366. ...Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Ömər ibn əl-Xattab Xəndək döyüşündə Əsr namazını qıla bilmədiyinə görə günəş batdıqdan sonra Qureyş kafirlərini söyməyə başladı. O dedi: "Ey Allahın Elçisi, mən günəş batana qədər namazımı qıla bilmədim". Allah Elçisi ﷺ dedi: "Allaha and olsun ki, mən də qıla bilməmişəm". Biz Buthan deyilən yerə gəldik və Allah Elçisi ﷺ dəstəmaz aldı. Biz də dəstəmaz aldıq və günəş batdıqdan sonra Əsr namazını qıldıq. Ondan sonra da Məğrib namazını qıldıq".

## ١٤ - كِتَابُ الْجُمُعَةِ

## 14. Cümə kitabı

### ١ - إِيجَابُ الْجُمُعَةِ

### 1-ci fəsil: Cümədə iştirak etmək

١٣٦٧ - أَخْبَرَنَا سَعِيدُ بْنُ عَبْدِ الرَّحْمَنِ الْمَخْزُومِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، وَابْنُ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : نَحْنُ الآخِرُونَ السَّابِقُونَ ، بَيْدَ أَنَّهُمْ أُوتُوا الْكِتَابَ مِنْ قَبْلِنَا ، وَأُوتِينَاهُ مِنْ بَعْدِهِمْ ، وَهَذَا الْيَوْمُ الَّذِي كَتَبَ اللَّهُ عَزَّ وَجَلَّ عَلَيْهِمْ فَاخْتَلَفُوا فِيهِ ، فَهَدَانَا اللَّهُ عَزَّ وَجَلَّ لَهُ - يَعْنِي يَوْمَ الْجُمُعَةِ - فَالنَّاسُ لَنَا فِيهِ تَبَعٌ الْيَهُودُ غَدًا وَالنَّصَارَى بَعْدَ غَدٍ.

1367. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: Allah Elçisi ﷺ belə buyurdu: "Biz axırıncı ümmətik, lakin Qiyamət günü öndə olacağıq. Hərçənd onlara bizdən əvvəl Kitab verilmişdir. Bu günü (Cümə gününü) Allah ﷻ onlara vacib etmişdi, lakin onlar ixtilafa düşdülər. Allah ﷻ bizi (bu günü ehtiramla keçirməyə) müvəffəq etdi və bu xüsusda insanlar bizim ardımızca gəldilər, yəhudilər sabahkı günü, xristianlar isə ondan sonrakı günü (təntənə ilə qeyd edirlər)".

١٣٦٨ - أَخْبَرَنَا وَاصِلُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا ابْنُ فُضَيْلٍ ، عَنْ أَبِي مَالِكٍ الأَشْجَعِيِّ ، عَنْ أَبِي حَازِمٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، وَعَنْ رِبْعِيِّ بْنِ حِرَاشٍ ، عَنْ حُذَيْفَةَ ، قَالاَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَضَلَّ اللَّهُ عَزَّ وَجَلَّ عَنِ الْجُمُعَةِ مَنْ كَانَ قَبْلَنَا ، فَكَانَ لِلْيَهُودِ يَوْمُ السَّبْتِ ، وَكَانَ لِلنَّصَارَى يَوْمُ الأَحَدِ ، فَجَاءَ اللَّهُ عَزَّ وَجَلَّ بِنَا فَهَدَانَا لِيَوْمِ الْجُمُعَةِ ، فَجَعَلَ الْجُمُعَةَ وَالسَّبْتَ وَالأَحَدَ ، وَكَذَلِكَ هُمْ لَنَا تَبَعٌ يَوْمَ الْقِيَامَةِ ، وَنَحْنُ الآخِرُونَ مِنْ أَهْلِ الدُّنْيَا ، وَالأَوَّلُونَ يَوْمَ الْقِيَامَةِ الْمَقْضِيُّ لَهُمْ قَبْلَ الْخَلاَئِقِ.

1368. ...Rəvayət edilir ki, Huzeyfə ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allah ﷻ bizdən öncə olanları Cümə günündən uzaq etdi. Yəhudilərin günü şənbə, xristianların günü isə bazar günü oldu. Bizi isə yaradıb Cümə gününə yönəltdi. Cümə, şənbə və bazar gününü təyin etdi. Onlar günlərdə bizdən sonra gəldikləri kimi Qiyamət günü də bizdən sonradırlar. Biz dünya əhlindən axırıncı olsaq da, Qiyamət günü yaradılmışlar arasında ilk hökm olunanlar olacağıq".

### ٢ - بَابُ التَّشْدِيدِ فِي التَّخَلُّفِ عَنِ الْجُمُعَةِ

### 2-ci fəsil: Cüməni tərk etməyin qınanması

١٣٦٩ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ عَبِيدَةَ بْنِ سُفْيَانَ الْحَضْرَمِيِّ ،

عَنْ أَبِي الْجَعْدِ الضَّمْرِيِّ ، وَكَانَتْ لَهُ صُحْبَةٌ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ تَرَكَ ثَلَاثَ جُمَعٍ تَهَاوُنًا بِهَا طَبَعَ اللَّهُ عَلَى قَلْبِهِ.

1369. ...Peyğəmbərlə ﷺ söhbət etmiş Əbul-Cəd əd-Damri ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Kim səhlənkarlıq edərək üç cüməni tərk edərsə, Allah onun qəlbini möhürləyər".

١٣٧٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْمَرٍ ، قَالَ : حَدَّثَنَا حَبَّانُ ، قَالَ : حَدَّثَنَا أَبَانُ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنِ الْحَضْرَمِيِّ بْنِ لَاحِقٍ ، عَنْ زَيْدٍ ، عَنْ أَبِي سَلَّامٍ ، عَنِ الْحَكَمِ بْنِ مِينَاءَ ، أَنَّهُ سَمِعَ ابْنَ عَبَّاسٍ ، وَابْنَ عُمَرَ يُحَدِّثَانِ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ وَهُوَ عَلَى أَعْوَادِ مِنْبَرِهِ : لَيَنْتَهِيَنَّ أَقْوَامٌ عَنْ وَدْعِهِمُ الْجُمُعَاتِ ، أَوْ لَيَخْتِمَنَّ اللَّهُ عَلَى قُلُوبِهِمْ ، وَلَيَكُونُنَّ مِنَ الْغَافِلِينَ.

1370. ...İbn Abbas və İbn Ömər ؓ rəvayət edirlər ki, Allah Elçisi ﷺ öz minbəri üzərində belə buyurdu: "İnsanlar ya Cüməyə gələcəklər, ya da Allah onların qəlblərinə möhür vuracaq və onlar qafillərdən olacaqlar".

١٣٧١ - أَخْبَرَنِي مَحْمُودُ بْنُ غَيْلَانَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ ، قَالَ : حَدَّثَنِي الْمُفَضَّلُ بْنُ فَضَالَةَ ، عَنْ عَيَّاشِ بْنِ عَبَّاسٍ ، عَنْ بُكَيْرِ بْنِ الْأَشَجِّ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، عَنْ حَفْصَةَ ، زَوْجِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : رَوَاحُ الْجُمُعَةِ وَاجِبٌ عَلَى كُلِّ مُحْتَلِمٍ.

1371. ...Rəvayət edilir ki, Peyğəmbərin ﷺ zövcəsi Həfsə ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Cüməyə gəlmək hər bir həddi-büluğa çatana vacibdir".

## ٣ - بَابُ كَفَّارَةِ مَنْ تَرَكَ الْجُمْعَةَ مِنْ غَيْرِ عُذْرٍ

## 3-cü fəsil: Üzr olmadan Cüməni tərk edənin kəffarəsi

١٣٧٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ هَارُونَ ، قَالَ : حَدَّثَنَا هَمَّامٌ ، عَنْ قَتَادَةَ ، عَنْ قُدَامَةَ بْنِ وَبَرَةَ ، عَنْ سَمُرَةَ بْنِ جُنْدُبٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ تَرَكَ الْجُمُعَةَ مِنْ غَيْرِ عُذْرٍ فَلْيَتَصَدَّقْ بِدِينَارٍ ، فَإِنْ لَمْ يَجِدْ فَبِنِصْفِ دِينَارٍ.

1372. ...Rəvayət edilir ki, Səmura ibn Cundəb ؓ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Cümə (namazını) üzr olmadan tərk edərsə, qoy bir dinar sədəqə versin. Bir dinar tapa bilməsə, qoy yarım dinar sədəqə versin".[1]

[1] Hədis zəifdir.

٤ - بَابُ ذِكْرِ فَضْلِ يَوْمِ الْجُمُعَةِ

## 4-cü fəsil: Cümə gününün fəziləti haqda

١٣٧٣ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ الأَعْرَجُ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَيْرُ يَوْمٍ طَلَعَتْ فِيهِ الشَّمْسُ يَوْمُ الْجُمُعَةِ ، فِيهِ خُلِقَ آدَمُ عَلَيْهِ السَّلاَمُ ، وَفِيهِ أُدْخِلَ الْجَنَّةَ ، وَفِيهِ أُخْرِجَ مِنْهَا.

1373. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Üzərinə Günəşin doğduğu ən xeyirli gün Cümə günüdür. O gün Adəm ﷺ yaradılmış, o gün Cənnətə daxil edilmiş və o gün də oradan çıxarılmışdır”.

٥ - إِكْثَارُ الصَّلاَةِ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ الْجُمُعَةِ

## 5-ci fəsil: Cümə günü Peyğəmbərə ﷺ salavat deməyi çoxaltmaq

١٣٧٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ الْجُعْفِيُّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ بْنِ جَابِرٍ ، عَنْ أَبِي الأَشْعَثِ الصَّنْعَانِيِّ ، عَنْ أَوْسِ بْنِ أَوْسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِنَّ مِنْ أَفْضَلِ أَيَّامِكُمْ يَوْمَ الْجُمُعَةِ ، فِيهِ خُلِقَ آدَمُ عَلَيْهِ السَّلاَمُ ، وَفِيهِ قُبِضَ ، وَفِيهِ النَّفْخَةُ ، وَفِيهِ الصَّعْقَةُ ، فَأَكْثِرُوا عَلَيَّ مِنَ الصَّلاَةِ ، فَإِنَّ صَلاَتَكُمْ مَعْرُوضَةٌ عَلَيَّ قَالُوا : يَا رَسُولَ اللهِ ، وَكَيْفَ تُعْرَضُ صَلاَتُنَا عَلَيْكَ ، وَقَدْ أَرَمْتَ أَيْ يَقُولُونَ قَدْ بَلِيتَ ؟ قَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ قَدْ حَرَّمَ عَلَى الأَرْضِ أَنْ تَأْكُلَ أَجْسَادَ الأَنْبِيَاءِ عَلَيْهِمُ السَّلاَمُ.

1374. ...Əus ibn Əus ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Sizin ən fəzilətli gününüz Cümə günüdür. O gün Adəm ﷺ yaradıldı, o gün vəfat etdi və o gün Sura birinci və ikinci dəfə üfürüləcək. O gün mənə salavatı çoxaldın, çünki sizin salavatınız mənə çatdırılır”. Səhabələr dedilər: “Ey Allahın Elçisi! Bizim salavatlarımız sənə neçə çatacaq, axı sənin bədənin çürüyəcək?!” O dedi: “Həqiqətən, Allah torpağa ﷻ peyğəmbərlərin ﷺ cəsədlərini yeməyi haram edib”.

٦ - بَابُ الأَمْرِ بِالسِّوَاكِ يَوْمَ الْجُمُعَةِ

## 6-cı fəsil: Cümə günü misvakdan istifadə etməyin əmr edilməsi

١٣٧٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، أَنَّ سَعِيدَ بْنَ أَبِي هِلاَلٍ ، وَبُكَيْرَ بْنَ الأَشَجِّ حَدَّثَاهُ ، عَنْ أَبِي بَكْرِ بْنِ الْمُنْكَدِرِ ، عَنْ عَمْرِو بْنِ سُلَيْمٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ

وَسَلَّمَ قَالَ : الْغُسْلُ يَوْمَ الْجُمُعَةِ وَاجِبٌ عَلَى كُلِّ مُحْتَلِمٍ ، وَالسِّوَاكُ ، وَيَمَسُّ مِنَ الطِّيبِ مَا قَدَرَ عَلَيْهِ ، إِلاَّ أَنَّ بُكَيْرًا لَمْ يَذْكُرْ عَبْدَ الرَّحْمَنِ ، وَقَالَ فِي الطِّيبِ : وَلَوْ مِنْ طِيبِ الْمَرْأَةِ.

1375. ...Abdur-Rahmən ibn Əbu Səid atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Cümə günü qüsl almaq, (dişlərini) misvakla təmizləmək və imkan daxilində ətirdən istifadə etmək hər bir həddi-büluğa çatana vacibdir". Hədisin ravisi Abdur-Rahmən Bukeyr adlı ravini yad etməmiş və ətir haqda demişdir: "Qadın ətiri olsa belə".

٧ - بَابُ الأَمْرِ بِالْغُسْلِ يَوْمَ الْجُمُعَةِ

## 7-ci fəsil: Cümə günü qüsl almağın əmr edilməsi

١٣٧٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِذَا جَاءَ أَحَدُكُمُ الْجُمُعَةَ فَلْيَغْتَسِلْ.

1376. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz Cüməyə gələndə, qüsl alsın!"

٨ - بَابُ إِيجَابِ الْغُسْلِ يَوْمَ الْجُمُعَةِ

## 8-ci fəsil: Cümə günü qüsl almağın vacib olması

١٣٧٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ صَفْوَانَ بْنِ سُلَيْمٍ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : غُسْلُ يَوْمِ الْجُمُعَةِ وَاجِبٌ عَلَى كُلِّ مُحْتَلِمٍ.

1377. ...Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Cümə günü qüsl almaq hər bir həddi-büluğa çatan şəxsə vacibdir".

١٣٧٨ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ ، قَالَ : حَدَّثَنَا دَاوُدُ بْنُ أَبِي هِنْدٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عَلَى كُلِّ رَجُلٍ مُسْلِمٍ فِي كُلِّ سَبْعَةِ أَيَّامٍ غُسْلُ يَوْمٍ وَهُوَ يَوْمُ الْجُمُعَةِ.

1378. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Hər bir müsəlman kişinin həftədə bir dəfə qüsl günü var, bu da Cümə günüdür".

٩ - بَابُ الرُّخْصَةِ فِي تَرْكِ الْغُسْلِ يَوْمَ الْجُمُعَةِ.

## 9-cu fəsil: Cümə qüslunu tərk etməyin icazəli olması

١٣٧٩ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ خَالِدٍ ، عَنِ الْوَلِيدِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ الْعَلاَءِ ، أَنَّهُ سَمِعَ الْقَاسِمَ بْنَ مُحَمَّدِ بْنِ أَبِي بَكْرٍ ، أَنَّهُمْ ذَكَرُوا غُسْلَ يَوْمِ الْجُمُعَةِ عِنْدَ عَائِشَةَ ، فَقَالَتْ : إِنَّمَا كَانَ النَّاسُ يَسْكُنُونَ الْعَالِيَةَ ، فَيَحْضُرُونَ الْجُمُعَةَ وَبِهِمْ وَسَخٌ ، فَإِذَا أَصَابَهُمُ الرَّوْحُ ، سَطَعَتْ أَرْوَاحُهُمْ فَيَتَأَذَّى بِهَا النَّاسُ ، فَذُكِرَ ذَلِكَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : أَوَ لاَ يَغْتَسِلُونَ.

1379. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Həqiqətən, bəzi insanlar kəndlərdə (hündür dağlıq yerlərdə) məskunlaşar və Cüməyə üst-başları çirkli halda gələrdilər. Külək əsdikdə onların üst-başlarından gələn pis qoxu insanlara əziyyət verərdi. Bu, Allah Elçisinə ﷺ deyildikə, belə buyurdu: “Məgər onlar yuyunmurlar?!”

١٣٨٠ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، عَنْ يَزِيدَ بْنِ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنِ الْحَسَنِ ، عَنْ سَمُرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ تَوَضَّأَ يَوْمَ الْجُمُعَةِ فَبِهَا وَنِعْمَتْ ، وَمَنِ اغْتَسَلَ فَالْغُسْلُ أَفْضَلُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : الْحَسَنُ ، عَنْ سَمُرَةَ كِتَابًا ، وَلَمْ يَسْمَعِ الْحَسَنُ مِنْ سَمُرَةَ إِلاَّ حَدِيثَ الْعَقِيقَةِ ، وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

1380. ...Rəvayət edilir ki, Səmura ﵁ demişdir: “Kim Cümə günü dəstəmaz alarsa, gözəl bir şey etmişdir. Kim də qüsl alarsa, daha fəzilətli bir şey etmişdir”.

١٠ - فَضْلُ غُسْلِ يَوْمِ الْجُمُعَةِ

## 10-cu fəsil: Cümə qüslunun fəziləti

١٣٨١ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، وَهَارُونُ بْنُ مُحَمَّدِ بْنِ بَكَّارِ بْنِ بِلاَلٍ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا أَبُو مُسْهِرٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَبْدِ الْعَزِيزِ ، عَنْ يَحْيَى بْنِ الْحَارِثِ ، عَنْ أَبِي الأَشْعَثِ الصَّنْعَانِيِّ ، عَنْ أَوْسِ بْنِ أَوْسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ غَسَّلَ وَاغْتَسَلَ ، وَغَدَا وَابْتَكَرَ ، وَدَنَا مِنَ الإِمَامِ وَلَمْ يَلْغُ كَانَ لَهُ بِكُلِّ خُطْوَةٍ عَمَلُ سَنَةٍ صِيَامُهَا وَقِيَامُهَا.

1381. ...Əus ibn Əus ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Kim yuyunaraq qüsl alar, (Cüməyə) tezdən gedər, imama yaxın oturar və heç bir boş işlə məşğul olmazsa, onun atdığı hər bir addıma görə ona bir ilin orucu və (gecə) namazı sayılar”.

١١ - الْهَيْئَةُ لِلْجُمُعَةِ

## 11-ci fəsil: Cüməyə hazırlaşmaq

١٣٨٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، أَنَّ عُمَرَ بْنَ الْخَطَّابِ رَأَى حُلَّةً ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، لَوِ اشْتَرَيْتَ هَذِهِ فَلَبِسْتَهَا يَوْمَ الْجُمُعَةِ وَلِلْوَفْدِ إِذَا قَدِمُوا عَلَيْكَ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا يَلْبَسُ هَذِهِ مَنْ لاَ خَلاَقَ لَهُ

فِي الآخِرَةِ ، ثُمَّ جَاءَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِثْلُهَا فَأَعْطَى عُمَرَ مِنْهَا حُلَّةً ، فَقَالَ عُمَرُ : يَا رَسُولَ اللهِ ، كَسَوْتَنِيهَا وَقَدْ قُلْتَ فِي حُلَّةِ عُطَارِدٍ مَا قُلْتَ ؟ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَمْ أَكْسُكَهَا لِتَلْبَسَهَا ، فَكَسَاهَا عُمَرُ أَخًا لَهُ مُشْرِكًا بِمَكَّةَ.

1382. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Ömər ibn əl-Xattab ipəkdən bir paltar görüb dedi: “Ey Allahın Elçisi, sən bunu alıb Cümə günü yanına gələn heyətlər üçün geyinə bilərsən”. Allah Elçisi ﷺ dedi: “Bu libası Axirətdə heç bir payı olmayan geyinər”. Sonra Allah Elçisinə ﷺ həmin paltardan gətirdilər. O da bu paltarı Ömərə verdi. Ömər dedi: “Ey Allahın Elçisi! Sən Utaridin gətirdiyi bu paltar haqda dediyinə baxmayaraq geyinmək üçün bunu mənə verirsən?” Allah Elçisi ﷺ buyurdu: “Mən bunu sənə geyinmək üçün vermirəm”. Ömər də bunu Məkkədə olan müşrik qardaşına bağışladı”.

١٣٨٣ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ سَوَّارٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي بَكْرِ بْنِ الْمُنْكَدِرِ ، أَنَّ عَمْرَو بْنَ سُلَيْمٍ أَخْبَرَهُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِيهِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ الْغُسْلَ يَوْمَ الْجُمُعَةِ عَلَى كُلِّ مُحْتَلِمٍ ، وَالسِّوَاكَ ، وَأَنْ يَمَسَّ مِنَ الطِّيبِ مَا يَقْدِرُ عَلَيْهِ.

1383. ...Abdur-Rahmən ibn Əbu Səid atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Cümə günü hər bir həddi-büluğa çatan şəxs qüsl almalı, (dişlərini) misvakla təmizləməli və imkan daxilində ətir vurmalıdır”.

## ١٢ - فَضْلُ الْمَشْيِ إِلَى الْجُمُعَةِ

## 12-ci fəsil: Məscidə piyada getməyin fəziləti

١٣٨٤ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ بْنِ جَابِرٍ ، أَنَّهُ سَمِعَ أَبَا الأَشْعَثِ حَدَّثَهُ ، أَنَّهُ سَمِعَ أَوْسَ بْنَ أَوْسٍ ، صَاحِبَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنِ اغْتَسَلَ يَوْمَ الْجُمُعَةِ وَغَسَلَ ، وَغَدَا وَابْتَكَرَ ، وَمَشَى وَلَمْ يَرْكَبْ ، وَدَنَا مِنَ الإِمَامِ ، وَأَنْصَتَ وَلَمْ يَلْغُ ، كَانَ لَهُ بِكُلِّ خُطْوَةٍ عَمَلُ سَنَةٍ.

1384. ...Allah Elçisinin ﷺ səhabəsi Əus ibn Əus ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim Cümə günü yuyunaraq qüsl alsa, məscidə tezdən və miniyə minmədən piyada getsə, imama yaxın oturub heç bir boş söz danışmasa, onun atdığı hər addıma görə bir ilin əməli yazılar”.

١٣ - بَابُ التَّبْكِيرِ إِلَى الْجُمُعَةِ

## 13-cü fəsil: Cüməyə tez getmək haqda

١٣٨٥ - أَخْبَرَنَا نَصْرُ بْنُ عَلِيِّ بْنِ نَصْرٍ ، عَنْ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنِ الأَغَرِّ أَبِي عَبْدِ اللهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا كَانَ يَوْمُ الْجُمُعَةِ قَعَدَتِ الْمَلاَئِكَةُ عَلَى أَبْوَابِ الْمَسْجِدِ ، فَكَتَبُوا مَنْ جَاءَ إِلَى الْجُمُعَةِ ، فَإِذَا خَرَجَ الإِمَامُ طَوَتِ الْمَلاَئِكَةُ الصُّحُفَ قَالَ : فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْمُهَجِّرُ إِلَى الْجُمُعَةِ كَالْمُهْدِي بَدَنَةً ، ثُمَّ كَالْمُهْدِي بَقَرَةً ، ثُمَّ كَالْمُهْدِي شَاةً ، ثُمَّ كَالْمُهْدِي بَطَّةً ، ثُمَّ كَالْمُهْدِي دَجَاجَةً ، ثُمَّ كَالْمُهْدِي بَيْضَةً.

1385. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Cümə günü olduqda məscidin qapılarında mələklər durar və məscidə gələnləri yazarlar. İmam (xütbə vermək üçün) gəldikdə, mələklər səhifələrini bağlayarlar”. Allah Elçisi ﷺ davam edərək belə dedi: “Cüməyə tez gələn kök bir dəvə, sonra gələn inək, sonra gələn qoyun, sonra gələn ördək, sonra gələn toyuq, sonra da gələn yumurta qurban etmiş kimi sayılar”.

١٣٨٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، حَدَّثَنَا الزُّهْرِيُّ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، يَبْلُغُ بِهِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا كَانَ يَوْمُ الْجُمُعَةِ كَانَ عَلَى كُلِّ بَابٍ مِنْ أَبْوَابِ الْمَسْجِدِ مَلاَئِكَةٌ يَكْتُبُونَ النَّاسَ عَلَى مَنَازِلِهِمْ ، الأَوَّلَ فَالأَوَّلَ ، فَإِذَا خَرَجَ الإِمَامُ طُوِيَتِ الصُّحُفُ ، وَاسْتَمَعُوا الْخُطْبَةَ ، فَالْمُهَجِّرُ إِلَى الصَّلاَةِ كَالْمُهْدِي بَدَنَةً ، ثُمَّ الَّذِي يَلِيهِ كَالْمُهْدِي بَقَرَةً ، ثُمَّ الَّذِي يَلِيهِ كَالْمُهْدِي كَبْشًا ، حَتَّى ذَكَرَ الدَّجَاجَةَ وَالْبَيْضَةَ.

1386. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Cümə günü məscidin hər qapısında mələklər dayanar və insanların dərəcələrinə (gəliş sırasına) görə yazarlar. İmam (xütbə vermək üçün) gəldikdə, mələklər səhifələrini bağlayar və xütbəyə qulaq asarlar. Cüməyə tez gələn kök bir dəvə, ondan sonra gələn inək, ondan sonra gələn qoç qurban etmiş kimi olar”. Sonra toyuq və yumurtanı da dedi”.

١٣٨٧ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ اللَّيْثِ ، قَالَ : أَنْبَأَنَا اللَّيْثُ ، عَنِ ابْنِ عَجْلاَنَ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : تَقْعُدُ الْمَلاَئِكَةُ يَوْمَ الْجُمُعَةِ عَلَى أَبْوَابِ الْمَسْجِدِ يَكْتُبُونَ النَّاسَ عَلَى مَنَازِلِهِمْ ، فَالنَّاسُ فِيهِ كَرَجُلٍ قَدَّمَ بَدَنَةً ، وَكَرَجُلٍ قَدَّمَ بَقَرَةً ، وَكَرَجُلٍ قَدَّمَ شَاةً ، وَكَرَجُلٍ قَدَّمَ دَجَاجَةً ، وَكَرَجُلٍ قَدَّمَ عُصْفُورًا ، وَكَرَجُلٍ قَدَّمَ بَيْضَةً.

1387. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Cümə günü məscidin qapılarında mələklər dayanar və insanları dərə-

cələrinə (gəliş sırasına) görə yazarlar. İnsanlar da dərəcələrinə görə belədir; biri dəvə, biri inək, biri qoyun, biri toyuq, biri sərçə, biri də yumurta (sədəqə) vermiş kimidir".[1]

## ١٤ - وَقْتُ الْجُمُعَةِ

## 14-cü fəsil: Cümənin vaxtı

١٣٨٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ سُمَيٍّ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنِ اغْتَسَلَ يَوْمَ الْجُمُعَةِ غُسْلَ الْجَنَابَةِ ، ثُمَّ رَاحَ فَكَأَنَّمَا قَرَّبَ بَدَنَةً ، وَمَنْ رَاحَ فِي السَّاعَةِ الثَّانِيَةِ فَكَأَنَّمَا قَرَّبَ بَقَرَةً ، وَمَنْ رَاحَ فِي السَّاعَةِ الثَّالِثَةِ فَكَأَنَّمَا قَرَّبَ كَبْشًا ، وَمَنْ رَاحَ فِي السَّاعَةِ الرَّابِعَةِ فَكَأَنَّمَا قَرَّبَ دَجَاجَةً ، وَمَنْ رَاحَ فِي السَّاعَةِ الْخَامِسَةِ فَكَأَنَّمَا قَرَّبَ بَيْضَةً ، فَإِذَا خَرَجَ الإِمَامُ حَضَرَتِ الْمَلاَئِكَةُ يَسْتَمِعُونَ الذِّكْرَ.

1388. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Cümə günü cənabət qüslu alsa, sonra məscidə getsə, sanki dəvə qurban etmiş kimi olar. Kim ikinci saatda getsə, sanki inək qurban etmiş kimi olar. Kim üçüncü saatda getsə, sanki qoç qurban etmiş kimi olar. Kim dördüncü saatda getsə, sanki bir toyuq qurban etmiş kimi olar. Kim beşinci saatda getsə, sanki yumurta qurban etmiş kimi olar. İmam (xütbə vermək üçün) gəldikdə isə mələklər xütbəyə qulaq asarlar".

١٣٨٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنِ الْجُلاَحِ ، مَوْلَى عَبْدِ الْعَزِيزِ ، أَنَّ أَبَا سَلَمَةَ بْنَ عَبْدِ الرَّحْمَنِ حَدَّثَهُ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يَوْمُ الْجُمُعَةِ اثْنَتَا عَشْرَةَ سَاعَةً ، لاَ يُوجَدُ فِيهَا عَبْدٌ مُسْلِمٌ يَسْأَلُ اللَّهَ شَيْئًا إِلاَّ آتَاهُ إِيَّاهُ ، فَالْتَمِسُوهَا آخِرَ سَاعَةٍ بَعْدَ الْعَصْرِ.

1389. ...Cabir ibn Abdullah رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Cümə günü on iki saatdır. Bu saatların birində müsəlman bəndəyə Allahdan istədiyi verilir. Bu saatı Əsr namazından sonra axtarın".

١٣٩٠ - أَخْبَرَنِي هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا حَسَنُ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : كُنَّا نُصَلِّي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْجُمُعَةَ ، ثُمَّ نَرْجِعُ فَنُرِيحُ نَوَاضِحَنَا ، قُلْتُ : أَيَّةَ سَاعَةٍ ؟ قَالَ : زَوَالُ الشَّمْسِ.

[1] "Biri sərçə" hissəsi səhih deyil.

1390. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə Cümə namazını qılar, sonra qayıdıb heyvanlarımızı rahatlayardıq”. Hədisin ravisi deyir: “Mən: “Hansı saatda?”- dedikidə, o: “Günəş zenitdə olarkən”- dedi”.

١٣٩١ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ يَعْلَى بْنِ الْحَارِثِ ، قَالَ : سَمِعْتُ إِيَاسَ بْنَ سَلَمَةَ بْنِ الأَكْوَعِ يُحَدِّثُ ، عَنْ أَبِيهِ ، قَالَ : كُنَّا نُصَلِّي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْجُمُعَةَ ثُمَّ نَرْجِعُ وَلَيْسَ لِلْحِيطَانِ فَيْءٌ يُسْتَظَلُّ بِهِ.

1391. ...İyas ibn Sələmə ibn əl-Əkva atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə Cümə namazını qılar, sonra qayıdardıq. (Bu zaman) kölgələnmək üçün divarın heç bir kölgəsi olmazdı”.

## ١٥ - بَابُ الأَذَانِ لِلْجُمُعَةِ

## 15-ci fəsil: Cümə namazının iki azanı

١٣٩٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي السَّائِبُ بْنُ يَزِيدَ ، أَنَّ الأَذَانَ كَانَ أَوَّلُ حِينَ يَجْلِسُ الإِمَامُ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ فِي عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَبِي بَكْرٍ ، وَعُمَرَ ، فَلَمَّا كَانَ فِي خِلاَفَةِ عُثْمَانَ ، وَكَثُرَ النَّاسُ أَمَرَ عُثْمَانُ يَوْمَ الْجُمُعَةِ بِالأَذَانِ الثَّالِثِ ، فَأُذِّنَ بِهِ عَلَى الزَّوْرَاءِ ، فَثَبَتَ الأَمْرُ عَلَى ذَلِكَ.

1392. ...əs-Səib ibn Yəzid ﵁ rəvayət edir ki, Allah Elçisinin ﷺ, Əbu Bəkrin və Ömərin vaxtında Cümə günü azan imam minbərdə oturduqda olurdu. Osmanın xilafəti dövründə insanlar çoxaldığı üçün Osman iki azanın verilməsini əmr etdi. Bu azan “Zəvra” adlı bazarda verilirdi. Beləliklə, bu, qayda halına keçdi”.

١٣٩٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنْ ابْنِ شِهَابٍ ، أَنَّ السَّائِبَ بْنَ يَزِيدَ أَخْبَرَهُ قَالَ : إِنَّمَا أَمَرَ بِالتَّأْذِينِ الثَّالِثِ عُثْمَانُ حِينَ كَثُرَ أَهْلُ الْمَدِينَةِ وَلَمْ يَكُنْ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ غَيْرُ مُؤَذِّنٍ وَاحِدٍ ، وَكَانَ التَّأْذِينُ يَوْمَ الْجُمُعَةِ حِينَ يَجْلِسُ الإِمَامُ.

1393. ...Rəvayət edilir ki, əs-Səib ibn Yəzid ﵁ demişdir: “Mədinə əhalisi çoxaldıqda, Osman üçüncü dəfə azan deyilməsini əmr etdi. Allah Elçisinin ﷺ vaxtında bir müəzzin var idi və azan Cümə günü imam minbərdə oturduqda oxunurdu”.

١٣٩٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، عَنْ أَبِيهِ ، عَنِ الزُّهْرِيِّ ، عَنِ السَّائِبِ بْنِ يَزِيدَ ، قَالَ : كَانَ بِلاَلٌ يُؤَذِّنُ إِذَا جَلَسَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ ، فَإِذَا نَزَلَ أَقَامَ ، ثُمَّ كَانَ كَذَلِكَ فِي زَمَنِ أَبِي بَكْرٍ وَعُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا.

1394. ...Rəvayət edilir ki, əs-Səib ibn Yəzid ﷺ demişdir: “Allah Elçisi ﷺ Cümə günü minbərdə oturduqda Bilal azan verərdi. Minbərdən endikdə isə iqaməni verərdi. Bu, Əbu Bəkr və Ömərin vaxtında da belə idi”.

١٦ - بَابُ الصَّلاَةِ يَوْمَ الْجُمُعَةِ لِمَنْ جَاءَ وَقَدْ خَرَجَ الإِمَامُ

## 16-cı fəsil: Cümə günü imam camaat arasına çıxdıqdan sonra gələn adamın namaz qılması

١٣٩٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، قَالَ : سَمِعْتُ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، يَقُولُ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِذَا جَاءَ أَحَدُكُمْ وَقَدْ خَرَجَ الإِمَامُ فَلْيُصَلِّ رَكْعَتَيْنِ ، قَالَ شُعْبَةُ : يَوْمَ الْجُمُعَةِ.

1395. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Biriniz Cüməyə gəldikdə, imamın camaat arasına çıxdığını görsə belə, iki rükət namaz qılsın”.

١٧ - مَقَامُ الإِمَامِ فِي الْخُطْبَةِ

## 17-ci fəsil: Xütbə dedidkdə imamın yeri

١٣٩٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، أَنَّ أَبَا الزُّبَيْرِ أَخْبَرَهُ ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا خَطَبَ يَسْتَنِدُ إِلَى جِذْعِ نَخْلَةٍ مِنْ سَوَارِي الْمَسْجِدِ ، فَلَمَّا صُنِعَ الْمِنْبَرُ وَاسْتَوَى عَلَيْهِ ، اضْطَرَبَتْ تِلْكَ السَّارِيَةُ كَحَنِينِ النَّاقَةِ حَتَّى سَمِعَهَا أَهْلُ الْمَسْجِدِ ، حَتَّى نَزَلَ إِلَيْهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَاعْتَنَقَهَا فَسَكَتَتْ.

1396. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: “Allah Elçisi ﷺ xütbə verdikdə, məsciddə olan xurma kötüklərindən birinə söykənərdi. Minbər düzəldikdə xütbəni minbərdə verməyə başladı. Kötük məscid əhlinin eşidəcəyi bir tərzdə dəvə balasının iniltisi kimi bir səs çıxarmağa başladı. Allah Elçisi ﷺ də minbərdən enib onu qucaqladı və o da sakitləşdi”.

١٨ - قِيَامُ الإِمَامِ فِي الْخُطْبَةِ

## 18-ci fəsil: Xütbə dedikdə, imamın ayaq üstə dayanması

١٣٩٧ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَكَمِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ أَبِي عُبَيْدَةَ ، عَنْ كَعْبِ بْنِ عُجْرَةَ ، قَالَ : دَخَلَ الْمَسْجِدَ وَعَبْدُ الرَّحْمَنِ ابْنُ أُمِّ الْحَكَمِ يَخْطُبُ قَاعِدًا ، فَقَالَ : انْظُرُوا إِلَى هَذَا يَخْطُبُ قَاعِدًا ، وَقَدْ قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : **{وَإِذَا رَأَوْا تِجَارَةً أَوْ لَهْوًا انْفَضُّوا إِلَيْهَا وَتَرَكُوكَ قَائِمًا}**.

1397. ...Rəvayət edilir ki, Kəb ibn Ucra ﵁ demişdir: “O, məscidə daxil olduqda, Abdur-Rahmən ibn Ummul-Həkəm xütbəni oturaraq verirdi. O dedi: ”Buna baxın! O, oturaraq xütbə verir. Halbuki Allah ﷻ belə buyurur: **“Onlar ticarət və ya əyləncə gördükləri zaman dağılışıb ona tərəf qaçdılar və səni minbərdə ayaq üstə olduğun halda tərk etdilər”** (əl-Cumuə, 11)”.

١٩ - بَابُ الْفَضْلِ فِي الدُّنُوِّ مِنَ الإِمَامِ

## 19-cu fəsil: İmama yaxın durmağın fəziləti

١٣٩٨ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنِي عُمَرُ بْنُ عَبْدِ الْوَاحِدِ ، قَالَ : سَمِعْتُ يَحْيَى بْنَ الْحَارِثِ يُحَدِّثُ ، عَنْ أَبِي الأَشْعَثِ الصَّنْعَانِيِّ ، عَنْ أَوْسِ بْنِ أَوْسٍ الثَّقَفِيِّ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ غَسَّلَ وَاغْتَسَلَ ، وَابْتَكَرَ وَغَدَا ، وَدَنَا مِنَ الإِمَامِ وَأَنْصَتَ ، ثُمَّ لَمْ يَلْغُ ، كَانَ لَهُ بِكُلِّ خُطْوَةٍ كَأَجْرِ سَنَةٍ صِيَامِهَا وَقِيَامِهَا.

1398. ...Əus ibn Əus əs-Səqafi ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kim yuyunaraq qüsl alar, (Cüməyə) tezdən gedər, imama yaxın oturar və heç bir boş işlə məşğul olmazsa, onun atdığı hər bir addıma bir ilin orucunun və (gecə) namazının savabı yazılar”.

٢٠ - النَّهْيُ عَنْ تَخَطِّي رِقَابِ النَّاسِ وَالإِمَامُ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ

## 20-ci fəsil: Cümə günü imam minbərdə olarkən insanların çiyinlərinin arasında keçməyin qadağan olunması

١٣٩٩ - أَخْبَرَنَا وَهْبُ بْنُ بَيَانٍ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : سَمِعْتُ مُعَاوِيَةَ بْنَ صَالِحٍ ، عَنْ أَبِي الزَّاهِرِيَّةِ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُسْرٍ ، قَالَ : كُنْتُ جَالِسًا إِلَى جَانِبِهِ يَوْمَ الْجُمُعَةِ ، فَقَالَ : جَاءَ رَجُلٌ يَتَخَطَّى رِقَابَ النَّاسِ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَيِ اجْلِسْ فَقَدْ آذَيْتَ.

1399. ...Rəvayət edilir ki, Abdullah ibn Busr ﵁ demişdir: “Mən Cümə günü Allah Elçisinin ﷺ yanında oturmuşdum. O dedi: “Bir kişi insanların

arasından keçərək gəldi və Allah Elçisi ﷺ ona dedi: "Otur! Həqiqətən, sən insanlara əziyyət verdin".

٢١ - بَابُ الصَّلاَةِ يَوْمَ الْجُمُعَةِ لِمَنْ جَاءَ وَالإِمَامُ يَخْطُبُ

## 21-ci fəsil: Cümə günü imam xütbə verərkən gələn adamın namaz qılması

١٤٠٠ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، وَيُوسُفُ بْنُ سَعِيدٍ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ دِينَارٍ ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، يَقُولُ : جَاءَ رَجُلٌ وَالنَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ فَقَالَ لَهُ : أَرَكَعْتَ رَكْعَتَيْنِ ؟ ، قَالَ : لاَ ، قَالَ : فَارْكَعْ.

1400. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Cümə günü Peyğəmbər ﷺ minbərdə olanda, bir kişi gəldi və Peyğəmbər ﷺ ona dedi: "Sən iki rükət namaz qılmısan?" O: "Xeyr"- dedi. Peyğəmbər ﷺ dedi: "O iki rükəti qıl!"

٢٢ - بَابُ الإِنْصَاتِ لِلْخُطْبَةِ يَوْمَ الْجُمُعَةِ

## 22-ci fəsil: Cümə günü xütbə vaxtı susmaq

١٤٠١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ قَالَ لِصَاحِبِهِ يَوْمَ الْجُمُعَةِ وَالإِمَامُ يَخْطُبُ : أَنْصِتْ ، فَقَدْ لَغَا.

1401. ...Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim Cümə günü imam xütbə deyərkən dostuna "Sus!" desə, artıq boş şey danışmış sayılar".

١٤٠٢ - أَخْبَرَنَا عَبْدُ الْمَلِكِ بْنُ شُعَيْبِ بْنِ اللَّيْثِ بْنِ سَعْدٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ جَدِّي ، قَالَ : حَدَّثَنِي عُقَيْلٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُمَرَ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ عَبْدِ اللهِ بْنِ إِبْرَاهِيمَ بْنِ قَارِظٍ ، وَعَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ أَنَّهُمَا حَدَّثَاهُ ، أَنَّ أَبَا هُرَيْرَةَ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا قُلْتَ لِصَاحِبِكَ أَنْصِتْ يَوْمَ الْجُمُعَةِ وَالإِمَامُ يَخْطُبُ فَقَدْ لَغَوْتَ.

1402. ...Rəvayət edilir ki, Əbu Hureyra رضي الله عنه demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: "Cümə günü imam xütbə verərkən dostuna "Sus!" deməyin artıq boş bir şey etməkdir".

٢٣ - بَابُ فَضْلِ الإِنْصَاتِ وَتَرْكِ اللَّغْوِ يَوْمَ الْجُمُعَةِ

## 23-cü fəsil: Cümə günü susmağın və boş sözləri tərk etməyin fəziləti

١٤٠٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي مَعْشَرٍ زِيَادِ بْنِ كُلَيْبٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنِ الْقَرْثَعِ الضَّبِّيِّ ، وَكَانَ مِنَ الْقُرَّاءِ الأَوَّلِينَ ، عَنْ سَلْمَانَ ، قَالَ : قَالَ لِي رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مِنْ رَجُلٍ يَتَطَهَّرُ يَوْمَ الْجُمُعَةِ كَمَا أُمِرَ ، ثُمَّ يَخْرُجُ مِنْ بَيْتِهِ حَتَّى يَأْتِيَ الْجُمُعَةَ وَيُنْصِتُ حَتَّى يَقْضِيَ صَلاَتَهُ إِلاَّ كَانَ كَفَّارَةً لِمَا قَبْلَهُ مِنَ الْجُمُعَةِ.

1403. ...Rəvayət edilir ki, Salman ﵁ demişdir: “Allah Elçisi ﷺ mənə dedi: “Kişi Cümə günü əmr olunduğu kimi təmizlənsə, sonra öz evindən çıxıb Cümə namazına gəlsə və namaz bitənə qədər sussa, bu onun üçün ondan əvvəlki cümə ilə bu cümə arasında edilənlərə kəffarə olar”.

٢٤ - بَابُ كَيْفِيَّةِ الْخُطْبَةِ

## 24-cü fəsil: Xütbənin oxunuş qaydası

١٤٠٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالاَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ أَبَا إِسْحَاقَ يُحَدِّثُ ، عَنْ أَبِي عُبَيْدَةَ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : عَلَّمَنَا خُطْبَةَ الْحَاجَةِ : الْحَمْدُ لِلَّهِ نَسْتَعِينُهُ وَنَسْتَغْفِرُهُ ، وَنَعُوذُ بِاللَّهِ مِنْ شُرُورِ أَنْفُسِنَا ، وَسَيِّئَاتِ أَعْمَالِنَا ، مَنْ يَهْدِهِ اللَّهُ فَلاَ مُضِلَّ لَهُ ، وَمَنْ يُضْلِلْ فَلاَ هَادِيَ لَهُ ، وَأَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ، ثُمَّ يَقْرَأُ ثَلاَثَ آيَاتٍ : **{يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ حَقَّ تُقَاتِهِ وَلاَ تَمُوتُنَّ إِلاَّ وَأَنْتُمْ مُسْلِمُونَ}** ، **{يَا أَيُّهَا النَّاسُ اتَّقُوا رَبَّكُمُ الَّذِي خَلَقَكُمْ مِنْ نَفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالاً كَثِيرًا وَنِسَاءً وَاتَّقُوا اللَّهَ الَّذِي تَسَاءَلُونَ بِهِ وَالأَرْحَامَ إِنَّ اللَّهَ كَانَ عَلَيْكُمْ رَقِيبًا}** ، **{يَا أَيُّهَا الَّذِينَ آمَنُوا اتَّقُوا اللَّهَ وَقُولُوا قَوْلاً سَدِيدًا}**. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : أَبُو عُبَيْدَةَ لَمْ يَسْمَعْ مِنْ أَبِيهِ شَيْئًا ، وَلاَ عَبْدُ الرَّحْمَنِ بْنُ عَبْدِ اللهِ بْنِ مَسْعُودٍ ، وَلاَ عَبْدُ الْجَبَّارِ بْنُ وَائِلِ بْنِ حُجْرٍ.

1404. ...Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ bizə “Xutbətul-Hacə”ni öyrədərək belə buyurdu: “Allaha həmd olsun! Ondan yardım istəyirik, Ondan bağışlanma diləyirik. Nəfslərimizin şərindən və pis əməllərimizdən Ona sığınırıq. Allahın doğru yola yönəltdiyi şəxsi heç kəs azdıra bilməz və azdırdığı şəxsi də heç kim doğru yola yönəldə bilməz. Mən şəhadət edirəm ki, Allahdan başqa ibadətə layiq məbud yoxdur və şəhadət edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!” Sonra üç ayə oxudu: **“Ey iman gətirənlər! Allahdan Ona layiq olan tərzdə qorxun və ancaq müsəlman olduğunuz halda ölün!”** (Ali-İmran, 102); **“Ey insanlar! Sizi tək bir candan xəlq edən, onun özündən zövcəsini yaradan və onlardan da bir çox kişi və qadın törədib yer üzünə yayan Rəbbinizdən qorxun! Adı ilə bir-birinizdən cürbəcür şeylər istədiyiniz Allahdan və qohumluq**

**əlaqələrini kəsməkdən çəkinin! Həqiqətən, Allah sizə nəzarət edir"** (ən-Nisə, 1); **"Ey iman gətirənlər! Allahdan qorxun və doğru söz danışın"** (əl-Əhzab, 70)".

٢٥ - بَابُ حَضِّ الإِمَامِ فِي خُطْبَتِهِ عَلَى الْغُسْلِ يَوْمَ الْجُمُعَةِ

25-ci fəsil: Xütbə deyərkən imamın qüsl almağa təşviq etməsi

١٤٠٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنِ الْحَكَمِ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، قَالَ : خَطَبَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِذَا رَاحَ أَحَدُكُمْ إِلَى الْجُمُعَةِ فَلْيَغْتَسِلْ.

1405. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Allah Elçisi ﷺ xütbə deyərkən belə buyurdu: "Sizdən biriniz Cümə namazına gəldikdə qüsl alsın!"

١٤٠٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ نَشِيطٍ ، أَنَّهُ سَأَلَ ابْنَ شِهَابٍ ، عَنِ الْغُسْلِ يَوْمَ الْجُمُعَةِ ، فَقَالَ : سُنَّةٌ ، وَقَدْ حَدَّثَنِي بِهِ سَالِمُ بْنُ عَبْدِ اللهِ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَكَلَّمَ بِهَا عَلَى الْمِنْبَرِ.

1406. ...Rəvayət edilir ki, İbrahim ibn Nəşit ﵀ Səlim ibn Şihabdan Cümə qüslu haqda soruşduqda, o dedi: "Bu, sünnədir. Artıq Səlim ibn Abdullah atasından bu haqda Allah Elçisinin ﷺ minbərdə danışdığını rəvayət etmişdir".

١٤٠٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ قَالَ وَهُوَ قَائِمٌ عَلَى الْمِنْبَرِ : مَنْ جَاءَ مِنْكُمُ الْجُمُعَةَ فَلْيَغْتَسِلْ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مَا أَعْلَمُ أَحَدًا تَابَعَ اللَّيْثَ عَلَى هَذَا الإِسْنَادِ غَيْرَ ابْنِ جُرَيْجٍ ، وَأَصْحَابُ الزُّهْرِيِّ يَقُولُونَ : عَنْ سَالِمِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِيهِ ، بَدَلَ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُمَرَ.

1407. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ minbərdə durarkən belə dedi: "Sizdən biriniz Cümə namazına gəldikdə qüsl alsın!"

٢٦ - بَابُ حَثِّ الإِمَامِ عَلَى الصَّدَقَةِ يَوْمَ الْجُمُعَةِ فِي خُطْبَتِهِ

26-cı fəsil: İmamın Cümə günü xütbə verərkən insanları sədəqəyə təşviq etməsi

١٤٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ ابْنِ عَجْلَانَ ، عَنْ عِيَاضِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : سَمِعْتُ أَبَا سَعِيدٍ الْخُدْرِيَّ ، يَقُولُ : جَاءَ رَجُلٌ يَوْمَ الْجُمُعَةِ وَالنَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ بِهَيْئَةٍ بَذَّةٍ ، فَقَالَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ

وَسَلَّمَ : أَصَلَّيْتَ ؟ قَالَ : لاَ ، قَالَ : صَلِّ رَكْعَتَيْنِ ، وَحَثَّ النَّاسَ عَلَى الصَّدَقَةِ ، فَأَلْقَوْا ثِيَابًا فَأَعْطَاهُ مِنْهَا ثَوْبَيْنِ ، فَلَمَّا كَانَتِ الْجُمُعَةُ الثَّانِيَةُ جَاءَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ ، فَحَثَّ النَّاسَ عَلَى الصَّدَقَةِ ، قَالَ : فَأَلْقَى أَحَدَ ثَوْبَيْهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : جَاءَ هَذَا يَوْمَ الْجُمُعَةِ بِهَيْئَةٍ بَذَّةٍ ، فَأَمَرْتُ النَّاسَ بِالصَّدَقَةِ ، فَأَلْقَوْا ثِيَابًا ، فَأَمَرْتُ لَهُ مِنْهَا بِثَوْبَيْنِ ، ثُمَّ جَاءَ الآنَ فَأَمَرْتُ النَّاسَ بِالصَّدَقَةِ ، فَأَلْقَى أَحَدَهُمَا ، فَانْتَهَرَهُ وَقَالَ : خُذْ ثَوْبَكَ.

1408. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﷺ demişdir: "Peyğəmbər ﷺ Cümə günü xütbə verərkən bir kişi kasıb bir paltarda gəldi və Allah Elçisi ﷺ ona dedi: "Namaz qılmısanmı?" O: "Xeyr"- dedi: Allah Elçisi ﷺ dedi: "İki rükət namaz qıl!" Sonra insanları sədəqə verməyə təşviq etdi. İnsanlar paltar sədəqə verdilər. Allah Elçisi ﷺ həmin paltarlardan ikisini o kişiyə verdi. Növbəti Cümə günü Allah Elçisi ﷺ xütbə verərkən (yenə o kişi) gəldi və Allah Elçisi ﷺ camaatı yenə sədəqə verməyə təşviq etdi. Həmin kişi ona verilən paltarlardan birini sədəqə üçün qoydu. Allah Elçisi ﷺ dedi: "Keçən Cümə o kişi köhnə paltarla gəlmişdi və mən insanları sədəqəyə təşviq etmişdim. İnsanlar da paltarlarından sədəqə etmişdilər. Mən də o paltarlardan ikisini bu kişiyə verilməsini əmr etmişdim. Bu gün də o gəldi və insanları sədəqə verməyə təşviq etdim. O, keçən həftə ona verilən paltarlardan birini sədəqə verdi". Allah Elçisi ﷺ onu qınayaraq: "Paltarını götür!"- dedi".

٢٧ - مُخَاطَبَةُ الإِمَامِ رَعِيَّتَهُ وَهُوَ عَلَى الْمِنْبَرِ

## 27-ci fəsil: Minbərdə olarkən imamın camaata söz deməsi

١٤٠٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : بَيْنَا النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ يَوْمَ الْجُمُعَةِ إِذْ جَاءَ رَجُلٌ ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صَلَّيْتَ ؟ قَالَ : لاَ ، قَالَ : قُمْ فَارْكَعْ.

1409. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: "Peyğəmbər ﷺ Cümə günü xütbə verərkən bir kişi gəldi. Peyğəmbər ﷺ ona: "Namaz qıldınmı?"- dedi. O: "Xeyr"- dedikdə, Peyğəmbər: "Dur namaz qıl!"- dedi".

١٤١٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَبُو مُوسَى إِسْرَائِيلُ بْنُ مُوسَى ، قَالَ : سَمِعْتُ الْحَسَنَ ، يَقُولُ : سَمِعْتُ أَبَا بَكْرَةَ ، يَقُولُ : لَقَدْ رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمِنْبَرِ وَالْحَسَنُ مَعَهُ وَهُوَ يُقْبِلُ عَلَى النَّاسِ مَرَّةً وَعَلَيْهِ مَرَّةً ، وَيَقُولُ : إِنَّ ابْنِي هَذَا سَيِّدٌ ، وَلَعَلَّ اللَّهَ أَنْ يُصْلِحَ بِهِ بَيْنَ فِئَتَيْنِ مِنَ الْمُسْلِمِينَ عَظِيمَتَيْنِ.

1410. ...Rəvayət edilir ki, Əbu Bəkra ﷺ demişdir: “Mən Peyğəmbərin ﷺ minbərdə dayandığını və Həsənin də onun yanında olduğunu gördüm. O, bir dəfə insanlara, bir dəfə də Həsənə çevrilərək diqqət edirdi. Sonra belə buyurdu: “Həqiqətən, bu oğlum seyyiddir (hörmətlidir). Ola bilsin ki, Allah onun vasitəsilə iki böyük müsəlman toplumun arasını düzəltsin”.

٢٨ - بَاب الْقِرَاءَةِ فِي الْخُطْبَةِ

## 28-ci fəsil: Xütbədə Quran oxumaq

١٤١١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا هَارُونُ بْنُ إِسْمَعِيلَ ، قَالَ : حَدَّثَنَا عَلِيٌّ وَهُوَ ابْنُ الْمُبَارَكِ ، عَنْ يَحْيَى ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ ابْنَةِ حَارِثَةَ بْنِ النُّعْمَانِ ، قَالَتْ : حَفِظْتُ ق وَالْقُرْآنِ الْمَجِيدِ مِنْ فِي رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ.

1411. ...Rəvayət edilir ki, Haris ibn ən-Numanın qızı ﷺ demişdir: “Mən Cümə günü Allah Elçisinin ﷺ ağzından **“Qaf. Şərəfli Qurana and olsun!”** (Qaf surəsini) əzbərləmişəm”.

٢٩ - بَابُ الإِشَارَةِ فِي الْخُطْبَةِ

## 29-cu fəsil: Xütbədə işarə etmək

١٤١٢ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ حُصَيْنٍ ، أَنَّ بِشْرَ بْنَ مَرْوَانَ ، رَفَعَ يَدَيْهِ يَوْمَ الْجُمُعَةِ عَلَى الْمِنْبَرِ ، فَسَبَّهُ عُمَارَةُ بْنُ رُوَيْبَةَ الثَّقَفِيُّ ، وَقَالَ : مَا زَادَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى هَذَا ، وَأَشَارَ بِإِصْبَعِهِ السَّبَّابَةِ.

1412. ...Husayn ﷺ rəvayət edir ki, Bişr ibn Mərvan Cümə günü minbərdə olarkən əllərini qaldırdı. Umarə ibn Ruveybə əs-Səqafi onu qınadı və şəhadət barmağı ilə işarə edərək dedi: “Allah Elçisi ﷺ bunun üzərinə heç bir şey əlavə etməmişdir”.

٣٠ - بَابُ نُزُولِ الإِمَامِ عَنِ الْمِنْبَرِ قَبْلَ فَرَاغِهِ مِنَ الْخُطْبَةِ ، وَقَطْعِهِ كَلاَمَهُ وَرُجُوعِهِ إِلَيْهِ يَوْمَ الْجُمُعَةِ

## 30-cu fəsil: Cümə günü imamın xütbəni bitirməmiş minbərdən aşağı enməsi və yenidən minbərə qayıtması

١٤١٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الْعَزِيزِ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ حُسَيْنِ بْنِ وَاقِدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ ، فَجَاءَ الْحَسَنُ وَالْحُسَيْنُ رَضِيَ اللَّهُ عَنْهُمَا ، وَعَلَيْهِمَا قَمِيصَانِ أَحْمَرَانِ يَعْثُرَانِ

فِيهِمَا ، فَنَزَلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَطَعَ كَلاَمَهُ ، فَحَمَلَهُمَا ثُمَّ عَادَ إِلَى الْمِنْبَرِ ، ثُمَّ قَالَ : صَدَقَ اللَّهُ : **{إِنَّمَا أَمْوَالُكُمْ وَأَوْلاَدُكُمْ فِتْنَةٌ}** ، رَأَيْتُ هَذَيْنِ يَعْثُرَانِ فِي قَمِيصَيْهِمَا ، فَلَمْ أَصْبِرْ حَتَّى قَطَعْتُ كَلاَمِي فَحَمَلْتُهُمَا.

1413. ...Abdullah ibn Bureydə atasının ﵁ belə dediyini rəvayət edir: “Peyğəmbər ﷺ xütbə deyirdi. Bu vaxt Həsən və Hüseyn gəldi. Onların üzərində qırmızı paltar var idi. Onlar ayaqları ilişə-ilişə gəlirdilər. Peyğəmbər ﷺ sözünü kəsərək minbərdən aşağı endi və onları qucağına götürüb dedi: “Allah doğru söyləmişdir: **“...var-dövlətiniz də, övladlarınız da ancaq bir imtahandır. Böyük mükafat isə Allah yanındadır”** (əl-Ənfal, 28). Mən bunların ayaqları paltarlarına ilişə-ilişə gəldiklərini gördüm, səbir edə bilmədim, sözümü kəsdim və onları qucağıma götürdüm”.

٣١ - بَابُ مَا يُسْتَحَبُّ مِنْ تَقْصِيرِ الْخُطْبَةِ

31-ci fəsil: Xütbəni nə qədər qısaltmaq olar

١٤١٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الْعَزِيزِ بْنِ غَزْوَانَ ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنِ الْحُسَيْنِ بْنِ وَاقِدٍ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ عُقَيْلٍ ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ أَبِي أَوْفَى ، يَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُكْثِرُ الذِّكْرَ ، وَيُقِلُّ اللَّغْوَ ، وَيُطِيلُ الصَّلاَةَ ، وَيُقَصِّرُ الْخُطْبَةَ ، وَلاَ يَأْنَفُ أَنْ يَمْشِيَ مَعَ الأَرْمَلَةِ ، وَالْمِسْكِينِ فَيَقْضِيَ لَهُ الْحَاجَةَ.

1414. ...Rəvayət edilir ki, Abdullah ibn Əbu Əufə ﵁ demişdir: “Allah Elçisi ﷺ çox zikr edər, boş sözlər danışmaz, namazı uzadar, xütbəni isə qısa edər, üstəlik, dul qadınlara və kasıblara baş çəkib onların ehtiyaclarını ödəməyi özünə ar bilməzdi”.

٣٢ - بَابُ كَمْ يَخْطُبُ

32-ci fəsil: Xütbə neçə dəfə verilir

١٤١٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، قَالَ : جَالَسْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَمَا رَأَيْتُهُ يَخْطُبُ إِلاَّ قَائِمًا وَيَجْلِسُ ، ثُمَّ يَقُومُ فَيَخْطُبُ الْخُطْبَةَ الآخِرَةَ.

1415. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: “Mən Peyğəmbərin ﷺ yanında oturdum. Onun ayaq üstə xütbə verdiyini gördüm. Oturar, sonra qalxıb axırıncı xütbəsini verərdi”.

### ٣٣ - بَابُ الْفَصْلِ بَيْنَ الْخُطْبَتَيْنِ بِالْجُلُوسِ
### 33-cü fəsil: İki xütbə arasını ayırmaq üçün oturmaq

١٤١٦ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، عَنْ نَافِعٍ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَخْطُبُ الْخُطْبَتَيْنِ وَهُوَ قَائِمٌ ، وَكَانَ يَفْصِلُ بَيْنَهُمَا بِجُلُوسٍ.

1416. ...Abdullah ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ ayaq üstə iki xütbə verər, onların arasını oturmaqla ayırardı.

### ١٤ - بَابُ السُّكُوتِ فِي الْقَعْدَةِ بَيْنَ الْخُطْبَتَيْنِ
### 34-cü fəsil: İki xütbə arasında oturduqda susmaq

١٤١٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ بَزِيعٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، يَعْنِي ابْنَ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا إِسْرَائِيلُ ، قَالَ : حَدَّثَنَا سِمَاكٌ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ يَوْمَ الْجُمُعَةِ قَائِمًا ، ثُمَّ يَقْعُدُ قِعْدَةً لاَ يَتَكَلَّمُ ، ثُمَّ يَقُومُ فَيَخْطُبُ خُطْبَةً أُخْرَى ، فَمَنْ حَدَّثَكُمْ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَخْطُبُ قَاعِدًا فَقَدْ كَذَبَ.

1417. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: "Mən Cümə günü Allah Elçisinin ﷺ ayaq üstə xütbə verdiyini gördüm. Sonra o oturdu və susdu. Sonra qalxıb başqa xütbə verdi. Kim sizə desə ki, "Allah Elçisi ﷺ oturaraq xütbə verib"- o, yalan danışmışdır".

### ٣٥ - بَابُ الْقِرَاءَةِ فِي الْخُطْبَةِ الثَّانِيَةِ وَالذِّكْرِ فِيهَا
### 35-ci fəsil: İkinci xütbədə Quran oxumaq və zikr etmək

١٤١٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ قَائِمًا ، ثُمَّ يَجْلِسُ ، ثُمَّ يَقُومُ ، وَيَقْرَأُ آيَاتٍ وَيَذْكُرُ اللَّهَ عَزَّ وَجَلَّ ، وَكَانَتْ خُطْبَتُهُ قَصْدًا وَصَلاَتُهُ قَصْدًا.

1418. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: "Peyğəmbər ﷺ ayaq üstə xütbə verər, sonra oturar, sonra yenə qalxar, bəzi ayələr oxuyar və Allahı zikr edərdi. Onun xütbəsi də, namazı da vaxt baxımından bir-birinə bərabər olardı".

٣٦ - الْكَلاَمُ وَالْقِيَامُ بَعْدَ النُّزُولِ عَنِ الْمِنْبَرِ

## 36-cı fəsil: Minbərdən aşağı düşdükdə dayanıb danışmaq

١٤١٩ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ مَيْمُونٍ ، قَالَ : حَدَّثَنَا الْفِرْيَابِيُّ ، قَالَ : حَدَّثَنَا جَرِيرُ بْنُ حَازِمٍ ، عَنْ ثَابِتٍ الْبُنَانِيِّ ، عَنْ أَنَسٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَنْزِلُ عَنِ الْمِنْبَرِ فَيَعْرِضُ لَهُ الرَّجُلُ ، فَيُكَلِّمُهُ فَيَقُومُ مَعَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى يَقْضِيَ حَاجَتَهُ ، ثُمَّ يَتَقَدَّمُ إِلَى مُصَلاَّهُ فَيُصَلِّي.

1419. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Allah Elçisi ﷺ minbərdən aşağı düşər, bir kişi ehtiyacından dolayı ona yaxınlaşar, Peyğəmbər ﷺ onun ehtiyaclarına qulaq asmaq üçün onunla söhbət edərdi. Sonra namaz qıldığı yerə keçər və namazı qılardı”.[1]

٣٧ - عَدَدُ صَلاَةِ الْجُمُعَةِ

## 37-ci fəsil: Cümə namazının rükətlərinin sayı

١٤٢٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ ، عَنْ زُبَيْدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، قَالَ : قَالَ عُمَرُ : صَلاَةُ الْجُمُعَةِ رَكْعَتَانِ ، وَصَلاَةُ الْفِطْرِ رَكْعَتَانِ ، وَصَلاَةُ الأَضْحَى رَكْعَتَانِ ، وَصَلاَةُ السَّفَرِ رَكْعَتَانِ تَمَامٌ غَيْرُ قَصْرٍ عَلَى لِسَانِ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : عَبْدُ الرَّحْمَنِ بْنُ أَبِي لَيْلَى لَمْ يَسْمَعْ مِنْ عُمَرَ.

1420. ...Rəvayət edilir ki, Ömər ﷺ demişdir: “Cümə namazı iki rükətdir. Ramazan bayramı namazı iki rükətdir. Qurban bayramı namazı iki rükətdir. Səfər namazı tam olaraq iki rükətdir. Muhəmməd ﷺ belə demişdir”.

٣٨ - الْقِرَاءَةُ فِي صَلاَةِ الْجُمُعَةِ بِسُورَةِ الْجُمُعَةِ وَالْمُنَافِقِينَ

## 38-ci fəsil: Cümə namazında “əl-Cumuə” və “əl-Munafiqun” surələrini oxumaq

١٤٢١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى الصَّنْعَانِيُّ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : أَخْبَرَنِي مُخَوَّلٌ ، قَالَ : سَمِعْتُ مُسْلِمًا الْبَطِينَ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ يَوْمَ الْجُمُعَةِ فِي صَلاَةِ الصُّبْحِ الم تَنْزِيلُ وَهَلْ أَتَى عَلَى الإِنْسَانِ ، وَفِي صَلاَةِ الْجُمُعَةِ بِسُورَةِ الْجُمُعَةِ وَالْمُنَافِقِينَ.

1421. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ Cümə gününün Sübh namazında **“Əlif. Ləm. Mim...”** (əs-Səcdə) və **“Doğrudanmı insanın...”**

---

[1] Hədis zəifdir.

(əl-İnsan) surələrini, Cümə namazında “əl-Cumuə” və “əl-Munafiqun” surələrini oxuyardı”.

٣٩ - الْقِرَاءَةُ فِي صَلاَةِ الْجُمُعَةِ بِـ{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى} وَ {هَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ}

39-cu fəsil: Cümə namazında “əl-Ə'lə” və “əl-Ğaşiyə” surələrini oxumaq

١٤٢٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، قَالَ : أَخْبَرَنِي مَعْبَدُ بْنُ خَالِدٍ ، عَنْ زَيْدِ بْنِ عُقْبَةَ ، عَنْ سَمُرَةَ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي صَلاَةِ الْجُمُعَةِ بِـ**{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** وَ**{هَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ}**.

1422. ...Rəvayət edilir ki, Səmura ﷺ demişdir: “Allah Elçisi ﷺ Cümə namazında **“Ən Uca Rəbbinin adına təriflər de!”** (əl-Ə'lə) və **“Aləmi Çulğalayanın xəbəri sənə gəlib çatdımı?”** (əl-Ğaşiyə) surələrini oxuyardı”.

٤٠ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى النُّعْمَانِ بْنِ بَشِيرٍ فِي الْقِرَاءَةِ فِي صَلاَةِ الْجُمُعَةِ

40-cı fəsil: ən-Numan ibn Bəşirin ﷺ Cümə namazında nəyin oxunması barəsində ixtilafı haqda

١٤٢٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ ضَمْرَةَ بْنِ سَعِيدٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ الضَّحَّاكَ بْنَ قَيْسٍ سَأَلَ النُّعْمَانَ بْنَ بَشِيرٍ : مَاذَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ يَوْمَ الْجُمُعَةِ عَلَى إِثْرِ سُورَةِ الْجُمُعَةِ ؟ قَالَ : كَانَ يَقْرَأُ **{هَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ}**.

1423. ...Ubeydullah ibn Abdullah ﷺ rəvayət edir ki, əd-Dahhak ibn Qeys ən-Numan ibn Bəşirdən soruşdu: “Allah Elçisi ﷺ Cümə namazında “əl-Cumuə” surəsindən başqa hansı surəni oxuyardı?” ən-Numan ibn Bəşir dedi: “O, **“Aləmi Çulğalayanın xəbəri sənə gəlib çatdımı?”** (əl-Ğaşiyə surəsini) oxuyardı”.

١٤٢٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، أَنَّ إِبْرَاهِيمَ بْنَ مُحَمَّدِ بْنِ الْمُنْتَشِرِ أَخْبَرَهُ ، قَالَ : سَمِعْتُ أَبِي يُحَدِّثُ ، عَنْ حَبِيبِ بْنِ سَالِمٍ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الْجُمُعَةِ بِـ**{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** ، وَ**{هَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ}** ، وَرُبَّمَا اجْتَمَعَ الْعِيدُ وَالْجُمُعَةُ ، فَيَقْرَأُ بِهِمَا فِيهِمَا جَمِيعًا.

1424. ...Rəvayət edilir ki, ən-Numan ibn Bəşir ﷺ demişdir: “Allah Elçisi ﷺ Cümə namazında **“Ən Uca Rəbbinin adına təriflər de!”** (əl-Ə'lə) və **“Aləmi Çulğalayanın xəbəri sənə gəlib çatdımı?”** (əl-Ğaşiyə) surələrini

oxuyardı. Hərdən Cümə ilə bayram namazları üst-üstə düşərdi. Onda da həmin surələri oxuyardı".

٤١ - مَنْ أَدْرَكَ رَكْعَةً مِنْ صَلاَةِ الْجُمُعَةِ

## 41-ci fəsil: Cümə namazının bir rükətinə çatan haqda

١٤٢٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، وَمُحَمَّدُ بْنُ مَنْصُورٍ ، وَاللَّفْظُ لَهُ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ أَدْرَكَ مِنْ صَلاَةِ الْجُمُعَةِ رَكْعَةً فَقَدْ أَدْرَكَ.

1425. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim Cümə namazının bir rükətinə çatsa, artıq (tam şəkildə) Cüməyə çatmış olar".[1]

٤٢ - عَدَدُ الصَّلاَةِ بَعْدَ الْجُمُعَةِ فِي الْمَسْجِدِ

## 42-ci fəsil: Cümə namazından sonra məsciddə qılınan namazların sayı

١٤٢٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا صَلَّى أَحَدُكُمُ الْجُمُعَةَ فَلْيُصَلِّ بَعْدَهَا أَرْبَعًا.

1426. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən biriniz Cümə namazını qıldıqdan sonra dörd rükət namaz qılsın".

٤٣ - صَلاَةُ الإِمَامِ بَعْدَ الْجُمُعَةِ

## 43-cü fəsil: İmamın Cümə namazından sonra namaz qılması

١٤٢٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ لاَ يُصَلِّي بَعْدَ الْجُمُعَةِ حَتَّى يَنْصَرِفَ فَيُصَلِّيَ رَكْعَتَيْنِ.

1427. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Cümə namazından sonra çıxıb gedənə qədər namaz qılmazdı. (Evinə) qayıdanda isə iki rükət namaz qılardı.

[1] "Cümə", "cüməyə" sözləri səhih deyil.

١٤٢٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بَعْدَ الْجُمُعَةِ رَكْعَتَيْنِ فِي بَيْتِهِ.

1428. ...Səlim atasının ﷺ belə dediyini rəvayət edir: “Allah Elçisi ﷺ Cümə namazından sonra evində iki rükət namaz qılardı”.

٤٤ - بَابُ إِطَالَةِ الرَّكْعَتَيْنِ بَعْدَ الْجُمُعَةِ

## 44-cü fəsil: Cümə namazından sonrakı iki rükəti uzadaraq qılmaq

١٤٢٩ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، عَنْ يَزِيدَ وَهُوَ ابْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ أَيُّوبَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّهُ كَانَ يُصَلِّي بَعْدَ الْجُمُعَةِ رَكْعَتَيْنِ يُطِيلُ فِيهِمَا ، وَيَقُولُ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُهُ.

1429. ...Nafi ﷺ rəvayət edir ki, İbn Ömər Cümə namazından sonrakı iki rükəti uzadaraq qılar və deyərdi: “Allah Elçisi ﷺ belə edərdi”.[1]

٤٥ - ذِكْرُ السَّاعَةِ الَّتِي يُسْتَجَابُ فِيهَا الدُّعَاءُ يَوْمَ الْجُمُعَةِ

## 45-ci fəsil: Cümə günü duaların qəbul olunan saatı haqda

١٤٣٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا بَكْرٌ ، يَعْنِي ابْنَ مُضَرَ ، عَنِ ابْنِ الْهَادِ ، عَنْ مُحَمَّدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : أَتَيْتُ الطُّورَ فَوَجَدْتُ ثَمَّ كَعْبًا ، فَمَكَثْتُ أَنَا وَهُوَ يَوْمًا أُحَدِّثُهُ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَيُحَدِّثُنِي عَنِ التَّوْرَاةِ ، فَقُلْتُ لَهُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَيْرُ يَوْمٍ طَلَعَتْ فِيهِ الشَّمْسُ يَوْمُ الْجُمُعَةِ ، فِيهِ خُلِقَ آدَمُ ، وَفِيهِ أُهْبِطَ ، وَفِيهِ تِيبَ عَلَيْهِ ، وَفِيهِ قُبِضَ ، وَفِيهِ تَقُومُ السَّاعَةُ ، مَا عَلَى الأَرْضِ مِنْ دَابَّةٍ إِلاَّ وَهِيَ تُصْبِحُ يَوْمَ الْجُمُعَةِ مُصِيخَةً ، حَتَّى تَطْلُعَ الشَّمْسُ شَفَقًا مِنَ السَّاعَةِ إِلاَّ ابْنَ آدَمَ ، وَفِيهِ سَاعَةٌ لاَ يُصَادِفُهَا مُؤْمِنٌ وَهُوَ فِي الصَّلاَةِ يَسْأَلُ اللَّهَ فِيهَا شَيْئًا إِلاَّ أَعْطَاهُ إِيَّاهُ فَقَالَ كَعْبٌ : ذَلِكَ يَوْمٌ فِي كُلِّ سَنَةٍ ، فَقُلْتُ : بَلْ هِيَ فِي كُلِّ جُمُعَةٍ ، فَقَرَأَ كَعْبٌ التَّوْرَاةَ ، ثُمَّ قَالَ : صَدَقَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هُوَ فِي كُلِّ جُمُعَةٍ . فَخَرَجْتُ فَلَقِيتُ بَصْرَةَ بْنَ أَبِي بَصْرَةَ الْغِفَارِيَّ ، فَقَالَ : مِنْ أَيْنَ جِئْتَ ؟ قُلْتُ : مِنَ الطُّورِ ، قَالَ : لَوْ لَقِيتُكَ مِنْ قَبْلِ أَنْ تَأْتِيَهُ لَمْ تَأْتِهِ ، قُلْتُ لَهُ : وَلِمَ ؟ قَالَ : إِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ تُعْمَلُ الْمَطِيُّ إِلاَّ إِلَى ثَلاَثَةِ مَسَاجِدَ : الْمَسْجِدِ الْحَرَامِ وَمَسْجِدِي وَمَسْجِدِ بَيْتِ الْمَقْدِسِ فَلَقِيتُ عَبْدَ اللهِ بْنَ سَلاَمٍ ، فَقُلْتُ : لَوْ رَأَيْتَنِي خَرَجْتُ إِلَى الطُّورِ فَلَقِيتُ كَعْبًا فَمَكَثْتُ أَنَا وَهُوَ يَوْمًا أُحَدِّثُهُ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَيُحَدِّثُنِي عَنِ التَّوْرَاةِ ، فَقُلْتُ لَهُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَيْرُ يَوْمٍ طَلَعَتْ فِيهِ الشَّمْسُ يَوْمُ الْجُمُعَةِ فِيهِ خُلِقَ آدَمُ ، وَفِيهِ أُهْبِطَ ، وَفِيهِ تِيبَ عَلَيْهِ ، وَفِيهِ قُبِضَ ، وَفِيهِ تَقُومُ السَّاعَةُ ، مَا عَلَى الأَرْضِ مِنْ دَابَّةٍ إِلاَّ وَهِيَ تُصْبِحُ يَوْمَ الْجُمُعَةِ مُصِيخَةً حَتَّى تَطْلُعَ الشَّمْسُ شَفَقًا مِنَ السَّاعَةِ إِلاَّ ابْنَ آدَمَ ، وَفِيهِ سَاعَةٌ لاَ يُصَادِفُهَا عَبْدٌ مُؤْمِنٌ وَهُوَ فِي الصَّلاَةِ يَسْأَلُ اللَّهَ شَيْئًا ، إِلاَّ أَعْطَاهُ إِيَّاهُ قَالَ كَعْبٌ : ذَلِكَ يَوْمٌ فِي كُلِّ سَنَةٍ ، فَقَالَ عَبْدُ اللهِ بْنُ سَلاَمٍ : كَذَبَ كَعْبٌ ، قُلْتُ : ثُمَّ قَرَأَ كَعْبٌ ، فَقَالَ : صَدَقَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : هُوَ فِي

[1] “Uzadaraq” sözü səhih deyil.

كُلِّ جُمُعَةٍ ، فَقَالَ عَبْدُ اللهِ : صَدَقَ كَعْبٌ إِنِّي لأَعْلَمُ تِلْكَ السَّاعَةَ ، فَقُلْتُ : يَا أَخِي ، حَدِّثْنِي بِهَا ، قَالَ : هِيَ آخِرُ سَاعَةٍ مِنْ يَوْمِ الْجُمُعَةِ قَبْلَ أَنْ تَغِيبَ الشَّمْسُ فَقُلْتُ : أَلَيْسَ قَدْ سَمِعْتَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : لاَ يُصَادِفُهَا مُؤْمِنٌ وَهُوَ فِي الصَّلاَةِ ، وَلَيْسَتْ تِلْكَ السَّاعَةَ صَلاَةٌ ، قَالَ : أَلَيْسَ قَدْ سَمِعْتَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : مَنْ صَلَّى ، وَجَلَسَ يَنْتَظِرُ الصَّلاَةَ لَمْ يَزَلْ فِي صَلاَتِهِ حَتَّى تَأْتِيَهُ الصَّلاَةُ الَّتِي تُلاَقِيهَا قُلْتُ : بَلَى ، قَالَ : فَهُوَ كَذَلِكَ.

1430. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Tur dağına getmişdim və orada Kəbi gördüm. Biz orada bir gün qaldıq. Mən ona Allah Elçisi ﷺ haqqında danışdım. O da mənə Tövrat haqda danışdı. Mən ona dedim: “Allah Elçisi ﷺ belə deyib: “Üzərinə Günəşin doğduğu ən xeyirli gün Cümə günüdür. O gün Adəm yaradıldı, o gün Cənnətdən qovuldu, o gün də onun tövbəsi qəbul edildi. O gün o öldü və o gün də Qiyamət qopacaq. Yer üzərində Adəm övladından başqa elə bir canlı yoxdur ki, Cümə günü şəfəq açılana qədər Qiyamətin qopmasına görə qorxu içində olmasın. Bu gündə elə bir saat var ki, mömin bu saatda namazda Allahdan bir şey istəsə, Allah bunu ona verər”. Kəb dedi: “Bu hər ildədirmi?” Mən ona dedim: “Əksinə, bu, hər Cümə günüdür”. Kəb Tövratı oxudu və sonra dedi: “Allah Elçisi ﷺ düz demişdir. Bu, hər Cümə günüdür.” Mən çıxıb getdikdə, yolda Bəsra ibn Əbu Bəsra əl-Ğifarini gördüm. O, mənə dedi: “Sən hardan gəlirsən?” Mən dedim: “Tur dağından”. O dedi: “Əgər mən səni ora getməmişdən qabaq görsəydim, sən ora getməzdin”. Mən dedim: “Nəyə görə?” O dedi: “ Allah Elçisinin ﷺ belə dediyini eşitmişəm: “Üç məsciddən başqa (yerə) ziyarət üçün səfər edilməz; Məscidul-Haram (Kəbə), mənim məscidim (Mədinədəki məscid) və Beytul-Məqdisdə (Aqsa) olan məscid”. Sonra mən Abdullah ibn Səlam ilə rastlaşdım və ona dedim: “Mən Tur dağına çıxmış və Kəblə görüşmüşdüm. Onunla bir gün qalaraq Allah Elçisi ﷺ haqda danışdım. O da mənə Tövrat haqda danışdı. Mən ona dedim: “Allah Elçisi ﷺ belə deyib: “Günəşin üzərinə doğduğu ən xeyirli gün Cümə günüdür. O gün Adəm yaradıldı, o gün Cənnətdən qovuldu, o gün də onun tövbəsi qəbul edildi. O gün o öldü və o gün də Qiyamət qopacaq. Yer üzərində Adəm övladından başqa elə bir canlı yoxdur ki, Cümə günü şəfəq açılana qədər Qiyamətin qopmasına görə qorxu içində olmasın. Bu gündə elə bir saat var ki, mömin bu saatda namazda Allahdan bir şey istəsə, Allah bunu ona verər”. Kəb dedi: “Bu, hər ildə bir gündür”. Abdullah ibn Səlam dedi: “Kəb düz deməyib”. Mən dedim: “Sonra Kəb ayə oxudu və dedi: “Allah Elçisi ﷺ düz demişdir. Bu, hər Cümədədir”. Abdullah dedi: “Kəb doğru söyləmişdir. Mən bunun hansı saat olduğunu

bilirəm. Mən dedim: "Ey qardaşım, bu haqda mənə xəbər ver". O dedi: "Bu, Cümə gününün günəş batmamışdan qabaq son saatıdır". Mən dedim: "Sən bunu Allah Elçisindən ﷺ eşitdinmi?" O dedi: "Sən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitməmisənmi?! "Mömin bəndə bu saatda namazda Allahdan bir şey istəyərsə, istədiyi ona verilər". Halbuki, bu saatda namaz qılınmır. Sən Allah Elçisindən ﷺ eşitməmisənmi?! O demişdi: "Kim namaz qılıb oturduğu yerdə namazı gözləyərsə, namazı qılana qədər namazda olmuş kimi sayılar". Mən: "Bəli, belədir"- dedim. O da dedi: "Bəli, belədir".

١٤٣١ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ حَنْبَلٍ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ خَالِدٍ ، عَنْ رَبَاحٍ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : حَدَّثَنِي سَعِيدٌ ، عَنْ أَبِي هُرَيْرَةَ : عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ فِي الْجُمُعَةِ سَاعَةً لاَ يُوَافِقُهَا عَبْدٌ مُسْلِمٌ يَسْأَلُ اللَّهَ فِيهَا شَيْئًا إِلاَّ أَعْطَاهُ إِيَّاهُ.

1431. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, Cümə günündə elə bir saat var ki, hər hansı müsəlman bəndə həmin saatda Allahdan ﷻ bir şey istəyərsə, Allah ona istədiyini verər".

١٤٣٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ مُحَمَّدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ أَبُو الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ فِي الْجُمُعَةِ سَاعَةً لاَ يُوَافِقُهَا عَبْدٌ مُسْلِمٌ قَائِمٌ يُصَلِّي يَسْأَلُ اللَّهَ عَزَّ وَجَلَّ شَيْئًا إِلاَّ أَعْطَاهُ إِيَّاهُ قُلْنَا : يُقَلِّلُهَا يُزَهِّدُهَا. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ نَعْلَمُ أَحَدًا حَدَّثَ بِهَذَا الْحَدِيثِ غَيْرَ رَبَاحٍ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، إِلاَّ أَيُّوبَ بْنَ سُوَيْدٍ ، فَإِنَّهُ حَدَّثَ بِهِ عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدٍ ، وَأَبِي سَلَمَةَ ، وَأَيُّوبُ بْنُ سُوَيْدٍ مَتْرُوكُ الْحَدِيثِ.

1432. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Əbul-Qasim (yəni Peyğəmbər ﷺ) buyurdu: "Həqiqətən, Cümə günündə elə bir saat var ki, həmin saatda hər hansı müsəlman qul namazda Allahdan ﷻ bir şey istəyərsə, Allah ona istədiyini verər". Biz dedik: "Bu saat az və qısadır".

## ١٥ - كِتَابُ تَقْصِيرِ الصَّلاَةِ فِي السَّفَرِ
## 15. Səfərdə namazı qısaltmaq kitabı

### ١ - تَقْصِيرِ الصَّلاَةِ
### 1-ci fəsil: Namazı qısaltmaq

١٤٣٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ إِدْرِيسَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ ابْنِ أَبِي عَمَّارٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ بَابَيْهِ ، عَنْ يَعْلَى بْنِ أُمَيَّةَ ، قَالَ : قُلْتُ لِعُمَرَ بْنِ الْخَطَّابِ **{لَيْسَ عَلَيْكُمْ جُنَاحٌ أَنْ تَقْصُرُوا}** مِنَ الصَّلاَةِ إِنْ خِفْتُمْ أَنْ يَفْتِنَكُمُ الَّذِينَ كَفَرُوا ، فَقَدْ أَمِنَ النَّاسُ ، فَقَالَ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ : عَجِبْتُ مِمَّا عَجِبْتَ مِنْهُ ، فَسَأَلْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ذَلِكَ ، فَقَالَ : صَدَقَةٌ تَصَدَّقَ اللَّهُ بِهَا عَلَيْكُمْ فَاقْبَلُوا صَدَقَتَهُ.

1433. ...Rəvayət edilir ki, Yə'lə ibn Umeyyə ﷺ demişdir: “Mən Ömər ibn əl-Xattaba ﷺ dedim: **“Yer üzündə səfərə çıxdığınız zaman kafirlərin sizə zərər yetirəcəklərindən qorxarsınızsa, namazı qısaltmanıza görə sizə günah gəlməz”** (ən-Nisa, 101). Artıq insanlar əmin-amanlıqdadırlar”. Ömər də dedi: “Mən də sənin kimi təəccüb etmişdim və Allah Elçisindən ﷺ bu haqda soruşduqda, o dedi: “Bu, Allahın sizə verdiyi sədəqədir. Allahın sədəqəsini qəbul edin”.

١٤٣٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أُمَيَّةَ بْنِ عَبْدِ اللهِ بْنِ خَالِدٍ أَنَّهُ قَالَ لِعَبْدِ اللهِ بْنِ عُمَرَ : إِنَّا نَجِدُ صَلاَةَ الْحَضَرِ ، وَصَلاَةَ الْخَوْفِ فِي الْقُرْآنِ ، وَلاَ نَجِدُ صَلاَةَ السَّفَرِ فِي الْقُرْآنِ ، فَقَالَ لَهُ ابْنُ عُمَرَ : يَا ابْنَ أَخِي ، إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ بَعَثَ إِلَيْنَا مُحَمَّدًا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَلاَ نَعْلَمُ شَيْئًا ، وَإِنَّمَا نَفْعَلُ كَمَا رَأَيْنَا مُحَمَّدًا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُ.

1434. ... Rəvayət edilir ki, Umeyyə ibn Abdullah ibn Xalid ﷺ Abdullah ibn Ömərə dedi: “Biz daimi yaşanılan yerdə və qorxu halında qılınan namaz haqda Quranda oxumuşuq, lakin səfər namazı haqda oxumamışıq”. İbn Ömər ona dedi: “Ey qardaşım oğlu! Həqiqətən, biz heç bir şey bilmədiyimiz halda Allah ﷻ bizə Muhəmmədi ﷺ göndərdi. Biz də Muhəmmədin ﷺ necə etdiyini görmüşüksə, elə də edirik”.

١٤٣٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، عَنْ مَنْصُورِ بْنِ زَاذَانَ ، عَنْ ابْنِ سِيرِينَ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ مِنْ مَكَّةَ إِلَى الْمَدِينَةِ لاَ يَخَافُ إِلاَّ رَبَّ الْعَالَمِينَ يُصَلِّي رَكْعَتَيْنِ.

1435. ...İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Məkkədən Mədinəyə tərəf yola çıxdı. Aləmlərin Rəbbindən başqa heç nədən qorxmadığı halda namazlarını iki rükət olaraq qıldı.

١٤٣٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَوْنٍ ، عَنْ مُحَمَّدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كُنَّا نَسِيرُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَيْنَ مَكَّةَ وَالْمَدِينَةِ لاَ نَخَافُ إِلاَّ اللَّهَ عَزَّ وَجَلَّ نُصَلِّي رَكْعَتَيْنِ.

1436. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə Məkkə ilə Mədinə arasında yol gedəndə Allahdan ﷻ başqa heç nədən qorxmadığımız halda namazları iki rükət qıldıq".

١٤٣٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا النَّضْرُ بْنُ شُمَيْلٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ يَزِيدَ بْنِ خُمَيْرٍ ، قَالَ : سَمِعْتُ حَبِيبَ بْنَ عُبَيْدٍ يُحَدِّثُ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، عَنِ ابْنِ السِّمْطِ ، قَالَ : رَأَيْتُ عُمَرَ بْنَ الْخَطَّابِ يُصَلِّي بِذِي الْحُلَيْفَةِ رَكْعَتَيْنِ ، فَسَأَلْتُهُ عَنْ ذَلِكَ ، فَقَالَ : إِنَّمَا أَفْعَلُ كَمَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْعَلُ.

1437. ...Rəvayət edilir ki, İbn əs-Simt ﷺ demişdir: "Ömər ibn əl-Xattabın ﷺ Zul-Huleyfədə namazı iki rükət qıldığını gördüm və ondan bu haqda soruşdum. O dedi: "Mən Allah Elçisinin ﷺ necə etdiyini görmüşəmsə, elə də edirəm".

١٤٣٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ يَحْيَى بْنِ أَبِي إِسْحَاقَ ، عَنْ أَنَسٍ ، قَالَ : خَرَجْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْمَدِينَةِ إِلَى مَكَّةَ فَلَمْ يَزَلْ يَقْصُرُ حَتَّى رَجَعَ فَأَقَامَ بِهَا عَشْرًا.

1438. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ ilə birlikdə Mədinədən Məkkəyə doğru səfərə çıxdıq. O, Məkkədə on gün qaldı və namazları qısaldaraq qıldı".

١٤٣٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ الْحَسَنِ بْنِ شَقِيقٍ ، قَالَ أَبِي ، أَنْبَأَنَا أَبُو حَمْزَةَ وَهُوَ السُّكَّرِيُّ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَلْقَمَةَ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي السَّفَرِ رَكْعَتَيْنِ ، وَمَعَ أَبِي بَكْرٍ رَكْعَتَيْنِ ، وَمَعَ عُمَرَ رَكْعَتَيْنِ رَضِيَ اللَّهُ عَنْهُمَا.

1439. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə səfərdə olarkən namazları iki rükət olaraq qıldım. Əbu Bəkr və Ömərlə birlikdə səfərdə olarkən də namazları iki rükət qıldım".

١٤٤٠ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ سُفْيَانَ وَهُوَ ابْنُ حَبِيبٍ ، عَنْ شُعْبَةَ ، عَنْ زُبَيْدٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، عَنْ عُمَرَ ، قَالَ : صَلاَةُ الْجُمُعَةِ رَكْعَتَانِ ، وَالْفِطْرُ رَكْعَتَانِ ، وَالنَّحْرُ رَكْعَتَانِ ، وَالسَّفَرُ رَكْعَتَانِ تَمَامٌ غَيْرُ قَصْرٍ ، عَلَى لِسَانِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1440. ...Rəvayət edilir ki, Ömər ﵁ demişdir: "Peyğəmbərin ﷺ dili ilə Cümə namazını iki rükət, Ramazan bayramı namazını iki rükət, Qurban bayramı namazını iki rükət və səfər namazını da iki rükət olaraq qılmaq tam qılmaq kimidir".

١٤٤١ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنِي أَبُو عَبْدِ الرَّحِيمِ ، قَالَ : حَدَّثَنِي زَيْدٌ ، عَنْ أَيُّوبَ وَهُوَ ابْنُ عَائِذٍ ، عَنْ بُكَيْرِ بْنِ الأَخْنَسِ ، عَنْ مُجَاهِدٍ أَبِي الْحَجَّاجِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : فُرِضَتْ صَلاَةُ الْحَضَرِ عَلَى لِسَانِ نَبِيِّكُمْ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَرْبَعًا ، وَصَلاَةُ السَّفَرِ رَكْعَتَيْنِ ، وَصَلاَةُ الْخَوْفِ رَكْعَةً.

1441. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Peyğəmbərimizin ﷺ dili ilə yaşadığın yerdə olan namaz dörd rükət, səfərdə olan namaz iki rükət, qorxu namazı isə bir rükət olaraq fərz edildi".

١٤٤٢ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ مَاهَانَ ، قَالَ : حَدَّثَنَا الْقَاسِمُ بْنُ مَالِكٍ ، عَنْ أَيُّوبَ بْنِ عَائِذٍ ، عَنْ بُكَيْرِ بْنِ الأَخْنَسِ ، عَنْ مُجَاهِدٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ فَرَضَ الصَّلاَةَ عَلَى لِسَانِ نَبِيِّكُمْ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فِي الْحَضَرِ أَرْبَعًا ، وَفِي السَّفَرِ رَكْعَتَيْنِ ، وَفِي الْخَوْفِ رَكْعَةً.

1442. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah ﷻ Peyğəmbərimizin ﷺ dili ilə yaşadığın yerdə qılınan namazı dörd rükət, səfərdə qılınan namazı iki rükət, qorxu namazını isə bir rükət olaraq fərz etmişdir".

## ٢ - بَابُ الصَّلاَةِ بِمَكَّةَ

## 2-ci fəsil: Məkkədə qılınan namaz

١٤٤٣ - حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، فِي حَدِيثِهِ ، عَنْ خَالِدِ بْنِ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، قَالَ : سَمِعْتُ مُوسَى وَهُوَ ابْنُ سَلَمَةَ ، قَالَ : قُلْتُ لاِبْنِ عَبَّاسٍ : كَيْفَ أُصَلِّي بِمَكَّةَ إِذَا لَمْ أُصَلِّ فِي جَمَاعَةٍ ؟ قَالَ : رَكْعَتَيْنِ سُنَّةَ أَبِي الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1443. ...Rəvayət edilir ki, Musa ibn Sələmə ﵀ demişdir: "Mən İbn Abbasa ﵄ dedim: "Məkkədə tək olduğum halda namazları necə qılım?" O dedi: "Əbul-Qasimin ﷺ sünnəsində olduğu kimi - iki rükət qıl!"

١٤٤٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، أَنَّ مُوسَى بْنَ سَلَمَةَ حَدَّثَهُمْ ، أَنَّهُ سَأَلَ ابْنَ عَبَّاسٍ ، قُلْتُ : تَفُوتُنِي الصَّلاَةُ فِي جَمَاعَةٍ وَأَنَا بِالْبَطْحَاءِ ، مَا تَرَى أَنْ أُصَلِّيَ ؟ قَالَ : رَكْعَتَيْنِ سُنَّةَ أَبِي الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1444. ...Rəvayət edilir ki, Musa ibn Sələmə ﵁ İbn Abbasdan ﵄ soruşdu: "Bəthədə olduğuma görə camaata çatmadım, namazı necə qılım?" O dedi: "Əbul-Qasimin ﷺ sünnəsində olduğu kimi - iki rükət qıl!"

## ٣ - بَابُ الصَّلاَةِ بِمِنًى

## 3-cü fəsil: Minada qılınan namaz

١٤٤٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ حَارِثَةَ بْنِ وَهْبٍ الْخُزَاعِيِّ ، قَالَ : صَلَّيْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِنًى آمَنَ مَا كَانَ النَّاسُ وَأَكْثَرَهُ رَكْعَتَيْنِ.

1445. ...Rəvayət edilir ki, Harisə ibn Vəhb əl-Xuzai ﵁ demişdir: "Mən Minada insanların əmin-amanlıq içində və çox olduqları halda namazları Peyğəmbərlə ﷺ iki rükət qıldım".

١٤٤٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْحَاقَ (ح) وَأَنْبَأَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : أَخْبَرَنِي أَبُو إِسْحَاقَ ، عَنْ حَارِثَةَ بْنِ وَهْبٍ ، قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِنًى أَكْثَرَ مَا كَانَ النَّاسُ وَآمَنَهُ رَكْعَتَيْنِ.

1446. ...Rəvayət edilir ki, Harisə ibn Vəhb ﵁ demişdir: "Peyğəmbər ﷺ Minada insanların əmin-amanlıq içində olduqları halda bizə namazları iki rükət olaraq qıldırdı".

١٤٤٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ بُكَيْرٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّهُ قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِنًى ، وَمَعَ أَبِي بَكْرٍ ، وَعُمَرَ رَكْعَتَيْنِ ، وَمَعَ عُثْمَانَ رَكْعَتَيْنِ صَدْرًا مِنْ إِمَارَتِهِ.

1447. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Mən Minada Allah Elçisi ﷺ ilə, Əbu Bəkrlə, Ömərlə və Osmanın xilafətinin əvvəllərində namazları iki rükət olaraq qılmışam".

١٤٤٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَاحِدِ ، عَنِ الأَعْمَشِ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ ، قَالَ : سَمِعْتُ عَبْدَ الرَّحْمَنِ بْنَ يَزِيدَ (ح) وَأَنْبَأَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ

بْنِ يَزِيدَ ، عَنْ عَبْدِ اللهِ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : صَلَّيْتُ بِمِنًى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَيْنِ.

1448. ...Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Mən Minada Allah Elçisi ﷺ ilə birlikdə namazları iki rükət qıldım".

١٤٤٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، قَالَ : حَدَّثَنَا عِيسَى ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، قَالَ : صَلَّى عُثْمَانُ بِمِنًى أَرْبَعًا حَتَّى بَلَغَ ذَلِكَ عَبْدَ اللهِ ، فَقَالَ : لَقَدْ صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَيْنِ.

1449. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Yəzid ﷺ demişdir: "Osman Minada bizə namazları dörd rükət qıldırdı. Bu xəbər Abdullaha çatdıqda, o dedi: "Amma mən Allah Elçisi ﷺ ilə birlikdə namazları iki rükət olaraq qılmışdım".

١٤٥٠ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، قَالَ : صَلَّيْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِنًى رَكْعَتَيْنِ ، وَمَعَ أَبِي بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ رَكْعَتَيْنِ ، وَمَعَ عُمَرَ رَضِيَ اللَّهُ عَنْهُ رَكْعَتَيْنِ.

1450. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Mən Minada Peyğəmbərlə ﷺ, Əbu Bəkrlə və Ömərlə namazları iki rükət olaraq qılmışam".

١٤٥١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ أَبِيهِ ، قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمِنًى رَكْعَتَيْنِ ، وَصَلاَّهَا أَبُو بَكْرٍ رَكْعَتَيْنِ ، وَصَلاَّهَا عُمَرُ رَكْعَتَيْنِ ، وَصَلاَّهَا عُثْمَانُ صَدْرًا مِنْ خِلاَفَتِهِ.

1451. ...Abdullah ibn Ömər atasının ﷺ belə dediyini rəvayət edir: "Allah Elçisi ﷺ Minada namazları iki rükət qılmışdı. Əbu Bəkr də iki rükət qılmışdı. Ömər də iki rükət qılmışdı. Osman xilafətin əvvəlində iki rükət qılmışdı".

## ٤ - بَابُ الْمَقَامِ الَّذِي يُقْصَرُ بِمِثْلِهِ الصَّلاَةُ

## 4-cü fəsil: Namazın qısaldıldığı yer

١٤٥٢ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ أَبِي إِسْحَاقَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْمَدِينَةِ إِلَى مَكَّةَ ، فَكَانَ يُصَلِّي بِنَا رَكْعَتَيْنِ حَتَّى رَجَعْنَا ، قُلْتُ : هَلْ أَقَامَ بِمَكَّةَ ؟ قَالَ : نَعَمْ ، أَقَمْنَا بِهَا عَشْرًا.

1452. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə Mədinədən Məkkəyə yola çıxdım. O, bizimlə birlikdə qayıdana qədər namazları iki rükət qılardı”. Hədisin ravisi soruşdu: “O, Məkkədə qaldımı?” Ənəs dedi: “Bəli, biz Məkkədə on gün qaldıq”.

١٤٥٣ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ الأَسْوَدِ الْبَصْرِيُّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ رَبِيعَةَ ، عَنْ عَبْدِ الْحَمِيدِ بْنِ جَعْفَرٍ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ عِرَاكِ بْنِ مَالِكٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَقَامَ بِمَكَّةَ خَمْسَةَ عَشَرَ يُصَلِّي رَكْعَتَيْنِ رَكْعَتَيْنِ.

1453. ...İbn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ Məkkədə on beş gün qaldı və namazları iki rükət-iki rükət qıldı.

١٤٥٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الْمَلِكِ بْنِ زَنْجُوَيْهِ ، عَنْ عَبْدِ الرَّزَّاقِ ، عَنْ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي إِسْمَعِيلُ بْنُ مُحَمَّدِ بْنِ سَعْدٍ ، أَنَّ حُمَيْدَ بْنَ عَبْدِ الرَّحْمَنِ أَخْبَرَهُ ، أَنَّ السَّائِبَ بْنَ يَزِيدَ أَخْبَرَهُ ، أَنَّهُ سَمِعَ الْعَلاَءَ بْنَ الْحَضْرَمِيِّ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَمْكُثُ الْمُهَاجِرُ بَعْدَ قَضَاءِ نُسُكِهِ ثَلاَثًا.

1454. ...Rəvayət edilir ki, əl-Aləi ibn əl-Hədrami ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Mühacirlər Həcci bitirdikdən sonra Məkkədə üç gün qalırlar”.

١٤٥٥ - أَخْبَرَنَا أَبُو عَبْدِ الرَّحْمَنِ ، قَالَ : الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، فِي حَدِيثِهِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ حُمَيْدٍ ، عَنِ السَّائِبِ بْنِ يَزِيدَ ، عَنِ الْعَلاَءِ بْنِ الْحَضْرَمِيِّ ، قَالَ : قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَمْكُثُ الْمُهَاجِرُ بِمَكَّةَ بَعْدَ نُسُكِهِ ثَلاَثًا.

1455. ...Rəvayət edilir ki, əl-Aləi ibn əl-Hədrami ﵁ demişdir: “Peyğəmbər ﷺ belə buyurdu: “Mühacirlər Həcci bitirdikdən sonra Məkkədə üç gün qalırlar”.

١٤٥٦ - أَخْبَرَنِي أَحْمَدُ بْنُ يَحْيَى الصُّوفِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا الْعَلاَءُ بْنُ زُهَيْرٍ الأَزْدِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، أَنَّهَا اعْتَمَرَتْ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنَ الْمَدِينَةِ إِلَى مَكَّةَ حَتَّى إِذَا قَدِمَتْ مَكَّةَ ، قَالَتْ : يَا رَسُولَ اللهِ ، بِأَبِي أَنْتَ وَأُمِّي قَصَرْتَ ، وَأَتْمَمْتُ ، وَأَفْطَرْتَ ، وَصُمْتُ ، قَالَ : أَحْسَنْتِ يَا عَائِشَةُ ، وَمَا عَابَ عَلَيَّ.

1456. ...Rəvayət edilir ki, Aişə ﵂ Allah Elçisi ilə birlikdə Mədinədən Məkkəyə gedərək ümrə ziyarətini etdi. Məkkəyə çatdıqda dedi: “Ey Allahın Elçisi, atam-anam sənə fəda olsun! Sən namazları qısaltdın, mən

isə tam qıldım. Mən oruc tutmadım, sən isə oruc tutdun". Peyğəmbər ﷺ mənə irad tutmadı və dedi: "Sən gözəl etmisən, ey Aişə!"[1]

٥ - تَرْكُ التَّطَوُّعِ فِي السَّفَرِ

5-ci fəsil: Səfərdə sünnə namazlarının tərk edilməsi

١٤٥٧ - أَخْبَرَنِي أَحْمَدُ بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا الْعَلاَءُ بْنُ زُهَيْرٍ ، قَالَ : حَدَّثَنَا وَبَرَةُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : كَانَ ابْنُ عُمَرَ لاَ يَزِيدُ فِي السَّفَرِ عَلَى رَكْعَتَيْنِ ، لاَ يُصَلِّي قَبْلَهَا ، وَلاَ بَعْدَهَا ، فَقِيلَ لَهُ : مَا هَذَا ؟ قَالَ : هَكَذَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَصْنَعُ.

1457. ...Rəvayət edilir ki, Vəbəra ibn Abdur-Rahmən ﵀ demişdir: "İbn Ömər səfərdə qılınan iki rükət namaza heç bir şey əlavə etməz, ondan qabaq və ondan sonra da heç nə qılmazdı. Ona deyildi: "Bu nədir?" O dedi: "Mən Allah Elçisinin ﷺ belə etdiyini görmüşəm".

١٤٥٨ - أَخْبَرَنِي نُوحُ بْنُ حَبِيبٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عِيسَى بْنُ حَفْصِ بْنِ عَاصِمٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : كُنْتُ مَعَ ابْنِ عُمَرَ فِي سَفَرٍ ، فَصَلَّى الظُّهْرَ وَالْعَصْرَ رَكْعَتَيْنِ ، ثُمَّ انْصَرَفَ إِلَى طِنْفِسَةٍ لَهُ فَرَأَى قَوْمًا يُسَبِّحُونَ ، قَالَ : مَا يَصْنَعُ هَؤُلاَءِ ؟ قُلْتُ : يُسَبِّحُونَ ، قَالَ : لَوْ كُنْتُ مُصَلِّيًا قَبْلَهَا أَوْ بَعْدَهَا لأَتْمَمْتُهَا ، صَحِبْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَكَانَ لاَ يَزِيدُ فِي السَّفَرِ عَلَى الرَّكْعَتَيْنِ ، وَأَبَا بَكْرٍ حَتَّى قُبِضَ ، وَعُمَرَ وَعُثْمَانَ رَضِيَ اللَّهُ عَنْهُمْ كَذَلِكَ.

1458. ...Rəvayət edilir ki, İsa ibn Həfs ibn Asim ﵀ demişdir: "Atam belə dedi: "Bir dəfə mən İbn Ömərlə birlikdə səfərdə idim. O, Zöhr və Əsr namazını iki rükət qıldı. Sonra xalçasına tərəf çevrildi. İnsanların namaz qıldıqlarını gördü və dedi: "Onlar nə edirlər?" Mən dedim: "Onlar nafilə namaz qılırlar". O dedi: "Əgər mən bundan qabaq və ya bundan sonra namaz qılsaydım, onu tamamlayardım (yəni fərz namazlarını dörd rükət qılsaydım, sünnə namazlarını da qılardım). Mən Allah Elçisi ﷺ ilə birlikdə yol çıxmışam. O, səfərdə iki rükətdən artıq namaz qılmazdı. Əbu Bəkr, Ömər və Osman da ölənə kimi belə etdilər".

[1] Hədis zəifdir.

# ١٦ - كِتَابُ الْكُسُوفِ

# 16. Kusuf (günəşin və ayın tutulması) kitabı

## ١ - كُسُوفُ الشَّمْسِ وَالْقَمَرِ

## 1-ci fəsil: Günəş və ay tutulması

١٤٥٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ يُونُسَ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ تَعَالَى لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يُخَوِّفُ بِهِمَا عِبَادَهُ.

1459. …Rəvayət edilir ki, Əbu Bəkrə ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, günəş və ay Uca Allahın varlığının əlamətlərindəndir. Onlar heç kimin ölməsi və ya dünyaya gəlməsi səbəbi ilə tutulmurlar. Allah ﷻ bununla Öz qullarını qorxudur”.

## ٢ - التَّسْبِيحُ وَالتَّكْبِيرُ وَالدُّعَاءُ عِنْدَ كُسُوفِ الشَّمْسِ

## 2-ci fəsil: Günəş tutulduqda təsbih, təkbir və dua etmək

١٤٦٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا أَبُو هِشَامٍ هُوَ الْمُغِيرَةُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، قَالَ : حَدَّثَنَا أَبُو مَسْعُودٍ الْجُرَيْرِيُّ ، عَنْ حَيَّانَ بْنِ عُمَيْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ سَمُرَةَ ، قَالَ : بَيْنَا أَنَا أَتَرَامَى بِأَسْهُمٍ لِي بِالْمَدِينَةِ إِذْ انْكَسَفَتِ الشَّمْسُ ، فَجَمَعْتُ أَسْهُمِي ، وَقُلْتُ : لأَنْظُرَنَّ مَا أَحْدَثَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي كُسُوفِ الشَّمْسِ ، فَأَتَيْتُهُ مِمَّا يَلِي ظَهْرَهُ ، وَهُوَ فِي الْمَسْجِدِ فَجَعَلَ يُسَبِّحُ ، وَيُكَبِّرُ ، وَيَدْعُو حَتَّى حُسِرَ عَنْهَا ، قَالَ : ثُمَّ قَامَ فَصَلَّى رَكْعَتَيْنِ وَأَرْبَعَ سَجَدَاتٍ.

1460. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Səmura ﵁ demişdir: “Mən Mədinədə öz oxlarımı ataraq məşq edirdim. Bu zaman günəş tutuldu. Mən oxlarımı toplayıb dedim: “Mən günəş tutulduqda Allah Elçisinin ﷺ nə etdiyinə baxmalıyam”. O, məsciddə idi. Günəş açılana qədər təsbih və təkbir edib dua etdi. Sonra qalxdı, dörd səcdədən ibarət olan iki rükət namaz qıldı”.

## ٣ - الأَمْرُ بِالصَّلاَةِ عِنْدَ كُسُوفِ الشَّمْسِ

## 3-cü fəsil: Günəş tutulduqda namaz qılmağın əmr edilməsi

١٤٦١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، أَنَّ عَبْدَ الرَّحْمَنِ بْنَ الْقَاسِمِ حَدَّثَهُ ، عَنْ أَبِيهِ

، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَخْسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنَّهُمَا آيَتَانِ مِنْ آيَاتِ اللهِ تَعَالَى ، فَإِذَا رَأَيْتُمُوهُمَا فَصَلُّوا.

1461. ...Abdullah ibn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, günəş və ay heç kimin ölməsi və ya dünyaya gəlməsi səbəbi ilə tutulmurlar. Onlar Uca Allahın varlığının əlamətlərindəndir. Onların (tutulmalarını) gördükdə namaz qılın!"

٤ - بَابُ الأَمْرِ بِالصَّلاَةِ عِنْدَ كُسُوفِ الْقَمَرِ

## 4-cü fəsil: Ay tutulduqda namaz qılmağın əmr olunması

١٤٣٢ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ إِسْمَعِيلَ ، قَالَ : حَدَّثَنِي قَيْسٌ ، عَنْ أَبِي مَسْعُودٍ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ ، وَلَكِنَّهُمَا آيَتَانِ مِنْ آيَاتِ اللهِ عَزَّ وَجَلَّ ، فَإِذَا رَأَيْتُمُوهُمَا فَصَلُّوا.

1462. …Rəvayət edilir ki, Əbu Məsud ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, Günəş və ay heç kimin ölməsinə görə tutulmurlar. Onlar Allahın ﷻ varlığının əlamətlərindəndir. Onları (tutulmalarını) gördükdə namaz qılın!"

٥ - بَابُ الأَمْرِ بِالصَّلاَةِ عِنْدَ الْكُسُوفِ حَتَّى تَنْجَلِيَ

## 5-ci fəsil: Günəş tutulduqda hava açılana qədər namaz qılmaq

١٤٦٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ كَامِلٍ الْمَرْوَزِيُّ ، عَنْ هُشَيْمٍ ، عَنْ يُونُسَ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ عَزَّ وَجَلَّ ، وَإِنَّهُمَا لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمُوهُمَا فَصَلُّوا حَتَّى تَنْجَلِيَ.

1463. ...Rəvayət edilir ki, Əbu Bəkrə ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, günəş və ay Allahın ﷻ varlığının dəlillərindən bir dəlildir. Onlar heç kimin ölməsi və ya doğulması səbəbi ilə tutulmur. Onların tutulmasını gördükdə hava açılana qədər namaz qılın".

١٤٦٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَمُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالاَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا أَشْعَثُ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، قَالَ : كُنَّا جُلُوسًا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَكَسَفَتِ الشَّمْسُ ، فَوَثَبَ يَجُرُّ ثَوْبَهُ ، فَصَلَّى رَكْعَتَيْنِ حَتَّى انْجَلَتْ.

1464. ...Rəvayət edilir ki, Əbu Bəkrə ﷺ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə oturmuşduq. Bu vaxt günəş tutuldu və Peyğəmbər ﷺ paltarını yığıb qalxdı və günəş açılana (hava açılana) qədər iki rükət namaz qıldı".

٦ - بَابُ الأَمْرِ بِالنِّدَاءِ لِصَلاَةِ الْكُسُوفِ

6-cı fəsil: Kusuf namazı üçün camaatın namaza çağırılması

١٤٦٥ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَمَرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُنَادِيًا يُنَادِي : أَنِ الصَّلاَةَ جَامِعَةً ، فَاجْتَمَعُوا وَاصْطَفُّوا ، فَصَلَّى بِهِمْ أَرْبَعَ رَكَعَاتٍ فِي رَكْعَتَيْنِ وَأَرْبَعَ سَجَدَاتٍ.

1465. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisinin ﷺ dövründə günəş tutulmuşdu. Peyğəmbər ﷺ insanları camaat namazına çağırmaq üçün bir carçıya əmr verdi. Camaat toplandı və səfə düzüldülər. Allah Elçisi ﷺ onlara dörd ruku və dörd səcdəsi olan iki rükətli namaz qıldırdı".

٧ - بَابُ الصُّفُوفِ فِي صَلاَةِ الْكُسُوفِ

7-ci fəsil: Kusuf namazında olan səflər (cərgələr)

١٤٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ خَالِدِ بْنِ خَلِيٍّ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ شُعَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّ عَائِشَةَ ، زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَتْ : كَسَفَتِ الشَّمْسُ فِي حَيَاةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الْمَسْجِدِ ، فَقَامَ فَكَبَّرَ ، وَصَفَّ النَّاسُ وَرَاءَهُ ، فَاسْتَكْمَلَ أَرْبَعَ رَكَعَاتٍ ، وَأَرْبَعَ سَجَدَاتٍ ، وَانْجَلَتِ الشَّمْسُ قَبْلَ أَنْ يَنْصَرِفَ.

1466. ...Urva ibn əz-Zubeyr ﵀ rəvayət edir ki, Peyğəmğəmbərin ﷺ zövcəsi Aişə demişdir: "Allah Elçisinin ﷺ yaşadığı dövrdə günəş tutulmuşdu. Allah Elçisi ﷺ (evindən) məscidə çıxdı və namaza dayanıb təkbir etdi. İnsanlar da onun arxasında səfdə dayandılar. O, dörd ruku və dörd səcdə etdi, namazı bitirməsindən əvvəl isə günəşin üzü açıldı".

٨ - بَابُ كَيْفَ صَلاَةُ الْكُسُوفِ

8-ci fəsil: Kusuf namazının necəliyi

١٤٦٧ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ إِسْمَعِيلَ ابْنِ عُلَيَّةَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ الثَّوْرِيُّ ، عَنْ حَبِيبِ بْنِ أَبِي ثَابِتٍ ، عَنْ طَاوُسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى عِنْدَ كُسُوفِ الشَّمْسِ ثَمَانِيَ رَكَعَاتٍ ، وَأَرْبَعَ سَجَدَاتٍ ، وَعَنْ عَطَاءٍ مِثْلُ ذَلِكَ.

1467. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ günəş tutulan zaman səkkiz rukusu və dörd səcdəsi olan bir namaz qıldı. Ətadan da bu cür rəvayət olunmuşdur.[1]

١٤٦٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنَا حَبِيبُ بْنُ أَبِي ثَابِتٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ صَلَّى فِي كُسُوفٍ فَقَرَأَ ، ثُمَّ رَكَعَ ، ثُمَّ قَرَأَ ، ثُمَّ رَكَعَ ، ثُمَّ قَرَأَ ، ثُمَّ رَكَعَ ، ثُمَّ قَرَأَ ، ثُمَّ رَكَعَ ، ثُمَّ سَجَدَ ، وَالأُخْرَى مِثْلُهَا.

1468. ...İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ günəşin və ya ayın tutulması namazını qıldıqda Quran oxudu, sonra ruku etdi. Sonra qalxıb Quran oxudu, sonra ruku etdi. Sonra qalxıb Quran oxudu, sonra ruku etdi. Sonra qalxıb Quran oxudu, sonra ruku etdi. Sonra səcdə etdi. Bundan sonrakı rükətdə də belə etdi.[2]

## ٩ - نَوْعٌ آخَرُ مِنْ صَلاَةِ الْكُسُوفِ عَنِ ابْنِ عَبَّاسٍ

## 9-cu fəsil: Kusuf namazının başqa bir növü

١٤٦٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنِ ابْنِ نَمِرٍ وَهُوَ عَبْدُ الرَّحْمَنِ بْنُ نَمِرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ كَثِيرِ بْنِ عَبَّاسٍ وَأَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَخْبَرَنِي كَثِيرُ بْنُ عَبَّاسٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى يَوْمَ كَسَفَتِ الشَّمْسُ أَرْبَعَ رَكَعَاتٍ فِي رَكْعَتَيْنِ وَأَرْبَعَ سَجَدَاتٍ.

1469. ...Abdullah ibn Abbas رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ günəş tutulduğu gün dörd ruku və dörd səcdəsi olan iki rükətli namaz qıldı.

## ١٠ - نَوْعٌ آخَرُ مِنْ صَلاَةِ الْكُسُوفِ

## 10-cu fəsil: Kusuf namazının başqa bir növü

١٤٧٠ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : أَخْبَرَنِي ابْنُ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، قَالَ : سَمِعْتُ عُبَيْدَ بْنَ عُمَيْرٍ يُحَدِّثُ ، قَالَ : حَدَّثَنِي مَنْ أُصَدِّقُ ، فَظَنَنْتُ أَنَّهُ يُرِيدُ عَائِشَةَ ، أَنَّهَا قَالَتْ : كَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَامَ بِالنَّاسِ قِيَامًا شَدِيدًا ، يَقُومُ بِالنَّاسِ ، ثُمَّ يَرْكَعُ ، ثُمَّ يَقُومُ ، ثُمَّ يَرْكَعُ ، ثُمَّ يَقُومُ ، ثُمَّ يَرْكَعُ ، فَرَكَعَ رَكْعَتَيْنِ فِي كُلِّ رَكْعَةٍ ثَلاَثَ رَكَعَاتٍ ، رَكَعَ الثَّالِثَةَ ، ثُمَّ سَجَدَ حَتَّى إِنَّ رِجَالاً يَوْمَئِذٍ يُغْشَى عَلَيْهِمْ ، حَتَّى إِنَّ سِجَالَ الْمَاءِ لَتُصَبُّ عَلَيْهِمْ مِمَّا قَامَ بِهِمْ ، يَقُولُ إِذَا رَكَعَ : اللَّهُ أَكْبَرُ ، وَإِذَا رَفَعَ رَأْسَهُ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، فَلَمْ يَنْصَرِفْ حَتَّى تَجَلَّتِ الشَّمْسُ ، فَقَامَ فَحَمِدَ

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.

اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، وَقَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنْ آيَتَانِ مِنْ آيَاتِ اللهِ يُخَوِّفُكُمْ بِهِمَا ، فَإِذَا كَسَفَا فَافْزَعُوا إِلَى ذِكْرِ اللهِ عَزَّ وَجَلَّ حَتَّى يَنْجَلِيَا.

1470. ...Rəvayət edilir ki, Ubeyd ibn Umeyr ﷺ demişdir: “Doğruluğuna inandığım biri – inandığım biri deməklə zənn edirəm ki, Aişəni qəsd edir - belə demşdir: “Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. Allah Elçisi ﷺ insanlarla brlikdə uzun bir namaza başladı, sonra ruku etdi, sonra qiyamda durdu. Sonra ruku etdi, sonra qiyamda durdu. Sonra ruku etdi və bu şəkildə iki rükət namaz qıldı. Hər rükətdə üç ruku etdi. Üçüncü rukunu etdikdən sonra səcdə etdi. Bəzi kişilər özlərindən getdilər. İş o yerə çatdı ki, onları ayıltmaq üçün üzərilərinə bir qab su tökdülər. Allah Elçisi ﷺ ruku etmək istədikdə “Allahu Əkbər”, başını qaldırmaq istədikdə isə “Səmi Alla:hu limən həmidəh” deyirdi. Onun namazı bitirməsindən əvvəl günəşin üzü açıldı. Namazdan sonra qalxaraq Allaha həmd-səna etdi və dedi: “Həqiqətən, günəş və ay heç kimin ölümünə və ya doğulmasına görə tutulmurlar. Onlar Allahın varlığının dəlillərindən bir dəlildir. Allah onlarla insanları qorxuzur. Onlar tutulduqda onların üzü açılana qədər zikr ilə Allaha ﷻ yönəlin”.[1]

١٤٧١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ - فِي صَلاَةِ الآيَاتِ - عَنْ عَطَاءٍ ، عَنْ عُبَيْدِ بْنِ عُمَيْرٍ ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى سِتَّ رَكَعَاتٍ فِي أَرْبَعِ سَجَدَاتٍ ، قُلْتُ لِمُعَاذٍ : عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : لاَ شَكَّ وَلاَ مِرْيَةَ.

1471. Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ altı ruku və dörd səcdədən ibarət olan namaz qıldı. Mən Muaza dedim: “Bunu Peyğəmbərdənmi ﷺ rəvayət edirsən?!” O dedi: “Bunun belə olmasına heç bir şübhə yoxdur”.[2]

### ١١ - نَوْعٌ آخَرُ مِنْهُ عَنْ عَائِشَةَ

### 11-ci fəsil: Kusuf namazının Aişədən رضي الله عنها rəvayət olunan başqa bir növü

١٤٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَسَفَتِ الشَّمْسُ فِي حَيَاةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَامَ فَكَبَّرَ ، وَصَفَّ النَّاسُ وَرَاءَهُ ، فَاقْتَرَأَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قِرَاءَةً طَوِيلَةً ، ثُمَّ كَبَّرَ فَرَكَعَ رُكُوعًا طَوِيلاً ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، رَبَّنَا وَلَكَ الْحَمْدُ ، ثُمَّ قَامَ

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.

فَاقْتَرَأَ قِرَاءَةً طَوِيلَةً هِيَ أَدْنَى مِنَ الْقِرَاءَةِ الأُولَى ، ثُمَّ كَبَّرَ فَرَكَعَ رُكُوعًا طَوِيلاً هُوَ أَدْنَى مِنَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ ، ثُمَّ سَجَدَ ، ثُمَّ فَعَلَ فِي الرَّكْعَةِ الأُخْرَى مِثْلَ ذَلِكَ ، فَاسْتَكْمَلَ أَرْبَعَ رَكَعَاتٍ ، وَأَرْبَعَ سَجَدَاتٍ ، وَانْجَلَتِ الشَّمْسُ قَبْلَ أَنْ يَنْصَرِفَ ، ثُمَّ قَامَ فَخَطَبَ النَّاسَ ، فَأَثْنَى عَلَى اللهِ عَزَّ وَجَلَّ بِمَا هُوَ أَهْلُهُ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ تَعَالَى لاَ يَخْسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمُوهُمَا فَصَلُّوا حَتَّى يُفْرَجَ عَنْكُمْ ، وَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : رَأَيْتُ فِي مَقَامِي هَذَا كُلَّ شَيْءٍ وُعِدْتُمْ ، لَقَدْ رَأَيْتُمُونِي أَرَدْتُ أَنْ آخُذَ قِطْفًا مِنَ الْجَنَّةِ حِينَ رَأَيْتُمُونِي جَعَلْتُ أَتَقَدَّمُ ، وَلَقَدْ رَأَيْتُ جَهَنَّمَ يَحْطِمُ بَعْضُهَا بَعْضًا حِينَ رَأَيْتُمُونِي تَأَخَّرْتُ ، وَرَأَيْتُ فِيهَا ابْنَ لُحَيٍّ وَهُوَ الَّذِي سَيَّبَ السَّوَائِبَ.

1472. ...Rəvayət edilir ki, Aişə (رضي الله عنها) demişdir: “Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. O, qalxıb təkbir etdi və insanlar da onun arxasında səf tutdular. Allah Elçisi ﷺ qiraətini[1] uzun etdi. Sonra təkbir edib uzun bir ruku etdi. Sonra başını qaldırdı və dedi: “Səmi Alla:hu limən həmidəh, Rabbənə: va ləkəl-həmd!”[2] Sonra qalxdı və birinci qiraətindən qısa, amma yenə uzun qiraət etdi. Sonra birinci rukudan qısa, amma yenə də uzun bir ruku etdi. Sonra dedi: “Səmi Alla:hu limən həmidəh, Rabbənə: və ləkəl-həmd”. Sonra səcdə etdi. O biri rükətdə də etdiklərini təkrar etdi. Dörd ruku və dörd səcdəni tamamladı. Allah Elçisi ﷺ namazını bitirmədən günəşin üzü açıldı. O, qalxdı və Allaha həmd-səna etdikdən sonra insanlara xitab etdi: “Həqiqətən, günəş və ay Allahın varlığının dəlillərindən bir dəlildir. Onlar heç kimin ölümünə və ya doğulmasına görə tutulmurlar. Siz onların tutulmasını gördükdə bu hal sizdən gedənə qədər namaz qılın!” Allah Elçisi ﷺ dedi: “Mən öz məqamımı və sizə vəd etdiyim hər şeyi gördüm. Siz mənim namazda önə getdiyimi gördüyünüzdə, mən Cənnətdən bir meyvə götürmək istəyirdim. Mən namazda arxaya çəkilmək istədikdə, Cəhənnəmin parçalarının bir-birinə girdiyini gördüm. Orada (Kəbəyə qurban deyilən dəvələrin) minilməməsi və yüklənməməsi adətini qoyan İbn Luheyi gördüm”.

١٤٧٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ ، عَنِ الأَوْزَاعِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَنُودِيَ : الصَّلاَةُ جَامِعَةٌ ، فَاجْتَمَعَ النَّاسُ ، فَصَلَّى بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَرْبَعَ رَكَعَاتٍ فِي رَكْعَتَيْنِ وَأَرْبَعَ سَجَدَاتٍ.

1473. ...Rəvayət edilir ki, Aişə (رضي الله عنها) demişdir: “Allah Elçisinin ﷺ zamanında günəş tutuldu və carçı “camaat namazına toplaşın!”- deyə nida etdi.

[1] Qiraət - namaz qılanda və ya digər vaxtlarda Qurani-Kərimin oxunması.
[2] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi! Ey Rəbbimiz, Sənə həmd olsun!

İnsanlar toplandıqda, Allah Elçisi ﷺ onlara iki rükətdə dörd ruku və dörd səcdədən ibarət olan namaz qıldırdı".

١٤٧٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَسَفَتِ الشَّمْسُ فِي عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالنَّاسِ ، فَقَامَ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ قَامَ فَأَطَالَ الْقِيَامَ وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ رَفَعَ فَسَجَدَ ، ثُمَّ فَعَلَ ذَلِكَ فِي الرَّكْعَةِ الأُخْرَى مِثْلَ ذَلِكَ ، ثُمَّ انْصَرَفَ وَقَدْ تَجَلَّتِ الشَّمْسُ ، فَخَطَبَ النَّاسَ ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ لاَ يَخْسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَادْعُوا اللَّهَ عَزَّ وَجَلَّ وَكَبِّرُوا وَتَصَدَّقُوا ، ثُمَّ قَالَ : يَا أُمَّةَ مُحَمَّدٍ ، مَا مِنْ أَحَدٍ أَغْيَرُ مِنَ اللهِ عَزَّ وَجَلَّ أَنْ يَزْنِيَ عَبْدُهُ أَوْ تَزْنِيَ أَمَتُهُ ، يَا أُمَّةَ مُحَمَّدٍ وَاللَّهِ لَوْ تَعْلَمُونَ مَا أَعْلَمُ لَضَحِكْتُمْ قَلِيلاً وَلَبَكَيْتُمْ كَثِيرًا.

1474. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. Allah Elçisi ﷺ də insanlara namaz qıldırdı. Namazın qiyamında uzun müddət qaldı. Sonra uzun bir ruku etdi. Sonra qiyama qalxdı və onu uzun etdi, lakin birinci qiyamdan qısa idi. Sonra uzun bir ruku etdi, lakin birinci rukudan qısa idi. Sonra dikəldi və səcdə etdi. Sonra qalxıb sonrakı rükəti buna oxşar şəkildə qıldı. Günəşin üzü açıldıqdan sonra namazı bitirdi və insanlara xitab edərək Allaha həmd-səna etdi, sonra da dedi: "Həqiqətən, günəş və ay Allahın varlığının dəlillərindən bir dəlildir. Onlar kiminsə ölümünə və ya dünyaya gəlməsinə görə tutulmurlar. Onların tutulduğunu gördükdə Allaha ﷻ dua edin, təkbir edin və sədəqə verin". Daha sonra buyurdu: "Ey Muhəmməd ümməti! Qullarının zina etməsinə Allahdan ﷻ daha çox qısqanan heç kim yoxdur. Ey Muhəmməd ümməti! Allaha and olsun ki, mənim bildiklərimi bilsəydininz, az gülüb çox ağlayardınız".

١٤٧٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنِ ابْنِ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، أَنَّ عَمْرَةَ حَدَّثَتْهُ ، أَنَّ عَائِشَةَ حَدَّثَتْهَا ، أَنَّ يَهُودِيَّةً أَتَتْهَا فَقَالَتْ : أَجَارَكِ اللَّهُ مِنْ عَذَابِ الْقَبْرِ ، قَالَتْ عَائِشَةُ : يَا رَسُولَ اللهِ ، إِنَّ النَّاسَ لَيُعَذَّبُونَ فِي الْقُبُورِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عَائِذًا بِاللَّهِ ، قَالَتْ عَائِشَةُ : إِنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ مَخْرَجًا فَخَسَفَتِ الشَّمْسُ ، فَخَرَجْنَا إِلَى الْحُجْرَةِ ، فَاجْتَمَعَ إِلَيْنَا نِسَاءٌ ، وَأَقْبَلَ إِلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَذَلِكَ ضَحْوَةً فَقَامَ قِيَامًا طَوِيلاً ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، فَقَامَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ دُونَ رُكُوعِهِ ، ثُمَّ سَجَدَ ، ثُمَّ قَامَ الثَّانِيَةَ ، فَصَنَعَ مِثْلَ ذَلِكَ ، إِلاَّ أَنَّ رُكُوعَهُ وَقِيَامَهُ دُونَ الرَّكْعَةِ الأُولَى ، ثُمَّ سَجَدَ وَتَجَلَّتِ الشَّمْسُ ، فَلَمَّا انْصَرَفَ قَعَدَ عَلَى الْمِنْبَرِ ، فَقَالَ فِيمَا يَقُولُ : إِنَّ النَّاسَ يُفْتَنُونَ فِي قُبُورِهِمْ كَفِتْنَةِ الدَّجَّالِ ، قَالَتْ عَائِشَةُ : كُنَّا نَسْمَعُهُ بَعْدَ ذَلِكَ يَتَعَوَّذُ مِنْ عَذَابِ الْقَبْرِ.

1475. ...Aişə ﵂ rəvayət edir ki, bir yəhudi onun yanına gəlib belə dedi: “Allah səni qəbir əzabından qorusun!” Aişə dedi: “Ey Allahın Elçisi, məgər insanlar qəbirlərində əzab olunacaqlar?” Allah Elçisi ﷺ dedi: “(Qəbir əzabından) Allaha sığınıram!” Aişə dedi: “Peyğəmbər ﷺ bayıra çıxdı, bu zaman günəş tutuldu. Biz də otaqlarımızdan çıxdıq, qadınlar da ətrafıma toplandı”. Allah Elçisi ﷺ bizə tərəf çevrildi. Bu hadisə də səhər tezdən baş vermişdi. O, namaz qılaraq uzun bir qiyam etdi. Sonra uzun bir ruku etdi. Sonra başını rukudan qaldırdı və əvvəlkindən daha qısa qiyamda durdu. Sonra əvvəlkindən qısa ruku etdi. Sonra səcdə etdi. Sonra ikincü rükəti də bunun kimi qıldı. Amma qiyam və rukuları əvvəlkilərdən qısa etdi. Sonra səcdə etdi. Bu vaxt günəşin üzü açıldı. O, namazı bitirdikdən sonra minbərə qalxdı və dedi: “Həqiqətən, insanlar qəbirlərində Məsih Dəccalın fitnəsi kimi imtahan olunacaqlar”. Aişə dedi: “Biz onun qəbir əzabından Allaha sığındığını eşidirdik”.

## ١٢ - نَوْعٌ آخَرُ

## 12-ci fəsil: Kusuf namazının başqa bir növü

١٤٧٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ هُوَ الأَنْصَارِيُّ ، قَالَ : سَمِعْتُ عَمْرَةَ ، قَالَتْ : سَمِعْتُ عَائِشَةَ ، تَقُولُ : جَاءَتْنِي يَهُودِيَّةٌ تَسْأَلُنِي ، فَقَالَتْ : أَعَاذَكِ اللَّهُ مِنْ عَذَابِ الْقَبْرِ ، فَلَمَّا جَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قُلْتُ : يَا رَسُولَ اللهِ ، أَيُعَذَّبُ النَّاسُ فِي الْقُبُورِ ؟ فَقَالَ : عَائِذًا بِاللَّهِ ، فَرَكِبَ مَرْكَبًا — يَعْنِي — وَانْخَسَفَتِ الشَّمْسُ ، فَكُنْتُ بَيْنَ الْحُجَرِ مَعَ نِسْوَةٍ ، فَجَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ مَرْكَبِهِ فَأَتَى مُصَلاَّهُ ، فَصَلَّى بِالنَّاسِ فَقَامَ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ قَامَ قِيَامًا أَيْسَرَ مِنْ قِيَامِهِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ أَيْسَرَ مِنْ رُكُوعِهِ الأَوَّلِ ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَقَامَ أَيْسَرَ مِنْ قِيَامِهِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ أَيْسَرَ مِنْ رُكُوعِهِ الأَوَّلِ ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَقَامَ أَيْسَرَ مِنْ قِيَامِهِ الأَوَّلِ ، فَكَانَتْ أَرْبَعَ رَكَعَاتٍ وَأَرْبَعَ سَجَدَاتٍ وَانْجَلَتِ الشَّمْسُ ، فَقَالَ : إِنَّكُمْ تُفْتَنُونَ فِي الْقُبُورِ كَفِتْنَةِ الدَّجَّالِ ، قَالَتْ عَائِشَةُ : فَسَمِعْتُهُ بَعْدَ ذَلِكَ يَتَعَوَّذُ مِنْ عَذَابِ الْقَبْرِ.

1476. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Bir yəhudi onun yanına gəlib belə dedi: “Allah səni qəbir əzabından qorusun!” Allah Elçisi ﷺ gəldikdə, mən ona dedim: “Ey Allahın Elçisi, insanlar qəbirlərində əzab olunacaqlarmı?” Allah Elçisi ﷺ dedi: “(Qəbir əzabından) Allaha sığınıram!” O, bir miniyə mindi və bu zaman günəş tutuldu. Mən qadınlarla birlikdə otaqlarımızın arasında idik. Allah Elçisi ﷺ miniklə gəldi və insanlarla birlikdə namaz qıldı. Qiyamı uzun etdi, sonra uzun bir ruku etdi. Sonra başını rukudan qaldırdı və uzun bir qiyamda durdu. Sonra ruku etdi. Sonra uzun bir səcdə etdi. Sonra qiyama durdu, lakin ilk qiyamdan qısa etdi. Sonra

uzun bir ruku etdi, lakin bu, birinci rukudan qısa idi. Sonra uzun bir qiyam etdi, lakin bu, birinci qiyamdan qısa idi. Sonra uzun bir ruku etdi, lakin bu, birinci rukudan qısa idi. Sonra başını qaldırdı və birinci qiyamdan qısa olan qiyam etdi. Bu şəkildə dörd ruku və dörd səcdə etdi. Bu vaxt günəşin üzü açıldı və o dedi: “Həqiqətən, siz qəbirlərinizdə Dəccalın fitnəsi kimi imtahan olunacaqsınız”. Aişə dedi: “Mən bundan sonra onun qəbir əzabından Allaha sığındığını eşitdim”.

١٤٧٧ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ الرَّحِيمِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ عُيَيْنَةَ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى فِي كُسُوفٍ فِي صُفَّةِ زَمْزَمَ أَرْبَعَ رَكَعَاتٍ فِي أَرْبَعِ سَجَدَاتٍ.

1477. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ Zəm-zəm quyusunun yanında dörd ruku və dörd səcdədən ibarət olan (günəş) tutulması namazını qıldı.[1]

١٤٧٨ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا أَبُو عَلِيٍّ الْحَنَفِيُّ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، صَاحِبُ الدَّسْتَوَائِيِّ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : كَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي يَوْمٍ شَدِيدِ الْحَرِّ ، فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِأَصْحَابِهِ ، فَأَطَالَ الْقِيَامَ حَتَّى جَعَلُوا يَخِرُّونَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ ، ثُمَّ رَفَعَ فَأَطَالَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ ، ثُمَّ رَفَعَ فَأَطَالَ ، ثُمَّ سَجَدَ سَجْدَتَيْنِ ، ثُمَّ قَامَ فَصَنَعَ نَحْوًا مِنْ ذَلِكَ ، وَجَعَلَ يَتَقَدَّمُ ، ثُمَّ جَعَلَ يَتَأَخَّرُ فَكَانَتْ أَرْبَعَ رَكَعَاتٍ ، وَأَرْبَعَ سَجَدَاتٍ ، كَانُوا يَقُولُونَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَخْسِفَانِ إِلاَّ لِمَوْتِ عَظِيمٍ مِنْ عُظَمَائِهِمْ ، وَإِنَّهُمَا آيَتَانِ مِنْ آيَاتِ اللهِ يُرِيكُمُوهُمَا ، فَإِذَا انْخَسَفَتْ فَصَلُّوا حَتَّى تَنْجَلِيَ.

1478. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: “Allah Elçisinin ﷺ zamanında isti bir gündə günəş tutulmuşdu. Allah Elçisi ﷺ səhabələri ilə birlikdə namaz qıldı və qiyamı elə uzun etdi ki, bəzi insanlar yorğunluqdan yıxılırdı. Sonra uzun bir ruku etdi. Sonra dikəldi və uzun müddət bu halda qaldı. Sonra yenə uzun bir ruku etdi. Sonra dikəldi və uzun müddət bu halda qaldı. Sonra iki dəfə səcdə etdi. Sonra qalxdı və (daha bir rükət qılaraq) bunun kimi təkrar etdi. Gah qabağa gedir, gah da arxaya çəkilirdi. Bu cür dörd ruku və dörd səcdə etdi. Camaat belə deyirdi: “Günəş və ay böyük insanlardan kiminsə ölümünə görə tutulur”. Peyğəmbər ﷺ dedi: “Həqiqətən, onlar Allahın varlığının dəlillərindəndir ki, onları sizə göstərir. Onlar tutulduqda, açılana qədər namaz qılın!”

[1] “Zəm-zəm quyusunun yanında” hissəsi səhih deyil.

## ١٣ - نَوْعٌ آخَرُ

## 13-cü fəsil: Kusuf namazının başqa bir növü

١٤٧٩ - أَخْبَرَنِي مَحْمُودُ بْنُ خَالِدٍ ، عَنْ مَرْوَانَ ، قَالَ : حَدَّثَنِي مُعَاوِيَةُ بْنُ سَلاَّمٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : خَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَمَرَ فَنُودِيَ : الصَّلاَةُ جَامِعَةٌ ، فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالنَّاسِ رَكْعَتَيْنِ وَسَجْدَةً ، ثُمَّ قَامَ فَصَلَّى رَكْعَتَيْنِ وَسَجْدَةً ، قَالَتْ عَائِشَةُ : مَا رَكَعْتُ رُكُوعًا قَطُّ وَلاَ سَجَدْتُ سُجُودًا قَطُّ كَانَ أَطْوَلَ مِنْهُ ،. خَالَفَهُ مُحَمَّدُ بْنُ حِمْيَرَ.

1479. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. O, "camaat namazına toplaşın!"- deyə nida etməyi əmr etdi. Allah Elçisi ﷺ insanlara (birinci rükətdə) iki rukusu və bir səcdəsi olan namaz qıldırdı. Sonra qalxıb yenə iki rukusu və bir səcdəsi olan namaz qıldırdı. Aişə deyir: "Mən bundan qabaq bu rukudan və səcdədən uzununu etməmişdim".

١٤٨٠ - أَخْبَرَنَا يَحْيَى بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا ابْنُ حِمْيَرَ ، عَنْ مُعَاوِيَةَ بْنِ سَلاَّمٍ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي طُعْمَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : كَسَفَتِ الشَّمْسُ ، فَرَكَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَيْنِ وَسَجْدَتَيْنِ ، ثُمَّ قَامَ فَرَكَعَ رَكْعَتَيْنِ وَسَجْدَتَيْنِ ، ثُمَّ جُلِّيَ عَنِ الشَّمْسِ ، وَكَانَتْ عَائِشَةُ تَقُولُ : مَا سَجَدَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سُجُودًا ، وَلاَ رَكَعَ رُكُوعًا أَطْوَلَ مِنْهُ ،. خَالَفَهُ عَلِيُّ بْنُ الْمُبَارَكِ.

1480. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "Günəş tutulduqda Allah Elçisi ﷺ bir rükətdə iki ruku və iki səcdə etdi. Sonra qalxıb bir rükətdə də iki ruku və iki səcdə etdi. Sonra günəş açıldı. Aişə deyir: "Allah Elçisi ﷺ bu səcdələrdən və rukulardan uzun səcdə və ruku etməmişdi".

١٤٨١ - أَخْبَرَنَا أَبُو بَكْرِ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا أَبُو زَيْدٍ سَعِيدُ بْنُ الرَّبِيعِ ، قَالَ : حَدَّثَنَا عَلِيُّ بْنُ الْمُبَارَكِ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، قَالَ : حَدَّثَنِي أَبُو حَفْصَةَ ، مَوْلَى عَائِشَةَ ، أَنَّ عَائِشَةَ أَخْبَرَتْهُ ، أَنَّهُ لَمَّا كَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تَوَضَّأَ ، وَأَمَرَ فَنُودِيَ : أَنَّ الصَّلاَةَ جَامِعَةٌ ، فَقَامَ فَأَطَالَ الْقِيَامَ فِي صَلاَتِهِ ، قَالَتْ عَائِشَةُ : فَحَسِبْتُ قَرَأَ سُورَةَ الْبَقَرَةِ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ قَامَ مِثْلَ مَا قَامَ وَلَمْ يَسْجُدْ ، ثُمَّ رَكَعَ فَسَجَدَ ، ثُمَّ قَامَ فَصَنَعَ مِثْلَ مَا صَنَعَ ، رَكْعَتَيْنِ وَسَجْدَةً ، ثُمَّ جَلَسَ وَجُلِّيَ عَنِ الشَّمْسِ.

1481. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. Allah Elçisi ﷺ dəstəmaz aldı və carçıya camaat namazı üçün çağırış etməyi əmr etdi. Namaza durdu və qiyamını uzun etdi. Aişə deyir: "Mən hesab edirəm ki, o, "əl-Bəqərə" surəsini oxuyurdu". Sonra uzun bir ruku

etdi. Sonra dedi: "Səmi Alla:hu limən həmidəh!" Sonra eyni şəkildə qiyamda durdu və səcdə etmədi. Sonra yenə ruku və səcdə etdi. Sonra qalxaraq bundan əvvəl etdiyi kimi etdi. Sonra iki ruku və səcdə etdi. Sonra oturdu və bu əsnada günəşin üzü açıldı".

## ١٤ - نَوْعٌ آخَرُ

## 14-cü fəsil: Kusuf namazının başqa bir növü

١٤٨٢ - أَخْبَرَنَا هِلاَلُ بْنُ بِشْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ عَبْدِ الصَّمَدِ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، قَالَ : حَدَّثَنِي أَبِي السَّائِبُ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عَمْرٍو حَدَّثَهُ ، قَالَ : انْكَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى الصَّلاَةِ وَقَامَ الَّذِينَ مَعَهُ ، فَقَامَ قِيَامًا فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ وَسَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ وَجَلَسَ فَأَطَالَ الْجُلُوسَ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ وَقَامَ فَصَنَعَ فِي الرَّكْعَةِ الثَّانِيَةِ مِثْلَ مَا صَنَعَ فِي الرَّكْعَةِ الأُولَى مِنَ الْقِيَامِ وَالرُّكُوعِ وَالسُّجُودِ وَالْجُلُوسِ ، فَجَعَلَ يَنْفُخُ فِي آخِرِ سُجُودِهِ مِنَ الرَّكْعَةِ الثَّانِيَةِ ، وَيَبْكِي وَيَقُولُ : لَمْ تَعِدْنِي هَذَا وَأَنَا فِيهِمْ ، لَمْ تَعِدْنِي هَذَا وَنَحْنُ نَسْتَغْفِرُكَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ وَانْجَلَتِ الشَّمْسُ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَخَطَبَ النَّاسَ ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ عَزَّ وَجَلَّ فَإِذَا رَأَيْتُمْ كُسُوفَ أَحَدِهِمَا فَاسْعَوْا إِلَى ذِكْرِ اللهِ عَزَّ وَجَلَّ ، وَالَّذِي نَفْسُ مُحَمَّدٍ بِيَدِهِ لَقَدْ أُدْنِيَتِ الْجَنَّةُ مِنِّي ، حَتَّى لَوْ بَسَطْتُ يَدِي لَتَعَاطَيْتُ مِنْ قُطُوفِهَا ، وَلَقَدْ أُدْنِيَتِ النَّارُ مِنِّي ، حَتَّى لَقَدْ جَعَلْتُ أَتَّقِيهَا خَشْيَةَ أَنْ تَغْشَاكُمْ ، حَتَّى رَأَيْتُ فِيهَا امْرَأَةً مِنْ حِمْيَرَ تُعَذَّبُ فِي هِرَّةٍ رَبَطَتْهَا ، فَلَمْ تَدَعْهَا تَأْكُلُ مِنْ خَشَاشِ الأَرْضِ ، فَلاَ هِيَ أَطْعَمَتْهَا وَلاَ هِيَ سَقَتْهَا حَتَّى مَاتَتْ ، فَلَقَدْ رَأَيْتُهَا تَنْهَشُهَا إِذَا أَقْبَلَتْ ، وَإِذَا وَلَّتْ تَنْهَشُ أَلْيَتَهَا ، وَحَتَّى رَأَيْتُ فِيهَا صَاحِبَ السِّبْتِيَّتَيْنِ أَخَا بَنِي الدَّعْدَاعِ يُدْفَعُ بِعَصًا ذَاتِ شُعْبَتَيْنِ فِي النَّارِ ، وَحَتَّى رَأَيْتُ فِيهَا صَاحِبَ الْمِحْجَنِ ، الَّذِي كَانَ يَسْرِقُ الْحَاجَّ بِمِحْجَنِهِ مُتَّكِئًا عَلَى مِحْجَنِهِ فِي النَّارِ ، يَقُولُ : أَنَا سَارِقُ الْمِحْجَنِ.

1482. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. Allah Elçisi ﷺ namaza durdu, onunla birlikdə olanlar da namaza durdular. O, qiyamı uzun etdi. Sonra ruku etdi və rukusunu uzun etdi. Sonra başını qaldıraraq dikəldi və səcdə etdi. Səcdəsini də uzun etdi. Sonra başını qaldırıb oturdu və uzun bir oturuş etdi. Sonra yenə səcdə etdi. Bu səcdəsini də uzun etdi. Sonra qalxdı və ikinci rükəti də əvvəlki rükətin qiyamı, rukusu, səcdəsi və oturuşu kimi uzadaraq qıldı. İkinci rükətin səcdəsində dərindən nəfəs alaraq ağlayır və belə deyirdi: "Mən onların arasında ikən bunu vəd etməmişdin, biz bağışlanma dilədiyimiz müddətdə bunu bizə vəd etməmişdin!" Sonra başını qaldırdı və günəşin üzü açıldı. Namazdan qalxaraq camaata xitab etdi, Allaha həmd edib Onu təriflədikdən sonra belə buyurdu: "Həqiqətən, günəş və ay Allahın ﷻ varlığının dəlillərindən bir dəlildir. Onların tutulduğunu gördükdə Allahı ﷻ zikr etməyə tələsin! Muhəmmədin canı Əlində

Olana and olsun ki, mənə Cənnət yaxınlaşdırıldı və əlimi uzatsaydım, ondan bir şey götürərdim. Artıq mənə Cəhənnəm də yaxınlaşdırıldı və mən sizə toxunar deyə ondan çəkindim. Mən orada bir qadın gördüm ki, bir pişiyi tutub bağlı yerdə saxladığına görə ona əzab verilir. Pişiyi yerin həşəratlarından yeməyə qoymamış və özü də onu yedizdirməmişdi. Mən gördüm ki, pişik qadını o tərəf-bu tərəfdən cırmaqlayır. Həmçinin mənim qurbanlıq dəvələrimi oğurlayanı - Bəni əd-Dadəa tayfasından olan şəxsi də gördüm. Od içində dəyənəklə təqib olunurdular. Həmçinin Cəhənnəmdə əyri əsası ilə həcc edənlərdən oğurluq edən birisini də gördüm. O, od içində öz əsasına söykənərək belə deyirdi: "Mən əsa ilə oğurluq edənəm".

١٤٨٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ الْعَظِيمِ ، قَالَ : حَدَّثَنِي إِبْرَاهِيمُ سَبَلاَنُ ، قَالَ : حَدَّثَنَا عَبَّادُ بْنُ عَبَّادٍ الْمُهَلَّبِيُّ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : كَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَامَ فَصَلَّى لِلنَّاسِ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ قَامَ فَأَطَالَ الْقِيَامَ وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ رَفَعَ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ وَهُوَ دُونَ السُّجُودِ الأَوَّلِ ، ثُمَّ قَامَ فَصَلَّى رَكْعَتَيْنِ وَفَعَلَ فِيهِمَا مِثْلَ ذَلِكَ ، ثُمَّ سَجَدَ سَجْدَتَيْنِ يَفْعَلُ فِيهِمَا مِثْلَ ذَلِكَ حَتَّى فَرَغَ مِنْ صَلاَتِهِ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ ، وَإِنَّهُمَا لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَافْزَعُوا إِلَى ذِكْرِ اللهِ عَزَّ وَجَلَّ وَإِلَى الصَّلاَةِ.

1483. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. O, qalxıb insanlarla birlikdə namaz qıldı və qiyamı uzun etdi. Sonra ruku etdi və rukunu da uzun etdi. Sonra qiyama qalxdı və onu uzun etdi, lakin bu qiyam birinci qiyamdan qısa idi. Sonra ruku etdi, lakin bu ruku birinci rukudan qısa idi. Sonra uzun bir səcdə etdi. Sonra dikəldi və daha bir səcdə etdi, lakin bu səcdə əvvəlkindən qısa idi. Sonra qalxıb buna oxşar daha bir rükət qıldı. Sonra iki dəfə səcdə etdi və onlarda da bundan qabaqkıları etdi və namazı bitirdi. Sonra dedi: "Həqiqətən, günəş və ay Allahın varlığının dəlillərindən bir dəlildir. Onlar kiminsə ölümü və ya dünyaya gəlməsinə görə tutulmurlar. Onların tutulduğunu gördükdə, Allahı ﷻ zikr etməyə və namaz qılmağa tələsin!"

## ١٥ - نَوْعٌ آخَرُ

## 15-ci fəsil: Kusuf namazının başqa bir növü

١٤٨٤ - أَخْبَرَنَا هِلاَلُ بْنُ الْعَلاَءِ بْنِ هِلاَلٍ ، قَالَ : حَدَّثَنَا الْحُسَيْنُ بْنُ عَيَّاشٍ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا الأَسْوَدُ بْنُ قَيْسٍ ، قَالَ : حَدَّثَنِي ثَعْلَبَةُ بْنُ عَبَّادٍ الْعَبْدِيُّ مِنْ أَهْلِ الْبَصْرَةِ أَنَّهُ شَهِدَ خُطْبَةً يَوْمًا لِسَمُرَةَ بْنِ جُنْدُبٍ ، فَذَكَرَ فِي خُطْبَتِهِ حَدِيثًا عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ سَمُرَةُ بْنُ جُنْدُبٍ : بَيْنَا أَنَا يَوْمًا وَغُلاَمٌ مِنَ الأَنْصَارِ نَرْمِي غَرَضَيْنِ لَنَا عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ

عَلَيْهِ وَسَلَّمَ ، حَتَّى إِذَا كَانَتِ الشَّمْسُ قِيدَ رُمْحَيْنِ أَوْ ثَلاَثَةٍ فِي عَيْنِ النَّاظِرِ مِنَ الأُفُقِ اسْوَدَّتْ ، فَقَالَ أَحَدُنَا لِصَاحِبِهِ : انْطَلِقْ بِنَا إِلَى الْمَسْجِدِ ، فَوَاللَّهِ لَيُحْدِثَنَّ شَأْنُ هَذِهِ الشَّمْسِ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي أُمَّتِهِ حَدَثًا ، قَالَ : فَدَفَعْنَا إِلَى الْمَسْجِدِ ، قَالَ : فَوَافَيْنَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ خَرَجَ إِلَى النَّاسِ ، قَالَ : فَاسْتَقْدَمَ فَصَلَّى ، فَقَامَ كَأَطْوَلِ قِيَامٍ قَامَ بِنَا فِي صَلاَةٍ قَطُّ ، مَا نَسْمَعُ لَهُ صَوْتًا ، ثُمَّ رَكَعَ بِنَا كَأَطْوَلِ رُكُوعٍ مَا رَكَعَ بِنَا فِي صَلاَةٍ قَطُّ ، مَا نَسْمَعُ لَهُ صَوْتًا ، ثُمَّ سَجَدَ بِنَا كَأَطْوَلِ سُجُودٍ مَا سَجَدَ بِنَا فِي صَلاَةٍ قَطُّ ، لاَ نَسْمَعُ لَهُ صَوْتًا ، ثُمَّ فَعَلَ ذَلِكَ فِي الرَّكْعَةِ الثَّانِيَةِ مِثْلَ ذَلِكَ ، قَالَ : فَوَافَقَ تَجَلِّي الشَّمْسِ جُلُوسَهُ فِي الرَّكْعَةِ الثَّانِيَةِ ، فَسَلَّمَ فَحَمِدَ اللَّهَ ، وَأَثْنَى عَلَيْهِ ، وَشَهِدَ أَنْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، وَشَهِدَ أَنَّهُ عَبْدُ اللهِ وَرَسُولُهُ مُخْتَصَرٌ.

1484. ...Rəvayət edilir ki, bir gün Bəsrə əhlindən olan Sələbə ibn Abbəd əl-Abdi ﷺ xütbədə Səmura ibn Cundəbə qulaq asırdı. Səmura ibn Cundəb bu xütbəsində Allah Elçisindən ﷺ bir hədis danışaraq dedi: “Allah Elçisinin ﷺ zamanında bir gün mən və ənsardan olan bir oğlan hədəfə ox atmaq üzrə məşq edirdik. Günəş üfüqdə iki və ya üç nizə hündürlükdə olarkən tutuldu. Birimiz digərinə dedi: “Tez məscidə gedək! Allaha and olsun ki, Allah Elçisi ﷺ bu məsələdə ümmətinə bir şeylər əmr edəcək”. Biz məscidə tərəf getik və bu anda Allah Elçisi ﷺ də (məscidə) insanlara tərəf gəlirdi. Allah Elçisi ﷺ önə keçdi və namaza durdu. Qiyamını bizim ən uzun gördüyümüz qiyam etdi. Namazda bundan qabaq belə qiyam etməmişdi. Ondan heç bir səs eşitmirdik. Sonra bizim gördüyümüz ən uzun rukunu etdi. Namazda bundan qabaq belə ruku etməmişdi. Yenə ondan heç nə eşitmirdik. Sonra bizim gördüyümüz ən uzun səcdəni etdi. Namazda bundan qabaq belə səcdə etməmişdi. Yenə ondan heç nə eşitmirdik. Sonra bunun kimi ikinci rükətdə də belə etdi. Sonra ikinci rükətin oturuşunda günəşin üzü açılmağa başladı. Sonra salam verdi, Allaha həmd və təriflər etdi. Allahdan başqa ibadətə layiq məbudun olmadığına və Muhəmmədin Allahın Elçisi ﷺ olduğuna şahidlik etdi”.[1]

## ١٦ - نَوْعٌ آخَرُ

## 16-cı fəsil: Kusuf namazının başqa bir növü

١٤٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَهَّابِ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ، قَالَ : انْكَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَخَرَجَ يَجُرُّ ثَوْبَهُ فَزِعًا ، حَتَّى أَتَى الْمَسْجِدَ ، فَلَمْ يَزَلْ يُصَلِّي بِنَا حَتَّى انْجَلَتْ ، فَلَمَّا انْجَلَتْ ، قَالَ : إِنَّ نَاسًا يَزْعُمُونَ أَنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ إِلاَّ لِمَوْتِ عَظِيمٍ مِنَ الْعُظَمَاءِ ، وَلَيْسَ كَذَلِكَ إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنَّهُمَا آيَتَانِ مِنْ آيَاتِ اللهِ عَزَّ وَجَلَّ ، إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ إِذَا بَدَا لِشَيْءٍ مِنْ خَلْقِهِ خَشَعَ لَهُ ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَصَلُّوا كَأَحْدَثِ صَلاَةٍ صَلَّيْتُمُوهَا مِنَ الْمَكْتُوبَةِ.

[1] Hədis zəifdir.

1485. …Rəvayət edilir ki, ən-Numan ibn Bəşir ﵁ demişdir: “Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. Allah Elçisi ﷺ təlaş içində və paltarını yuxarı çəkə-çəkə məscidə gəldi. Günəşin üzü açılana qədər bizimlə namaz qıldı. Günəşin üzü açıldıqda isə dedi: “İnsanlar elə fikirləşirlər ki, günəş və ay böyük insanlardan hansınınsa ölümünə görə tutulur. Bu, belə deyil. Şübhəsiz ki, günəş və ay heç kimin ölümünə və ya doğulmasına görə tutulmur. Onlar Allahın ﷻ varlığının dəlillərindən bir dəlildir. Allah ﷻ yaratdıqlarına bir şey etmək istədikdə, Ona tabe olurlar. Belə şey gördükdə, fərz namazlarını qıldığınız kimi namaz qılın!”[1]

١٤٨٦ - وأَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ عَاصِمٍ ، أَنَّ جَدَّهُ عُبَيْدَ اللهِ بْنَ الْوَازِعِ حَدَّثَهُ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ السَّخْتِيَانِيُّ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ قَبِيصَةَ بْنِ مُخَارِقٍ الْهِلاَلِيِّ ، قَالَ : كَسَفَتِ الشَّمْسُ وَنَحْنُ إِذْ ذَاكَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْمَدِينَةِ ، فَخَرَجَ فَزِعًا يَجُرُّ ثَوْبَهُ ، فَصَلَّى رَكْعَتَيْنِ أَطَالَهُمَا ، فَوَافَقَ انْصِرَافُهُ انْجِلاَءَ الشَّمْسِ ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ ، وَإِنَّهُمَا لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمْ مِنْ ذَلِكَ شَيْئًا فَصَلُّوا كَأَحْدَثِ صَلاَةٍ مَكْتُوبَةٍ صَلَّيْتُمُوهَا.

1486. ...Rəvayət edilir ki, Qabisa ibn Muxariq əl-Hilali ﵁ demişdir: “Biz Mədinədə Allah Elçisinin ﷺ yanında olduqda günəş tutuldu. Allah Elçisi ﷺ təlaş içində və (ayaqlarına maneçilik törətməmək üçün) libasının ətəyini bir qədər qaldıraraq gəldi. İki rükət uzun olan namaz qıldırdı. Onun namazı bitirməsi günəşin açılması ilə üst-üstə düşdü. O, Allahı həmd və tərif etdi, sonra da dedi: “Həqiqətən, günəş və ay Allahın varlığının dəlillərindən bir dəlildir. Onlar heç kimin ölümünə və ya doğulmasına görə tutulmur. Belə bir şey gördükdə, fərz namazlarını qıldığınız kimi namazlar qılın!”[2]

١٤٨٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُعَاذٌ وَهُوَ ابْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ قَبِيصَةَ الْهِلاَلِيِّ ، أَنَّ الشَّمْسَ انْخَسَفَتْ ، فَصَلَّى نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَيْنِ رَكْعَتَيْنِ حَتَّى انْجَلَتْ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْخَسِفَانِ لِمَوْتِ أَحَدٍ ، وَلَكِنَّهُمَا خَلْقَانِ مِنْ خَلْقِهِ ، وَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يُحْدِثُ فِي خَلْقِهِ مَا شَاءَ ، وَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ إِذَا تَجَلَّى لِشَيْءٍ مِنْ خَلْقِهِ يَخْشَعُ لَهُ ، فَأَيُّهُمَا حَدَثَ فَصَلُّوا حَتَّى يَنْجَلِيَ أَوْ يُحْدِثَ اللَّهُ أَمْرًا.

1487. ...Qabisa əl-Hilali ﵁ rəvayət edir ki, günəş tutulmuşdu və Allahın Peyğəmbəri ﷺ iki rükətdə iki rukulu namaz qıldı, sonra da belə buyurudu:

---

[1] Hədis zəifdir.

[2] Hədis zəifdir.

“Həqiqətən, günəş və ay kiminsə ölümünə görə tutulmur. Onlar Allahın yaratdığı iki məxluqdur. Allah ﷻ yaratdıqları arasında istədiyi dəyişikliyi edir. Allah ﷻ hansı məxluq üzərində bir dəyişiklik etmək istəsə, onlar buna boyun əyərlər. Onların hansınınsa tutulmasını gördükə hava açılana və ya Allah başqa bir şey əmr edənə qədər namaz qılın!”[1]

١٤٨٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ مُعَاذِ بْنِ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا خَسَفَتِ الشَّمْسُ وَالْقَمَرُ فَصَلُّوا كَأَحْدَثِ صَلاَةٍ صَلَّيْتُمُوهَا.

1488. ən-Numan ibn Bəşir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Günəş və ay tutulduqda, namazınızı ən gözəl şəkildə qılın!”[2]

١٤٨٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، عَنِ الْحَسَنِ بْنِ صَالِحٍ ، عَنْ عَاصِمٍ الأَحْوَلِ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى حِينَ انْكَسَفَتِ الشَّمْسُ مِثْلَ صَلاَتِنَا يَرْكَعُ وَيَسْجُدُ.

1489. ...Numan ibn Bəşir ﷺ rəvayət edir ki, günəş tutulduqda, Allah Elçisi ﷺ bizim namazımız kimi namaz qıldı, ruku və səcdə etdi.[3]

١٤٩٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنِ الْحَسَنِ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ خَرَجَ يَوْمًا مُسْتَعْجِلاً إِلَى الْمَسْجِدِ وَقَدْ انْكَسَفَتِ الشَّمْسُ ، فَصَلَّى حَتَّى انْجَلَتْ ، ثُمَّ قَالَ : إِنَّ أَهْلَ الْجَاهِلِيَّةِ كَانُوا يَقُولُونَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْخَسِفَانِ إِلاَّ لِمَوْتِ عَظِيمٍ مِنْ عُظَمَاءِ أَهْلِ الأَرْضِ ، وَإِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْخَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنَّهُمَا خَلِيقَتَانِ مِنْ خَلْقِهِ ، يُحْدِثُ اللَّهُ فِي خَلْقِهِ مَا يَشَاءُ ، فَأَيُّهُمَا انْخَسَفَ فَصَلُّوا حَتَّى يَنْجَلِيَ أَوْ يُحْدِثَ اللَّهُ أَمْرًا.

1490. ...Numan ibn Bəşir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bir gün tələsik məscidə gəldi. Bu zaman günəş tutulmuşdu. Hava açılana qədər namaz qıldı, sonra isə dedi: “Cahiliyyə insanları deyərdilər: “Günəş və ay yer üzünün böyük insanlarına görə tutulurlar”. Həqiqətən, günəş və ay heç kimin ölümünə və ya doğulmasına görə tutulmurlar. Onlar Allahın yaratdıqlarından bir məxluqdur. Allah Öz yaratdıqlarına istədiyini edir. Onlardan hansısa tutulduqda, açılana qədər və ya Allah başqa bir əmr edincəyə qədər namaz qılın”.[4]

---

[1] Hədis zəifdir.
[2] Hədis zəifdir.
[3] Hədis zəifdir.
[4] Hədis zəifdir.

١٤٩١ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا يُونُسُ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، قَالَ : كُنَّا عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَانْكَسَفَتِ الشَّمْسُ ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَجُرُّ رِدَاءَهُ حَتَّى انْتَهَى إِلَى الْمَسْجِدِ ، وَثَابَ إِلَيْهِ النَّاسُ ، فَصَلَّى بِنَا رَكْعَتَيْنِ ، فَلَمَّا انْكَشَفَتِ الشَّمْسُ ، قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ يُخَوِّفُ اللَّهُ عَزَّ وَجَلَّ بِهِمَا عِبَادَهُ ، وَإِنَّهُمَا لاَ يَخْسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَصَلُّوا حَتَّى يُكْشَفَ مَا بِكُمْ ، وَذَلِكَ أَنَّ ابْنًا لَهُ مَاتَ يُقَالُ لَهُ : إِبْرَاهِيمُ ، فَقَالَ لَهُ نَاسٌ فِي ذَلِكَ.

1491. ...Rəvayət edilir ki, Əbu Bəkrə ﵁ demişdir: "Biz Allah Elçisinin ﷺ yanında ikən günəş tutuldu. Allah Elçisi ﷺ (ayaqlarına maneçilik törətməmək üçün) libasının ətəyini bir qədər qaldıraraq məscidə gəldi. İnsanlar da ora toplandılar. O, bizə iki rükət namaz qıldırdı. Günəş açıldıqda isə belə buyurdu: "Həqiqətən, günəş və ay Allahın ﷻ varlığının dəlillərindən bir dəlildir. Allah ﷻ onlarla Öz qullarını qorxudur. Onlar kiminsə ölümünə və ya doğulmasına görə tutulmur. Onların tutulmasını gördükdə, hava açılana qədər namaz qılın". Onun oğlu var idi, adı da İbrahim idi. İnsanlar günəşin tutulmasını İbrahimin ölümü ilə əlaqələndirirdilər".

١٤٩٢ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ أَشْعَثَ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى رَكْعَتَيْنِ مِثْلَ صَلاَتِكُمْ هَذِهِ ، وَذَكَرَ كُسُوفَ الشَّمْسِ.

1492. ...Əbu Bəkrə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ günəş tutulan zaman sizin namazınız kimi iki rükət namaz qıldı.

### ١٧ - قَدْرُ الْقِرَاءَةِ فِي صَلاَةِ الْكُسُوفِ

### 17-ci fəsil: Kusuf namazında qiraət nə qədər olmaldır?

١٤٩٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ الْقَاسِمِ ، عَنْ مَالِكٍ ، قَالَ : حَدَّثَنِي زَيْدُ بْنُ أَسْلَمَ ، عَنْ عَطَاءِ بْنِ يَسَارٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، قَالَ : خَسَفَتِ الشَّمْسُ ، فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالنَّاسُ مَعَهُ ، فَقَامَ قِيَامًا طَوِيلاً ، قَرَأَ نَحْوًا مِنْ سُورَةِ الْبَقَرَةِ قَالَ : ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً ، ثُمَّ رَفَعَ فَقَامَ قِيَامًا طَوِيلاً وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ سَجَدَ ، ثُمَّ قَامَ قِيَامًا طَوِيلاً وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ رَفَعَ فَقَامَ قِيَامًا طَوِيلاً وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ سَجَدَ ، ثُمَّ انْصَرَفَ ، وَقَدْ تَجَلَّتِ الشَّمْسُ ، فَقَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ لاَ يَخْسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَاذْكُرُوا اللَّهَ عَزَّ وَجَلَّ قَالُوا : يَا رَسُولَ اللهِ ، رَأَيْنَاكَ تَنَاوَلْتَ شَيْئًا فِي مَقَامِكَ هَذَا ، ثُمَّ رَأَيْنَاكَ تَكَعْكَعْتَ ، قَالَ : إِنِّي رَأَيْتُ الْجَنَّةَ – أَوْ أُرِيتُ الْجَنَّةَ – فَتَنَاوَلْتُ مِنْهَا عُنْقُودًا ، وَلَوْ أَخَذْتُهُ لأَكَلْتُمْ مِنْهُ مَا بَقِيَتِ الدُّنْيَا ، وَرَأَيْتُ النَّارَ فَلَمْ أَرَ كَالْيَوْمِ مَنْظَرًا قَطُّ ، وَرَأَيْتُ أَكْثَرَ أَهْلِهَا النِّسَاءَ قَالُوا : لِمَ يَا رَسُولَ اللهِ ؟ قَالَ : بِكُفْرِهِنَّ ، قِيلَ : يَكْفُرْنَ بِاللَّهِ ؟ قَالَ : يَكْفُرْنَ الْعَشِيرَ ، وَيَكْفُرْنَ الإِحْسَانَ ، لَوْ أَحْسَنْتَ إِلَى إِحْدَاهُنَّ الدَّهْرَ ثُمَّ رَأَتْ مِنْكَ شَيْئًا قَالَتْ : مَا رَأَيْتُ مِنْكَ خَيْرًا قَطُّ.

1493. Rəvayət edilir ki, Abdullah ibn Abbas ﷠ demişdir: "Günəş tutulmuşdu və Allah Elçisi ﷺ namaz qıldı. İnsanlar da onunla birlikdə namaz qıldılar. O, uzun bir qiyam etdi və "əl-Bəqərə" surəsi qədər oxudu. Sonra uzun bir ruku etdi. Sonra qalxıb qiyamda durdu, lakin bu, ilk qiyamdan qısa idi. Sonra uzun bir ruku etdi, lakin bu ruku ilk rukudan qısa idi. Sonra səcdə etdi. Sonra uzun bir qiyam etdi, lakin bu qiyam əvvəlkindən qısa idi. Sonra uzun bir ruku etdi, lakin bu ruku ilk rukudan qısa idi. Sonra qalxıb qiyamda durdu, lakin bu, ilk qiyamdan qısa idi. Sonra uzun bir ruku etdi, lakin bu ruku ilk rukudan qısa idi. Sonra səcdə etdi, sonra da namazını bitirdi. Bu zaman günəşin üzü açılmışdı. Sonra dedi: "Həqiqətən, günəş və ay Allahın varlığının dəlillərindən bir dəlildir. Onlar kiminsə ölümünə və ya doğulmasına görə tutulmur. Siz bunu gördükdə Allahı ﷻ zikr edin!" Allah onlarla Öz qullarını qorxudur. Onların tutulmasını gördükdə hava açılana qədər namaz qılın!" Səhabələr eddilər: "Ey Allahın Elçisi! Biz gördük ki, sən namazda ikən sanki əlinlə nəyisə tutmaq istəyirsən. Sonra gördük ki, sən arxaya çəkilirsən". O dedi: "Mən Cənnəti gördüm – və ya Cənnət mən göstərildi. Ondan bir budaq götürmək istədim. Əgər bunu götürsəydim, dünya mövcud olduğu müddətdə siz bundan yeyərdiniz və bu salxım bitməzdi. Mən bundan əvvəl belə bir mənzərə görməmişdim. Belə ki, Cəhənnəm əhlinin çoxunun qadınlar olduğunu gördüm". Səhabələr dedilər: "Nəyə görə, ey Allahın Elçisi?" Allah Elçisi ﷺ dedi: "Onların küfrlərinə görə". Dedilər: "Onlar Allahamı küfr edirlər?" O dedi: "Onlar öz ailələrinə küfr edirlər. Onlara edilən yaxşılığa naşükürlük edirlər. Əgər sən onlara ömür boyu yaxşılıq etsən, sonra səndən başqa bir şey görsə, deyər: "Mən indiyə kimi səndən heç bir xeyir görmədim".

١٨ - بَابُ الْجَهْرِ بِالْقِرَاءَةِ فِي صَلاَةِ الْكُسُوفِ

18-ci fəsil: Kusuf namazında qiraəti səsli oxumaq

١٤٩٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا الْوَلِيدُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ نَمِرٍ ، أَنَّهُ سَمِعَ الزُّهْرِيَّ يُحَدِّثُ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ صَلَّى أَرْبَعَ رَكَعَاتٍ فِي أَرْبَعِ سَجَدَاتٍ ، وَجَهَرَ فِيهَا بِالْقِرَاءَةِ كُلَّمَا رَفَعَ رَأْسَهُ قَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ رَبَّنَا وَلَكَ الْحَمْدُ.

1494. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ dörd rukulu və dörd səcdəli namaz qıldı. Bu namazda qiraəti səsli etdi. Hər dəfə başını rukudan qaldır-

dıqda deyərdi: "Səmi Alla:hu limən həmidəh, Rabbənə: və ləkəl-həmd!"[1]

١٩ - تَرْكُ الْجَهْرِ فِيهَا بِالْقِرَاءَةِ

## 19-cu fəsil: Kusuf namazında qiraəti səssiz oxumaq

١٤٩٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَسْوَدِ بْنِ قَيْسٍ ، عَنِ ابْنِ عَبَّادٍ ، رَجُلٍ مِنْ بَنِي عَبْدِ الْقَيْسِ ، عَنْ سَمُرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِهِمْ فِي كُسُوفِ الشَّمْسِ لاَ نَسْمَعُ لَهُ صَوْتًا.

1495. …Səmura ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ onlarla günəşin tutulması namazını qıldı. Biz onun səsini (qiraət oxunuşu) eşitmədik.[2]

٢٠ - بَابُ الْقَوْلِ فِي السُّجُودِ فِي صَلاَةِ الْكُسُوفِ

## 20-ci fəsil: Kusuf namazında səcdələrdə deyilən sözlər

١٤٩٦ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ الْمِسْوَرِ الزُّهْرِيُّ ، قَالَ : حَدَّثَنَا غُنْدَرٌ ، عَنْ شُعْبَةَ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ أَبِيهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو ، قَالَ : كَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ فَأَطَالَ ـــ قَالَ شُعْبَةُ : وَأَحْسَبُهُ قَالَ : فِي السُّجُودِ نَحْوَ ذَلِكَ ـــ وَجَعَلَ يَبْكِي فِي سُجُودِهِ وَيَنْفُخُ وَيَقُولُ : رَبِّ لَمْ تَعِدْنِي هَذَا وَأَنَا أَسْتَغْفِرُكَ ، لَمْ تَعِدْنِي هَذَا وَأَنَا فِيهِمْ ، فَلَمَّا صَلَّى قَالَ : عُرِضَتْ عَلَيَّ الْجَنَّةُ حَتَّى لَوْ مَدَدْتُ يَدِي تَنَاوَلْتُ مِنْ قُطُوفِهَا ، وَعُرِضَتْ عَلَيَّ النَّارُ فَجَعَلْتُ أَنْفُخُ خَشْيَةَ أَنْ يَغْشَاكُمْ حَرُّهَا ، وَرَأَيْتُ فِيهَا سَارِقَ بَدَنَتَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَرَأَيْتُ فِيهَا أَخَا بَنِي دُعْدُعٍ سَارِقَ الْحَجِيجِ ، فَإِذَا فُطِنَ لَهُ قَالَ : هَذَا عَمَلُ الْمِحْجَنِ ، وَرَأَيْتُ فِيهَا امْرَأَةً طَوِيلَةً سَوْدَاءَ تُعَذَّبُ فِي هِرَّةٍ رَبَطَتْهَا ، فَلَمْ تُطْعِمْهَا وَلَمْ تَسْقِهَا ، وَلَمْ تَدَعْهَا تَأْكُلُ مِنْ خَشَاشِ الأَرْضِ حَتَّى مَاتَتْ ، وَإِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنَّهُمَا آيَتَانِ مِنْ آيَاتِ اللهِ ، فَإِذَا انْكَسَفَتْ إِحْدَاهُمَا ـــ أَوْ قَالَ : فَعَلَ أَحَدُهُمَا شَيْئًا مِنْ ذَلِكَ ـــ فَاسْعَوْا إِلَى ذِكْرِ اللهِ عَزَّ وَجَلَّ.

1496. …Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. Allah Elçisi ﷺ namaz qıldı və qiyamını uzun etdi. Sonra uzun bir ruku etdi. Sonra rukudan qalxdı və bunu uzun etdi". Hədisin ravisi Şöbə deyir: "Zənn edirəm ki, səcdəsini də uzun etdi". Səcdəsində ağlayır və üfürərək belə deyirdi: "Ya Rəbbim, mən bağışlanma dilədiyim müddətdə Sən bunu mənə vəd etməmişdin. Mən onların arasında olduğum müddətdə Sən bunu mənə vəd etməmişdin". Namazı bitirdikdən sonra isə dedi: "Cənnət (qarşıma) gətirildi, əlimi uzatsaydım, onun meyvələrindən dərərdim. Cəhənnəm də (qarşıma) gətirildi, onun

[1] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi! Ey Rəbbimiz, Sənə həmd olsun!
[2] Hədis zəifdir.

istisinin sizə toxunmasından qorxduğum üçün üfləməyə başladım. Orda mənim iki qurbanlıq inəyimi oğurlayanı gördüm. Həmçinin orda Bəni Dudu tayfasından olan, əsasının ucu ilə həcc edənlərdən oğurluq edənləri gördüm. Həmin şəxsə bu deyiləndə, deyərmiş: “Bu, mənim əsamın işidir (əsama ilişib)”. Mən orada uzun qara qadını gördüm. Ona bir pişiyə görə əzab verilirdi. O, pişiyi tutub bağlamış, onu yedizdirib-içizdirmirdi, ona su vermirdi. Buraxmırdı ki, yerdə olan həşəratlardan yesin. (Beləliklə də pişik) ölmüşdü. Həqiqətən, günəş və ay kiminsə ölümünə və ya dünyaya gəlməsinə görə tutulmur. Onlar Allahın varlığına sübut olan dəlillərdən bir dəlildir. Onlardan biri tutulduqda - və ya “onlardan belə bir hal gördükdə”- Allahı ﷻ zikr etməyə tələsin!”

٢١ - بَابُ التَّشَهُّدِ وَالتَّسْلِيمِ فِي صَلاَةِ الْكُسُوفِ

## 21-ci fəsil: Kusuf namazlarında təşəhhüd və salam

١٤٩٧ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرٍ ، عَنِ الْوَلِيدِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ نَمِرٍ ، أَنَّهُ سَأَلَ الزُّهْرِيَّ ، عَنْ سُنَّةِ صَلاَةِ الْكُسُوفِ ، فَقَالَ : أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : كَسَفَتِ الشَّمْسُ فَأَمَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلاً فَنَادَى : أَنِ الصَّلاَةَ جَامِعَةً ، فَاجْتَمَعَ النَّاسُ ، فَصَلَّى بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَكَبَّرَ ، ثُمَّ قَرَأَ قِرَاءَةً طَوِيلَةً ، ثُمَّ كَبَّرَ فَرَكَعَ رُكُوعًا طَوِيلاً مِثْلَ قِيَامِهِ أَوْ أَطْوَلَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، وَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ قَرَأَ قِرَاءَةً طَوِيلَةً هِيَ أَدْنَى مِنَ الْقِرَاءَةِ الأُولَى ، ثُمَّ كَبَّرَ فَرَكَعَ رُكُوعًا طَوِيلاً هُوَ أَدْنَى مِنَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ كَبَّرَ فَسَجَدَ سُجُودًا طَوِيلاً مِثْلَ رُكُوعِهِ أَوْ أَطْوَلَ ، ثُمَّ كَبَّرَ فَرَفَعَ رَأْسَهُ ، ثُمَّ كَبَّرَ فَسَجَدَ ، ثُمَّ كَبَّرَ ، فَقَامَ ، فَقَرَأَ قِرَاءَةً طَوِيلَةً هِيَ أَدْنَى مِنَ الأُولَى ، ثُمَّ كَبَّرَ ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً هُوَ أَدْنَى مِنَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ قَرَأَ قِرَاءَةً طَوِيلَةً وَهِيَ أَدْنَى مِنَ الْقِرَاءَةِ الأُولَى فِي الْقِيَامِ الثَّانِي ، ثُمَّ كَبَّرَ فَرَكَعَ رُكُوعًا طَوِيلاً دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ كَبَّرَ فَرَفَعَ رَأْسَهُ ، فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ ، ثُمَّ كَبَّرَ فَسَجَدَ أَدْنَى مِنْ سُجُودِهِ الأَوَّلِ ، ثُمَّ تَشَهَّدَ ، ثُمَّ سَلَّمَ فَقَامَ فِيهِمْ فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْخَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنَّهُمَا آيَتَانِ مِنْ آيَاتِ اللهِ ، فَأَيُّهُمَا خُسِفَ بِهِ أَوْ بِأَحَدِهِمَا فَافْزَعُوا إِلَى اللهِ عَزَّ وَجَلَّ بِذِكْرِ الصَّلاَةِ.

1497. …Rəvayət edilir ki, Abdur-Rahmən ibn Nəmr ﵁ əz-Zuhridən kusuf namazında olan sünnə haqda soruşdu. əz-Zuhri dedi: “Bizə Urva ibn əz-Zubeyr Aişənin belə dediyini rəvayət etmişdir: “Günəş tutulduqda Allah Elçisi ﷺ bir kişiyə (insanları) camaat namazına çağırmaq üçün əmr etdi. İnsanlar toplandıqda Allah Elçisi ﷺ onlarla namaz qılaraq təkbir etdi, sonra qiyamda oxunuşu uzun etdi. Sonra təkbir edib qiyamı qədər və ya ondan da uzun olan ruku etdi. Sonra başını rukudan qaldıraraq: “Səmi Alla:hu limən həmidəh!”- dedi. Sonra qiyamda oxunuşu uzun, lakin birinci qiyam-

dan bir qədər qısa etdi. Sonra təkbir edib uzun, lakin birinci rukudan bir qədər qısa olan ruku etdi. Sonra başını rukudan qaldıraraq: “Səmi Alla:hu limən həmidəh!”- dedi. Sonra təkbir edib ruku və ya qiyam qədər uzun olan səcdə etdi. Sonra təkbir edib başını səcdədən qaldırdı. Sonra təkbir edib yenə səcdəyə getdi. Sonra təkbir edib ayağa qalxdı və uzun olan, lakin əvvəlki oxunuşdan daha qısa oxunuş eti. Sonra təkbir edib uzun olan, lakin ilk rukudan qısa olan ruku etdi. Sonra başını rukudan qaldıraraq: “Səmi Alla:hu limən həmidəh”- dedi. Sonra ayaq üstə uzun olan, lakin ikinci rükətin birinci oxunuşundan qısa bir oxunuş etdi. Sonra təkbir edib uzun olan, lakin əvvəlki rukudan qısa olan ruku etdi. Sonra təkbir edib başını rukudan qaldıraraq: “Səmi Alla:hu limən həmidəh”- dedi. Sonra təkbir edib əvvəlki səcdələrdən qısa səcdə etdi. Sonra təşəhhüdü dedi. Sonra salam verdi. Sonra qalxıb insanlar arasında Allaha həmd edib Onu təriflədi. Sonra da dedi: “Həqiqətən, günəş və ay kiminsə ölümünə və ya dünyaya gəlməsinə görə tutulmur. Onlar Allahın varlığına sübut olan dəlillərdən bir dəlildir. Onların və ya birinin tutulduğunu gördükdə, zikr etmək və namazla Allaha ﷻ sığının!”

١٤٩٨ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ دَاوُدَ ، قَالَ : حَدَّثَنَا نَافِعُ بْنُ عُمَرَ ، عَنْ ابْنِ أَبِي مُلَيْكَةَ ، عَنْ أَسْمَاءَ بِنْتِ أَبِي بَكْرٍ ، قَالَتْ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْكُسُوفِ ، فَقَامَ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ رَفَعَ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ قَامَ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ فَأَطَالَ الْقِيَامَ ، ثُمَّ رَكَعَ فَأَطَالَ الرُّكُوعَ ، ثُمَّ رَفَعَ ، ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ رَفَعَ ثُمَّ سَجَدَ فَأَطَالَ السُّجُودَ ، ثُمَّ رَفَعَ ، ثُمَّ انْصَرَفَ.

1498. …Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ günəş tutulduqda namaz qıldı. Qiyamını uzun etdi, sonra uzun bir ruku etdi. Sonra başını rukudan qaldırıb yenidən uzun bir qiyamda durdu. Sonra uzun bir ruku etdi. Sonra rukudan başını qaldırdı. Sonra uzun bir səcdə etdi. Sonra başını səcdədən qaldırdı və yenə uzun bir səcdə etdi. Sonra ayağa durdu və qiyamını uzun etdi. Sonra uzun bir ruku etdi. Sonra başını rukudan qaldırdı və uzun bir qiyamda durdu. Sonra uzun bir ruku etdi. Sonra başını rukudan qaldırdı. Sonra səcdə etdi və səcdəsini uzun etdi. Sonra başını səcdədən qaldırdı və yenidən uzun bir səcdə etdi. Sonra başını səcdədən qaldırdı və namazını bitirdi”.

٢٢ - بَابُ الْقُعُودِ عَلَى الْمِنْبَرِ بَعْدَ صَلاَةِ الْكُسُوفِ

22-ci fəsil: Kusuf namazından sonra minbərdə dayanmaq

١٤٩٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، عَنْ ابْنِ وَهْبٍ ، عَنْ عَمْرِو بْنِ الْحَارِثِ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، أَنَّ عَمْرَةَ حَدَّثَتْهُ ، أَنَّ عَائِشَةَ ، قَالَتْ : إِنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ مَخْرَجًا فَخُسِفَ بِالشَّمْسِ ، فَخَرَجْنَا إِلَى الْحُجْرَةِ فَاجْتَمَعَ إِلَيْنَا نِسَاءٌ ، وَأَقْبَلَ إِلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَذَلِكَ ضَحْوَةً ، فَقَامَ قِيَامًا طَوِيلاً ، ثُمَّ رَكَعَ رُكُوعًا طَوِيلاً ، ثُمَّ رَفَعَ رَأْسَهُ فَقَامَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ دُونَ رُكُوعِهِ ، ثُمَّ سَجَدَ ، ثُمَّ قَامَ الثَّانِيَةَ فَصَنَعَ مِثْلَ ذَلِكَ إِلاَّ أَنَّ قِيَامَهُ وَرُكُوعَهُ دُونَ الرَّكْعَةِ الأُولَى ، ثُمَّ سَجَدَ وَتَجَلَّتِ الشَّمْسُ ، فَلَمَّا انْصَرَفَ قَعَدَ عَلَى الْمِنْبَرِ ، فَقَالَ فِيمَا يَقُولُ : إِنَّ النَّاسَ يُفْتَنُونَ فِي قُبُورِهِمْ كَفِتْنَةِ الدَّجَّالِ مُخْتَصَرٌ.

1499. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Bir gün Peyğəmbər ﷺ evindən çıxıb məscidə girdikdə, günəş tutuldu. Biz də öz otaqlarımızdan çıxdıq və qadınlar da bizim yanımıza toplandılar. Səhər vaxtı idi və Allah Elçisi ﷺ bizim yanımıza gəldi. O, qiyamı uzun olan namaz qıldı. Sonra uzun ruku etdi, sonra başını rukudan qaldırdı və əvvəlkindən bir az qısa qiyamda durdu. Sonra əvvəlkindən bir az qısa ruku etdi. Sonra səcdə etdi. Sonra ikinci dəfə ayağa durdu və bunun mislində olanları etdi. Amma bu rükət birinci rükətdən qısa oldu. Sonra səcdə etdi və günəşin üzü açıldı. Sonra namazı bitirib minbərə qalxdı və dedi: "Həqiqətən, insanlar qəbirdə Dəccalın fitnəsi kimi fitnəyə məruz qalacaqlar".

٢٣ - بَابُ كَيْفَ الْخُطْبَةِ فِي الْكُسُوفِ

23-cü fəsil: Günəş və ay tutulduqda olan xütbə

١٥٠٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : خَسَفَتِ الشَّمْسُ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَامَ فَصَلَّى ، فَأَطَالَ الْقِيَامَ جِدًّا ، ثُمَّ رَكَعَ ، فَأَطَالَ الرُّكُوعَ جِدًّا ، ثُمَّ رَفَعَ ، فَأَطَالَ الْقِيَامَ جِدًّا وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ ، فَأَطَالَ الرُّكُوعَ وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ سَجَدَ ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، فَأَطَالَ الْقِيَامَ وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ ، فَأَطَالَ الرُّكُوعَ وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ رَفَعَ ، فَأَطَالَ الْقِيَامَ وَهُوَ دُونَ الْقِيَامِ الأَوَّلِ ، ثُمَّ رَكَعَ ، فَأَطَالَ الرُّكُوعَ وَهُوَ دُونَ الرُّكُوعِ الأَوَّلِ ، ثُمَّ سَجَدَ ، فَفَرَغَ مِنْ صَلاَتِهِ وَقَدْ جُلِّيَ عَنِ الشَّمْسِ ، فَخَطَبَ النَّاسَ ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، ثُمَّ قَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، فَإِذَا رَأَيْتُمْ ذَلِكَ فَصَلُّوا وَتَصَدَّقُوا ، وَاذْكُرُوا اللَّهَ عَزَّ وَجَلَّ ، وَقَالَ : يَا أُمَّةَ مُحَمَّدٍ ، إِنَّهُ لَيْسَ أَحَدٌ أَغْيَرَ مِنَ اللهِ عَزَّ وَجَلَّ أَنْ يَزْنِيَ عَبْدُهُ أَوْ أَمَتُهُ ، يَا أُمَّةَ مُحَمَّدٍ ، لَوْ تَعْلَمُونَ مَا أَعْلَمُ لَضَحِكْتُمْ قَلِيلاً وَلَبَكَيْتُمْ كَثِيرًا.

1500. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisinin ﷺ zamanında günəş tutulmuşdu. O, qalxıb qiyamı çox uzun namaz qıldı. Sonra ruku etdi və rukusu çox uzun idi. Sonra başını (rukudan) qaldırdı və yenə qiyamı

çox uzun oldu, lakin birinci qiyamdan qısa idi. Sonra ruku etdi, lakin birinci rukudan qısa etdi. Sonra səcdə etdi və başını səcdədən qaldırdı. Sonra qiyamda durdu, lakin birinci qiyamdan qısa etdi. Sonra ruku etdi, lakin birinci rukudan qısa etdi. Sonra başını rukudan qaldırdı və qiyamını uzun etdi, lakin əvvəlki qiyamdan qısa etdi. Sonra ruku etdi, lakin rukusunu əvvəlkindən qısa etdi. Sonra səcdə etdi. Namazı bitirdikdə, artıq günəşin üzü açılmışdı. O, insanlara xitab edərək Allaha həmd və səna etdi. Sonra dedi: "Həqiqətən, günəş və ay heç kimin ölümü və ya doğulmasına görə tutulmur. Onları gördükdə, namaz qılın, sədəqə verin və Allahı ﷻ zikr edin!" Sonra dedi: "Ey Muhəmməd ümməti! Həqiqətən, Allahın qadın və ya kişi qulu zina etdikdə, heç kim Ondan daha çox qısqanc ola bilməz. Ey Muhəmməd ümməti! Mən bildiklərimi bilsəydiniz, az gülüb çox ağlayardınız".

١٥٠١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ الْحَفَرِيُّ ، عَنْ سُفْيَانَ ، عَنِ الأَسْوَدِ بْنِ قَيْسٍ ، عَنْ ثَعْلَبَةَ بْنِ عَبَّادٍ ، عَنْ سَمُرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَطَبَ حِينَ انْكَسَفَتِ الشَّمْسُ فَقَالَ : أَمَّا بَعْدُ.

1501. …Səmura ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ günəş tutulduqda xütbə verdi və dedi: "Bundan sonra…".[1]

## ٢٤ - الأَمْرُ بِالدُّعَاءِ فِي الْكُسُوفِ

## 24-cü fəsil: Günəş və ay tutulduqda dua etməyin əmr edilməsi

١٥٠٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا يُونُسُ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، قَالَ : كُنَّا عِنْدَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَانْكَسَفَتِ الشَّمْسُ ، فَقَامَ إِلَى الْمَسْجِدِ يَجُرُّ رِدَاءَهُ مِنَ الْعَجَلَةِ ، فَقَامَ إِلَيْهِ النَّاسُ ، فَصَلَّى رَكْعَتَيْنِ كَمَا يُصَلُّونَ ، فَلَمَّا انْجَلَتْ خَطَبَنَا فَقَالَ : إِنَّ الشَّمْسَ وَالْقَمَرَ آيَتَانِ مِنْ آيَاتِ اللهِ يُخَوِّفُ بِهِمَا عِبَادَهُ ، وَإِنَّهُمَا لاَ يَنْكَسِفَانِ لِمَوْتِ أَحَدٍ ، فَإِذَا رَأَيْتُمْ كُسُوفَ أَحَدِهِمَا فَصَلُّوا وَادْعُوا حَتَّى يَنْكَشِفَ مَا بِكُمْ.

1502. …Rəvayət edilir ki, Əbu Bəkra ﵁ demişdir: "Biz Peyğəmbərin ﷺ yanında idik. Günəş tutuldu və o, tələsərək ridasını yuxarı çəkə-çəkə məscidə tərəf getdi. İnsanlar da ona tərəf gəldilər. Onlarla sizin qıldığınız kimi iki rükət namaz qıldı. Günəşin üzü açıldıqda, insanlara xitab edərək dedi: "Həqiqətən, günəş və ay Allahın varlığının əlamətlərindəndir. Allah bununla Öz qullarını qorxudur. Onlar heç kimin ölməsi səbəbi ilə tutulmur.

[1] Hədis zəifdir.

Onlardan birinin tutulduğunu gördükdə, bu hal sizdən gedənə qədər namaz qılıb dua edin!"

٢٥ - الأَمْرُ بِالاِسْتِغْفَارِ فِي الْكُسُوفِ

### 25-ci fəsil: Günəş və ay tutulduqda bağışlanma diləməyin əmr edilməsi

١٥٠٣ - أَخْبَرَنَا مُوسَى بْنُ عَبْدِ الرَّحْمَنِ الْمَسْرُوقِيُّ ، عَنْ أَبِي أُسَامَةَ ، عَنْ بُرَيْدٍ ، عَنْ أَبِي بُرْدَةَ ، عَنْ أَبِي مُوسَى ، قَالَ : خَسَفَتِ الشَّمْسُ ، فَقَامَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَزِعًا يَخْشَى أَنْ تَكُونَ السَّاعَةُ ، فَقَامَ حَتَّى أَتَى الْمَسْجِدَ ، فَقَامَ يُصَلِّي بِأَطْوَلِ قِيَامٍ وَرُكُوعٍ وَسُجُودٍ مَا رَأَيْتُهُ يَفْعَلُهُ فِي صَلاَتِهِ قَطُّ ، ثُمَّ قَالَ : إِنَّ هَذِهِ الآيَاتِ الَّتِي يُرْسِلُ اللَّهُ لاَ تَكُونُ لِمَوْتِ أَحَدٍ وَلاَ لِحَيَاتِهِ ، وَلَكِنَّ اللَّهَ يُرْسِلُهَا يُخَوِّفُ بِهَا عِبَادَهُ ، فَإِذَا رَأَيْتُمْ مِنْهَا شَيْئًا فَافْزَعُوا إِلَى ذِكْرِهِ وَدُعَائِهِ وَاسْتِغْفَارِهِ.

1503. ...Rəvayət edilir ki, Əbu Musa ﵁ demişdir: "Günəş tutulduqda, Peyğəmbər ﷺ Qiyamətin baş verəcəyindən təlaşa düşüb ayağa qalxdı və məscidə getdi. Bundan qabaq mənim görmədiyim, qiyamı, rukusu və səcdələri uzun olan bir namaz qıldı, sonra da dedi: "Həqiqətən, Allahın göndərdiyi bu ayələr (günəşin tutulması) heç kimin ölümü və ya doğulmasına görə baş vermir. Allah onları qullarını qorxutmaq üçün göndərir. Onları gördükdə Allahı zikr etməyə, Ona dua etməyə və Ondan bağışlanma diləməyə tələsin!"

# ١٧ - كِتَابُ الاِسْتِسْقَاءِ

# 17. İstisqa (yağışın yağması üçün dua etmək) kitabı

## ١ - مَتَى يَسْتَسْقِي الإِمَامُ

## 1-ci fəsil: İmam nə vaxt yağış üçün dua edir?

١٥٠٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنْ شَرِيكِ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي نَمِرٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : جَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، هَلَكَتِ الْمَوَاشِي ، وَانْقَطَعَتِ السُّبُلُ ، فَادْعُ اللَّهَ عَزَّ وَجَلَّ ، فَدَعَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَمُطِرْنَا مِنَ الْجُمُعَةِ إِلَى الْجُمُعَةِ ، فَجَاءَ رَجُلٌ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، تَهَدَّمَتِ الْبُيُوتُ ، وَانْقَطَعَتِ السُّبُلُ ، وَهَلَكَتِ الْمَوَاشِي ، فَقَالَ : اللَّهُمَّ عَلَى رُؤُوسِ الْجِبَالِ ، وَالآكَامِ ، وَبُطُونِ الأَوْدِيَةِ ، وَمَنَابِتِ الشَّجَرِ ، فَانْجَابَتْ عَنِ الْمَدِينَةِ انْجِيَابَ الثَّوْبِ.

1504. …Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: “Bir kişi Allah Elçisinin ﷺ yanına gəlib dedi: “Ey Allahın Elçisi, mal-qaramız qırıldı, yollar kəsildi, Allaha ﷻ dua et!” Allah Elçisi ﷺ də dua etdi və həmin cümədən gələn cüməyə qədər yağış yağdı. Yenə bir kişi Allah Elçisinin ﷺ yanına gəlib dedi: “Ey Allahın Elçisi, (yağan yağış səbəbi ilə) evlərimiz dağıldı, yollarımız kəsildi və mal-qaramız qırıldı”. Allah Elçisi ﷺ (dua edərək) dedi: “Allahım, (bu yağışı) dağların başına, təpələrə və vadilərin ortalarına, ağacların bitdiyi yerlərə yağdır! Paltar çıxdığı kimi buludları da Mədinədən uzaqlaşdır”.

## ٢ - خُرُوجُ الإِمَامِ إِلَى الْمُصَلَّى لِلاِسْتِسْقَاءِ

## 2-ci fəsil: İmamın yağış duası üçün musalləyə[1] çıxması

١٥٠٥ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا الْمَسْعُودِيُّ ، عَنْ أَبِي بَكْرِ بْنِ عَمْرِو بْنِ حَزْمٍ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، قَالَ سُفْيَانُ : فَسَأَلْتُ عَبْدَ اللهِ بْنَ أَبِي بَكْرٍ ، فَقَالَ : سَمِعْتُهُ مِنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، يُحَدِّثُ أَبِي ، أَنَّ عَبْدَ اللهِ بْنَ زَيْدٍ الَّذِي أُرِيَ النِّدَاءَ ، قَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ إِلَى الْمُصَلَّى يَسْتَسْقِي ، فَاسْتَقْبَلَ الْقِبْلَةَ ، وَقَلَبَ رِدَاءَهُ ، وَصَلَّى رَكْعَتَيْنِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا غَلَطٌ مِنِ ابْنِ عُيَيْنَةَ ، وَعَبْدُ اللهِ بْنُ زَيْدٍ الَّذِي أُرِيَ النِّدَاءَ هُوَ عَبْدُ اللهِ بْنُ زَيْدِ بْنِ عَبْدِ رَبِّهِ ، وَهَذَا عَبْدُ اللهِ بْنُ زَيْدِ بْنِ عَاصِمٍ.

1505. …Yuxuda azanın göstərildiyini görən Abdullah ibn Zeyd ﷺ demişdir: “Allah Elçisi ﷺ yağışın yağması üçün dua etdikdə musalləyə çıxdı,

[1] Musallə - namazgah. Peyğəmbər ﷺ adətən bayram namazlarını, günəşin və ayın tutulması namazlarını, yağışın yağması üçün qılınan namazı məsciddə deyil, camaatı yığaraq açıq yerdə qılardı.

qibləyə yönəldi, əbasının tərs tərəfini geyindi və iki rükət namaz qıldı".

٣ - بَابُ الْحَالِ الَّتِي يُسْتَحَبُّ لِلإِمَامِ أَنْ يَكُونَ عَلَيْهَا إِذَا خَرَجَ

### 3-cü fəsil: Yağış duası üçün namazgaha çıxan imama müstəhəb olanlar

١٥٠٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنْ هِشَامِ بْنِ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ كِنَانَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : أَرْسَلَنِي فُلاَنٌ إِلَى ابْنِ عَبَّاسٍ أَسْأَلُهُ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الاِسْتِسْقَاءِ ، فَقَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُتَضَرِّعًا مُتَوَاضِعًا مُتَبَذِّلاً ، فَلَمْ يَخْطُبْ نَحْوَ خُطْبَتِكُمْ هَذِهِ فَصَلَّى رَكْعَتَيْنِ.

1506. ...Hişam ibn İshaq ibn Abdullah ibn Kinanə ﵁ atasının belə dediyini rəvayət etmişdir: "Bir nəfər məni Allah Elçisinin ﷺ yağış namazının necəliyi haqda soruşmaq üçün İbn Abbasın yanına göndərdi. O dedi: "Allah Elçisi ﷺ Allaha möhtac halda, təvazökarlıq və sadəlik içində çıxdı. Sizin xütbənizə bənzəməyən bir xütbə verdi və iki rükət namaz qıldı".

١٥٠٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ ، عَنْ عُمَارَةَ بْنِ غَزِيَّةَ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ زَيْدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اسْتَسْقَى وَعَلَيْهِ خَمِيصَةٌ سَوْدَاءُ.

1507. ...Abdullah ibn Zeyd ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ yağış yağması üçün dua etməyə çıxanda əynində qara libas var idi.

٤ - بَابُ جُلُوسِ الإِمَامِ عَلَى الْمِنْبَرِ لِلاِسْتِسْقَاءِ

### 4-cü fəsil: Yağış duası etdikdə imamın minbərdə oturması

١٥٠٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدِ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ إِسْمَعِيلَ ، عَنْ هِشَامِ بْنِ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ كِنَانَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : سَأَلْتُ ابْنَ عَبَّاسٍ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الاِسْتِسْقَاءِ ، فَقَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُتَبَذِّلاً ، مُتَوَاضِعًا ، مُتَضَرِّعًا ، فَجَلَسَ عَلَى الْمِنْبَرِ فَلَمْ يَخْطُبْ خُطْبَتَكُمْ هَذِهِ ، وَلَكِنْ لَمْ يَزَلْ فِي الدُّعَاءِ وَالتَّضَرُّعِ وَالتَّكْبِيرِ ، وَصَلَّى رَكْعَتَيْنِ كَمَا كَانَ يُصَلِّي فِي الْعِيدَيْنِ.

1508. ...Hişam ibn İshaq ibn Abdullah ibn Kinanə atasının ﵁ belə dediyini rəvayət etmişdir: "İbn Abbasdan Allah Elçisinin ﷺ yağış istəmək üçün qıldığı namazı haqqında soruşdum. O dedi: "Allah Elçisi ﷺ üst-başı dağınıq halda (libasını səhmana salmadan), təvazökarlıq və sadəlik içində çıxdı. Minbərdə oturdu və xütbə verdi, lakin bu xütbə sizin xütbənizə oxşamırdı. Xütbəsində dua edər, yalvarıb-yaxarar və təkbir edərdi. (Sonra da) bayram namazları kimi iki rükət namaz qıldı".

٥ - تَحْوِيلُ الإِمَامِ ظَهْرَهُ إِلَى النَّاسِ عِنْدَ الدُّعَاءِ فِي الاِسْتِسْقَاءِ

## 5-ci fəsil: Yağış duası etdikdə imamın kürəyini insanlara çevirməsi

١٥٠٩ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، عَنْ ابْنِ أَبِي ذِئْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، أَنَّ عَمَّهُ حَدَّثَهُ ، أَنَّهُ خَرَجَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَسْقِي ، فَحَوَّلَ رِدَاءَهُ ، وَحَوَّلَ لِلنَّاسِ ظَهْرَهُ ، وَدَعَا ثُمَّ صَلَّى رَكْعَتَيْنِ ، فَقَرَأَ فَجَهَرَ.

1509. …Abbad ibn Təmim rəvayət edir ki, onun əmisi Allah Elçisi ﷺ ilə yağış duası üçün çıxmışdı. Allah Elçisi ﷺ əbasını tərsinə geyindi, kürəyini insanlara çevirib dua etdi. Sonra iki rükət səsli namaz qıldı.

٦ - تَقْلِيبُ الإِمَامِ الرِّدَاءَ عِنْدَ الاِسْتِسْقَاءِ

## 6-cı fəsil: Yağış istəmək üçün dua etdikdə imamın əbasının tərs üzünü çevirməsi

١٥١٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ سُفْيَانَ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ عَمِّهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اسْتَسْقَى ، وَصَلَّى رَكْعَتَيْنِ ، وَقَلَبَ رِدَاءَهُ.

1510. …Abbad ibn Təmim əmisindən ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ yağışın yağması üçün dua etdi, iki rükət namaz qıldı və əbasının tərs üzünü çevirdi.

٧ - مَتَى يُحَوِّلُ الإِمَامُ رِدَاءَهُ

## 7-ci fəsil: İmam əbasının tərs üzünü nə zaman çevirir?

١٥١١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، أَنَّهُ سَمِعَ عَبَّادَ بْنَ تَمِيمٍ ، يَقُولُ : سَمِعْتُ عَبْدَ اللهِ بْنَ زَيْدٍ يَقُولُ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَاسْتَسْقَى ، وَحَوَّلَ رِدَاءَهُ حِينَ اسْتَقْبَلَ الْقِبْلَةَ

1511. …Rəvayət edilir ki, Abdullah ibn Zeyd ﷺ demişdir: “Allah Elçisi ﷺ yağışın yağması üçün dua etməyə çıxdı, qibləyə döndükdə əbasının tərs üzünü çevirdi.

٨ - رَفْعُ الإِمَامِ يَدَهُ

## 8-ci fəsil: (İstisqa zamanı) imamın əllərini qaldırması

١٥١٢ - أَخْبَرَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ أَبُو تَقِيٍّ الْحِمْصِيُّ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، عَنْ شُعَيْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ عَمِّهِ ، أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الاِسْتِسْقَاءِ اسْتَقْبَلَ الْقِبْلَةَ ، وَقَلَبَ الرِّدَاءَ ، وَرَفَعَ يَدَيْهِ.

1512. ...Abbad ibn Təmim ﷺ rəvayət edir ki, əmisi Allah Elçisinin ﷺ yağışın yağması üçün dua etdikdə qibləyə yönəldiyini, əbasının tərs üzünü çevirdiyini və əllərini qaldırdığını görmüşdür.

٩ - كَيْفَ يَرْفَعُ

9-cu fəsil: (İstisqa zamanı) əllər necə qaldırılır?

١٥١٣ - أَخْبَرَنِي شُعَيْبُ بْنُ يُوسُفَ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ الْقَطَّانِ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يَرْفَعُ يَدَيْهِ فِي شَيْءٍ مِنَ الدُّعَاءِ إِلاَّ فِي الاِسْتِسْقَاءِ ، فَإِنَّهُ كَانَ يَرْفَعُ يَدَيْهِ حَتَّى يُرَى بَيَاضُ إِبْطَيْهِ.

1513. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ dua zamanı yalnız yağışın yağması üçün dua etdikdə əllərini qaldırardı. O, əllərini qoltuğunun ağlığı görünənə qədər qaldırardı".

١٥١٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ خَالِدِ بْنِ يَزِيدَ ، عَنْ سَعِيدِ بْنِ أَبِي هِلاَلٍ ، عَنْ يَزِيدَ بْنِ عَبْدِ اللهِ ، عَنْ عُمَيْرٍ ، مَوْلَى آبِي اللَّحْمِ ، عَنْ آبِي اللَّحْمِ ، أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عِنْدَ أَحْجَارِ الزَّيْتِ يَسْتَسْقِي وَهُوَ مُقْنِعٌ بِكَفَّيْهِ يَدْعُو.

1514. ...Rəvayət edilir ki, Əbu Ləhm ﷺ Allah Elçisinin ﷺ zeytun ağaclarının yanında əllərini qaldıraraq yağışın yağması üçün dua etdiyini görmüşdür.

١٥١٥ - أَخْبَرَنَا عِيسَى بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدٍ وَهُوَ الْمَقْبُرِيُّ ، عَنْ شَرِيكِ بْنِ عَبْدِ اللهِ بْنِ أَبِي نَمِرٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّهُ سَمِعَهُ يَقُولُ : بَيْنَا نَحْنُ فِي الْمَسْجِدِ يَوْمَ الْجُمُعَةِ ، وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ النَّاسَ ، فَقَامَ رَجُلٌ فَقَالَ : يَا رَسُولَ اللهِ ، تَقَطَّعَتِ السُّبُلُ ، وَهَلَكَتِ الأَمْوَالُ ، وَأَجْدَبَ الْبِلاَدُ ، فَادْعُ اللَّهَ أَنْ يَسْقِيَنَا ، فَرَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَيْهِ حِذَاءَ وَجْهِهِ ، فَقَالَ : اللَّهُمَّ اسْقِنَا ، فَوَاللَّهِ مَا نَزَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الْمِنْبَرِ حَتَّى أُوسِعْنَا مَطَرًا ، وَأُمْطِرْنَا ذَلِكَ الْيَوْمَ إِلَى الْجُمُعَةِ الأُخْرَى ، فَقَامَ رَجُلٌ لاَ أَدْرِي هُوَ الَّذِي قَالَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اسْتَسْقِ لَنَا أَمْ لاَ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، انْقَطَعَتِ السُّبُلُ ، وَهَلَكَتِ الأَمْوَالُ مِنْ كَثْرَةِ الْمَاءِ ، فَادْعُ اللَّهَ أَنْ يُمْسِكَ عَنَّا الْمَاءَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّهُمَّ حَوَالَيْنَا وَلاَ عَلَيْنَا ، وَلَكِنْ عَلَى الْجِبَالِ وَمَنَابِتِ الشَّجَرِ ، قَالَ : وَاللَّهِ مَا هُوَ إِلاَّ أَنْ تَكَلَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِذَلِكَ تَمَزَّقَ السَّحَابُ حَتَّى مَا نَرَى مِنْهُ شَيْئًا.

1515. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Bir dəfə biz cümə günü məsciddə idik. Allah Elçisi ﷺ insanlara xütbə deyirdi. Bir kişi ayağa qalxaraq belə dedi: "Ey Allahın Elçisi! Yollar kəsildi, mal-qara tələf oldu, yurdumuzda quraqlıqdır. Allaha dua et ki, bizə yağış yağdırsın!" Allah Elçisi ﷺ əllərini üzünə tərəf qaldırdı və: "Allahım, bizə yağış endir!"- dedi.

Allaha and olsun ki, Allah Elçisi ﷺ minbərdən düşməmiş yağış yağmağa başladı. Yağış növbəti cüməyə qədər davam etdi. Sonra bir kişi, bilmədim o, Allah Elçisindən ﷺ yağış yağmasını istəyən kişi idi ya yox, ayağa qalxdı və dedi: "Ey Allahın Elçisi! Yollar tutuldu, suyun çoxluğundan mal-qara tələf oldu. Allaha yağışı dayandırması üçün dua et!" Allah Elçisi ﷺ dedi: "Allahım, üzərimizdən çəkib ətrafımıza - dağlara, ağacların olduğu yerə yağdır!" Ənəs dedi: "Allaha and olsun! Allah Elçisi ﷺ duasını bitirməmiş buludlar parçalandı və biz heç bir bulud görmədik".

## ١٠ - ذِكْرُ الدُّعَاءِ

## 10-cu fəsil: Yağış duası haqda

١٥١٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنِي أَبُو هِشَامٍ الْمُغِيرَةُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنِي وُهَيْبٌ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : اللَّهُمَّ اسْقِنَا.

1516. …Ənəs ibn Malik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Allahım, bizə yağış ver!"

١٥١٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ : سَمِعْتُ عُبَيْدَ اللهِ بْنَ عُمَرَ وَهُوَ الْعُمَرِيُّ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ ، قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ يَوْمَ الْجُمُعَةِ ، فَقَامَ إِلَيْهِ النَّاسُ فَصَاحُوا ، فَقَالُوا : يَا نَبِيَّ اللهِ ، قَحَطَتِ الْمَطَرُ ، وَهَلَكَتِ الْبَهَائِمُ ، فَادْعُ اللَّهَ أَنْ يَسْقِيَنَا ، قَالَ : اللَّهُمَّ اسْقِنَا ، اللَّهُمَّ اسْقِنَا قَالَ : وَايْمُ اللهِ ، مَا نَرَى فِي السَّمَاءِ قَزَعَةً مِنْ سَحَابٍ قَالَ : فَأَنْشَأَتْ سَحَابَةٌ فَانْتَشَرَتْ ، ثُمَّ إِنَّهَا أُمْطِرَتْ ، وَنَزَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَصَلَّى ، وَانْصَرَفَ النَّاسُ فَلَمْ تَزَلْ تَمْطُرُ إِلَى يَوْمِ الْجُمُعَةِ الأُخْرَى ، فَلَمَّا قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ صَاحُوا إِلَيْهِ ، فَقَالُوا : يَا نَبِيَّ اللهِ ، تَهَدَّمَتِ الْبُيُوتُ ، وَتَقَطَّعَتِ السُّبُلُ ، فَادْعُ اللَّهَ أَنْ يَحْبِسَهَا عَنَّا ، فَتَبَسَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ : اللَّهُمَّ حَوَالَيْنَا وَلاَ عَلَيْنَا فَتَقَشَّعَتْ عَنِ الْمَدِينَةِ ، فَجَعَلَتْ تَمْطُرُ حَوْلَهَا وَمَا تَمْطُرُ بِالْمَدِينَةِ قَطْرَةً ، فَنَظَرْتُ إِلَى الْمَدِينَةِ وَإِنَّهَا لَفِي مِثْلِ الإِكْلِيلِ.

1517. …Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Peyğəmbər ﷺ cümə günü xütbə verdikdə, insanlardan bəziləri belə dedilər: "Ey Allahın Peyğəmbəri! (Uzun müddət) yağış yağmır, heyvanlar məhv oldu. Allaha dua et ki, bizə yağış yağdırsın!" Peyğəmbər ﷺ dedi: "Allahım, bizə yağış endir, Allahım bizə yağış endir!" (Ənəs) deyir: "Allaha and olsun! Səmada heç bir bulud olmadığı halda, bir bulud əmələ gəldi və ətrafa yayılmağa başladı. Sonra ondan yağış yağmağa başladı. Allah Elçisi ﷺ minbərdən aşağı düşüb (cümə) namazını qıldırdı. Sonra insanlar dağılışdılar. Yağış növbəti cümə gününə qədər yağmağa davam etdi. (Növbəti cümədə) Allah Elçisi ﷺ xütbə demək istədikdə, bəzi kimsələr möhkəm səslə dedilər: "Ey

Allahın Peyğəmbəri! Evlər dağıldı, yollar kəsildi. Allaha dua et ki, yağışı dayandırsın". Allah Elçisi ﷺ təbəssüm edib dedi: "Allahım, yağışı üzərimizə deyil, ətrafımıza yağdır!" Mədinəyə yağan yağış kəsilərək ətrafa yağmağa başladı. Mədinəyə bir damcı belə yağış düşmədi. Mədinəyə baxdıqda (yağışın ortasında) bir dairə kimi qalmışdı".

١٥١٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شَرِيكُ بْنُ عَبْدِ اللهِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ رَجُلاً دَخَلَ الْمَسْجِدَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَائِمٌ يَخْطُبُ ، فَاسْتَقْبَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَائِمًا وَقَالَ : يَا رَسُولَ اللهِ ، هَلَكَتِ الأَمْوَالُ ، وَانْقَطَعَتِ السُّبُلُ ، فَادْعُ اللَّهَ أَنْ يُغِيثَنَا ، فَرَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَيْهِ ثُمَّ قَالَ : اللَّهُمَّ أَغِثْنَا ، اللَّهُمَّ أَغِثْنَا ، قَالَ أَنَسٌ : وَلاَ وَاللَّهِ مَا نَرَى فِي السَّمَاءِ مِنْ سَحَابَةٍ وَلاَ قَزَعَةٍ وَمَا بَيْنَنَا وَبَيْنَ سَلْعٍ مِنْ بَيْتٍ وَلاَ دَارٍ ، فَطَلَعَتْ سَحَابَةٌ مِثْلُ التُّرْسِ ، فَلَمَّا تَوَسَّطَتِ السَّمَاءَ انْتَشَرَتْ وَأَمْطَرَتْ ، قَالَ أَنَسٌ : وَلاَ وَاللَّهِ مَا رَأَيْنَا الشَّمْسَ سَبْتًا ، قَالَ : ثُمَّ دَخَلَ رَجُلٌ مِنْ ذَلِكَ الْبَابِ فِي الْجُمُعَةِ الْمُقْبِلَةِ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَائِمٌ يَخْطُبُ ، فَاسْتَقْبَلَهُ قَائِمًا فَقَالَ : يَا رَسُولَ اللهِ صَلَّى اللَّهُ وَسَلَّمَ عَلَيْكَ ، هَلَكَتِ الأَمْوَالُ ، وَانْقَطَعَتِ السُّبُلُ ، فَادْعُ اللَّهَ أَنْ يُمْسِكَهَا عَنَّا ، فَرَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَيْهِ ، فَقَالَ : اللَّهُمَّ حَوَالَيْنَا وَلاَ عَلَيْنَا ، اللَّهُمَّ عَلَى الآكَامِ وَالظِّرَابِ ، وَبُطُونِ الأَوْدِيَةِ ، وَمَنَابِتِ الشَّجَرِ ، قَالَ : فَأَقْلَعَتْ ، وَخَرَجْنَا نَمْشِي فِي الشَّمْسِ قَالَ شَرِيكٌ : سَأَلْتُ أَنَسًا : أَهُوَ الرَّجُلُ الأَوَّلُ ؟ قَالَ : لاَ.

1518. ...Ənəs ibn Malik ؓ rəvayət edir ki, bir dəfə Allah Elçisi ﷺ ayaq üstə xütbə deyərkən bir kişi məscidə daxil oldu və ayaq üstə Allah Elçisinə ﷺ belə dedi: "Ey Allahın Elçisi! Mal-qara tələf oldu, yollar kəsildi. Allaha dua et ki, bizə yağış yağdırsın!" Allah Elçisi ﷺ əllərini qaldırdı və dedi: "Allahım, bizə yağış endir! Allahım, bizə yağış endir!" Ənəs dedi: "Allaha and olsun ki, göydə nə bir bulud, nə də buluddan bir parça qalmadı. Səli dağı ilə aramızda buludları görməyimizə maneə olan heç bir ev yox idi. Səmada qalxan kimi buludlar meydana gəldi. Buludlar toplandıqdan sonra ətrafa yayılmağa başladı". Ənəs sözünə davam edərək deyir: "Allaha and olsun ki, bir həftə ərzində günəşi görmədik. Sonra cümə günü məscidə həmin qapıdan bir kişi daxil oldu. Allah Elçisi ﷺ də bu zaman xütbə deyirdi. Kişi ayaq üstə duraraq belə dedi: "Ey Allahın Elçisi, mal-qara tələf oldu, yollar kəsildi. Yağışı dayandırması üçün Allaha dua et!" Allah Elçisi ﷺ əllərini qaldırıb dedi: "Allahım, bu yağışı üzərimizdən ətrafımıza - dağlara, təpələrə, vadilərin içinə, ağacların olduğu yerə endir!" Bu vaxt buludlar dağıldı, biz də məsciddən çıxıb günəşin altında gəzişməyə başladıq". Şərik deyir: "Ənəsə sual verərək dedim: "Bu, əvvəlki yağış tələb edən kişi idi?" O: "Xeyr"- dedi.

١١ - بَابُ الصَّلَاةِ بَعْدَ الدُّعَاءِ

## 11-ci fəsil: Duadan sonra namaz qılmaq

١٥١٩ - قَالَ الْحَارِثُ بْنُ مِسْكِينٍ : ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنْ ابْنِ وَهْبٍ ، عَنْ ابْنِ أَبِي ذِئْبٍ ، وَيُونُسَ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي عَبَّادُ بْنُ تَمِيمٍ ، أَنَّهُ سَمِعَ عَمَّهُ ، وَكَانَ مِنْ أَصْحَابِ رَسُولِ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، يَقُولُ : خَرَجَ رَسُولُ اللَّهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمًا يَسْتَسْقِي ، فَحَوَّلَ إِلَى النَّاسِ ظَهْرَهُ ، يَدْعُو اللَّهَ وَيَسْتَقْبِلُ الْقِبْلَةَ ، وَحَوَّلَ رِدَاءَهُ ، ثُمَّ صَلَّى رَكْعَتَيْنِ قَالَ ابْنُ أَبِي ذِئْبٍ فِي الْحَدِيثِ : وَقَرَأَ فِيهِمَا.

1519. …Abbad ibn Təmim ﷺ Allah Elçisinin ﷺ səhabəsi olan əmisinin belə dediyini rəvayət edir: “Bir gün Allah Elçisi ﷺ yağışın yağması üçün dua etməyə çıxdı, kürəyini insanlara çevirdi, qibləyə dönmüş vəziyyətdə əbasını tərsinə geyindi. Sonra iki rükət namaz qıldı”. Ravi İbn Əbu Zibin hədisində deyilir: “Hər iki rükətdə Quran oxudu”.

١٢ - كَمْ صَلَاةُ الاِسْتِسْقَاءِ ؟

## 12-ci fəsil: Yağış namazı neçə rükətdir?

١٥٢٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي بَكْرِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ زَيْدٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ يَسْتَسْقِي ، فَصَلَّى رَكْعَتَيْنِ ، وَاسْتَقْبَلَ الْقِبْلَةَ.

1520. …Abdullah ibn Zeyd ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ yağış duası etmək üçün çıxdı və qibləyə yönələrək iki rükət namaz qıldı.

١٣ - كَيْفَ صَلَاةُ الاِسْتِسْقَاءِ

## 13-cü fəsil: İstisqa namazının necəliyi

١٥٢١ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلَانَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ هِشَامِ بْنِ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ بْنِ كِنَانَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : أَرْسَلَنِي أَمِيرٌ مِنَ الأُمَرَاءِ إِلَى ابْنِ عَبَّاسٍ أَسْأَلُهُ عَنِ الاِسْتِسْقَاءِ ، فَقَالَ ابْنُ عَبَّاسٍ : مَا مَنَعَهُ أَنْ يَسْأَلَنِي ؟ خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُتَوَاضِعًا مُتَبَذِّلاً ، مُتَخَشِّعًا ، مُتَضَرِّعًا ، فَصَلَّى رَكْعَتَيْنِ كَمَا يُصَلِّي فِي الْعِيدَيْنِ ، وَلَمْ يَخْطُبْ خُطْبَتَكُمْ هَذِهِ.

1521. …Hişam ibn İshaq ibn Abdullah ibn Kinənə atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Əmirlərdən biri məni istisqa haqda (öyrənmək üçün) İbn Abbasın yanına göndərdi. İbn Abbas dedi: “Onun özünün məndən soruşmasına nə mane olur? Allah Elçisi ﷺ Allahın hüzuruna təvazökar,

fədakar, müti və ehtiyaclı halda çıxdı. İki bayram namazında olduğu kimi iki rükət namaz qıldı və sizin xütbənizdən fərqli xütbə dedi".

## ١٤ - بَابُ الْجَهْرِ بِالْقِرَاءَةِ فِي صَلاَةِ الاِسْتِسْقَاءِ

## 14-cü fəsil: İstisqa namazında qiraətin səsli deyilməsi

١٥٢٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ ابْنِ أَبِي ذِئْبٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَبَّادِ بْنِ تَمِيمٍ ، عَنْ عَمِّهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ فَاسْتَسْقَى ، فَصَلَّى رَكْعَتَيْنِ جَهَرَ فِيهِمَا بِالْقِرَاءَةِ.

1522. ...Abbad ibn Təmim əmisindən ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ yağışın yağması üçün dua etməyə çıxdı, iki rükət namaz qıldı və qiraətini səsli etdi.

## ١٥ - الْقَوْلُ عِنْدَ الْمَطَرِ

## 15-ci fəsil: Yağış yağarkən deyilən dua

١٥٢٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ مِسْعَرٍ ، عَنِ الْمِقْدَامِ بْنِ شُرَيْحٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا أُمْطِرَ ، قَالَ : اللَّهُمَّ اجْعَلْهُ صَيِّبًا نَافِعًا.

1523. ...Aişə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ yağış yağdıqda belə dua edərdi: "Allahım, bu yağışı bizim üçün faydalı et!"

## ١٦ - كَرَاهِيَةُ الاِسْتِمْطَارِ بِالْكَوْكَبِ

## 16-cı fəsil: Ulduzlardan nəsə ummağın pis bir şey olması

١٥٢٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : مَا أَنْعَمْتُ عَلَى عِبَادِي مِنْ نِعْمَةٍ إِلاَّ أَصْبَحَ فَرِيقٌ مِنْهُمْ بِهَا كَافِرِينَ ، يَقُولُونَ الْكَوْكَبُ وَبِالْكَوْكَبِ.

1524. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə dedi: "Allah ﷻ belə buyurur: "Qullarıma nemətlərdən bir nemət verdikdə, bəziləri küfrə düşərək belə deyirlər: "Filan ulduza görə (bizə nemət) verildi".

١٥٢٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ صَالِحِ بْنِ كَيْسَانَ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ زَيْدِ بْنِ خَالِدٍ الْجُهَنِيِّ ، قَالَ : مُطِرَ النَّاسُ عَلَى عَهْدِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : أَلَمْ تَسْمَعُوا مَاذَا قَالَ رَبُّكُمُ اللَّيْلَةَ ؟ قَالَ : مَا أَنْعَمْتُ عَلَى عِبَادِي مِنْ

نِعْمَةٍ إِلاَّ أَصْبَحَ طَائِفَةٌ مِنْهُمْ بِهَا كَافِرِينَ ، يَقُولُونَ : مُطِرْنَا بِنَوْءِ كَذَا وَكَذَا ، فَأَمَّا مَنْ آمَنَ بِي وَحَمِدَنِي عَلَى سُقْيَايَ فَذَاكَ الَّذِي آمَنَ بِي وَكَفَرَ بِالْكَوْكَبِ ، وَمَنْ قَالَ : مُطِرْنَا بِنَوْءِ كَذَا وَكَذَا فَذَاكَ الَّذِي كَفَرَ بِي وَآمَنَ بِالْكَوْكَبِ.

1525. …Rəvayət edilir ki, Zeyd ibn Xalid əl-Cuhəni ﵁ demişdir: "Peyğəmbərin ﷺ dövründə yağış yağmışdı. Allah Elçisi ﷺ dedi: "Bu gecə Rəbbinizin nə dediyini eşitdinizmi? Allah buyurdu: "Mən qullarıma nemət verdikdə, onlardan bir tayfa küfr edərək belə deyər: "Bizə filan ulduza görə yağış yağdı". Amma Mənə iman edən və yağışa görə Mənə həmd edənə gəlincə, Mənə iman etmiş və ulduzun (yağış yağdırmasını) inkar etmişdir. Kim "bizə filan ulduza görə yağış yağdı"- desə, Mənə küfr etmiş və ulduzun (yağış yağdırmasına) iman etmişdir".

١٥٢٦ - أَخْبَرَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْعَلاَءِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَمْرٍو ، عَنْ عَتَّابِ بْنِ حُنَيْنٍ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَوْ أَمْسَكَ اللَّهُ عَزَّ وَجَلَّ الْمَطَرَ عَنْ عِبَادِهِ خَمْسَ سِنِينَ ثُمَّ أَرْسَلَهُ لأَصْبَحَتْ طَائِفَةٌ مِنَ النَّاسِ كَافِرِينَ يَقُولُونَ : سُقِينَا بِنَوْءِ الْمِجْدَحِ.

1526. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Əgər Allah ﷻ qullarına beş il yağış yağdırmasa, sonra isə onlara yağış göndərsə, onlardan kafir olanlar deyərlər: "Yağış bizə əl-Midcəh ulduzuna görə yağdı".[1]

١٧ - مَسْأَلَةُ الإِمَامِ رَفْعَ الْمَطَرِ إِذَا خَافَ ضَرَرَهُ

## 17-ci fəsil: Yağış zərər verdikdə dayanması üçün imamın dua etməsi

١٥٢٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنْ أَنَسٍ ، قَالَ : قَحَطَ الْمَطَرُ عَامًا ، فَقَامَ بَعْضُ الْمُسْلِمِينَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي يَوْمِ جُمُعَةٍ فَقَالَ : يَا رَسُولَ اللهِ ، قَحَطَ الْمَطَرُ ، وَأَجْدَبَتِ الأَرْضُ ، وَهَلَكَ الْمَالُ ، قَالَ : فَرَفَعَ يَدَيْهِ وَمَا نَرَى فِي السَّمَاءِ سَحَابَةً ، فَمَدَّ يَدَيْهِ حَتَّى رَأَيْتُ بَيَاضَ إِبْطَيْهِ يَسْتَسْقِي اللَّهَ عَزَّ وَجَلَّ ، قَالَ : فَمَا صَلَّيْنَا الْجُمُعَةَ حَتَّى أَهَمَّ الشَّابَّ الْقَرِيبَ الدَّارِ الرُّجُوعُ إِلَى أَهْلِهِ ، فَدَامَتْ جُمُعَةٌ ، فَلَمَّا كَانَتِ الْجُمُعَةُ الَّتِي تَلِيهَا ، قَالُوا : يَا رَسُولَ اللهِ ، تَهَدَّمَتِ الْبُيُوتُ ، وَاحْتَبَسَ الرُّكْبَانُ ، قَالَ : فَتَبَسَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِسُرْعَةِ مَلاَلَةِ ابْنِ آدَمَ ، وَقَالَ بِيَدَيْهِ : اللَّهُمَّ حَوَالَيْنَا وَلاَ عَلَيْنَا فَتَكَشَّطَتْ عَنِ الْمَدِينَةِ.

1527. …Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Bir il quraqlıq olmuşdu. Müsəlmanlardan bir nəfər cümə günü ayağa qalxıb Peyğəmbərə ﷺ dedi: "Ey Allahın Elçisi, yağış yağmadı, torpaq çat-çat oldu, mal-qara tələf oldu". Peyğəmbər ﷺ əllərini elə qaldırdı ki, qoltuqaltının ağlığını gördüm.

[1] Hədis zəifdir.

Göydə heç bir bulud görmürdük. O, Allahdan ﷻ yağış istədi. Cüməni qılmamış evləri yaxında olanlar evə necə gedəcəkləri haqda düşünməyə başladılar. Yağış bir həftə yağdı. Növbəti Cümə camaat dedi: “Ey Allahın Elçisi, evlərimiz dağıldı, minik heyvanlarına minmək mümkün deyil”. Allah Elçisi ﷺ Adəm övladının necə tez bezikdiyini görərək təbəssüm etdi və əllərini qaldıraraq dedi: “Allahım, yağışı üzərimizə deyil, ətrafımıza yağdır!” Yağış da dərhal kəsildi”.

## ١٨ - بَابُ رَفْعِ الإِمَامِ يَدَيْهِ عِنْدَ مَسْأَلَةِ إِمْسَاكِ الْمَطَرِ

## 18-ci fəsil: Yağışın kəsilməsi üçün dua etdikdə əllərin qaldırılması

١٥٢٨ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ خَالِدٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ ، قَالَ : أَنْبَأَنَا أَبُو عَمْرٍو الأَوْزَاعِيُّ ، عَنْ إِسْحَاقَ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : أَصَابَ النَّاسُ سَنَةٌ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَبَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ عَلَى الْمِنْبَرِ يَوْمَ الْجُمُعَةِ ، فَقَامَ أَعْرَابِيٌّ فَقَالَ : يَا رَسُولَ اللهِ ، هَلَكَ الْمَالُ ، وَجَاعَ الْعِيَالُ ، فَادْعُ اللَّهَ لَنَا ، فَرَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَيْهِ ، وَمَا نَرَى فِي السَّمَاءِ قَزَعَةً ، وَالَّذِي نَفْسِي بِيَدِهِ ، مَا وَضَعَهَا حَتَّى ثَارَ سَحَابٌ أَمْثَالُ الْجِبَالِ ، ثُمَّ لَمْ يَنْزِلْ عَنْ مِنْبَرِهِ حَتَّى رَأَيْتُ الْمَطَرَ يَتَحَادَرُ عَلَى لِحْيَتِهِ ، فَمُطِرْنَا يَوْمَنَا ذَلِكَ وَمِنَ الْغَدِ ، وَالَّذِي يَلِيهِ حَتَّى الْجُمُعَةِ الأُخْرَى ، فَقَامَ ذَلِكَ الأَعْرَابِيُّ أَوْ قَالَ غَيْرُهُ فَقَالَ : يَا رَسُولَ اللهِ ، تَهَدَّمَ الْبِنَاءُ ، وَغَرِقَ الْمَالُ ، فَادْعُ اللَّهَ لَنَا ، فَرَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَيْهِ فَقَالَ : اللَّهُمَّ حَوَالَيْنَا وَلاَ عَلَيْنَا ، فَمَا يُشِيرُ بِيَدِهِ إِلَى نَاحِيَةٍ مِنَ السَّحَابِ إِلاَّ انْفَرَجَتْ حَتَّى صَارَتِ الْمَدِينَةُ مِثْلَ الْجَوْبَةِ ، وَسَالَ الْوَادِي وَلَمْ يَجِئْ أَحَدٌ مِنْ نَاحِيَةٍ إِلاَّ أَخْبَرَ بِالْجَوْدِ.

1528. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ؓ demişdir: “Allah Elçisinin ﷺ dövründə insanlara quraqlıq üz vermişdi. Allah Elçisi ﷺ cümə günü minbərdə xütbə deyərkən yanında idim. Bir bədəvi ayağa qalxıb dedi: “Ey Allahın Elçisi, mal-qara həlak oldu, ailəmiz ac qaldı. Bizim üçün Allaha dua et (yağış yağdırsın)!” Allah Elçisi ﷺ dua etmək üçün əllərini qaldırdı. Biz göydə heç bir bulud görmürdük. Canım Əlində Olana and olsun! Dağlar boyda bulud meydana gəldi. Allah Elçisi ﷺ minbərdən aşağı enməmiş saqqalının yağış damcları ilə islandığını gördüm. Səhərisi, birisi gün və növbəti cüməyə qədər bizə yağış yağdı. Həmin bədəvi və ya başqası ayağa qalxıb dedi: “Ey Allahın Elçisi, binalar uçdu, mallarımız su altında qaldı, bizim üçün Allaha dua et ki, yağışı dayandırsın!” Allah Elçisi ﷺ əllərini qaldırıb dua edərək belə dedi: “Allahım, yağışı bizim üzərimizə deyil, ətrafımıza yağdır!” Əli ilə hansı tərəfə işarə edirdisə, buludlar həmin ərazidə dağılırdı. Elə oldu ki, Mədinə ortada qaldı. Yağış ətrafa yağmağa başladı və vadilər sel ilə doldu. Kənar ərazilərdən gələnlər bol yağış və bərəkət xəbərləri ilə gəldilər”.

## ١٨ - كِتَابُ صَلاَةِ الْخَوْفِ

## 18. Qorxu namazı kitabı

١٥٢٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَشْعَثِ بْنِ أَبِي الشَّعْثَاءِ ، عَنِ الأَسْوَدِ بْنِ هِلاَلٍ ، عَنْ ثَعْلَبَةَ بْنِ زَهْدَمٍ ، قَالَ : كُنَّا مَعَ سَعِيدِ بْنِ الْعَاصِي بِطَبَرِسْتَانَ ، وَمَعَنَا حُذَيْفَةُ بْنُ الْيَمَانِ ، فَقَالَ : أَيُّكُمْ صَلَّى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْخَوْفِ ؟ فَقَالَ حُذَيْفَةُ : أَنَا ، فَوَصَفَ ، فَقَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْخَوْفِ بِطَائِفَةٍ رَكْعَةً ، صَفٌّ خَلْفَهُ ، وَطَائِفَةٍ أُخْرَى بَيْنَهُ وَبَيْنَ الْعَدُوِّ ، فَصَلَّى بِالطَّائِفَةِ الَّتِي تَلِيهِ رَكْعَةً ، ثُمَّ نَكَصَ هَؤُلاَءِ إِلَى مَصَافِّ أُولَئِكَ ، وَجَاءَ أُولَئِكَ فَصَلَّى بِهِمْ رَكْعَةً.

1529. …Rəvayət edilir ki, Sələbə ibn Zəhdəm ﷺ demişdir: "Bir dəfə biz Təbəristanda Səid ibn əl-Asın yanında idik. Bizim yanımızda Huzeyfə ibn əl-Yəmən də var idi. O dedi: "Sizdən hansınız Allah Elçisi ﷺ ilə birlikdə qorxu namazını qılıb?" Huzeyfə: "Mən qılmışam"- dedi və bunu vəsf etdi: "Allah Elçisi ﷺ arxada səf olan dəstədə olanlara bir rükət qorxu namazı qıldırdı. Digər dəstədə olanlar onlarla düşmənin arasında durmuşdular. Səfdə duran dəstədə olanlar düşmənlə döyüşən dəstədə olanların yerinə keçdilər. Düşmənlə döyüşən dəstədə olanlar isə Allah Elçisinin ﷺ arxasında bir rükət qıldılar".

١٥٣٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي أَشْعَثُ بْنُ سُلَيْمٍ ، عَنِ الأَسْوَدِ بْنِ هِلاَلٍ ، عَنْ ثَعْلَبَةَ بْنِ زَهْدَمٍ ، قَالَ : كُنَّا مَعَ سَعِيدِ بْنِ الْعَاصِي بِطَبَرِسْتَانَ ، فَقَالَ : أَيُّكُمْ صَلَّى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْخَوْفِ ؟ فَقَالَ : حُذَيْفَةُ : أَنَا ، فَقَامَ حُذَيْفَةُ فَصَفَّ النَّاسُ خَلْفَهُ صَفَّيْنِ ، صَفًّا خَلْفَهُ وَصَفًّا مُوَازِيَ الْعَدُوِّ ، فَصَلَّى بِالَّذِي خَلْفَهُ رَكْعَةً ثُمَّ انْصَرَفَ هَؤُلاَءِ إِلَى مَكَانِ هَؤُلاَءِ ، وَجَاءَ أُولَئِكَ فَصَلَّى بِهِمْ رَكْعَةً وَلَمْ يَقْضُوا

1530. …Rəvayət edilir ki, Sələbə ibn Zəhdəm ﷺ demişdir: "Bir dəfə biz Təbəristanda Səid ibn əl-Asın yanında idik. O dedi: "Sizdən hansınız Allah Elçisi ﷺ ilə birlikdə qorxu namazını qılıb?" Huzeyfə: "Mən qılmışam"- dedi. Huzeyfə ayağa qalxdı və insanlar da arxasında iki səf oldular. Bir qismi arxasında, bir qismi də düşmənlə üz-üzə durdular. Öncə arxasındakılara bir rükət qıldırdı. Sonra onlar düşmənin qarşısında olanlarla yerlərini dəyişdirdilər. Onlar Huzeyfənin arxasında səfdə durdular. Huzeyfə onlara da bir rükət namaz qıldırdı. Onlar (qılmadıqları rükətləri) qəza etmədilər".

١٥٣١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي الرُّكَيْنُ بْنُ الرَّبِيعِ ، عَنِ الْقَاسِمِ بْنِ حَسَّانَ ، عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِثْلَ صَلاَةِ حُذَيْفَةَ.

1531. ...Eyni hədisdir.

١٥٣٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ بُكَيْرِ بْنِ الأَخْنَسِ ، عَنْ مُجَاهِدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، قَالَ : فَرَضَ اللَّهُ الصَّلاَةَ عَلَى لِسَانِ نَبِيِّكُمْ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الْحَضَرِ أَرْبَعًا ، وَفِي السَّفَرِ رَكْعَتَيْنِ ، وَفِي الْخَوْفِ رَكْعَةً.

1532. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah sizin Peyğəmbərinizin ﷺ dili ilə namazı daimi yaşayış yerində dörd, səfərdə iki, qorxu halında isə bir rükət qılmağı fərz etmişdir".

١٥٣٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنِي أَبُو بَكْرِ بْنُ أَبِي الْجَهْمِ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِذِي قَرَدٍ ، وَصَفَّ النَّاسُ خَلْفَهُ صَفَّيْنِ ، صَفًّا خَلْفَهُ وَصَفًّا مُوَازِيَ الْعَدُوِّ ، فَصَلَّى بِالَّذِينَ خَلْفَهُ رَكْعَةً ، ثُمَّ انْصَرَفَ هَؤُلاَءِ إِلَى مَكَانِ هَؤُلاَءِ ، وَجَاءَ أُولَئِكَ فَصَلَّى بِهِمْ رَكْعَةً وَلَمْ يَقْضُوا.

1533. …İbn Abbas ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Zu-Qarad döyüşündə namaz qıldırdı. İnsanlar iki səf oldular. Səflərdən biri onun arxasında, digəri isə düşmənlə üz-üzə durdu. Arxasındakılara bir rükət qıldırdıqdan sonra onlar digərlərinin yerinə keçdilər. Düşmənlə üz-üzə duranlar isə gəlib Peyğəmbərin ﷺ arxasında durdular. Peyğəmbər ﷺ onlara da bir rükət qıldırdı. Camaatdan heç kəs (qalan bir rükəti) qəza etmədi.

١٥٣٤ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرٍ ، عَنْ مُحَمَّدٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عَبَّاسٍ قَالَ : قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَقَامَ النَّاسُ مَعَهُ فَكَبَّرَ وَكَبَّرُوا ، ثُمَّ رَكَعَ وَرَكَعَ أُنَاسٌ مِنْهُمْ ، ثُمَّ سَجَدَ وَسَجَدُوا ، ثُمَّ قَامَ إِلَى الرَّكْعَةِ الثَّانِيَةِ ، فَتَأَخَّرَ الَّذِينَ سَجَدُوا مَعَهُ وَحَرَسُوا إِخْوَانَهُمْ ، وَأَتَتِ الطَّائِفَةُ الأُخْرَى فَرَكَعُوا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَسَجَدُوا وَالنَّاسُ كُلُّهُمْ فِي صَلاَةٍ يُكَبِّرُونَ وَلَكِنْ يَحْرُسُ بَعْضُهُمْ بَعْضًا.

1534. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ ayağa durduqda, insanlar da ayağa durdular. O, təkbir etdikdə, insanlar da təkbir etdilər. O, ruku etdikdə, insanlardan da bir qismi ruku etdi. Sonra səcdə etdikdə, insanlar da səcdə etdilər. Sonra ikinci rükətə qalxdılar. Peyğəmbərlə ﷺ səcdə edənlər digər döyüşən qardaşlarının yerinə keçdilər. Digərləri gəlib Peyğəmbərlə ﷺ birlikdə ruku və səcdə etdilər. Camaatın hamısı eyni vaxtda təkbir edirdilər, lakin bir qismi gözləyirdi".

١٥٣٥ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ ابْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنِي دَاوُدُ بْنُ الْحُصَيْنِ ، عَنْ عِكْرِمَةَ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : مَا كَانَتْ صَلَاةُ الْخَوْفِ إِلاَّ سَجْدَتَيْنِ كَصَلاَةِ أَحْرَاسِكُمْ هَؤُلَاءِ الْيَوْمَ خَلْفَ أَئِمَّتِكُمْ هَؤُلَاءِ ، إِلاَّ أَنَّهَا كَانَتْ عُقَبًا ، قَامَتْ طَائِفَةٌ مِنْهُمْ وَهُمْ جَمِيعًا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَسَجَدَتْ مَعَهُ طَائِفَةٌ مِنْهُمْ ، ثُمَّ قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَامُوا مَعَهُ جَمِيعًا ، ثُمَّ رَكَعَ وَرَكَعُوا مَعَهُ جَمِيعًا ، ثُمَّ سَجَدَ فَسَجَدَ مَعَهُ الَّذِينَ كَانُوا قِيَامًا أَوَّلَ مَرَّةٍ ، فَلَمَّا جَلَسَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالَّذِينَ سَجَدُوا مَعَهُ فِي آخِرِ صَلَاتِهِمْ سَجَدَ الَّذِينَ كَانُوا قِيَامًا لأَنْفُسِهِمْ ، ثُمَّ جَلَسُوا فَجَمَعَهُمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالتَّسْلِيمِ.

1535. …Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Qorxu namazı (döyüşdə düşmənlə üzbəüz dayanan) sizi qoruyanların arxasında imamınızın sizinlə birlikdə qıldığı iki səcdəli namazdır. Amma rükətləri hər dəstə bir-birindən ayrı şəkildə ard-arda qılır. Onlar Allah Elçisi ﷺ ilə birlikdə camaatla namaz qılarkən bir dəstə ayaq üstə gözləyər, digər dəstə isə Allah Elçisi ﷺ ilə birlikdə səcdə edərdi. Allah Elçisi ﷺ qalxar, onlar da hamısı onunla birlikdə ayağa qalxardılar. Sonra Allah Elçisi ﷺ ruku edər, onlar da onunla birlikdə ruku edərdilər. İlk dəfə qiyamda olanlar Allah Elçisi ﷺ ilə birlikdə səcdə edərdilər. Allah Elçisi ﷺ oturduqda, onunla birlikdə səcdə edənlər namazlarını tamamlayardılar. Sonra onlar oturar və Allah Elçisi ﷺ onlarla birlikdə salam verərdi".

١٥٣٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ صَالِحِ بْنِ خَوَّاتٍ ، عَنْ سَهْلِ بْنِ أَبِي حَثْمَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِهِمْ صَلَاةَ الْخَوْفِ ، فَصَفَّ صَفًّا خَلْفَهُ وَصَفًّا مُصَافُّو الْعَدُوِّ ، فَصَلَّى بِهِمْ رَكْعَةً ، ثُمَّ ذَهَبَ هَؤُلَاءِ وَجَاءَ أُولَئِكَ ، فَصَلَّى بِهِمْ رَكْعَةً ، ثُمَّ قَامُوا فَقَضَوْا رَكْعَةً رَكْعَةً.

1536. …Səhl ibn Əbu Həsmə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ onlara qorxu namazı qıldırdıqda, onları iki hissəyə ayırdı. Bir qismi onun arxasında səfdə durdu, digər qismi isə düşmənlə üzbəüz durdu. Arxasındakılara bir rükət namaz qıldırdıqdan sonra onlar digərləri ilə yerlərini dəyişdirdilər. Onlara da bir rükət namaz qıldırdı. Sonra hər iki dəstə bir rükəti qəza etdi".

١٥٣٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ يَزِيدَ بْنِ رُومَانَ ، عَنْ صَالِحِ بْنِ خَوَّاتٍ ، عَمَّنْ صَلَّى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ ذَاتِ الرِّقَاعِ صَلَاةَ الْخَوْفِ ، أَنَّ طَائِفَةً صَفَّتْ مَعَهُ ، وَطَائِفَةٌ وِجَاهَ الْعَدُوِّ ، فَصَلَّى بِالَّذِينَ مَعَهُ رَكْعَةً ، ثُمَّ ثَبَتَ قَائِمًا وَأَتَمُّوا لأَنْفُسِهِمْ ثُمَّ انْصَرَفُوا ، فَصَفُّوا وِجَاهَ الْعَدُوِّ ، وَجَاءَتِ الطَّائِفَةُ الأُخْرَى فَصَلَّى بِهِمُ الرَّكْعَةَ الَّتِي بَقِيَتْ مِنْ صَلَاتِهِ ، ثُمَّ ثَبَتَ جَالِسًا وَأَتَمُّوا لأَنْفُسِهِمْ ، ثُمَّ سَلَّمَ بِهِمْ.

1537. ...Salih ibn Xavvat ﷺ Allah Elçisi ﷺ ilə birlikdə qorxu namazı qılan bir nəfərdən rəvayət edir ki, Allah Elçisi ﷺ Zatir-Riqa döyüşündə qorxu namazını qıldı. Bir dəstə onunla birlikdə namaz üçün safda olduğu halda, digər dəstə düşmənlə üz-üzə idi. Onunla olan dəstəyə bir rükət namaz qıldırdı və ayağa durdu. Onlar isə özləri namazı tamamladılar. Sonra isə düşmən ilə üz-üzə dayananlarla yerlərini dəyişdilər. Allah Elçisi ﷺ bu dəstə ilə də qalan bir rükəti qıldı və oturdu. Onlar da qılmadıqları bir rükəti təkbaşına qıldılar. Sonra Allah Elçisi ﷺ onlarla birlikdə salam verdi".

١٥٣٨ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ يَزِيدَ بْنِ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِإِحْدَى الطَّائِفَتَيْنِ رَكْعَةً ، وَالطَّائِفَةُ الأُخْرَى مُوَاجِهَةُ الْعَدُوِّ ، ثُمَّ انْطَلَقُوا فَقَامُوا فِي مَقَامِ أُولَئِكَ ، وَجَاءَ أُولَئِكَ فَصَلَّى بِهِمْ رَكْعَةً أُخْرَى ، ثُمَّ سَلَّمَ عَلَيْهِمْ ، فَقَامَ هَؤُلاَءِ فَقَضَوْا رَكْعَتَهُمْ ، وَقَامَ هَؤُلاَءِ فَقَضَوْا رَكْعَتَهُمْ.

1538. ...Səlim atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ iki dəstədən birinə namaz qıldırdıqda, digər dəstə düşmənə qarşı dayanmışdı. Sonra namaz qılanlarla düşmənə qarşı dayananlar yerlərini dəyişdirdilər. Allah Elçisi ﷺ qalan bir rükəti də onlarla qılıb salam verdi. Sonra dəstələrdən biri, daha sonra digər dəstədə olanlar qalan bir rükəti tamamladılar.

١٥٣٩ - أَخْبَرَنِي كَثِيرُ بْنُ عُبَيْدٍ ، عَنْ بَقِيَّةَ ، عَنْ شُعَيْبٍ ، قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ ، قَالَ : حَدَّثَنِي سَالِمُ بْنُ عَبْدِ اللهِ ، عَنْ أَبِيهِ ، قَالَ : غَزَوْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قِبَلَ نَجْدٍ ، فَوَازَيْنَا الْعَدُوَّ وَصَافَفْنَاهُمْ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بِنَا ، فَقَامَتْ طَائِفَةٌ مِنَّا مَعَهُ ، وَأَقْبَلَ طَائِفَةٌ عَلَى الْعَدُوِّ ، فَرَكَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَمَنْ مَعَهُ رَكْعَةً ، وَسَجَدَ سَجْدَتَيْنِ ، ثُمَّ انْصَرَفُوا فَكَانُوا مَكَانَ أُولَئِكَ الَّذِينَ لَمْ يُصَلُّوا ، وَجَاءَتِ الطَّائِفَةُ الَّتِي لَمْ تُصَلِّ فَرَكَعَ بِهِمْ رَكْعَةً وَسَجْدَتَيْنِ ، ثُمَّ سَلَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَامَ كُلُّ رَجُلٍ مِنَ الْمُسْلِمِينَ فَرَكَعَ لِنَفْسِهِ رَكْعَةً وَسَجْدَتَيْنِ.

1539. ...Səlim ibn Abdullah atasının ﷺ belə dediyini rəvat etmişdir: "Allah Elçisi ﷺ ilə birlikdə Nəcd tərəfdə bir döyüşdə iştirak etmişdim. Düşmənlə qarşılaşdıqda səfdə durduq və Allah Elçisi ﷺ bizə namaz qıldırdı. Onunla birlikdə bir dəstə namaza qalxdı, digər dəstə isə düşmənə qarşı dayandı. Allah Elçisi ﷺ ruku etdi və onunla birlikdə olan dəstədə olanlar da ruku və iki səcdə etdilər. Sonra namaz qılmayan dəstədə olanlar onların yerlərinə keçdilər. Bu dəstədə olanlar da bir ruku və iki səcdə etdikdən sonra Allah Elçisi ﷺ salam verdi. Müsəlmanlardan olan hər bir kişi özlüyündə bir ruku və iki səcdəli namaz qıldı".

١٥٤٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحِيمِ الْبَرْقِيُّ ، عَنْ عَبْدِ اللهِ بْنِ يُوسُفَ ، قَالَ : أَنْبَأَنَا سَعِيدُ بْنُ عَبْدِ الْعَزِيزِ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : كَانَ عَبْدُ اللهِ بْنُ عُمَرَ يُحَدِّثُ ، أَنَّهُ صَلَّى صَلاَةَ الْخَوْفِ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : كَبَّرَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَصَفَّ خَلْفَهُ طَائِفَةٌ مِنَّا ، وَأَقْبَلَتْ طَائِفَةٌ عَلَى الْعَدُوِّ ، فَرَكَعَ بِهِمُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَةً وَسَجْدَتَيْنِ ، ثُمَّ انْصَرَفُوا وَأَقْبَلُوا عَلَى الْعَدُوِّ ، وَجَاءَتِ الطَّائِفَةُ الأُخْرَى فَصَلَّوْا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَفَعَلَ مِثْلَ ذَلِكَ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ قَامَ كُلُّ رَجُلٍ مِنَ الطَّائِفَتَيْنِ فَصَلَّى لِنَفْسِهِ رَكْعَةً وَسَجْدَتَيْنِ.

1540. ...Rəvayət edilir ki, Zuhri ﷺ demişdir: “Abdullah ibn Ömər ﷺ deyirdi: “Bir dəfə Allah Elçisi ﷺ ilə birlikdə qorxu namazını qılırdım. Peyğəmbər ﷺ təkbir etdi və bizdən bir dəstə onun arxasında səfdə durdu. Digər bir dəstə isə düşmənə qarşı durdu. Peyğəmbər ﷺ bizimlə birlikdə bir ruku və iki səcdə edərək bir rükət qıldı, sonra biz çevrilib düşmənə qarşı durduq. Digər dəstə də gəlib bizim yerimizə keçdi. Peyğəmbər ﷺ onlara da eyni şəkildə bir rükət namaz qıldırdı. Sonra da salam verdi. Daha sonra hər iki dəstədən olanlar təklikdə namazlarını bir rükətdə bir ruku və iki səcdə ilə tamamladılar”.

١٥٤١ - أَخْبَرَنِي عِمْرَانُ بْنُ بَكَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْمُبَارَكِ ، قَالَ : أَنْبَأَنَا الْهَيْثَمُ بْنُ حُمَيْدٍ ، عَنِ الْعَلاَءِ ، وَأَبِي أَيُّوبَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ ، قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْخَوْفِ قَامَ فَكَبَّرَ ، فَصَلَّى خَلْفَهُ طَائِفَةٌ مِنَّا وَطَائِفَةٌ مُوَاجِهَةَ الْعَدُوِّ ، فَرَكَعَ بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَةً وَسَجَدَ سَجْدَتَيْنِ ، ثُمَّ انْصَرَفُوا وَلَمْ يُسَلِّمُوا وَأَقْبَلُوا عَلَى الْعَدُوِّ ، فَصَفُّوا مَكَانَهُمْ ، وَجَاءَتِ الطَّائِفَةُ الأُخْرَى فَصَفُّوا خَلْفَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَصَلَّى بِهِمْ رَكْعَةً وَسَجْدَتَيْنِ ، ثُمَّ سَلَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَدْ أَتَمَّ رَكْعَتَيْنِ وَأَرْبَعَ سَجَدَاتٍ ، ثُمَّ قَامَتِ الطَّائِفَتَانِ فَصَلَّى كُلُّ إِنْسَانٍ مِنْهُمْ لِنَفْسِهِ رَكْعَةً وَسَجْدَتَيْنِ قَالَ أَبُو بَكْرِ بْنُ السُّنِّيِّ : الزُّهْرِيُّ سَمِعَ مِنِ ابْنِ عُمَرَ حَدِيثَيْنِ وَلَمْ يَسْمَعْ هَذَا مِنْهُ.

1541. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﷺ demişdir: “Allah Elçisi ﷺ qorxu namazını qıldırdı. O, ayağa durdu və təkbir etdi. Arxasında bir dəstə onunla namaz qıldığı halda, digər dəstə düşmənin qarşısında dayanmışdı. Allah Elçisi ﷺ onlarla bir ruku və iki səcdə edərək bir rükət qıldı. Sonra onlar salam vermədən namazdan çıxdılar. Bu dəstə düşmənə qarşı dayananların yerinə keçdi. (Düşmənin qarşısında əvvəl dayanan) dəstə gəlib Allah Elçisinin ﷺ arxasında səfdə duraraq bir ruku və iki səcdə edərək namazlarını qıldılar. Sonra Allah Elçisi ﷺ salam verərək namazı iki ruku və dörd səcdə olaraq tamamlamış oldu. Sonra hər kəs bir ruku və iki səcdə olmaqla bir rükət namaz qılaraq namazlarını tamamlamış oldular”.

١٥٤٢ - أَخْبَرَنَا عَبْدُ الأَعْلَى بْنُ وَاصِلِ بْنِ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، عَنْ سُفْيَانَ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْخَوْفِ فِي بَعْضِ أَيَّامِهِ ، فَقَامَتْ طَائِفَةٌ مَعَهُ وَطَائِفَةٌ بِإِزَاءِ الْعَدُوِّ ، فَصَلَّى بِالَّذِينَ مَعَهُ رَكْعَةً ، ثُمَّ ذَهَبُوا وَجَاءَ الآخَرُونَ فَصَلَّى بِهِمْ رَكْعَةً ، ثُمَّ قَضَتِ الطَّائِفَتَانِ رَكْعَةً رَكْعَةً.

1542. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: “Bəzi döyüşlərdə Allah Elçisi ﷺ qorxu namazı qıldırmışdı. Bir dəstədə olanlar onunla birlikdə səfdə durub namaz qılarkən, digər dəstədə olanlar düşmən ilə qarşı-qarşıya idi. Allah Elçisi ﷺ yanındakılara bir rükət namaz qıldırdı. Sonra bu dəstədə olanlar getdi və digər dəstədə olanlar gəldi. Allah Elçisi ﷺ onlara da bir rükət qıldırdı, sonra hər iki dəstədə olanlar təkbaşına bir rükət qıldılar”.

١٥٤٣ - أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ بْنُ يَزِيدَ الْمُقْرِئُ (ح) وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا حَيْوَةُ ، وَذَكَرَ آخَرَ ، قَالاَ : حَدَّثَنَا أَبُو الأَسْوَدِ ، أَنَّهُ سَمِعَ عُرْوَةَ بْنَ الزُّبَيْرِ يُحَدِّثُ ، عَنْ مَرْوَانَ بْنِ الْحَكَمِ ، أَنَّهُ سَأَلَ أَبَا هُرَيْرَةَ : هَلْ صَلَّيْتَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْخَوْفِ ؟ فَقَالَ أَبُو هُرَيْرَةَ : نَعَمْ ، قَالَ : مَتَى ، قَالَ : عَامَ غَزْوَةِ نَجْدٍ ، قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِصَلاَةِ الْعَصْرِ وَقَامَتْ مَعَهُ طَائِفَةٌ وَطَائِفَةٌ أُخْرَى مُقَابِلَ الْعَدُوِّ وَظُهُورُهُمْ إِلَى الْقِبْلَةِ ، فَكَبَّرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَكَبَّرُوا جَمِيعًا الَّذِينَ مَعَهُ وَالَّذِينَ يُقَابِلُونَ الْعَدُوَّ ، ثُمَّ رَكَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَةً وَاحِدَةً وَرَكَعَتْ مَعَهُ الطَّائِفَةُ الَّتِي تَلِيهِ ، ثُمَّ سَجَدَ وَسَجَدَتِ الطَّائِفَةُ الَّتِي تَلِيهِ وَالآخَرُونَ قِيَامٌ مُقَابِلَ الْعَدُوِّ ، ثُمَّ قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَامَتِ الطَّائِفَةُ الَّتِي مَعَهُ ، فَذَهَبُوا إِلَى الْعَدُوِّ فَقَابَلُوهُمْ ، وَأَقْبَلَتِ الطَّائِفَةُ الَّتِي كَانَتْ مُقَابِلَ الْعَدُوِّ فَرَكَعُوا وَسَجَدُوا ، وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَائِمٌ كَمَا هُوَ ، ثُمَّ قَامُوا فَرَكَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَةً أُخْرَى وَرَكَعُوا مَعَهُ وَسَجَدَ وَسَجَدُوا مَعَهُ ، ثُمَّ أَقْبَلَتِ الطَّائِفَةُ الَّتِي كَانَتْ مُقَابِلَ الْعَدُوِّ فَرَكَعُوا وَسَجَدُوا وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَاعِدٌ وَمَنْ مَعَهُ ، ثُمَّ كَانَ السَّلاَمُ فَسَلَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَسَلَّمُوا جَمِيعًا ، فَكَانَ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَانِ وَلِكُلِّ رَجُلٍ مِنَ الطَّائِفَتَيْنِ رَكْعَتَانِ رَكْعَتَانِ.

1543. ...Rəvayət edilir ki, Mərvan ibn əl-Həkəm ﵁ Əbu Hureyradan soruşdu: “Sən Allah Elçisi ﷺ ilə qorxu namazını qılmısanmı?” Əbu Hureyra: “Bəli!”- dedi. Mərvan dedi: “Nə vaxt?” Əbu Hureyra dedi: “Nəcd döyüşü vaxtı. Allah Elçisi ﷺ Əsr namazını qılmaq üçün qalxdı və onunla yanaşı bir dəstə də namaza qalxdı. Digər dəstə isə arxaları qibləyə doğru olduqları halda düşmənə qarşı durdular. Allah Elçisi ﷺ təkbir etdi və hər iki dəstədə olanlar təkbir etdilər. Sonra Allah Elçisi ﷺ ruku etdi və onun yanında olan dəstədə olanlar ruku etdilər. Sonra səcdə etdi, onlar da səcdə etdilər. Digər dəstədə olanlar isə düşmənə qarşı durmuşdular. Sonra Allah Elçisi ﷺ qalxdıqda, onun yanındakı dəstədə olanlar qalxıb düşmənə qarşı dayanmaq üçün getdilər. Düşmənə qarşı duran dəstədə olanlar gəlib ruku

və səcdə etdilər. Bu zaman Allah Elçisi ﷺ ayaq üstə durmuşdu. Sonra qalxdılar və Allah Elçisi ﷺ ruku etdi, onlar da ruku etdilər. O, səcdə etdikdə, onlar da səcdə etdilər. Sonra düşmənə qarşı duran dəstədə olanlar gəlib ruku və səcdə etdilər. Allah Elçisi ﷺ də oturub gözləyirdi. Onun yanında olanlar da oturmuşdular. Sonra Allah Elçisi ﷺ salam verdikdə, hamı salam verdi. Allah Elçisinə ﷺ iki rükət, hər dəstədən olanlara da iki rükət düşdü".

١٥٤٤ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ ، قَالَ : حَدَّثَنِي عَبْدُ الصَّمَدِ بْنُ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنِي سَعِيدُ بْنُ عُبَيْدٍ الْهُنَائِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ شَقِيقٍ ، قَالَ : حَدَّثَنَا أَبُو هُرَيْرَةَ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَازِلاً بَيْنَ ضَجْنَانَ وَعُسْفَانَ مُحَاصِرَ الْمُشْرِكِينَ ، فَقَالَ الْمُشْرِكُونَ : إِنَّ لِهَؤُلاَءِ صَلاَةً هِيَ أَحَبُّ إِلَيْهِمْ مِنْ أَبْنَائِهِمْ وَأَبْكَارِهِمْ ، أَجْمِعُوا أَمْرَكُمْ ثُمَّ مِيلُوا عَلَيْهِمْ مَيْلَةً وَاحِدَةً ، فَجَاءَ جِبْرِيلُ عَلَيْهِ السَّلاَمُ فَأَمَرَهُ أَنْ يَقْسِمَ أَصْحَابَهُ نِصْفَيْنِ ، فَيُصَلِّيَ بِطَائِفَةٍ مِنْهُمْ ، وَطَائِفَةٌ مُقْبِلُونَ عَلَى عَدُوِّهِمْ قَدْ أَخَذُوا حِذْرَهُمْ وَأَسْلِحَتَهُمْ ، فَيُصَلِّيَ بِهِمْ رَكْعَةً ، ثُمَّ يَتَأَخَّرَ هَؤُلاَءِ وَيَتَقَدَّمَ أُولَئِكَ فَيُصَلِّيَ بِهِمْ رَكْعَةً تَكُونُ لَهُمْ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَةً رَكْعَةً وَلِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَانِ.

1544. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: "Allah Elçisi ﷺ Dacnən və Usfan arasında olan bir yerdə müşriklərin mühasirəsində idi. Müşriklər dedilər: "Həqiqətən, onların bu namazdan sonra elə bir namazları var ki, onlara övladlarından və qızlarından daha sevimlidir. İşlərinizi toparlayın və onlara bir dəfə həmlə edib (məhv edin)". Sonra Cəbrail ؑ nazil oldu. Peyğəmbərə ﷺ öz səhabələrini iki dəstəyə bölməyi, bir dəstə ilə namaz qılmasını, o biri dəstənin isə silahlarını və ehtiyatlarını götürərək düşmənə tərəf dayanmasını əmr etdi". Peyğəmbər ﷺ onlarla (bir dəstə ilə) bir rükət qıldı, sonra onlar arxaya çəkildilər və ikinci dəstə qabağa gəldi. Onlarla da bir rükət qıldı. Bu, onların hər biri üçün Peyğəmbər ﷺ ilə bir rükət oldu, Peyğəmbər ﷺ isə iki rükət qılmış oldu".

١٥٤٥ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، عَنْ حَجَّاجِ بْنِ مُحَمَّدٍ ، عَنْ شُعْبَةَ ، عَنِ الْحَكَمِ ، عَنْ يَزِيدَ الْفَقِيرِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِهِمْ صَلاَةَ الْخَوْفِ ، فَقَامَ صَفٌّ بَيْنَ يَدَيْهِ وَصَفٌّ خَلْفَهُ ، صَلَّى بِالَّذِينَ خَلْفَهُ رَكْعَةً وَسَجْدَتَيْنِ ، ثُمَّ تَقَدَّمَ هَؤُلاَءِ حَتَّى قَامُوا فِي مَقَامِ أَصْحَابِهِمْ ، وَجَاءَ أُولَئِكَ فَقَامُوا مَقَامَ هَؤُلاَءِ ، وَصَلَّى بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَةً وَسَجْدَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، فَكَانَتْ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَتَانِ وَلَهُمْ رَكْعَةٌ.

1545. ...Cabir ibn Abdullah ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ onlarla qorxu namazı qılmışdı. Allah Elçisi ﷺ ayağa durdu, bir səf onun qabağında və bir səf də arxasında dayandı. Allah Elçisi ﷺ onun arxasında dayananlarla birlikdə bir ruku və iki səcdə etdi. Sonra qabaqda dayananlar arxada dayanan

səhabə dostları ilə yerlərini dəyişdilər. Allah Elçisi ﷺ onun arxasına keçən səflə birlikdə bir ruku və iki səcdə etdi. Sonra da salam verdi. Allah Elçisi ﷺ üçün namaz iki rükət oldu. Hər dəstədə olan səhabələr üçün isə bir rükət oldu.

١٥٤٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ الْمِقْدَامِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ عَبْدِ اللهِ الْمَسْعُودِيُّ ، قَالَ : أَنْبَأَنِي يَزِيدُ الْفَقِيرُ ، أَنَّهُ سَمِعَ جَابِرَ بْنَ عَبْدِ اللهِ ، قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأُقِيمَتِ الصَّلَاةُ فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَامَتْ خَلْفَهُ طَائِفَةٌ وَطَائِفَةٌ مُوَاجِهَةَ الْعَدُوِّ ، فَصَلَّى بِالَّذِينَ خَلْفَهُ رَكْعَةً وَسَجَدَ بِهِمْ سَجْدَتَيْنِ ، ثُمَّ إِنَّهُمُ انْطَلَقُوا فَقَامُوا مَقَامَ أُولَئِكَ الَّذِينَ كَانُوا فِي وَجْهِ الْعَدُوِّ ، وَجَاءَتْ تِلْكَ الطَّائِفَةُ فَصَلَّى بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَكْعَةً وَسَجَدَ بِهِمْ سَجْدَتَيْنِ ، ثُمَّ إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَلَّمَ فَسَلَّمَ الَّذِينَ خَلْفَهُ وَسَلَّمَ أُولَئِكَ.

1546. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah رضي الله عنهما demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə idik. Namaza iqamə verildi və Allah Elçisi ﷺ namaza qalxdı. Camaatdan olan bir dəstə onun arxasında dayandı və bir dəstə də düşmənə tərəf dayandı. Allah Elçisi ﷺ onun arxasında olanlarla birlikdə bir ruku və iki səcdə etdi. Sonra arxada dayanan dəstədə olanlar düşmənlə üz-üzə dayanan dəstə ilə yerlərini dəyişdilər. Allah Elçisi ﷺ onlarla birlikdə bir ruku və iki səcdə etdi, arxasında olanlarla birlikdə salam verdi. Düşmənlə üzbəüz dayananlar da salam verdilər”.

١٥٤٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ الْحُسَيْنِ الدِّرْهَمِيُّ ، وَإِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَا : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنْ جَابِرٍ ، قَالَ : شَهِدْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَاةَ الْخَوْفِ ، فَقُمْنَا خَلْفَهُ صَفَّيْنِ وَالْعَدُوُّ بَيْنَنَا وَبَيْنَ الْقِبْلَةِ ، فَكَبَّرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَكَبَّرْنَا ، وَرَكَعَ وَرَكَعْنَا ، وَرَفَعَ وَرَفَعْنَا ، فَلَمَّا انْحَدَرَ لِلسُّجُودِ سَجَدَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالَّذِينَ يَلُونَهُ ، وَقَامَ الصَّفُّ الثَّانِي حِينَ رَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالصَّفُّ الَّذِينَ يَلُونَهُ ، ثُمَّ سَجَدَ الصَّفُّ الثَّانِي حِينَ رَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي أَمْكِنَتِهِمْ ، ثُمَّ تَأَخَّرَ الصَّفُّ الَّذِينَ كَانُوا يَلُونَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَتَقَدَّمَ الصَّفُّ الآخَرُ فَقَامُوا فِي مَقَامِهِمْ وَقَامَ هَؤُلَاءِ فِي مَقَامِ الآخَرِينَ قِيَامًا ، وَرَكَعَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَرَكَعْنَا ، ثُمَّ رَفَعَ وَرَفَعْنَا ، فَلَمَّا انْحَدَرَ لِلسُّجُودِ سَجَدَ الَّذِينَ يَلُونَهُ وَالآخَرُونَ قِيَامٌ ، فَلَمَّا رَفَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالَّذِينَ يَلُونَهُ سَجَدَ الآخَرُونَ ، ثُمَّ سَلَّمَ.

1547. …Rəvayət edilir ki, Cabir رضي الله عنه demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə qorxu namazını qıldıq və onun arxasında iki səfdə düzləndik. Düşmən isə bizimlə qiblənin arasında idi. Allah Elçisi ﷺ təkbir etdikdə, biz də təkbir etdik. O, ruku etdikdə, biz də ruku etdik. O, rukudan qalxdıqda, biz də rukudan qalxdıq. Səcdə etmək istədikdə, onun arxasında olan birinci səfdə olanlar onunla birlikdə səcdə etdilər. İkinci səfdə olanlar isə ayaq üstə

dayandılar. Sonra Allah Elçisi ﷺ qalxdıqda, onun arxasında olanlar da qalxdılar. Sonra birinci səfdə olanlarla ikinci səfdə olanlar yerlərini dəyişdilər. Allah Elçisi ﷺ ruku etdikdə, biz də ruku etdik. Sonra o, rukudan dikəldikdə, biz də rukudan qalxdıq. Sonra səcdənin vaxtı gəldikdə, Allah Elçisi ﷺ səcdə etdi, ikinci səfdə olanlar ayaq üstə dayandılar. Allah Elçisi ﷺ və onun arxasında olanlar qalxdıqda, digərləri səcdə etdilər, sonra da salam verdilər”.

١٥٤٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، قَالَ : كُنَّا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِنَخْلٍ وَالْعَدُوُّ بَيْنَنَا وَبَيْنَ الْقِبْلَةِ فَكَبَّرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَكَبَّرُوا جَمِيعًا ، ثُمَّ رَكَعَ فَرَكَعُوا جَمِيعًا ، ثُمَّ سَجَدَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالصَّفُّ الَّذِي يَلِيهِ وَالآخَرُونَ قِيَامٌ يَحْرُسُونَهُمْ ، فَلَمَّا قَامُوا سَجَدَ الآخَرُونَ مَكَانَهُمُ الَّذِي كَانُوا فِيهِ ، ثُمَّ تَقَدَّمَ هَؤُلاَءِ إِلَى مَصَافِّ هَؤُلاَءِ ، فَرَكَعَ فَرَكَعُوا جَمِيعًا ، ثُمَّ رَفَعَ فَرَفَعُوا جَمِيعًا ، ثُمَّ سَجَدَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَالصَّفُّ الَّذِينَ يَلُونَهُ وَالآخَرُونَ قِيَامٌ يَحْرُسُونَهُمْ ، فَلَمَّا سَجَدُوا وَجَلَسُوا سَجَدَ الآخَرُونَ مَكَانَهُمْ ، ثُمَّ سَلَّمَ ، قَالَ جَابِرٌ : كَمَا يَفْعَلُ أُمَرَاؤُكُمْ.

1548. …Rəvayət edilir ki, Cabir ؓ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə Nəxl deyilən yerdə idik. Düşmən isə bizimlə qiblənin arasında idi. Allah Elçisi ﷺ təkbir etdikdə, (orduda olanlar) hamısı onunla birlikdə təkbir etdilər. Sonra o, ruku etdikdə, onlar hamısı onunla birlikdə ruku etdilər. Daha sonra Peyğəmbər ﷺ səcdə etdikdə, onun arxasında səfdə olanlar onunla birlikdə səcdə etdilər. İkinci səfdə olanlar isə ayaq üstə dayanıb onları qorudular. Onlar səcdədən qalxdıqda, səcdə etməyənlər səcdə etdilər. Sonra ikinci səfdə olanlar onların yerinə keçdilər. Sonra Allah Elçisi ﷺ ruku etdi, onun arxasında olanlar da ruku etdilər. Sonra Allah Elçisi ﷺ rukudan qalxdıqda, onlar da rukudan qalxdılar. Daha sonra Peyğəmbər ﷺ səcdə etdi, onun arxasında onlar da səcdə etdilər. Digərləri isə ayaq üstə dayanıb onları qorudular. Onlar səcdə edib oturdular, digərləri də səcdə etdilər. Sonra Allah Elçisi ﷺ salam verdi”. Cabir dedi: “Sizin əmirlərinizin etdiyi kimi etdi”.

١٥٤٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، وَمُحَمَّدُ بْنُ بَشَّارٍ ، عَنْ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، قَالَ : سَمِعْتُ مُجَاهِدًا يُحَدِّثُ ، عَنْ أَبِي عَيَّاشٍ الزُّرَقِيِّ - قَالَ شُعْبَةُ : كَتَبَ بِهِ إِلَيَّ وَقَرَأْتُهُ عَلَيْهِ وَسَمِعْتُهُ مِنْهُ يُحَدِّثُ وَلَكِنِّي حَفِظْتُهُ ، قَالَ ابْنُ بَشَّارٍ : فِي حَدِيثِهِ حِفْظِي مِنَ الْكِتَابِ - أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ مُصَافَّ الْعَدُوِّ بِعُسْفَانَ ، وَعَلَى الْمُشْرِكِينَ خَالِدُ بْنُ الْوَلِيدِ ، فَصَلَّى بِهِمُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الظُّهْرَ ، قَالَ الْمُشْرِكُونَ : إِنَّ لَهُمْ صَلاَةً بَعْدَ هَذِهِ هِيَ أَحَبُّ إِلَيْهِمْ مِنْ أَمْوَالِهِمْ وَأَبْنَائِهِمْ ، فَصَلَّى بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْعَصْرَ ، فَصَفَّهُمْ صَفَّيْنِ خَلْفَهُ ، فَرَكَعَ بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَمِيعًا ، فَلَمَّا

رَفَعُوا رُؤُوسَهُمْ سَجَدَ بِالصَّفِّ الَّذِي يَلِيهِ وَقَامَ الآخَرُونَ ، فَلَمَّا رَفَعُوا رُؤُوسَهُمْ مِنَ السُّجُودِ سَجَدَ الصَّفُّ الْمُؤَخَّرُ بِرُكُوعِهِمْ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ تَأَخَّرَ الصَّفُّ الْمُقَدَّمُ ، وَتَقَدَّمَ الصَّفُّ الْمُؤَخَّرُ ، فَقَامَ كُلُّ وَاحِدٍ مِنْهُمْ فِي مَقَامِ صَاحِبِهِ ، ثُمَّ رَكَعَ بِهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَمِيعًا ، فَلَمَّا رَفَعُوا رُؤُوسَهُمْ مِنَ الرُّكُوعِ سَجَدَ الصَّفُّ الَّذِي يَلِيهِ وَقَامَ الآخَرُونَ ، فَلَمَّا فَرَغُوا مِنْ سُجُودِهِمْ سَجَدَ الآخَرُونَ ، ثُمَّ سَلَّمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَيْهِمْ.

1549. ...Əbu Ayyəş əz-Zuraqi ﷺ rəvayət edir ki, Şöbə belə demişdir: “O, mənə məktub yazmışdı, mən də məktubu oxumuşdum. Bunu ondan eşitmişdim deyə əzbərləmişdim. Mənim əzbərlədiyim hədisdə İbn Bəşşar belə dedi: “Peyğəmbər ﷺ düşmənlə Usfan (döyüşündə) qarşılaşmışdı. Müşriklərə Xalid ibn Valid başçılıq edirdi. Peyğəmbər ﷺ səhabələrlə Zöhr namazını qıldı. Müşriklər dedilər: “Onların bu namazdan sonra elə bir namazları var ki, onlara mal-dövlətlərindən və övladlarından daha sevimlidir”. Allah Elçisi ﷺ səhabələrlə birlikdə Əsr namazını qıldı. Onları öz arxasında iki səf olaraq düzdü və onların hamısı ilə birlikdə ruku etdi. Onlar başlarını rukudan qaldırdıqda, Allah Elçisi ﷺ arxasında dayanan birinci səfdə olanlarla birlikdə səcdə etdi. Arxada olan (ikinci səfdə olanlar) isə ayaq üstə durdular. (Birinci səfdə olanlar) başlarını səcdədən qaldır dıqda, digər səfdə olanlar Allah Elçisi ﷺ ilə səcdə etdilər. Sonra arxada qalan səf qabağa, qabaqda olan səf isə arxaya keçərək bir-biri ilə yerlərini dəyişdilər. Sonra Allah Elçisi ﷺ hamısı ilə birlikdə ruku etdi. Rukudan başlarını qaldırdıqda, onun arxasında olan səfdəkilər səcdə etdi, o birilər isə ayaq üstə dayandılar. Onlar səcdəni bitirdikdə, digərləri səcdə etdilər. Sonra Peyğəmbər ﷺ salam verdi”.

١٥٥٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ عَبْدِ الصَّمَدِ ، قَالَ : حَدَّثَنَا مَنْصُورٌ ، عَنْ مُجَاهِدٍ ، عَنْ أَبِي عَيَّاشٍ الزُّرَقِيِّ ، قَالَ : كُنَّا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِعُسْفَانَ ، فَصَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الظُّهْرِ ، وَعَلَى الْمُشْرِكِينَ يَوْمَئِذٍ خَالِدُ بْنُ الْوَلِيدِ فَقَالَ الْمُشْرِكُونَ : لَقَدْ أَصَبْنَا مِنْهُمْ غِرَّةً ، وَلَقَدْ أَصَبْنَا مِنْهُمْ غَفْلَةً ، فَنَزَلَتْ - يَعْنِي - صَلاَةَ الْخَوْفِ بَيْنَ الظُّهْرِ وَالْعَصْرِ ، فَصَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْعَصْرِ ، فَفَرَّقَنَا فِرْقَتَيْنِ ، فِرْقَةً تُصَلِّي مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَفِرْقَةً يَحْرُسُونَهُ ، فَكَبَّرَ بِالَّذِينَ يَلُونَهُ وَالَّذِينَ يَحْرُسُونَهُمْ ، ثُمَّ رَكَعَ فَرَكَعَ هَؤُلاَءِ وَأُولَئِكَ جَمِيعًا ، ثُمَّ سَجَدَ الَّذِينَ يَلُونَهُ وَتَأَخَّرَ هَؤُلاَءِ وَالَّذِينَ يَلُونَهُ وَتَقَدَّمَ الآخَرُونَ فَسَجَدُوا ، ثُمَّ قَامَ فَرَكَعَ بِهِمْ جَمِيعًا الثَّانِيَةَ بِالَّذِينَ يَلُونَهُ وَبِالَّذِينَ يَحْرُسُونَهُ ، ثُمَّ سَجَدَ بِالَّذِينَ يَلُونَهُ ، ثُمَّ تَأَخَّرُوا فَقَامُوا فِي مَصَافِّ أَصْحَابِهِمْ وَتَقَدَّمَ الآخَرُونَ فَسَجَدُوا ، ثُمَّ سَلَّمَ عَلَيْهِمْ ، فَكَانَتْ لِكُلِّهِمْ رَكْعَتَانِ رَكْعَتَانِ مَعَ إِمَامِهِمْ وَصَلَّى مَرَّةً بِأَرْضِ بَنِي سُلَيْمٍ.

1550. …Rəvayət edilir ki, Əbu Ayyəş əz-Zuraqi ﷺ belə demişdir: “Allah Elçisi ﷺ ilə birlikdə Usfan (döyüşündə) idik. Biz Allah Elçisi ﷺ ilə birlikdə

Zöhr namazını qıldıq. Müşriklərə Xalid ibn Valid başçılıq edirdi. Müşriklər dedilər: “Artıq biz onlar namazda ikən onları tapdıq”. Bu zaman Zöhr ilə Əsr namazı arasında qorxu namazı haqda ayə nazil oldu. Allah Elçisi ﷺ bizimlə Əsr namazını qıldı. Biz iki dəstəyə ayrıldıq. Bir dəstə Allah Elçisi ﷺ ilə birlikdə namazı qıldı, digər dəstə isə onları qoruyurdu. Allah Elçisi ﷺ təkbir etdikdə, onu qoruyanlarla birlikdə hamı təkbir etdi. Sonra Peyğəmbər ﷺ ruku etdi, biz də hamımız ruku etdik. (Bu zaman) onun arxasında olanlar səcdə etdilər. Sonra geriyə çəkildilər. Digər dəstədə olanlar qabağa keçib səcdə etdilər. Sonra Allah Elçisi ﷺ qalxıb hamı ilə - arxasında olanlar və onları qoruyanlarla birlikdə (ikinci dəfə) ruku etdi. Sonra onun arxasında olanlarla səcdə etdi. Daha sonra onlar geriyə çəkildilər və öz dostları ilə səflərini dəyişdilər. Arxada olanlar önə keçərək səcdə etdilər. Sonra Allah Elçisi ﷺ salam verdi. Bu, dəstələrin hər biri üçün iki rükət oldu, iki rükətlərini də imamları ilə qıldılar. Allah Elçisi ﷺ (qorxu namazını) bir dəfə də Bənu Suleym qəbiləsində qıldı”.

١٥٥١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، وَإِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، وَاللَّفْظُ لَهُ ، قَالاَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ أَشْعَثَ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِالْقَوْمِ فِي الْخَوْفِ رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ صَلَّى بِالْقَوْمِ الآخَرِينَ رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، فَصَلَّى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَرْبَعًا.

1551. ...Əbu Bəkrə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ bir toplum camaatla iki rükət qorxu namazını qıldı və salam verdi. Sonra başqa toplumla da iki rükət namaz qıldı və salam verdi. Beləliklə Peyğəmbər ﷺ dörd rükət namaz qılmış oldu.

١٥٥٢ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ عَاصِمٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ قَتَادَةَ ، عَنِ الْحَسَنِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِطَائِفَةٍ مِنْ أَصْحَابِهِ رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ ، ثُمَّ صَلَّى بِآخَرِينَ أَيْضًا رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ.

1552. ...Cabir ibn Abdullah ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ səhabələrdən olan bir dəstə ilə iki rükət namaz qıldı, sonra salam verdi. Həmçinin digər dəstə ilə də iki rükət namaz qıldı, sonra da salam verdi.

١٥٥٣ - أَخْبَرَنَا أَبُو حَفْصٍ عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ ، عَنِ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ ، عَنْ صَالِحِ بْنِ خَوَّاتٍ ، عَنْ سَهْلِ بْنِ أَبِي حَثْمَةَ ، فِي صَلاَةِ الْخَوْفِ ، قَالَ : يَقُومُ الإِمَامُ مُسْتَقْبِلَ الْقِبْلَةِ وَتَقُومُ طَائِفَةٌ مِنْهُمْ مَعَهُ وَطَائِفَةٌ قِبَلَ الْعَدُوِّ وَوُجُوهُهُمْ إِلَى الْعَدُوِّ ، فَيَرْكَعُ بِهِمْ رَكْعَةً وَيَرْكَعُونَ لأَنْفُسِهِمْ وَيَسْجُدُونَ سَجْدَتَيْنِ فِي مَكَانِهِمْ ، وَيَذْهَبُونَ إِلَى مَقَامِ

أُولَئِكَ وَيَجِيءُ أُولَئِكَ فَيَرْكَعُ بِهِمْ وَيَسْجُدُ بِهِمْ سَجْدَتَيْنِ ، فَهِيَ لَهُ ثِنْتَانِ وَلَهُمْ وَاحِدَةٌ ، ثُمَّ يَرْكَعُونَ رَكْعَةً رَكْعَةً ، وَيَسْجُدُونَ سَجْدَتَيْنِ.

1553. ...Rəvayət edilir ki, Səhl ibn Əbu Həsmə ﷺ qorxu namazı haqqında belə demişdir: "İmam qibləyə yönəlir. Bir dəstə onunla, bir dəstə də düşmənlə üzbəüz dayanır. İmam ruku etdikdə, onlar da ruku edirlər. Onlar öz yerlərində iki səcdə edirlər (bir rükət qılırlar), sonra da düşmənə tərəf dayananlarla yerlərini dəyişirlər. İmam onlarla bir rükət qılaraq iki səcdə etdikdə, imam üçün iki rükət, onlar üçün isə bir rükət sayılır. Sonra onlar bir rükətdə bir ruku və iki səcdə edirlər".

١٥٥٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا يُونُسُ ، عَنِ الْحَسَنِ ، قَالَ : حَدَّثَ جَابِرُ بْنُ عَبْدِ اللهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى بِأَصْحَابِهِ صَلاَةَ الْخَوْفِ ، فَصَلَّتْ طَائِفَةٌ مَعَهُ وَطَائِفَةٌ وُجُوهُهُمْ قِبَلَ الْعَدُوِّ ، فَصَلَّى بِهِمْ رَكْعَتَيْنِ ، ثُمَّ قَامُوا مَقَامَ الآخَرِينَ ، وَجَاءَ الآخَرُونَ فَصَلَّى بِهِمْ رَكْعَتَيْنِ ، ثُمَّ سَلَّمَ.

1554. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ səhabələri ilə qorxu namazını qıldı. Bir dəstə Peyğəmbərlə ﷺ namaz qıldı, digər dəstə isə düşmənlə üz-üzə durdu. Allah Elçisi ﷺ onlarla iki rükət qıldı. Sonra onlar qalxıb düşmənlə üz-üzə duranların yerinə keçdilər, o biri dəstədə olanlar gəlib Allah Elçisi ﷺ ilə iki rükət qıldılar, sonra da salam verdilər.

١٥٥٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا الأَشْعَثُ ، عَنِ الْحَسَنِ ، عَنْ أَبِي بَكْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّهُ صَلَّى صَلاَةَ الْخَوْفِ بِالَّذِينَ خَلْفَهُ رَكْعَتَيْنِ وَالَّذِينَ جَاؤُوا بَعْدُ رَكْعَتَيْنِ ، فَكَانَتْ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَرْبَعُ رَكَعَاتٍ ، وَلِهَؤُلاَءِ رَكْعَتَيْنِ رَكْعَتَيْنِ.

1555. ...Əbu Bəkrə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ onun arxasında olan insanlarla birlikdə qorxu namazını iki rükət qıldı. Sonra başqaları gəldi və onlarla da iki rükət qıldı. Namaz Peyğəmbər ﷺ üçün dörd rükət, hər dəstə üçün isə iki rükət oldu.

## ١٩ - كِتَابُ صَلاَةِ الْعِيدَيْنِ
## 19. Bayram namazları kitabı

### ١ - صَلاَةِ الْعِيدَيْنِ
### 1-ci fəsil: İki bayram namazı

١٥٥٦ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا حُمَيْدٌ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : كَانَ لأَهْلِ الْجَاهِلِيَّةِ يَوْمَانِ فِي كُلِّ سَنَةٍ يَلْعَبُونَ فِيهِمَا ، فَلَمَّا قَدِمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْمَدِينَةَ ، قَالَ : كَانَ لَكُمْ يَوْمَانِ تَلْعَبُونَ فِيهِمَا وَقَدْ أَبْدَلَكُمُ اللَّهُ بِهِمَا خَيْرًا مِنْهُمَا : يَوْمَ الْفِطْرِ ، وَيَوْمَ الأَضْحَى.

1556. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: “Cahiliyyə əhlində hər il iki bayram var idi. Onlar bu bayramlarda sevinib oynayırdılar. Peyğəmbər ﷺ Mədinəyə gələndə dedi: “Sizin iki bayramınız var idi və siz bu bayramlarda oynayırdınız. Allah sizin üçün bu bayramları daha xeyirli iki bayramla əvəz etdi. Bunlar əl-Fitr (Ramazan) və əl-Ədhə (Qurban) bayramlarıdır”.

### ٢ - بَابُ الْخُرُوجِ إِلَى الْعِيدَيْنِ مِنَ الْغَدِ
### 2-ci fəsil: Bayram namazlarına səhər tezdən getmək

١٥٥٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو بِشْرٍ ، عَنْ أَبِي عُمَيْرِ بْنِ أَنَسٍ ، عَنْ عُمُومَةٍ لَهُ ، أَنَّ قَوْمًا رَأَوْا الْهِلاَلَ ، فَأَتَوْا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَمَرَهُمْ أَنْ يُفْطِرُوا بَعْدَ مَا ارْتَفَعَ النَّهَارُ ، وَأَنْ يَخْرُجُوا إِلَى الْعِيدِ مِنَ الْغَدِ.

1557. ...Əbu Umeyr ibn Ənəs ﵁ öz əmilərindən rəvayət edir ki, bir toplum ayı görüb Peyğəmbərin ﷺ yanına gəldi. Peyğəmbər ﷺ onlara günəş bir az qalxdıqdan sonra oruclarını açmağı və səhər tezdən bayram namazına gəlmələrini əmr etdi.

### ٣ - خُرُوجُ الْعَوَاتِقِ ، وَذَوَاتِ الْخُدُورِ فِي الْعِيدَيْنِ
### 3-cü fəsil: Həddi-büluğ yaşına yaxın olan uşaqlar və bakirə qızların bayram namazlarına gəlməsi

١٥٥٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ حَفْصَةَ ، قَالَتْ : كَانَتْ أُمُّ عَطِيَّةَ لاَ تَذْكُرُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلاَّ قَالَتْ : بَابَا ، فَقُلْتُ : أَسَمِعْتِ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَذْكُرُ كَذَا وَكَذَا ؟ فَقَالَتْ : نَعَمْ ، بَابا ، قَالَ : لِيَخْرُجِ الْعَوَاتِقُ ، وَذَوَاتُ الْخُدُورِ ، وَالْحُيَّضُ وَيَشْهَدْنَ الْعِيدَ ، وَدَعْوَةَ الْمُسْلِمِينَ ، وَلْيَعْتَزِلِ الْحُيَّضُ الْمُصَلَّى.

1558. ...Rəvayət edilir ki, Həfsə ﵂ demişdir: “Ummu Atiyyənin yanında Allah Elçisi ﷺ yad edildikdə, “Atam-anam ona fəda olsun”- deyərdi. Mən dedim: “Sən bunu Allah Elçisindən ﷺ belə eşitdin?” O dedi: “Bəli, atam-anam ona fəda olsun!” O dedi: “Qoy həddi-büluğ yaşına yaxın uşaqlar, bakirə qızlar və heyzli qadınlar bayram namazını müşahidə edib müsəlmanların çağırışına cavab versinlər. Heyzli qadınlar namazgahdan bir az kənarda dursunlar”.

### ٤ - اعْتِزَالُ الْحُيَّضِ مُصَلَّى النَّاسِ

### 4-cü fəsil: Heyzli qadınların namazgahdan kənarda dayanması

١٥٥٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ ، عَنْ مُحَمَّدٍ ، قَالَ : لَقِيتُ أُمَّ عَطِيَّةَ ، فَقُلْتُ لَهَا : هَلْ سَمِعْتِ مِنَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَكَانَتْ إِذَا ذَكَرَتْهُ قَالَتْ : بَابا ، قَالَ : أَخْرِجُوا الْعَوَاتِقَ ، وَذَوَاتِ الْخُدُورِ فَيَشْهَدْنَ الْعِيدَ ، وَدَعْوَةَ الْمُسْلِمِينَ ، وَلْيَعْتَزِلِ الْحُيَّضُ مُصَلَّى النَّاسِ.

1559. ...Rəvayət edilir ki, Muhəmməd ﵀ demişdir: “Ummu Atiyyəni gördükdə, ona dedim: “Sən bunu Peyğəmbərdən ﷺ eşitdinmi?” O, elə adam idi ki, onun yanında Peyğəmbər ﷺ yad edildikdə, həmişə: “Atam-anam ona fəda olsun!”- deyərdi. Atiyyə deyir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Qoy həddi-büluğ yaşına yaxın uşaqlar və bakirə qızlar müsəlmanların bayram namazını müşahidə etsinlər. Heyzli qadın isə insanların namazgahından kənarda dursun”.

### ٥ - بَابُ الزِّينَةِ لِلْعِيدَيْنِ

### 5-ci fəsil: Bayram namazları üçün gözəl geyinib bəzənmək

١٥٦٠ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ بْنُ يَزِيدَ ، وَعَمْرُو بْنُ الْحَارِثِ ، عَنْ ابْنِ شِهَاب ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، قَالَ : وَجَدَ عُمَرُ بْنُ الْخَطَّاب رَضِيَ اللَّهُ عَنْهُ حُلَّةً مِنْ إِسْتَبْرَق بِالسُّوق ، فَأَخَذَهَا فَأَتَى بِهَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، ابْتَعْ هَذِهِ ، فَتَجَمَّلْ بِهَا لِلْعِيدِ وَالْوَفْدِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّمَا هَذِهِ لِبَاسُ مَنْ لاَ خَلاَقَ لَهُ ـــ أَوْ إِنَّمَا يَلْبَسُ هَذِهِ مَنْ لاَ خَلاَقَ لَهُ فَلَبِثَ عُمَرُ مَا شَاءَ اللَّهُ ، ثُمَّ أَرْسَلَ إِلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِجُبَّةِ دِيبَاجٍ ، فَأَقْبَلَ بِهَا حَتَّى جَاءَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : يَا رَسُولَ اللهِ ، قُلْتَ : إِنَّمَا هَذِهِ لِبَاسُ مَنْ لاَ خَلاَقَ لَهُ ، ثُمَّ أَرْسَلْتَ إِلَيَّ بِهَذِهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : بِعْهَا ، وَتُصِبْ بِهَا حَاجَتَكَ.

1560. ...Rəvayət edilir ki, Səlim ﵀ öz atasının (İbn Ömərdən ﵄) belə dediyini rəvayət etmişdir: “Ömər ibn əl-Xattab bazarda ipəkdən bir paltar gördü. Onu alıb Allah Elçisinin ﷺ yanına gəldi və dedi: “Ey Allahın Elçisi,

bunu götür! Bayram namazlarına və sənin yanına gələn heyətlərin qarşısına çıxmaq üçün geyinərsən". Allah Elçisi ﷺ dedi: "Həqiqətən, bu libas Axirətdə heç bir payı olmayan insanların və ya heç bir nəsibi olmayanların geyimidir". Ömər Allahın istədiyi qədər gözlədi. Sonra Allah Elçisi ﷺ ona ipəkdən bir cübbə göndərdi. Ömər cübbəni götürüb Allah Elçisinin ﷺ yanına getdi və dedi: "Ey Allahın Elçisi, sən dedin ki, bu, Axirətdə heç bir payı olmayanların libasıdır, sonra isə onu mənə göndərdin". Allah Elçisi ﷺ dedi: "Onu satmaq və öz ehtiyaclarını ödəmək üçün göndərdim!"

٦ - الصَّلاَةُ قَبْلَ الإِمَامِ يَوْمَ الْعِيدِ

### 6-cı fəsil: Bayram günü imamdan qabaq namaz qılmamaq

١٥٦١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنِ الأَشْعَثِ ، عَنِ الأَسْوَدِ بْنِ هِلاَلٍ ، عَنْ ثَعْلَبَةَ بْنِ زَهْدَمٍ ، أَنَّ عَلِيًّا اسْتَخْلَفَ أَبَا مَسْعُودٍ عَلَى النَّاسِ فَخَرَجَ يَوْمَ عِيدٍ ، فَقَالَ : يَا أَيُّهَا النَّاسُ ، إِنَّهُ لَيْسَ مِنَ السُّنَّةِ أَنْ يُصَلَّى قَبْلَ الإِمَامِ.

1561. ...Sələbə ibn Zəhdəm ﵁ rəvayət edir ki, bayram günü Əli öz əvəzinə Əbu Məsudu insanların üzərində qoyub getdi və dedi: "Ey insanlar! Həqiqətən, imamdan qabaq namaz qılmaq sünnədən deyil".

٧ - تَرْكُ الأَذَانِ لِلْعِيدَيْنِ

### 7-ci fəsil: Bayram namazları üçün azanın verilməməsi

١٥٦٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ عَبْدِ الْمَلِكِ بْنِ أَبِي سُلَيْمَانَ ، عَنْ عَطَاءٍ ، عَنْ جَابِرٍ ، قَالَ : صَلَّى بِنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي عِيدٍ قَبْلَ الْخُطْبَةِ بِغَيْرِ أَذَانٍ وَلاَ إِقَامَةٍ.

1562. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Allah Elçisi ﷺ xütbədən qabaq azan və iqamə vermədən bizə bayram namazını qıldırdı".

٨ - الْخُطْبَةُ يَوْمَ الْعِيدِ

### 8-ci fəsil: Bayram günü verilən xütbə

١٥٦٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَهْزٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : أَخْبَرَنِي زُبَيْدٌ ، قَالَ : سَمِعْتُ الشَّعْبِيَّ ، يَقُولُ : حَدَّثَنَا الْبَرَاءُ بْنُ عَازِبٍ ، عِنْدَ سَارِيَةٍ مِنْ سَوَارِي الْمَسْجِدِ ، قَالَ : خَطَبَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ النَّحْرِ ، فَقَالَ : إِنَّ أَوَّلَ مَا نَبْدَأُ بِهِ فِي يَوْمِنَا هَذَا أَنْ نُصَلِّيَ ، ثُمَّ نَذْبَحَ ، فَمَنْ فَعَلَ ذَلِكَ فَقَدْ أَصَابَ سُنَّتَنَا ، وَمَنْ ذَبَحَ قَبْلَ ذَلِكَ فَإِنَّمَا هُوَ لَحْمٌ يُقَدِّمُهُ لأَهْلِهِ ، فَذَبَحَ أَبُو بُرْدَةَ بْنُ دِينَارٍ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، عِنْدِي جَذَعَةٌ خَيْرٌ مِنْ مُسِنَّةٍ قَالَ : اذْبَحْهَا وَلَنْ تُوفِيَ عَنْ أَحَدٍ بَعْدَكَ.

1563. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﷺ məscidin dirəklərinin birinin yanında durub dedi: "Peyğəmbər ﷺ Qurban bayramı günü bizə xütbə verərək belə dedi: "Bizim bu gündə başladığımız ilk şey namaz, sonra isə qurban kəsməkdir. Kim belə etsə, sünnəmizə müvafiq olmuş olur. Kim bundan (bayram namazından) qabaq qurban kəsərsə, sanki öz ailəsi üçün ət kəsmiş olur". Bureydə ibn Dinar (namazdan qabaq) qurban kəsmişdi və dedi: "Ey Allahın Elçisi, məndə namazdan qabaq kəsdiyimdən daha xeyirli bir illik heyvan var, (onu kəsimmi)?" Allah Elçisi ﷺ dedi: "Kəs, amma səndən sonra heç kim belə etməsin".

٩ - بَابُ صَلاَةِ الْعِيدَيْنِ قَبْلَ الْخُطْبَةِ

## 9-cu fəsil: Bayram namazlarının xütbədən qabaq olması

١٥٦٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدَةُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبَا بَكْرٍ وَعُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا كَانُوا يُصَلُّونَ الْعِيدَيْنِ قَبْلَ الْخُطْبَةِ.

1564. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ, Əbu Bəkr və Ömər bayram namazlarını xütbədən qabaq qılardılar.

١٠ - بَابُ صَلاَةِ الْعِيدَيْنِ إِلَى الْعَنَزَةِ

## 10-cu fəsil: Bayram namazlarında sütrə olaraq əsadan istifadə etmək

١٥٦٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنْ أَيُّوبَ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُخْرِجُ الْعَنَزَةَ يَوْمَ الْفِطْرِ ، وَيَوْمَ الأَضْحَى يُرْكِزُهَا فَيُصَلِّي إِلَيْهَا.

1565. ...İbn Ömər ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Ramazan və Qurban bayramı günü əsasını çıxarar və onu mərkəzdə basdırıb sütrə olaraq ona tərəf namaz qılardı.

١١ - عَدَدُ صَلاَةِ الْعِيدَيْنِ

## 11-ci fəsil: Bayram namazlarında rükətlərin sayı

١٥٦٦ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ بْنُ سَعِيدٍ ، عَنْ زُبَيْدٍ الأَيَامِيِّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ذَكَرَهُ ، عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : صَلاَةُ الأَضْحَى رَكْعَتَانِ ، وَصَلاَةُ الْفِطْرِ رَكْعَتَانِ ، وَصَلاَةُ الْمُسَافِرِ رَكْعَتَانِ ، وَصَلاَةُ الْجُمُعَةِ رَكْعَتَانِ تَمَامٌ لَيْسَ بِقَصْرٍ عَلَى لِسَانِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1566. ...Rəvayət edilir ki, Ömər ibn əl-Xattab ﵁ demişdir: “Qurban bayramı namazının, Ramazan bayramı namazının, səfər namazının və Cümə namazının heç bir qısaltma olmadan, tam şəkildə iki rükət olduğu Peyğəmbərin ﷺ dili ilə bildirilmişdir”.

١٢ - بَابُ الْقِرَاءَةِ فِي الْعِيدَيْنِ بِقَافْ وَاقْتَرَبَتْ

12-ci fəsil: Bayram namazlarında “Qaf” və “əl-Qamər” surələrini oxumaq

١٥٦٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي ضَمْرَةُ بْنُ سَعِيدٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : خَرَجَ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ يَوْمَ عِيدٍ ، فَسَأَلَ أَبَا وَاقِدٍ اللَّيْثِيَّ : بِأَيِّ شَيْءٍ كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي هَذَا الْيَوْمِ ؟ فَقَالَ : بِقَافْ وَاقْتَرَبَتْ.

1567. ...Rəvayət edilir ki, Ubeydullah ibn Abdullah ﵀ demişdir: “Ömər Qurban bayramı günü çıxdı. Əbu Vaqid əl-Leysi ondan soruşdu: “Peyğəmbər ﷺ bayram günü (namazda) hansı surələri oxuyardı?” O da buyurdu: “Qaf” və “əl-Qamər” surələrini oxuyardı”.

١٣ - بَابُ الْقِرَاءَةِ فِي الْعِيدَيْنِ بِـ{**سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى**} وَهَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ

13-cü fəsil: Bayram namazlarında “əl-Ə'lə” və “əl-Ğaşiyə” surələrini oxumaq

١٥٦٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ إِبْرَاهِيمَ بْنِ مُحَمَّدِ بْنِ الْمُنْتَشِرِ ، عَنْ أَبِيهِ ، عَنْ حَبِيبِ بْنِ سَالِمٍ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقْرَأُ فِي الْعِيدَيْنِ ، وَيَوْمِ الْجُمُعَةِ بِـ{**سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى**} وَهَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ ، وَرُبَّمَا اجْتَمَعَا فِي يَوْمٍ وَاحِدٍ فَيَقْرَأُ بِهِمَا.

1568. ...ən-Numən ibn Bəşir ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ bayram və Cümə namazlarında “əl-Ə'lə” və “əl-Ğaşiyə” surələrini oxuyardı. Bəzən bu günlər bir gündə üst-üstə düşəndə, o, onların ikisini də oxuyardı.

١٤ - بَابُ الْخُطْبَةِ فِي الْعِيدَيْنِ بَعْدَ الصَّلاَةِ

14-cü fəsil: Bayram namazlarında xütbənin namazdan sonra olması

١٥٦٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : سَمِعْتُ أَيُّوبَ يُخْبِرُ ، عَنْ عَطَاءٍ ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ ، يَقُولُ : أَشْهَدُ أَنِّي شَهِدْتُ الْعِيدَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَبَدَأَ بِالصَّلاَةِ قَبْلَ الْخُطْبَةِ ثُمَّ خَطَبَ.

1569. ...Rəvayət edilir ki, Əta ﷺ demişdir: “Mən İbn Abbasın belə dediyini eşitdim: “Mən Allah Elçisi ﷺ ilə birlikdə olarkən, bayram günündə xütbədən qabaq namaza başladığının, sonra xütbə verməsinin şahidi oldum”.

١٥٧٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ مَنْصُورٍ ، عَنِ الشَّعْبِيِّ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ، قَالَ : خَطَبَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ النَّحْرِ بَعْدَ الصَّلاَةِ.

1570. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib ﷺ demişdir: “Allah Elçisi ﷺ Qurban bayramı günü namazdan sonra bizə xütbə dedi”.

### ١٥ - التَّخْيِيرُ بَيْنَ الْجُلُوسِ فِي الْخُطْبَةِ لِلْعِيدَيْنِ

### 15-ci fəsil: Bayram namazlarında xütbəni dinləmək üçün oturub-oturmamaqda seçim etmək

١٥٧١ - حَدَّثَنَا مُحَمَّدُ بْنُ يَحْيَى بْنِ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا ابْنُ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ السَّائِبِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى الْعِيدَ ، قَالَ : مَنْ أَحَبَّ أَنْ يَنْصَرِفَ فَلْيَنْصَرِفْ ، وَمَنْ أَحَبَّ أَنْ يُقِيمَ لِلْخُطْبَةِ فَلْيُقِمْ.

1571. ...Abdullah ibn əs-Səib ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bayram namazını qıldı və dedi: “Kim getmək istəyirsə, getsin. Kim qalmaq istəyirsə, qalsın”.

### ١٦ - الزِّينَةُ لِلْخُطْبَةِ لِلْعِيدَيْنِ

### 16-ci fəsil: Bayram xütbəsi üçün bəzənmək

١٥٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ بْنُ إِيَادٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي رِمْثَةَ ، قَالَ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ وَعَلَيْهِ بُرْدَانِ أَخْضَرَانِ.

1572. ...Rəvayət edilir ki, Əbu Ramsə ﷺ demişdir: “Peyğəmbəri ﷺ iki yaşıl parçadan olan paltarda xütbə verərkən gördüm”.

### ١٧ - الْخُطْبَةُ عَلَى الْبَعِيرِ

### 17-ci fəsil: Dəvə üzərində xütbə vermək

١٥٧٣ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي زَائِدَةَ ، قَالَ : أَخْبَرَنِي إِسْمَعِيلُ بْنُ أَبِي خَالِدٍ ، عَنْ أَخِيهِ ، عَنْ أَبِي كَاهِلٍ الأَحْمَسِيِّ قَالَ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ عَلَى نَاقَةٍ ، وَحَبَشِيٌّ آخِذٌ بِخِطَامِ النَّاقَةِ.

1573. ...Rəvayət edilir ki, Əbu Kahil əl-Əhməsi ﵁ demişdir: "Mən Peyğəmbərin ﷺ dəvənin üzərində xütbə dediyini gördüm. Bu əsnada həbəşi (Bilal) dəvənin yüyənindən tutmuşdu".

١٨ - قِيَامُ الإِمَامِ فِي الْخُطْبَةِ

## 18-ci fəsil: Xütbə dedikdə imamın ayaq üstə durması

١٥٧٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سِمَاكٍ ، قَالَ : سَأَلْتُ جَابِرًا : أَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ قَائِمًا ؟ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ قَائِمًا ، ثُمَّ يَقْعُدُ قَعْدَةً ، ثُمَّ يَقُومُ.

1574. ...Rəvayət edilir ki, Simak ﵀ demişdir: "Mən Cabirdən soruşdum: "Allah Elçisi ﷺ ayaq üstə xütbə deyibmi?" O dedi: "Allah Elçisi ﷺ xütbəni ayaq üstə deyirdi. Sonra bir az oturar, sonra da qalxardı".

١٩ - قِيَامُ الإِمَامِ فِي الْخُطْبَةِ مُتَوَكِّئًا عَلَى إِنْسَانٍ

## 19-cu fəsil: Xütbə dedikdə imamın kiməsə söykənib dayanması

١٥٧٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْمَلِكِ بْنُ أَبِي سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَطَاءٌ ، عَنْ جَابِرٍ ، قَالَ : شَهِدْتُ الصَّلاَةَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي يَوْمِ عِيدٍ ، فَبَدَأَ بِالصَّلاَةِ قَبْلَ الْخُطْبَةِ بِغَيْرِ أَذَانٍ وَلاَ إِقَامَةٍ ، فَلَمَّا قَضَى الصَّلاَةَ قَامَ مُتَوَكِّئًا عَلَى بِلاَلٍ ، فَحَمِدَ اللَّهَ وَأَثْنَى عَلَيْهِ ، وَوَعَظَ النَّاسَ وَذَكَّرَهُمْ وَحَثَّهُمْ عَلَى طَاعَتِهِ ، ثُمَّ مَالَ وَمَضَى إِلَى النِّسَاءِ وَمَعَهُ بِلاَلٌ ، فَأَمَرَهُنَّ بِتَقْوَى اللهِ وَوَعَظَهُنَّ وَذَكَّرَهُنَّ وَحَمِدَ اللَّهَ ، وَأَثْنَى عَلَيْهِ ، ثُمَّ حَثَّهُنَّ عَلَى طَاعَتِهِ ، ثُمَّ قَالَ : تَصَدَّقْنَ فَإِنَّ أَكْثَرَكُنَّ حَطَبُ جَهَنَّمَ ، فَقَالَتِ امْرَأَةٌ مِنْ سَفِلَةِ النِّسَاءِ سَفْعَاءُ الْخَدَّيْنِ : بِمَ يَا رَسُولَ اللهِ ؟ قَالَ : تُكْثِرْنَ الشَّكَاةَ ، وَتَكْفُرْنَ الْعَشِيرَ ، فَجَعَلْنَ يَنْزِعْنَ قَلاَئِدَهُنَّ ، وَأَقْرُطَهُنَّ ، وَخَوَاتِيمَهُنَّ يَقْذِفْنَهُ فِي ثَوْبِ بِلاَلٍ يَتَصَدَّقْنَ بِهِ.

1575. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ bayram namazını qılmasının şahidi oldum. O, birinci xütbədən qabaq azan və iqaməsiz namaza başladı. Namazı bitirdikdə, Bilala söykənərək ayağa qalxdı. Allaha həmd etdi və Ona təriflər dedi. İnsanlara moizə etdi və onlara itaəti xatırladaraq buna təşviq etdi. Sonra Bilal ilə birlikdə qadınlara tərəf getdi. Qadınlara Allahdan qorxmağı əmr etdi. Qadınlara moizə etdi və onlara xatırlatdı. Allaha həmd etdi və təriflər dedi. Sonra qadınları özünə itaət etməyə təşviq etdi və dedi: "Sədəqə verin! Həqiqətən, sizin çoxunuz Cəhənnəmin odunudur". Qarayanız və alçaqboy bir qadın dedi: "Nə üçün, ey Allahın Elçisi?" Peyğəmbər ﷺ dedi: "Siz çox şikayət edirsiniz. Ailələrinizə nankorluq edirsiniz". Onlar da öz boyunbağlarını, sırğalarını

və üzüklərini sədəqə etmək üçün Bilalın tutduğu parçanın içinə atmağa başladılar”.

### ٢٠ - اسْتِقْبَالُ الإِمَامِ النَّاسَ بِوَجْهِهِ فِي الْخُطْبَةِ

### 20-ci fəsil: Xütbə dedikdə imamın üzünü insanlara çevirməsi

١٥٧٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ ، عَنْ دَاوُدَ ، عَنْ عِيَاضِ بْنِ عَبْدِ اللهِ ، عَنْ أَبِي سَعِيدٍ الْخُدْرِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَخْرُجُ يَوْمَ الْفِطْرِ ، وَيَوْمَ الأَضْحَى إِلَى الْمُصَلَّى فَيُصَلِّي بِالنَّاسِ ، فَإِذَا جَلَسَ فِي الثَّانِيَةِ وَسَلَّمَ قَامَ فَاسْتَقْبَلَ النَّاسَ بِوَجْهِهِ وَالنَّاسُ جُلُوسٌ ، فَإِنْ كَانَتْ لَهُ حَاجَةٌ يُرِيدُ أَنْ يَبْعَثَ بَعْثًا ذَكَرَهُ لِلنَّاسِ ، وَإِلاَّ أَمَرَ النَّاسَ بِالصَّدَقَةِ ، قَالَ : تَصَدَّقُوا ــ ثَلاَثَ مَرَّاتٍ ــ فَكَانَ مِنْ أَكْثَرِ مَنْ يَتَصَدَّقُ النِّسَاءُ.

1576. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ Ramazan və Qurban bayramı günləri namazgaha gəlib insanlara namaz qıldırar, xütbə zamanı ikinci oturuşda qalxar və insanlar oturduqları halda üzünü insanlara tərəf çevirərdi. Əgər kimisə bir işin arxasınca göndərməyə ehtiyacı olardısa, bunu insanlara deyərdi. Bir iş olmadıqda, insanlara sədəqə verməyə əmr edərək üç dəfə: “Sədəqə verin!”- deyərdi. Ən çox sədəqə verən də qadınlar idi.

### ٢١ - الإِنْصَاتُ لِلْخُطْبَةِ

### 21-ci fəsil: Xütbədə susmaq

١٥٧٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنِ ابْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا قُلْتَ لِصَاحِبِكَ أَنْصِتْ وَالإِمَامُ يَخْطُبُ فَقَدْ لَغَوْتَ.

1577. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Əgər imam xütbə verərkən sən dostuna “sus!” desən, artıq danışmısan”.

### ٢٢ - كَيْفَ الْخُطْبَةُ

### 22-ci fəsil: Xütbənin keyfiyyəti

١٥٧٨ - أَخْبَرَنَا عُتْبَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، عَنْ سُفْيَانَ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ فِي خُطْبَتِهِ : يَحْمَدُ اللَّهَ وَيُثْنِي عَلَيْهِ بِمَا هُوَ أَهْلُهُ ، ثُمَّ يَقُولُ : مَنْ يَهْدِهِ اللَّهُ فَلاَ مُضِلَّ لَهُ ، وَمَنْ يُضْلِلْهُ فَلاَ هَادِيَ لَهُ ، إِنَّ أَصْدَقَ الْحَدِيثِ كِتَابُ اللهِ ، وَأَحْسَنَ الْ هَدْيِ هَدْيُ مُحَمَّدٍ ، وَشَرُّ الأُمُورِ مُحْدَثَاتُهَا ،

وَكُلُّ مُحْدَثَةٍ بِدْعَةٌ وَكُلُّ بِدْعَةٍ ضَلاَلَةٌ ، وَكُلُّ ضَلاَلَةٍ فِي النَّارِ ، ثُمَّ يَقُولُ : بُعِثْتُ أَنَا وَالسَّاعَةُ كَهَاتَيْنِ ، وَكَانَ إِذَا ذَكَرَ السَّاعَةَ احْمَرَّتْ وَجْنَتَاهُ ، وَعَلاَ صَوْتُهُ ، وَاشْتَدَّ غَضَبُهُ كَأَنَّهُ نَذِيرُ جَيْشٍ يَقُولُ : صَبَّحَكُمْ مَسَّاكُمْ ، ثُمَّ قَالَ : مَنْ تَرَكَ مَالاً فَلأَهْلِهِ ، وَمَنْ تَرَكَ دَيْنًا أَوْ ضَيَاعًا فَإِلَيَّ أَوْ عَلَيَّ ، وَأَنَا أَوْلَى بِالْمُؤْمِنِينَ.

1578. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﵄ demişdir: “Allah Elçisi ﷺ xütbəsində Allaha həmd edər və Onu tərifləyər, sonra deyərdi: “Allahın doğru yola yönəltdiyi şəxsi heç kəs azdıra bilməz və azdırdığı şəxsi də heç kim doğru yola yönəldə bilməz. Həqiqətən, sözlərin ən doğrusu Allahın Kitabıdır. Yolların ən gözəli də Muhəmmədin yoludur. İşlərin ən şərlisi sonradan uydurulanlardır. Sonradan uydurulan hər bir şey bidət, hər bidət zəlalət, hər zəlalət isə oddadır”. Sonra dedi: “Mən Qiyamət saatı ilə yanaşı iki barmaq kimi yaxın vaxtla göndərildim”. Peyğəmbər ﷺ Qiyamət xatırlandıqda, sanki ordunu döyüşə yönəldirmiş kimi qəzəbi şiddətlənər, yanaqları qızarar, səsi ucalar və buyurardı: “Kim ölümündən sonra bir mal buraxsa, bu, onun ailəsinə aiddir. Kim özündən sonra bir borc və ya yetim qoyub gedərsə, o, mənə aiddir. Belə şeylərdə mən möminlərə daha yaxınam”.

## ٢٣ - حَثُّ الإِمَامِ عَلَى الصَّدَقَةِ فِي الْخُطْبَةِ

## 23-ci fəsil: Xütbədə imamın sədəqə verməyə təşviq etməsi

١٥٧٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا دَاوُدُ بْنُ قَيْسٍ ، قَالَ : حَدَّثَنِي عِيَاضٌ ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَخْرُجُ يَوْمَ الْعِيدِ فَيُصَلِّي رَكْعَتَيْنِ ، ثُمَّ يَخْطُبُ فَيَأْمُرُ بِالصَّدَقَةِ ، فَيَكُونُ أَكْثَرَ مَنْ يَتَصَدَّقُ النِّسَاءُ ، فَإِنْ كَانَتْ لَهُ حَاجَةٌ أَوْ أَرَادَ أَنْ يَبْعَثَ بَعْثًا تَكَلَّمَ وَإِلاَّ رَجَعَ.

1579. ...Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ bayram günü çıxıb iki rükət namaz qılar, sonra xütbə deyər və xütbədə sədəqə verməyi əmr edərdi. Ən çox sədəqə verən qadınlar olardı. Əgər onun ehtiyacı olar və ya kimisə bir işin arxasınca göndərmək istəyərdisə, bunu söyləyərdi. Bir iş olmayanda isə qayıdıb gedərdi”.

١٥٨٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ هَارُونَ ، قَالَ : أَنْبَأَنَا حُمَيْدٌ ، عَنِ الْحَسَنِ ، أَنَّ ابْنَ عَبَّاسٍ خَطَبَ بِالْبَصْرَةِ فَقَالَ : أَدُّوا زَكَاةَ صَوْمِكُمْ ، فَجَعَلَ النَّاسُ يَنْظُرُ بَعْضُهُمْ إِلَى بَعْضٍ ، فَقَالَ : مَنْ هَاهُنَا مِنْ أَهْلِ الْمَدِينَةِ ، قُومُوا إِلَى إِخْوَانِكُمْ فَعَلِّمُوهُمْ فَإِنَّهُمْ لاَ يَعْلَمُونَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرَضَ صَدَقَةَ الْفِطْرِ عَلَى الصَّغِيرِ وَالْكَبِيرِ ، وَالْحُرِّ وَالْعَبْدِ ، وَالذَّكَرِ وَالأُنْثَى ، نِصْفَ صَاعٍ مِنْ بُرٍّ أَوْ صَاعًا مِنْ تَمْرٍ أَوْ شَعِيرٍ.

1580. ...əl-Həsən ﵀ rəvayət edir ki, İbn Abbas Bəsrədə xütbə verərək belə dedi: "Orucunuzun zəkatını verin!" İnsanlar başa düşmədikləri üçün bir-birinə baxdılar. İbn Abbas dedi: "Burada Mədinə əhlindən olan varmı!? Qalxın öz qardaşlarınızı öyrədin, onlar bilmirlər. Həqiqətən, Allah Elçisi ﷺ fitrə zəkatını kiçiyə və böyüyə, azad olana və köləyə, kişiyə və qadına yarım saa buğda və ya bir saa xurma və ya arpa verməyi əmr etdi".

١٥٨١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ مَنْصُورٍ ، عَنِ الشَّعْبِيِّ ، عَنِ الْبَرَاءِ ، قَالَ : خَطَبَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ النَّحْرِ بَعْدَ الصَّلاَةِ ثُمَّ قَالَ : مَنْ صَلَّى صَلاَتَنَا وَنَسَكَ نُسُكَنَا ، فَقَدْ أَصَابَ النُّسُكَ ، وَمَنْ نَسَكَ قَبْلَ الصَّلاَةِ فَتِلْكَ شَاةُ لَحْمٍ ، فَقَالَ أَبُو بُرْدَةَ بْنُ نِيَارٍ : يَا رَسُولَ اللهِ ، وَاللَّهِ لَقَدْ نَسَكْتُ قَبْلَ أَنْ أَخْرُجَ إِلَى الصَّلاَةِ ، عَرَفْتُ أَنَّ الْيَوْمَ يَوْمُ أَكْلٍ وَشُرْبٍ فَتَعَجَّلْتُ فَأَكَلْتُ وَأَطْعَمْتُ أَهْلِي وَجِيرَانِي ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : تِلْكَ شَاةُ لَحْمٍ ، قَالَ : فَإِنَّ عِنْدِي جَذَعَةً خَيْرٌ مِنْ شَاتَيْ لَحْمٍ ، فَهَلْ تُجْزِي عَنِّي ؟ قَالَ : نَعَمْ ، وَلَنْ تُجْزِيَ عَنْ أَحَدٍ بَعْدَكَ.

1581. ...Rəvayət edilir ki, əl-Bəra ﵁ demişdir: "Allah Elçisi ﷺ Qurban bayramı günü namazdan sonra bizə xütbə deyərək buyurdu: "Kim bizim namazımızı qılıb qurban kəsərsə, bizim sünnəmizə uyğun hərəkət etmiş olar. Kim namazdan qabaq qurban kəsərsə, adi ət kəsmiş sayılar". Əbu Burdə ibn Niyar dedi: "Ey Allahın Elçisi! Vallahi, mən artıq namaza gəlməmiş qurban kəsmişəm. Bu günün yeyib-içmək olduğunu bildiyimə görə tələsib ailəmə və qonşularıma bunu yedizdirdim". Allah Elçisi ﷺ dedi: "Bu, adi ət kəsmək sayılır". Səhabə dedi: "Mənim bundan daha xeyirli və iki qoyunun ətini verəcək heyvanım da var. Bunu (kəssəm) mənim üçün keçərlidirmi?" Allah Elçisi ﷺ dedi: "Bəli, amma səndən sonra heç kim üçün keçərli deyil".

## ٢٤ - الْقَصْدُ فِي الْخُطْبَةِ

## 24-cü fəsil: Xütbənin qısalığı

١٥٨٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، قَالَ : كُنْتُ أُصَلِّي مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَكَانَتْ صَلاَتُهُ قَصْدًا ، وَخُطْبَتُهُ قَصْدًا.

1582. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: "Mən Peyğəmbər ﷺ ilə birlikdə namaz qıldım. Onun namazı da, xütbə deməyi də qısa idi".

٢٥ - الْجُلُوسُ بَيْنَ الْخُطْبَتَيْنِ وَالسُّكُوتُ فِيهِ

25-ci fəsil: İki xütbə arasında səs salmadan oturmaq

١٥٨٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ قَائِمًا ، ثُمَّ يَقْعُدُ قَعْدَةً لاَ يَتَكَلَّمُ فِيهَا ، ثُمَّ قَامَ فَخَطَبَ خُطْبَةً أُخْرَى ، فَمَنْ خَبَّرَكَ أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَطَبَ قَاعِدًا فَلاَ تُصَدِّقْهُ.

1583. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ ayaq üstə duraraq xütbə dediyini gördüm. Sonra oturdu və danışmadı. Sonra qalxdı və başqa bir xütbə dedi. Kim sənə Peyğəmbərin ﷺ oturaraq xütbə dediyini söyləsə, ona inanma!"

٢٦ - الْقِرَاءَةُ فِي الْخُطْبَةِ الثَّانِيَةِ وَالذِّكْرُ فِيهَا

26-cı fəsil: İkinci xütbədə oxunan ayə və zikrlər

١٥٨٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ ، قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ قَائِمًا ثُمَّ يَجْلِسُ ، ثُمَّ يَقُومُ وَيَقْرَأُ آيَاتٍ وَيَذْكُرُ اللَّهَ ، وَكَانَتْ خُطْبَتُهُ قَصْدًا وَصَلاَتُهُ قَصْدًا.

1584. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ﵁ demişdir: "Peyğəmbər ﷺ ayaq üstə xütbə deyər, sonra oturar, daha sonra isə qalxıb bəzi ayələri oxuyub Allahı zikr edərdi. Onun xütbəsi və namazı qısa olardı".

٢٧ - نُزُولُ الإِمَامِ عَنِ الْمِنْبَرِ قَبْلَ فَرَاغِهِ مِنَ الْخُطْبَةِ

27-cı fəsil: İmamın xütbədən ayrılaraq minbərdən aşağı enməsi

١٥٨٥ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبُو تُمَيْلَةَ ، عَنِ الْحُسَيْنِ بْنِ وَاقِدٍ ، عَنِ ابْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : بَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمِنْبَرِ يَخْطُبُ إِذْ أَقْبَلَ الْحَسَنُ ، وَالْحُسَيْنُ عَلَيْهِمَا السَّلاَمُ عَلَيْهِمَا قَمِيصَانِ أَحْمَرَانِ يَمْشِيَانِ وَيَعْثُرَانِ ، فَنَزَلَ وَحَمَلَهُمَا ، فَقَالَ : صَدَقَ اللَّهُ : **{إِنَّمَا أَمْوَالُكُمْ وَأَوْلاَدُكُمْ فِتْنَةٌ}** رَأَيْتُ هَذَيْنِ يَمْشِيَانِ وَيَعْثُرَانِ فِي قَمِيصَيْهِمَا فَلَمْ أَصْبِرْ حَتَّى نَزَلْتُ فَحَمَلْتُهُمَا.

1585. ...İbn Bureydə atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Allah Elçisi ﷺ xütbə deyərkən Həsən və Hüseyn – onlara Allahın salamı oslun - gəldi. Onların üzərində qırmızı köynək var idi. Onlar gəzə-gəzə büdrəyərək gah yıxılır, gah da dururdular. Peyğəmbər ﷺ minbərdən düşərək onları qucağına götürdü və dedi: "Allah ayəsində doğru buyurmuşdur: "**Həqiqə-**

**tən, var-dövlətiniz və övladlarınız ancaq bir sınaqdır"** (ət-Təğabun, 15). Mən onların öz köynəklərində gəzə-gəzə büdrəyərək gah yıxılıb, gah da durduqlarını görəndə səbir edə bilmədim, minbərdən enib onları qucağıma götürdüm".

٢٨ - مَوْعِظَةُ الإِمَامِ النِّسَاءَ بَعْدَ الْفَرَاغِ مِنَ الْخُطْبَةِ وَحَثُّهُنَّ عَلَى الصَّدَقَةِ

28-cı fəsil: Xütbəni bitirdikdən sonra imamın qadınları sədəqə verməyə təşviq etməsi

١٥٨٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ عَابِسٍ ، قَالَ : سَمِعْتُ ابْنَ عَبَّاسٍ قَالَ لَهُ رَجُلٌ : شَهِدْتَ الْخُرُوجَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : نَعَمْ ، وَلَوْلاَ مَكَانِي مِنْهُ مَا شَهِدْتُهُ ـــ يَعْنِي مِنْ صِغَرِهِ ـــ أَتَى الْعَلَمَ الَّذِي عِنْدَ دَارِ كَثِيرِ بْنِ الصَّلْتِ فَصَلَّى ، ثُمَّ خَطَبَ ، ثُمَّ أَتَى النِّسَاءَ فَوَعَظَهُنَّ وَذَكَّرَهُنَّ وَأَمَرَهُنَّ أَنْ يَتَصَدَّقْنَ ، فَجَعَلَتِ الْمَرْأَةُ تُهْوِي بِيَدِهَا إِلَى حَلَقِهَا تُلْقِي فِي ثَوْبِ بِلاَلٍ.

1586. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Abis ﷺ demişdir: "Bir kişinin İbn Abbasa belə dediyini eşitdim: "Sən Allah Elçisi ﷺ ilə birlikdə bayram namazında oldunmu?" İbn Abbas dedi: "Bəli. Əgər mənim onunla qohumluğum olmasaydı, yaşım az olduğuna görə çıxmazdım. Allah Elçisi ﷺ Kəsir ibn Saltın evinin yanında məlum olan bir yerə gələrək orada namaz qıldı və xütbə dedi. Sonra qadınlara üz tutaraq onlara moizə verdi, onlara xatırlatdı və sədəqə verməyi əmr etdi. Qadınlar da öz əllərindəki zinət əşyalarını Bilalın ətəyinə atırdılar".

٢٩ - الصَّلاَةُ قَبْلَ الْعِيدَيْنِ وَبَعْدَهَا

29-cu fəsil: Bayram namazlarından qabaq və sonra namaz qılmaq haqda

١٥٨٧ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ سَعِيدٍ الأَشَجُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ إِدْرِيسَ ، قَالَ : أَنْبَأَنَا شُعْبَةُ ، عَنْ عَدِيٍّ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ يَوْمَ الْعِيدِ ، فَصَلَّى رَكْعَتَيْنِ لَمْ يُصَلِّ قَبْلَهَا وَلاَ بَعْدَهَا.

1587. ...İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bayram günü gəlib iki rükət namaz qıldı. Bu namazdan nə qabaq, nə də sonra namaz qılmadı.

٣٠ - ذَبْحُ الإِمَامِ يَوْمَ الْعِيدِ وَعَدَدُ مَا يَذْبَحُ

30-cu fəsil: İmamın bayram günü qurban kəsməsi və qurbanın sayı

١٥٨٨ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا حَاتِمُ بْنُ وَرْدَانَ ، عَنْ أَيُّوبَ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، قَالَ : خَطَبَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ أَضْحَى ، وَانْكَفَأَ إِلَى كَبْشَيْنِ أَمْلَحَيْنِ فَذَبَحَهُمَا.

1588. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﵁ demişdir: "Allah Elçisi ﷺ bizə Qurban bayramı günü xütbə dedi və iki dənə qumral qoç kəsdi".

١٥٨٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، عَنِ اللَّيْثِ ، عَنْ كَثِيرِ بْنِ فَرْقَدٍ ، عَنْ نَافِعٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ أَخْبَرَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَذْبَحُ أَوْ يَنْحَرُ بِالْمُصَلَّى.

1589. ...Abdullah ibn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ dəvə və ya qoç qurban kəsdikdə, namazgahda kəsərdi.

٣١ - اجْتِمَاعُ الْعِيدَيْنِ وَشُهُودُهُمَا

## 31-cu fəsil: İki bayramın cümə ilə eyni gündə olması və orada iştirak etmək haqda

١٥٩٠ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، عَنْ جَرِيرٍ ، عَنْ إِبْرَاهِيمَ بْنِ مُحَمَّدِ بْنِ الْمُنْتَشِرِ ، قُلْتُ عَنْ أَبِيهِ ، قَالَ : نَعَمْ ، عَنْ حَبِيبِ بْنِ سَالِمٍ ، عَنِ النُّعْمَانِ بْنِ بَشِيرٍ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ فِي الْجُمُعَةِ وَالْعِيدِ بِـــ**{سَبِّحِ اسْمَ رَبِّكَ الأَعْلَى}** وَهَلْ أَتَاكَ حَدِيثُ الْغَاشِيَةِ ، وَإِذَا اجْتَمَعَ الْجُمُعَةُ وَالْعِيدُ فِي يَوْمٍ قَرَأَ بِهِمَا.

1590. ...Rəvayət edilir ki, ən-Numan ibn Bəşir ﵁ demişdir: "Allah Elçisi ﷺ cümədə və bayram namazlarında "əl-Ə'lə" və "əl-Ğaşiyə" surələrini oxuyardı. Əgər cümə ilə bayram bir günə düşərdisə, eynilə həmin surələri oxuyardı".

٣٢ - الرُّخْصَةُ فِي التَّخَلُّفِ عَنِ الْجُمُعَةِ لِمَنْ شَهِدَ الْعِيدَ

## 32-ci fəsil: Bayram namazında iştirak edənin cüməyə gəlməməsi rüsxəti

١٥٩١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ مَهْدِيٍّ ، قَالَ : حَدَّثَنَا إِسْرَائِيلُ ، عَنْ عُثْمَانَ بْنِ الْمُغِيرَةِ ، عَنْ إِيَاسِ بْنِ أَبِي رَمْلَةَ ، قَالَ : سَمِعْتُ مُعَاوِيَةَ ، سَأَلَ زَيْدَ بْنَ أَرْقَمَ أَشَهِدْتَ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عِيدَيْنِ ؟ قَالَ : نَعَمْ ، صَلَّى الْعِيدَ مِنْ أَوَّلِ النَّهَارِ ، ثُمَّ رَخَّصَ فِي الْجُمُعَةِ.

1591. ...Rəvayət edilir ki, İyas ibn Əbu Ramlə ﵀ demişdir: "Müaviyənin Zeyd ibn Ərqamdan belə soruşduğunu eşitdim: "Sən Allah Elçisi ﷺ ilə bayramlarda bir yerdə olmusanmı?" O dedi: "Bəli. O, bayram namazını günün ilk vaxtında qıldı, sonra cüməyə gəlməməyə rüsxət verdi".

١٥٩٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْحَمِيدِ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنِي وَهْبُ بْنُ كَيْسَانَ ، قَالَ : اجْتَمَعَ عِيدَانِ عَلَى عَهْدِ ابْنِ الزُّبَيْرِ فَأَخَّرَ الْخُرُوجَ حَتَّى تَعَالَى النَّهَارُ ، ثُمَّ خَرَجَ فَخَطَبَ فَأَطَالَ الْخُطْبَةَ ، ثُمَّ نَزَلَ فَصَلَّى وَلَمْ يُصَلِّ لِلنَّاسِ يَوْمَئِذٍ الْجُمُعَةَ ، فَذُكِرَ ذَلِكَ لابْنِ عَبَّاسٍ فَقَالَ : أَصَابَ السُّنَّةَ.

1592. ...Rəvayət edilir ki, Vəhb ibn Keysən ﵁ demişdir: "İbn əz-Zubeyrin vaxtında cümə ilə bayram bir günə düşmüşdü. O, camaatın içinə bir az gec çıxdı. Belə ki, günəş bir qədər yüksəlmişdi. Sonra çıxıb uzun bir xütbə dedi. Sonra (minbərdən) aşağı düşərək namaz qıldı. Bundan sonra isə həmin gün camaata cüməni qıldırmadı. Bu hadisə İbn Abbasa deyildikdə, İbn Abbas dedi: "O, sünnəyə müvafiq olmuşdur".

٣٣ - ضَرْبُ الدُّفِّ يَوْمَ الْعِيدِ

## 33-cü fəsil: Bayram günü dəf çalmaq

١٥٩٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ عَلَيْهَا وَعِنْدَهَا جَارِيَتَانِ تَضْرِبَانِ بِدُفَّيْنِ ، فَانْتَهَرَهُمَا أَبُو بَكْرٍ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : دَعْهُنَّ فَإِنَّ لِكُلِّ قَوْمٍ عِيدًا.

1593. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ onun yanına gəldi. Aişənin yanında dəf çalan iki cariyə qız uşağı var idi. Əbu Bəkr onların üstünə acıqlandıqda, Peyğəmbər ﷺ ona dedi: "Onları rahat burax! Hər bir qövmün bir bayramı var".

٣٤ - اللَّعِبُ بَيْنَ يَدَيِ الإِمَامِ يَوْمَ الْعِيدِ

## 34-cü fəsil: Bayram günü imamın qabağında oynamaq

١٥٩٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ عَبْدَةَ ، عَنْ هِشَامٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : جَاءَ السُّودَانُ يَلْعَبُونَ بَيْنَ يَدَيِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي يَوْمِ عِيدٍ ، فَدَعَانِي ، فَكُنْتُ أَطَّلِعُ إِلَيْهِمْ مِنْ فَوْقِ عَاتِقِهِ ، فَمَا زِلْتُ أَنْظُرُ إِلَيْهِمْ حَتَّى كُنْتُ أَنَا الَّتِي انْصَرَفْتُ.

1594. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Bayram günü həbəşilər gələrək Peyğəmbərin ﷺ qarşısında oynayırdılar. O, məni çağırdı və mən də onun çiyninin üstündən onlara tamaşa edirdim. Mən özüm gedənə qədər onlara tamaşa etdim".

٣٥ - اللَّعِبُ فِي الْمَسْجِدِ يَوْمَ الْعِيدِ وَنَظَرُ النِّسَاءِ إِلَى ذَلِكَ

## 35-ci fəsil: Bayram günü məsciddə oynamaq haqda və qadınların da buna baxması

١٥٩٥ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتُرُنِي بِرِدَائِهِ ، وَأَنَا أَنْظُرُ إِلَى الْحَبَشَةِ يَلْعَبُونَ فِي الْمَسْجِدِ حَتَّى أَكُونَ أَنَا أَسْأَمُ ، فَاقْدُرُوا قَدْرَ الْجَارِيَةِ الْحَدِيثَةِ السِّنِّ الْحَرِيصَةِ عَلَى اللَّهْوِ.

1595. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ məni öz ridası ilə örtmüşdü. Mən də həbəşilərin məsciddə oynamağına baxırdım. Mən usanana qədər onlara baxdım. Ona görə azyaşlı qızların oynamaq həvəsini - qədrini başa düşün (anlayışla qarşılayın)”.

١٥٩٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ بْنُ مُسْلِمٍ ، قَالَ : حَدَّثَنَا الأَوْزَاعِيُّ ، قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : دَخَلَ عُمَرُ وَالْحَبَشَةُ يَلْعَبُونَ فِي الْمَسْجِدِ ، فَزَجَرَهُمْ عُمَرُ رَضِيَ اللَّهُ عَنْهُ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : دَعْهُمْ يَا عُمَرُ ، فَإِنَّمَا هُمْ بَنُو أَرْفِدَةَ.

1596. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Həbəşilər məsciddə oynayarkən Ömər məscidə daxil oldu. Ömər onları danlayanda, Allah Elçisi ﷺ dedi: “Ey Ömər, onları burax! Onlar Ərdifə oğullarıdır[1]”.

٣٦ - الرُّخْصَةُ فِي الاِسْتِمَاعِ إِلَى الْغِنَاءِ وَضَرْبُ الدُّفِّ يَوْمَ الْعِيدِ

## 36-ci fəsil: Bayram günü yüksək səslə nəşid[2] deməyin və dəf çalmağın icazəli olması

١٥٩٧ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَفْصِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : حَدَّثَنِي إِبْرَاهِيمُ بْنُ طَهْمَانَ ، عَنْ مَالِكِ بْنِ أَنَسٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ أَنَّهُ حَدَّثَهُ ، أَنَّ عَائِشَةَ حَدَّثَتْهُ ، أَنَّ أَبَا بَكْرٍ الصِّدِّيقَ دَخَلَ عَلَيْهَا وَعِنْدَهَا جَارِيَتَانِ تَضْرِبَانِ بِالدُّفِّ وَتُغَنِّيَانِ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُسَجًّى بِثَوْبِهِ - وَقَالَ مَرَّةً أُخْرَى : مُتَسَجٍّ ثَوْبَهُ - فَكَشَفَ عَنْ وَجْهِهِ ، فَقَالَ : دَعْهُمَا يَا أَبَا بَكْرٍ إِنَّهَا أَيَّامُ عِيدٍ ، وَهُنَّ أَيَّامُ مِنًى وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَئِذٍ بِالْمَدِينَةِ.

1597. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Əbu Bəkr əs-Siddiq mənim yanıma gəldi. Yanımda dəf çalan iki cariyə var idi və yüksək səslə mahnı oxuyurdular. Allah Elçisi ﷺ də öz paltarına bürünmüşdü. O, üzünü açaraq belə dedi: “Ey Əbu Bəkr, onlarla işin olmasın! Həqiqətən, bu, bayram və Mina günləridir[3]”. Həmin gün Allah Elçisi ﷺ Mədinədə idi”.

---

[1] Həbəşilərin başqa adlarından biri. Bəzilərinə görə bu sözlə onların məhz hansısa bir tayfadan olmaları nəzərdə tutulur.

[2] Nəşid - avaz ilə deyilən şeirdir. Müasir nəşidlər isə İslam alimlərinə görə dinə gətirilmiş yenilikdir.

[3] Mina - Həcc ziyarətinə gedən zəvvarlar Zil-Hiccə ayının 10-dan 12-dək Məkkənin yaxınlığında yerləşən “Mina” adlı yerdə qalırlar. Həcc ziyarətinin rükünlərindən olan böyük, orta və kiçik cəmərələrə daş atma, eləcə də Qurban bayramına aid əməllər burada yerinə yetirilir.

## ٢٠ - كِتَابُ قِيَامِ اللَّيْلِ وَتَطَوُّعِ النَّهَارِ

## 20. Gecə namazı və gündüz edilən əlavə ibadətlər

### ١ - بَابُ الْحَثِّ عَلَى الصَّلاَةِ فِي الْبُيُوتِ وَالْفَضْلِ فِي ذَلِكَ

### 1-ci fəsil: Evdə namaz qılmağa təşviq etmək və onun fəziləti

١٥٩٨ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ أَسْمَاءَ ، قَالَ : حَدَّثَنَا جُوَيْرِيَةُ بْنُ أَسْمَاءَ ، عَنِ الْوَلِيدِ بْنِ أَبِي هِشَامٍ ، عَنْ نَافِعٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صَلُّوا فِي بُيُوتِكُمْ وَلاَ تَتَّخِذُوهَا قُبُورًا.

1598. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Evlərinizdə də namaz qılın ki, qəbiristanlığa bənzəməsin”.

١٥٩٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عَفَّانُ بْنُ مُسْلِمٍ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، قَالَ : سَمِعْتُ مُوسَى بْنَ عُقْبَةَ ، قَالَ : سَمِعْتُ أَبَا النَّضْرِ يُحَدِّثُ ، عَنْ بُسْرِ بْنِ سَعِيدٍ ، عَنْ زَيْدِ بْنِ ثَابِتٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اتَّخَذَ حُجْرَةً فِي الْمَسْجِدِ مِنْ حَصِيرٍ ، فَصَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِيهَا لَيَالِيَ حَتَّى اجْتَمَعَ إِلَيْهِ النَّاسُ ، ثُمَّ فَقَدُوا صَوْتَهُ لَيْلَةً ، فَظَنُّوا أَنَّهُ نَائِمٌ ، فَجَعَلَ بَعْضُهُمْ يَتَنَحْنَحُ لِيَخْرُجَ إِلَيْهِمْ ، فَقَالَ : مَا زَالَ بِكُمُ الَّذِي رَأَيْتُ مِنْ صُنْعِكُمْ حَتَّى خَشِيتُ أَنْ يُكْتَبَ عَلَيْكُمْ ، وَلَوْ كُتِبَ عَلَيْكُمْ مَا قُمْتُمْ بِهِ ، فَصَلُّوا أَيُّهَا النَّاسُ فِي بُيُوتِكُمْ ، فَإِنَّ أَفْضَلَ صَلاَةِ الْمَرْءِ فِي بَيْتِهِ إِلاَّ الصَّلاَةَ الْمَكْتُوبَةَ.

1599. ...Zeyd ibn Sabit ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ məsciddə həsirdən balaca bir otaq düzəltdi və orada gecə namazlarını qılmağa başladı. İnsanlar da onun yanına toplaşmağa başladılar. Sonra onlar həmin otaqdan Peyğəmbərin ﷺ səsini eşitmədilər və onun yatdığını zənn etdilər. Onlardan bəziləri səslərini eşidib yanlarına çıxması üçün öskürək kimi səslər çıxarmağa başladılar. Peyğəmbər ﷺ dedi: “Sizin bu elədiyinizi görürəm. Sizə nə olub? Mən bu namazların sizə fərz olunmasından qorxdum. Əgər bu namaz sizə fərz olunsaydı, bunu qıla bilməzdiniz. Ey insanlar, evlərinizdə də namaz qılın! Həqiqətən, fərz namazlarından sonra kişinin ən üstün namazı evində qıldığı namazdır!”

١٦٠٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : أَنْبَأَنَا إِبْرَاهِيمُ بْنُ أَبِي الْوَزِيرِ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ مُوسَى الْفِطْرِيُّ ، عَنْ سَعْدِ بْنِ إِسْحَاقَ بْنِ كَعْبِ بْنِ عُجْرَةَ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ ، قَالَ : صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلاَةَ الْمَغْرِبِ فِي مَسْجِدِ بَنِي عَبْدِ الأَشْهَلِ ، فَلَمَّا صَلَّى قَامَ نَاسٌ يَتَنَفَّلُونَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : عَلَيْكُمْ بِهَذِهِ الصَّلاَةِ فِي الْبُيُوتِ.

1600. ...Rəvayət edilir ki, Kəb ibn Ucra ﵁ demişdir: “Allah Elçisi ﷺ Bəni Abduləşhəl tayfasının məscidində Məğrib namazını qıldı. O, namazını

qılıb qurtarandan sonra camaat nafilə namaz qılmağa başladı. Peyğəmbər ﷺ dedi: “Sizə bu namazı evinizdə qılmağı əmr edirəm”.

## ٢ - بَابُ قِيَامِ اللَّيْلِ
## 2-ci fəsil: Gecə namazı

١٦٠١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ زُرَارَةَ ، عَنْ سَعْدِ بْنِ هِشَامٍ ، أَنَّهُ لَقِيَ ابْنَ عَبَّاسٍ ، فَسَأَلَهُ عَنِ الْوَتْرِ ، فَقَالَ : أَلاَ أُنَبِّئُكَ بِأَعْلَمِ أَهْلِ الأَرْضِ بِوَتْرِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ : نَعَمْ ، قَالَ : عَائِشَةُ ، ائْتِهَا فَسَلْهَا ، ثُمَّ ارْجِعْ إِلَيَّ فَأَخْبِرْنِي بِرَدِّهَا عَلَيْكَ ، فَأَتَيْتُ عَلَى حَكِيمِ بْنِ أَفْلَحَ ، فَاسْتَلْحَقْتُهُ إِلَيْهَا ، فَقَالَ : مَا أَنَا بِقَارِبِهَا إِنِّي نَهَيْتُهَا أَنْ تَقُولَ فِي هَاتَيْنِ الشِّيعَتَيْنِ شَيْئًا ، فَأَبَتْ فِيهَا إِلاَّ مُضِيًّا ، فَأَقْسَمْتُ عَلَيْهِ فَجَاءَ مَعِي فَدَخَلَ عَلَيْهَا ، فَقَالَتْ لِحَكِيمٍ : مَنْ هَذَا مَعَكَ ؟ قُلْتُ : سَعْدُ بْنُ هِشَامٍ ، قَالَتْ : مَنْ هِشَامٌ ؟ قُلْتُ : ابْنُ عَامِرٍ ، فَتَرَحَّمَتْ عَلَيْهِ ، وَقَالَتْ : نِعْمَ الْمَرْءُ كَانَ عَامِرًا ، قَالَ : يَا أُمَّ الْمُؤْمِنِينَ ، أَنْبِئِينِي عَنْ خُلُقِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : أَلَيْسَ تَقْرَأُ الْقُرْآنَ ؟ قَالَ : قُلْتُ : بَلَى ، قَالَتْ : فَإِنَّ خُلُقَ نَبِيِّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الْقُرْآنُ فَهَمَمْتُ أَنْ أَقُومَ فَبَدَا لِي قِيَامُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : يَا أُمَّ الْمُؤْمِنِينَ ، أَنْبِئِينِي عَنْ قِيَامِ نَبِيِّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : أَلَيْسَ تَقْرَأُ هَذِهِ السُّورَةَ ؟ يَا أَيُّهَا الْمُزَّمِّلُ قُلْتُ : بَلَى ، قَالَتْ : فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ افْتَرَضَ قِيَامَ اللَّيْلِ فِي أَوَّلِ هَذِهِ السُّورَةِ ، فَقَامَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَصْحَابُهُ حَوْلاً حَتَّى انْتَفَخَتْ أَقْدَامُهُمْ ، وَأَمْسَكَ اللَّهُ عَزَّ وَجَلَّ خَاتِمَتَهَا اثْنَيْ عَشَرَ شَهْرًا ، ثُمَّ أَنْزَلَ اللَّهُ عَزَّ وَجَلَّ التَّخْفِيفَ فِي آخِرِ هَذِهِ السُّورَةِ فَصَارَ قِيَامُ اللَّيْلِ تَطَوُّعًا بَعْدَ أَنْ كَانَ فَرِيضَةً فَهَمَمْتُ أَنْ أَقُومَ فَبَدَا لِي وَتْرُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقُلْتُ : يَا أُمَّ الْمُؤْمِنِينَ ، أَنْبِئِينِي عَنْ وَتْرِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : كُنَّا نُعِدُّ لَهُ سِوَاكَهُ ، وَطَهُورَهُ ، فَيَبْعَثُهُ اللَّهُ عَزَّ وَجَلَّ لِمَا شَاءَ أَنْ يَبْعَثَهُ مِنَ اللَّيْلِ ، فَيَتَسَوَّكُ ، وَيَتَوَضَّأُ ، وَيُصَلِّي ثَمَانِيَ رَكَعَاتٍ لاَ يَجْلِسُ فِيهِنَّ إِلاَّ عِنْدَ الثَّامِنَةِ ، يَجْلِسُ فَيَذْكُرُ اللَّهَ عَزَّ وَجَلَّ ، وَيَدْعُو ثُمَّ يُسَلِّمُ تَسْلِيمًا يُسْمِعُنَا ، ثُمَّ يُصَلِّي رَكْعَتَيْنِ وَهُوَ جَالِسٌ بَعْدَ مَا يُسَلِّمُ ، ثُمَّ يُصَلِّي رَكْعَةً فَتِلْكَ إِحْدَى عَشْرَةَ رَكْعَةً يَا بُنَيَّ ، فَلَمَّا أَسَنَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَخَذَ اللَّحْمَ أَوْتَرَ بِسَبْعٍ ، وَصَلَّى رَكْعَتَيْنِ وَهُوَ جَالِسٌ بَعْدَ مَا سَلَّمَ فَتِلْكَ تِسْعُ رَكَعَاتٍ يَا بُنَيَّ ، وَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا صَلَّى صَلاَةً أَحَبَّ أَنْ يَدُومَ عَلَيْهَا وَكَانَ إِذَا شَغَلَهُ عَنْ قِيَامِ اللَّيْلِ نَوْمٌ أَوْ مَرَضٌ أَوْ وَجَعٌ صَلَّى مِنَ النَّهَارِ اثْنَتَيْ عَشْرَةَ رَكْعَةً وَلاَ أَعْلَمُ أَنَّ نَبِيَّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ الْقُرْآنَ كُلَّهُ فِي لَيْلَةٍ ، وَلاَ قَامَ لَيْلَةً كَامِلَةً حَتَّى الصَّبَاحَ ، وَلاَ صَامَ شَهْرًا كَامِلاً غَيْرَ رَمَضَانَ فَأَتَيْتُ ابْنَ عَبَّاسٍ فَحَدَّثْتُهُ بِحَدِيثِهَا ، فَقَالَ : صَدَقَتْ ، أَمَا إِنِّي لَوْ كُنْتُ أَدْخُلُ عَلَيْهَا لأَتَيْتُهَا حَتَّى تُشَافِهَنِي مُشَافَهَةً. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : كَذَا وَقَعَ فِي كِتَابِي ، وَلاَ أَدْرِي مِمَّنِ الْخَطَأُ فِي مَوْضِعِ وَتْرِهِ عَلَيْهِ السَّلاَمُ.

1601. ...Rəvayət edilir ki, Səd ibn Hişam ﷺ demişdir: “Mən İbn Abbas ilə qarşılaşdım və ondan vitr barəsində soruşdum. O da dedi: “Sənə Allah Elçisinin ﷺ vitr namazını yer üzündə ən yaxşı bilən biri haqda xəbər verimmi?” Mən: “Bəli”- dedim. O dedi: “Bu Aişədir, get, ondan soruş və onun cavabını mənə bildir”. Onun yanına gedərkən Hakim ibn Əflah ilə qarşılaşdım. Onu da özümlə götürmək istədim. O dedi: “Mən onun yaxını deyiləm. Mən ona iki tayfa arasında bir şey danışmağı qadağan etmişdim. O isə bundan üz döndərdi”. Hişam dedi: “Mən ona mənimlə Aişənin

yanına gəlməsi üçün and verdim". Aişə Həkimə dedi: "Sənin yanında olan kimdir?" Mən dedim: "Səd ibn Hişam". O dedi: "Hansı Hişam?" Mən dedim: "Amirin oğlu". O, Amir üçün Allahdan rəhmət dilədi və dedi: "Amir çox yaxşı insan idi". Dedim: "Ey möminlərin anası, mənə Allah Elçisinin ﷺ əxlaqı haqda xəbər ver!" O dedi: "Sən Quran oxumursanmı!?" Dedim: "Əlbəttə, oxuyuram". O dedi: "Həqiqətən, Peyğəmbərin ﷺ əxlaqı Quran idi". Mən durub getmək istədim, birdən ağlıma Allah Elçisinin ﷺ gecə namazı haqda soruşmaq gəldi. Mən dedim: "Ey möminlərin anası, mənə Peyğəmbərin ﷺ gecə namazı haqda xəbər ver". O dedi: "Sən "əl-Muzəmmil" surəsini oxumamısanmı?" Dedim: "Bəli, oxumuşam". O dedi: "Həqiqətən, Allah ﷻ bu surənin əvvəlində gecə namazını fərz etmişdi. Peyğəmbər ﷺ və onun səhabələri ayaqları şişənə qədər bunu qılırdılar. Allah bu surənin axırını təxminən on iki ay endirmədi. Sonra Allah ﷻ bu surənin axırında asanlıq endirdi və gecə namazı fərz olduqdan sonra nafilə oldu". Mən durmaq istədikdə, yadıma Allah Elçisinin ﷺ vitr namazı haqda soruşmaq düşdü. Mən dedim: "Ey möminlərin anası, mənə Allah Elçisinin ﷺ vitr namazı haqda xəbər ver". O dedi: "Biz onun üçün misvakını və dəstamaz suyunu hazırlayardıq. Allah ﷻ gecə vaxtı istədiyini yuxudan qaldırardı. Peyğəmbər ﷺ dişlərini misvakla təmizləyib dəstəmaz alardı. Sonra oturmadan səkkiz rükət namaz qılardı. Səkkizinci rükətdə oturar, Allahı zikr edər və dua edərdi. Sonra bizim eşitdiyimiz şəkildə salam verərdi. Sonra həmin yerdə iki rükət qılar və salam verərədi. Daha sonra isə bir rükət qılardı. Bu da, ey övladlarım, on bir rükət olardı. Allah Elçisi ﷺ yaşlanıb kökəldikcə, bu namazların sayını yeddi rükət edər, həmin yerdə salam verdikdən sonra iki rükət qılardı. Bu da, ey övladlarım, doqquz edərdi. Allah Elçisi ﷺ namaz qıldıqda bu namazları uzatmaq istəyərdi. Əgər onu gecə namazını qılmağa bir şey - yuxu, xəstəlik və ya ağrı qoymazdısa, onları on iki rükət olmaqla günorta qılardı. Mən Peyğəmbərin ﷺ bir gecədə Quranın hamısını oxumasını görməmişəm. Həmçinin bütün gecəni səhərə qədər namaz qıldığını da görməmişəm. Həmçinin də Ramazan ayından başqa bütün ayı oruc tutmağını görməmişəm". Hişam deyir: "Mən İbn Abbasın yanına gedərək bunları ona danışdım. İbn Abbas dedi: "Doğru söyləyib! Əgər ora getsəydim, onun ağzından çıxan hər bir şeyə diqqətlə qulaq asardım".

٣ - بَابُ ثَوَابِ مَنْ قَامَ رَمَضَانَ إِيمَانًا وَاحْتِسَابًا

## 3-cü fəsil: Ramazan ayını imanla və savabını Allahdan umaraq ibadətlə keçirənin savabı

١٦٠٢ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَاب ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : مَنْ قَامَ رَمَضَانَ إِيمَانًا وَاحْتِسَابًا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

1602. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Ramazan ayını imanla və savabını Allahdan umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar".

١٦٠٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ أَبُو بَكْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ أَسْمَاءَ ، قَالَ : حَدَّثَنَا جُوَيْرِيَةُ ، عَنْ مَالِكٍ ، قَالَ : قَالَ الزُّهْرِيُّ ، أَخْبَرَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، وَحُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ قَامَ رَمَضَانَ إِيمَانًا وَاحْتِسَابًا غُفِرَ لَهُ مَا تَقَدَّمَ مِنْ ذَنْبِهِ.

1603. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Ramazan ayını imanla və savabını Allahdan umaraq ibadətlə keçirərsə, keçmiş günahları bağışlanar".

٤ - بَابُ قِيَامِ شَهْرِ رَمَضَانَ

## 4-cü fəsil: Ramazan ayında olan namaz

١٦٠٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَاب ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى فِي الْمَسْجِدِ ذَاتَ لَيْلَةٍ ، وَصَلَّى بِصَلَاتِهِ نَاسٌ ، ثُمَّ صَلَّى مِنَ الْقَابِلَةِ ، وَكَثُرَ النَّاسُ ثُمَّ اجْتَمَعُوا مِنَ اللَّيْلَةِ الثَّالِثَةِ أَوِ الرَّابِعَةِ فَلَمْ يَخْرُجْ إِلَيْهِمْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا أَصْبَحَ قَالَ : قَدْ رَأَيْتُ الَّذِي صَنَعْتُمْ فَلَمْ يَمْنَعْنِي مِنَ الْخُرُوجِ إِلَيْكُمْ إِلاَّ أَنِّي خَشِيتُ أَنْ يُفْرَضَ عَلَيْكُمْ وَذَلِكَ فِي رَمَضَانَ.

1604. ...Aişə ﷺ rəvayət edir ki, bir gecə Allah Elçisi ﷺ məsciddə namaz qıldı. İnsanlar da onunla birlikdə namaz qılmağa başladılar. Peyğəmbər ﷺ növbəti gecə də namaz qılmaq üçün məscidə gəldi. Sonra insanlar çoxalaraq üçüncü və ya dördüncü gecədə toplaşmağa başladılar. Lakin Allah Elçisi ﷺ onların yanına çıxmadı. Səhər olduqda dedi: "Mən sizin toplaşdığınızı gördükdə, bu əməlin Ramazanda sizin üzərinizə fərz olacağından qorxduğum üçün sizin yanınıza çıxmadım".

١٦٠٥ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ الْفُضَيْلِ ، عَنْ دَاوُدَ بْنِ أَبِي هِنْدٍ ، عَنِ الْوَلِيدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ ، عَنْ أَبِي ذَرٍّ ، قَالَ : صُمْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي رَمَضَانَ ، فَلَمْ يَقُمْ بِنَا حَتَّى بَقِيَ سَبْعٌ مِنَ الشَّهْرِ ، فَقَامَ بِنَا حَتَّى ذَهَبَ ثُلُثُ اللَّيْلِ ، ثُمَّ لَمْ يَقُمْ بِنَا فِي السَّادِسَةِ ، فَقَامَ بِنَا فِي الْخَامِسَةِ حَتَّى ذَهَبَ شَطْرُ اللَّيْلِ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، لَوْ نَفَّلْتَنَا بَقِيَّةَ لَيْلَتِنَا هَذِهِ ، قَالَ : إِنَّهُ مَنْ قَامَ مَعَ الإِمَامِ حَتَّى يَنْصَرِفَ ، كَتَبَ اللَّهُ لَهُ قِيَامَ لَيْلَةٍ ، ثُمَّ لَمْ يُصَلِّ بِنَا وَلَمْ يَقُمْ حَتَّى بَقِيَ ثَلاَثٌ مِنَ الشَّهْرِ ، فَقَامَ بِنَا فِي الثَّالِثَةِ ، وَجَمَعَ أَهْلَهُ وَنِسَاءَهُ حَتَّى تَخَوَّفْنَا أَنْ يَفُوتَنَا الْفَلاَحُ ، قُلْتُ : وَمَا الْفَلاَحُ ؟ قَالَ : السُّحُورُ.

1605. ...Rəvayət edilir ki, Əbu Zərr ﷺ demişdir: “Biz Allah Elçisi ﷺ ilə Ramazan orucunu tutduq. O, bizə Ramazan ayından yeddi gün qalana qədər namaz qıldırmadı. Yeddi gün qalanda artıq gecənin üçdə biri keçmişdi ki, bizə namaz qıldırdı. Altı gün qalanda yenə qıldırmadı. Sonra beşinci gün gecənin yarısı gedənə qədər bizə namaz qıldırdı. Mən dedim: “Ey Allahın Elçisi, gecənin qalan yarısını da bizimlə birlikdə namaz qılaq?” O dedi: “Sizdən biriniz imam namazı bitirənə qədər onunla birlikdə namaz qılsa, ona bütün gecəni namaz qılmış kimi savab yazılar”. Sonra Allah Elçisi ﷺ Ramazan ayından üç gün qalana qədər namaz qıldırmadı. Üç gecə qalanda namaz qıldırdı. Sonra ailəsini və qadınlarını topladı. Biz (namazın uzun olacağı səbəbi ilə) “uğuru” itirməkdən qorxduq. Biz dedik: “Uğur nədir?” Əbu Zərr dedi: “Səhur”.

١٦٠٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، قَالَ : أَخْبَرَنِي مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، قَالَ : حَدَّثَنِي نُعَيْمُ بْنُ زِيَادٍ أَبُو طَلْحَةَ ، قَالَ : سَمِعْتُ النُّعْمَانَ بْنَ بَشِيرٍ ، عَلَى مِنْبَرِ حِمْصَ يَقُولُ : قُمْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي شَهْرِ رَمَضَانَ لَيْلَةَ ثَلاَثٍ وَعِشْرِينَ إِلَى ثُلُثِ اللَّيْلِ الأَوَّلِ ، ثُمَّ قُمْنَا مَعَهُ لَيْلَةَ خَمْسٍ وَعِشْرِينَ إِلَى نِصْفِ اللَّيْلِ ، ثُمَّ قُمْنَا مَعَهُ لَيْلَةَ سَبْعٍ وَعِشْرِينَ حَتَّى ظَنَنَّا أَنْ لاَ نُدْرِكَ الْفَلاَحَ ، وَكَانُوا يُسَمُّونَهُ السُّحُورَ.

1606. ...Rəvayət edilir ki, Nueym ibn Ziyad Əbu Talhə ﷺ demişdir: “Hims şəhərinin[1] məscidində minbərdən ən-Numan ibn Bəşirin belə dediyini eşitdim: “Biz Allah Elçisi ﷺ ilə birlikdə Ramazanın iyirmi üçüncü gecəsinin ilk üçdə birinə qədər namaz qıldıq. Sonra onunla birlikdə Ramazanın iyirmi beşinci günü gecənin yarısına qədər, sonra da iyirmi yeddinci gecəni namaz qıldıq. Biz “uğura” çatmayacağımızı zənn etdik”. Onlar səhuru “uğur” adlandırırdılar”.

[1] Hims və ya Homs - müasir dövrdə Suriya ərazisində olan şəhərdir.

## ٥ - بَابُ التَّرْغِيبِ فِي قِيَامِ اللَّيْلِ
## 5-ci fəsil: Gecə namazına rəğbətləndirmək

١٦٠٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا نَامَ أَحَدُكُمْ عَقَدَ الشَّيْطَانُ عَلَى رَأْسِهِ ثَلاَثَ عُقَدٍ ، يَضْرِبُ عَلَى كُلِّ عُقْدَةٍ لَيْلاً طَوِيلاً أَيِ ارْقُدْ ، فَإِنِ اسْتَيْقَظَ فَذَكَرَ اللَّهَ انْحَلَّتْ عُقْدَةٌ ، فَإِنْ تَوَضَّأَ انْحَلَّتْ عُقْدَةٌ أُخْرَى ، فَإِنْ صَلَّى انْحَلَّتِ الْعُقَدُ كُلُّهَا ، فَيُصْبِحُ طَيِّبَ النَّفْسِ نَشِيطًا ، وَإِلاَّ أَصْبَحَ خَبِيثَ النَّفْسِ كَسْلاَنَ.

1607. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Biriniz yatdıqda, şeytan onun başına üç düyün vurur. Hər bir düyündə “gecə uzundur” deyir. Əgər oyanıb Allahı zikr etsə, düyünün biri açılar. Əgər dəstəmaz alsa, düyünün biri də açılar. Əgər namaz qılsa, bütün düyünlər açılar. O, sevinc içində və gümrah olaraq oyanar. Bunu etməsə, əzgin və tənbəl olaraq oyanar”.

١٦٠٨ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَبْدِ اللهِ ، قَالَ : ذُكِرَ عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ رَجُلٌ نَامَ لَيْلَةً حَتَّى أَصْبَحَ ، قَالَ : ذَاكَ رَجُلٌ بَالَ الشَّيْطَانُ فِي أُذُنَيْهِ.

1608. ...Rəvayət edilir ki, Abdullah ﵁ demişdir: “Allah Elçisinin ﷺ yanında (Sübh namazını qılmayıb) səhərə qədər yatan kişi haqda danışıldıqda, dedi: “Bu kişi qulaqlarına şeytanın sidik buraxdığı kimsədir”.

١٦٠٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ عَبْدِ الصَّمَدِ ، قَالَ : حَدَّثَنَا مَنْصُورٌ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّ رَجُلاً قَالَ : يَا رَسُولَ اللهِ ، إِنَّ فُلاَنًا نَامَ عَنِ الصَّلاَةِ الْبَارِحَةَ حَتَّى أَصْبَحَ ، قَالَ : ذَاكَ شَيْطَانٌ بَالَ فِي أُذُنَيْهِ.

1609. ...Abdullah ﵁ rəvayət edir ki, bir kişi belə dedi: “Ey Allahın Elçisi, filıankəs dünən axşam səhərə qədər namazsız yatıb qaldı”. Allah Elçisi ﷺ dedi: “Bu, qulaqlarına şeytanın sidik buraxdığı kimsədir”.

١٦١٠ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ ابْنِ عَجْلاَنَ ، قَالَ : حَدَّثَنِي الْقَعْقَاعُ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : رَحِمَ اللَّهُ رَجُلاً قَامَ مِنَ اللَّيْلِ فَصَلَّى ، ثُمَّ أَيْقَظَ امْرَأَتَهُ فَصَلَّتْ ، فَإِنْ أَبَتْ نَضَحَ فِي وَجْهِهَا الْمَاءَ ، وَرَحِمَ اللَّهُ امْرَأَةً قَامَتْ مِنَ اللَّيْلِ فَصَلَّتْ ، ثُمَّ أَيْقَظَتْ زَوْجَهَا فَصَلَّى ، فَإِنْ أَبَى نَضَحَتْ فِي وَجْهِهِ الْمَاءَ.

1610. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Allah gecə vaxtı yatağından qalxıb namaz qılan və zövcəsini

namaza oyadan, oyanmadığı təqdirdə isə onun üzünə su çiləyən kişiyə rəhm etsin! Habelə Allah gecə vaxtı yatağından qalxıb namaz qılan, ərini namaza oyadan, oyanmadığı təqdirdə isə onun üzünə su çiləyən qadına rəhm etsin!"

١٦١١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَلِيِّ بْنِ حُسَيْنٍ ، أَنَّ الْحُسَيْنَ بْنَ عَلِيٍّ حَدَّثَهُ ، عَنْ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ طَرَقَهُ وَفَاطِمَةَ ، فَقَالَ : أَلاَ تُصَلُّونَ ؟ قُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنَّمَا أَنْفُسُنَا بِيَدِ اللهِ ، فَإِذَا شَاءَ أَنْ يَبْعَثَهَا بَعَثَهَا ، فَانْصَرَفَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ قُلْتُ لَهُ ذَلِكَ ، ثُمَّ سَمِعْتُهُ وَهُوَ مُدْبِرٌ يَضْرِبُ فَخِذَهُ ، وَيَقُولُ : **{وَكَانَ الإِنْسَانُ أَكْثَرَ شَيْءٍ جَدَلاً}**.

1611. ...Əli ibn Əbu Talib ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə vaxtı onun və Fatimənin yanına gəlib dedi: "Niyə (gecə) namazını qılmırsınız?" Mən dedim: "Ey Allahın Elçisi! Həqiqətən, bizim canımız Allahın Əlindədir, istəsə, bizi oyadar". Mən bunu ona dedikdən sonra üz döndərib buduna (dizinə) vura-vura bu ayəni oxudu: **"...İnsan isə ən çox mübahisə edəndir"** (əl-Kəhf, 54)".

١٦١٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعْدِ بْنِ إِبْرَاهِيمَ بْنِ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا عَمِّي ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنِ ابْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنِي حَكِيمُ بْنُ حَكِيمِ بْنِ عَبَّادِ بْنِ حُنَيْفٍ ، عَنْ مُحَمَّدِ بْنِ مُسْلِمِ بْنِ شِهَابٍ ، عَنْ عَلِيِّ بْنِ حُسَيْنٍ ، عَنْ أَبِيهِ ، عَنْ جَدِّهِ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ ، قَالَ : دَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعَلَى فَاطِمَةَ مِنَ اللَّيْلِ ، فَأَيْقَظَنَا لِلصَّلاَةِ ، ثُمَّ رَجَعَ إِلَى بَيْتِهِ فَصَلَّى هَوِيًّا مِنَ اللَّيْلِ فَلَمْ يَسْمَعْ لَنَا حِسًّا ، فَرَجَعَ إِلَيْنَا فَأَيْقَظَنَا ، فَقَالَ : قُومَا فَصَلِّيَا ، قَالَ : فَجَلَسْتُ وَأَنَا أَعْرُكُ عَيْنِي ، وَأَقُولُ : إِنَّا وَاللَّهِ مَا نُصَلِّي إِلاَّ مَا كَتَبَ اللَّهُ لَنَا ، إِنَّمَا أَنْفُسُنَا بِيَدِ اللهِ ، فَإِنْ شَاءَ أَنْ يَبْعَثَنَا بَعَثَنَا ، قَالَ : فَوَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَهُوَ يَقُولُ : وَيَضْرِبُ بِيَدِهِ عَلَى فَخِذِهِ : مَا نُصَلِّي إِلاَّ مَا كَتَبَ اللَّهُ لَنَا ، **{وَكَانَ الإِنْسَانُ أَكْثَرَ شَيْءٍ جَدَلاً}**.

1612. ...Rəvayət edilir ki, Əli ibn Əbu Talib ﷺ demişdir: "Allah Elçisi ﷺ mənimlə Fatimənin yanına gəldi və bizi namaz üçün oyatdı. Sonra evinə qayıdıb bizə heç bir səs eşitdirmədən namaz qıldı. Sonra bizim yanımıza qayıtdı və bizi yenidən oyadaraq dedi: "Qalxıb namaz qılın!" Mən oturub gözlərimi ovuşduraraq dedim: "Allaha and olsun ki, biz yalnız Allahın bizə fərz etdiklərini qıldıq. Həqiqətən, bizim canımız Allahın Əlindədir. İstəsə, bizi oyadar". Allah Elçisi ﷺ çevrilib gedərək öz buduna vurub: "Biz yalnız Allahın bizə fərz etdiklərini qıldıq"- deyir və bu ayəni oxuyurdu: **"...İnsan isə ən çox mübahisə edəndir"** (əl-Kəhf, 54)".

٦ - فَضْلِ صَلاَةِ اللَّيْلِ

6-cı fəsil: Gecə namazının fəziləti

١٦١٣ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عَوَانَةَ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ هُوَ ابْنُ عَوْفٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفْضَلُ الصِّيَامِ بَعْدَ شَهْرِ رَمَضَانَ شَهْرُ اللهِ الْمُحَرَّمُ ، وَأَفْضَلُ الصَّلاَةِ بَعْدَ الْفَرِيضَةِ صَلاَةُ اللَّيْلِ.

1613. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ramazan ayından sonra ən fəzilətli oruc ayı Allahın ayı olan Muhərrəmdir. Fərz namazlarından sonra ən fəzilətli namaz isə gecə namazıdır".

١٦١٤ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بِشْرٍ جَعْفَرِ بْنِ أَبِي وَحْشِيَّةَ ، أَنَّهُ سَمِعَ حُمَيْدَ بْنَ عَبْدِ الرَّحْمَنِ ، يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَفْضَلُ الصَّلاَةِ بَعْدَ الْفَرِيضَةِ قِيَامُ اللَّيْلِ ، وَأَفْضَلُ الصِّيَامِ بَعْدَ رَمَضَانَ الْمُحَرَّمُ ، أَرْسَلَهُ شُعْبَةُ بْنُ الْحَجَّاجِ.

1614. ...Rəvayət edilir ki, Humeyd ibn Abdur-Rahmən ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Fərz namazlarından sonra ən fəzilətli namaz gecə namazıdır. Ramazandan sonra ən fəzilətli oruc Muhərrəm ayının orucudur". Bunu Şöbə ibn əl-Həccəc mürsəl olaraq rəvayət etmişdir".

٧ - فَضْلُ صَلاَةِ اللَّيْلِ فِي السَّفَرِ

7-ci fəsil: Səfərdə gecə namazının fəziləti

١٦١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، قَالَ : سَمِعْتُ رِبْعِيًّا ، عَنْ زَيْدِ بْنِ ظَبْيَانَ ، رَفَعَهُ إِلَى أَبِي ذَرٍّ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : ثَلاَثَةٌ يُحِبُّهُمُ اللَّهُ عَزَّ وَجَلَّ : رَجُلٌ أَتَى قَوْمًا فَسَأَلَهُمْ بِاللَّهِ وَلَمْ يَسْأَلْهُمْ بِقَرَابَةٍ بَيْنَهُ وَبَيْنَهُمْ فَمَنَعُوهُ فَتَخَلَّفَهُمْ رَجُلٌ بِأَعْقَابِهِمْ فَأَعْطَاهُ سِرًّا لاَ يَعْلَمُ بِعَطِيَّتِهِ إِلاَّ اللَّهُ عَزَّ وَجَلَّ وَالَّذِي أَعْطَاهُ ، وَقَوْمٌ سَارُوا لَيْلَتَهُمْ حَتَّى إِذَا كَانَ النَّوْمُ أَحَبَّ إِلَيْهِمْ مِمَّا يُعْدَلُ بِهِ نَزَلُوا فَوَضَعُوا رُؤُوسَهُمْ فَقَامَ يَتَمَلَّقُنِي وَيَتْلُو آيَاتِي ، وَرَجُلٌ كَانَ فِي سَرِيَّةٍ فَلَقُوا الْعَدُوَّ فَانْهَزَمُوا فَأَقْبَلَ بِصَدْرِهِ حَتَّى يُقْتَلَ أَوْ يُفْتَحَ لَهُ.

1615. ...Əbu Zərr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Üç nəfər var ki, Allah ﷻ onları sevir; (birincisi,) bir kişi bir camaatın yanına gedir, onlardan aralarında qohumluq əlaqəsinə görə deyil, yalnız Allah üçün (nə isə) istəyir. Onlar isə ona istədiyini vermirlər. O camaatdan bir kişi geriyə qalıb həmin istəyən adama istədiyini verir. Onun verdiyini

yalnız Allah ﷻ və verdiyi şəxs bildi. (İkincisi,) gecə vaxtı bir dəstə adam səfər edir. Gecənin (yuxunun) ən sevimli və heç nəyin bu (yuxunu) əvəz etmədiyi bir vaxtı gəldikdə, dəstədə olanlar da bir yerdə dayanırlar və başlarını qoyub yatırlar. Həmin dəstədə bir kişi (namaza) qalxıb Allahın ayələrini oxuyur. (Üçüncüsü,) bir kişi döyüş dəstəsində olduqda, düşmənlə qarşılaşaraq (döyüş yoldaşları) darmadağın edildiyi və tək qaldığı halda, ya öldürülür, ya da ona fəth (qələbə) nəsib olur".[1]

## ٨ - بَابُ وَقْتِ الْقِيَامِ

## 8-ci fəsil: Gecə namazının vaxtı

١٦١٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ الْبَصْرِيُّ ، عَنْ بِشْرٍ هُوَ ابْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَشْعَثَ بْنِ سُلَيْمٍ ، عَنْ أَبِيهِ ، عَنْ مَسْرُوقٍ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ : أَيُّ الأَعْمَالِ أَحَبُّ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَتْ : الدَّائِمُ ، قُلْتُ : فَأَيُّ اللَّيْلِ كَانَ يَقُومُ ؟ قَالَتْ : إِذَا سَمِعَ الصَّارِخَ.

1616. ...Rəvayət edilir ki, Məsruq ؓ demişdir: "Mən Aişəyə dedim: "Allah Elçisinə ﷺ hansı əməl daha sevimli idi?" O: "Daimi olan"- dedi. Mən dedim: "O, gecə namazını nə vaxt qılardı?" O dedi: "Xoruzların banlamasını eşitdiyi vaxt".

## ٩ - بَابُ ذِكْرِ مَا يُسْتَفْتَحُ بِهِ الْقِيَامُ

## 9-ci fəsil: Peyğəmbər ﷺ gecə namazını nə ilə başlayardı?

١٦١٧ - أَخْبَرَنَا عِصْمَةُ بْنُ الْفَضْلِ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ الْحُبَابِ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، قَالَ : حَدَّثَنَا الأَزْهَرُ بْنُ سَعِيدٍ ، عَنْ عَاصِمِ بْنِ حُمَيْدٍ ، قَالَ : سَأَلْتُ عَائِشَةَ : بِمَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْتَفْتِحُ قِيَامَ اللَّيْلِ ؟ قَالَتْ : لَقَدْ سَأَلْتَنِي عَنْ شَيْءٍ مَا سَأَلَنِي عَنْهُ أَحَدٌ قَبْلَكَ ، كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُكَبِّرُ عَشْرًا ، وَيَحْمَدُ عَشْرًا ، وَيُسَبِّحُ عَشْرًا ، وَيُهَلِّلُ عَشْرًا ، وَيَسْتَغْفِرُ عَشْرًا ، وَيَقُولُ : اللَّهُمَّ اغْفِرْ لِي وَاهْدِنِي ، وَارْزُقْنِي وَعَافِنِي ، أَعُوذُ بِاللَّهِ مِنْ ضِيقِ الْمَقَامِ يَوْمَ الْقِيَامَةِ.

1617. ...Rəvayət edilir ki, Asim ibn Humeyd ؓ demişdir: "Mən Aişədən soruşdum: "Allah Elçisi ﷺ gecə namazını nə ilə başlayardı?" O dedi: "Artıq sən məndən elə bir şey barəsində soruşdun ki, səndən qabaq bunu məndən heç kim soruşmamışdı. Allah Elçisi ﷺ on dəfə "Allahu Əkbər", on dəfə "Əlhəmdulilləh", on dəfə "Subhən-Allah", on dəfə "Lə iləhə İlləllah" və on dəfə "Əstəğfirullah" deyər, sonra belə dua edərdi: "Allahım, məni bağışla,

---

[1] Hədis zəifdir.

mənə hidayət ver, mənə ruzi ver, mənə salamatlıq ver! Allahım, Qiyamət günü hüzurunda dayanmağın sıxlığından Sənə sığınıram!”[1]

١٦١٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مَعْمَرٍ ، وَالأَوْزَاعِيِّ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ رَبِيعَةَ بْنِ كَعْبٍ الأَسْلَمِيِّ ، قَالَ : كُنْتُ أَبِيتُ عِنْدَ حُجْرَةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَكُنْتُ أَسْمَعُهُ إِذَا قَامَ مِنَ اللَّيْلِ ، يَقُولُ : سُبْحَانَ اللهِ رَبِّ الْعَالَمِينَ الْهَوِيَّ ، ثُمَّ يَقُولُ : سُبْحَانَ اللهِ وَبِحَمْدِهِ الْهَوِيَّ.

1618. ...Rəvayət edilir ki, Rabi ibn Kəb əl-Əsləmi ﷺ demişdir: “Mən Peyğəmbərin hücrəsinin (evinin) yanında gecələyərdim. O, gecə namazına qalxdıqda uzun-uzun: “Pak və nöqsansız Allah aləmlərin Rəbbidir!”[2]- deyərdi. Sonra uzun-uzun: “Allah pak və nöqsansızdır! Həmd Ona məxsusdur!”[3]- deyərdi”.

١٦١٩ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الأَحْوَلِ يَعْنِي سُلَيْمَانَ بْنَ أَبِي مُسْلِمٍ ، عَنْ طَاوُوسٍ ، عَنِ ابْنِ عَبَّاسٍ ، قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا قَامَ مِنَ اللَّيْلِ يَتَهَجَّدُ ، قَالَ : اللَّهُمَّ لَكَ الْحَمْدُ أَنْتَ نُورُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ ، وَلَكَ الْحَمْدُ أَنْتَ قَيَّامُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ ، وَلَكَ الْحَمْدُ أَنْتَ مَلِكُ السَّمَوَاتِ وَالأَرْضِ وَمَنْ فِيهِنَّ ، وَلَكَ الْحَمْدُ أَنْتَ حَقٌّ ، وَوَعْدُكَ حَقٌّ ، وَالْجَنَّةُ حَقٌّ ، وَالنَّارُ حَقٌّ ، وَالسَّاعَةُ حَقٌّ ، وَالنَّبِيُّونَ حَقٌّ ، وَمُحَمَّدٌ حَقٌّ ، لَكَ أَسْلَمْتُ ، وَعَلَيْكَ تَوَكَّلْتُ ، وَبِكَ آمَنْتُ ، - ثُمَّ ذَكَرَ قُتَيْبَةُ كَلِمَةً مَعْنَاهَا - وَبِكَ خَاصَمْتُ ، وَإِلَيْكَ حَاكَمْتُ ، اغْفِرْ لِي مَا قَدَّمْتُ وَمَا أَخَّرْتُ وَمَا أَعْلَنْتُ ، أَنْتَ الْمُقَدِّمُ وَأَنْتَ الْمُؤَخِّرُ ، لاَ إِلَهَ إِلاَّ أَنْتَ ، وَلاَ حَوْلَ وَلاَ قُوَّةَ إِلاَّ بِاللَّهِ.

1619. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: “Peyğəmbər ﷺ gecə vaxtı təhəccüdə[4] qalxdıqda, belə deyərdi: “Allahım, həmd yalnız Sənədir! Sən göylərin, yerin və onlarda olanların nurusan, həmd yalnız Sənədir! Sən göylərin, yerin və onlarda olanların Hamisisən, həmd yalnız Sənədir! Sən göylərin və yerin Hökmdarısan, həmd yalnız Sənədir! Sən Haqsan! Verdiyin vəd haqdır! Cənnət haqdır! Cəhənnəm haqdır! Qiyamət Saatı haqdır! Peyğəmbərlər haqdır! Muhəmməd haqdır! Allahım! Sənə təslim oldum, Sənə təvəkkül etdim, Sənə iman gətirdim!” Sonra hədisin ravisi Quteybə bu mənada olan kəlmələr zikr edərək dedi: “Sənin uğrunda mübarizə apardım və Sənin hökmünə üz tutdum. Əvvəl etdiyim, sonra edəcəyim və üzə çıxartdığım pis əməllərimi bağışla! Əvvələ çəkən də Sən-

---

[1] Transkripsiyası: Alla:humməğfirli:, vahdini:, varzuqni:, və a:fini:, əu:zu billə:hi min di:qil-məqa:mi yəuvməl-qiyə:mə!

[2] Transkripsiyası: Subhə:n-Alla:hi Rabbil-a:ləmi:n!

[3] Transkripsiyası: Subhə:n-Alla:hi və bihəmdihi!

[4] Təhəccüd – gecə vaxtı qılınan nafilə, əlavə namaz.

sən, təxirə salan da Sənsən. İbadətə layiq məbud yalnız Sənsən! Qüdrət və güc yalnız Allahdadır!”[1]

١٦٢٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْقَاسِمِ ، عَنْ مَالِكٍ ، قَالَ : حَدَّثَنِي مَخْرَمَةُ بْنُ سُلَيْمَانَ ، عَنْ كُرَيْبٍ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عَبَّاسٍ أَخْبَرَهُ ، أَنَّهُ بَاتَ عِنْدَ مَيْمُونَةَ أُمِّ الْمُؤْمِنِينَ وَهِيَ خَالَتُهُ ، فَاضْطَجَعَ فِي عَرْضِ الْوِسَادَةِ ، وَاضْطَجَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَهْلُهُ فِي طُولِهَا ، فَنَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، حَتَّى إِذَا انْتَصَفَ اللَّيْلُ أَوْ قَبْلَهُ قَلِيلاً أَوْ بَعْدَهُ قَلِيلاً اسْتَيْقَظَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَجَلَسَ يَمْسَحُ النَّوْمَ عَنْ وَجْهِهِ بِيَدِهِ ، ثُمَّ قَرَأَ الْعَشْرَ الآيَاتِ الْخَوَاتِيمَ مِنْ سُورَةِ آلِ عِمْرَانَ ، ثُمَّ قَامَ إِلَى شَنٍّ مُعَلَّقَةٍ ، فَتَوَضَّأَ مِنْهَا فَأَحْسَنَ وُضُوءَهُ ، ثُمَّ قَامَ يُصَلِّي ، قَالَ عَبْدُ اللهِ بْنُ عَبَّاسٍ : فَقُمْتُ فَصَنَعْتُ مِثْلَ مَا صَنَعَ ، ثُمَّ ذَهَبْتُ فَقُمْتُ إِلَى جَنْبِهِ ، فَوَضَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَدَهُ الْيُمْنَى عَلَى رَأْسِي ، وَأَخَذَ بِأُذُنِي الْيُمْنَى يَفْتِلُهَا ، فَصَلَّى رَكْعَتَيْنِ ، ثُمَّ رَكْعَتَيْنِ ، ثُمَّ رَكْعَتَيْنِ ، ثُمَّ رَكْعَتَيْنِ ، ثُمَّ رَكْعَتَيْنِ ، ثُمَّ رَكْعَتَيْنِ ، ثُمَّ أَوْتَرَ ، ثُمَّ اضْطَجَعَ حَتَّى جَاءَهُ الْمُؤَذِّنُ فَصَلَّى رَكْعَتَيْنِ خَفِيفَتَيْنِ.

1620. ...Rəvayət edilir ki, Abdullah ibn Abbas ﵄ xalası və möminlərin anası Məymunəgildə gecələmişdi. İbn Abbas yastığa uzandı. Allah Elçisi ﷺ və ailəsi də yatdılar. Allah Elçisi ﷺ gecənin yarısı və ya ondan qabaq və ya sonra oyandı. Allah Elçisi ﷺ oyandıqdan sonra oturub əlləri ilə üzünü ovuşdurdu və Ali-İmran surəsinin sonundan on ayə oxudu. Sonra ayağa durub asılı vəziyyətdə olan tuluqdakı su ilə gözəl şəkildə dəstəmaz aldı. Sonra namaz qıldı. Abdullah ibn Abbas dedi: “Mən qalxdım və onun etdiyi kimi etdim. Sonra gedib onun yanında dayandım. Allah Elçisi ﷺ sağ əlini başımın üzərinə qoydu və sağ qulağımdan çəkdi. Sonra iki rükət qıldı. Sonra iki rükət qıldı. Sonra iki rükət qıldı. Sonra iki rükət qıldı. Sonra iki rükət qıldı. Sonra iki rükət qıldı. Sonra da vitri qıldı. Sonra müəzzin gələnə qədər uzanıb yatdı. Sonra da iki yüngül rükət qıldı”.

## ١٠ - بَابُ مَا يَفْعَلُ إِذَا قَامَ مِنَ اللَّيْلِ مِنَ السِّوَاكِ

## 10-cu fəsil: Peyğəmbər ﷺ gecə oyandıqda, misvakdan necə istifadə edərdi?

١٦٢١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ عَبْدِ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنْ مَنْصُورٍ ، وَالأَعْمَشِ ، وَحُصَيْنٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ حُذَيْفَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا قَامَ مِنَ اللَّيْلِ يَشُوصُ فَاهُ بِالسِّوَاكِ.

---

[1] Transkripsiyası: Alla:hummə, ləkəl-həmdu Əntə nu:rus-səmə:və:ti val-ərdi va mən fi:hinnə va ləkəl-həmdu Əntə qayyə:mus-səmə:və:ti val-ərdi va mən fi:hinnə va ləkəl-həmdu Əntə məlikus-səmə:və:ti val-ərdi və mən fi:hinnə, va ləkəl-həmdu Əntə haqq, va va'dukə haqq, val-Cənnətu haqq, van-nə:ru haqq, vas-sə:atu haqq, van-nəbiyyu:nə haqq, va Muhəmmədun haqq, ləkə əsləmtu, va aleykə təvəkkəltu, va bikə ə:məntu..., bikə xa:səmtu, va ileykə hə:kəmtu, iğfirli: mə: qaddəmtu, va mə: əxxartu, va mə: ə'ləntu, Əntəl-muqaddimu, və Əntəl-muəxxiru, lə: ilə:hə illə: Ənt, va lə: həulə va lə: quvvətə illə: billəh!

1621. ...Huzeyfə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə namazına qalxdıqda, ağzını misvakla təmizləyərdi.

١٦٢٢ - حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ حُصَيْنٍ ، قَالَ : سَمِعْتُ أَبَا وَائِلٍ يُحَدِّثُ ، عَنْ حُذَيْفَةَ ، قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا قَامَ مِنَ اللَّيْلِ يَشُوصُ فَاهُ بِالسِّوَاكِ.

1622. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: "Allah Elçisi ﷺ gecə namazına qalxdıqda, ağzını misvakla təmizləyərdi".

١١ - ذِكْرُ الاِخْتِلاَفِ عَلَى أَبِي حَصِينٍ عُثْمَانَ بْنِ عَاصِمٍ فِي هَذَا الْحَدِيثِ

## 11-ci fəsil: Əbu Həsin Osman ibn Asimin bu hədis haqda ixtilafı

١٦٢٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، عَنْ إِسْحَاقَ بْنِ سُلَيْمَانَ ، عَنْ أَبِي سِنَانٍ ، عَنْ أَبِي حَصِينٍ ، عَنْ شَقِيقٍ ، عَنْ حُذَيْفَةَ قَالَ : كُنَّا نُؤْمَرُ بِالسِّوَاكِ إِذَا قُمْنَا مِنَ اللَّيْلِ.

1623. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: "Biz gecə namazına qalxdıqda, ağzımızı misvakla təmizləməklə əmr olunduq".

١٦٢٥ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، قَالَ : أَنْبَأَنَا إِسْرَائِيلُ ، عَنْ أَبِي حَصِينٍ ، عَنْ شَقِيقٍ قَالَ : كُنَّا نُؤْمَرُ إِذَا قُمْنَا مِنَ اللَّيْلِ أَنْ نَشُوصَ أَفْوَاهَنَا بِالسِّوَاكِ.

1624. ...Rəvayət edilir ki, Şəqiq ﵁ demişdir: "Biz gecə namazına qalxdıqda, ağzımızı misvakla təmizləməklə əmr olunduq".

١٢ - بَابُ بِأَيِّ شَيْءٍ تُسْتَفْتَحُ صَلاَةُ اللَّيْلِ

## 12-ci fəsil: Peyğəmbər ﷺ gecə namazını nə ilə başlayardı?

١٦٢٥ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ ، قَالَ : أَنْبَأَنَا عُمَرُ بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا عِكْرِمَةُ بْنُ عَمَّارٍ ، قَالَ : حَدَّثَنِي يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : سَأَلْتُ عَائِشَةَ : بِأَيِّ شَيْءٍ كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَفْتَتِحُ صَلاَتَهُ ؟ قَالَتْ : كَانَ إِذَا قَامَ مِنَ اللَّيْلِ افْتَتَحَ صَلاَتَهُ قَالَ : اللَّهُمَّ رَبَّ جِبْرِيلَ وَمِيكَائِيلَ وَإِسْرَافِيلَ ، فَاطِرَ السَّمَوَاتِ وَالأَرْضِ ، عَالِمَ الْغَيْبِ وَالشَّهَادَةِ ، أَنْتَ تَحْكُمُ بَيْنَ عِبَادِكَ فِيمَا كَانُوا فِيهِ يَخْتَلِفُونَ ، اللَّهُمَّ اهْدِنِي لِمَا اخْتُلِفَ فِيهِ مِنَ الْحَقِّ ، إِنَّكَ تَهْدِي مَنْ تَشَاءُ إِلَى صِرَاطٍ مُسْتَقِيمٍ.

1625. ...Rəvayət edilir ki, Əbu Sələmə ibn Abdur-Rahmən ﵀ demişdir: "Mən Aişədən soruşdum: "Peyğəmbər ﷺ gecə namazın nə ilə başlayardı?"

O dedi: "Peyğəmbər gecə namazına başlayaraq belə deyərdi: "Cəbrailin, Mikailin və İsrafilin Rəbbi, göyləri və yeri yaradan, qeybdə və aşkarda olanı Bilən Allahım! Allahım, ixtilafda olduqları şeylər barəsində bəndələrin arasında Sən hökm verirsən. Baş vermiş ixtilafda məni haqqa yönəlt! Həqiqətən, Sən istədiyini doğru yola yönəldirsən!"[1]

١٦٢٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، عَنْ يُونُسَ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنِي حُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، أَنَّ رَجُلاً مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : قُلْتُ وَأَنَا فِي سَفَرٍ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَاللَّهِ لأَرْقُبَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِصَلاَةٍ حَتَّى أَرَى فِعْلَهُ ، فَلَمَّا صَلَّى صَلاَةَ الْعِشَاءِ وَهِيَ الْعَتَمَةُ ، اضْطَجَعَ هَوِيًّا مِنَ اللَّيْلِ ، ثُمَّ اسْتَيْقَظَ فَنَظَرَ فِي الأُفُقِ ، فَقَالَ : **{رَبَّنَا مَا خَلَقْتَ هَذَا بَاطِلاً}** حَتَّى بَلَغَ **{إِنَّكَ لاَ تُخْلِفُ الْمِيعَادَ}** ، ثُمَّ أَهْوَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَى فِرَاشِهِ ، فَاسْتَلَّ مِنْهُ سِوَاكًا ، ثُمَّ أَفْرَغَ فِي قَدَحٍ مِنْ إِدَاوَةٍ عِنْدَهُ مَاءً فَاسْتَنَّ ، ثُمَّ قَامَ فَصَلَّى حَتَّى قُلْتُ : قَدْ صَلَّى قَدْرَ مَا نَامَ ، ثُمَّ اضْطَجَعَ حَتَّى قُلْتُ : قَدْ نَامَ قَدْرَ مَا صَلَّى ، ثُمَّ اسْتَيْقَظَ فَفَعَلَ كَمَا فَعَلَ أَوَّلَ مَرَّةٍ ، وَقَالَ مِثْلَ مَا قَالَ ، فَفَعَلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثَلاَثَ مَرَّاتٍ قَبْلَ الْفَجْرِ.

1626. ...Humeyd Abdur-Rahmən ibn Auf ﷺ Peyğəmbərin ﷺ səhabələrindən olan bir kişidən rəvayət edərək belə demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə səfərdə idim. Allaha and olsun ki, mən onun necə namaz qılacağını güdürdüm. O, İşanı, yəni Atamə namazını qıldı. Uzun müddət yatdı. Sonra oyanaraq üfüqə baxıb bu ayəni oxudu: **"Ey Rəbbimiz! Sən bunları əbəs yerə yaratmamısan. Sən pak və müqəddəssən. Bizi Odun əzabından qoru! Ey Rəbbimiz! Sən Oda saldığın kəsi, əlbəttə, rəzil etmiş olarsan. Zalımların heç bir köməkçisi olmaz. Ey Rəbbimiz! Həqiqətən, biz: "Rəbbinizə iman gətirin!"– deyə imana çağıran bir çağırışçını eşidib iman gətirdik. Ey Rəbbimiz! Günahlarımızı bizə bağışla, təqsirlərimizdən keç və canımızı yaxşılarla bir yerdə al! Ey Rəbbimiz! Öz elçilərinin vasitəsi ilə vəd etdiklərini bizə ver və Qiyamət günü bizi rəzil etmə! Şübhəsiz ki, Sən vədindən dönməzsən!"** (Ali-İmran, 191-194). Sonra yatağını axtarıb ordan misvakını götürdü, yanındakı qabı su ilə doldurdu və misvakını ona batırıb dişlərini misvakla təmizlədi. Sonra qalxıb namaz qıldı. Mən deyərdim ki, yatdığı qədər namaz qıldı. Sonra uzanıb namaz qıldığı qədər yatdı. Sonra oyanıb birinci dəfə etdiyi və dediyi kimi etdi. Allah Elçisi ﷺ bunu Sübh namazından qabaq üç dəfə təkrar etdi".

---

[1] Transkripsiyası: Alla:hummə Rabbə Cibri:lə va Mi:kə:i:lə va İsra:fi:lə fə:tiras-səmə:və:ti val-ərd, a:liməl-ğaybi vaş-şəhə:dəti əntə təhkumu beynə ibə:dikə fi:mə kə:nu: fi:hi yəxtəlifu:n. Alla:hummə-hdini: liməxtulifə fi:hi minəl-həqq, innəkə təhdi: mən təşə:u ilə: sıra:tim mustəqi:m!

١٣ - بَابُ ذِكْرِ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِاللَّيْلِ

## 13-cü fəsil: Allah Elçisinin ﷺ gecə namazı haqda

١٦٢٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا حُمَيْدٌ ، عَنْ أَنَسٍ قَالَ : مَا كُنَّا نَشَاءُ أَنْ نَرَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي اللَّيْلِ مُصَلِّيًا إِلاَّ رَأَيْنَاهُ ، وَلاَ نَشَاءُ أَنْ نَرَاهُ نَائِمًا إِلاَّ رَأَيْنَاهُ.

1627. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Biz Allah Elçisinin ﷺ gecə namaz qıldığını görmək istədikdə, namaz qılan, yatdığını görmək istədikdə də yatan görürdük".

١٦٢٨ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ : قَالَ ابْنُ جُرَيْجٍ : عَنْ أَبِيهِ ، أَخْبَرَنِي ابْنُ أَبِي مُلَيْكَةَ ، أَنَّ يَعْلَى بْنَ مَمْلَكٍ أَخْبَرَهُ ، أَنَّهُ سَأَلَ أُمَّ سَلَمَةَ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : كَانَ يُصَلِّي الْعَتَمَةَ ، ثُمَّ يُسَبِّحُ ، ثُمَّ يُصَلِّي بَعْدَهَا مَا شَاءَ اللَّهُ مِنَ اللَّيْلِ ، ثُمَّ يَنْصَرِفُ فَيَرْقُدُ مِثْلَ مَا صَلَّى ، ثُمَّ يَسْتَيْقِظُ مِنْ نَوْمِهِ ذَلِكَ فَيُصَلِّي مِثْلَ مَا نَامَ ، وَصَلاَتُهُ تِلْكَ الآخِرَةُ تَكُونُ إِلَى الصُّبْحِ.

1628. ...Rəvayət edilir ki, Yə'lə ibn Məmlək ﷺ Ummu Sələmədən Allah Elçisinin ﷺ namazı haqda soruşduqda, Ummu Sələmə belə dedi: "Allah Elçisi ﷺ Atəməni (İşanı) qılar, təsbih edər, sonra gecə Allahın istədiyi qədər namaz qılar, sonra da namaz qıldığı qədər yatardı. Sonra oyanaraq yatdığı qədər namaz qılardı. Onun axırıncı namazı Sübhə qədər olardı".[1]

١٦٢٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُبَيْدِ اللهِ بْنِ أَبِي مُلَيْكَةَ ، عَنْ يَعْلَى بْنِ مَمْلَكٍ ، أَنَّهُ سَأَلَ أُمَّ سَلَمَةَ ، زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ قِرَاءَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَعَنْ صَلاَتِهِ ، فَقَالَتْ : مَا لَكُمْ وَصَلاَتَهُ ؟ كَانَ يُصَلِّي ثُمَّ يَنَامُ قَدْرَ مَا صَلَّى ، ثُمَّ يُصَلِّي قَدْرَ مَا نَامَ ، ثُمَّ يَنَامُ قَدْرَ مَا صَلَّى حَتَّى يُصْبِحَ ، ثُمَّ نَعَتَتْ لَهُ قِرَاءَتَهُ ، فَإِذَا هِيَ تَنْعَتُ قِرَاءَةً مُفَسَّرَةً حَرْفًا حَرْفًا.

1629. ... Rəvayət edilir ki, Yə'lə ibn Məmlək ﷺ Peyğəmbərin ﷺ zövcəsi Ummu Sələmədən Allah Elçisinin ﷺ qiraəti və namazı haqda soruşduqda, Ummu Sələmə belə dedi: "Siz harada, onun namazı harada! O, namaz qılar, sonra da namaz qıldığı qədər yatardı. Sonra oyanaraq yatdığı qədər namaz qılardı. Sonra Sübhədək namaz qıldığı qədər yatardı". Sonra Ummu Sələmə onun qiraətini vəsf etdi və onun hərf-hərf asta şəkildə oxumağını söylədi".[2]

---

[1] Hədis zəifdir.

[2] Hədis zəifdir.

١٤ - ذِكْرُ صَلاَةِ نَبِيِّ اللهِ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ بِاللَّيْلِ

## 14-cü fəsil: Allahın Peyğəmbəri Davudun ﷺ gecə namazı haqda

١٦٣٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ عَمْرِو بْنِ أَوْسٍ ، أَنَّهُ سَمِعَ عَبْدَ اللهِ بْنَ عَمْرِو بْنِ الْعَاصِ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَحَبُّ الصِّيَامِ إِلَى اللهِ عَزَّ وَجَلَّ صِيَامُ دَاوُدَ عَلَيْهِ السَّلاَمُ ، كَانَ يَصُومُ يَوْمًا وَيُفْطِرُ يَوْمًا ، وَأَحَبُّ الصَّلاَةِ إِلَى اللهِ صَلاَةُ دَاوُدَ كَانَ يَنَامُ نِصْفَ اللَّيْلِ ، وَيَقُومُ ثُلُثَهُ ، وَيَنَامُ سُدُسَهُ.

1630. ...Rəvayət edilir ki, Amr ibn Əus ﷺ Abdullah ibn Amr ibn əl-Asın belə dediyini eşitmişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Allahın ﷻ ən çox xoşuna gələn oruc Davudun ﷺ tutduğu orucdur. O, günaşırı oruc tutardı. Həmçinin Allahın ən çox xoşuna gələn namaz da Davudun qıldığı namazdır. Davud gecənin yarısını yatar, sonra qalxıb onun üçdə birini namaz qılar, sonra da yerdə qalan altıda birini yatardı".

١٥ - ذِكْرُ صَلاَةِ نَبِيِّ اللهِ مُوسَى عَلَيْهِ السَّلاَمُ ، وَذِكْرُ الاِخْتِلاَفِ عَلَى سُلَيْمَانَ التَّيْمِيِّ فِيهِ

## 15-ci fəsil: Allahın Peyğəmbəri Musanın ﷺ namazı və Süleyman ət-Teyminin ixtilafı haqda

١٦٣١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَلِيِّ بْنِ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ خَالِدٍ ، قَالَ : أَنْبَأَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ سُلَيْمَانَ التَّيْمِيِّ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَتَيْتُ لَيْلَةَ أُسْرِيَ بِي عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ عِنْدَ الْكَثِيبِ الأَحْمَرِ وَهُوَ قَائِمٌ يُصَلِّي فِي قَبْرِهِ.

1631. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "İsra gecəsi Musanın ﷺ yanından keçdim. O, qırmızı qum təpəsinin yanında öz qəbrində ayaq üstə namaz qılırdı".

١٦٣٢ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا يُونُسُ بْنُ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ سُلَيْمَانَ التَّيْمِيِّ ، وَثَابِتٍ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَتَيْتُ عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ عِنْدَ الْكَثِيبِ الأَحْمَرِ وَهُوَ قَائِمٌ يُصَلِّي. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا أَوْلَى بِالصَّوَابِ عِنْدَنَا مِنْ حَدِيثِ مُعَاذِ بْنِ خَالِدٍ وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

1632. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Musanın ﷺ yanından keçdim. O, qırmızı qum təpəsinin yanında öz qəbrində ayaq üstə namaz qılırdı". Əbu Abdur-Rahmən (ən-Nəsəi) dedi: "Bu, düzgünlük cəhətdən bizim üçün Muaz ibn Xalidin hədisindən daha yaxındır. Doğrusunu Uca Allah bilir".

١٦٣٣ - أَخْبَرَنِي أَحْمَدُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَبَّانُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، قَالَ : أَنْبَأَنَا ثَابِتٌ ، وَسُلَيْمَانُ التَّيْمِيُّ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَرَرْتُ عَلَى قَبْرِ مُوسَى عَلَيْهِ السَّلاَمُ وَهُوَ يُصَلِّي فِي قَبْرِهِ.

1633. ... Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Musanın ﷺ qəbrinin yanından keçdim. O, öz qəbrində namaz qılırdı".

١٦٣٤ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، قَالَ : حَدَّثَنَا عِيسَى ، عَنْ سُلَيْمَانَ التَّيْمِيِّ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَرَرْتُ لَيْلَةَ أُسْرِيَ بِي عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ وَهُوَ يُصَلِّي فِي قَبْرِهِ.

1634. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "İsra gecəsi Musanın ﷺ yanından keçdim. O, öz qəbrində namaz qılırdı".

١٦٣٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُعْتَمِرٌ ، عَنْ أَبِيهِ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةَ أُسْرِيَ بِهِ مَرَّ عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ وَهُوَ يُصَلِّي فِي قَبْرِهِ.

1635. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ İsra gecəsi Musanın ﷺ yanından keçmişdi. O, öz qəbrində namaz qılırdı.

١٦٣٦ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبِ بْنِ عَرَبِيٍّ ، وَإِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالاَ : حَدَّثَنَا مُعْتَمِرٌ ، قَالَ : سَمِعْتُ أَبِي ، قَالَ : سَمِعْتُ أَنَسًا يَقُولُ : أَخْبَرَنِي بَعْضُ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةَ أُسْرِيَ بِهِ مَرَّ عَلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ وَهُوَ يُصَلِّي فِي قَبْرِهِ.

1636. ...Rəvayət edilir Ənəs ﷺ demişdir: "Mənə Peyğəmbərin ﷺ bəzi səhabələri xəbər verdilər ki, Peyğəmbər ﷺ İsra gecəsi Musanın ﷺ yanından keçmişdi. O, öz qəbrində namaz qılırdı".

١٦٣٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَبِي عَدِيٍّ ، عَنْ سُلَيْمَانَ ، عَنْ أَنَسٍ ، عَنْ بَعْضِ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْلَةَ أُسْرِيَ بِي مَرَرْتُ عَلَى مُوسَى وَهُوَ يُصَلِّي فِي قَبْرِهِ.

1637. ...Ənəs ﷺ Peyğəmbərin ﷺ bəzi səhabələrinin belə dediyini rəvayət etmişdir: "Peyğəmbər ﷺ belə buyurdu: "İsra gecəsi Musanın yanından keçdim. O, öz qəbrində namaz qılırdı".

## ١٦ - بَابُ إِحْيَاءِ اللَّيْلِ

## 16-cı fəsil: Gecəni oyaq qalmaq

١٦٣٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ بْنِ سَعِيدِ بْنِ كَثِيرٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، وَبَقِيَّةُ ، قَالاَ : حَدَّثَنَا ابْنُ أَبِي حَمْزَةَ ، قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ ، قَالَ : أَخْبَرَنِي عُبَيْدُ اللهِ بْنُ عَبْدِ اللهِ بْنِ الْحَارِثِ بْنِ نَوْفَلٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ خَبَّابِ بْنِ الأَرَتِّ ، عَنْ أَبِيهِ - وَكَانَ قَدْ شَهِدَ بَدْرًا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ - أَنَّهُ رَاقَبَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اللَّيْلَةَ كُلَّهَا حَتَّى كَانَ مَعَ الْفَجْرِ ، فَلَمَّا سَلَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مِنْ صَلاَتِهِ جَاءَهُ خَبَّابٌ ، فَقَالَ : يَا رَسُولَ اللهِ ، بِأَبِي أَنْتَ وَأُمِّي ، لَقَدْ صَلَّيْتَ اللَّيْلَةَ صَلاَةً مَا رَأَيْتُكَ صَلَّيْتَ نَحْوَهَا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَجَلْ ، إِنَّهَا صَلاَةُ رَغَبٍ وَرَهَبٍ سَأَلْتُ رَبِّي عَزَّ وَجَلَّ فِيهَا ثَلاَثَ خِصَالٍ ، فَأَعْطَانِي اثْنَتَيْنِ وَمَنَعَنِي وَاحِدَةً ، سَأَلْتُ رَبِّي عَزَّ وَجَلَّ أَنْ لاَ يُهْلِكَنَا بِمَا أَهْلَكَ بِهِ الأُمَمَ قَبْلَنَا ، فَأَعْطَانِيهَا ، وَسَأَلْتُ رَبِّي عَزَّ وَجَلَّ أَنْ لاَ يُظْهِرَ عَلَيْنَا عَدُوًّا مِنْ غَيْرِنَا ، فَأَعْطَانِيهَا ، وَسَأَلْتُ رَبِّي أَنْ لاَ يَلْبِسَنَا شِيَعًا ، فَمَنَعَنِيهَا.

1638. ...Abdullah ibn Xabbab əl-Ərat atasından ﷺ rəvayət edir ki, o, Allah Elçisi ﷺ ilə Bədr döyüşündə idi və bütün gecəni Sübhə qədər Allah Elçisini ﷺ güdürdü. Allah Elçisi ﷺ namazı bitirib salam verdikdə, Xabbab onun yanına gəlib dedi: “Ey Allahın Elçisi, atam-anam sənə fəda olsun! Sən gecə elə namaz qıldın ki, mən sənin belə namaz qıldığını görməmişdim”. Allah Elçisi ﷺ dedi: “Bəli, bu namaz rəğbət (Allaha tərəf yaxınlaşmaq) və qorxu namazı idi. Mən Rəbbimdən ﷻ üç şey istədim, ikisini mənə verdi, üçüncüsünü isə vermədi. Mən Rəbbimdən ﷻ bizi bizdən əvvəlki ümmətlər kimi həlak etməməsini istədim, onu mənə verdi. Mən Rəbbimdən bizim üzərimizə bizdən qeyri düşmənləri qalib etməməsini istədim, bunu da mənə verdi. Mən Rəbbimdən bizi firqələrə bölməməsini istədim, bunu isə vermədi”.

## ١٧ - الاِخْتِلاَفُ عَلَى عَائِشَةَ فِي إِحْيَاءِ اللَّيْلِ

## 17-ci fəsil: Aişənin ﵂ gecəni oyaq qalmaq haqda olan ixtilafı

١٦٣٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي يَعْفُورٍ ، عَنْ مُسْلِمٍ ، عَنْ مَسْرُوقٍ ، قَالَ : قَالَتْ عَائِشَةُ رَضِيَ اللَّهُ عَنْهَا : كَانَ إِذَا دَخَلَتِ الْعَشْرُ أَحْيَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ اللَّيْلَ ، وَأَيْقَظَ أَهْلَهُ ، وَشَدَّ الْمِئْزَرَ.

1639. ...Rəvayət edilir ki, Məsruq ﵀ demişdir: “Aişə dedi: “(Ramazan ayının) son on günu daxil olduqda, Allah Elçisi ﷺ gecəni oyaq olar və ailəsini də oyadardı. İzarını isə bağlayardı[1]”.

[1] Qadınları ilə cinsi münasibətdə olmazdı.

١٦٤٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، عَنْ أَبِي إِسْحَاقَ ، قَالَ : أَتَيْتُ الأَسْوَدَ بْنَ يَزِيدَ ، وَكَانَ لِي أَخًا صَدِيقًا ، فَقُلْتُ : يَا أَبَا عَمْرٍو حَدِّثْنِي مَا حَدَّثَتْكَ بِهِ أُمُّ الْمُؤْمِنِينَ عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : قَالَتْ : كَانَ يَنَامُ أَوَّلَ اللَّيْلِ وَيُحْيِي آخِرَهُ.

1640. ...Rəvayət edilir ki, Əbu İshaq ﷺ demişdir: "Mən əl-Əsvəd ibn Yəzidin yanına gəldim. O, mənim qardaşım və dostum idi. Mən dedim: "Ey Əbu Amr! Mənə möminlərin anasının Allah Elçisinin ﷺ namazı haqda danışdıqlarını danış". Möminlərin anası dedi: "O, gecənin ilk vaxtında yatar, axırında isə oyaq qalardı".

١٦٤١ - أَخْبَرَنَا هَارُونُ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ بْنُ سُلَيْمَانَ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ زُرَارَةَ بْنِ أَوْفَى ، عَنْ سَعْدِ بْنِ هِشَامٍ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، قَالَتْ : لاَ أَعْلَمُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَرَأَ الْقُرْآنَ كُلَّهُ فِي لَيْلَةٍ ، وَلاَ قَامَ لَيْلَةً حَتَّى الصَّبَاحَ ، وَلاَ صَامَ شَهْرًا كَامِلاً قَطُّ غَيْرَ رَمَضَانَ.

1641. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ bir gecədə bütün Quranı oxuduğunu, bütün gecəni səhərə qədər namaz qıldığını və Ramazandan başqa bütün ayı oruc tutduğunu bilmirəm".

١٦٤٢ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، عَنْ يَحْيَى ، عَنْ هِشَامٍ ، قَالَ : أَخْبَرَنِي أَبِي ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ عَلَيْهَا وَعِنْدَهَا امْرَأَةٌ ، فَقَالَ : مَنْ هَذِهِ ؟ قَالَتْ : فُلاَنَةُ ، لاَ تَنَامُ ، فَذَكَرَتْ مِنْ صَلاَتِهَا ، فَقَالَ : مَهْ عَلَيْكُمْ بِمَا تُطِيقُونَ ، فَوَاللَّهِ لاَ يَمَلُّ اللَّهُ عَزَّ وَجَلَّ حَتَّى تَمَلُّوا ، وَلَكِنَّ أَحَبَّ الدِّينِ إِلَيْهِ مَا دَاوَمَ عَلَيْهِ صَاحِبُهُ.

1642. ...Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ onun yanına gəldikdə, onun yanında bir qadın var idi. Allah Elçisi ﷺ dedi: "Bu kimdir?" Aişə dedi: "Filankəsdir. O, yatmır..."- və onun uzun-uzadı gecə namaz qıldığını danışdı. Allah Elçisi ﷺ dedi: "Bəsdir! Sizə gücünüz çatacağınız şeyi əmr edirəm. Allaha and olsun! Siz usanmadıqca Allah usanmaz! Allah üçün ibadətlərin ən sevimli olanı, insanın davamlı yerinə yetirdiyi əməldir".

١٦٤٣ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، عَنْ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ دَخَلَ الْمَسْجِدَ فَرَأَى حَبْلاً مَمْدُودًا بَيْنَ سَارِيَتَيْنِ ، فَقَالَ : مَا هَذَا الْحَبْلُ ؟ فَقَالُوا : لِزَيْنَبَ تُصَلِّي ، فَإِذَا فَتَرَتْ تَعَلَّقَتْ بِهِ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : حُلُّوهُ ، لِيُصَلِّ أَحَدُكُمْ نَشَاطَهُ فَإِذَا فَتَرَ فَلْيَقْعُدْ.

1643. ...Ənəs ibn Malik ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ məscidə daxil olduqda, iki sütun arasında bir ipin bağlandığını görüb dedi: "Bu nədir?"

Səhabələr dedilər: "Bu, Zeynəbin ipidir. Namaz qılır, yorulanda ondan tutur". Peyğəmbər ﷺ dedi: "İpi açın! Sizdən biriniz gümrahlığı davam edənə qədər namaz qılsın, yorulanda isə otursun".

١٦٤٤ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، وَمُحَمَّدُ بْنُ مَنْصُورٍ ، وَاللَّفْظُ لَهُ ، عَنْ سُفْيَانَ ، عَنْ زِيَادِ بْنِ عِلاَقَةَ ، قَالَ : سَمِعْتُ الْمُغِيرَةَ بْنَ شُعْبَةَ يَقُولُ : قَامَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى تَوَرَّمَتْ قَدَمَاهُ ، فَقِيلَ لَهُ : قَدْ غَفَرَ اللَّهُ لَكَ مَا تَقَدَّمَ مِنْ ذَنْبِكَ وَمَا تَأَخَّرَ قَالَ : أَفَلاَ أَكُونُ عَبْدًا شَكُورًا.

1644. ...Rəvayət edilir ki, Ziyad ibn İlaqa ﵀ demişdir: "əl-Muğira ibn Şöbənin belə dediyini eşitdim: "Peyğəmbər ﷺ ayaqları şişənə qədər namaz qıldıqda, ona deyildi: "Artıq Allah sənin gələcək və keçmiş günahlarını bağışlayıb". O dedi: "Bəs mən şükür edən qul olmayımmı?"

١٦٤٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا صَالِحُ بْنُ مِهْرَانَ ، وَكَانَ ثِقَةً ، قَالَ : حَدَّثَنَا النُّعْمَانُ بْنُ عَبْدِ السَّلاَمِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَاصِمِ بْنِ كُلَيْبٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي حَتَّى تَزْلَعَ - يَعْنِي تَشَقَّقُ - قَدَمَاهُ.

1645. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ ayaqları şişənə qədər namaz qılardı".

١٨ - كَيْفَ يَفْعَلُ إِذَا افْتَتَحَ الصَّلَاةَ قَائِمًا وَذِكْرُ اخْتِلَافِ النَّاقِلِينَ عَنْ عَائِشَةَ فِي ذَلِكَ

## 18-ci fəsil: Peyğəmbər ﷺ ayaq üstə namaza başladıqda nə edərdi və Aişədən ﵂ rəvayət olunan hədisdə olan ixtilaf haqda

١٦٤٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ بُدَيْلٍ ، وَأَيُّوبُ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي لَيْلاً طَوِيلاً ، فَإِذَا صَلَّى قَائِمًا رَكَعَ قَائِمًا ، وَإِذَا صَلَّى قَاعِدًا رَكَعَ قَاعِدًا.

1646. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ gecə vaxtı uzun-uzadı namaz qılardı. Əgər namazı ayaq üstə qılardısa, rukusunu da ayaq üstə edərdi. Əgər namazı oturaraq qılardısa, rukusunu da oturaraq edərdi".

١٦٤٧ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ الرَّحِيمِ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنِي يَزِيدُ بْنُ إِبْرَاهِيمَ ، عَنِ ابْنِ سِيرِينَ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي قَائِمًا وَقَاعِدًا ، فَإِذَا افْتَتَحَ الصَّلاَةَ قَائِمًا رَكَعَ قَائِمًا ، وَإِذَا افْتَتَحَ الصَّلاَةَ قَاعِدًا رَكَعَ قَاعِدًا.

1647. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ namazı ayaq üstə də, oturaraq da qılardı. Əgər namazını ayaq üstə başlayardısa, rukusunu da ayaq üstə edərdi. Əgər namazını oturaraq başlayardısa, rukusunu da oturaraq edərdi”.

١٦٤٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، قَالَ : حَدَّثَنَا ابْنُ الْقَاسِمِ ، عَنْ مَالِكٍ ، قَالَ : حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ يَزِيدَ ، وَأَبُو النَّضْرِ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي وَهُوَ جَالِسٌ فَيَقْرَأُ وَهُوَ جَالِسٌ ، فَإِذَا بَقِيَ مِنْ قِرَاءَتِهِ قَدْرَ مَا يَكُونُ ثَلاَثِينَ أَوْ أَرْبَعِينَ آيَةً قَامَ فَقَرَأَ وَهُوَ قَائِمٌ ، ثُمَّ رَكَعَ ، ثُمَّ سَجَدَ ، ثُمَّ يَفْعَلُ فِي الرَّكْعَةِ الثَّانِيَةِ مِثْلَ ذَلِكَ.

1648. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ namazını oturaraq qıldıqda, namazda olan qiraəti da oturaraq edərdi. Quran oxunuşundan otuz və ya qırx ayə qədər qaldıqda, ayağa qalxar və qiraəti ayaq üstə edərdi. Sonra ruku edər, sonra səcdə edər, sonra da ikinci rükətdə eyni şeyi edərdi.

١٦٤٩ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عِيسَى بْنُ يُونُسَ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : مَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى جَالِسًا حَتَّى دَخَلَ فِي السِّنِّ ، فَكَانَ يُصَلِّي وَهُوَ جَالِسٌ يَقْرَأُ ، فَإِذَا غَبَرَ مِنَ السُّورَةِ ثَلاَثُونَ أَوْ أَرْبَعُونَ آيَةً ، قَامَ فَقَرَأَ بِهَا ثُمَّ رَكَعَ.

1649. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisinin ﷺ yaşlanana qədər oturaraq namaz qıldığını görmədim. Yaşlandıqda isə oturaraq namaz qılar, namazda olan qiraəti də oturaraq edərdi. Surədən otuz-qırx ayə qaldıqda, qalxıb qiraəti davam edər, sonra da ruku edərdi”.

١٦٥٠ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا ابْنُ عُلَيَّةَ ، قَالَ : حَدَّثَنَا الْوَلِيدُ بْنُ أَبِي هِشَامٍ ، عَنْ أَبِي بَكْرِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقْرَأُ وَهُوَ قَاعِدٌ ، فَإِذَا أَرَادَ أَنْ يَرْكَعَ قَامَ قَدْرَ مَا يَقْرَأُ إِنْسَانٌ أَرْبَعِينَ آيَةً.

1650. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ oturaraq namaz qılar və namazda olan qiraəti də oturaraq edərdi. Ruku etmək istədikdə, qalxıb birinin qırx ayə oxuduğu müddət rukuda qalardı”.

١٦٥١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، عَنْ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، عَنِ الْحَسَنِ ، عَنْ سَعْدِ بْنِ هِشَامِ بْنِ عَامِرٍ ، قَالَ : قَدِمْتُ الْمَدِينَةَ فَدَخَلْتُ عَلَى عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، قَالَتْ : مَنْ أَنْتَ ؟ قُلْتُ : أَنَا سَعْدُ بْنُ هِشَامِ بْنِ عَامِرٍ ، قَالَتْ : رَحِمَ اللَّهُ أَبَاكَ ، قُلْتُ : أَخْبِرِينِي عَنْ صَلاَةِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ وَكَانَ ، قُلْتُ : أَجَلْ ، قَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُصَلِّي بِاللَّيْلِ صَلاَةَ الْعِشَاءِ ، ثُمَّ يَأْوِي إِلَى فِرَاشِهِ فَيَنَامُ ، فَإِذَا كَانَ جَوْفُ اللَّيْلِ قَامَ إِلَى حَاجَتِهِ وَإِلَى طَهُورِهِ ، فَتَوَضَّأَ ، ثُمَّ دَخَلَ الْمَسْجِدَ فَيُصَلِّي ثَمَانِيَ رَكَعَاتٍ يُخَيَّلُ إِلَيَّ أَنَّهُ يُسَوِّي بَيْنَهُنَّ فِي الْقِرَاءَةِ

وَالرُّكُوعِ وَالسُّجُودِ وَيُوتِرُ بِرَكْعَةٍ ، ثُمَّ يُصَلِّي رَكْعَتَيْنِ وَهُوَ جَالِسٌ ، ثُمَّ يَضَعُ جَنْبَهُ فَرُبَّمَا جَاءَ بِلاَلٌ فَآذَنَهُ بِالصَّلاَةِ قَبْلَ أَنْ يُغْفِيَ ، وَرُبَّمَا يُغْفِي ، وَرُبَّمَا شَكَكْتُ أَغْفَى أَوْ لَمْ يُغْفِ حَتَّى يُؤْذِنَهُ بِالصَّلاَةِ ، فَكَانَتْ تِلْكَ صَلاَةَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى أَسَنَّ وَلُحِمَ ، فَذَكَرَتْ مِنْ لَحْمِهِ مَا شَاءَ اللَّهُ قَالَتْ : وَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي بِالنَّاسِ الْعِشَاءَ ، ثُمَّ يَأْوِي إِلَى فِرَاشِهِ ، فَإِذَا كَانَ جَوْفُ اللَّيْلِ قَامَ إِلَى طَهُورِهِ وَإِلَى حَاجَتِهِ ، فَتَوَضَّأَ ، ثُمَّ يَدْخُلُ الْمَسْجِدَ فَيُصَلِّي سِتَّ رَكَعَاتٍ يُخَيَّلُ إِلَيَّ أَنَّهُ يُسَوِّي بَيْنَهُنَّ فِي الْقِرَاءَةِ وَالرُّكُوعِ وَالسُّجُودِ ، ثُمَّ يُوتِرُ بِرَكْعَةٍ ، ثُمَّ يُصَلِّي رَكْعَتَيْنِ وَهُوَ جَالِسٌ ، ثُمَّ يَضَعُ جَنْبَهُ وَرُبَّمَا جَاءَ بِلاَلٌ فَآذَنَهُ بِالصَّلاَةِ قَبْلَ أَنْ يُغْفِيَ ، وَرُبَّمَا أَغْفَى ، وَرُبَّمَا شَكَكْتُ أَغْفَى أَمْ لاَ ؟ حَتَّى يُؤْذِنَهُ بِالصَّلاَةِ ، قَالَتْ : فَمَا زَالَتْ تِلْكَ صَلاَةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1651. ...Rəvayət edilir ki, Səd ibn Hişam ibn Amir ﵁ demişdir: “Mədinəyə gələrək Aişənin yanına daxil oldum. O dedi: “Sən kimsən?” Mən dedim: “Mən Səd ibn Hişam ibn Amirəm”. Aişə dedi: “Allah sənin atana rəhm etsin!” Mən dedim: “Mənə Allah Elçisinin ﷺ namazı haqda xəbər ver”. O dedi: “Allah Elçisi ﷺ filan cür namaz qılardı”. Mən dedim: ”Bəli”. O dedi: “Allah Elçisi ﷺ axşam İşa namazını qılar və yatağına uzanıb yatardı. Gecənin yarısı olduqda, ehtiyacı üçün qalxar və dəstəmaz alar, sonra məscidə daxil olar və səkkiz rükət namaz qılardı. Mənə elə gəldi ki, bu rükətlərdə olan qiraət, ruku və səcdənin uzunluğu eyni olardı. Sonra bir rükət Vitr namazını qılardı. Sonra oturduğu halda iki rükət də qılardı. Sonra uzanar və mürgüləməzdən əvvəl Bilal gəlib namaza azan vermək üçün izn istəyərdi. Hərdən o mürgüləyəndə mən onun Bilal azan üçün izn istəməzdən qabaq mürgüləyib-mürgüləməməsində şübhəyə düşərdim. Bu, onun yaşlaşıb bir qədər kökələnə qədər olan namazı idi”. Sonra Aişə onun bir qədər kökəlməsi haqda danışdı. O, davam edərək dedi: “Peyğəmbər insanlara İşa namazını qıldırdı. Sonra yatağına uzandı. Gecənin yarısı olduqda, ehtiyacı üçün qalxar və dəstəmaz alar, sonra məscidə daxil olar və altı rükət namaz qılardı. Mənə elə gəldi ki, bu rükətlərdə olan qiraət, ruku və səcdə (uzunluq baxımından) eyni olardı. Sonra bir rükət Vitr namazını qılardı. Sonra oturduğu halda iki rükət də qılardı. Sonra uzanar və mürgüləməzdən əvvəl Bilal gəlib namaza azan vermək üçün izn istəyərdi. Hərdən o mürgüləyəndə mən onun Bilalın azan üçün izn istəməsindən qabaq mürgüləyib-mürgüləməməsində şübhəyə düşərdim. Bu da Allah Elçisinin ﷺ namazı idi”.

١٩ - بَابُ صَلاَةِ الْقَاعِدِ فِي النَّافِلَةِ ، وَذِكْرِ الاِخْتِلاَفِ عَلَى أَبِي إِسْحَاقَ فِي ذَلِكَ

## 19-cu fəsil: Nafilə (əlavə) namazları oturaraq qılmaq və Əbu İshaqın bu haqda olan ixtilafı

١٦٥٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، عَنْ حَدِيثِ أَبِي عَاصِمٍ ، قَالَ : حَدَّثَنَا عُمَرُ بْنُ أَبِي زَائِدَةَ ، قَالَ : حَدَّثَنِي أَبُو إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ عَائِشَةَ ، قَالَتْ : مَا كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَمْتَنِعُ مِنْ وَجْهِي وَهُوَ صَائِمٌ ، وَمَا مَاتَ حَتَّى كَانَ أَكْثَرُ صَلاَتِهِ قَاعِدًا ، ثُمَّ ذَكَرَتْ كَلِمَةً مَعْنَاهَا إِلاَّ الْمَكْتُوبَةَ ، وَكَانَ أَحَبُّ الْعَمَلِ إِلَيْهِ مَا دَامَ عَلَيْهِ الإِنْسَانُ وَإِنْ كَانَ يَسِيرًا. خَالَفَهُ يُونُسُ ، رَوَاهُ عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ أُمِّ سَلَمَةَ.

1652. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ oruc olduğu halda mənim üzümdən öpməkdən imtina etməzdi. Ölümünə yaxın olan vaxtlarda fərz namazlarından başqa namazların əksəriyyətini oturaraq qılardı. Ona ən sevimli əməl yüngül olub davamiyyətli olan əməl idi”.

١٦٥٣ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ سَلْمٍ الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا النَّضْرُ ، قَالَ : أَنْبَأَنَا يُونُسُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنِ الأَسْوَدِ ، عَنْ أُمِّ سَلَمَةَ قَالَتْ : مَا قُبِضَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى كَانَ أَكْثَرُ صَلاَتِهِ جَالِسًا إِلاَّ الْمَكْتُوبَةَ. خَالَفَهُ شُعْبَةُ ، وَسُفْيَانُ ، وَقَالاَ : عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ.

1653. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: “Allah Elçisi ﷺ ölənə yaxın fərz namazlarından başqa namazların çoxunu oturaraq qılardı”.

١٦٥٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ أَبِي إِسْحَاقَ ، قَالَ : سَمِعْتُ أَبَا سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ قَالَتْ : مَا مَاتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى كَانَ أَكْثَرُ صَلاَتِهِ قَاعِدًا إِلاَّ الْفَرِيضَةَ ، وَكَانَ أَحَبُّ الْعَمَلِ إِلَيْهِ أَدْوَمَهُ وَإِنْ قَلَّ.

1654. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: “Allah Elçisi ﷺ ölənə yaxın fərz namazlarından başqa namazların əksəriyyətini oturaraq qılardı. Ona ən sevimli əməl, az olsa da, davamlı olanı idi”.

١٦٥٥ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ عَبْدِ الصَّمَدِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أُمِّ سَلَمَةَ ، قَالَتْ : وَالَّذِي نَفْسِي بِيَدِهِ ، مَا مَاتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى كَانَ أَكْثَرُ صَلاَتِهِ قَاعِدًا إِلاَّ الْمَكْتُوبَةَ ، وَكَانَ أَحَبُّ الْعَمَلِ إِلَيْهِ مَا دَاوَمَ عَلَيْهِ وَإِنْ قَلَّ. خَالَفَهُ عُثْمَانُ بْنُ أَبِي سُلَيْمَانَ ، فَرَوَاهُ عَنْ أَبِي سَلَمَةَ ، عَنْ عَائِشَةَ.

1655. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: “Canım Əlində Olana and olsun! Allah Elçisi ﷺ ölənə yaxın fərz namazlarından başqa

namazların əksəriyyətini oturaraq qılardı. Ona ən sevimli əməl, az olsa da, davamlı olanı idi".

١٦٥٦ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ مُحَمَّدٍ ، عَنْ حَجَّاجٍ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عُثْمَانُ بْنُ أَبِي سُلَيْمَانَ ، أَنَّ أَبَا سَلَمَةَ أَخْبَرَهُ ، أَنَّ عَائِشَةَ أَخْبَرَتْهُ : أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمْ يَمُتْ حَتَّى كَانَ يُصَلِّي كَثِيرًا مِنْ صَلاَتِهِ وَهُوَ جَالِسٌ.

1656. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ ölənə yaxın namazlarının çoxunu oturaraq qılardı.

١٦٥٧ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، عَنْ يَزِيدَ بْنِ زُرَيْعٍ ، قَالَ : أَنْبَأَنَا الْجُرَيْرِيُّ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، قَالَ : قُلْتُ لِعَائِشَةَ : هَلْ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي وَهُوَ قَاعِدٌ ؟ قَالَتْ : نَعَمْ ، بَعْدَ مَا حَطَمَهُ النَّاسُ.

1657. ...Rəvayət edilir ki, Abdullah ibn Şəqiq ﵀ demişdir: "Mən Aişədən soruşdum: "Allah Elçisi ﷺ oturaraq namaz qılardımı?" O dedi: "Bəli, yaşlandıqda insanlar içində belə edərdi".

١٦٥٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنِ السَّائِبِ بْنِ يَزِيدَ ، عَنِ الْمُطَّلِبِ بْنِ أَبِي وَدَاعَةَ ، عَنْ حَفْصَةَ قَالَتْ : مَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى فِي سُبْحَتِهِ قَاعِدًا قَطُّ حَتَّى كَانَ قَبْلَ وَفَاتِهِ بِعَامٍ ، فَكَانَ يُصَلِّي قَاعِدًا يَقْرَأُ بِالسُّورَةِ فَيُرَتِّلُهَا حَتَّى تَكُونَ أَطْوَلَ مِنْ أَطْوَلَ مِنْهَا.

1658. ...Rəvayət edilir ki, Həfsa ﵂ demişdir: "Mən Allah Elçisini ﷺ ölümünə bir il qalmışa qədər oturaraq namaz qılan görmədim. O, namazını oturaraq qılar və surəni aramla elə oxuyardı ki, ondan uzun surədən daha uzun görsənərdi".

## ٢٠ - بَابُ فَضْلِ صَلاَةِ الْقَائِمِ عَلَى صَلاَةِ الْقَاعِدِ

## 20-ci fəsil: Ayaq üstə qılınan namazın oturaraq qılınan namazdan üstün olması

١٦٥٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنَا مَنْصُورٌ ، عَنْ هِلاَلِ بْنِ يَسَافٍ ، عَنْ أَبِي يَحْيَى ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو قَالَ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي جَالِسًا ، فَقُلْتُ : حُدِّثْتُ أَنَّكَ قُلْتَ : إِنَّ صَلاَةَ الْقَاعِدِ عَلَى النِّصْفِ مِنْ صَلاَةِ الْقَائِمِ ، وَأَنْتَ تُصَلِّي قَاعِدًا ، قَالَ : أَجَلْ ، وَلَكِنِّي لَسْتُ كَأَحَدٍ مِنْكُمْ.

1659. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﵄ demişdir: "Peyğəmbərin ﷺ oturaraq namaz qılmasını gördüm və ona dedim: "Mənə deyildi ki, sən

belə demisən: “Oturaraq namaz qılanın namazı ayaq üstə namaz qılanın namazının yarısı qədərdir”. Sənin də namazı oturaraq qıldığını görürəm. Peyğəmbər ﷺ dedi: “Bəli, lakin mən sizin kimi deyiləm”.

٢١ - فَضْلُ صَلاَةِ الْقَاعِدِ عَلَى صَلاَةِ النَّائِمِ

## 21-ci fəsil: Oturaraq qılınan namazın uzanaraq qılınan namazdan üstün olması

١٦٦٠ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ سُفْيَانَ بْنِ حَبِيبٍ ، عَنْ حُسَيْنٍ الْمُعَلِّمِ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُرَيْدَةَ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ، قَالَ : سَأَلْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنِ الَّذِي يُصَلِّي قَاعِدًا ، قَالَ : مَنْ صَلَّى قَائِمًا فَهُوَ أَفْضَلُ ، وَمَنْ صَلَّى قَاعِدًا فَلَهُ نِصْفُ أَجْرِ الْقَائِمِ ، وَمَنْ صَلَّى نَائِمًا فَلَهُ نِصْفُ أَجْرِ الْقَاعِدِ.

1660. ...Rəvayət edilir ki, İmran ibn Husayn ؓ demişdir: “Peyğəmbərdən ﷺ oturaraq namaz qılan haqda soruşdum. O dedi: “Kim ayaq üstə namaz qılsa, daha üstündür. Kim oturaraq namaz qılsa, ona ayaq üstə namaz qılanın namazının yarısı qədər savabı var. Kim uzanaraq namaz qılsa, ona oturaraq namaz qılanın namazının yarısı qədər savabı var”.

٢٢ - بَابُ كَيْفَ صَلاَةُ الْقَاعِدِ

## 22-ci fəsil: Oturaraq namaz necə qılınır?

١٦٦١ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ الْحَفَرِيُّ ، عَنْ حَفْصٍ ، عَنْ حُمَيْدٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ شَقِيقٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : رَأَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي مُتَرَبِّعًا ، قَالَ : أَبُو عَبْدِ الرَّحْمَنِ : لاَ أَعْلَمُ أَحَدًا رَوَى هَذَا الْحَدِيثَ غَيْرَ أَبِي دَاوُدَ وَهُوَ ثِقَةٌ ، وَلاَ أَحْسِبُ هَذَا الْحَدِيثَ إِلاَّ خَطَأً وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

1661. ...Rəvayət edilir ki, Aişə ؓ demişdir: “Mən Peyğəmbərin ﷺ oturaraq namaz qıldığını görmüşəm”.

٢٣ - بَابُ كَيْفَ الْقِرَاءَةُ بِاللَّيْلِ

## 23-cü fəsil: Gecə namazında Quran necə oxunur?

١٦٦٢ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي قَيْسٍ ، قَالَ : سَأَلْتُ عَائِشَةَ ، كَيْفَ كَانَتْ قِرَاءَةُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِاللَّيْلِ يَجْهَرُ أَمْ يُسِرُّ ؟ قَالَتْ : كُلُّ ذَلِكَ قَدْ كَانَ يَفْعَلُ رُبَّمَا جَهَرَ ، وَرُبَّمَا أَسَرَّ.

1662. ...Rəvayət edilir ki, Abdullah ibn Əbu Qeys ﵁ demişdir: “Mən Aişədən soruşdum: “Allah Elçisi ﷺ gecə namazında Quranı səsli oxuyardı, yoxsa səssiz?” O dedi: “Bunların hər birini edərdi. Hərdən səsli, hərdən də səssiz qılardı”.

٢٤ - فَضْلُ السِّرِّ عَلَى الْجَهْرِ

24-cü fəsil: Səssiz oxumağın səsli oxumaqdan daha üstün olması

١٦٦٣ - أَخْبَرَنَا هَارُونُ بْنُ مُحَمَّدِ بْنِ بَكَّارِ بْنِ بِلاَلٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، يَعْنِي ابْنَ سُمَيْعٍ ، قَالَ : حَدَّثَنَا زَيْدٌ ، يَعْنِي ابْنَ وَاقِدٍ ، عَنْ كَثِيرِ بْنِ مُرَّةَ ، أَنَّ عُقْبَةَ بْنَ عَامِرٍ حَدَّثَهُمْ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ الَّذِي يَجْهَرُ بِالْقُرْآنِ كَالَّذِي يَجْهَرُ بِالصَّدَقَةِ ، وَالَّذِي يُسِرُّ بِالْقُرْآنِ كَالَّذِي يُسِرُّ بِالصَّدَقَةِ.

1663. ...Kəsir ibn Murra ﵁ rəvayət edir ki, Uqbə ibn Amir onlara belə demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Quranı səsli oxuyan aşkarda sədəqə verən kimidir. Quranı səssiz oxuyan isə gizli sədəqə verən kimidir”.

٢٥ - بَابُ تَسْوِيَةِ الْقِيَامِ وَالرُّكُوعِ ، وَالْقِيَامِ بَعْدَ الرُّكُوعِ ، وَالسُّجُودِ وَالْجُلُوسِ بَيْنَ السَّجْدَتَيْنِ فِي صَلاَةِ اللَّيْلِ

25-ci fəsil: Gecə namazında qiyamın, rukunun, rukudan sonrakı qiyamın, səcdənin və iki səcdə arasında olan oturuşun vaxtlarının eyni olması

١٦٦٤ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ نُمَيْرٍ ، قَالَ : حَدَّثَنَا الأَعْمَشُ ، عَنْ سَعْدِ بْنِ عُبَيْدَةَ ، عَنِ الْمُسْتَوْرِدِ بْنِ الأَحْنَفِ ، عَنْ صِلَةَ بْنِ زُفَرَ ، عَنْ حُذَيْفَةَ قَالَ : صَلَّيْتُ مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْلَةً فَافْتَتَحَ الْبَقَرَةَ ، فَقُلْتُ : يَرْكَعُ عِنْدَ الْمِائَةِ ، فَمَضَى ، فَقُلْتُ : يَرْكَعُ عِنْدَ الْمِائَتَيْنِ ، فَمَضَى ، فَقُلْتُ : يُصَلِّي بِهَا فِي رَكْعَةٍ ، فَمَضَى ، فَافْتَتَحَ النِّسَاءَ ، فَقَرَأَهَا ، ثُمَّ افْتَتَحَ آلَ عِمْرَانَ فَقَرَأَهَا ، يَقْرَأُ مُتَرَسِّلاً إِذَا مَرَّ بِآيَةٍ فِيهَا تَسْبِيحٌ سَبَّحَ ، وَإِذَا مَرَّ بِسُؤَالٍ سَأَلَ ، وَإِذَا مَرَّ بِ تَعَوُّذٍ تَعَوَّذَ ، ثُمَّ رَكَعَ ، فَقَالَ : سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ ، فَكَانَ رُكُوعُهُ نَحْوًا مِنْ قِيَامِهِ ، ثُمَّ رَفَعَ رَأْسَهُ ، فَقَالَ : سَمِعَ اللَّهُ لِمَنْ حَمِدَهُ فَكَانَ قِيَامُهُ قَرِيبًا مِنْ رُكُوعِهِ ، ثُمَّ سَجَدَ فَجَعَلَ يَقُولُ : سُبْحَانَ رَبِّيَ الأَعْلَى ، فَكَانَ سُجُودُهُ قَرِيبًا مِنْ رُكُوعِهِ.

1664. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə gecə namazını qılırdım. O, namazı əl-Bəqərə surəsi ilə başladı. Mən öz-özümə: “Yüz ayədən sonra ruku edər”- dedim. O, davam etdi. Mən yenə öz-özümə: “İki yüz ayədən sonra ruku edər”- dedim. O, davam etdi. Mən öz-özümə: “əl-Bəqərə” surəsini bir rükətdə oxuyub ruku edər”- dedim. O, yenə davam etdi. Sonra “ən-Nisa” surəsini oxumağa başladı və sona qədər oxudu. Sonra “Ali-İmran” surəsinə başladı və onu da sona

qədər oxudu. Onları aramla oxuyardı. Təsbih ayəsi keçdikdə, Allahı təsbih edərdi.[1] Cənnət ayələri keçdikdə, Allahdan istəyərdi. Əzab ayələri keçdikdə, Allaha sığınardı. Sonra ruku etdi və: "Subhə:nə Rabbiyəl-Azi:m![2]"- dedi. Onun rukusu vaxt baxımından qiyamı qədər idi. Sonra başını qaldırıb: "Səmi Alla:hu limən həmidəh![3]"- dedi. Rukudan sonrakı qiyamı ruku etməsi qədər idi. Sonra səcdə etdi və: "Subhə:nə Rabbiyəl-Ə'lə![4]"- dedi. Səcdəsi də rukusunun müddətinə yaxın müddət qədər idi".

١٦٦٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا النَّضْرُ بْنُ مُحَمَّدٍ الْمَرْوَزِيُّ ثِقَةٌ ، قَالَ : حَدَّثَنَا الْعَلاَءُ بْنُ الْمُسَيَّبِ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ طَلْحَةَ بْنِ يَزِيدَ الأَنْصَارِيِّ ، عَنْ حُذَيْفَةَ ، أَنَّهُ صَلَّى مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي رَمَضَانَ فَرَكَعَ فَقَالَ فِي رُكُوعِهِ : سُبْحَانَ رَبِّيَ الْعَظِيمِ مِثْلَ مَا كَانَ قَائِمًا ، ثُمَّ جَلَسَ يَقُولُ : رَبِّ اغْفِرْ لِي ، رَبِّ اغْفِرْ لِي مِثْلَ مَا كَانَ قَائِمًا ، ثُمَّ سَجَدَ فَقَالَ : سُبْحَانَ رَبِّيَ الأَعْلَى مِثْلَ مَا كَانَ قَائِمًا ، فَمَا صَلَّى إِلاَّ أَرْبَعَ رَكَعَاتٍ ، حَتَّى جَاءَ بِلاَلٌ إِلَى الْغَدَاةِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا الْحَدِيثُ عِنْدِي مُرْسَلٌ ، وَطَلْحَةُ بْنُ يَزِيدَ لاَ أَعْلَمُهُ سَمِعَ مِنْ حُذَيْفَةَ شَيْئًا ، وَغَيْرُ الْعَلاَءِ بْنِ الْمُسَيَّبِ ، قَالَ فِي هَذَا الْحَدِيثِ ، عَنْ طَلْحَةَ ، عَنْ رَجُلٍ ، عَنْ حُذَيْفَةَ.

1665. ...Rəvayət edilir ki, Huzeyfə ﵁ Ramazan ayında Allah Elçisi ﷺ ilə birlikdə namaz qılırdı. Allah Elçisi ﷺ ruku etdi və rukuda qiyamdakı vaxt qədər: "Subhə:nə-Rabbiyəl-Azi:m!"- dedi. Sonra oturdu və qiyamdakı vaxt qədər: "Rabbiğfirli:! Rabbiğfirli:![5]"- dedi. Sonra səcdə etdi və qiyamdakı vaxt qədər: "Subhə:nə-Rabbiyəl-Ə'lə!"- dedi. Beləcə, Bilal gəlib onu Sübh namazına çağırana qədər dörd rükət qıldı".

## ٢٦ - بَابُ كَيْفَ صَلاَةُ اللَّيْلِ

## 26-cı fəsil: Gecə namazı necə qılınır?

١٦٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، وَعَبْدُ الرَّحْمَنِ ، قَالاَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ يَعْلَى بْنِ عَطَاءٍ ، أَنَّهُ سَمِعَ عَلِيًّا الأَزْدِيَّ ، أَنَّهُ سَمِعَ ابْنَ عُمَرَ يُحَدِّثُ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صَلاَةُ اللَّيْلِ وَالنَّهَارِ مَثْنَى مَثْنَى ، أَبُو عَبْدِ الرَّحْمَنِ هَذَا الْحَدِيثُ عِنْدِي خَطَأٌ وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

1666. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Gecə və gündüz qılınan (əlavə) namazlar cüt rükət olaraq qılınır".

---

[1] Yəni Allahın zikr edilməsi, xatırlanması ilə bağlı ayələr keçdikdə zikr edərdi.
[2] Tərcüməsi: Əzəmətli Rəbbim pak və müqəddəsdir!
[3] Tərcüməsi: Allah Ona həmd edəni eşitdi!
[4] Tərcüməsi: Ən Uca Rəbbim pak və müqəddəsdir!
[5] Tərcüməsi: Rəbbim, məni bağışla!

١٦٦٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ حَبِيبٍ ، عَنْ طَاوُوسٍ ، قَالَ : قَالَ ابْنُ عُمَرَ : سَأَلَ رَجُلٌ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ صَلاَةِ اللَّيْلِ ، فَقَالَ : مَثْنَى مَثْنَى ، فَإِذَا خَشِيتَ الصُّبْحَ فَوَاحِدَةٌ.

1667. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Bir kişi Allah Elçisindən ﷺ gecə namazı haqda soruşdu". Peyğəmbər ﷺ dedi: "(Gecə namazı) cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxsan, onları bir rükət ilə tamamla".

١٦٦٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، وَمُحَمَّدُ بْنُ صَدَقَةَ ، قَالاَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : صَلاَةُ اللَّيْلِ مَثْنَى مَثْنَى ، فَإِذَا خِفْتَ الصُّبْحَ فَأَوْتِرْ بِوَاحِدَةٍ.

1668. ...Səlim atasından ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Gecə namazı cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxduqda, onları bir rükət vitr ilə tamamla".

١٦٦٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ ابْنِ أَبِي لَبِيدٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنِ ابْنِ عُمَرَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى الْمِنْبَرِ يُسْأَلُ عَنْ صَلاَةِ اللَّيْلِ ؟ فَقَالَ : مَثْنَى مَثْنَى ، فَإِذَا خِفْتَ الصُّبْحَ فَأَوْتِرْ بِرَكْعَةٍ.

1669. ... Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Allah Elçisinin ﷺ minbərdə olarkən gecə namazı haqda soruşulduğunu eşitdim. Allah Elçisi ﷺ dedi: "(Gecə namazı) cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxduqda, onları bir rükət vitr ilə tamamla".

١٦٧٠ - أَخْبَرَنَا مُوسَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ عَبْدِ اللهِ بْنِ يُونُسَ ، قَالَ : حَدَّثَنَا زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا الْحَسَنُ بْنُ الْحُرِّ ، قَالَ : حَدَّثَنَا نَافِعٌ ، أَنَّ ابْنَ عُمَرَ أَخْبَرَهُمْ ، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ صَلاَةِ اللَّيْلِ ، قَالَ : مَثْنَى مَثْنَى ، فَإِنْ خَشِيَ أَحَدُكُمُ الصُّبْحَ فَلْيُوتِرْ بِوَاحِدَةٍ.

1670. ...İbn Ömər ﷺ rəvayət edir ki, bir kişi Allah Elçisindən ﷺ gecə namazı haqda soruşdu. Allah Elçisi ﷺ dedi: "(Gecə namazı) cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxduqda, onları bir rükət vitr ilə tamamla".

١٦٧١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : صَلاَةُ اللَّيْلِ مَثْنَى مَثْنَى ، فَإِذَا خِفْتَ الصُّبْحَ فَأَوْتِرْ بِوَاحِدَةٍ.

1671. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə dedi: "Gecə namazı cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxduqda, onları bir rükət vitr ilə tamamla".

١٦٧٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ ، عَنْ شُعَيْب ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ ابْنِ عُمَرَ قَالَ : سَأَلَ رَجُلٌ مِنَ الْمُسْلِمِينَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَيْفَ صَلاَةُ اللَّيْلِ ؟ فَقَالَ : صَلاَةُ اللَّيْلِ مَثْنَى مَثْنَى ، فَإِذَا خِفْتَ الصُّبْحَ فَأَوْتِرْ بِوَاحِدَةٍ.

1672. ...Rəvayət edilir ki, İbn Ömər ﵄ demişdir: "Müsəlmanlardan bir kişi Allah Elçisindən ﷺ gecə namazının necə qılınması haqda soruşdu. Allah Elçisi ﷺ dedi: "Gecə namazı cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxduqda, onları bir rükət vitr ilə tamamla".

١٦٧٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا ابْنُ أَخِي ابْنِ شِهَاب ، عَنْ عَمِّهِ ، قَالَ : أَخْبَرَنِي حُمَيْدُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ أَخْبَرَهُ ، أَنَّ رَجُلاً سَأَلَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ صَلاَةِ اللَّيْلِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صَلاَةُ اللَّيْلِ مَثْنَى مَثْنَى ، فَإِذَا خَشِيتَ الصُّبْحَ فَأَوْتِرْ بِوَاحِدَةٍ.

1673. ...İbn Ömər ﵄ rəvayət edir ki, bir kişi Allah Elçisindən ﷺ gecə namazı haqda soruşdu. Allah Elçisi dedi: "Gecə namazı cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxduqda, bir rükət vitr ilə tamamla".

١٦٧٤- أَخْبَرَنَا أَحْمَدُ بْنُ الْهَيْثَمِ ، قَالَ : حَدَّثَنَا حَرْمَلَةُ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ ابْنَ شِهَابٍ حَدَّثَهُ ، أَنَّ سَالِمَ بْنَ عَبْدِ اللهِ ، وَحُمَيْدَ بْنَ عَبْدِ الرَّحْمَنِ حَدَّثَاهُ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ قَالَ : قَامَ رَجُلٌ فَقَالَ : يَا رَسُولَ اللهِ ، كَيْفَ صَلاَةُ اللَّيْلِ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صَلاَةُ اللَّيْلِ مَثْنَى مَثْنَى ، فَإِذَا خِفْتَ الصُّبْحَ فَأَوْتِرْ بِوَاحِدَةٍ.

1674. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər demişdir: "Bir kişi ayağa qalxıb dedi: "Ey Allahın Elçisi, gecə namazı necə qılınır?" Allah Elçisi dedi: "Gecə namazı cüt-cüt qılınan rükətlərdir. Sübh namazının vaxtının girməsindən qorxduqda, onları bir rükət vitr ilə tamamla".

## ٢٧ - بَابُ الأَمْرِ بِالْوِتْرِ

## 27-cı fəsil: Vitr namazının qılınmasının əmr edilməsi

١٦٧٥ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، عَنْ أَبِي بَكْرِ بْنِ عَيَّاشٍ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ عَاصِمٍ وَهُوَ ابْنُ ضَمْرَةَ ، عَنْ عَلِيٍّ رَضِيَ اللَّهُ عَنْهُ قَالَ : أَوْتَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثُمَّ قَالَ : يَا أَهْلَ الْقُرْآنِ ، أَوْتِرُوا ، فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ وِتْرٌ يُحِبُّ الْوِتْرَ.

1805. ...Rəvayət edilir ki, Ummu Həbibə ﵂ demişdir: "Kim gün ərzində fərz namazlarından əlavə on iki rükət namaz qılarsa, onun üçün Cənnətdə bir ev tikilər".

١٨٠٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ حَاتِمٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ مَكِّيٍّ ، وَحِبَّانُ ، قَالاَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ إِسْمَعِيلَ ، عَنِ الْمُسَيَّبِ بْنِ رَافِعٍ ، عَنْ أُمِّ حَبِيبَةَ قَالَتْ : مَنْ صَلَّى فِي يَوْمٍ وَلَيْلَةٍ ثِنْتَيْ عَشْرَةَ رَكْعَةً سِوَى الْمَكْتُوبَةِ بَنَى اللَّهُ عَزَّ وَجَلَّ لَهُ بَيْتًا فِي الْجَنَّةِ لَمْ يَرْفَعْهُ حُصَيْنٌ ، وَأَدْخَلَ بَيْنَ عَنْبَسَةَ ، وَبَيْنَ الْمُسَيَّبِ ، ذَكْوَانَ.

1806. ...Rəvayət edilir ki, Ummu Həbibə ﵂ demişdir: "Kim gündüz və gecə fərz namazlarından əlavə on iki rükət namaz qılarsa, Allah ﷻ onun üçün Cənnətdə bir ev inşa edər".

١٨٠٨ - أَخْبَرَنَا زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا وَهْبٌ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ حُصَيْنٍ ، عَنِ الْمُسَيَّبِ بْنِ رَافِعٍ ، عَنْ أَبِي صَالِحٍ ذَكْوَانَ ، قَالَ : حَدَّثَنِي عَنْبَسَةُ بْنُ أَبِي سُفْيَانَ ، أَنَّ أُمَّ حَبِيبَةَ حَدَّثَتْهُ أَنَّهُ : مَنْ صَلَّى فِي يَوْمٍ ثِنْتَيْ عَشْرَةَ رَكْعَةً بُنِيَ لَهُ بَيْتٌ فِي الْجَنَّةِ.

1807. ...Rəvayət edilir ki, Ummu Həbibə ﵂ demişdir: "Kim gün ərzində on iki rükət namaz qılarsa, onun üçün Cənnətdə bir ev inşa edilər".

١٨٠٨ - أَخْبَرَنَا يَحْيَى بْنُ حَبِيبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ عَاصِمٍ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أُمِّ حَبِيبَةَ قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَلَّى فِي يَوْمٍ ثِنْتَيْ عَشْرَةَ رَكْعَةً سِوَى الْفَرِيضَةِ بَنَى اللَّهُ لَهُ أَوْ بُنِيَ لَهُ بَيْتٌ فِي الْجَنَّةِ.

1808. ...Rəvayət edilir ki, Ummu Həbibə ﵂ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim gün ərzində fərz namazlardan əlavə on iki rükət namaz qılarsa, Allah onun üçün Cənnətdə ev inşa edər və ya onun üçün Cənnətdə ev tikilər".

١٨٠٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ الْمُثَنَّى ، عَنْ سُوَيْدِ بْنِ عَمْرٍو ، قَالَ : حَدَّثَنِي حَمَّادٌ ، عَنْ عَاصِمٍ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أُمِّ حَبِيبَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ صَلَّى ثِنْتَيْ عَشْرَةَ رَكْعَةً فِي يَوْمٍ وَلَيْلَةٍ بَنَى اللَّهُ لَهُ بَيْتًا فِي الْجَنَّةِ.

1809. ...Ummu Həbibə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim gündüz və gecə on iki rükət namaz qılarsa, Allah onun üçün Cənnətdə ev inşa edər".

١٨١٠ - أَخْبَرَنَا زَكَرِيَّا بْنُ يَحْيَى ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ ، قَالَ : حَدَّثَنَا النَّضْرُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ عَاصِمٍ ، عَنْ أَبِي صَالِحٍ ، عَنْ أُمِّ حَبِيبَةَ قَالَتْ : مَنْ صَلَّى فِي يَوْمٍ اثْنَتَيْ عَشْرَةَ رَكْعَةً بُنِيَ لَهُ بَيْتٌ فِي الْجَنَّةِ.

1810. ...Rəvayət edilir ki, Ummu Həbibə ﵂ demişdir: “Kim gün ərzində on iki rükət namaz qılarsa, onun üçün Cənnətdə ev tikilər”.

١٨١١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سُلَيْمَانَ ، عَنْ سُهَيْلِ بْنِ أَبِي صَالِحٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ صَلَّى فِي يَوْمٍ ثِنْتَيْ عَشْرَةَ رَكْعَةً سِوَى الْفَرِيضَةِ بَنَى اللَّهُ لَهُ بَيْتًا فِي الْجَنَّةِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا خَطَأٌ ، وَمُحَمَّدُ بْنُ سُلَيْمَانَ ضَعِيفٌ ، هُوَ ابْنُ الأَصْبَهَانِيِّ ، وَقَدْ رُوِيَ هَذَا الْحَدِيثُ مِنْ أَوْجُهٍ سِوَى هَذَا الْوَجْهِ بِغَيْرِ اللَّفْظِ الَّذِي تَقَدَّمَ ذِكْرُهُ.

1811. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Kim gün ərzində fərz namazlarından əlavə on iki rükət namaz qılarsa, Allah onun üçün Cənnətdə ev inşa edər”.

١٨١٢ - أَخْبَرَنِي يَزِيدُ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الصَّمَدِ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ الْعَطَّارُ ، قَالَ : حَدَّثَنِي إِسْمَعِيلُ بْنُ عَبْدِ اللهِ بْنِ سَمَاعَةَ ، عَنْ مُوسَى بْنِ أَعْيَنَ ، عَنْ أَبِي عَمْرٍو الأَوْزَاعِيِّ ، عَنْ حَسَّانَ بْنِ عَطِيَّةَ ، قَالَ : لَمَّا نُزِلَ بِعَنْبَسَةَ جَعَلَ يَتَضَوَّرُ ، فَقِيلَ لَهُ ، فَقَالَ : أَمَا إِنِّي سَمِعْتُ أُمَّ حَبِيبَةَ زَوْجَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ تُحَدِّثُ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ قَالَ : مَنْ رَكَعَ أَرْبَعَ رَكَعَاتٍ قَبْلَ الظُّهْرِ وَأَرْبَعًا بَعْدَهَا حَرَّمَ اللَّهُ عَزَّ وَجَلَّ لَحْمَهُ عَلَى النَّارِ ، فَمَا تَرَكْتُهُنَّ مُنْذُ سَمِعْتُهُنَّ.

1812. ...Rəvayət edilir ki, Həssən ibn Atiyyə ﵀ demişdir: “Anbəsənin halı pisləşdikdə və ağrıdan qıvrıldıqda, dedi: “O ki qaldı mənə, mən Peyğəmbərin ﷺ zövcəsi Ummu Həbibənin belə dediyini eşitmişəm: “Peyğəmbər ﷺ belə buyurdu: “Kim Zöhr namazından qabaq dörd və sonra dörd rükət namaz qılarsa, Allah ﷻ Cəhənnəmi ona haram edər”. Mən də Peyğəmbərdən ﷺ eşidəndən bəri bu namazları tərk etməmişəm”.

١٨١٣ - أَخْبَرَنَا هِلَالُ بْنُ الْعَلَاءِ بْنِ هِلَالٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، عَنْ زَيْدِ بْنِ أَبِي أُنَيْسَةَ ، قَالَ : حَدَّثَنِي أَيُّوبُ ، رَجُلٌ مِنْ أَهْلِ الشَّامِ ، عَنِ الْقَاسِمِ الدِّمَشْقِيِّ ، عَنْ عَنْبَسَةَ بْنِ أَبِي سُفْيَانَ ، قَالَ : أَخْبَرَتْنِي أُخْتِي أُمُّ حَبِيبَةَ زَوْجُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ حَبِيبَهَا أَبَا الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَخْبَرَهَا ، قَالَ : مَا مِنْ عَبْدٍ مُؤْمِنٍ يُصَلِّي أَرْبَعَ رَكَعَاتٍ بَعْدَ الظُّهْرِ فَتَمَسُّ وَجْهَهُ النَّارُ أَبَدًا إِنْ شَاءَ اللَّهُ عَزَّ وَجَلَّ.

1813. ...Rəvayət edilir ki, Anbəsə ibn Əbu Sufyan ﵀ demişdir: “Peyğəmbərin ﷺ zövcəsi və bacım Ummu Həbibəyə sevimlisi Əbul-Qasim ﷺ belə dedi: “Hər hansı bir mömin bəndə Zöhr namazından sonra dörd rükət namaz qılarsa, Allahın ﷻ izni ilə Cəhənnəm odu onun üzünə əbədiyyən toxunmaz”.

١٨١٤ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ نَاصِحٍ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ بْنُ مُحَمَّدٍ ، عَنْ سَعِيدِ بْنِ عَبْدِ الْعَزِيزِ ، عَنْ سُلَيْمَانَ بْنِ مُوسَى ، عَنْ

مَكْحُول ، عَنْ عَنْبَسَةَ بْنِ أَبِي سُفْيَانَ ، عَنْ أُمِّ حَبِيبَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَقُولُ : مَنْ صَلَّى أَرْبَعَ رَكَعَاتٍ قَبْلَ الظُّهْرِ وَأَرْبَعًا بَعْدَهَا حَرَّمَهُ اللَّهُ عَزَّ وَجَلَّ عَلَى النَّارِ.

1814. ...Ummu Həbibə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim Zöhr namazından qabaq dörd və sonra dörd rükət namaz qılarsa, Allah ﷻ Cəhənnəmi ona haram edər".

١٨١٥ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ خَالِدٍ ، عَنْ مَرْوَانَ بْنِ مُحَمَّدٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَبْدِ الْعَزِيزِ ، عَنْ سُلَيْمَانَ بْنِ مُوسَى ، عَنْ مَكْحُولٍ ، عَنْ عَنْبَسَةَ بْنِ أَبِي سُفْيَانَ ، عَنْ أُمِّ حَبِيبَةَ ـــ قَال مَرْوَانُ : وَكَانَ سَعِيدٌ إِذَا قُرِئَ عَلَيْهِ ، عَنْ أُمِّ حَبِيبَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَقَرَّ بذَلِكَ وَلَمْ يُنْكِرْهُ ، وَإِذَا حَدَّثَنَا بِهِ هُوَ لَمْ يَرْفَعْهُ ـــ قَالَتْ : مَنْ رَكَعَ أَرْبَعَ رَكَعَاتٍ قَبْلَ الظُّهْرِ وَأَرْبَعًا بَعْدَهَا حَرَّمَهُ اللَّهُ عَلَى النَّارِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مَكْحُولٌ لَمْ يَسْمَعْ مِنْ عَنْبَسَةَ شَيْئًا.

1815. ...Ummu Həbibə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim Zöhr namazından qabaq dörd və sonra dörd rükət namaz qılarsa, Allah Cəhənnəmi ona haram edər".

١٨١٦ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا أَبُو عَاصِمٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عَبْدِ الْعَزِيزِ ، قَالَ : سَمِعْتُ سُلَيْمَانَ بْنَ مُوسَى يُحَدِّثُ ، عَنْ مُحَمَّدِ بْنِ أَبِي سُفْيَانَ ، قَالَ : لَمَّا نَزَلَ بِهِ الْمَوْتُ أَخَذَهُ أَمْرٌ شَدِيدٌ ، فَقَالَ : حَدَّثَتْنِي أُخْتِي أُمُّ حَبِيبَةَ بِنْتُ أَبِي سُفْيَانَ ، قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ حَافَظَ عَلَى أَرْبَعِ رَكَعَاتٍ قَبْلَ الظُّهْرِ وَأَرْبَعٍ بَعْدَهَا حَرَّمَهُ اللَّهُ تَعَالَى عَلَى النَّارِ.

1816. ...Rəvayət edilir ki, Muhəmməd ibn Əbu Sufyana ﷺ ölüm ayağında olan şiddətli əziyyət üz verdikdə, o dedi: "Bacım Ummu Həbibə bint Əbu Sufyan belə demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Zöhr namazından qabaq dörd və sonra dörd rükət namazı qoruyarsa (daim qılarsa), Uca Allah Cəhənnəmi ona haram edər".

١٨١٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو قُتَيْبَةَ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ الشُّعَيْثِيُّ ، عَنْ أَبِيهِ ، عَنْ عَنْبَسَةَ بْنِ أَبِي سُفْيَانَ ، عَنْ أُمِّ حَبِيبَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ صَلَّى أَرْبَعًا قَبْلَ الظُّهْرِ وَأَرْبَعًا بَعْدَهَا لَمْ تَمَسَّهُ النَّارُ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا خَطَأٌ ، وَالصَّوَابُ حَدِيثُ مَرْوَانَ مِنْ حَدِيثِ سَعِيدِ بْنِ عَبْدِ الْعَزِيزِ.

1817. ...Ummu Həbibə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim Zöhr namazından qabaq dörd və sonra dörd rükət namaz qılarsa, ona Cəhənnəm odu toxunmaz".

## ٢١ - كِتَابُ الْجَنَائِزِ
## 21. Cənazələr kitabı

### ١ - بَابُ تَمَنِّي الْمَوْتِ
### 1-ci fəsil: Ölümü istəmək

١٨١٨ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، حَدَّثَنَا مَعْنٌ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ بْنُ سَعْدٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَتَمَنَّيَنَّ أَحَدٌ مِنْكُمُ الْمَوْتَ ، إِمَّا مُحْسِنًا فَلَعَلَّهُ أَنْ يَزْدَادَ خَيْرًا ، وَإِمَّا مُسِيئًا فَلَعَلَّهُ أَنْ يَسْتَعْتِبَ.

1818. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Heç biriniz özünə ölüm istəməsin! Əgər o, yaxşı adamdırsa, xeyir əməllərini çoxaltması ümid edilir. Əgər pis adamdırsa, ümid edilir ki, tövbə edib Allahı razı salsın".

١٨١٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، قَالَ : حَدَّثَنِي الزُّبَيْدِيُّ ، قَالَ : حَدَّثَنِي الزُّهْرِيُّ ، عَنْ أَبِي عُبَيْدٍ ، مَوْلَى عَبْدِ الرَّحْمَنِ بْنِ عَوْفٍ ، أَنَّهُ سَمِعَ أَبَا هُرَيْرَةَ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ يَتَمَنَّيَنَّ أَحَدُكُمُ الْمَوْتَ ، إِمَّا مُحْسِنًا فَلَعَلَّهُ أَنْ يَعِيشَ يَزْدَادُ خَيْرًا وَهُوَ خَيْرٌ لَهُ ، وَإِمَّا مُسِيئًا فَلَعَلَّهُ أَنْ يَسْتَعْتِبَ.

1819. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Heç biriniz özünə ölüm istəməsin! Əgər o, yaxşı adamdırsa, ümid edilir ki, o yaşaya, xeyir əməllərini artıra və bu onun üçün daha xeyirli ola. Əgər pis adamdırsa, ümid edilir ki, tövbə edib Allahı razı salsın".

١٨٢٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَتَمَنَّيَنَّ أَحَدُكُمُ الْمَوْتَ لِضُرٍّ نَزَلَ بِهِ فِي الدُّنْيَا ، وَلَكِنْ لِيَقُلِ : اللَّهُمَّ أَحْيِنِي مَا كَانَتِ الْحَيَاةُ خَيْرًا لِي ، وَتَوَفَّنِي إِذَا كَانَتِ الْوَفَاةُ خَيْرًا لِي.

1820. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Heç biriniz dünya sıxıntılarına görə özünə ölüm diləməsin və belə desin: "Allahım, bu həyatda yaşamağım mənim üçün xeyirlidirsə, məni yaşat, ölümüm mənim üçün xeyirlidirsə, məni öldür!"[1]

[1] Transkripsiyası: Alla:hummə, əhyini: mə: kə:nətil-həyə:tu xayran li: və təvaffəni: izə: kə:nətil-vafə:tu xayran li:!

١٨٢١ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ابْنُ عُلَيَّةَ ، عَنْ عَبْدِ الْعَزِيزِ وَأَنْبَأَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ ، عَنْ أَنَسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَلاَ لاَ يَتَمَنَّى أَحَدُكُمُ الْمَوْتَ لِضُرٍّ نَزَلَ بِهِ ، فَإِنْ كَانَ لاَ بُدَّ مُتَمَنِّيًا الْمَوْتَ فَلْيَقُلِ : اللَّهُمَّ أَحْيِنِي مَا كَانَتِ الْحَيَاةُ خَيْرًا لِي ، وَتَوَفَّنِي مَا كَانَتِ الْوَفَاةُ خَيْرًا لِي.

1821. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Heç biriniz dünya sıxıntılarına görə özünə ölüm diləməsin və əgər ölüm diləməkdən başqa yolu qalmasa, qoy desin: “Allahım, bu həyatda yaşamağım mənim üçün xeyirlidirsə, məni yaşat, ölümüm mənim üçün xeyirlidirsə, məni öldür!”[1]

## ٢ - الدُّعَاءُ بِالْمَوْتِ

## 2-ci fəsil: Ölmək üçün dua etmək

١٨٢٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ حَفْصِ بْنِ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : حَدَّثَنِي إِبْرَاهِيمُ بْنُ طَهْمَانَ ، عَنِ الْحَجَّاجِ وَهُوَ الْبَصْرِيُّ ، عَنْ يُونُسَ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَدْعُوا بِالْمَوْتِ وَلاَ تَتَمَنَّوْهُ ، فَمَنْ كَانَ دَاعِيًا لاَ بُدَّ فَلْيَقُلِ : اللَّهُمَّ أَحْيِنِي مَا كَانَتِ الْحَيَاةُ خَيْرًا لِي ، وَتَوَفَّنِي إِذَا كَانَتِ الْوَفَاةُ خَيْرًا لِي.

1822. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ölmək üçün dua etməyin və özünüzə ölüm diləməyin! Kim dua edirsə, qoy belə desin: “Allahım, bu həyatda yaşamağım mənim üçün xeyirlidirsə, məni yaşat, ölümüm mənim üçün xeyirlidirsə, məni öldür!”[2]

١٨٢٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنِي قَيْسٌ ، قَالَ : دَخَلْتُ عَلَى خَبَّابٍ وَقَدْ اكْتَوَى فِي بَطْنِهِ سَبْعًا وَقَالَ : لَوْلاَ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَهَانَا أَنْ نَدْعُوَ بِالْمَوْتِ دَعَوْتُ بِهِ.

1823. ...Rəvayət edilir ki, Qeys ﷺ demişdir: “Xəstələndiyi zaman Xabbabın yanına gəlmişdim. O, qarnına yeddi dəfə dağ basmışdı. Xabbab dedi: “Əgər Allah Elçisi ﷺ ölüm diləməyi qadağan etməsəydi, mən özüm üçün ölüm istəyərdim”.

---

[1] Transkripsiyası: Alla:hummə, əhyini: mə: kə:nətil-həyə:tu xayran li: və təvaffəni: mə: kə:nətil-vafə:tu xayran li:!

[2] Transkripsiyası: Alla:hummə, əhyini: mə: kə:nətil-həyə:tu xayran li: və təvaffəni: izə: kə:nətil-vafə:tu xayran li:!

## ٣ - كَثْرَةُ ذِكْرِ الْمَوْتِ
## 3-cü fəsil: Ölümü çox yad etmək

١٨٢٤ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : أَنْبَأَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو (ح) وأَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : أَنْبَأَنَا مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرٍو ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَكْثِرُوا ذِكْرَ هَاذِمِ اللَّذَّاتِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : مُحَمَّدُ بْنُ إِبْرَاهِيمَ وَالِدُ أَبِي بَكْرِ بْنِ أَبِي شَيْبَةَ.

1824. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ləzzətləri yox edən ölümü çox yad edin!”

١٨٢٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، عَنْ يَحْيَى ، عَنِ الأَعْمَشِ ، قَالَ : حَدَّثَنِي شَقِيقٌ ، عَنْ أُمِّ سَلَمَةَ قَالَتْ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا حَضَرْتُمُ الْمَرِيضَ فَقُولُوا خَيْرًا ، فَإِنَّ الْمَلاَئِكَةَ يُؤَمِّنُونَ عَلَى مَا تَقُولُونَ ، فَلَمَّا مَاتَ أَبُو سَلَمَةَ ، قُلْتُ : يَا رَسُولَ اللهِ ، كَيْفَ أَقُولُ ؟ قَالَ : قُولِي اللَّهُمَّ اغْفِرْ لَنَا وَلَهُ ، وَأَعْقِبْنِي مِنْهُ عُقْبَى حَسَنَةً ، فَأَعْقَبَنِي اللَّهُ عَزَّ وَجَلَّ مِنْهُ مُحَمَّدًا صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1825. ...Rəvayət edilir ki, Ummu Sələmə ﵂ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitdim: “Xəstənin yanında olduqda xeyir dua edin, çünki mələklər sizin dediklərinizə “Amin” deyirlər”. Əbu Sələmə vəfat etdikdə mən dedim: “Ey Allahın Elçisi, necə dua edim?” O buyurdu: “Allahım, bizi və onu bağışla! Onun əvəzində mənə daha xeyirlisini ver!” Allah ﷻ da mənə Muhəmmədi ﷺ verdi”.

## ٤ - بَابُ تَلْقِينِ الْمَيِّتِ
## 4-cü fəsil: Ölüm ayağında olana təlqin etmək

١٨٢٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا عُمَارَةُ بْنُ غَزِيَّةَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ عُمَارَةَ ، قَالَ : سَمِعْتُ أَبَا سَعِيدٍ (ح) وَأَنْبَأَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ ، عَنْ عُمَارَةَ بْنِ غَزِيَّةَ ، عَنْ يَحْيَى بْنِ عُمَارَةَ ، عَنْ أَبِي سَعِيدٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَقِّنُوا مَوْتَاكُمْ لاَ إِلَهَ إِلاَّ اللَّهُ.

1826. ...Rəvayət edilir ki, Əbu Səid ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Ölüm ayağında olanlarınıza “Lə iləhə illəllah” (kəlməsini deməyi) təlqin edin!”

١٨٢٧ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنِي أَحْمَدُ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، قَالَ : حَدَّثَنَا مَنْصُورُ ابْنُ صَفِيَّةَ ، عَنْ أُمِّهِ صَفِيَّةَ بِنْتِ شَيْبَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَقِّنُوا هَلْكَاكُمْ قَوْلَ لاَ إِلَهَ إِلاَّ اللَّهُ.

1827. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Ölüm ayağında olanlarınıza “Lə iləhə illəllah” (kəlməsini deməyi) təlqin edin!”

٥ - بَابُ عَلاَمَةِ مَوْتِ الْمُؤْمِنِ

5-ci fəsil: Mömininin ölümünün əlaməti

١٨٢٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ الْمُثَنَّى بْنِ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَوْتُ الْمُؤْمِنِ بِعَرَقِ الْجَبِينِ.

1828. ...Abdullah ibn Bureydə atasından ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Mömininin ölümü alnındakı tər ilə olur”.

١٨٢٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْمَرٍ ، قَالَ : حَدَّثَنَا يُوسُفُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا كَهْمَسٌ ، عَنِ ابْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : الْمُؤْمِنُ يَمُوتُ بِعَرَقِ الْجَبِينِ.

1829. ...İbn Bureydə atasının ﵁ belə dediyini rəvayət etmişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Mömininin ölümü alnı tərləyərək olur”.

٦ - شِدَّةُ الْمَوْتِ

6-cı fəsil: Ölümün dəhşəti

١٨٣٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنِي اللَّيْثُ ، قَالَ : حَدَّثَنِي ابْنُ الْهَادِ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ الْقَاسِمِ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : مَاتَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَإِنَّهُ لَبَيْنَ حَاقِنَتِي وَذَاقِنَتِي ، فَلاَ أَكْرَهُ شِدَّةَ الْمَوْتِ لأَحَدٍ أَبَدًا بَعْدَ مَا رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1830. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ başı çənəm ilə sinəm arasında olarkən vəfat etmişdir. Buna görə mən Allah Elçisinin ﷺ vəfatının çətinliyini gördükdən sonra, artıq heç kimin çətinliklə ölməsinə pis olmuram”.

٧ - الْمَوْتُ يَوْمَ الاِثْنَيْنِ

7-ci fəsil: Bazar ertəsi vəfat etmək

١٨٣١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَنَسٍ قَالَ : آخِرُ نَظْرَةٍ نَظَرْتُهَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَشْفُ السِّتَارَةِ وَالنَّاسُ صُفُوفٌ خَلْفَ أَبِي بَكْرٍ رَضِيَ اللَّهُ عَنْهُ ، فَأَرَادَ أَبُو بَكْرٍ أَنْ يَرْتَدَّ ، فَأَشَارَ إِلَيْهِمْ أَنِ امْكُثُوا وَأَلْقَى السِّجْفَ ، وَتُوُفِّيَ مِنْ آخِرِ ذَلِكَ الْيَوْمِ ، وَذَلِكَ يَوْمُ الاِثْنَيْنِ.

1831. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: “Mənim Allah Elçisinə ﷺ son baxışım pərdənin açılışı ilə bağlanışı zamanı qədər idi. İnsanlar Əbu Bəkrin arxasında namaz qılmaq üçün səf tutmuşdular. (Pərdə açıldıqda) Əbu Bəkr Allah Elçisinin ﷺ namaza gələcəyini zənn edərək geri çəkildi. Peyğəmbər ﷺ isə ona yerində qalmasını işarə etdi və pərdəni endirdi. Peyğəmbər ﷺ həmin günün sonunda vəfat etdi. O gün bazar ertəsi idi”.

## ٨ - الْمَوْتُ بِغَيْرِ مَوْلِدِهِ
## 8-ci fəsil: Doğulduğu yerdən başqa bir yerdə vəfat etmək

١٨٣٢ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي حُيَيُّ بْنُ عَبْدِ اللهِ ، عَنْ أَبِي عَبْدِ الرَّحْمَنِ الْحُبُلِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو قَالَ : مَاتَ رَجُلٌ بِالْمَدِينَةِ مِمَّنْ وُلِدَ بِهَا ، فَصَلَّى عَلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثُمَّ قَالَ : يَا لَيْتَهُ مَاتَ بِغَيْرِ مَوْلِدِهِ ، قَالُوا : وَلِمَ ذَاكَ يَا رَسُولَ اللهِ ؟ قَالَ : إِنَّ الرَّجُلَ إِذَا مَاتَ بِغَيْرِ مَوْلِدِهِ قِيسَ لَهُ مِنْ مَوْلِدِهِ إِلَى مُنْقَطَعِ أَثَرِهِ فِي الْجَنَّةِ.

1832. ...Rəvayət edilir ki, Abdullah ibn Amr رضي الله عنهما demişdir: “Bir kişi Mədinədə doğulmuşdu və orada da vəfat etdi. Allah Elçisi ﷺ onun üçün cənazə namazını qıldı, sonra da dedi: “Kaş bu adam doğulduğu yerdən başqa bir yerdə vəfat edərdi”. Səhabələr dedilər: “Nəyə görə, ey Allahın Elçisi?!” Allah Elçisi ﷺ buyurdu: “Həqiqətən, adam doğulduğu yerdən başqa bir yerdə vəfat edərsə, ona Cənnətdə doğulduğu yer ilə vəfat etdiyi yer arasındakı məsafə qədər yer verilir”.

## ٩ - بَابُ مَا يُلْقَى بِهِ الْمُؤْمِنُ مِنَ الْكَرَامَةِ عِنْدَ خُرُوجِ نَفْسِهِ
## 9-ci fəsil: Möminin ruhu bədənindən çıxdıqda ona verilən kəramət

١٨٣٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا مُعَاذُ بْنُ هِشَامٍ ، قَالَ : حَدَّثَنِي أَبِي ، عَنْ قَتَادَةَ ، عَنْ قَسَامَةَ بْنِ زُهَيْرٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا حُضِرَ الْمُؤْمِنُ أَتَتْهُ مَلاَئِكَةُ الرَّحْمَةِ بِحَرِيرَةٍ بَيْضَاءَ فَيَقُولُونَ : اخْرُجِي رَاضِيَةً مَرْضِيًّا عَنْكِ إِلَى رَوْحِ اللهِ ، وَرَيْحَانٍ ، وَرَبٍّ غَيْرِ غَضْبَانَ ، فَتَخْرُجُ كَأَطْيَبِ رِيحِ الْمِسْكِ ، حَتَّى أَنَّهُ لَيُنَاوِلُهُ بَعْضُهُمْ بَعْضًا ، حَتَّى يَأْتُونَ بِهِ بَابَ السَّمَاءِ فَيَقُولُونَ : مَا أَطْيَبَ هَذِهِ الرِّيحَ الَّتِي جَاءَتْكُمْ مِنَ الأَرْضِ ، فَيَأْتُونَ بِهِ أَرْوَاحَ الْمُؤْمِنِينَ فَلَهُمْ أَشَدُّ فَرَحًا بِهِ مِنْ أَحَدِكُمْ بِغَائِبِهِ يَقْدَمُ عَلَيْهِ ، فَيَسْأَلُونَهُ : مَاذَا فَعَلَ فُلاَنٌ ؟ مَاذَا فَعَلَ فُلاَنٌ ؟ فَيَقُولُونَ : دَعُوهُ فَإِنَّهُ كَانَ فِي غَمِّ الدُّنْيَا ، فَإِذَا قَالَ : أَمَا أَتَاكُمْ ؟ قَالُوا : ذُهِبَ بِهِ إِلَى أُمِّهِ الْهَاوِيَةِ ، وَإِنَّ الْكَافِرَ إِذَا احْتُضِرَ أَتَتْهُ مَلاَئِكَةُ الْعَذَابِ بِمِسْحٍ فَيَقُولُونَ : اخْرُجِي سَاخِطَةً مَسْخُوطًا عَلَيْكِ إِلَى عَذَابِ اللهِ عَزَّ وَجَلَّ ، فَتَخْرُجُ كَأَنْتَنِ رِيحِ جِيفَةٍ ، حَتَّى يَأْتُونَ بِهِ بَابَ الأَرْضِ ، فَيَقُولُونَ : مَا أَنْتَنَ هَذِهِ الرِّيحَ حَتَّى يَأْتُونَ بِهِ أَرْوَاحَ الْكُفَّارِ.

1833. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Möminə ölüm anı gəldikdə, rəhmət mələkləri ağ ipək libaslarda gəlib (möminə) deyirlər: "Sən Rəbbindən razı, O da səndən razı olaraq, sənə qarşı qəzəbli olmayan Rəbbinin rəhməti ilə çıx!" Mömininin ruhu bədənindən ən gözəl müşk qoxusu kimi çıxır. Sonra mələklər bu ruhu bir-birinə ötürərək səmanın qapısına gətirib deyirlər: "Sizinlə yerdən gələn bu gözəl qoxu nədir?" Sonra onu digər möminlərin ruhlarının yanına gətirirlər. Möminlərin ruhları gətirilən mömininin ruhuna, birinizin itirdiyini tapdıqda sevindiyindən daha çox sevinir və ondan soruşurlar: "Filankəs necədir? Filankəs necədir?" Digərləri deyirlər: "Onu dinc qoyun! O, kədərli dünyadan gəlib". Yeni gələn ruh deyir: "Həmin adam sizin yanınıza gəlməyibmi?" Ona deyirlər: "(Yəqin) onu anası Haviyəyə (Cəhənnəmə) aparıblar". Kafirin ölüm anında əzab mələkləri özləri ilə cod parça gətirib deyirlər: "Allah ﷻ sənə qarşı qəzəbləndiyi halda çıx!" Kafirin ruhu da ən pis qoxu kimi çıxır. Mələklər onu yerin qapılarına gətirib: "Bu, necə də pis qoxudur"- deyib kafirlərin ruhlarının yanına aparırlar".

## ١٠ - فِيمَنْ أَحَبَّ لِقَاءَ اللَّهِ

## 10-cu fəsil: Allahla qarşılaşmağı sevmək

١٨٣٤ - أَخْبَرَنَا هَنَّادٌ ، عَنْ أَبِي زُبَيْدٍ وَهُوَ عَبْثَرُ بْنُ الْقَاسِمِ ، عَنْ مُطَرِّفٍ ، عَنْ عَامِرٍ ، عَنْ شُرَيْحِ بْنِ هَانِئٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَحَبَّ لِقَاءَ اللهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ ، وَمَنْ كَرِهَ لِقَاءَ اللهِ كَرِهَ اللَّهُ لِقَاءَهُ ، قَالَ شُرَيْحٌ : فَأَتَيْتُ عَائِشَةَ ، فَقُلْتُ : يَا أُمَّ الْمُؤْمِنِينَ ، سَمِعْتُ أَبَا هُرَيْرَةَ يَذْكُرُ عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَدِيثًا إِنْ كَانَ كَذَلِكَ فَقَدْ هَلَكْنَا ، قَالَتْ : وَمَا ذَاكَ ؟ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَحَبَّ لِقَاءَ اللهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ ، وَمَنْ كَرِهَ لِقَاءَ اللهِ كَرِهَ اللَّهُ لِقَاءَهُ ، وَلَكِنْ لَيْسَ مِنَّا أَحَدٌ إِلاَّ وَهُوَ يَكْرَهُ الْمَوْتَ ، قَالَتْ : قَدْ قَالَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَلَيْسَ بِالَّذِي تَذْهَبُ إِلَيْهِ ، وَلَكِنْ إِذَا طَمَحَ الْبَصَرُ ، وَحَشْرَجَ الصَّدْرُ ، وَاقْشَعَرَّ الْجِلْدُ فَعِنْدَ ذَلِكَ مَنْ أَحَبَّ لِقَاءَ اللهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ ، وَمَنْ كَرِهَ لِقَاءَ اللهِ كَرِهَ اللَّهُ لِقَاءَهُ.

1834. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər. Kim də Allahla qarşılaşmaq istəməsə, Allah da onunla qarşılaşmaq istəməz". Şureyh deyir: "Mən Aişənin yanına gəlib ona dedim: "Ey möminlərin anası! Mən Əbu Hureyranın Allah Elçisindən ﷺ rəvayət etdiyi bir hədis eşitdim. Əgər onun söylədiyi kimidirsə, biz məhv olduq". Aişə dedi: "O nədir?" (Mən dedim:) Allah Elçisi ﷺ belə buyurmuşdur: "Kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər. Kim də

Allahla qarşılaşmaq istəməsə, Allah da onunla qarşılaşmaq istəməz". Amma bizim içimizdə ölümdən xoşlanan adam varmı?!" Aişə dedi: "Məsələ sənin anladığın kimi deyil. Allah Elçisi ﷺ belə demək istəmişdir: "İş orasındadır ki, ölüm yetişdiyi zaman göz bir yerə dikilib baxdıqda, sinə enib-qalxmağa başladıqda və o anın dəhşətindən dərilər tikan-tikan olduqda kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər, kim də Allahla qarşılaşmaq istəməsə, Allah da onunla qarşılaşmaq istəməz".

١٨٣٥ - قَالَ الْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنْ ابْنِ الْقَاسِمِ ، حَدَّثَنِي مَالِكٌ (ح) وَأَنْبَأَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا الْمُغِيرَةُ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : قَالَ اللَّهُ تَعَالَى : إِذَا أَحَبَّ عَبْدِي لِقَائِي أَحْبَبْتُ لِقَاءَهُ ، وَإِذَا كَرِهَ لِقَائِي كَرِهْتُ لِقَاءَهُ.

1835. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Uca Allah buyurdu: "Qulum Mənimlə qarşılaşmaq istəyərsə, Mən də onunla qarşılaşmaq istəyərəm. Əgər o, Mənimlə qarşılaşmaq istəməzsə, Mən də onunla qarşılaşmaq istəmərəm".

١٨٣٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، قَالَ : سَمِعْتُ أَنَسًا يُحَدِّثُ ، عَنْ عُبَادَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَحَبَّ لِقَاءَ اللهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ ، وَمَنْ كَرِهَ لِقَاءَ اللهِ كَرِهَ اللَّهُ لِقَاءَهُ.

1836. ...Ubadə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər. Kim də Allahla qarşılaşmaq istəməsə, Allah da onunla qarşılaşmaq istəməz".

١٨٣٧ - أَخْبَرَنَا أَبُو الأَشْعَثِ ، قَالَ : حَدَّثَنَا الْمُعْتَمِرُ ، قَالَ : سَمِعْتُ أَبِي يُحَدِّثُ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسِ بْنِ مَالِكٍ ، عَنْ عُبَادَةَ بْنِ الصَّامِتِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ أَحَبَّ لِقَاءَ اللهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ ، وَمَنْ كَرِهَ لِقَاءَ اللهِ كَرِهَ اللَّهُ لِقَاءَهُ.

1837. ...Rəvayət edilir ki, Ubadə ibn əs-Samit ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər. Kim də Allahla qarşılaşmaq istəməsə, Allah da onunla qarşılaşmaq istəməz".

١٨٣٨ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ (ح) وأَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ خَالِدِ بْنِ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، عَنْ قَتَادَةَ ، عَنْ زُرَارَةَ ، عَنْ سَعْدِ بْنِ هِشَامٍ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ أَحَبَّ لِقَاءَ اللهِ أَحَبَّ اللَّهُ لِقَاءَهُ ، وَمَنْ كَرِهَ لِقَاءَ اللهِ كَرِهَ اللَّهُ لِقَاءَهُ زَادَ عَمْرٌو فِي حَدِيثِهِ ، فَقِيلَ : يَا رَسُولَ اللهِ ، كَرَاهِيَةُ لِقَاءِ

اللهِ كَرَاهِيَةُ الْمَوْتِ ، كُلُّنَا نَكْرَهُ الْمَوْتَ ، قَالَ : ذَاكَ عِنْدَ مَوْتِهِ ، إِذَا بُشِّرَ بِرَحْمَةِ اللهِ وَمَغْفِرَتِهِ أَحَبَّ لِقَاءَ اللهِ وَأَحَبَّ اللَّهُ لِقَاءَهُ ، وَإِذَا بُشِّرَ بِعَذَابِ اللهِ كَرِهَ لِقَاءَ اللهِ وَكَرِهَ اللَّهُ لِقَاءَهُ.

1838. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Kim Allahla qarşılaşmaq istəsə, Allah da onunla qarşılaşmaq istəyər. Kim də Allahla qarşılaşmaq istəməsə, Allah da onunla qarşılaşmaq istəməz”. Amrın hədisində bu əlavə var: “Ona deyildi: “Ey Allahın Elçisi, Allahla qarşılaşmağı istəməmək, ölümü istəməməkdir. Heç birimiz də ölümü istəmirik”. Allah Elçisi ﷺ dedi: “Bu, ölüm anında olan haldır. Kim ölüm anında Allahın rəhməti və bağışlanması ilə müjdələnərsə, Allahla qarşılaşmaq istəyər, Allah da onunla qarşılaşmaq istəyər. Kim də Allahın əzabı ilə müjdələnərsə, Allahla qarşılaşmaq istəməz, Allah da onunla qarşılaşmaq istəməz”.

## ١١ - تَقْبِيلُ الْمَيِّتِ
## 11-ci fəsil: Ölən adamı öpmək

١٨٣٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرٍو ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ أَبَا بَكْرٍ ، قَبَّلَ بَيْنَ عَيْنَيِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مَيِّتٌ.

1839. ...Aişə ﵅ rəvayət edir ki, Peyğəmbər ﷺ vəfat etdikdə, Əbu Bəkr onu iki gözünün arasından (alnından) öpmüşdü.

١٨٤٠ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالاَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنِي مُوسَى بْنُ أَبِي عَائِشَةَ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنِ ابْنِ عَبَّاسٍ ، وَعَنْ عَائِشَةَ ، أَنَّ أَبَا بَكْرٍ قَبَّلَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَهُوَ مَيِّتٌ.

1840. ...İbn Abbas və Aişədən ﵄ rəvayət edirlər ki, Peyğəmbər ﷺ vəfat etdikdə, Əbu Bəkr onu öpmüşdü.

١٨٤١ - أَخْبَرَنَا سُوَيْدٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، قَالَ : قَالَ مَعْمَرٌ ، وَيُونُسُ ، قَالَ الزُّهْرِيُّ ، وَأَخْبَرَنِي أَبُو سَلَمَةَ ، أَنَّ عَائِشَةَ أَخْبَرَتْهُ ، أَنَّ أَبَا بَكْرٍ أَقْبَلَ عَلَى فَرَسٍ مِنْ مَسْكَنِهِ بِالسُّنْحِ حَتَّى نَزَلَ ، فَدَخَلَ الْمَسْجِدَ فَلَمْ يُكَلِّمِ النَّاسَ حَتَّى دَخَلَ عَلَى عَائِشَةَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُسَجًّى بِبُرْدٍ حِبَرَةٍ فَكَشَفَ عَنْ وَجْهِهِ ، ثُمَّ أَكَبَّ عَلَيْهِ فَقَبَّلَهُ ، فَبَكَى ، ثُمَّ قَالَ : بِأَبِي أَنْتَ ، وَاللَّهِ لاَ يَجْمَعُ اللَّهُ عَلَيْكَ مَوْتَتَيْنِ أَبَدًا أَمَّا الْمَوْتَةُ الَّتِي كَتَبَ اللَّهُ عَلَيْكَ فَقَدْ مِتَّهَا.

1841. ...Aişə ﵅ rəvayət edir ki, Əbu Bəkr yerləşdiyi məskənindən gəldi, məscidə daxil oldu və insanlarla danışmadı. Aişənin yanına gəldi. Allah

Elçisinin ﷺ üzü xətli ədyal ilə örtülmüşdü. Əbu Bəkr ədyalı onun üzündən götürdü və üzünü öpərək ağladı. Sonra dedi: "Atam-anam sənə fəda olsun! Allaha and olsun ki, Allah ölümü sənə iki dəfə daddırmaz. Allahın sənə yazdığı ölümə gəldikdə isə, artıq, sən vəfat etdin".

### ١٢ - تَسْجِيَةُ الْمَيِّتِ

### 12-ci fəsil: Ölən adamın üzərini örtmək

١٨٤٢ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : سَمِعْتُ ابْنَ الْمُنْكَدِرِ ، يَقُولُ : سَمِعْتُ جَابِرًا يَقُولُ : جِيءَ بِأَبِي يَوْمَ أُحُدٍ وَقَدْ مُثِّلَ بِهِ ، فَوُضِعَ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَدْ سُجِّيَ بِثَوْبٍ ، فَجَعَلْتُ أُرِيدُ أَنْ أَكْشِفَ عَنْهُ ، فَنَهَانِي قَوْمِي ، فَأَمَرَ بِهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَرُفِعَ ، فَلَمَّا رُفِعَ سَمِعَ صَوْتَ بَاكِيَةٍ ، فَقَالَ : مَنْ هَذِهِ ؟ فَقَالُوا : هَذِهِ بِنْتُ عَمْرٍو أَوْ أُخْتُ عَمْرٍو ، قَالَ : فَلاَ تَبْكِي أَوْ فَلِمَ تَبْكِي مَا زَالَتِ الْمَلاَئِكَةُ تُظِلُّهُ بِأَجْنِحَتِهَا حَتَّى رُفِعَ.

1842. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Uhud döyüşündə şəhid olan atamı gətirmişdilər. (Onun cəsədi qulaqları və gözü kəsilərək) əcaib hala salınmışdı. Onun meyiti Allah Elçisinin ﷺ önünə qoyulmuşdu və üzəri bir örtüklə örtülmüşdü. Örtüyü üzərindən götürmək istədim, camaat mənə mane oldu, lakin Peyğəmbər ﷺ örtüyün götürülməsini əmr etdi. Örtük götürüldükdə, Allah Elçisi ﷺ ağlayan bir qadının səsini eşitdi və dedi: "Bu (ağlayan) kimdir?" Səhabələr dedilər: "Bu, Amrın ya qızı, ya da bacısıdır". Peyğəmbər ﷺ buyurdu: "Ağlama! Niyə ağlayırsan?! (Onun cəsədi) qaldırılana qədər mələklər onu qanadları ilə kölgələndirirlər".

### ١٣ - فِي الْبُكَاءِ عَلَى الْمَيِّتِ

### 13-cü fəsil: Ölən adam üçün ağlamaq

١٨٤٣ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ ، عَنْ عَطَاءِ بْنِ السَّائِبِ ، عَنْ عِكْرِمَةَ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : لَمَّا حُضِرَتْ بِنْتٌ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَغِيرَةٌ فَأَخَذَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَضَمَّهَا إِلَى صَدْرِهِ ، ثُمَّ وَضَعَ يَدَهُ عَلَيْهَا فَقَضَتْ وَهِيَ بَيْنَ يَدَيْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَبَكَتْ أُمُّ أَيْمَنَ ، فَقَالَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَا أُمَّ أَيْمَنَ ، أَتَبْكِينَ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عِنْدَكِ ، فَقَالَتْ : مَا لِي لاَ أَبْكِي وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَبْكِي ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنِّي لَسْتُ أَبْكِي ، وَلَكِنَّهَا رَحْمَةٌ ، ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْمُؤْمِنُ بِخَيْرٍ عَلَى كُلِّ حَالٍ تُنْزَعُ نَفْسُهُ مِنْ بَيْنِ جَنْبَيْهِ وَهُوَ يَحْمَدُ اللَّهَ عَزَّ وَجَلَّ.

1843. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: "Allah Elçisi ﷺ ölüm ayağında olan kiçik qızı qucağına götürdü, bağrına basdı və əlini onun

üzərinə qoydu, uşaq da həmin anda Allah Elçisinin ﷺ qarşısında vəfat etdi. Bu zaman Ummu Əymən ağlamağa başladı. Allah Elçisi ﷺ ona dedi: "Ey Ummu Əymən, Allah Elçisi yanında ola-ola niyə ağlayırsan?" Ummu Əymən dedi: "Allah Elçisi ﷺ ağladığı halda mən niyə ağlamayım?" Allah Elçisi ﷺ dedi: "Mən ağlamıram, sadəcə bu rəhm hissidir". Sonra Allah Elçisi ﷺ dedi: "Mömin bütün hallarda xeyir içindədir. Bədənindən ruhu çiyinləri arasından çıxar, o isə Allaha ﷻ həmd edər".

١٨٤٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ ، أَنَّ فَاطِمَةَ بَكَتْ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ مَاتَ فَقَالَتْ : يَا أَبَتَاهُ مِنْ رَبِّهِ مَا أَدْنَاهُ ، يَا أَبَتَاهُ إِلَى جِبْرِيلَ نَنْعَاهْ ، يَا أَبَتَاهُ جَنَّةُ الْفِرْدَوْسِ مَأْوَاهُ.

1844. ...Ənəs ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ vəfat etdikdə, Fatimə ağladı və belə dedi: "Ey Rəbbindən aldığı əmrlə Ona yaxınlaşan atam! Ey Cəbrailə ölümünü xəbər verdiyimiz atam! Yurdu Firdovs Cənnəti olan atam!"

١٨٤٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا بَهْزُ بْنُ أَسَدٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مُحَمَّدِ بْنِ الْمُنْكَدِرِ ، عَنْ جَابِرٍ ، أَنَّ أَبَاهُ قُتِلَ يَوْمَ أُحُدٍ قَالَ : فَجَعَلْتُ أَكْشِفُ عَنْ وَجْهِهِ وَأَبْكِي ، وَالنَّاسُ يَنْهَوْنِي ، وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يَنْهَانِي ، وَجَعَلَتْ عَمَّتِي تَبْكِيهِ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَبْكِيهِ مَا زَالَتِ الْمَلاَئِكَةُ تُظِلُّهُ بِأَجْنِحَتِهَا حَتَّى رَفَعْتُمُوهُ.

1845. ...Rəvayət edilir ki, Cabirin ؓ atası Uhud döyüşündə öldürülmüşdü. O belə deyir: "Onun üzünüdəki örtüyü açıb ağlamaq istədikdə, insanlar mənə mane oldular. Lakin Allah Elçisi ﷺ bunu mənə qadağan etmədi. Bibim ağlamağa başladı. Allah Elçisi ﷺ dedi: "Onun üçün ağlama! Siz qaldırıb dəfn edincəyə qədər mələklər onu qanadları ilə kölgələndirirlər".

## ١٤ - النَّهْيُ عَنِ الْبُكَاءِ عَلَى الْمَيِّتِ

## 14-cü fəsil: Ölən adam üçün vay-şivənlə ağlamağın qadağan edilməsi

١٨٤٦ - أَخْبَرَنَا عُتْبَةُ بْنُ عَبْدِ اللهِ بْنِ عُتْبَةَ ، قَالَ : قَرَأْتُ عَلَى مَالِكٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ بْنِ جَابِرِ بْنِ عَتِيكٍ ، أَنَّ عَتِيكَ بْنَ الْحَارِثِ ، وَهُوَ جَدُّ عَبْدِ اللهِ بْنِ عَبْدِ اللهِ أَبُو أُمِّهِ أَخْبَرَهُ ، أَنَّ جَابِرَ بْنَ عَتِيكٍ أَخْبَرَهُ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَاءَ يَعُودُ عَبْدَ اللهِ بْنَ ثَابِتٍ فَوَجَدَهُ قَدْ غُلِبَ عَلَيْهِ ، فَصَاحَ بِهِ ، فَلَمْ يُجِبْهُ فَاسْتَرْجَعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ : قَدْ غُلِبْنَا عَلَيْكَ أَبَا الرَّبِيعِ ، فَصِحْنَ النِّسَاءُ وَبَكَيْنَ ، فَجَعَلَ ابْنُ عَتِيكٍ يُسَكِّتُهُنَّ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : دَعْهُنَّ فَإِذَا وَجَبَ فَلاَ تَبْكِيَنَّ بَاكِيَةٌ ، قَالُوا : وَمَا الْوُجُوبُ يَا رَسُولَ اللهِ ؟ قَالَ : الْمَوْتُ ، قَالَتِ ابْنَتُهُ : إِنْ كُنْتُ لأَرْجُو أَنْ تَكُونَ شَهِيدًا قَدْ كُنْتَ قَضَيْتَ

جهازك ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَإِنَّ اللَّهَ عَزَّ وَجَلَّ قَدْ أَوْقَعَ أَجْرَهُ عَلَيْهِ عَلَى قَدْرِ نِيَّتِهِ ، وَمَا تَعُدُّونَ الشَّهَادَةَ ؟ قَالُوا : الْقَتْلُ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الشَّهَادَةُ سَبْعٌ سِوَى الْقَتْلِ فِي سَبِيلِ اللهِ عَزَّ وَجَلَّ : الْمَطْعُونُ شَهِيدٌ ، وَالْمَبْطُونُ شَهِيدٌ ، وَالْغَرِيقُ شَهِيدٌ ، وَصَاحِبُ الْهَدَمِ شَهِيدٌ ، وَصَاحِبُ ذَاتِ الْجَنْبِ شَهِيدٌ ، وَصَاحِبُ الْحَرَقِ شَهِيدٌ ، وَالْمَرْأَةُ تَمُوتُ بِجُمْعٍ شَهِيدَةٌ.

1846. ...Cabir ibn Atik ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Abdullah ibn Sabiti ziyarət etməyə gəldi. O, ölmək üzrə idi. Peyğəmbər onu çağırdı, lakin cavab verməyincə, istirca etdi[1] və buyurdu: "Əbur-Rabinin ölümünə görə Allaha boyun əydik". Qadınlar yüksək səslə ağlamağa başladılar. İbn Atik onları sakitləşdirməyə çalışdı. Allah Elçisi ﷺ dedi: "Onlarla işin olmasın! Vacib olana qədər ağlasınlar!" Oradakılar dedilər: "Vacib olan nədir, ey Allahın Elçisi?" O dedi: "Ölüm". Abdullah ibn Sabitin qızı dedi: "Həqiqətən, mən sənin şəhidlərdən olmağına ümid edirəm, çünki sən, şəhidlik üçün hər şeyi hazırlamışdın". Allah Elçisi ﷺ dedi: "Allah ﷻ ona niyyətinə görə əcrini vermişdir. Siz nəyi şəhidlik sayırsınız?" Orada olanlar: "Allah ﷻ yolunda öldürülməkdir"- dedilər. Allah Elçisi ﷺ buyurdu: "Allah yolunda öldürülməkdən başqa şəhidlik yeddi qisimdir; taundan ölən şəhiddir, qarın xəstəliyindən ölən şəhiddir, suda boğularaq ölən şəhiddir, dağıntı altında qalaraq ölən şəhiddir, ağ ciyər iltihabından ölən şəhiddir, yanaraq ölən şəhiddir, doğuş zamanı ölən qadın şəhiddir".

١٨٤٧ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ وَهْبٍ ، قَالَ : قَالَ مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، وَحَدَّثَنِي يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : لَمَّا أَتَى نَعْيُ زَيْدِ بْنِ حَارِثَةَ ، وَجَعْفَرِ بْنِ أَبِي طَالِبٍ ، وَعَبْدِ اللهِ بْنِ رَوَاحَةَ جَلَسَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُعْرَفُ فِيهِ الْحُزْنُ وَأَنَا أَنْظُرُ مِنْ صِئْرِ الْبَابِ ، فَجَاءَهُ رَجُلٌ فَقَالَ : إِنَّ نِسَاءَ جَعْفَرٍ يَبْكِينَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : انْطَلِقْ فَانْهَهُنَّ فَانْطَلَقَ ثُمَّ جَاءَ فَقَالَ : قَدْ نَهَيْتُهُنَّ فَأَبَيْنَ أَنْ يَنْتَهِينَ ، فَقَالَ : انْطَلِقْ فَانْهَهُنَّ ، فَانْطَلَقَ ثُمَّ جَاءَ ، فَقَالَ : قَدْ نَهَيْتُهُنَّ فَأَبَيْنَ أَنْ يَنْتَهِينَ ، قَالَ : فَانْطَلِقْ فَاحْثُ فِي أَفْوَاهِهِنَّ التُّرَابَ ، فَقَالَتْ عَائِشَةُ : فَقُلْتُ : أَرْغَمَ اللَّهُ أَنْفَ الأَبْعَدِ ، إِنَّكَ وَاللَّهِ مَا تَرَكْتَ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَمَا أَنْتَ بِفَاعِلٍ.

1847. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Zeyd ibn Harisə, Cəfər ibn Əbu Talib və Abdullah ibn Ravahanın (Muta döyüşündə) ölüm xəbərləri gəldikdə Allah Elçisi ﷺ oturdu. Kədərli olması üzündən hiss olunurdu, mən də qapının kandarından ona baxırdım. Bu vaxt bir nəfər gəlib: "Cəfərin qadınları (fəryad qoparıb) ağlayırlar"- dedi. Allah Elçisi ﷺ dedi: "Get və onlara (bu cür ağlamağı) qadağan et!" Adam getdi, sonra qayıdıb

[1] İnnə: lillə:hi va innə: ileyhi ra:ciu:n! - Biz Allaha məxsusuq və yalnız Ona qayıdacağıq!

dedi: “Onlara bunu qadağan etsəm də, mənə qulaq asmadılar”. Allah Elçisi ﷺ dedi: “Get və onlara (bu cür ağlamağı) qadağan et!” Adam getdi, sonra qayıdıb dedi: “Onlara bunu qadağan etsəm də, mənə yenə qulaq asmadılar”. Bu dəfə Allah Elçisi ﷺ dedi: “Get və onların ağzını torpaqla bağla!” Aişə dedi: “Allah sənin burnunu yerə sürtsün! Vallahi, nə Allah Elçisini ﷺ dinc qoydun, nə də dediyini yerinə yetirdin”.

١٨٤٨ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، عَنْ عُمَرَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْمَيِّتُ يُعَذَّبُ بِبُكَاءِ أَهْلِهِ عَلَيْهِ.

1848. ...Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Ölən adama ailəsinin onun üçün (fəryad edib) ağlamasından dolayı əzab verilir”.

١٨٤٩ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ اللهِ بْنِ صُبَيْحٍ ، قَالَ : سَمِعْتُ مُحَمَّدَ بْنَ سِيرِينَ ، يَقُولُ : ذُكِرَ عِنْدَ عِمْرَانَ بْنِ حُصَيْنٍ الْمَيِّتُ يُعَذَّبُ بِبُكَاءِ الْحَيِّ ، فَقَالَ عِمْرَانُ : قَالَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1849. ...Rəvayət edilir ki, Muhəmməd ibn Sirin ﷺ demişdir: “İmran ibn Husaynın yanında “Ölən adama dirilərin onun üçün (fəryad edib) ağlamasından dolayı əzab verilir” deyildikdə o: “Bu sözü Allah Elçisi ﷺ söyləmişdir”- dedi”.

١٨٥٠ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ سَيْفٍ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : قَالَ سَالِمٌ ، سَمِعْتُ عَبْدَ اللهِ بْنَ عُمَرَ ، يَقُولُ : قَالَ عُمَرُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُعَذَّبُ الْمَيِّتُ بِبُكَاءِ أَهْلِهِ عَلَيْهِ.

1850. ...Rəvayət edilir ki, Ömər ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ölən adama ailəsinin onun üçün (fəryad edib) ağlamasına görə əzab verilir”.

## ١٥ - النِّيَاحَةُ عَلَى الْمَيِّتِ

## 15-ci fəsil: Ölən adam üçün fəryad edib ağlamaq

١٨٥١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ مُطَرِّفٍ ، عَنْ حَكِيمِ بْنِ قَيْسٍ ، أَنَّ قَيْسَ بْنَ عَاصِمٍ ، قَالَ : لاَ تَنُوحُوا عَلَيَّ ، فَإِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَمْ يُنَحْ عَلَيْهِ مُخْتَصَرٌ.

1851. ...Rəvayət edilir ki, Qeys ibn Asim ﷺ demişdir: “Mən ölsəm, fəryad edib ağlamayın, çünki Allah Elçisi ﷺ üçün fəryad edilib ağlanılmamışdır”.

١٨٥٢ - أَخْبَرَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنْ ثَابِتٍ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَخَذَ عَلَى النِّسَاءِ حِينَ بَايَعَهُنَّ أَنْ لاَ يَنُحْنَ ، فَقُلْنَ : يَا رَسُولَ اللهِ ، إِنَّ نِسَاءً أَسْعَدْنَنَا فِي الْجَاهِلِيَّةِ أَفَنُسْعِدُهُنَّ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ إِسْعَادَ فِي الإِسْلاَمِ.

1852. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ qadınlarla beyət etdikdə ölən adamın arxasından fəryad edərək ağlamamaq üzrə söz almışdı. Qadınlar dedilər: "Ey Allahın Elçisi, cahiliyyə dövründə qadınlar var idi ki, bizimlə birgə ağlayardılar. İndi biz onlara qoşulub toplaşaraq ağlaya bilərikmi?" Allah Elçisi ﷺ dedi: "İslamda bir yerə toplaşaraq ağlaşmaq yoxdur".

١٨٥٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنَا قَتَادَةُ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ ابْنِ عُمَرَ ، عَنْ عُمَرَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : الْمَيِّتُ يُعَذَّبُ فِي قَبْرِهِ بِالنِّيَاحَةِ عَلَيْهِ.

1853. ...Rəvayət edilir ki, Ömər ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Ölən adama onun üçün fəryad edərək ağlayanlara görə qəbrində əzab verilir".

١٨٥٤ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : أَنْبَأَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا مَنْصُورٌ هُوَ ابْنُ زَاذَانَ ، عَنِ الْحَسَنِ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ قَالَ : الْمَيِّتُ يُعَذَّبُ بِنِيَاحَةِ أَهْلِهِ عَلَيْهِ فَقَالَ لَهُ رَجُلٌ : أَرَأَيْتَ رَجُلاً مَاتَ بِخُرَاسَانَ وَنَاحَ أَهْلُهُ عَلَيْهِ هَاهُنَا ، أَكَانَ يُعَذَّبُ بِنِيَاحَةِ أَهْلِهِ ؟ قَالَ : صَدَقَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَكَذَبْتَ أَنْتَ.

1854. ...Rəvayət edilir ki, İmran ibn Husayn ﷺ demişdir: "Ölən adama ailəsinin onun üçün fəryad edərək ağlamasına görə əzab verilir". Bir kişi dedi: "Bir adam Xorasanda ölsə, yaxınları da burda onun üçün fəryad edərək ağlasalar, ona yenə əzab verilirmi?" İmran dedi: "Allah Elçisi ﷺ doğru söyləmişdir, sən isə yalan".[1]

١٨٥٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ عَبْدَةَ ، عَنْ هِشَامٍ ، عَنْ أَبِيهِ ، عَنْ ابْنِ عُمَرَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الْمَيِّتَ لَيُعَذَّبُ بِبُكَاءِ أَهْلِهِ عَلَيْهِ ، فَذُكِرَ ذَلِكَ لِعَائِشَةَ فَقَالَتْ : وَهِلَ ، إِنَّمَا مَرَّ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى قَبْرٍ ، فَقَالَ : إِنَّ صَاحِبَ الْقَبْرِ لَيُعَذَّبُ ، وَإِنَّ أَهْلَهُ يَبْكُونَ عَلَيْهِ ، ثُمَّ قَرَأَتْ **{وَلاَ تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَى}**.

1855. ...Rəvayət edilir ki, İbn Ömər ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ölən adama ailəsinin onun üçün (fəryad edərək) ağlamasından dolayı əzab verilir". Bu, Aişəyə deyildikdə o dedi: "Ravi tam deməyib. Bir

---

[1] Hədisin isnadı zəifdir.

dəfə Allah Elçisi ﷺ bir qəbrin yanından keçəndə belə buyurdu: “Həqiqətən, bu qəbirdə olana yaxınlarının (fəryad edərək) ağladıqlarına görə əzab verilir”. Sonra da bu ayəni oxudu: **“Heç bir günahkar başqasının günah yükünü daşımaz”** (Fatir, 18)”.

١٨٥٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكِ بْنِ أَنَسٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَمْرَةَ أَنَّهَا أَخْبَرَتْهُ ، أَنَّهَا سَمِعَتْ عَائِشَةَ وَذُكِرَ لَهَا أَنَّ عَبْدَ اللهِ بْنَ عُمَرَ يَقُولُ : إِنَّ الْمَيِّتَ لَيُعَذَّبُ بِبُكَاءِ الْحَيِّ عَلَيْهِ ، قَالَتْ عَائِشَةُ : يَغْفِرُ اللَّهُ لأَبِي عَبْدِ الرَّحْمَنِ ، أَمَا إِنَّهُ لَمْ يَكْذِبْ وَلَكِنْ نَسِيَ أَوْ أَخْطَأَ ، إِنَّمَا مَرَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى يَهُودِيَّةٍ يُبْكَى عَلَيْهَا ، فَقَالَ : إِنَّهُمْ لَيَبْكُونَ عَلَيْهَا وَإِنَّهَا لَتُعَذَّبُ.

1856. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər رضي الله عنهما demişdir: “Həqiqətən, ölən adama dirilərin onun üçün (fəryad edib) ağlamasından dolayı əzab verilir”. Aişə dedi: “Allah Əbu Abdur-Rahməni bağışlasın! O, yalan söyləməmiş, lakin unutmuş və ya xəta etmişdir. Bir dəfə Allah Elçisi ﷺ bir yəhudi toplumunun yanına gəldi, onlar da ölən qadın üçün (fəryad edərək) ağlayırdılar. Allah Elçisi ﷺ də dedi: “Həqiqətən, onlar bu ölən kimsə üçün (fəryad edərək) ağlayırlar, ona isə əzab verilir”.

١٨٥٧ - أَخْبَرَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْعَلاَءِ بْنِ عَبْدِ الْجَبَّارِ ، عَنْ سُفْيَانَ ، قَالَ : قَصَّهُ لَنَا عَمْرُو بْنُ دِينَارٍ ، قَالَ : سَمِعْتُ ابْنَ أَبِي مُلَيْكَةَ ، يَقُولُ : قَالَ ابْنُ عَبَّاسٍ : قَالَتْ عَائِشَةُ : إِنَّمَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ اللَّهَ عَزَّ وَجَلَّ يَزِيدُ الْكَافِرَ عَذَابًا بِبَعْضِ بُكَاءِ أَهْلِهِ عَلَيْهِ.

1857. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, Allah ﷻ ailəsinin (fəryad edərək) bəzi ağlamalarına görə kafirin əzabını artırır”.

١٨٥٨ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ مَنْصُورٍ الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْوَرْدِ ، سَمِعْتُ ابْنَ أَبِي مُلَيْكَةَ ، يَقُولُ : لَمَّا هَلَكَتْ أُمُّ أَبَانَ حَضَرْتُ مَعَ النَّاسِ ، فَجَلَسْتُ بَيْنَ عَبْدِ اللهِ بْنِ عُمَرَ وَابْنِ عَبَّاسٍ فَبَكَيْنَ النِّسَاءُ ، فَقَالَ ابْنُ عُمَرَ : أَلاَ تَنْهَى هَؤُلاَءِ عَنِ الْبُكَاءِ ، فَإِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِنَّ الْمَيِّتَ لَيُعَذَّبُ بِبَعْضِ بُكَاءِ أَهْلِهِ عَلَيْهِ ، فَقَالَ ابْنُ عَبَّاسٍ ، قَدْ كَانَ عُمَرُ ، يَقُولُ بَعْضَ ذَلِكَ : خَرَجْتُ مَعَ عُمَرَ حَتَّى إِذَا كُنَّا بِالْبَيْدَاءِ رَأَى رَكْبًا تَحْتَ شَجَرَةٍ ، فَقَالَ : انْظُرْ مَنِ الرَّكْبُ ، فَذَهَبْتُ فَإِذَا صُهَيْبٌ وَأَهْلُهُ ، فَرَجَعْتُ إِلَيْهِ ، فَقُلْتُ : يَا أَمِيرَ الْمُؤْمِنِينَ ، هَذَا صُهَيْبٌ وَأَهْلُهُ ، فَقَالَ : عَلَيَّ بِصُهَيْبٍ ، فَلَمَّا دَخَلْنَا الْمَدِينَةَ أُصِيبَ عُمَرُ ، فَجَلَسَ صُهَيْبٌ يَبْكِي عِنْدَهُ يَقُولُ : وَا أُخَيَّاهُ وَا أُخَيَّاهُ ، فَقَالَ عُمَرُ : يَا صُهَيْبُ لاَ تَبْكِ ، فَإِنِّي سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِنَّ الْمَيِّتَ لَيُعَذَّبُ بِبَعْضِ بُكَاءِ أَهْلِهِ عَلَيْهِ قَالَ : فَذَكَرْتُ ذَلِكَ لِعَائِشَةَ ، فَقَالَتْ أَمَا وَاللَّهِ مَا تُحَدِّثُونَ هَذَا الْحَدِيثَ عَنْ كَاذِبَيْنِ مُكَذَّبَيْنِ ، وَلَكِنَّ السَّمْعَ يُخْطِئُ ، وَإِنَّ لَكُمْ فِي الْقُرْآنِ لَمَا يَشْفِيكُمْ **{أَلاَّ تَزِرُ وَازِرَةٌ وِزْرَ أُخْرَى}** وَلَكِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ اللَّهَ لَيَزِيدُ الْكَافِرَ عَذَابًا بِبُكَاءِ أَهْلِهِ عَلَيْهِ.

1858. ...Rəvayət edilir ki, İbn Əbu Muleykə ﵀ demişdir: “(Osmanın qızı) Ummu Əbən vəfat etdikdə insanların yanında mən də var idim və Abdullah ibn Ömərlə İbn Abbasın arasında oturdum. Bu arada qadınlar (fəryad edərək) ağlamağa başladılar. İbn Ömər dedi: “Bunlar (fəryad edərək) ağlamaqdan çəkindirilmədilərmi? Çünki mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Ölən adama ailəsinin onun üçün bəzi ağlamasından dolayı əzab verilir”. İbn Abbas dedi: “Ömər, ölən adama hər dəfə ağlamağa görə deyil, bir qisim ağlaşmağa görə əzab verilir. Mən Ömərlə birlikdə Məkkədən çıxdım. Beyda adlanan yerdə bir ağacın altında süvari bir dəstə gördüm. O dedi: “Bax gör, bu süvari dəstədəkilər kimlərdir!?” Gedib gördüm ki, Suheyb və ailəsidir. Qayıdıb dedim: “Ey möminlərin əmiri! Bu, Suheyb və ailəsidir”. Ömər dedi: “Suheybi bura çağır!” Suheybi çağırdım və birlikdə Mədinəyə gəldik. Bu arada Ömər yaralanmışdı. Onda Suheyb onun yanında oturub ağlamağa və belə deməyə başladı: “Ay qardaş, vay qardaş!” Ömər dedi: “Ey Suheyb, ağlama! Çünki mən Allah Elçisinin ﷺ belə dediyini eşitmişəm: “Ölən adama ailəsinin onun üçün bəzi ağlamasından dolayı əzab verilir”. Bu hadisəni Aişəyə danışdım. O dedi: “Diqqət edin! Vallahi, siz bu hədisi yalançılardan və yalanda ittiham edilənlərdən rəvayət etmirsiniz, lakin qulaq yanıla bilər. Quranda sizə şəfa verəcək bir çox ayələr var. **“Heç bir günahkar başqasının günah yükünü daşımaz”** (Fatir, 18). Lakin Allah Elçisi ﷺ belə buyurmuşdur: “Həqiqətən, Allah ailəsinin (fəryad edərək) ağlamasına görə kafirin əzabını artırır”.

### ١٦ - بَابُ الرُّخْصَةِ فِي الْبُكَاءِ عَلَى الْمَيِّتِ

### 16-cı fəsil: Ölən adam üçün (sükunətlə) ağlamağa rüsxət verilməsi

١٨٥٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ هُوَ ابْنُ جَعْفَرٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَلْحَلَةَ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ عَطَاءٍ ، أَنَّ سَلَمَةَ بْنَ الأَزْرَقِ قَالَ : سَمِعْتُ أَبَا هُرَيْرَةَ قَالَ : مَاتَ مَيِّتٌ مِنْ آلِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَاجْتَمَعَ النِّسَاءُ يَبْكِينَ عَلَيْهِ ، فَقَامَ عُمَرُ يَنْهَاهُنَّ وَيَطْرُدُهُنَّ ، فَقَالَ : رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : دَعْهُنَّ يَا عُمَرُ فَإِنَّ الْعَيْنَ دَامِعَةٌ ، وَالْقَلْبَ مُصَابٌ ، وَالْعَهْدَ قَرِيبٌ.

1859. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisinin ﷺ ailəsindən bir nəfər vəfat etmişdi. Qadınlar bir yerə toplaşıb ağlamağa başladılar. Ömər də buna görə onları məzəmmət etməyə başlamışdı. Allah

Elçisi ﷺ buyurdu: "Burax onları, ey Ömər! Həqiqətən, gözlər yaşarır, qəlblər kədərlənir, hadisə isə yeni baş verib".[1]

## ١٧ - دَعْوَى الْجَاهِلِيَّةِ

## 17-ci fəsil: Cahiliyyə ağlaşması

١٨٦٠ - أَخْبَرَنَا عَلِيُّ بْنُ خَشْرَمٍ ، قَالَ : حَدَّثَنَا عِيسَى ، عَنِ الأَعْمَشِ أَنْبَأَنَا الْحَسَنُ بْنُ إِسْمَعِيلَ ، قَالَ : حَدَّثَنَا ابْنُ إِدْرِيسَ ، عَنِ الأَعْمَشِ ، عَنْ عَبْدِ اللهِ بْنِ مُرَّةَ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَبْدِ اللهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَ مِنَّا مَنْ ضَرَبَ الْخُدُودَ ، وَشَقَّ الْجُيُوبَ ، وَدَعَا بِدُعَاءِ الْجَاهِلِيَّةِ وَاللَّفْظُ لِعَلِيٍّ ، وَقَالَ : الْحَسَنُ بِدَعْوَى.

1860. Rəvayət edilir ki, Abdullah ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim ölən bir adam üçün yanaqlarını cırar, yaxasını yırtar və cahiliyyə adəti kimi fəryad edib bağırarsa, bizdən deyil".

## ١٨ - السَّلَقُ

## 18-ci fəsil: Səsi yüksəldərək ağlaşmaq

١٨٦١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَوْفٍ ، عَنْ خَالِدٍ الأَحْدَبِ ، عَنْ صَفْوَانَ بْنِ مُحْرِزٍ ، قَالَ : أُغْمِيَ عَلَى أَبِي مُوسَى فَبَكَوْا عَلَيْهِ ، فَقَالَ : أَبْرَأُ إِلَيْكُمْ كَمَا بَرِئَ إِلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيْسَ مِنَّا مَنْ حَلَقَ ، وَلاَ خَرَقَ ، وَلاَ سَلَقَ.

1861. ...Rəvayət edilir ki, Safvan ibn Muhriz ﷺ demişdir: "Əbu Musanın huşu getmişdi, ona görə də (ətrafındakılar) ağlamağa başladılar. Əbu Musa ayıldıqda belə dedi: "Allah Elçisi ﷺ müsibət anında saçını-başını yolan, yaxasını cıran, səsini yüksəldərək ağlayandan uzaq olduğu kimi mən də uzağam".

## ١٩ - ضَرْبُ الْخُدُودِ

## 19-cu fəsil: Üzə vuraraq ağlaşmaq

١٨٦٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنِي زُبَيْدٌ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَبْدِ اللهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْسَ مِنَّا مَنْ ضَرَبَ الْخُدُودَ ، وَشَقَّ الْجُيُوبَ ، وَدَعَا بِدَعْوَى الْجَاهِلِيَّةِ.

1862. ...Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim ölən bir adam üçün yanaqlarını cırar, yaxasını yırtar və cahiliyyə adəti kimi

[1] Hədis zəifdir.

fəryad edib bağırarsa, bizdən deyil".

٢٠ - الْحَلْقُ

## 20-ci fəsil: Saçını-başını yolmaq

١٨٦٣ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عُثْمَانَ بْنِ حَكِيمٍ ، قَالَ : أَنْبَأَنَا جَعْفَرُ بْنُ عَوْنٍ ، قَالَ : حَدَّثَنَا أَبُو عُمَيْسٍ ، عَنْ أَبِي صَخْرَةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ يَزِيدَ ، وَأَبِي بُرْدَةَ ، قَالاَ : لَمَّا ثَقُلَ أَبُو مُوسَى أَقْبَلَتِ امْرَأَتُهُ تَصِيحُ ، قَالاَ : فَأَفَاقَ ، فَقَالَ : أَلَمْ أُخْبِرْكِ أَنِّي بَرِيءٌ مِمَّنْ بَرِئَ مِنْهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالاَ : وَكَانَ يُحَدِّثُهَا أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَنَا بَرِيءٌ مِمَّنْ حَلَقَ ، وَخَرَقَ ، وَسَلَقَ.

1863. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Yəzid və Əbu Burdə ﷺ demişlər: "Əbu Musanın xəstəliyi ağırlaşdıqda zövcəsi fəryad edərək ağlamağa başladı. Onlar dedilər: "Əbu Musa oyandıqda dedi: "Allah Elçisinin ﷺ uzaq olduğu adamlardan mənim də uzaq olduğumu sənə bildirməmişdimmi?" Abdur-Rahmən ibn Yəzid və Əbu Burdə dedilər: "Əbu Musa zövcəsinə Allah Elçisinin ﷺ belə buyurduğunu dedi: "Mən saçını-başını yolan, yaxasını cıran, səsini yüksəldərək çığırandan uzağam".

٢١ - شَقُّ الْجُيُوبِ

## 21-ci fəsil: Yaxanı yırtmaq

١٨٦٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ زُبَيْدٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَبْدِ اللهِ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَيْسَ مِنَّا مَنْ ضَرَبَ الْخُدُودَ ، وَشَقَّ الْجُيُوبَ ، وَدَعَا بِدَعْوَى الْجَاهِلِيَّةِ.

1864. ...Abdullah ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Müsibət anında əlləri ilə yanaqlarına vuran, paltarlarını cıran, cahillikdə olduğu kimi fəryad edib bağıran bizdən deyil".

١٨٦٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ يَزِيدَ بْنِ أَوْسٍ ، عَنْ أَبِي مُوسَى ، أَنَّهُ أُغْمِيَ عَلَيْهِ فَبَكَتْ أُمُّ وَلَدٍ لَهُ ، فَلَمَّا أَفَاقَ ، قَالَ لَهَا : أَمَا بَلَغَكِ مَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ فَسَأَلْنَاهَا : فَقَالَتْ : قَالَ : لَيْسَ مِنَّا مَنْ سَلَقَ ، وَحَلَقَ ، وَخَرَقَ.

1865. ...Yəzid ibn Əvs ﷺ rəvayət edir ki, bir dəfə (xəstə olduqda) Əbu Musa huşunu itirdi, onun uşaqlarının anası ağlamağa başladı. Əbu Musa özünə gəldikdə zövcəsinə dedi: "Allah Elçisinin ﷺ nə dediyini eşitməmisənmi?!" Biz soruşduq: "Allah Elçisi ﷺ nə demişdi ki?" O dedi: "Müsibət

anında səsini yüksəldərək çığıran, saçını-başını yolan və yaxasını cıran bizdən deyil".

١٨٦٦ - أَخْبَرَنَا عَبْدَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا إِسْرَائِيلُ ، عَنْ مَنْصُورٍ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ يَزِيدَ بْنِ أَوْسٍ ، عَنْ أُمِّ عَبْدِ اللهِ امْرَأَةِ أَبِي مُوسَى ، عَنْ أَبِي مُوسَى قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَيْسَ مِنَّا مَنْ حَلَقَ ، وَسَلَقَ ، وَخَرَقَ.

1866. ...Rəvayət edilir ki, Əbu Musa ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Müsibət anında saçını-başını yolan, səsini yüksəldərək çığıran və yaxasını cıran bizdən deyil".

١٨٦٧ - أَخْبَرَنَا هَنَّادٌ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ إِبْرَاهِيمَ ، عَنْ سَهْمِ بْنِ مِنْجَابٍ ، عَنِ الْقَرْثَعِ ، قَالَ : لَمَّا ثَقُلَ أَبُو مُوسَى صَاحَتْ امْرَأَتُهُ فَقَالَ : أَمَا عَلِمْتِ مَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَتْ : بَلَى ، ثُمَّ سَكَتَتْ ، فَقِيلَ لَهَا بَعْدَ ذَلِكَ : أَيُّ شَيْءٍ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَتْ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَعَنَ مَنْ حَلَقَ ، أَوْ سَلَقَ ، أَوْ خَرَقَ.

1867. ...Rəvayət edilir ki, əl-Qarsəi ﵀ demişdir: "Əbu Musanın xəstəliyi ağırlaşdıqda onun zövcəsi vay-şivən salmağa başladı. O da dedi: "Məgər sən Allah Elçisinin ﷺ nə dediyini bilmirsənmi?" Zövcəsi: "Əksinə, bilirəm"- dedi və susdu. Əbu Musanın zövcəsindən soruşdular: "Allah Elçisi ﷺ nə demişdi ki?" O dedi: "Həqiqətən, Allah Elçisi ﷺ müsibət anında saçını-başını yolana, səsini yüksəldərək çığırana və yaxasını cırana lənət etmişdir".

## ٢٢ - الأَمْرُ بِالاِحْتِسَابِ وَالصَّبْرِ عِنْدَ نُزُولِ الْمُصِيبَةِ

## 22-ci fəsil: Müsibət gəldikdə savab umaraq səbir etməyin əmr edilməsi

١٨٦٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ عَاصِمِ بْنِ سُلَيْمَانَ ، عَنْ أَبِي عُثْمَانَ ، قَالَ : حَدَّثَنِي أُسَامَةُ بْنُ زَيْدٍ ، قَالَ : أَرْسَلَتْ بِنْتُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِلَيْهِ أَنَّ ابْنًا لِي قُبِضَ فَأْتِنَا ، فَأَرْسَلَ يَقْرَأُ السَّلاَمَ وَيَقُولُ : إِنَّ لِلَّهِ مَا أَخَذَ ، وَلَهُ مَا أَعْطَى ، وَكُلُّ شَيْءٍ عِنْدَ اللهِ بِأَجَلٍ مُسَمًّى ، فَلْتَصْبِرْ وَلْتَحْتَسِبْ ، فَأَرْسَلَتْ إِلَيْهِ تُقْسِمُ عَلَيْهِ لَيَأْتِيَنَّهَا ، فَقَامَ وَمَعَهُ سَعْدُ بْنُ عُبَادَةَ ، وَمُعَاذُ بْنُ جَبَلٍ ، وَأُبَيُّ بْنُ كَعْبٍ ، وَزَيْدُ بْنُ ثَابِتٍ ، وَرِجَالٌ ، فَرُفِعَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الصَّبِيُّ وَنَفْسُهُ تَقَعْقَعُ ، فَفَاضَتْ عَيْنَاهُ ، فَقَالَ سَعْدٌ : يَا رَسُولَ اللهِ ، مَا هَذَا ؟ قَالَ : هَذَا رَحْمَةٌ ، يَجْعَلُهَا اللَّهُ فِي قُلُوبِ عِبَادِهِ ، وَإِنَّمَا يَرْحَمُ اللَّهُ مِنْ عِبَادِهِ الرُّحَمَاءَ.

1868. ...Rəvayət edilir ki, Usamə ibn Zeyd ﵄ demişdir: "Oğlunun can verməsinə görə Peyğəmbərin ﷺ qızı onlara gəlməsi üçün Peyğəmbərə ﷺ

xəbər göndərdi. Peyğəmbər ﷺ qızına salam göndərərək dedi: "Həqiqətən, almaq da, vermək də Allaha aiddir. Allah dərgahında hər şeyin bəlli bir əcəli var. Səbir et və savabını um!" Qızı and verərək mütləq gəlməsi üçün yenidən xəbər göndərdi. Onda Peyğəmbər ﷺ qalxaraq Səd ibn Ubadə, Muaz ibn Cəbəl, Ubey ibn Kəb, Zeyd ibn Sabit və başqaları ilə birlikdə qızıgilə getdilər. Uşaq Allah Elçisinin ﷺ qucağına verildi. Uşaq can verirdi. Bu zaman Allah Elçisinin ﷺ gözləri doldu. Səd dedi: "Ey Allahın Elçisi, bu nədir?" Allah Elçisi ﷺ buyurdu: "Bu, Allahın Öz bəndələrinin qəlblərinə yerləşdirdiyi rəhmətdir. Həqiqətən, Allah Öz bəndələrindən rəhmli olanlara rəhm edər".

١٨٦٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ ثَابِتٍ ، قَالَ : سَمِعْتُ أَنَسًا يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الصَّبْرُ عِنْدَ الصَّدْمَةِ الأُولَى.

1869. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Səbir bəlanın ilk anında olandır".

١٨٧٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو إِيَاسٍ وَهُوَ مُعَاوِيَةُ بْنُ قُرَّةَ ، عَنْ أَبِيهِ رَضِيَ اللَّهُ عَنْهُ ، أَنَّ رَجُلاً أَتَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَمَعَهُ ابْنٌ لَهُ فَقَالَ لَهُ : أَتُحِبُّهُ ؟ فَقَالَ : أَحَبَّكَ اللَّهُ كَمَا أُحِبُّهُ ، فَمَاتَ ، فَفَقَدَهُ ، فَسَأَلَ عَنْهُ ، فَقَالَ : مَا يَسُرُّكَ أَنْ لاَ تَأْتِيَ بَابًا مِنْ أَبْوَابِ الْجَنَّةِ إِلاَّ وَجَدْتَهُ عِنْدَهُ يَسْعَى يَفْتَحُ لَكَ ؟

1870. ...Müaviyə ibn Qurra atasından ﵁ rəvayət edir ki, bir nəfər uşağı ilə Peyğəmbərin ﷺ yanına gəlmişdi. Allah Elçisi ﷺ ona dedi: "Sən onu sevirsənmi?" Həmin adam dedi: "Mənim onu sevdiyim kimi Allah da səni sevsin!" Bir qədər sonra uşaq vəfat etdi. Allah Elçisi ﷺ həmin adamı bir müddət görmədi, görəndə isə dedi: "Sən Cənnətin qapılarından birinə gəldikdə uşağının qapını açmaq üçün qaçaraq gəldiyini görməyin səni sevindirməzmi!?"

## ٢٣ - ثَوَابُ مَنْ صَبَرَ وَاحْتَسَبَ

## 23-cü fəsil: Səbir edib savabını (Allahdan) uman haqda

١٨٧١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، قَالَ : أَنْبَأَنَا عُمَرُ بْنُ سَعِيدِ بْنِ أَبِي حُسَيْنٍ ، أَنَّ عَمْرَو بْنَ شُعَيْبٍ كَتَبَ إِلَى عَبْدِ اللهِ بْنِ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي حُسَيْنٍ يُعَزِّيهِ بِابْنٍ لَهُ هَلَكَ وَذَكَرَ فِي كِتَابِهِ ، أَنَّهُ سَمِعَ أَبَاهُ يُحَدِّثُ ، عَنْ جَدِّهِ عَبْدِ اللهِ بْنِ عَمْرِو بْنِ الْعَاصِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ اللَّهَ لاَ يَرْضَى لِعَبْدِهِ الْمُؤْمِنِ إِذَا ذَهَبَ بِصَفِيِّهِ مِنْ أَهْلِ الأَرْضِ فَصَبَرَ وَاحْتَسَبَ ، وَقَالَ : مَا أُمِرَ بِهِ بِثَوَابٍ دُونَ الْجَنَّةِ.

1871. ...Ömər ibn Səid ibn Əbu Hüseyn ﷺ rəvayət edir ki, Amr ibn Şueyb oğlu vəfat edən Abdullah ibn Abdur-Rahmən ibn Əbu Hüseynə başsağlığı üçün məktub yazmışdı. Məktubda atasının və babasının Abdullah ibn Amr ibn əl-Asın belə dediyini yazmışdı: "Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, yer üzündə mömin bəndənin həddi-büluğa çatmayan övladı vəfat edər, o da buna səbir edib savabını Allahdan umarsa, Allah mükafat olaraq ona Cənnətdən başqasını verməyə razı olmaz!"

٢٤ - بَابُ ثَوَابِ مَنْ احْتَسَبَ ثَلاَثَةً مِنْ صُلْبِهِ

24-cü fəsil: Həddi-büluğa çatmadan üç uşağı ölənin savabı haqda

١٨٧٢ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، قَالَ : حَدَّثَنَا ابْنُ وَهْبٍ ، حَدَّثَنِي عَمْرٌو ، قَالَ : حَدَّثَنِي بُكَيْرُ بْنُ عَبْدِ اللهِ ، عَنْ عِمْرَانَ بْنِ نَافِعٍ ، عَنْ حَفْصِ بْنِ عُبَيْدِ اللهِ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ احْتَسَبَ ثَلاَثَةً مِنْ صُلْبِهِ دَخَلَ الْجَنَّةَ ، فَقَامَتِ امْرَأَةٌ ، فَقَالَتْ : أَوِ اثْنَانِ ؟ قَالَ : أَوِ اثْنَانِ ، قَالَتِ الْمَرْأَةُ : يَا لَيْتَنِي قُلْتُ وَاحِدًا.

1872. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kimin həddi-büluğa çatmamış üç övladı vəfat edər və o da buna görə səbir edib savabını Allahdan umarsa, Cənnətə girər". Bir qadın ayağa qalxıb dedi: "Bəs, iki uşağı ölən?" Peyğəmbər ﷺ dedi: "İki uşağı ölən də belədir". Həmin qadın dedi: "Kaş bir uşağı ölən haqda da soruşsaydım!"

٢٥ - مَنْ يُتَوَفَّى لَهُ ثَلاَثَةٌ

25-ci fəsil: Üç uşağı ölən haqda

١٨٧٣ - أَخْبَرَنَا يُوسُفُ بْنُ حَمَّادٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، عَنْ عَبْدِ الْعَزِيزِ ، عَنْ أَنَسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مِنْ مُسْلِمٍ يُتَوَفَّى لَهُ ثَلاَثَةٌ مِنَ الْوَلَدِ لَمْ يَبْلُغُوا الْحِنْثَ إِلاَّ أَدْخَلَهُ اللَّهُ الْجَنَّةَ بِفَضْلِ رَحْمَتِهِ إِيَّاهُمْ.

1873. ...Rəvayət edilir ki, Ənəs ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Həddi-büluğa çatmamış üç uşağı ölən elə bir müsəlman yoxdur ki, Allah onu uşaqlara olan mərhəmətinin lütfü sayəsində Cənnətə daxil etməsin".

١٨٧٤ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، عَنْ يُونُسَ ، عَنِ الْحَسَنِ ، عَنْ صَعْصَعَةَ بْنِ مُعَاوِيَةَ ، قَالَ : لَقِيتُ أَبَا ذَرٍّ ، قُلْتُ : حَدِّثْنِي ، قَالَ : نَعَمْ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا مِنْ مُسْلِمَيْنِ يَمُوتُ بَيْنَهُمَا ثَلاَثَةُ أَوْلاَدٍ لَمْ يَبْلُغُوا الْحِنْثَ إِلاَّ غَفَرَ اللَّهُ لَهُمَا بِفَضْلِ رَحْمَتِهِ إِيَّاهُمْ.

1874. ...Rəvayət edilir ki, Sa'saə ibn Müaviyə ﷺ demişdir: "Mən Əbu Zərr

ilə qarşılaşdım və dedim: “Mənə bir hədis danış”. O dedi: “Yaxşı, Allah Elçisi ﷺ belə buyurmuşdu: “Həddi-büluğa çatmamış üç övladı ölən elə müsəlman cütlük[1] yoxdur ki, Allah onları uşaqlara olan mərhəmətinin lütfü sayəsində bağışlamasın”.

١٨٧٥ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَمُوتُ لأَحَدٍ مِنَ الْمُسْلِمِينَ ثَلاَثَةٌ مِنَ الْوَلَدِ فَتَمَسَّهُ النَّارُ إِلاَّ تَحِلَّةَ الْقَسَمِ.

1875. ...Əbu Hureyra ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Cəhənnəm odu üç övladı ölən müsəlmana yalnız Allahın andı yerinə yetsin deyə toxunar”. (Məryəm, 71)”.[2]

١٨٧٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ إِسْمَعِيلَ بْنِ إِبْرَاهِيمَ ابْنِ عُلَيَّةَ ، وَعَبْدُ الرَّحْمَنِ بْنُ مُحَمَّدٍ ، قَالاَ : حَدَّثَنَا إِسْحَاقُ وَهُوَ الأَزْرَقُ ، عَنْ عَوْفٍ ، عَنْ مُحَمَّدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَا مِنْ مُسْلِمَيْنِ يَمُوتُ بَيْنَهُمَا ثَلاَثَةُ أَوْلاَدٍ لَمْ يَبْلُغُوا الْحِنْثَ إِلاَّ أَدْخَلَهُمَا اللَّهُ بِفَضْلِ رَحْمَتِهِ إِيَّاهُمُ الْجَنَّةَ ، قَالَ : يُقَالُ لَهُمْ : ادْخُلُوا الْجَنَّةَ ، فَيَقُولُونَ : حَتَّى يَدْخُلَ آبَاؤُنَا ، فَيُقَالُ : ادْخُلُوا الْجَنَّةَ أَنْتُمْ وَآبَاؤُكُمْ.

1876. ...Əbu Hureyra ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Həddi büluğa çatmamış üç övladı vəfat edən elə bir müsəlman cütlük yoxdur ki, Allah onları Öz mərhəməti sayəsində Cənnətə daxil etməsin. (Qiyamət günü) onların övladlarına deyiləcək: “Cənnətə girin!” Onlar deyəcəklər: “Valideynlərimiz daxil olmayınca (biz girmərik)”. Onlara deyiləcək: “Siz də, valideynləriniz də Cənnətə girin!”

## ٢٦ - مَنْ قَدَّمَ ثَلاَثَةً

## 26-cı fəsil: Özündən qabaq üç uşağı ölən haqda

١٨٧٧ - أَخْبَرَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا جَرِيرٌ ، قَالَ : حَدَّثَنِي طَلْقُ بْنُ مُعَاوِيَةَ ، وَحَفْصُ بْنُ غِيَاثٍ ، قَالَ : حَدَّثَنِي جَدِّي طَلْقُ بْنُ مُعَاوِيَةَ ، عَنْ أَبِي زُرْعَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : جَاءَتِ امْرَأَةٌ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَابْنٍ لَهَا يَشْتَكِي ، فَقَالَتْ : يَا رَسُولَ اللهِ ، أَخَافُ عَلَيْهِ وَقَدْ قَدَّمْتُ ثَلاَثَةً ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لَقَدْ احْتَظَرْتِ بِحِظَارٍ شَدِيدٍ مِنَ النَّارِ.

1877. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: “Allah Elçisinin ﷺ yanına bir qadın (əzab çəkən uşağına görə) gəlib şikayət edərək dedi: “Ey

---

[1] Burada “cütlük” deyildikdə uşağın valindeynləri nəzərdə tutulur.

[2] Uca Allah buyurur: **“İçinizdən hər kəs oraya varid olacaq. Bu, Rəbbinin əzəldən müəyyən etdiyi qəti bir qərardır”** (Məryəm, 71).

Allahın Elçisi! Özümdən qabaq artıq üç uşağımı dəfn etmişəm, bunun da ölməsindən qorxuram". Allah Elçisi ﷺ buyurdu: "Elə isə Cəhənnəm oduna qarşı güclü sədd çəkmisən!"

## ٢٧ - بَابُ النَّعْيِ
## 27-ci fəsil: Ölüm xəbərini yaymaq

١٨٧٨ - أَخْبَرَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ أَيُّوبَ ، عَنْ حُمَيْدِ بْنِ هِلاَلٍ ، عَنْ أَنَسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَعَى زَيْدًا وَجَعْفَرًا قَبْلَ أَنْ يَجِيءَ خَبَرُهُمْ ، فَنَعَاهُمْ وَعَيْنَاهُ تَذْرِفَانِ.

1878. ...Ənəs ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Zeydin və Cəfərin ölüm xəbəri gəlməmişdən qabaq onların ölüm xəbərini vermişdi. Onun gözləri yaşla dolmuşdu.

١٨٧٩ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ ، وَابْنُ الْمُسَيَّبِ ، أَنَّ أَبَا هُرَيْرَةَ أَخْبَرَهُمَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَعَى لَهُمَا النَّجَاشِيَّ صَاحِبَ الْحَبَشَةِ الْيَوْمَ الَّذِي مَاتَ فِيهِ ، وَقَالَ : اسْتَغْفِرُوا لأَخِيكُمْ.

1879. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Həbəşistanın rəhbəri Nəcaşinin ölüm xəbərini onun vəfat etdiyi gün xəbər verdi və dedi: "Qardaşınız üçün bağışlanma diləyin!"

١٨٨٠ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ فَضَالَةَ بْنِ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ هُوَ ابْنُ يَزِيدَ الْمُقْرِئُ (ح) وَأَنْبَأَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ الْمُقْرِيءُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ سَعِيدٌ ، حَدَّثَنِي رَبِيعَةُ بْنُ سَيْفٍ الْمَعَافِرِيُّ ، عَنْ أَبِي عَبْدِ الرَّحْمَنِ الْحُبُلِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَمْرٍو قَالَ : بَيْنَمَا نَحْنُ نَسِيرُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذْ بَصُرَ بِامْرَأَةٍ لاَ تَظُنُّ أَنَّهُ عَرَفَهَا ، فَلَمَّا تَوَسَّطَ الطَّرِيقَ وَقَفَ حَتَّى انْتَهَتْ إِلَيْهِ ، فَإِذَا فَاطِمَةُ بِنْتُ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ لَهَا : مَا أَخْرَجَكِ مِنْ بَيْتِكِ يَا فَاطِمَةُ ؟ ، قَالَتْ : أَتَيْتُ أَهْلَ هَذَا الْمَيِّتِ ، فَتَرَحَّمْتُ إِلَيْهِمْ ، وَعَزَّيْتُهُمْ بِمَيِّتِهِمْ ، قَالَ : لَعَلَّكِ بَلَغْتِ مَعَهُمُ الْكُدَى ؟ ، قَالَتْ : مَعَاذَ اللهِ ، أَنْ أَكُونَ بَلَغْتُهَا وَقَدْ سَمِعْتُكَ تَذْكُرُ فِي ذَلِكَ مَا تَذْكُرُ ، فَقَالَ لَهَا : لَوْ بَلَغْتِهَا مَعَهُمْ مَا رَأَيْتِ الْجَنَّةَ حَتَّى يَرَاهَا جَدُّ أَبِيكِ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : رَبِيعَةُ ضَعِيفٌ.

1880. ...Rəvayət edilir ki, Abdullah ibn Amr ﷺ demişdir: "Bir gün Allah Elçisi ﷺ ilə birlikdə yol gedəndə bir qadın gördük. Qadın onu tanımadığımızı zənn etdi. Yolun yarısına çatanda gəlib dayandı və həmin qadın gələnə qədər gözlədi. Gələn qadın Allah Elçisinin ﷺ qızı Fatimə idi. Peyğəmbər ﷺ ona dedi: "Evdən çıxmağına səbəb nədir, ey Fatimə?" Fatimə

dedi: “Bu vəfat edən kimsənin ailəsinin yanına Allahdan rəhmət diləməyə və onlara başsağlığı deməyə gəlmişdim”. Peyğəmbər ﷺ dedi: “Yəqin ki, onlarla birlikdə qəbiristanlığa da getmisən?!” O dedi: “Ora getməkdən Allaha sığınıram! Sənin bu haqda nə dediyini bilirəm”. Allah Elçisi ﷺ ona dedi: “Əgər onlarla birlikdə getsəydin, Cənnəti atanın babasından qabaq görməzdin”.[1]

## ٢٨ - غَسْلُ الْمَيِّتِ بِالْمَاءِ وَالسِّدْرِ

## 28-ci fəsil: Ölənin su və sidr ilə yuyulması

١٨٨١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَيُّوبَ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، أَنَّ أُمَّ عَطِيَّةَ الأَنْصَارِيَّةَ قَالَتْ : دَخَلَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ تُوُفِّيَتِ ابْنَتُهُ ، فَقَالَ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ذَلِكِ ، بِمَاءٍ وَسِدْرٍ ، وَاجْعَلْنَ فِي الآخِرَةِ كَافُورًا أَوْ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، فَلَمَّا فَرَغْنَا آذَنَّاهُ ، فَأَعْطَانَا حَقْوَهُ وَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ.

1881. ...Rəvayət edilir ki, Ummu Atiyyə əl-Ənsariyyə رضي الله عنها demişdir: “Allah Elçisinin ﷺ qızı (Zeynəb) vəfat etdikdə, o bizim yanımıza gəlib dedi: “Onu üç və ya beş dəfə, yaxud məsləhət bilirsinizsə, bundan da çox su və sidr[2] ilə yuyun. Axırıncısına kafur[3] və ya ona bənzər qoxu qatın. Bitirdikdən sonra mənə xəbər verin”. Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: “Onu buna bükün!”

## ٢٩ - غَسْلُ الْمَيِّتِ بِالْحَمِيمِ

## 29-cu fəsil: Ölənin isti su ilə yuyulması

١٨٨٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ بْنِ أَبِي حَبِيبٍ ، عَنْ أَبِي الْحَسَنِ ، مَوْلَى أُمِّ قَيْسٍ بِنْتِ مِحْصَنٍ ، عَنْ أُمِّ قَيْسٍ قَالَتْ : تُوُفِّيَ ابْنِي فَجَزِعْتُ عَلَيْهِ ، فَقُلْتُ لِلَّذِي يَغْسِلُهُ : لاَ تَغْسِلِ ابْنِي بِالْمَاءِ الْبَارِدِ فَتَقْتُلَهُ ، فَانْطَلَقَ عُكَّاشَةُ بْنُ مِحْصَنٍ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَخْبَرَهُ بِقَوْلِهَا ، فَتَبَسَّمَ ، ثُمَّ قَالَ : مَا قَالَتْ طَالَ عُمْرُهَا " ، فَلاَ نَعْلَمُ امْرَأَةً عَمِرَتْ مَا عَمِرَتْ.

1882. ...Rəvayət edilir ki, Ummu Qeys رضي الله عنها demişdir: “Oğlum vəfat etmişdi, bu səbəblə həyəcanlı idim. Onu yuyan adama dedim: “Oğlumu soyuq su ilə yuma, onu öldürmüş olarsan”. Ukkaşə ibn Mihsan Allah Elçisinin ﷺ

---

[1] Hədis zəifdir.

[2] Sidr - şam fəsiləsindən həmişəyaşıl, iynəyarpaqlı ağacdır.

[3] Kafur - dəfnəkimilər fəsiləsindən həmişəyaşıl və gözəl ətri olan ağacdır.

yanına gedib qadının bu sözünü ona dedi. Allah Elçisi ﷺ təbəssüm etdi və dedi: "Onun dediyi kimi et, Allah onun ömrünü uzatsın!" Ravi deyir ki, Ummu Qeys kimi uzun ömürlü qadın tanımırıq.[1]

## ٣٠ - نَقْضُ رَأْسِ الْمَيِّتِ
## 30-cu fəsil: Ölənin saçını hörmək

١٨٨٣ - أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ أَيُّوبُ ، سَمِعْتُ حَفْصَةَ ، تَقُولُ : حَدَّثَتْنَا أُمُّ عَطِيَّةَ ، أَنَّهُنَّ جَعَلْنَ رَأْسَ ابْنَةَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثَلاَثَةَ قُرُونٍ ، قُلْتُ : نَقَضْنَهُ وَجَعَلْنَهُ ثَلاَثَةَ قُرُونٍ ؟ قَالَتْ : نَعَمْ.

1883. ...Ummu Atiyyə رضي الله عنها rəvayət edir ki, Peyğəmbərin ﷺ qızını yuyan qadınlar meyitin saçına üç hörük vurdular. Mən dedim: "Onun saçını açıb üç hörük vurdunuz?" Onlar: "Bəli"- dedilər.

## ٣١ - مَيَامِنُ الْمَيِّتِ وَمَوَاضِعُ الْوُضُوءِ مِنْهُ
## 31-ci fəsil: Öləni yuduqda sağ tərəfindən və dəstəmaz əzalarından başlamaq

١٨٨٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا أَحْمَدُ بْنُ مُحَمَّدِ بْنِ حَنْبَلٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ خَالِدٍ ، عَنْ حَفْصَةَ ، عَنْ أُمِّ عَطِيَّةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ فِي غَسْلِ ابْنَتِهِ : ابْدَأْنَ بِمَيَامِنِهَا وَمَوَاضِعِ الْوُضُوءِ مِنْهَا.

1884. ...Ummu Atiyyə رضي الله عنها rəvayət edir ki, Allah Elçisinin ﷺ qızının cənazəsini yuduqda Allah Elçisi ﷺ dedi: "Sağ tərəfindən və dəstəmaz əzalarından yumağa başlayın".

## ٣٢ - غَسْلُ الْمَيِّتِ وِتْرًا
## 32-ci fəsil: Öləni tək sayda yumaq

١٨٨٥ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، قَالَ : حَدَّثَتْنَا حَفْصَةُ ، عَنْ أُمِّ عَطِيَّةَ قَالَتْ : مَاتَتْ إِحْدَى بَنَاتِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَرْسَلَ إِلَيْنَا فَقَالَ : اغْسِلْنَهَا بِمَاءٍ وَسِدْرٍ ، وَاغْسِلْنَهَا وِتْرًا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ سَبْعًا إِنْ رَأَيْتُنَّ ذَلِكِ ، وَاجْعَلْنَ فِي الآخِرَةِ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، فَلَمَّا فَرَغْنَا آذَنَّاهُ ، فَأَلْقَى إِلَيْنَا حَقْوَهُ وَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ ، وَمَشَطْنَاهَا ثَلاَثَةَ قُرُونٍ ، وَأَلْقَيْنَاهَا مِنْ خَلْفِهَا.

1885. ...Rəvayət edilir ki, Ummu Atiyyə رضي الله عنها demişdir: "Peyğəmbərin ﷺ qızlarından biri vəfat etmişdi. Peyğəmbər ﷺ bizə xəbər göndərərək belə

[1] Hədisin isnadı zəifdir.

buyurdu: “Onu su və sidr ilə tək sayda – üç, beş və ya yeddi dəfə yuyun. Bunun kifayət etdiyini görsəniz, axırıncı dəfədə kafur istifadə edin. İşinizi tamamladıqdan sonra mənə xəbər verin”. Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: “Onu buna bükün!” Biz onun saçlarını darayıb üç hörük vurduq və arxa tərəfinə keçirdik”.

## ٣٣ - غَسْلُ الْمَيِّتِ أَكْثَرَ مِنْ خَمْسٍ

## 33-cü fəsil: Meyiti beş dəfədən çox yumaq

١٨٨٦ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ أُمِّ عَطِيَّةَ قَالَتْ : دَخَلَ عَلَيْنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَنَحْنُ نَغْسِلُ ابْنَتَهُ ، فَقَالَ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ذَلِكِ ، بِمَاءٍ وَسِدْرٍ ، وَاجْعَلْنَ فِي الآخِرَةِ كَافُورًا أَوْ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، فَلَمَّا فَرَغْنَا آذَنَّاهُ ، فَأَلْقَى إِلَيْنَا حِقْوَهُ وَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ.

1886. ...Rəvayət edilir ki, Ummu Atiyyə رضي الله عنها demişdir: “Biz Allah Elçisinin ﷺ vəfat etmiş qızını yuyarkən Allah Elçisi ﷺ bizim yanımıza gəldi və dedi: “Onu su və sidr ilə üç, beş, lazım olsa, bundan çox yuyun. Axırıncısına kafur və ya ona bənzər bir şey qatın. Bitirdikdən sonra mənə xəbər verin”. Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: “Onu buna bükün!”

## ٣٤ - غَسْلُ الْمَيِّتِ أَكْثَرَ مِنْ سَبْعَةٍ

## 34-cü fəsil: Meyiti yeddi dəfədən çox yumaq

١٨٨٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ مُحَمَّدٍ ، عَنْ أُمِّ عَطِيَّةَ قَالَتْ : تُوُفِّيَتْ إِحْدَى بَنَاتِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَرْسَلَ إِلَيْنَا ، فَقَالَ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ، بِمَاءٍ وَسِدْرٍ ، وَاجْعَلْنَ فِي الآخِرَةِ كَافُورًا أَوْ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، فَلَمَّا فَرَغْنَا آذَنَّاهُ ، فَأَلْقَى إِلَيْنَا حِقْوَهُ وَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ

1887. ...Rəvayət edilir ki, Ummu Atiyyə رضي الله عنها demişdir: “Peyğəmbərin ﷺ qızlarından biri vəfat etmişdi. Peyğəmbər ﷺ bizə xəbər göndərərək belə buyurdu: “Onu su və sidr ilə üç, beş və ya daha çox sayda yuyun. Son yumada kafur və ya ona bənzər bir şey qatın. Bunu tamamladıqdan sonra mənə xəbər verin”. Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: “Onu buna bükün!”

١٨٨٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ حَفْصَةَ ، عَنْ أُمِّ عَطِيَّةَ ، نَحْوَهُ غَيْرَ أَنَّهُ قَالَ : ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ سَبْعًا أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ذَلِكِ.

1888. ...Rəvayət edilir ki, Ummu Atiyyə ﵂ yuxarıdakı hədisi qeyd edərək demişdir: "Üç, beş, yeddi və ya lazım olsa, daha çox sayda yuyun".

١٨٨٩ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرٌ ، عَنْ سَلَمَةَ بْنِ عَلْقَمَةَ ، عَنْ مُحَمَّدٍ ، عَنْ بَعْضِ إِخْوَتِهِ ، عَنْ أُمِّ عَطِيَّةَ قَالَتْ : تُوُفِّيَتِ ابْنَةٌ لِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَمَرَنَا بِغَسْلِهَا ، فَقَالَ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ سَبْعًا أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ، قَالَتْ : قُلْتُ : وِتْرًا ؟ قَالَ : نَعَمْ ، وَاجْعَلْنَ فِي الآخِرَةِ كَافُورًا ، أَوْ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، فَلَمَّا فَرَغْنَا آذَنَّاهُ ، فَأَعْطَانَا حِقْوَهُ وَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ.

1889. ...Rəvayət edilir ki, Ummu Atiyyə ﵂ demişdir: "Allah Elçisinin ﷺ qızı vəfat etmişdi. O, bizə qızını yumağı əmr edərək dedi: "Onu su və sidr ilə üç, beş, yeddi və ya ehtiyac olsa, daha çox sayda yuyun". Mən dedim: "Tək sayda?" Peyğəmbər ﷺ dedi: "Bəli, son yumada kafur və ya ona bənzər bir şeylə yuyun. Bunu tamamladıqdan sonra mənə xəbər verin". Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: "Onu buna bükün!"

## ٣٥ - الْكَافُورُ فِي غَسْلِ الْمَيِّتِ

## 35-ci fəsil: Meyiti yuduqda kafurdan istifadə etmək

١٨٩٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ مُحَمَّدٍ ، عَنْ أُمِّ عَطِيَّةَ قَالَتْ : أَتَانَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَنَحْنُ نَغْسِلُ ابْنَتَهُ فَقَالَ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ذَلِكِ ، بِمَاءٍ وَسِدْرٍ ، وَاجْعَلْنَ فِي الآخِرَةِ كَافُورًا ، أَوْ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، فَلَمَّا فَرَغْنَا آذَنَّاهُ ، فَأَلْقَى إِلَيْنَا حِقْوَهُ وَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ ، قَالَ : أَوْ قَالَتْ حَفْصَةُ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا أَوْ سَبْعًا ، قَالَ : وَقَالَتْ أُمُّ عَطِيَّةَ : مَشَطْنَاهَا ثَلاَثَةَ قُرُونٍ.

1890. ...Rəvayət edilir ki, Ummu Atiyyə ﵂ demişdir: "Biz Allah Elçisinin ﷺ vəfat etmiş qızını yuyarkən Allah Elçisi ﷺ bizim yanımıza gəldi və dedi: "Onu su və sidr ilə üç, beş, ehtiyac olsa, daha çox sayda yuyun. Axırıncısına kafur və ya ona bənzər şeylə yuyun. İşinizi tamamladıqdan sonra mənə xəbər verin". Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: "Onu buna bükün!" Digər rəvayətdə Həfsa dedi: "Onu üç, beş və ya yeddi dəfə yuyun". Ummu Atiyyə dedi: "Biz onun saçını daradıq və saçına üç hörük vurduq".

١٨٩١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ مُحَمَّدٍ ، قَالَ : أَخْبَرَتْنِي حَفْصَةُ ، عَنْ أُمِّ عَطِيَّةَ ، قَالَتْ : وَجَعَلْنَا رَأْسَهَا ثَلاَثَةَ قُرُونٍ.

1891. ...Rəvayət edilir ki, Ummu Atiyyə ﵂ demişdir: "Biz onun saçını daradıq və saçına üç hörük vurduq".

١٨٩٢ - أَخْبَرَنَا قُتَيْبَةُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، وَقَالَتْ حَفْصَةُ ، عَنْ أُمِّ عَطِيَّةَ ، وَجَعَلْنَا رَأْسَهَا ثَلاَثَةَ قُرُونٍ.

1892. ...Rəvayət edilir ki, Ummu Atiyyə ﵂ demişdir: "Biz onun saçını daradıq və saçına üç hörük vurduq".

## ٣٦ - الإِشْعَارُ

## 36-cı fəsil: Meyitə paltar geyindirmək

١٨٩٣ - أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَيُّوبُ بْنُ أَبِي تَمِيمَةَ ، أَنَّهُ سَمِعَ مُحَمَّدَ بْنَ سِيرِينَ ، يَقُولُ : كَانَتْ أُمُّ عَطِيَّةَ امْرَأَةٌ مِنَ الأَنْصَارِ قَدِمَتْ تُبَادِرُ ابْنًا لَهَا ، فَلَمْ تُدْرِكْهُ ، حَدَّثَتْنَا قَالَتْ : دَخَلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَيْنَا وَنَحْنُ نَغْسِلُ ابْنَتَهُ فَقَالَ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ، بِمَاءٍ وَسِدْرٍ ، وَاجْعَلْنَ فِي الآخِرَةِ كَافُورًا أَوْ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، فَلَمَّا فَرَغْنَا أَلْقَى إِلَيْنَا حِقْوَهُ وَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ ، وَلَمْ يَزِدْ عَلَى ذَلِكَ ، قَالَ : لاَ أَدْرِي أَيُّ بَنَاتِهِ قَالَ : قُلْتُ : مَا قَوْلُهُ أَشْعِرْنَهَا إِيَّاهُ ؟ أَتُؤَزَّرُ بِهِ ؟ قَالَ : لاَ أُرَاهُ إِلاَّ أَنْ يَقُولَ الْفُفْنَهَا فِيهِ.

1893. ...Rəvayət edilir ki, Muhəmməd ibn Sirin ﵀ demişdir: "Ummu Atiyyə ənsardan olan bir qadın idi. Övladı ondan qabaq vəfat etmişdi. Bizə bir hadisəni danışdı: "Biz Allah Elçisinin ﷺ vəfat etmiş qızını yuyarkən Allah Elçisi ﷺ bizim yanımıza gəldi və dedi: "Onu su və sidr ilə üç, beş, ehtiyac olsa, daha çox sayda yuyun. Axırıncısına kafur və ya ona bənzər bir şeylə yuyun. Onu yuduqdan sonra mənə xəbər verin". Biz (onu yuyub) qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: "Onu buna bükün!" Bunun üzərinə heç bir şey əlavə etmədi. Mən bilmirəm bu hansı qızı idi". Mən Ummu Atiyyəyə dedim: "İzarına bükmək" nə mənada idi?" O dedi: "Örtmək mənasında idi".

١٨٩٤ - أَخْبَرَنَا شُعَيْبُ بْنُ يُوسُفَ النَّسَائِيُّ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ ، قَالَ : حَدَّثَنَا ابْنُ عَوْنٍ ، عَنْ مُحَمَّدٍ ، عَنْ أُمِّ عَطِيَّةَ قَالَتْ : تُوُفِّيَ إِحْدَى بَنَاتِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : اغْسِلْنَهَا ثَلاَثًا أَوْ خَمْسًا ، أَوْ أَكْثَرَ مِنْ ذَلِكِ إِنْ رَأَيْتُنَّ ذَلِكِ ، وَاغْسِلْنَهَا بِالسِّدْرِ وَالْمَاءِ ، وَاجْعَلْنَ فِي آخِرِ ذَلِكِ كَافُورًا أَوْ شَيْئًا مِنْ كَافُورٍ ، فَإِذَا فَرَغْتُنَّ فَآذِنَّنِي ، قَالَتْ : فَآذَنَّاهُ ، فَأَلْقَى إِلَيْنَا حِقْوَهُ فَقَالَ : أَشْعِرْنَهَا إِيَّاهُ.

1894. ...Rəvayət edilir ki, Ummu Atiyyə ﵂ demişdir: “Allah Elçisinin ﷺ qızlarından biri vəfat etmişdi. O dedi: “Onu üç, beş, ehtiyac olsa, daha çox sayda sidr və su ilə yuyun. Axırıncısına kafur və ya ona bənzər bir qoxu qatın. Onu yuduqdan sonra mənə xəbər verin”. Biz (onu yuyub qurtardıqdan sonra) Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını bizə verib dedi: “Onu buna bükün!”

### ٣٧ - الأَمْرُ بِتَحْسِينِ الْكَفَنِ

### 37-ci fəsil: Kəfəni gözəl etməyin əmr edilməsi

١٨٩٥ - أَخْبَرَنَا عَبْدُ الرَّحْمَنِ بْنُ خَالِدٍ الرَّقِّيُّ الْقَطَّانُ ، وَيُوسُفُ بْنُ سَعِيدٍ ، وَاللَّفْظُ لَهُ ، قَالَ : أَنْبَأَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ جَابِرًا يَقُولُ : خَطَبَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَ رَجُلاً مِنْ أَصْحَابِهِ مَاتَ فَقُبِرَ لَيْلاً ، وَكُفِّنَ فِي كَفَنٍ غَيْرِ طَائِلٍ ، فَزَجَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يُقْبَرَ إِنْسَانٌ لَيْلاً إِلاَّ أَنْ يُضْطَرَّ إِلَى ذَلِكَ ، وَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا وَلِيَ أَحَدُكُمْ أَخَاهُ فَلْيُحَسِّنْ كَفَنَهُ.

1895. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Allah Elçisi ﷺ xütbə verərkən səhabələrindən bir kişinin ölməsi və bədəni tam örtməyən kəfənlə kəfənlənərək gecə dəfn olunması haqda danışdı. O, zərurət olmadığı müddətcə insanı gecə vaxtı dəfn etmkdən çəkindirdi. Sonra da dedi: “Sizdən biriniz (ölən) qardaşını dəfn etmək istədikdə onun kəfənini gözəl etsin”.

### ٣٨ - أَيُّ الْكَفَنِ خَيْرٌ

### 38-ci fəsil: Hansı kəfən daha xeyirlidir?

١٨٩٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : أَنْبَأَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : سَمِعْتُ سَعِيدَ بْنَ أَبِي عَرُوبَةَ يُحَدِّثُ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَبِي الْمُهَلَّبِ ، عَنْ سَمُرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الْبَسُوا مِنْ ثِيَابِكُمُ الْبَيَاضَ ، فَإِنَّهَا أَطْهَرُ وَأَطْيَبُ ، وَكَفِّنُوا فِيهَا مَوْتَاكُمْ.

1896. ...Səmura ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Libaslarınızı ağ parçalardan edin! O, daha təmiz və daha yaxşıdır. Ölülərinizi də ağ (parçalar) ilə kəfənləyin!”

### ٣٩ - كَفَنُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

### 39-cu fəsil: Peyğəmbərin ﷺ kəfəni

١٨٩٧ - أَخْبَرَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُفِّنَ

النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي ثَلاَثَةِ أَثْوَابٍ سُحُولِيَّةٍ بِيضٍ.

1897. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Peyğəmbəri ﷺ Suhuliyyə şəhərində hazırlanmış üç ədəd ağappaq parça ilə kəfənlədilər”.

١٨٩٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ هِشَامِ بْنِ عُرْوَةَ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كُفِّنَ فِي ثَلاَثَةِ أَثْوَابٍ بِيضٍ سُحُولِيَّةٍ لَيْسَ فِيهَا قَمِيصٌ وَلاَ عِمَامَةٌ.

1898. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ Suhuliyyə şəhərində hazırlanmış üç ədəd ağappaq pambıq parça ilə kəfənləndi. Bunların arasında köynək və əmmamə yox idi”.

١٨٩٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَفْصٌ ، عَنْ هِشَامٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : كُفِّنَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي ثَلاَثَةِ أَثْوَابٍ بِيضٍ يَمَانِيَةٍ كُرْسُفٍ لَيْسَ فِيهَا قَمِيصٌ ، وَلاَ عِمَامَةٌ ، فَذُكِرَ لِعَائِشَةَ قَوْلُهُمْ فِي ثَوْبَيْنِ وَبُرْدٍ مِنْ حِبَرَةٍ ، فَقَالَتْ : قَدْ أُتِيَ بِالْبُرْدِ وَلَكِنَّهُمْ رَدُّوهُ وَلَمْ يُكَفِّنُوهُ فِيهِ.

1899. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: Allah Elçisi ﷺ Yəməndən olan üç ədəd ağappaq pambıq parçaya bürüdülər. Bunların arasında köynək və əmmamə yox idi”. Aişəyə Peyğəmbərin ﷺ iki paltar – mil-mil parçadan olan əbaya qoyulduğu deyildikdə, Aişə dedi: “Həqiqətən, onun üçün əba gətirilmişdi, lakin səhabələr bununla razılaşmadılar və onu bununla kəfənləmədilər”.

## ٤٠ - الْقَمِيصُ فِي الْكَفَنِ

## 40-cı fəsil: Köynək ilə kəfənlənmək

١٩٠٠ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا عُبَيْدُ اللهِ ، قَالَ : حَدَّثَنَا نَافِعٌ ، عَنْ عَبْدِ اللهِ بْنِ عُمَرَ قَالَ : لَمَّا مَاتَ عَبْدُ اللهِ بْنُ أُبَيٍّ جَاءَ ابْنُهُ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : اعْطِنِي قَمِيصَكَ حَتَّى أُكَفِّنَهُ فِيهِ ، وَصَلِّ عَلَيْهِ ، وَاسْتَغْفِرْ لَهُ ، فَأَعْطَاهُ قَمِيصَهُ ثُمَّ قَالَ : إِذَا فَرَغْتُمْ فَآذِنُونِي أُصَلِّي عَلَيْهِ ، فَجَذَبَهُ عُمَرُ وَقَالَ : قَدْ نَهَاكَ اللَّهُ أَنْ تُصَلِّيَ عَلَى الْمُنَافِقِينَ ، فَقَالَ : أَنَا بَيْنَ خِيرَتَيْنِ ، قَالَ : اسْتَغْفِرْ لَهُمْ ، أَوْ لاَ تَسْتَغْفِرْ لَهُمْ ، فَصَلَّى عَلَيْهِ ، فَأَنْزَلَ اللَّهُ تَعَالَى : **{وَلاَ تُصَلِّ عَلَى أَحَدٍ مِنْهُمْ مَاتَ أَبَدًا وَلاَ تَقُمْ عَلَى قَبْرِهِ}** فَتَرَكَ الصَّلاَةَ عَلَيْهِمْ.

1900. ...Rəvayət edilir ki, Abdullah ibn Ömər ﵄ demişdir: “Abdullah ibn Ubey öldükdə onun oğlu Peyğəmbərin ﷺ yanına gələrək belə dedi: “(Ey Allahın Elçisi!) köynəyini ver, atamı ona bürüyək, onun namazını qıl və

onun üçün (Allahdan) bağışlanma dilə". Peyğəmbər ﷺ köynəyini ona verib dedi: "Kəfənlədikdən sonra mənə xəbər verin ki, onun (cənazə) namazını qılım". Bu zaman Ömər onun ətəyindən dartıb dedi: "Axı Allah sənə münafiqlərin cənazə namazını qılmağı qadağan edib". Peyğəmbər ﷺ dedi: "Mən (onların cənazə namazını qılıb-qılmamaqda) ixtiyar sahibiyəm!"– deyib bu ayəni oxudu: **"Onların bağışlanması üçün dua etsən də, etməsən də..."** (ət-Tövbə, 80)". Sonra Peyğəmbər ﷺ onun cənazə namazını qıldı və Uca Allah bu ayəni nazil etdi: **"Heç vaxt onlardan ölmüş bir kəsin cənazə namazını qılma, qəbrinin başında da durma!"** (ət-Tövbə, 84). Bundan sonra Peyğəmbər ﷺ onlara cənazə namazı qılmağı tərk etdi".

١٩٠١ - أَخْبَرَنَا عَبْدُ الْجَبَّارِ بْنُ الْعَلاَءِ بْنِ عَبْدِ الْجَبَّارِ ، عَنْ سُفْيَانَ ، عَنْ عَمْرٍو ، قَالَ : سَمِعْتُ جَابِرًا يَقُولُ : أَتَى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَبْرَ عَبْدِ اللهِ بْنِ أُبَيٍّ وَقَدْ وُضِعَ فِي حُفْرَتِهِ ، فَوَقَفَ عَلَيْهِ ، فَأَمَرَ بِهِ فَأُخْرِجَ لَهُ ، فَوَضَعَهُ عَلَى رُكْبَتَيْهِ ، وَأَلْبَسَهُ قَمِيصَهُ ، وَنَفَثَ عَلَيْهِ مِنْ رِيقِهِ ، وَاللَّهُ تَعَالَى أَعْلَمُ.

1901. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Abdullah ibn Ubey dəfn olunduqdan sonra Peyğəmbər ﷺ onun qəbrinin yanına gəldi. O, qəbirə qoyulmuşdu, Peyğəmbər ﷺ də bir qədər orda dayandı və qəbirdən çıxarılmasını əmr etdi. Ölü qəbirdən çıxarıldı. Peyğəmbər ﷺ onu dizlərinin üstünə qoydu, köynəyini ona geyindirdi və ona yüngülcə tüpürdü".

١٩٠٢ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدِ بْنِ عَبْدِ الرَّحْمَنِ الزُّهْرِيُّ الْبَصْرِيُّ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، سَمِعَ جَابِرًا ، يَقُولُ : وَكَانَ الْعَبَّاسُ بِالْمَدِينَةِ ، فَطَلَبَتِ الأَنْصَارُ ثَوْبًا يَكْسُونَهُ ، فَلَمْ يَجِدُوا قَمِيصًا يَصْلُحُ عَلَيْهِ إِلاَّ قَمِيصَ عَبْدِ اللهِ بْنِ أُبَيٍّ فَكَسَوْهُ إِيَّاهُ.

1902. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Abbas Mədinəyə gəlmişdi. Ənsar onu geyindirmək üçün bir paltar axtardı, lakin Abdullah ibn Ubeyin köynəyindən başqa uyğun olan paltar tapmadılar və (o köynəyi) ona geyindirdilər".

١٩٠٣ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ الأَعْمَشِ وأَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ الْقَطَّانُ ، قَالَ : سَمِعْتُ الأَعْمَشَ ، قَالَ : سَمِعْتُ شَقِيقًا ، قَالَ : حَدَّثَنَا خَبَّابٌ ، قَالَ : هَاجَرْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَبْتَغِي وَجْهَ اللهِ تَعَالَى ، فَوَجَبَ أَجْرُنَا عَلَى اللهِ ، فَمِنَّا مَنْ مَاتَ لَمْ يَأْكُلْ مِنْ أَجْرِهِ شَيْئًا ، مِنْهُمْ مُصْعَبُ بْنُ عُمَيْرٍ قُتِلَ يَوْمَ أُحُدٍ فَلَمْ نَجِدْ شَيْئًا نُكَفِّنُهُ فِيهِ إِلاَّ نَمِرَةً ، كُنَّا إِذَا غَطَّيْنَا رَأْسَهُ خَرَجَتْ رِجْلاَهُ ، وَإِذَا غَطَّيْنَا بِهَا رِجْلَيْهِ خَرَجَتْ رَأْسُهُ ، فَأَمَرَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ نُغَطِّيَ بِهَا رَأْسَهُ ، وَنَجْعَلَ عَلَى رِجْلَيْهِ إِذْخِرًا ، وَمِنَّا مَنْ أَيْنَعَتْ لَهُ ثَمَرَتُهُ فَهُوَ يَهْدِبُهَا وَاللَّفْظُ لِإِسْمَعِيلَ.

1903. ...Rəvayət edilir ki, Xabbab ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə birlikdə Allahın Üzünü diləyərək (Allah rizası üçün Məkkədən Mədinəyə) hicrət etdik və buna görə də Allah bizi mükafatlandırdı. Bizimlə hicrət edənlərdən bəziləri dünyalarını dəyişdilər, o savabdan qazanmadılar və o nemətlərdən yeyə bilmədilər. Musab ibn Umeyr o kimsələrdən idi və Uhud döyüşündə şəhid olmuşdu. Biz onu kəfənləmək üçün (onun əynindəki) libasdan başqa bir şey tapa bilmədik. Bu libasla onun baş tərəfini örtdükdə ayaqları açıq qalırdı, ayaqlarını örtdükdə isə başı açıq qalırdı. Onda Peyğəmbər ﷺ bizə (bu libasla) onun baş tərəfini örtməyi, ayaqlarının üstünə də ətirli qamış qoymağı əmr etdi. Hicrət edənlər arasında belə kimsələr olduğu kimi hicrətin bəhrəsini əldə edənlər də oldu".

٤١ - كَيْفَ يُكَفَّنُ الْمُحْرِمُ إِذَا مَاتَ

## 41-ci fəsil: Ehramlı kimsə vəfat etdikdə necə kəfənlənir?

١٩٠٤ - أَخْبَرَنَا عُتْبَةُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا يُونُسُ بْنُ نَافِعٍ ، عَنْ عَمْرِو بْنِ دِينَارٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اغْسِلُوا الْمُحْرِمَ فِي ثَوْبَيْهِ اللَّذَيْنِ أَحْرَمَ فِيهِمَا ، وَاغْسِلُوهُ بِمَاءٍ وَسِدْرٍ ، وَكَفِّنُوهُ فِي ثَوْبَيْهِ ، وَلاَ تُمِسُّوهُ بِطِيبٍ ، وَلاَ تُخَمِّرُوا رَأْسَهُ ، فَإِنَّهُ يُبْعَثُ يَوْمَ الْقِيَامَةِ مُحْرِمًا.

1904. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ehramlı ikən vəfat edəni geyindiyi iki parça ilə birlikdə su və sidr ilə yuyun və iki parçaya bürüyün; ona ətir vurmayın, başını da örtməyin, çünki o, Qiyamət günü ehramlı həşr[1] olunacaq".

٤٢ - الْمِسْكُ

## 42-ci fəsil: Müşk

١٩٠٥ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، وَشَبَابَةُ ، قَالاَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ خُلَيْدِ بْنِ جَعْفَرٍ ، سَمِعَ أَبَا نَضْرَةَ ، عَنْ أَبِي سَعِيدٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَطْيَبُ الطِّيبِ الْمِسْكُ.

1905. ...Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ətirlərinizdən ən yaxşısı müşkdür".

[1] Həşr – "Qiyamət günü dirildilmək" deməkdir.

١٩٠٦ - أَخْبَرَنَا عَلِيُّ بْنُ الْحُسَيْنِ الدِّرْهَمِيُّ ، قَالَ : حَدَّثَنَا أُمَيَّةُ بْنُ خَالِدٍ ، عَنِ الْمُسْتَمِرِّ بْنِ الرَّيَّانِ ، عَنْ أَبِي نَضْرَةَ ، عَنْ أَبِي سَعِيدٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مِنْ خَيْرِ طِيبِكُمُ الْمِسْكُ.

1906. ...Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ətirlərinizdən ən xeyirlisi müşkdür”.

### ٤٣ - الإِذْنُ بِالْجَنَازَةِ

### 43-cü fəsil: Cənazə haqda xəbər vermək

١٩٠٧ - أَخْبَرَنَا قُتَيْبَةُ فِي حَدِيثِهِ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي أُمَامَةَ بْنِ سَهْلِ بْنِ حُنَيْفٍ أَنَّهُ أَخْبَرَهُ ، أَنَّ مِسْكِينَةً مَرِضَتْ ، فَأُخْبِرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِمَرَضِهَا ، وَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَعُودُ الْمَسَاكِينَ ، وَيَسْأَلُ عَنْهُمْ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا مَاتَتْ فَآذِنُونِي ، فَأُخْرِجَ بِجَنَازَتِهَا لَيْلاً ، وَكَرِهُوا أَنْ يُوقِظُوا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا أَصْبَحَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُخْبِرَ بِالَّذِي كَانَ مِنْهَا ، فَقَالَ : أَلَمْ آمُرْكُمْ أَنْ تُؤْذِنُونِي بِهَا ، قَالُوا : يَا رَسُولَ اللهِ ، كَرِهْنَا أَنْ نُوقِظَكَ لَيْلاً ، فَخَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَتَّى صَفَّ بِالنَّاسِ عَلَى قَبْرِهَا ، وَكَبَّرَ أَرْبَعَ تَكْبِيرَاتٍ.

1907. ...Əbu Umamə ibn Səhl ibn Huneyf ﷺ rəvayət edir ki, yoxsul bir qadın xəstələnmişdi. Onun xəstə olması haqda Allah Elçisinə ﷺ xəbər verdilər, çünki Allah Elçisi ﷺ kasıbları ziyarət edər, onların vəziyyətləri haqda soruşardı. Allah Elçisi ﷺ dedi: “Bu qadın ölsə, mənə xəbər verərsiz”. Qadın öldükdə səhabələr Allah Elçisini ﷺ oyatmaq istəmədilər və qadının cənazə namazını qılıb gecə ikən dəfn etdilər. Səhər olduqda olanları Allah Elçisinə ﷺ xəbər verdikdə o dedi: “Mən sizə onun ölümünü xəbər verməniziəmr etməmişdim!?” Səhabələr dedilər: “Ey Allahın Elçisi, biz səni gecə vaxtı oyatmaq istəmədik”. Onda Allah Elçisi ﷺ çıxıb onun qəbrinin yanında insanları səfə düzdü və dörd təkbir edərək cənazə namazını yenidən qıldı”.

### ٤٤ - السُّرْعَةُ بِالْجَنَازَةِ

### 44-cü fəsil: Cənazəni iti addımlarla aparmaq

١٩٠٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ ابْنِ أَبِي ذِئْبٍ ، عَنْ سَعِيدٍ الْمَقْبُرِيِّ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ مِهْرَانَ ، أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : إِذَا وُضِعَ الرَّجُلُ الصَّالِحُ عَلَى سَرِيرِهِ ، قَالَ : قَدِّمُونِي قَدِّمُونِي، وَإِذَا وُضِعَ الرَّجُلُ – يَعْنِي السُّوءَ – عَلَى سَرِيرِهِ ، قَالَ : يَا وَيْلِي أَيْنَ تَذْهَبُونَ بِي.

1908. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Əməlisaleh adam tabuta qoyulduqda:

“Məni tez aparın! Məni tez aparın!”- deyər. Pis adam tabuta qoyulduqda: “Vay olsun mənə! Məni hara aparırsınız?”- deyər”.

١٩٠٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِيهِ ، أَنَّهُ سَمِعَ أَبَا سَعِيدٍ الْخُدْرِيَّ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا وُضِعَتِ الْجَنَازَةُ فَاحْتَمَلَهَا الرِّجَالُ عَلَى أَعْنَاقِهِمْ ، فَإِنْ كَانَتْ صَالِحَةً قَالَتْ : قَدِّمُونِي قَدِّمُونِي ، وَإِنْ كَانَتْ غَيْرَ صَالِحَةٍ ، قَالَتْ : يَا وَيْلَهَا إِلَى أَيْنَ تَذْهَبُونَ بِهَا ، يَسْمَعُ صَوْتَهَا كُلُّ شَيْءٍ إِلاَّ الإِنْسَانَ ، وَلَوْ سَمِعَهَا الإِنْسَانُ لَصَعِقَ.

1909. ...Rəvayət edilir ki, Əbu Səid əl-Xudri ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Cənazə (hazırlanıb mafəyə[1]) qoyulduğu və kişilər onu çiyinlərinə aldığı zaman, əgər ölən adam əməlisaleh olmuşdursa: “Məni tez aparın!”- deyər, yox, əgər əməlisaleh adam olmamışsa: “Vay halıma! Məni hara aparırsınız?”- deyər. Onun səsini insanlardan başqa hamı eşidər. Əgər insan bu səsi eşitsəydi, huşunu itirib yerə yıxılardı”.

١٩١٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، يَبْلُغُ بِهِ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ: أَسْرِعُوا بِالْجَنَازَةِ ، فَإِنْ تَكُ صَالِحَةً فَخَيْرٌ تُقَدِّمُونَهَا إِلَيْهِ ، وَإِنْ تَكُ غَيْرَ ذَلِكَ فَشَرٌّ تَضَعُونَهُ عَنْ رِقَابِكُمْ.

1910. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Cənazəni (dəfn etməyə) iti addımlarla aparın! Əgər o, əməlisaleh olmuşdursa, siz onu xeyrə qovuşdurmuş olarsınız. Yox, əgər əməlisaleh adam olmamışdırsa, (tezliklə) şəri boynunuzdan atmış olarsınız”.

١٩١١ - أَخْبَرَنَا سُوَيْدٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : حَدَّثَنِي أَبُو أُمَامَةَ بْنُ سَهْلٍ ، أَنَّ أَبَا هُرَيْرَةَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : أَسْرِعُوا بِالْجَنَازَةِ فَإِنْ كَانَتْ صَالِحَةً قَدَّمْتُمُوهَا إِلَى الْخَيْرِ ، وَإِنْ كَانَتْ غَيْرَ ذَلِكَ كَانَتْ شَرًّا تَضَعُونَهُ عَنْ رِقَابِكُمْ.

1911. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: “Cənazəni (dəfn etməyə) iti addımlarla aparın! Əgər o, əməlisaleh adam olmuşdursa, siz onu xeyrə qovuşdurmuş olarsınız. Yox, əgər əməlisaleh adam olmamışdırsa, (tezliklə) şəri boynunuzdan atmış olarsınız”.

١٩١٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : أَنْبَأَنَا عُيَيْنَةُ بْنُ عَبْدِ الرَّحْمَنِ بْنِ يُونُسَ ، قَالَ : حَدَّثَنِي أَبِي ، قَالَ : شَهِدْتُ جِنَازَةَ عَبْدِ الرَّحْمَنِ بْنِ سَمُرَةَ وَخَرَجَ زِيَادٌ يَمْشِي بَيْنَ يَدَيِ السَّرِيرِ ، فَجَعَلَ رِجَالٌ مِنْ أَهْلِ عَبْدِ الرَّحْمَنِ وَمَوَالِيهِمْ

[1] Mafə - içərisinə tabut qoyulub aparılan xərək.

يَسْتَقْبِلُونَ السَّرِيرَ وَيَمْشُونَ عَلَى أَعْقَابِهِمْ ، وَيَقُولُونَ : رُوَيْدًا رُوَيْدًا بَارَكَ اللَّهُ فِيكُمْ ، فَكَانُوا يَدِبُّونَ دَبِيبًا حَتَّى إِذَا كُنَّا بِبَعْضِ طَرِيقِ الْمِرْبَدِ لَحِقَنَا أَبُو بَكْرَةَ عَلَى بَغْلَةٍ ، فَلَمَّا رَأَى الَّذِي يَصْنَعُونَ حَمَلَ عَلَيْهِمْ بِبَغْلَتِهِ ، وَأَهْوَى إِلَيْهِمْ بِالسَّوْطِ ، وَقَالَ : خَلُّوا ، فَوَالَّذِي أَكْرَمَ وَجْهَ أَبِي الْقَاسِمِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَقَدْ رَأَيْتُنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَإِنَّا لَنَكَادُ نَرْمُلُ بِهَا رَمَلاً ، فَانْبَسَطَ الْقَوْمُ.

1912. ...Uyeynə ibn Abdur-Rahmən ibn Yunus atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Mən Abdur-Rahmən ibn Səmuranın cənazəsində iştirak edirdim. Ziyad tabutun önündə gedirdi. Abdur-Rahmənin ailəsindən olan kişilər və azad etdiyi kölələr tabutun arxası ilə ağır-ağır addımlayaraq deyirdilər: “Yavaş-yavaş götürün! Allah sizə bərəkət versin!” Əbu Bəkrə qatırının üzərində “Mirbəd” deyilən yerdə bizə çatdı. Onların etdiklərini gördükdə qatırı ilə onların üzərinə gəldi və qamçısı ilə onlara irəli işarə edərək dedi: “Aralanın! Əbul-Qasimi ﷺ şərəfləndirənə and olsun ki, biz Allah Elçisi ﷺ ilə birlikdə cənazəni iti addımlarla aparardıq”. İnsanlar aralaşdılar və cənazəni sürətlə aparmağa başladılar”.

١٩١٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، عَنْ إِسْمَعِيلَ ، وَهُشَيْمٌ ، عَنْ عُيَيْنَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي بَكْرَةَ قَالَ : لَقَدْ رَأَيْتُنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَإِنَّا لَنَكَادُ نَرْمُلُ بِهَا رَمَلاً وَاللَّفْظُ حَدِيثُ هُشَيْمٍ.

1913. ...Rəvayət edilir ki, Əbu Bəkrə ﷺ demişdir: “Biz Allah Elçisi ﷺ ilə birlikdə cənazəni iti addımlarla aparardıq”.

١٩١٤ - أَخْبَرَنَا يَحْيَى بْنُ دُرُسْتَ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْمَعِيلَ ، عَنْ يَحْيَى ، أَنَّ أَبَا سَلَمَةَ حَدَّثَهُ ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا مَرَّتْ بِكُمْ جِنَازَةٌ فَقُومُوا ، فَمَنْ تَبِعَهَا فَلاَ يَقْعُدْ حَتَّى تُوضَعَ.

1914. ...Əbu Səid ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Yanınızdan cənazə keçdikdə ayağa qalxın. Cənazəni müşayiət edən isə cənazə yerə qoyulmadıqca oturmasın”.

### ٤٥ - بَابُ الأَمْرِ بِالْقِيَامِ لِلْجَنَازَةِ

### 45-ci fəsil: Cənazə üçün ayağa qalxmaq

١٩١٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، عَنْ عَامِرِ بْنِ رَبِيعَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا رَأَى أَحَدُكُمُ الْجَنَازَةَ فَلَمْ يَكُنْ مَاشِيًا مَعَهَا ، فَلْيَقُمْ حَتَّى تُخَلِّفَهُ أَوْ تُوضَعَ مِنْ قَبْلِ أَنْ تُخَلِّفَهُ.

1915. ...Amir ibn Rabia ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Kim cənazə gördükdə onu müşayiət etmək istəməsə, cənazə onun yanından keçənə və ya bir yerə qoyulana qədər ayaq üstə dursun”.

١٩١٦ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَامِرِ بْنِ رَبِيعَةَ الْعَدَوِيِّ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ قَالَ : إِذَا رَأَيْتُمُ الْجَنَازَةَ فَقُومُوا حَتَّى تُخَلِّفَكُمْ أَوْ تُوضَعَ.

1916. ...Amir ibn Rabia əl-Adəvi ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Cənazə gördüyünüz zaman yanınızdan keçənə və ya bir yerə qoyulana qədər ayaq üstə durun!"

١٩١٧ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ هِشَامٍ (ح) وأَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ: حَدَّثَنَا هِشَامٌ ، عَنْ يَحْيَى ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي سَعِيدٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا رَأَيْتُمُ الْجَنَازَةَ فَقُومُوا ، فَمَنْ تَبِعَهَا فَلاَ يَقْعُدْ حَتَّى تُوضَعَ.

1917. ...Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Cənazə gördüyünüz zaman ayağa qalxın! Cənazəni müşayiət edən cənazə yerə qoyulmadan oturmasın!"

١٩١٨ - أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنْ ابْنِ جُرَيْجٍ ، عَنْ ابْنِ عَجْلاَنَ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، وَأَبِي سَعِيدٍ ، قَالاَ : مَا رَأَيْنَا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ شَهِدَ جِنَازَةً قَطُّ فَجَلَسَ حَتَّى تُوضَعَ.

1918. ...Rəvayət edilir ki, Əbu Hureyra və Əbu Səid ﷺ demişlər: "Allah Elçisinin ﷺ iştirak etdiyi heç bir cənazədə cənazə yerə qoyulmadan oturduğunu görmədik".

١٩١٩ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا زَكَرِيَّا ، عَنِ الشَّعْبِيِّ ، قَالَ : قَالَ أَبُو سَعِيدٍ (ح) وأَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ بْنِ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا أَبُو زَيْدٍ سَعِيدُ بْنُ الرَّبِيعِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي السَّفَرِ ، قَالَ : سَمِعْتُ الشَّعْبِيَّ يُحَدِّثُ ، عَنْ أَبِي سَعِيدٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَرُّوا عَلَيْهِ بِجَنَازَةٍ فَقَامَ وَقَالَ عَمْرٌو : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَرَّتْ بِهِ جِنَازَةٌ فَقَامَ.

1919. ...Səid ﷺ rəvayət edir ki, Allah Elçisinin ﷺ yanından bir cənazə aparıldıqda ayağa durardı. Amr deyir: "Həqiqətən, Allah Elçisinin ﷺ yanından bir cənazə keçdikdə ayağa qalxardı".

١٩٢٠ - أَخْبَرَنِي أَيُّوبُ بْنُ مُحَمَّدٍ الْوَزَّانُ ، قَالَ : حَدَّثَنَا مَرْوَانُ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ حَكِيمٍ ، قَالَ : أَخْبَرَنِي خَارِجَةُ بْنُ زَيْدِ بْنِ ثَابِتٍ ، عَنْ عَمِّهِ يَزِيدَ بْنِ ثَابِتٍ ، أَنَّهُمْ كَانُوا جُلُوسًا مَعَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَطَلَعَتْ جِنَازَةٌ ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَامَ مَنْ مَعَهُ فَلَمْ يَزَالُوا قِيَامًا حَتَّى نَفَذَتْ.

1920. ...Yəzid ibn Sabitin əmisi ﷺ rəvayət edir ki, onlar Allah Elçisi ﷺ ilə birlikdə oturarkən bir cənazəni dəfn etmək üçün aparırdılar. Həmin vaxt Allah Elçisi ﷺ ayağa durdu, yanındakılar da ayağa durdular. Onlar cənazə aparılıb gözdən itənə qədər ayaq üstə dayandılar.

٤٦ - الْقِيَامُ لِجَنَازَةِ أَهْلِ الشِّرْكِ

## 46-cı fəsil: Şirk əhlinin cənazəsi keçdikdə ayağa qalxmaq

١٩٢١ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ أَبِي لَيْلَى ، قَالَ : كَانَ سَهْلُ ابْنُ حُنَيْفٍ ، وَقَيْسُ بْنُ سَعْدِ بْنِ عُبَادَةَ بِالْقَادِسِيَّةِ ، فَمُرَّ عَلَيْهِمَا بِجَنَازَةٍ ، فَقَامَا ، فَقِيلَ لَهُمَا : إِنَّهَا مِنْ أَهْلِ الأَرْضِ ، فَقَالاَ : مُرَّ عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِجَنَازَةٍ فَقَامَ ، فَقِيلَ لَهُ : إِنَّهُ يَهُودِيٌّ ، فَقَالَ : أَلَيْسَتْ نَفْسًا ؟

1921. ...Rəvayət edilir ki, Abdur-Rahmən ibn Əbu Leyla ﷺ demişdir: “Səhl ibn Huneyf və Qeys ibn Səd ibn Ubadə Qadisiyyədə idilər. Onların yanından bir cənazə keçdikdə ikisi də ayağa qalxdı. Onlara dedilər: “Bu cənazə yerli əhalidən olan (qeyri-müsəlmana) aiddir”. Onlar dedilər: “Allah Elçisinin ﷺ yanından bir cənazə keçdikdə Allah Elçisi ﷺ ayağa qalxdı. Ona deyildi: “Axı bu, yəhudinin cənazəsidir”. Allah Elçisi ﷺ buyurdu: “Məgər o, canlı deyildimi?!”

١٩٢٢ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ هِشَامٍ (ح) وأَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ: حَدَّثَنَا هِشَامٌ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ مِقْسَمٍ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ قَالَ : مَرَّتْ بِنَا جَنَازَةٌ فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقُمْنَا مَعَهُ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنَّمَا هِيَ جَنَازَةُ يَهُودِيَّةٍ ، فَقَالَ : إِنَّ لِلْمَوْتِ فَزَعًا ، فَإِذَا رَأَيْتُمُ الْجَنَازَةَ ، فَقُومُوا اللَّفْظُ لِخَالِدٍ.

1922. ...Rəvayət edilir ki, Cabir ibn Abdullah ﷺ demişdir: “Bir dəfə biz Allah Elçisinin ﷺ yanında olarkən yanımızdan bir cənazə keçdi. (Bu vaxt) Allah Elçisi ﷺ ayağa qalxdı və biz də onunla birlikdə ayağa qalxdıq. Mən dedim: “Ey Allahın Elçisi! Axı bu, yəhudinin cənazəsidir”. Allah Elçisi ﷺ dedi: “Həqiqətən, ölüm dəhşətli bir haldır. Cənazə gördüyünüz zaman ayağa qalxın!”

٤٧ - الرُّخْصَةُ فِي تَرْكِ الْقِيَامِ

## 47-ci fəsil: Cənazə keçdikdə ayağa qalxmamaq

١٩٢٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ ابْنِ أَبِي نَجِيحٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ أَبِي مَعْمَرٍ ، قَالَ : كُنَّا عِنْدَ عَلِيٍّ فَمَرَّتْ بِهِ جَنَازَةٌ فَقَامُوا لَهَا ، فَقَالَ عَلِيٌّ : مَا هَذَا ؟ قَالُوا : أَمْرُ أَبِي مُوسَى ، فَقَالَ : إِنَّمَا قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ

لِجَنَازَةِ يَهُودِيَّةٍ وَلَمْ يَعُدْ بَعْدَ ذَلِكَ.

1923. ...Rəvayət edilir ki, Əbu Mə'mər ﵀ demişdir: “Biz Əlinin yanında olarkən bir cənazə keçdi və camaat ayağa qalxdı. Əli dedi: “Bu nədir?” Camaat dedi: “Əbu Musanın əmri belədir”. Əli də belə dedi: “Allah Elçisi ﷺ bir yəhudinin cənazəsi keçdikdə ayağa durmuşdu. Ondan sonra heç vaxt cənazə keçərkən ayağa durmamışdı”.

١٩٢٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ أَيُّوبَ ، عَنْ مُحَمَّدٍ ، أَنَّ جِنَازَةً مَرَّتْ بِالْحَسَنِ بْنِ عَلِيٍّ وَابْنِ عَبَّاسٍ ، فَقَامَ الْحَسَنُ وَلَمْ يَقُمْ ابْنُ عَبَّاسٍ ، فَقَالَ الْحَسَنُ : أَلَيْسَ قَدْ قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِجَنَازَةِ يَهُودِيٍّ ؟ قَالَ ابْنُ عَبَّاسٍ : نَعَمْ ، ثُمَّ جَلَسَ.

1924. ...Muhəmməd ﵀ rəvayət edir ki, Həsən ibn Əli ilə İbn Abbasın yanından bir cənazə keçdi. Həsən ayağa durdu, İbn Abbas isə ayağa durmadı. Həsən İbn Abbasa dedi: “Məgər Allah Elçisi ﷺ bir yəhudinin cənazəsini gördükdə ayağa durmamışdımı?” İbn Abbas dedi: “Bəli, sonra oturmuşdu”.

١٩٢٥ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : أَنْبَأَنَا مَنْصُورٌ ، عَنِ ابْنِ سِيرِينَ ، قَالَ : مُرَّ بِجَنَازَةٍ عَلَى الْحَسَنِ بْنِ عَلِيٍّ ، وَابْنِ عَبَّاسٍ ، فَقَامَ الْحَسَنُ ، وَلَمْ يَقُمِ ابْنُ عَبَّاسٍ ، فَقَالَ الْحَسَنُ لِابْنِ عَبَّاسٍ : أَمَا قَامَ لَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قَالَ ابْنُ عَبَّاسٍ : قَامَ لَهَا ثُمَّ قَعَدَ.

1925. ...Rəvayət edilir ki, İbn Sirin ﵀ demişdir: “Həsən ibn Əli ilə İbn Abbasın yanından bir cənazə keçdi. Həsən ayağa durdu, İbn Abbas isə ayağa durmadı. Həsən İbn Abbasa dedi: “Məgər Allah Elçisi ﷺ cənazə keçdikdə ayağa durmamışdımı?” İbn Abbas: “Bəli, sonra oturmuşdu”.

١٩٢٦ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، عَنْ ابْنِ عُلَيَّةَ ، عَنْ سُلَيْمَانَ التَّيْمِيِّ ، عَنْ أَبِي مِجْلَزٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، وَالْحَسَنِ بْنِ عَلِيٍّ ، مَرَّتْ بِهِمَا جِنَازَةٌ فَقَامَ أَحَدُهُمَا ، وَقَعَدَ الآخَرُ ، فَقَالَ الَّذِي قَامَ : أَمَا وَاللَّهِ ، لَقَدْ عَلِمْتُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ قَامَ ، قَالَ لَهُ الَّذِي جَلَسَ : لَقَدْ عَلِمْتُ أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ جَلَسَ.

1926. ...İbn Abbas ﵄ rəvayət edir ki, onun və Həsən ibn Əlinin yanından bir cənazə keçdi. Biri ayağa durdu, digəri isə oturdu. Ayağa qalxan dedi: “Allaha and olsun ki, mən Allah Elçisinin ﷺ cənazə keçdikdə ayağa durduğunu görmüşəm”. Oturan isə dedi: “Mən Allah Elçisinin ﷺ cənazə keçdikdə oturduğunu görmüşəm”.

١٩٢٧ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ هَارُونَ الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا حَاتِمٌ ، عَنْ جَعْفَرِ بْنِ مُحَمَّدٍ ، عَنْ أَبِيهِ ، أَنَّ الْحَسَنَ بْنَ عَلِيٍّ كَانَ جَالِسًا فَمُرَّ عَلَيْهِ بِجَنَازَةٍ ، فَقَامَ النَّاسُ حَتَّى جَاوَزَتِ الْجَنَازَةُ ، فَقَالَ الْحَسَنُ : إِنَّمَا مُرَّ بِجَنَازَةِ يَهُودِيٍّ وَكَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى طَرِيقِهَا جَالِسًا ، فَكَرِهَ أَنْ تَعْلُوَ رَأْسَهُ جِنَازَةُ يَهُودِيٍّ ، فَقَامَ.

1927. ...Cəfər ibn Muhəmməd atasından ﵁ rəvayət edir ki, bir dəfə Həsən ibn Əlinin oturduğu yerdən cənazə keçdi. Bu zaman insanlar ayağa qalxdılar və cənazə keçib gedənə qədər bu halda durdular. Həsən dedi: “Bir yəhudinin cənazəsi keçirdi, Allah Elçisi ﷺ də o cənazənin keçəcəyi yolun üstündə idi. Yəhudinin cənazəsinin öz başından yuxarıda olmasını yaxşı şey saymadığına görə ayayğa qalxdı”.

١٩٢٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ جَابِرًا يَقُولُ : قَامَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِجَنَازَةِ يَهُودِيٍّ مَرَّتْ بِهِ حَتَّى تَوَارَتْ وأَخْبَرَنِي أَبُو الزُّبَيْرِ أَيْضًا ، أَنَّهُ سَمِعَ جَابِرًا رَضِيَ اللَّهُ عَنْهُ يَقُولُ : قَامَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَصْحَابُهُ لِجَنَازَةِ يَهُودِيٍّ حَتَّى تَوَارَتْ.

1928. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Allah Elçisi ﷺ onun yanından keçən bir yəhudinin cənazəsinə görə ayağa durmuşdu. Cənazə keçib gedənə qədər Allah Elçisi ﷺ ayaq üstə dayanmışdı”. Cabir demişdir: “Allah Elçisi ﷺ və səhabələri yanlarından keçən bir yəhudinin cənazəsinə görə ayağa durmuş və cənazə keçib gedənə qədər onlar ayaq üstə dayanmışdılar”.

١٩٣٠ - أَخْبَرَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا النَّضْرُ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ سَلَمَةَ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ جِنَازَةً مَرَّتْ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَامَ ، فَقِيلَ : إِنَّهَا جِنَازَةُ يَهُودِيٍّ ، فَقَالَ : إِنَّمَا قُمْنَا لِلْمَلاَئِكَةِ.

1929. ...Ənəs ﵁ rəvayət edir ki, Allah Elçisinin ﷺ yanından bir cənazə keçdikdə Allah Elçisi ﷺ ayağa qalxmışdı. Ona deyildi: “O, bir yəhudinin cənazəsidir”. Allah Elçisi ﷺ dedi: “Biz mələklərə görə ayağa qalxdıq”.

### ٤٨ - اسْتِرَاحَةُ الْمُؤْمِنِ بِالْمَوْتِ

### 48-ci fəsil: Möminin ölüm ilə rahatlıq tapması

١٩٣٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ مُحَمَّدِ بْنِ عَمْرِو بْنِ حَلْحَلَةَ ، عَنْ مَعْبَدِ بْنِ كَعْبِ بْنِ مَالِكٍ ، عَنْ أَبِي قَتَادَةَ بْنِ رِبْعِيٍّ أَنَّهُ كَانَ يُحَدِّثُ : أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مُرَّ عَلَيْهِ بِجَنَازَةٍ فَقَالَ : مُسْتَرِيحٌ وَمُسْتَرَاحٌ مِنْهُ ، فَقَالُوا : مَا الْمُسْتَرِيحُ وَمَا الْمُسْتَرَاحُ مِنْهُ ؟ قَالَ : الْعَبْدُ الْمُؤْمِنُ يَسْتَرِيحُ مِنْ نَصَبِ الدُّنْيَا وَأَذَاهَا ، وَالْعَبْدُ الْفَاجِرُ يَسْتَرِيحُ مِنْهُ الْعِبَادُ وَالْبِلاَدُ وَالشَّجَرُ وَالدَّوَابُّ.

1930. ...Rəvayət edilir ki, Əbu Qatədə ibn Ribi ﵁ demişdir: “Bir dəfə Allah Elçisinin ﷺ yanından cənazə keçdi. Allah Elçisi ﷺ buyurdu: “Bu cənazə ya qurtulub, ya da ondan qurtulublar”. Səhabələr dedilər: “Qurtulan və ya ondan qurtulan nə deməkdir?” Allah Elçisi ﷺ dedi: “Mömin bəndə öldükdə dünyanın sıxıntılarından qurtulur. Günahkar biri öldükdə bəndələr, şəhərlər, ağaclar və heyvanlar onun (şərindən) qurtulmuş olurlar”.

## ٤٩ - الاِسْتِرَاحَةُ مِنَ الْكُفَّارِ

## 49-cu fəsil: Kafirin ölümündən qurtulmaq

١٩٣١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ وَهْبِ بْنِ أَبِي كَرِيمَةَ الْحَرَّانِيُّ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ وَهُوَ الْحَرَّانِيُّ ، عَنْ أَبِي عَبْدِ الرَّحِيمِ ، حَدَّثَنِي زَيْدٌ ، عَنْ وَهْبِ بْنِ كَيْسَانَ ، عَنْ مَعْبَدِ بْنِ كَعْبٍ ، عَنْ أَبِي قَتَادَةَ قَالَ : كُنَّا جُلُوسًا عِنْدَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذْ طَلَعَتْ جنَازَةٌ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مُسْتَرِيحٌ وَمُسْتَرَاحٌ مِنْهُ ، الْمُؤْمِنُ يَمُوتُ فَيَسْتَرِيحُ مِنْ أَوْصَابِ الدُّنْيَا وَنَصَبِهَا وَأَذَاهَا ، وَالْفَاجِرُ يَمُوتُ فَيَسْتَرِيحُ مِنْهُ الْعِبَادُ وَالْبِلاَدُ وَالشَّجَرُ وَالدَّوَابُّ.

1931. ...Rəvayət edilir ki, Əbu Qatədə ﵁ demişdir: “Bir dəfə biz Allah Elçisinin ﷺ yanında oturmuşduq. Bu zaman bir cənazə keçdi və Allah Elçisi ﷺ dedi: “Bu cənazə ya qurtulub, ya da ondan qurtulublar. Mömin öldükdə dünyanın sıxıntılarından, çətinliklərindən və yorğunluğundan qurtulur. Günahkar biri öldükdə bəndələr, şəhərlər, ağaclar və heyvanlar onun (şərindən) qurtulmuş olurlar”.

## ٥٠ - بَابُ الثَّنَاءِ

## 50-ci fəsil: Öləni xeyirlə xatırlamaq

١٩٣٢ - أَخْبَرَنِي زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ ، عَنْ أَنَسٍ قَالَ : مُرَّ بِجَنَازَةٍ فَأُثْنِيَ عَلَيْهَا خَيْرًا ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَجَبَتْ ، وَمُرَّ بِجَنَازَةٍ أُخْرَى فَأُثْنِيَ عَلَيْهَا شَرًّا ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَجَبَتْ ، فَقَالَ عُمَرُ : فِدَاكَ أَبِي وَأُمِّي ، مُرَّ بِجَنَازَةٍ فَأُثْنِيَ عَلَيْهَا خَيْرًا ، فَقُلْتَ : وَجَبَتْ ، وَمُرَّ بِجَنَازَةٍ فَأُثْنِيَ عَلَيْهَا شَرًّا ، فَقُلْتَ : وَجَبَتْ ، فَقَالَ : مَنْ أَثْنَيْتُمْ عَلَيْهِ خَيْرًا وَجَبَتْ لَهُ الْجَنَّةُ ، وَمَنْ أَثْنَيْتُمْ عَلَيْهِ شَرًّا وَجَبَتْ لَهُ النَّارُ ، أَنْتُمْ شُهَدَاءُ اللهِ فِي الأَرْضِ.

1932. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Bir dəfə cənazə aparılarkən onu xoş sözlə yad edib tərifləddilər. Peyğəmbər ﷺ: “Vacib oldu!”- deyə buyurdu. Sonra başqa bir cənazə aparılarkən onu xoşagəlməz şər ilə yad etdilər. Peyğəmbər ﷺ yenə: “Vacib oldu!”- deyə buyurdu. Ömər: “Atam-anam sənə fəda olsun, cənazə aparılarkən onu xoş sözlə yad etdikdə sən: “Vacib oldu!”- dedin. Sonra başqa bir cənazə aparılarkən onu şər ilə yad etdikdə

sən yenə: “Vacib oldu!” dedin”. Peyğəmbər ﷺ buyurdu: “Kimi xoş sözlərlə yad etdinizsə, ona Cənnət vacib oldu. Kimi də şər ilə yad etdinizsə, ona Cəhənnəm vacib oldu. Siz Allahın yer üzündəki şahidlərisiniz!”

١٩٣٣ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : سَمِعْتُ إِبْرَاهِيمَ بْنَ عَامِرٍ ، وَجَدُّهُ أُمَيَّةُ بْنُ خَلَفٍ قَالَ : سَمِعْتُ عَامِرَ بْنَ سَعْدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : مَرُّوا بِجَنَازَةٍ عَلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَأَثْنَوْا عَلَيْهَا خَيْرًا ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَجَبَتْ ، ثُمَّ مَرُّوا بِجَنَازَةٍ أُخْرَى فَأَثْنَوْا عَلَيْهَا شَرًّا ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : وَجَبَتْ ، قَالُوا : يَا رَسُولَ اللهِ ، قَوْلُكَ الأُولَى وَالأُخْرَى وَجَبَتْ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الْمَلاَئِكَةُ شُهَدَاءُ اللهِ فِي السَّمَاءِ ، وَأَنْتُمْ شُهَدَاءُ اللهِ فِي الأَرْضِ.

1933. ...Rəvayət edir ki, Əbu Hureyra ﷺ demişdir: “Bir dəfə Peyğəmbərin ﷺ yanından bir cənazə aparılırdı. Həmin cənazə xoş sözlərlə yad edildikdə Peyğəmbər ﷺ: “Vacib oldu!”- deyə buyurdu. Sonra başqa bir cənazə aparılarkən həmin cənazə şər ilə yad edildi. Peyğəmbər ﷺ yenə: “Vacib oldu!”- deyə buyurdu. Səhabələr dedilər: “Ey Allahın Elçisi! Əvvəlkinə də, sonrakına da “vacib oldu!” dedin”. Peyğəmbər ﷺ buyurdu: “Mələklər Allahın göydəki şahidləri, siz isə Allahın yerdəki şahidlərisiniz”.

١٩٣٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ عَبْدِ الْمَلِكِ ، وَعَبْدُ اللهِ بْنُ يَزِيدَ ، قَالاَ : حَدَّثَنَا دَاوُدُ بْنُ أَبِي الْفُرَاتِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ بُرَيْدَةَ ، عَنْ أَبِي الأَسْوَدِ الدِّيْلِيِّ ، قَالَ : أَتَيْتُ الْمَدِينَةَ فَجَلَسْتُ إِلَى عُمَرَ بْنِ الْخَطَّابِ ، فَمُرَّ بِجَنَازَةٍ فَأُثْنِيَ عَلَى صَاحِبِهَا خَيْرًا ، فَقَالَ عُمَرُ : وَجَبَتْ ، ثُمَّ مُرَّ بِأُخْرَى فَأُثْنِيَ عَلَى صَاحِبِهَا خَيْرًا ، فَقَالَ عُمَرُ : وَجَبَتْ ، ثُمَّ مُرَّ بِالثَّالِثِ فَأُثْنِيَ عَلَى صَاحِبِهَا شَرًّا فَقَالَ عُمَرُ : وَجَبَتْ ، فَقُلْتُ وَمَا وَجَبَتْ يَا أَمِيرَ الْمُؤْمِنِينَ ؟ قَالَ : قُلْتُ كَمَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَيُّمَا مُسْلِمٍ شَهِدَ لَهُ أَرْبَعَةٌ قَالُوا خَيْرًا أَدْخَلَهُ اللَّهُ الْجَنَّةَ ، قُلْنَا : أَوْ ثَلاَثَةٌ ؟ قَالَ : أَوْ ثَلاَثَةٌ ، قُلْنَا : أَوِ اثْنَانِ ، قَالَ : أَوِ اثْنَانِ.

1934. ...Rəvayət edilir ki, Əbul-Əsvəd əd-Deyləmi ﷺ demişdir: “Mədinəyə gəlib Ömər ibn əl-Xattabın yanında oturdum. Bu əsnada bir cənazəni dəfn etmək üçün aparırdılar və insanlar onu xeyirlə yad etdilər. Ömər: “Vacib oldu!” dedi. Sonra başqa bir cənazə dəfn olunmağa aparılarkən insanlar onu da xeyirlə yad etdilər. Ömər yenə: “Vacib oldu!” dedi. Sonra üçüncü cənazə dəfn olunmaq üçün aparılarkən insanlar onu şər ilə yad etdilər. Ömər yenə də: “Vacib oldu!” dedi. Mən dedim: “Nə vacib oldu, ey möminlərin əmiri?” Ömər dedi: “Mən sizə Allah Elçisinin ﷺ dediyi kimi dedim. Hansı müsəlmanın yaxşı əməl sahibi olduğuna dörd nəfər (müsəlman) şahidlik etsə, Allah onu Cənnətə daxil edər”. Biz: “Bəs üç nəfər (olsa)?”– deyə soruşduq. O: “Üç nəfər də (olsa)”– deyə cavab verdi.

Biz: "Bəs iki nəfər (olsa)?"– deyə soruşduq. O: "İki nəfər də (olsa)"– deyə cavab verdi.

### ٥١ - النَّهْيُ عَنْ ذِكْرِ الْهَلْكَى إِلاَّ بِخَيْرٍ

### 51-ci fəsil: Öləni yalnız xeyirlə xatırlamaq

١٩٣٥ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنِي أَحْمَدُ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا وُهَيْبٌ ، قَالَ : حَدَّثَنَا مَنْصُورُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أُمِّهِ ، عَنْ عَائِشَةَ قَالَتْ : ذُكِرَ عِنْدَ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ هَالِكٌ بِسُوءٍ فَقَالَ : لاَ تَذْكُرُوا هَلْكَاكُمْ إِلاَّ بِخَيْرٍ.

1935. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Peyğəmbərin ﷺ yanında pis ölümlə ölən yad edildikdə dedi: "Ölülərinizi yalnız xeyirlə yad edin!"

### ٥٢ - النَّهْيُ عَنْ سَبِّ الأَمْوَاتِ

### 52-ci fəsil: Ölüləri söyməyin qadağası

١٩٣٦ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ بِشْرٍ وَهُوَ ابْنُ الْمُفَضَّلِ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ الأَعْمَشِ ، عَنْ مُجَاهِدٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لاَ تَسُبُّوا الأَمْوَاتَ فَإِنَّهُمْ قَدْ أَفْضَوْا إِلَى مَا قَدَّمُوا.

1936. ...Rəvayət edilir ki, Aişə ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Ölüləri söyməyin! Çünki onlar etdikləri əməllərə (görə öz aqibətlərinə) artıq qovuşmuşlar".

١٩٣٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَبْدِ اللهِ بْنِ أَبِي بَكْرٍ ، قَالَ : سَمِعْتُ أَنَسَ بْنَ مَالِكٍ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يَتْبَعُ الْمَيِّتَ ثَلاَثَةٌ : أَهْلُهُ وَمَالُهُ وَعَمَلُهُ ، فَيَرْجِعُ اثْنَانِ أَهْلُهُ وَمَالُهُ ، وَيَبْقَى وَاحِدٌ عَمَلُهُ.

1937. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Öləni (qəbiristanlığa) üç şey müşayiət edər: ailəsi, malı və əməli. İkisi - ailəsi və malı qəbiristanlıqdan geri qayıdar. Əməli isə onunla birlikdə qalar".

١٩٣٨ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ مُوسَى ، عَنْ سَعِيدِ بْنِ أَبِي سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لِلْمُؤْمِنِ عَلَى الْمُؤْمِنِ سِتُّ خِصَالٍ : يَعُودُهُ إِذَا مَرِضَ ، وَيَشْهَدُهُ إِذَا مَاتَ ، وَيُجِيبُهُ إِذَا دَعَاهُ ، وَيُسَلِّمُ عَلَيْهِ إِذَا لَقِيَهُ ، وَيُشَمِّتُهُ إِذَا عَطَسَ ، وَيَنْصَحُ لَهُ إِذَا غَابَ أَوْ شَهِدَ.

1938. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Mömünin mömin üzərində altı haqqı var: xəstələndikdə onu ziyarət edər,

öldükdə cənazəsində iştirak edər, dəvətini qəbul edər, qarşılaşdıqda salamlaşar, asqırdıqda onun üçün xeyir diləyər, yaxında və ya uzaqda olduqda ona nəsihət edər".

## ٥٣ - الأَمْرُ بِاتِّبَاعِ الْجَنَائِزِ

## 53-cü fəsil: Cənazəni müşayiət etməyin əmr edilməsi

١٩٣٩ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ مَنْصُورٍ الْبَلْخِيُّ ، قَالَ : حَدَّثَنَا أَبُو الأَحْوَصِ (ح) وَأَنْبَأَنَا هَنَّادُ بْنُ السَّرِيِّ فِي حَدِيثِهِ ، عَنْ أَبِي الأَحْوَصِ ، عَنْ أَشْعَثَ ، عَنْ مُعَاوِيَةَ بْنِ سُوَيْدٍ ــ قَالَ هَنَّادٌ ــ : قَالَ الْبَرَاءُ بْنُ عَازِبٍ : ــ وَقَالَ سُلَيْمَانُ ــ : عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ قَالَ : أَمَرَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِسَبْعٍ ، وَنَهَانَا عَنْ سَبْعٍ : أَمَرَنَا بِعِيَادَةِ الْمَرِيضِ ، وَتَشْمِيتِ الْعَاطِسِ ، وَإِبْرَارِ الْقَسَمِ ، وَنُصْرَةِ الْمَظْلُومِ ، وَإِفْشَاءِ السَّلاَمِ ، وَإِجَابَةِ الدَّاعِي ، وَاتِّبَاعِ الْجَنَائِزِ ، وَنَهَانَا عَنْ خَوَاتِيمِ الذَّهَبِ ، وَعَنْ آنِيَةِ الْفِضَّةِ ، وَعَنِ الْمَيَاثِرِ ، وَالْقَسِّيَّةِ ، وَالإِسْتَبْرَقِ ، وَالْحَرِيرِ ، وَالدِّيبَاجِ.

1939. ...Rəvayət edilir ki, Bəra ibn Azib ﵁ demişdir: "Allah Elçisi ﷺ bizə yeddi şeyi əmr etdi və yeddi şeyi qadağan etdi. O, bizə xəstəni ziyarət etməyi, asqıran adama rəhmət diləməyi[1], andı yerinə yetirməyi, məzluma yardım etməyi, salamı yaymağı, (məclisə) dəvət edənin dəvətini qəbul etməyi və cənazəni müşayiət etməyi əmr etdi. Həmçinin bizə qızıl üzük taxmağı, gümüş qabdan yeyib-içməyi, ipək yəhərdən (istifadə etməyi), atlas parça (geyməyi), taftadan, ipəkdən və ipək qatışığı olan paltarlar geyinməyi qadağan etdi".[2]

## ٥٤ - فَضْلُ مَنْ يَتْبَعُ جَنَازَةً

## 54-cü fəsil: Cənazəni müşayiət etməyin fəziləti

١٩٤٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْثَرٌ ، عَنْ بُرْدٍ ، أَخِي يَزِيدَ بْنِ أَبِي زِيَادٍ ، عَنِ الْمُسَيَّبِ بْنِ رَافِعٍ ، قَالَ : سَمِعْتُ الْبَرَاءَ بْنَ عَازِبٍ يَقُولُ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ تَبِعَ جَنَازَةً حَتَّى يُصَلَّى عَلَيْهَا كَانَ لَهُ مِنَ الأَجْرِ قِيرَاطٌ ، وَمَنْ مَشَى مَعَ الْجَنَازَةِ حَتَّى تُدْفَنَ كَانَ لَهُ مِنَ الأَجْرِ قِيرَاطَانِ ، وَالْقِيرَاطُ مِثْلُ أُحُدٍ.

1940. ...Rəvayət edilir ki, Bəra ibn Azib ﵁ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim cənazəni cənazə namazı qılınana qədər müşayiət edərsə, ona bir qirat savab verilər. Kim də cənazəni dəfn olunana qədər müşayiət edərsə, ona iki qirat savab verilər. Bir qirat Uhud dağı kimidir".

[1] Asqırdıqdan sonra "Əlhəmdulillah" deyən müsəlmana "Yərhəmukəllah" demək vacibdir.
[2] Hədisdə qadağan olunmuş yeddi şey bu ümmətin kişilərinə aiddir. Qızıl və gümüş qablardan istifadə etmək isə həm kişilərə, həm də qadınlara aiddir.

١٩٤١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا أَشْعَثُ ، عَنِ الْحَسَنِ ، عَنْ عَبْدِ اللهِ بْنِ الْمُغَفَّلِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ تَبِعَ جِنَازَةً حَتَّى يُفْرَغَ مِنْهَا فَلَهُ قِيرَاطَانِ ، فَإِنْ رَجَعَ قَبْلَ أَنْ يُفْرَغَ مِنْهَا فَلَهُ قِيرَاطٌ.

1941. ...Rəvayət edilir ki, Abdullah ibn əl-Muğaffəl ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Kim cənazəni müşayiət edər və cənazə dəfn olunana qədər gözləyərsə, iki qirat savab alar. Cənazənin dəfn edilməsini gözləmədən qayıdarsa, bir qirat savab alar”.

٥٥ - مَكَانُ الرَّاكِبِ مِنَ الْجَنَازَةِ

## 55-ci fəsil: Cənazə aparılarkən süvari olanın yeri

١٩٤٢ - أَخْبَرَنَا زِيَادُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَاحِدِ بْنُ وَاصِلٍ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عُبَيْدِ اللهِ ، وَأَخُوهُ الْمُغِيرَةُ جَمِيعًا ، عَنْ زِيَادِ بْنِ جُبَيْرٍ ، عَنْ أَبِيهِ ، عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ الرَّاكِبُ خَلْفَ الْجَنَازَةِ ، وَالْمَاشِي حَيْثُ شَاءَ مِنْهَا ، وَالطِّفْلُ يُصَلَّى عَلَيْهِ.

1942. ...Rəvayət edilir Muğira ibn Şöbə ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Süvari aparılan cənazənin arxasında, piyada isə aparılan cənazənin istədiyi tərəfində gedə bilər. Körpə üçün də cənazə namazı qılınır”.

٥٦ - مَكَانُ الْمَاشِي مِنَ الْجَنَازَةِ

## 56-cı fəsil: Cənazə aparılarkən piyada olanın yeri

١٩٤٣ - أَخْبَرَنِي أَحْمَدُ بْنُ بَكَّارٍ الْحَرَّانِيُّ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ السَّرِيِّ ، عَنْ سَعِيدٍ الثَّقَفِيِّ ، عَنْ عَمِّهِ زِيَادِ بْنِ جُبَيْرِ بْنِ حَيَّةَ ، عَنْ أَبِيهِ ، عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : الرَّاكِبُ خَلْفَ الْجَنَازَةِ ، وَالْمَاشِي حَيْثُ شَاءَ مِنْهَا ، وَالطِّفْلُ يُصَلَّى عَلَيْهِ.

1943. ...Rəvayət edilir Muğira ibn Şöbə ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Süvari aparılan cənazənin arxasında, piyada isə aparılan cənazənin istədiyi tərəfində gedə bilər. Körpə üçün də cənazə namazı qılınır”.

١٩٤٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، وَعَلِيُّ بْنُ حُجْرٍ ، وَقُتَيْبَةُ ، عَنْ سُفْيَانَ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَالِمٍ ، عَنْ أَبِيهِ ، أَنَّهُ رَأَى رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَأَبَا بَكْرٍ ، وَعُمَرَ رَضِيَ اللَّهُ عَنْهُمَا يَمْشُونَ أَمَامَ الْجَنَازَةِ.

1944. ...Səlim ﵁ rəvayət edir ki, atası Allah Elçisini ﷺ, Əbu Bəkri, Ömər və Osmanı – Allah onlardan razı olsun! - cənazənin önü ilə yeriyən görmüşdür.

١٩٤٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا هَمَّامٌ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، وَمَنْصُورٌ ، وَزِيَادٌ ، وَبَكْرٌ هُوَ ابْنُ وَائِلٍ كُلُّهُمْ ذَكَرُوا ، أَنَّهُمْ سَمِعُوا مِنَ الزُّهْرِيِّ يُحَدِّثُ ، أَنَّ سَالِمًا أَخْبَرَهُ ، أَنَّ أَبَاهُ أَخْبَرَهُ ، أَنَّهُ رَأَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَأَبَا بَكْرٍ ، وَعُمَرَ ، وَعُثْمَانَ يَمْشُونَ بَيْنَ يَدَيِ الْجَنَازَةِ ، بَكْرٌ وَحْدَهُ لَمْ يَذْكُرْ عُثْمَانَ. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : هَذَا خَطَأٌ وَالصَّوَابُ مُرْسَلٌ.

1945. ...Səlim ﵁ rəvayət edir ki, atası Allah Elçisini ﷺ, Əbu Bəkri, Ömər və Osmanı – Allah onlardan razı olsun! - cənazənin önü ilə yeriyən görmüşdür.

## ٥٧ - الأَمْرُ بِالصَّلاَةِ عَلَى الْمَيِّتِ

## 57-ci fəsil: Cənazə üçün namaz qılmağın əmr edilməsi

١٩٤٦ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، وَعَمْرُو بْنُ زُرَارَةَ النَّيْسَابُورِيُّ ، قَالاَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَبِي الْمُهَلَّبِ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ أَخَاكُمْ قَدْ مَاتَ فَقُومُوا فَصَلُّوا عَلَيْهِ.

1946. ...Rəvayət edilir ki, İmran ibn Husayn ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Qardaşınız (Nəcaşi) vəfat etmişdir. Qalxın, onun üçün cənazə namazını qılın!”

## ٥٨ - الصَّلاَةُ عَلَى الصِّبْيَانِ

## 58-ci fəsil: Uşaq üçün cənazə namazı

١٩٤٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا طَلْحَةُ بْنُ يَحْيَى ، عَنْ عَمَّتِهِ عَائِشَةَ بِنْتِ طَلْحَةَ ، عَنْ خَالَتِهَا أُمِّ الْمُؤْمِنِينَ عَائِشَةَ قَالَتْ : أُتِيَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِصَبِيٍّ مِنْ صِبْيَانِ الأَنْصَارِ ، فَصَلَّى عَلَيْهِ ، قَالَتْ عَائِشَةُ : فَقُلْتُ : طُوبَى لِهَذَا عُصْفُورٌ مِنْ عَصَافِيرِ الْجَنَّةِ ، لَمْ يَعْمَلْ سُوءًا وَلَمْ يُدْرِكْهُ ، قَالَ : أَوَ غَيْرُ ذَلِكَ يَا عَائِشَةُ ، خَلَقَ اللَّهُ عَزَّ وَجَلَّ الْجَنَّةَ وَخَلَقَ لَهَا أَهْلاً ، وَخَلَقَهُمْ فِي أَصْلاَبِ آبائِهِمْ ، وَخَلَقَ النَّارَ وَخَلَقَ لَهَا أَهْلاً ، وَخَلَقَهُمْ فِي أَصْلاَبِ آبائِهِمْ.

1947. ...Rəvayət edilir ki, möminlərin anası Aişə ﵂ demişdir: “Ənsar uşaqlarından birinin cənazəsi Allah Elçisinin ﷺ yanına gətirilmişdi. Allah Elçisi ﷺ də onun cənazə namazını qılmışdı. Mən dedim: “Cənnət quşlarından bir quş olan bu uşağın xoş halına! Nə pis şey etdi, nə də pis şey etmək yaşına çatdı”. Allah Elçisi ﷺ dedi: “Belə deməsən, daha yaxşı olar, ey Aişə!

Allah ﷻ Cənnəti və onun əhlini yaratmış, onları (uşaqları) da onların bellərində yaratmışdır. Həmçinin Cəhənnəmi və onun əhlini yaratmış, onları (uşaqları) da onların atalarının bellərində yaratmışdır".

٥٩ - الصَّلاَةُ عَلَى الأَطْفَالِ

## 59-cu fəsil: Körpə üçün cənazə namazı

١٩٤٨ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ عُبَيْدِ اللهِ ، قَالَ : سَمِعْتُ زِيَادَ بْنَ جُبَيْرٍ يُحَدِّثُ ، عَنْ أَبِيهِ ، عَنِ الْمُغِيرَةِ بْنِ شُعْبَةَ أَنَّهُ ذَكَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : الرَّاكِبُ خَلْفَ الْجَنَازَةِ ، وَالْمَاشِي حَيْثُ شَاءَ مِنْهَا ، وَالطِّفْلُ يُصَلَّى عَلَيْهِ.

1948. ...Muğira ibn Şöbə ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Süvari aparılan cənazənin arxasında, piyada isə aparılan cənazənin istədiyi tərəfində gedə bilər. Körpə üçün də cənazə namazı qılınır".

٦٠ - أَوْلاَدُ الْمُشْرِكِينَ

## 60-cı fəsil: Müşriklərin uşaqları

١٩٤٩ - أَخْبَرَنَا إِسْحَاقُ ، قَالَ : أَنْبَأَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَطَاءِ بْنِ يَزِيدَ اللَّيْثِيِّ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ أَوْلاَدِ الْمُشْرِكِينَ ، فَقَالَ : اللَّهُ أَعْلَمُ بِمَا كَانُوا عَامِلِينَ.

1949. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisindən ﷺ müşriklərin (ölən) övladları haqda soruşulduqda o dedi: "Allah onların nə əməllər edəcəklərini yaxşı bilir".

١٩٥٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا الأَسْوَدُ بْنُ عَامِرٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادٌ ، عَنْ قَيْسٍ هُوَ ابْنُ سَعْدٍ ، عَنْ طَاوُوسٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سُئِلَ عَنْ أَوْلاَدِ الْمُشْرِكِينَ ، فَقَالَ : اللَّهُ أَعْلَمُ بِمَا كَانُوا عَامِلِينَ.

1950. ...Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ müşriklərin (ölən) övladları haqda soruşulduqda dedi: "Allah onların nə əməllər edəcəklərini yaxşı bilir".

١٩٥١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : سُئِلَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ أَوْلاَدِ الْمُشْرِكِينَ ، فَقَالَ : خَلَقَهُمُ اللَّهُ حِينَ خَلَقَهُمْ وَهُوَ يَعْلَمُ بِمَا كَانُوا عَامِلِينَ.

1951. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisi ﷺ müşriklərin (ölən) övladları haqda soruşulduqda dedi: “Onları Allah yaratmış və onların nə əməllər edəcəklərini yaxşı bilir”.

١٩٥٢ - أَخْبَرَنِي مُجَاهِدُ بْنُ مُوسَى ، عَنْ هُشَيْمٍ ، عَنْ أَبِي بِشْرٍ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : سُئِلَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ ذَرَارِيِّ الْمُشْرِكِينَ ، فَقَالَ : اللَّهُ أَعْلَمُ بِمَا كَانُوا عَامِلِينَ.

1952. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Peyğəmbər ﷺ müşriklərin (ölən) övladları haqda soruşulduqda o dedi: “Allah onların nə əməllər edəcəklərini yaxşı bilir”.

## ٦١ - الصَّلاَةُ عَلَى الشُّهَدَاءِ

## 61-ci fəsil: Şəhidlərə cənazə namazı qılmaq

١٩٥٣ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عِكْرِمَةُ بْنُ خَالِدٍ ، أَنَّ ابْنَ أَبِي عَمَّارٍ أَخْبَرَهُ ، عَنْ شَدَّادِ بْنِ الْهَادِ ، أَنَّ رَجُلاً مِنَ الأَعْرَابِ جَاءَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَآمَنَ بِهِ وَاتَّبَعَهُ ، ثُمَّ قَالَ : أُهَاجِرُ مَعَكَ ، فَأَوْصَى بِهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْضَ أَصْحَابِهِ ، فَلَمَّا كَانَتْ غَزْوَةٌ غَنِمَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَبْيًا ، فَقَسَمَ وَقَسَمَ لَهُ ، فَأَعْطَى أَصْحَابَهُ مَا قَسَمَ لَهُ ، وَكَانَ يَرْعَى ظَهْرَهُمْ ، فَلَمَّا جَاءَ دَفَعُوهُ إِلَيْهِ ، فَقَالَ : مَا هَذَا ؟ ، قَالُوا : قِسْمٌ قَسَمَهُ لَكَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَخَذَهُ فَجَاءَ بِهِ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَ : مَا هَذَا ؟ قَالَ : قَسَمْتُهُ لَكَ ، قَالَ : مَا عَلَى هَذَا اتَّبَعْتُكَ ، وَلَكِنِّي اتَّبَعْتُكَ عَلَى أَنْ أُرْمَى إِلَى هَاهُنَا ، وَأَشَارَ إِلَى حَلْقِهِ ب سَهْمٍ ، فَأَمُوتَ فَأَدْخُلَ الْجَنَّةَ فَقَالَ : إِنْ تَصْدُق اللَّهَ يَصْدُقْكَ ، فَلَبِثُوا قَلِيلاً ثُمَّ نَهَضُوا فِي قِتَالِ الْعَدُوِّ ، فَأُتِيَ بِهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُحْمَلُ قَدْ أَصَابَهُ سَهْمٌ حَيْثُ أَشَارَ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَهُوَ هُوَ ؟ قَالُوا : نَعَمْ ، قَالَ : صَدَقَ اللَّهَ فَصَدَقَهُ ، ثُمَّ كَفَّنَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي جُبَّةِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ قَدَّمَهُ فَصَلَّى عَلَيْهِ ، فَكَانَ فِيمَا ظَهَرَ مِنْ صَلاَتِهِ : اللَّهُمَّ هَذَا عَبْدُكَ خَرَجَ مُهَاجِرًا فِي سَبِيلِكَ فَقُتِلَ شَهِيدًا أَنَا شَهِيدٌ عَلَى ذَلِكَ.

1953. ...Şəddad ibn əl-Həd ﵁ rəvayət edir ki, bir bədəvi Peyğəmbərin ﷺ yanına gələrək ona iman gətirdi və tabe oldu. Sonra dedi: “Mən sənin yanına hicrət edimmi?” Allah Elçisi ﷺ onu səhabələrinə tapşırdı. Bir müddətdən sonra döyüş olduqda qənimətlər ələ keçirildi və qənimətləri bölüşdürdü. Həmin bədəviyə də bir pay ayırdılar. O, səhabələrin qoyunlarını otarırdı. O gəldikdə onun payını ona verdilər. Bədəvi: “Bu nədir?” dedi. Səhabələr ona dedilər: “Peyğəmbərin ﷺ böldüyü paydır”. O, öz payına düşəni Peyğəmbərə ﷺ gətirərək: “Bu nədir?”- deyə buyurdu. Peyğəmbər ﷺ dedi: “Bunu sənə mən ayırmışam”. Bədəvi dedi: “Mən sənə qənimət əldə etmək üçün tabe olmadım”. O, boğazını göstərərək: “Mən

buramdan ox ilə vurularaq şəhid olub Cənnətə düşmək üçün sənə tabe oldum". Peyğəmbər ﷺ buyurdu: "Əgər doğru söyləyirsənsə və Allaha verdiyin sözü tutarsansa, Allah sənin sözünü doğru çıxaracaq". Az bir müddət keçdikdən sonra düşmənlə döyüş oldu və həmin adamı işarə etdiyi yerdən – boğazından ox ilə vurulmuş halda Peyğəmbərin ﷺ yanına gətirdilər. Peyğəmbər ﷺ dedi: "O, həmin adamdır?" Səhabələr: "Bəli!" dedilər. Peyğəmbər ﷺ buyurdu: "O, Allaha sadiq oldu, Allah da onu sadiq etdi". Sonra o, Peyğəmbərin ﷺ libası ilə kəfənləndi və gətirib Peyğəmbərin ﷺ önünə qoydular. Peyğəmbər ﷺ onun cənazə namazını qıldı. Namazda bu dua eşidilirdi: "Allahım, bu qulun Sənin yolunda hicrət edərək şəhid oldu. Mən buna şahidəm".

١٩٥٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَزِيدَ ، عَنْ أَبِي الْخَيْرِ ، عَنْ عُقْبَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ خَرَجَ يَوْمًا فَصَلَّى عَلَى أَهْلِ أُحُدٍ صَلاَتَهُ عَلَى الْمَيِّتِ ، ثُمَّ انْصَرَفَ إِلَى الْمِنْبَرِ فَقَالَ : إِنِّي فَرَطٌ لَكُمْ وَأَنَا شَهِيدٌ عَلَيْكُمْ.

1954. ...Uqbə ibn Amir ؓ rəvayət edir ki, bir gün Allah Elçisi ﷺ gedib Uhud şəhidləri üçün cənazə namazı qıldı. Sonra (Mədinəyə gəldi və) minbərə qalxıb buyurdu: "Mən sizi qabaqlayacağam (sizdən əvvəl bu dünyadan köçəcəyəm). Mən sizin nə etdiklərinizə şahidəm".

٦٢ - تَرْكُ الصَّلاَةِ عَلَيْهِمْ

## 62-ci fəsil: Şəhidlərin cənazə namazını qılmamaq

١٩٥٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ كَعْبِ بْنِ مَالِكٍ ، أَنَّ جَابِرَ بْنَ عَبْدِ اللهِ أَخْبَرَهُ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَجْمَعُ بَيْنَ الرَّجُلَيْنِ مِنْ قَتْلَى أُحُدٍ فِي ثَوْبٍ وَاحِدٍ ، ثُمَّ يَقُولُ : أَيُّهُمَا أَكْثَرُ أَخْذًا لِلْقُرْآنِ ؟ فَإِذَا أُشِيرَ إِلَى أَحَدِهِمَا قَدَّمَهُ فِي اللَّحْدِ ، قَالَ : « أَنَا شَهِيدٌ عَلَى هَؤُلاَءِ » وَأَمَرَ بِدَفْنِهِمْ فِي دِمَائِهِمْ ، وَلَمْ يُصَلِّ عَلَيْهِمْ ، وَلَمْ يُغَسَّلُوا.

1955. ...Cabir ibn Abdullah ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ Uhud döyüşündə öldürülənlərdən iki nəfəri bir kəfənlə qəbirə qoyur və bizdən: "Bunlardan Quranı kim daha çox bilirdi?" soruşurdu. Onlardan birinə işarə edildikdə, onu qəbirə birinci qoyaraq: "Mən bunlara şahidəm"- dedi və onları qanlı-qanlı, cənazə namazlarını qılmadan və qüsl etmədən dəfn etməmizi əmr edirdi".

## ٦٣ - بَابُ تَرْكِ الصَّلاَةِ عَلَى الْمَرْجُومِ

## 63-cü fəsil: Rəcm[1] olunmuş adamın cənazə namazının tərk edilməsi

١٩٥٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ يَحْيَى ، وَنُوحُ بْنُ حَبِيبٍ ، قَالاَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ رَجُلاً مِنْ أَسْلَمَ جَاءَ إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَاعْتَرَفَ بِالزِّنَا ، فَأَعْرَضَ عَنْهُ ، ثُمَّ اعْتَرَفَ ، فَأَعْرَضَ عَنْهُ ، ثُمَّ اعْتَرَفَ ، فَأَعْرَضَ عَنْهُ حَتَّى شَهِدَ عَلَى نَفْسِهِ أَرْبَعَ مَرَّاتٍ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَبِكَ جُنُونٌ ؟ ، قَالَ : لاَ ، قَالَ : أَحْصَنْتَ ؟ قَالَ : نَعَمْ فَأَمَرَ بِهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَرُجِمَ ، فَلَمَّا أَذْلَقَتْهُ الْحِجَارَةُ ، فَرَّ فَأُدْرِكَ فَرُجِمَ فَمَاتَ ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : خَيْرًا ، وَلَمْ يُصَلِّ عَلَيْهِ.

1956. ...Cabir ibn Abdullah ﷺ rəvayət edir ki, müsəlman bir kişi Peyğəmbərin ﷺ yanına gələrək zina etdiyini etiraf etdi. Peyğəmbər ﷺ üzünü ondan yana çevirdi. Sonra həmin adam zina etdiyini yenə etiraf etdi. Peyğəmbər ﷺ üzünü ondan yana çevirdi. Sonra həmin adam zina etdiyini yenə etiraf etdi. Peyğəmbər ﷺ üzünü ondan yana çevirdi. Həmin adam zina etdiyini dörd dəfə etiraf etdi. Peyğəmbər ﷺ dedi: "Sən dəlisən?" Adam: "Xeyr" dedi. Peyğəmbər ﷺ dedi: "Evlisən?" Adam: "Bəli" dedi. Peyğəmbər ﷺ onun rəcm olunmasını əmr etdi, o da rəcm olundu. Bu əsnada həmin adam rəcm edilərkən qaçdı, lakin tutuldu və ölənə qədər rəcm olundu. Allah Elçisi ﷺ onun üçün xeyir dua etdi, lakin cənazə namazını qılmadı.

## ٦٤ - الصَّلاَةُ عَلَى الْمَرْجُومِ

## 64-cü fəsil: Rəcm olunmuş adamın cənazə namazını qılmaq

١٩٥٧ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا هِشَامٌ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ أَبِي الْمُهَلَّبِ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ، أَنَّ امْرَأَةً مِنْ جُهَيْنَةَ أَتَتْ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَقَالَتْ : إِنِّي زَنَيْتُ ، وَهِيَ حُبْلَى ، فَدَفَعَهَا إِلَى وَلِيِّهَا فَقَالَ : أَحْسِنْ إِلَيْهَا ، فَإِذَا وَضَعَتْ فَأْتِنِي بِهَا ، فَلَمَّا وَضَعَتْ جَاءَ بِهَا ، فَأَمَرَ بِهَا فَشُكَّتْ عَلَيْهَا ثِيَابُهَا ، ثُمَّ رَجَمَهَا ، ثُمَّ صَلَّى عَلَيْهَا ، فَقَالَ لَهُ عُمَرُ : أَتُصَلِّي عَلَيْهَا وَقَدْ زَنَتْ ، فَقَالَ : لَقَدْ تَابَتْ تَوْبَةً لَوْ قُسِمَتْ بَيْنَ سَبْعِينَ مِنْ أَهْلِ الْمَدِينَةِ لَوَسِعَتْهُمْ ، وَهَلْ وَجَدْتَ تَوْبَةً أَفْضَلَ مِنْ أَنْ جَادَتْ بِنَفْسِهَا لِلَّهِ عَزَّ وَجَلَّ.

1957. ...İmran ibn Husayn ﷺ rəvayət edir ki, Cuheynədən olan bir qadın Allah Elçisinin ﷺ yanına gəlib dedi: "Mən zina etmişəm". Həmin qadın hamilə idi. Allah Elçisi ﷺ onu vəlisinə tapşırdı və dedi: "Ona yaxşı bax! Vaxtı çatanda (uşağı dünyaya gətirəndən sonra) mənim yanıma gətir".

[1] Rəcm - daşqalaq olunmaq.

Qadın uşağı dünyaya gətirədikdən sonra vəlisi onu Allah Elçisinin ﷺ yanına gətirdi. Allah Elçisi ﷺ ona paltarının bağlanmasını əmr etdi və o, rəcm edildi. Sonra onun cənazə namazını qıldı. Ömər ona dedi: "Sən zina edənin cənazə namazını qılırsan?" Allah Elçisi ﷺ buyurdu: "O, elə bir tövbə etdi ki, əgər Mədinə əhlindən yetmiş nəfərə paylansaydı, hamısına bəs edərdi. Sən Allah üçün canını fəda etməkdən daha üstün tövbə bilirsən?!"

### ٦٥ - الصَّلاَةُ عَلَى مَنْ يَحِيفُ فِي وَصِيَّتِهِ

### 65-ci fəsil: Ədalətsiz vəsiyyət edənin cənazə namazını qılmaq

١٩٥٨ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا هُشَيْمٌ ، عَنْ مَنْصُورٍ وَهُوَ ابْنُ زَاذَانَ ، عَنِ الْحَسَنِ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ ، أَنَّ رَجُلاً أَعْتَقَ سِتَّةً مَمْلُوكِينَ لَهُ عِنْدَ مَوْتِهِ ، وَلَمْ يَكُنْ لَهُ مَالٌ غَيْرَهُمْ ، فَبَلَغَ ذَلِكَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَغَضِبَ مِنْ ذَلِكَ وَقَالَ: « لَقَدْ هَمَمْتُ أَنْ لاَ أُصَلِّيَ عَلَيْهِ ». ثُمَّ دَعَا مَمْلُوكِيهِ فَجَزَّأَهُمْ ثَلاَثَةَ أَجْزَاءٍ ، ثُمَّ أَقْرَعَ بَيْنَهُمْ ، فَأَعْتَقَ اثْنَيْنِ وَأَرَقَّ أَرْبَعَةً.

1958. ...İmran ibn Husayn ﵁ rəvayət edir ki, bir nəfər ölüm ayağında olarkən özünün altı köləsini azad etdi. Onun bu kölələrdən başqa heç bir malı yox idi. Bu hadisə Peyğəmbərə ﷺ çatdıqda qəzəblənərək dedi: "Artıq mən onun cənazə namazını qılmaq istəmirəm". Sonra adamın kölələrini çağırtdırdı və onları üç qrupa ayırdı. Aralarında püşk atdı; ikisini azad etdi, dördünü isə kölə olaraq saxladı.[1]

### ٦٦ - الصَّلاَةُ عَلَى مَنْ غَلَّ

### 66-cı fəsil: Oğurluq edənin cənazə namazını qılmaq

١٩٥٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ سَعِيدٍ ، عَنْ يَحْيَى بْنِ سَعِيدٍ الأَنْصَارِيِّ ، عَنْ مُحَمَّدِ بْنِ يَحْيَى بْنِ حَبَّانَ ، عَنْ أَبِي عَمْرَةَ ، عَنْ زَيْدِ بْنِ خَالِدٍ قَالَ : مَاتَ رَجُلٌ بِخَيْبَرَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صَلُّوا عَلَى صَاحِبِكُمْ إِنَّهُ غَلَّ فِي سَبِيلِ اللهِ ، فَفَتَّشْنَا مَتَاعَهُ فَوَجَدْنَا فِيهِ خَرَزًا مِنْ خَرَزِ يَهُودَ مَا يُسَاوِي دِرْهَمَيْنِ.

---

[1] Bəziləri Peyğəmbərin ﷺ bu hədisini düzgün başa düşməyə bilər. Digər səhih hədislərdən məlum olur ki, Peyğəmbərin ﷺ dövründə müsəlmanlara məxsus kölələr sahibinin yediyindən yeyər, geyindiyindən geyər, hər bir müsəlman sahib olduğu köləsinə də qardaşı kimi baxardı. Peyğəmbər ﷺ kölələrə bərabər hüquqla davranmağı və onları azad etməyi təşviq edərdi. Bu hədisdə isə kasıb olanın köləsi də kasıb olduğu üçün azad olunduqdan sonra kasıblıqdan əziyyət çəkməsini nəzərə alaraq onların bir qismini azad etmək, bir qismini isə kölə kimi saxlayaraq insanlara xidmətə verməkdən söhbət gedir.

1959. ...Rəvayət edilir ki, Zeyd ibn Xalid ﵁ demişdir: “Xeybər döyüşündə bir kişi öldü. Allah Elçisi ﷺ belə buyurdu: “Yoldaşınızın cənazə namazını qılın! Həqiqətən, o, Allah yolunda döyüşərkən oğurluq etmişdir”. Onun əşyalarını axtardıqda iki dirhəm dəyərində yəhudi muncuğu tapdıq”.[1]

٦٧ - الصَّلاَةُ عَلَى مَنْ عَلَيْهِ دَيْنٌ

## 67-ci fəsil: Borcu olanın cənazə namazını qılmaq

١٩٦٠ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عُثْمَانَ بْنِ عَبْدِ اللهِ بْنِ مَوْهَبٍ ، سَمِعْتُ عَبْدَ اللهِ بْنَ أَبِي قَتَادَةَ يُحَدِّثُ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أُتِيَ بِرَجُلٍ مِنَ الأَنْصَارِ لِيُصَلِّيَ عَلَيْهِ فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : صَلُّوا عَلَى صَاحِبِكُمْ فَإِنَّ عَلَيْهِ دَيْنًا ، قَالَ : أَبُو قَتَادَةَ هُوَ عَلَيَّ ، قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : بِالْوَفَاءِ ، قَالَ : بِالْوَفَاءِ ، فَصَلَّى عَلَيْهِ.

1960. ...Abdullah ibn Əbu Qatədə atasından ﵁ rəvayət edir ki, ənsardan vəfat etmiş bir kişini cənazə namazını qılmaq üçün Allah Elçisinin ﷺ yanına gətirdilər. Peyğəmbər ﷺ dedi: “Yoldaşınızın cənazə namazını qılın. Onun borcu var”. Əbu Qatədə onun borcunu ödəməyi öz üzərinə götürdü. Peyğəmbər ﷺ dedi: “Sən əhdinə vəfalı olacaqsan?” Əbu Qatədə: “Mən əhdimə vəfalı olacağam” dedikdə Peyğəmbər ﷺ onun cənazə namazını qıldı.

١٩٦١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، وَمُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالاَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ أَبِي عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا سَلَمَةُ ، يَعْنِي ابْنَ الأَكْوَعِ قَالَ : أُتِيَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِجَنَازَةٍ ، فَقَالُوا : يَا نَبِيَّ اللهِ ، صَلِّ عَلَيْهَا ، قَالَ : هَلْ تَرَكَ عَلَيْهِ دَيْنًا ؟ ، قَالُوا : نَعَمْ ، قَالَ : هَلْ تَرَكَ مِنْ شَيْءٍ ؟ قَالُوا : لاَ ، قَالَ : صَلُّوا عَلَى صَاحِبِكُمْ قَالَ رَجُلٌ مِنَ الأَنْصَارِ يُقَالُ لَهُ : أَبُو قَتَادَةَ : صَلِّ عَلَيْهِ وَعَلَيَّ دَيْنُهُ ، فَصَلَّى عَلَيْهِ.

1961. ...Rəvayət edilir ki, Sələmə ibn Əkva ﵁ demişdir: “Peyğəmbərin ﷺ yanına bir cənazə gətirib dedilər: “Ey Allahın Peyğəmbəri, onun cənazə namazını qıl!” Allah Elçisi ﷺ dedi: “Onun borcu varmı?” Səhabələr dedilər: “Bəli, var”. Peyğəmbər ﷺ dedi: “Onun tərk etdiyi bir şey varmı?” Səhabələr dedilər: “Xeyr”. Peyğəmbər ﷺ dedi: “Onda yoldaşınızın cənazə namazını qılın!” Ənsardan Əbu Qatədə adlı bir kişi dedi: “Namazını qılın, onun borcunu mən ödəyəcəm”. Peyğəmbər ﷺ də onun cənazə namazını qıldı”.

[1] Hədis zəifdir.

١٩٦٢ - أَخْبَرَنَا نُوحُ بْنُ حَبِيبٍ الْقُومَسِيُّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ جَابِرٍ قَالَ : كَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لاَ يُصَلِّي عَلَى رَجُلٍ عَلَيْهِ دَيْنٌ ، فَأُتِيَ بِمَيْتٍ ، فَسَأَلَ : أَعَلَيْهِ دَيْنٌ ؟ قَالُوا : نَعَمْ ، عَلَيْهِ دِينَارَانِ ، قَالَ : صَلُّوا عَلَى صَاحِبِكُمْ ، قَالَ أَبُو قَتَادَةَ : هُمَا عَلَيَّ يَا رَسُولَ اللهِ ، فَصَلَّى عَلَيْهِ ، فَلَمَّا فَتَحَ اللَّهُ عَلَى رَسُولِهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَنَا أَوْلَى بِكُلِّ مُؤْمِنٍ مِنْ نَفْسِهِ ، مَنْ تَرَكَ دَيْنًا فَعَلَيَّ ، وَمَنْ تَرَكَ مَالاً فَلِوَرَثَتِهِ.

1962. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Peyğəmbər ﷺ borcu olanın cənazə namazını qılmazdı. Bir cənazə gətirildi. Peyğəmbər ﷺ soruşdu: “Onun borcu varmı?” Səhabələr dedilər: “Bəli, iki dinar borcu var”. Peyğəmbər ﷺ dedi: “Yoldaşınıza cənazə namazını qılın!” Əbu Qatədə dedi: “O iki dinarı mən ödəyəcəm, ey Allahın Elçisi!” Peyğəmbər ﷺ də onun cənazə namazını qıldı. Allah Öz Elçisinə ﷺ fəthlər nəsib etdikdə Peyğəmbər ﷺ dedi: “Mən hər möminə canından daha yaxınam. Kim borcu olaraq ölərsə, onun borcunu ödəmək mənə aiddir. Kim də mal-dövlət tərk edərsə, varislərinindir”.

١٩٦٣ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، وَابْنُ أَبِي ذِئْبٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا تُوُفِّيَ الْمُؤْمِنُ وَعَلَيْهِ دَيْنٌ سَأَلَ : هَلْ تَرَكَ لِدَيْنِهِ مِنْ قَضَاءٍ ؟ فَإِنْ قَالُوا : نَعَمْ صَلَّى عَلَيْهِ ، وَإِنْ قَالُوا : لاَ ، قَالَ : صَلُّوا عَلَى صَاحِبِكُمْ ، فَلَمَّا فَتَحَ اللَّهُ عَزَّ وَجَلَّ عَلَى رَسُولِهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ : أَنَا أَوْلَى بِالْمُؤْمِنِينَ مِنْ أَنْفُسِهِمْ ، فَمَنْ تُوُفِّيَ وَعَلَيْهِ دَيْنٌ فَعَلَيَّ قَضَاؤُهُ ، وَمَنْ تَرَكَ مَالاً فَهُوَ لِوَرَثَتِهِ.

1963. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, bir mömin vəfat etdikdə Allah Elçisi ﷺ: “Borcunun ödənilməsi üçün nə isə qoyubmu?” deyə soruşardı. “Bəli” deyildikdə qılar, “Xeyr” deyildikdə ”Yoldaşınızın cənazə namazını qılın!” deyərdi. Allah ﷻ Öz Elçisinə ﷺ fəthlər nəsib etdikdən sonra isə dedi: “Mən hər möminə canından daha yaxınam. Kim borcu olaraq ölərsə, onun borcunu ödəmək mənə aiddir. Kim də mal-dövlət tərk edərsə, varislərinindir”.

## ٦٨ - تَرْكُ الصَّلاَةِ عَلَى مَنْ قَتَلَ نَفْسَهُ

## 68-ci fəsil: İntihar edənə cənazə namazını qılmamaq

١٩٦٤ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : أَنْبَأَنَا أَبُو الْوَلِيدِ ، قَالَ : حَدَّثَنَا أَبُو خَيْثَمَةَ زُهَيْرٌ ، قَالَ : حَدَّثَنَا سِمَاكٌ ، عَنِ ابْنِ سَمُرَةَ ، أَنَّ رَجُلاً قَتَلَ نَفْسَهُ بِمَشَاقِصَ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : أَمَّا أَنَا فَلاَ أُصَلِّي عَلَيْهِ.

1964. ...İbn Səmura ﷺ rəvayət edir ki, bir adam oxla özünü öldürərək intihar etmişdi. Allah Elçisi ﷺ dedi: “Mənə gəldikdə isə, mən onun cənazə namazını qılmıram”.

١٩٦٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سُلَيْمَانَ ، سَمِعْتُ ذَكْوَانَ يُحَدِّثُ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ تَرَدَّى مِنْ جَبَلٍ ، فَقَتَلَ نَفْسَهُ فَهُوَ فِي نَارِ جَهَنَّمَ يَتَرَدَّى خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا ، وَمَنْ تَحَسَّى سُمًّا فَقَتَلَ نَفْسَهُ فَسُمُّهُ فِي يَدِهِ يَتَحَسَّاهُ فِي نَارِ جَهَنَّمَ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا ، وَمَنْ قَتَلَ نَفْسَهُ بِحَدِيدَةٍ ــ ثُمَّ انْقَطَعَ عَلَيَّ شَيْءٌ خَالِدٌ يَقُولُ ــ كَانَتْ حَدِيدَتُهُ فِي يَدِهِ يَجَأُ بِهَا فِي بَطْنِهِ فِي نَارِ جَهَنَّمَ خَالِدًا مُخَلَّدًا فِيهَا أَبَدًا.

1965. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kim özünü dağdan ataraq intihar edərsə, o, əbədi olaraq Cəhənnəm odunda bu cür əzaba düçar olar. Kim zəhər içərək intihar edərsə, əlində zəhər qabı Cəhənnəmdə əbədi olaraq zəhər içər. Kim özünü kəsici alətlə öldürərsə, əlindəki o alətlə qarnına vuraraq əbədiyyən Cəhənnəmdə olar".

## ٦٩ - الصَّلاَةُ عَلَى الْمُنَافِقِينَ

## 69-cu fəsil: Münafiqlər üçün cənazə namazını qılmaq

١٩٦٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا حُجَيْنُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ عُقَيْلٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عُبَيْدِ اللهِ بْنِ عَبْدِ اللهِ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، عَنْ عُمَرَ بْنِ الْخَطَّابِ قَالَ : لَمَّا مَاتَ عَبْدُ اللهِ بْنُ أُبَيٍّ ابْنُ سَلُولَ دُعِيَ لَهُ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِيُصَلِّيَ عَلَيْهِ ، فَلَمَّا قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَثَبْتُ إِلَيْهِ ، فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، تُصَلِّي عَلَى ابْنِ أُبَيٍّ وَقَدْ ؟ قَالَ : يَوْمَ كَذَا وَكَذَا كَذَا وَكَذَا أُعَدِّدُ عَلَيْهِ ، فَتَبَسَّمَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ : أَخِّرْ عَنِّي يَا عُمَرُ ، فَلَمَّا أَكْثَرْتُ عَلَيْهِ ، قَالَ : إِنِّي قَدْ خُيِّرْتُ فَاخْتَرْتُ ، فَلَوْ عَلِمْتُ أَنِّي لَوْ زِدْتُ عَلَى السَّبْعِينَ غُفِرَ لَهُ لَزِدْتُ عَلَيْهَا ، فَصَلَّى عَلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، ثُمَّ انْصَرَفَ ، فَلَمْ يَمْكُثْ إِلاَّ يَسِيرًا حَتَّى نَزَلَتِ الآيَتَانِ مِنْ بَرَاءَةَ **{وَلاَ تُصَلِّ عَلَى أَحَدٍ مِنْهُمْ مَاتَ أَبَدًا وَلاَ تَقُمْ عَلَى قَبْرِهِ إِنَّهُمْ كَفَرُوا بِاللَّهِ وَرَسُولِهِ وَمَاتُوا وَهُمْ فَاسِقُونَ}** ، فَعَجِبْتُ بَعْدُ مِنْ جُرْأَتِي عَلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَئِذٍ وَاللَّهُ وَرَسُولُهُ أَعْلَمُ.

1966. ...Rəvayət edilir ki, Ömər ibn əl-Xattab ﷺ demişdir: "Abdullah ibn Ubey ibn Səlul öldükdə onun cənazə namazını qılmaq üçün Allah Elçisini ﷺ çağırmışdılar. Allah Elçisi ﷺ qalxıb onun cənazə namazını qılmaq istədikdə mən onun önünə atıldım və dedim: "Ey Allahın Elçisi, sən İbn Ubeyin cənazə namazını qılmaq istəyirsən? Filan gün belə-belə, belə-belə, belə-belə" deyərək etdiklərini sadaladım. Allah Elçisi ﷺ təbəssüm edərək buyurdu: "Məni burax, ey Ömər!" Mən israr etdikdə dedi: "Mən (onun cənazə namazını qılıb-qılmamaqda) ixtiyar sahibiyəm! Əgər yetmiş dəfədən artıq bağışlanma diləməklə onun bağışlanacağını bilsəm, bunu da edərəm". O, cənazə namazını qıldı, sonra çıxıb getdi. Az bir müddət keçdikdən sonra ət-Tövbə surəsinin iki ayəsi nazil oldu: **"Heç vaxt onlardan ölmüş bir kəsin cənazə namazını qılma, qəbrinin başında da**

**durma. Çünki onlar Allahı və Onun Elçisini inkar etdilər və günahkar olaraq öldülər”** (ət-Tövbə, 84)”. Sonralar mən Allah Elçisinə ﷺ qarşı etdiyim cürətdən heyrət etdim. Doğrusunu Allah bilir”.

### ٧٠ - الصَّلاَةُ عَلَى الْجَنَازَةِ فِي الْمَسْجِدِ

### 70-ci fəsil: Cənazə namazını məsciddə qılmaq

١٩٦٧ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، وَعَلِيُّ بْنُ حُجْرٍ ، قَالاَ : حَدَّثَنَا عَبْدُ الْعَزِيزِ بْنُ مُحَمَّدٍ ، عَنْ عَبْدِ الْوَاحِدِ بْنِ حَمْزَةَ ، عَنْ عَبَّادِ بْنِ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ ، عَنْ عَائِشَةَ قَالَتْ : مَا صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى سُهَيْلِ ابْنِ بَيْضَاءَ إِلاَّ فِي الْمَسْجِدِ.

1967. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ Suheyl ibn Beydanın cənazə namazını məsciddə qılmışdı”.

١٩٦٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ مُوسَى بْنِ عُقْبَةَ ، عَنْ عَبْدِ الْوَاحِدِ بْنِ حَمْزَةَ ، أَنَّ عَبَّادَ بْنَ عَبْدِ اللهِ بْنِ الزُّبَيْرِ أَخْبَرَهُ ، أَنَّ عَائِشَةَ قَالَتْ : مَا صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى سُهَيْلِ ابْنِ بَيْضَاءَ إِلاَّ فِي جَوْفِ الْمَسْجِدِ.

1968. ...Rəvayət edilir ki, Aişə رضي الله عنها demişdir: “Allah Elçisi ﷺ Suheyl ibn Beydanın cənazə namazını məscidin içində qılmışdı”.

### ٧١ - الصَّلاَةُ عَلَى الْجَنَازَةِ بِاللَّيْلِ

### 71-ci fəsil: Cənazə namazını gecə vaxtı qılmaq

١٩٦٩ - أَخْبَرَنَا يُونُسُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : حَدَّثَنِي يُونُسُ ، عَنِ ابْنِ شِهَابٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو أُمَامَةَ بْنُ سَهْلِ بْنِ حُنَيْفٍ أَنَّهُ قَالَ : اشْتَكَتِ امْرَأَةٌ بِالْعَوَالِي مِسْكِينَةٌ ، فَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَسْأَلُهُمْ عَنْهَا ، وَقَالَ : إِنْ مَاتَتْ فَلاَ تَدْفِنُوهَا حَتَّى أُصَلِّيَ عَلَيْهَا ، فَتُوُفِّيَتْ ، فَجَاؤُوا بِهَا إِلَى الْمَدِينَةِ بَعْدَ الْعَتَمَةِ ، فَوَجَدُوا رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَدْ نَامَ ، فَكَرِهُوا أَنْ يُوقِظُوهُ ، فَصَلَّوْا عَلَيْهَا وَدَفَنُوهَا بِبَقِيعِ الْغَرْقَدِ ، فَلَمَّا أَصْبَحَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ جَاؤُوا فَسَأَلَهُمْ عَنْهَا ، فَقَالُوا : قَدْ دُفِنَتْ يَا رَسُولَ اللهِ ، وَقَدْ جِئْنَاكَ فَوَجَدْنَاكَ نَائِمًا فَكَرِهْنَا أَنْ نُوقِظَكَ ، قَالَ : فَانْطَلِقُوا ، فَانْطَلَقَ يَمْشِي وَمَشَوْا مَعَهُ حَتَّى أَرَوْهُ قَبْرَهَا ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَصَفُّوا وَرَاءَهُ ، فَصَلَّى عَلَيْهَا وَكَبَّرَ أَرْبَعًا.

1969. ...Rəvayət edilir ki, Əbu Umamə ibn Səhl ibn Huneyf رضي الله عنه demişdir: “Mədinənin kənarında yaşayan bir kasıb qadın xəstələnmişdi. Peyğəmbər ﷺ səhabələrindən onun vəziyyəti haqda soruşar və deyərdi: “Öldükdə mən onun cənazə namazını qılmayana qədər onu dəfn etməyin!” Qadın öldükdə onu İşa namazından sonra Mədinəyə gətirdilər, amma Allah Elçisi ﷺ artıq yatmışdı. Səhabələr Allah Elçisini ﷺ narahat etməmək üçün onun cənazəsini qılıb Bəqiul-Ğarqad qəbiristanlığında dəfn etdilər. Səhər olduqda Allah Elçisi ﷺ gəlib o qadın haqda soruşdu. Səhabələr dedilər:

“Onu dəfn etmişik, ey Allahın Elçisi! Biz onu sənin yanına gətirdikdə sən yatmışdın, ona görə də səni oyatmaq istəmədik”. Allah Elçisi ﷺ dedi: “Gedək!” Onlar Peyğəmbərlə ﷺ birlikdə gəlib qadının qəbrini ona göstərdilər. Allah Elçisi ﷺ namaza durdu, insanlar da onun arxasında səfə düzüldülər və o, dörd təkbir edərək cənazə namazını qıldırdı”.

### ٧٢ - الصُّفُوفُ عَلَى الْجَنَازَةِ

### 72-ci fəsil: Cənazə namazındakı səflər

١٩٧٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ ، عَنْ حَفْصِ بْنِ غِيَاثٍ ، عَنْ ابْنِ جُرَيْجٍ ، عَنْ عَطَاءٍ ، عَنْ جَابِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ أَخَاكُمُ النَّجَاشِيَّ قَدْ مَاتَ ، فَقُومُوا فَصَلُّوا عَلَيْهِ ، فَقَامَ فَصَفَّ بِنَا كَمَا يُصَفُّ عَلَى الْجَنَازَةِ وَصَلَّى عَلَيْهِ.

1970. ...Cabir ؓ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, qardaşınız Nəcaşi vəfat etmişdir. Qalxın, onun cənazə namazını qılın!” Sonra özü ayağa durdu, bizi cənazənin önündə səfdə durduğumuz kimi səfə düzdü və cənazə namazını qıldı.

١٩٧١ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَعَى لِلنَّاسِ النَّجَاشِيَّ الْيَوْمَ الَّذِي مَاتَ فِيهِ ، ثُمَّ خَرَجَ بِهِمْ إِلَى الْمُصَلَّى ، فَصَفَّ بِهِمْ فَصَلَّى عَلَيْهِ وَكَبَّرَ أَرْبَعَ تَكْبِيرَاتٍ.

1971. ...Əbu Hureyra ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ Nəcaşinin öldüyü gün insanlara onun ölüm xəbərini verdi. Sonra onlarla namazgaha getdi, onları səfə düzdü və dörd təkbir etməklə (Nəcaşinin) cənazə namazını qıldı”.

١٩٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ ابْنِ الْمُسَيَّبِ ، وَأَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : نَعَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ النَّجَاشِيَّ لأَصْحَابِهِ بِالْمَدِينَةِ ، فَصَفُّوا خَلْفَهُ ، فَصَلَّى عَلَيْهِ ، وَكَبَّرَ أَرْبَعًا. قَالَ أَبُو عَبْدِ الرَّحْمَنِ : ابْنُ الْمُسَيَّبِ إِنِّي لَمْ أَفْهَمْهُ كَمَا أَرَدْتَ.

1972. ...Rəvayət edilir ki, Əbu Hureyra ؓ demişdir: “Allah Elçisi ﷺ Mədinədə səhabələrinə Nəcaşinin ölüm xəbərini verdi. Sonra onlar Allah Elçisinin ﷺ arxasında səfə düzüldülər. O, dörd təkbir etməklə (Nəcaşinin) cənazə namazını qıldı”.

١٩٧٣ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ أَخَاكُمْ قَدْ مَاتَ ، فَقُومُوا فَصَلُّوا عَلَيْهِ ، فَصَفَفْنَا عَلَيْهِ صَفَّيْنِ.

1973. ...Cabir ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, qardaşınız vəfat etmişdir. Qalxın, onun cənazə namazını qılın!" Biz iki səf olduq.

١٩٧٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا أَبُو دَاوُدَ ، سَمِعْتُ شُعْبَةَ ، يَقُولُ : ـــ السَّاعَةَ يَخْرُجُ السَّاعَةَ يَخْرُجُ ـــ حَدَّثَنَا أَبُو الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : كُنْتُ فِي الصَّفِّ الثَّانِي يَوْمَ صَلَّى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى النَّجَاشِيِّ.

1974. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: "Allah Elçisi ﷺ Nəcaşiyə cənazə qılan gün mən ikinci səfdə idim".

١٩٧٥ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا بِشْرُ بْنُ الْمُفَضَّلِ ، قَالَ : حَدَّثَنَا يُونُسُ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ أَبِي الْمُهَلَّبِ ، عَنْ عِمْرَانَ بْنِ حُصَيْنٍ قَالَ : قَالَ لَنَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ أَخَاكُمُ النَّجَاشِيَّ قَدْ مَاتَ ، فَقُومُوا فَصَلُّوا عَلَيْهِ ، قَالَ : فَقُمْنَا فَصَفَفْنَا عَلَيْهِ كَمَا يُصَفُّ عَلَى الْمَيِّتِ ، وَصَلَّيْنَا عَلَيْهِ كَمَا يُصَلَّى عَلَى الْمَيِّتِ.

1975. ...Rəvayət edilir ki, İmran ibn Husayn ﵁ demişdir: "Allah Elçisi ﷺ bizə belə buyurdu: "Həqiqətən, qardaşınız Nəcaşi vəfat etmişdir. Qalxın, onun cənazə namazını qılın!" Biz ayağa qalxdıq və cənazə namazında olduğu kimi səflərə düzdüldük. Cənazə namazında olduğu kimi namaz qıldıq".

## ٧٣ - الصَّلاَةُ عَلَى الْجَنَازَةِ قَائِمًا

## 73-cü fəsil: Ayaq üstə cənazə namazı

١٩٧٦ - أَخْبَرَنَا حُمَيْدُ بْنُ مَسْعَدَةَ ، عَنْ عَبْدِ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا حُسَيْنٌ ، عَنْ ابْنِ بُرَيْدَةَ ، عَنْ سَمُرَةَ ، قَالَ : صَلَّيْتُ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى أُمِّ كَعْبٍ مَاتَتْ فِي نِفَاسِهَا ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي الصَّلاَةِ فِي وَسَطِهَا.

1976. ...Rəvayət edilir ki, Səmura ﵁ demişdir: "Mən Allah Elçisi ﷺ ilə birlikdə nifasdan ölən Ummu Kəbə cənazə namazı qıldım. Allah Elçisi ﷺ ayağa durdu və cənazə namazını meyitin orta[1] tərəfində duraraq qıldı".

[1] Kişi üçün cənazə namazı qılındıqda isə imam onun baş tərəfində durmalıdır.

## ٧٤ - اجْتِمَاعُ جِنَازَةِ صَبِيٍّ وَامْرَأَةٍ

## 74-cü fəsil: Uşağın və qadının cənazə namazını birlikdə qılmaq

١٩٧٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا سَعِيدٌ ، قَالَ : حَدَّثَنِي يَزِيدُ بْنُ أَبِي حَبِيبٍ ، عَنْ عَطَاءِ بْنِ أَبِي رَبَاحٍ ، عَنْ عَمَّارٍ قَالَ : حَضَرَتْ جِنَازَةُ صَبِيٍّ وَامْرَأَةٍ ، فَقُدِّمَ الصَّبِيُّ مِمَّا يَلِي الْقَوْمَ ، وَوُضِعَتِ الْمَرْأَةُ وَرَاءَهُ ، فَصَلَّى عَلَيْهِمَا ، وَفِي الْقَوْمِ أَبُو سَعِيدٍ الْخُدْرِيُّ ، وَابْنُ عَبَّاسٍ ، وَأَبُو قَتَادَةَ ، وَأَبُو هُرَيْرَةَ فَسَأَلْتُهُمْ عَنْ ذَلِكَ ، فَقَالُوا : السُّنَّةُ.

1977. ...Rəvayət edilir ki, Ammər ﷺ demişdir: “Bir uşaqla qadının cənazəsində iştirak edirdim. Uşağın cənazəsi önə, qadının cənazəsi isə onun arxa tərəfinə qoyuldu. İkisinin cənazə namazı birlikdə qılındı. Cənazə namazını qılanlar arasında Əbu Səid əl-Xudri, İbn Abbas, Əbu Qatədə və Əbu Hureyra da var idi. Onlardan bu haqda soruşduqda dedilər: “Bu, sünnədir”.

## ٧٥ - اجْتِمَاعُ جَنَائِزِ الرِّجَالِ وَالنِّسَاءِ

## 75-ci fəsil: Kişinin və qadının birlikdə cənazə namazı

١٩٧٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا ابْنُ جُرَيْجٍ ، قَالَ : سَمِعْتُ نَافِعًا يَزْعُمُ ، أَنَّ ابْنَ عُمَرَ صَلَّى عَلَى تِسْعِ جَنَائِزَ جَمِيعًا فَجَعَلَ الرِّجَالَ يَلُونَ الإِمَامَ ، وَالنِّسَاءَ يَلِينَ الْقِبْلَةَ ، فَصَفَّهُنَّ صَفًّا وَاحِدًا ، وَوُضِعَتْ جِنَازَةُ أُمِّ كُلْثُومٍ بِنْتِ عَلِيٍّ امْرَأَةِ عُمَرَ بْنِ الْخَطَّابِ ، وَابْنٍ لَهَا يُقَالُ لَهُ زَيْدٌ وُضِعَا جَمِيعًا وَالإِمَامُ يَوْمَئِذٍ سَعِيدُ بْنُ الْعَاصِ ، وَفِي النَّاسِ ابْنُ عُمَرَ ، وَأَبُو هُرَيْرَةَ ، وَأَبُو سَعِيدٍ ، وَأَبُو قَتَادَةَ ، فَوُضِعَ الْغُلاَمُ مِمَّا يَلِي الإِمَامَ ، فَقَالَ رَجُلٌ : فَأَنْكَرْتُ ذَلِكَ ، فَنَظَرْتُ إِلَى ابْنِ عَبَّاسٍ ، وَأَبِي هُرَيْرَةَ ، وَأَبِي سَعِيدٍ ، وَأَبِي قَتَادَةَ ، فَقُلْتُ : مَا هَذَا ؟ قَالُوا : هِيَ السُّنَّةُ.

1978. ...Nafi ﷺ rəvayət edir ki, İbn Ömər doqquz nəfərin cənazəsinə birlikdə bir cənazə namazı qıldı. Kişiləri imamın qabağına doğru, qadınları isə onların arxasına qiblə tərəfə qoydu və onları bir sıra şəklində düzdü. Ömər ibn əl-Xattabın zövcəsi Ummu Kulsum bint Əlini və onun Zeyd adlı oğlunun cənazəsini birlikdə qoydu. O gün imam Səd ibn əl-As idi. İnsanların arasında İbn Ömər, Əbu Hureyra, Əbu Səid və Əbu Qatədə var idi. Uşağın cənazəsi imama yaxın qoyuldu. Bir kişi dedi: “Bunu bəyənmirəm”. Bu əsnada İbn Abbasa, Əbu Hureyraya, Əbu Səidə və Əbu Qatədəyə baxdım və dedim: “Bu nədir?” Onlar dedilər: “Bu, sünnədir”.

١٩٧٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : أَنْبَأَنَا ابْنُ الْمُبَارَكِ ، وَالْفَضْلُ بْنُ مُوسَى (ح) وأَخْبَرَنَا سُوَيْدٌ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ حُسَيْنٍ الْمُكْتِبِ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُرَيْدَةَ ، عَنْ سَمُرَةَ بْنِ جُنْدُبٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى عَلَى أُمِّ فُلاَنٍ مَاتَتْ فِي نِفَاسِهَا ، فَقَامَ فِي وَسَطِهَا.

1979. ...Səmura ibn Cundub ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ nifasdan vəfat edən Ummu Fulanın cənazəsinin orta tərəfində duraraq cənazə namazını qıldı.

٧٦ - عَدَدُ التَّكْبِيرِ عَلَى الْجَنَازَةِ

76-cı fəsil: Cənazə namazında olan təkbirlərin sayı

١٩٨٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدٍ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَعَى لِلنَّاسِ النَّجَاشِيَّ ، وَخَرَجَ بِهِمْ فَصَفَّ بِهِمْ ، وَكَبَّرَ أَرْبَعَ تَكْبِيرَاتٍ.

1980. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Nəcaşinin vəfat etdiyini bizə xəbər verdi və bizi çıxararaq səfə düzdü. Sonra dörd təkbirlə cənazə namazını qıldı.

١٩٨١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي أُمَامَةَ بْنِ سَهْلٍ قَالَ : مَرِضَتِ امْرَأَةٌ مِنْ أَهْلِ الْعَوَالِي ، وَكَانَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَحْسَنَ شَيْءٍ عِيَادَةً لِلْمَرِيضِ ، فَقَالَ : إِذَا مَاتَتْ فَآذِنُونِي ، فَمَاتَتْ لَيْلاً ، فَدَفَنُوهَا وَلَمْ يُعْلِمُوا النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا أَصْبَحَ سَأَلَ عَنْهَا ، فَقَالُوا : كَرِهْنَا أَنْ نُوقِظَكَ يَا رَسُولَ اللهِ ، فَأَتَى قَبْرَهَا ، فَصَلَّى عَلَيْهَا وَكَبَّرَ أَرْبَعًا.

1981. ...Rəvayət edilir ki, Əbu Umamə ibn Səhl demişdir: "Mədinənin kənarında yaşayan bir qadın xəstələnmişdi. Peyğəmbər ﷺ xəstə ziyarətinə diqqətli olardı. O dedi: "Bu qadın öldükdə mənə xəbər verin!" Qadın gecə vaxtı vəfat etdi. Onu gecə dəfn etdilər və bunu Peyğəmbərə ﷺ bildirmədilər. Səhər Peyğəmbər ﷺ o qadın haqda soruşduqda səhabələr dedilər: "Səni oyatmaq istəmədik, ey Allahın Elçisi!" Peyğəmbər ﷺ onun dəfn olunduğu yerə gedərək onun cənazə namazını qıldı və namazda dörd dəfə təkbir etdi".

١٩٨٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : حَدَّثَنِي عَمْرُو بْنُ مُرَّةَ ، عَنْ ابْنِ أَبِي لَيْلَى ، أَنَّ زَيْدَ بْنَ أَرْقَمَ صَلَّى عَلَى جِنَازَةٍ فَكَبَّرَ عَلَيْهَا خَمْسًا ، وَقَالَ : كَبَّرَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1982. ...İbn Əbu Leyla ﷺ rəvayət edir ki, Zeyd ibn Ərqam bir cənazənin namazını qıldı, beş dəfə təkbir etdi və: "Allah Elçisi ﷺ (də bu qədər) təkbir etmişdir".

## ٧٧ - الدُّعَاءُ

## 77-ci fəsil: Cənazə namazında oxunan dua

١٩٨٣ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ عَمْرِو بْنِ السَّرْحِ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، عَنْ أَبِي حَمْزَةَ بْنِ سُلَيْمٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ جُبَيْرٍ ، عَنْ أَبِيهِ ، عَنْ عَوْفِ بْنِ مَالِكٍ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى عَلَى جنَازَةٍ يَقُولُ : اللَّهُمَّ اغْفِرْ لَهُ وَارْحَمْهُ ، وَاعْفُ عَنْهُ وَعَافِهِ ، وَأَكْرِمْ نُزُلَهُ ، وَوَسِّعْ مُدْخَلَهُ ، وَاغْسِلْهُ بِمَاءٍ وَثَلْجٍ وَبَرَدٍ ، وَنَقِّهِ مِنَ الْخَطَايَا كَمَا يُنَقَّى الثَّوْبُ الأَبْيَضُ مِنَ الدَّنَسِ ، وَأَبْدِلْهُ دَارًا خَيْرًا مِنْ دَارِهِ ، وَأَهْلاً خَيْرًا مِنْ أَهْلِهِ ، وَزَوْجًا خَيْرًا مِنْ زَوْجِهِ ، وَقِهِ عَذَابَ الْقَبْرِ ، وَعَذَابَ النَّارِ ، قَالَ عَوْفٌ : فَتَمَنَّيْتُ أَنْ لَوْ كُنْتُ الْمَيِّتَ لِدُعَاءِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِذَلِكَ الْمَيِّتِ.

1983. ...Rəvayət edilir ki, Auf ibn Malik ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ cənazə namazını qılarkən belə dua etdiyini eşitdim: "Allahım! Onu bağışla, ona rəhm et, onu əfv et, onu (günahlardan) salamat et, onu gözəl tərzdə qarşıla, onun yerini geniş et! Onu su, qar və dolu ilə yu! Ağ paltarı çirkdən təmizlədiyin kimi onu da günahlardan təmizlə! Ona evinin əvəzinə daha xeyirli ev, ailəsinin əvəzinə daha xeyirli ailə, zövcəsinin əvəzinə daha xeyirli zövcə ver! Onu qəbir və Cəhənnəm əzabından qoru![1]" Auf deyir: "Mən Allah Elçisinin ﷺ ölən adama etdiyi duaları eşitdikdə, "bu ölən mən olaydım" deyə təmənna etdim".

١٩٨٤ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا مَعْنٌ ، قَالَ : حَدَّثَنَا مُعَاوِيَةُ بْنُ صَالِحٍ ، عَنْ حَبِيبِ بْنِ عُبَيْدٍ الْكَلَاعِيِّ ، عَنْ جُبَيْرِ بْنِ نُفَيْرٍ الْحَضْرَمِيِّ ، قَالَ : سَمِعْتُ عَوْفَ بْنَ مَالِكٍ يَقُولُ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يُصَلِّي عَلَى مَيِّتٍ فَسَمِعْتُ فِي دُعَائِهِ وَهُوَ يَقُولُ : اللَّهُمَّ اغْفِرْ لَهُ وَارْحَمْهُ ، وَعَافِهِ وَاعْفُ عَنْهُ ، وَأَكْرِمْ نُزُلَهُ ، وَوَسِّعْ مُدْخَلَهُ ، وَاغْسِلْهُ بِالْمَاءِ وَالثَّلْجِ وَالْبَرَدِ ، وَنَقِّهِ مِنَ الْخَطَايَا كَمَا نَقَّيْتَ الثَّوْبَ الأَبْيَضَ مِنَ الدَّنَسِ ، وَأَبْدِلْهُ دَارًا خَيْرًا مِنْ دَارِهِ ، وَأَهْلاً خَيْرًا مِنْ أَهْلِهِ ، وَزَوْجًا خَيْرًا مِنْ زَوْجِهِ ، وَأَدْخِلْهُ الْجَنَّةَ وَنَجِّهِ مِنَ النَّارِ — أَوْ قَالَ — : وَأَعِذْهُ مِنْ عَذَابِ الْقَبْرِ.

1984. ...Rəvayət edilir ki, Auf ibn Malik ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ cənazə namazını qılarkən belə dua etdiyini eşitdim: "Allahım! Onu bağışla, ona rəhm et, onu (günahlardan) salamat et, onu əfv et, onu gözəl tərzdə qarşıla, onun yerini geniş et! Onu su, qar və dolu ilə yu! Ağ paltarı çirkdən təmizlədiyin kimi onu da günahlardan təmizlə! Ona evinin əvəzinə daha xeyirli ev, ailəsinin əvəzinə daha xeyirli ailə, zövcəsinin

[1] Transkripsiyası: Alla:hummə-ğfir ləhu varhəmhu va'fu anhu va a:fihi va əkrim nuzuləhu va vassi' mudxaləhu vağsilhu bi mə:i va səlci va bəradi va nəqqihi minəl-xata:yə: kəmə: yunəqqis-səubul-əbyədu minəd-dənəsi, va əbdilhu də:ran xayran min də:rihi, va əhlən xayran min əhlihi, va zəucən xayran min zəucihi va qihi azə:bil-qabri va azə:bin-nə:r!

əvəzinə daha xeyirli zövcə ver! Onu Cənnətə daxil et! Onu Cəhənnəm əzabından xilas et![1]" və ya dedi: "Onu qəbir əzabından qoru!"

١٩٨٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَمْرِو بْنِ مُرَّةَ ، قَالَ : سَمِعْتُ عَمْرَو بْنَ مَيْمُونٍ يُحَدِّثُ ، عَنْ عَبْدِ اللهِ بْنِ رُبَيِّعَةَ السُّلَمِيِّ ، وَكَانَ مِنْ أَصْحَابِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، عَنْ عُبَيْدِ بْنِ خَالِدٍ السُّلَمِيِّ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ آخَى بَيْنَ رَجُلَيْنِ ، فَقُتِلَ أَحَدُهُمَا وَمَاتَ الآخَرُ بَعْدَهُ ، فَصَلَّيْنَا عَلَيْهِ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَا قُلْتُمْ ؟ قَالُوا : دَعَوْنَا لَهُ اللَّهُمَّ اغْفِرْ لَهُ ، اللَّهُمَّ ارْحَمْهُ ، اللَّهُمَّ أَلْحِقْهُ بِصَاحِبِهِ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَأَيْنَ صَلاَتُهُ بَعْدَ صَلاَتِهِ ؟ وَأَيْنَ عَمَلُهُ بَعْدَ عَمَلِهِ ؟ فَلَمَا بَيْنَهُمَا كَمَا بَيْنَ السَّمَاءِ وَالأَرْضِ قَالَ عَمْرُو بْنُ مَيْمُونٍ : أَعْجَبَنِي لأَنَّهُ أَسْنَدَ لِي.

1985. Ubeyd ibn Xalid əs-Suləmi rəvayət edir ki, Allah Elçisi ﷺ iki kişi arasında qardaşlıq təyin etmişdi. Onlardan biri döyüşdə öldürüldü, digəri isə ondan sonra vəfat etdi. Biz onun cənazə namazını qılıdıq. Peyğəmbər ﷺ dedi: "Siz (duanızda) nə dediniz?" Səhabələr dedilər: "Duamızda dedik: "Allahım, onu bağışla! Allahım, ona rəhm et! Allahım, onu dostuna qovuşdur!" Peyğəmbər ﷺ dedi: "Onun namazı harda, bunun namazı harda?! Onun əməli harda, bunun əməli harda?! Onların arasında göylə yer arası qədər fərq var". Ravi Amr ibn Məymun dedi: "Bu, mənə təəccüblü gəldi".

١٩٨٦ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا هِشَامُ بْنُ أَبِي عَبْدِ اللهِ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي إِبْرَاهِيمَ الأَنْصَارِيِّ ، عَنْ أَبِيه ، أَنَّهُ سَمِعَ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ فِي الصَّلاَةِ عَلَى الْمَيِّتِ : اللَّهُمَّ اغْفِرْ لِحَيِّنَا وَمَيِّتِنَا ، وَشَاهِدِنَا وَغَائِبِنَا ، وَذَكَرِنَا وَأُنْثَانَا ، وَصَغِيرِنَا وَكَبِيرِنَا.

1986. ...Əbu İbrahim əl-Ənsari ﵁ rəvayət edir ki, atası Peyğəmbrin ﷺ bir cənazə namazında belə dediyini eşitmişdir: "Allahım, dirimizi və ölümüzü, burada olanımızı və olmayanımızı, kişimizi və qadınımızı, kiçiyimizi və böyüyümüzü bağışla![2]"

١٩٨٧ - أَخْبَرَنَا الْهَيْثَمُ بْنُ أَيُّوبَ ، قَالَ : حَدَّثَنَا إِبْرَاهِيمُ وَهُوَ ابْنُ سَعْدٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ طَلْحَةَ بْنِ عَبْدِ اللهِ بْنِ عَوْفٍ ،

---

[1] Transkripsiyası: Alla:hummə-ğfir ləhu varhəmhu va a:fihi va'fu anhu va əkrim nuzuləhu va vassi' mudxaləhu vağsilhu bil-mə:i vas-səlci val-bəradi va nəqqihi minəl-xata:yə: kəmə: nəqqaytəs-səubəl-əbyəda minəd-dənəsi, va əbdilhu də:ran xayran min də:rihi, va əhlən xayran min əhlihi, va zəucən xayran min zəucihi va ədxilhul-cənnətə va nəccihi min ən-nə:r!.. Va əi'zhu min azə:bil-qabr!

[2] Transkripsiyası: Alla:hummə-ğfir liheyyinə: va meyyitinə: va şə:hidinə: va ğa:ibinə: va zəkərinə: va unsə:nə: va sağı:rinə: va kəbi:rinə:!

قَالَ : صَلَّيْتُ خَلْفَ ابْنِ عَبَّاسٍ عَلَى جِنَازَةٍ ، فَقَرَأَ بِفَاتِحَةِ الْكِتَابِ ، وَسُورَةٍ وَجَهَرَ حَتَّى أَسْمَعَنَا ، فَلَمَّا فَرَغَ أَخَذْتُ بِيَدِهِ ، فَسَأَلْتُهُ فَقَالَ : سُنَّةٌ وَحَقٌّ.

1987. ...Rəvayət edilir ki, Talha ibn Abdullah ibn Auf ﷺ demişdir: "Mən İbn Abbasın arxasında cənazə namazı qıldım. Namazda "əl-Fatihə" və başqa bir surəni eşidilə biləcək şəkildə səsli oxuyurdu. Namazı bitirdkidə onun əlindən tutub bu etdiyinin nə olduğunu soruşdum. O dedi: "Bu, sünnə və haqdır".

١٩٨٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ سَعْدِ بْنِ إِبْرَاهِيمَ ، عَنْ طَلْحَةَ بْنِ عَبْدِ اللهِ ، قَالَ : صَلَّيْتُ خَلْفَ ابْنِ عَبَّاسٍ عَلَى جِنَازَةٍ فَسَمِعْتُهُ يَقْرَأُ بِفَاتِحَةِ الْكِتَابِ ، فَلَمَّا انْصَرَفَ أَخَذْتُ بِيَدِهِ ، فَسَأَلْتُهُ فَقُلْتُ : تَقْرَأُ ، قَالَ : نَعَمْ ، إِنَّهُ حَقٌّ وَسُنَّةٌ.

1988. ...Rəvayət edilir ki, Talha ibn Abdullah ﷺ demişdir: "Mən İbn Abbasın arxasında cənazə namazı qıldım və namazda onun "əl-Fatihə" surəsini oxudu. Namazı bitirdkidə əlindən tutub soruşdum: "Sən nə oxuyursan?" O dedi: "Bəli, həqiqətən, o, haqq və sünnədir".

١٩٨٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ أَبِي أُمَامَةَ أَنَّهُ قَالَ : السُّنَّةُ فِي الصَّلاَةِ عَلَى الْجَنَازَةِ أَنْ يَقْرَأَ فِي التَّكْبِيرَةِ الأُولَى بِأُمِّ الْقُرْآنِ مُخَافَتَةً ، ثُمَّ يُكَبِّرَ ثَلاَثًا ، وَالتَّسْلِيمُ عِنْدَ الآخِرَةِ

1989. ...Rəvayət edilir ki, Əbu Umamə ﷺ demişdir: "Cənazə namazında birinci təkbirdən sonra "Quranın Anasını" səssiz oxumaq, sonra isə üç dəfə təkbir etmək, son təkbirdən sonra da salam vermək sünnədir".

١٩٨٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ مُحَمَّدِ بْنِ سُوَيْدٍ الدِّمَشْقِيِّ الْفِهْرِيِّ ، عَنِ الضَّحَّاكِ بْنِ قَيْسٍ الدِّمَشْقِيِّ بِنَحْوِ ذَلِكَ.

1990. ...Eyni hədisdir.

٧٨ - فَضْلُ مَنْ صَلَّى عَلَيْهِ مِئَةٌ

## 78-ci fəsil: Cənazə namazını yüz nəfərin qılmasının fəziləti

١٩٩١ - أَخْبَرَنَا سُوَيْدٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ سَلاَّمِ بْنِ أَبِي مُطِيعٍ الدِّمَشْقِيِّ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، رَضِيعِ عَائِشَةَ ، عَنْ عَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهُمَا ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَا مِنْ مَيِّتٍ يُصَلِّي عَلَيْهِ أُمَّةٌ مِنَ الْمُسْلِمِينَ يَبْلُغُونَ أَنْ يَكُونُوا مِئَةً يَشْفَعُونَ إِلاَّ شُفِّعُوا فِيهِ ، قَالَ سَلاَّمٌ : فَحَدَّثْتُ بِهِ شُعَيْبَ بْنَ الْحَبْحَابِ فَقَالَ : حَدَّثَنِي بِهِ أَنَسُ بْنُ

مَالِكٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

1991. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Kimin cənazə namazını yüz nəfər müsəlman qılaraq ona şəfaət diləyərlərsə, onların şəfaəti qəbul olunar".

١٩٩٢ - أَخْبَرَنَا عَمْرُو بْنُ زُرَارَةَ ، قَالَ : أَنْبَأَنَا إِسْمَعِيلُ ، عَنْ أَيُّوبَ ، عَنْ أَبِي قِلاَبَةَ ، عَنْ عَبْدِ اللهِ بْنِ يَزِيدَ ، رَضِيعِ لِعَائِشَةَ رَضِيَ اللَّهُ عَنْهَا ، عَنْ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ يَمُوتُ أَحَدٌ مِنَ الْمُسْلِمِينَ فَيُصَلِّي عَلَيْهِ أُمَّةٌ مِنَ النَّاسِ فَيَبْلُغُوا أَنْ يَكُونُوا مِئَةً ، فَيَشْفَعُوا إِلاَّ شُفِّعُوا فِيهِ.

1992. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Ölən müsəlmanın cənazə namazını ümmətdən olan yüz nəfər qılaraq ona şəfaət diləsələr, onların şəfaəti qəbul olunar".

١٩٩٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا مُحَمَّدُ بْنُ سَوَاءِ أَبُو الْخَطَّابِ ، قَالَ : حَدَّثَنَا أَبُو بَكَّارٍ الْحَكَمُ بْنُ فَرُّوخَ ، قَالَ : صَلَّى بِنَا أَبُو الْمَلِيحِ عَلَى جِنَازَةٍ فَظَنَنَّا أَنَّهُ قَدْ كَبَّرَ ، فَأَقْبَلَ عَلَيْنَا بِوَجْهِهِ ، فَقَالَ : أَقِيمُوا صُفُوفَكُمْ وَلْتَحْسُنْ شَفَاعَتُكُمْ ، قَالَ أَبُو الْمَلِيحِ ، حَدَّثَنِي عَبْدُ اللهِ وَهُوَ ابْنُ سَلِيطٍ ، عَنْ إِحْدَى أُمَّهَاتِ الْمُؤْمِنِينَ وَهِيَ مَيْمُونَةُ زَوْجُ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَتْ : أَخْبَرَنِي النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَا مِنْ مَيِّتٍ يُصَلِّي عَلَيْهِ أُمَّةٌ مِنَ النَّاسِ إِلاَّ شُفِّعُوا فِيهِ ، فَسَأَلْتُ أَبَا الْمَلِيحِ عَنِ الأُمَّةِ : فَقَالَ : أَرْبَعُونَ.

1993. ...Rəvayət edilir ki, Əbu Bəkkər əl-Həkəm ibn Fərrux ﵀ demişdir: "Əbul-Məlih bizə cənazə namazı qıldırırdı. Biz onun təkbir etdiyini zənn etdik, amma o, üzünü bizə döndərərək dedi: "Səflərinizi düzəldin və gözəl şəkildə şəfaət edin!" Abdullah ibn Səlit rəvayət edir ki, möminlərin analarından biri Peyğəmbərin ﷺ zövcələrindən olan Məymunə demişdir: "Peyğəmbər ﷺ mənə xəbər verərək buyurdu: "Ölən müsəlmanın cənazə namazını ümmətdən olanlar qılaraq ona şəfaət diləsələr, onların şəfaəti qəbul olunar". Mən Əbul-Məlihdən "ümmət" sözünün nə olduğunu soruşduqda: "Qırx nəfər"- dedi".

## ٧٩ - بَابُ ثَوَابِ مَنْ صَلَّى عَلَى جِنَازَةٍ

## 79-cu fəsil: Cənazə namazını qılmağın savabı

١٩٩٤ - أَخْبَرَنَا نُوحُ بْنُ حَبِيبٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّزَّاقِ ، قَالَ : أَنْبَأَنَا مَعْمَرٌ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ صَلَّى عَلَى جِنَازَةٍ فَلَهُ قِيرَاطٌ ، وَمَنِ انْتَظَرَهَا حَتَّى تُوضَعَ فِي اللَّحْدِ فَلَهُ قِيرَاطَانِ ، وَالْقِيرَاطَانِ مِثْلُ الْجَبَلَيْنِ الْعَظِيمَيْنِ.

1994. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim cənazə namazını qılarsa, ona bir qirat savab verilər. Kim də qəbirə qoyulanadək gözləyərsə, ona iki qirat savab verilər. İki qirat iki böyük dağ kimidir".

١٩٩٥ - أَخْبَرَنَا سُوَيْدٌ ، قَالَ : أَخْبَرَنَا عَبْدُ اللهِ ، عَنْ يُونُسَ ، عَنِ الزُّهْرِيِّ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ الرَّحْمَنِ الأَعْرَجُ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ شَهِدَ جَنَازَةً حَتَّى يُصَلَّى عَلَيْهَا فَلَهُ قِيرَاطٌ ، وَمَنْ شَهِدَ حَتَّى تُدْفَنَ فَلَهُ قِيرَاطَانِ ، قِيلَ : وَمَا الْقِيرَاطَانِ يَا رَسُولَ اللهِ ؟ قَالَ : مِثْلُ الْجَبَلَيْنِ الْعَظِيمَيْنِ.

1995. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim cənazəni müşayiət edər və cənazə namazını qılarsa, ona bir qirat savab verilər. Kim də cənazə namazını qılıb onu dəfn edənə qədər cənazəni müşayiət edərsə, ona iki qirat savab verilər". Səhabələr dedilər: "İki qirat nə qədərdir, ey Allahın Elçisi?" O dedi: "İki böyük dağ kimidir".

١٩٩٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ جَعْفَرٍ ، عَنْ عَوْفٍ ، عَنْ مُحَمَّدِ بْنِ سِيرِينَ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : مَنْ تَبِعَ جِنَازَةَ رَجُلٍ مُسْلِمٍ احْتِسَابًا فَصَلَّى عَلَيْهَا وَدَفَنَهَا فَلَهُ قِيرَاطَانِ ، وَمَنْ صَلَّى عَلَيْهَا ثُمَّ رَجَعَ قَبْلَ أَنْ تُدْفَنَ فَإِنَّهُ يَرْجِعُ بِقِيرَاطٍ مِنَ الأَجْرِ.

1996. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Kim savab umaraq müsəlman kişinin cənazəsini müşayiət edər, cənazə namazını qılar və dəfn edərsə, ona iki qirat savab verilər. Kim də cənazə namazını qılar və dəfn edilməmiş qayıdarsa, bir qirat savab ilə qayıdar".

١٩٩٧ - أَخْبَرَنَا الْحَسَنُ بْنُ قَزَعَةَ ، قَالَ : حَدَّثَنَا مَسْلَمَةُ بْنُ عَلْقَمَةَ ، قَالَ : أَنْبَأَنَا دَاوُدُ ، عَنْ عَامِرٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ تَبِعَ جِنَازَةً فَصَلَّى عَلَيْهَا ثُمَّ انْصَرَفَ فَلَهُ قِيرَاطٌ مِنَ الأَجْرِ ، وَمَنْ تَبِعَهَا فَصَلَّى عَلَيْهَا ثُمَّ قَعَدَ حَتَّى يُفْرَغَ مِنْ دَفْنِهَا فَلَهُ قِيرَاطَانِ مِنَ الأَجْرِ ، كُلُّ وَاحِدٍ مِنْهُمَا أَعْظَمُ مِنْ أُحُدٍ.

1997. ... Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Kim cənazəni müşayiət edər, cənazə namazını qılar və qayıdarsa, ona bir qirat savab verilər. Kim də cənazə namazını qılıb onu dəfn edənə qədər orda olarsa, ona iki qirat savab verilər. Onların (qiratların) hər biri Uhud dağından böyükdür".

## ٨٠ - الْجُلُوسُ قَبْلَ أَنْ تُوضَعَ الْجَنَازَةُ

## 80-ci fəsil: Cənazə dəfn edilməmişdən qabaq oturmaq

١٩٩٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ هِشَامٍ ، وَالأَوْزَاعِيُّ ، عَنْ يَحْيَى بْنِ أَبِي كَثِيرٍ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي سَعِيدٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِذَا رَأَيْتُمُ الْجَنَازَةَ ، فَقُومُوا وَمَنْ تَبِعَهَا فَلاَ يَقْعُدَنَّ حَتَّى تُوضَعَ.

1998. ...Rəvayət edilir ki, Əbu Səid ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Cənazənin aparıldığını görsəniz, ayağa durun! Kim cənazəni müşayiət edərsə, cənazə qəbirə qoyulmadan oturmasın!""

## ٨١ - الْوُقُوفُ لِلْجَنَائِزِ

## 81-ci fəsil: Cənazə üçün ayağa durmaq

١٩٩٩ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ يَحْيَى ، عَنْ وَاقِدٍ ، عَنْ نَافِعِ بْنِ جُبَيْرٍ ، عَنْ مَسْعُودِ بْنِ الْحَكَمِ ، عَنْ عَلِيِّ بْنِ أَبِي طَالِبٍ ، أَنَّهُ ذُكِرَ الْقِيَامُ عَلَى الْجَنَازَةِ حَتَّى تُوضَعَ ، فَقَالَ عَلِيُّ بْنُ أَبِي طَالِبٍ : قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ثُمَّ قَعَدَ.

1999. ...Məsud ibn əl-Həkəm ﷺ rəvayət edir ki, Əli ibn Əbu Talibin yanında "cənazə qəbirə qoyulana qədər ayaq üstə durmaq lazımdır" deyiləndə Əli ibn Əbu Talib dedi: "Allah Elçisi ﷺ ayaq üstə durdu, sonra oturdu".

٢٠٠٠ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، قَالَ : أَخْبَرَنِي مُحَمَّدُ بْنُ الْمُنْكَدِرِ ، عَنْ مَسْعُودِ بْنِ الْحَكَمِ ، عَنْ عَلِيٍّ قَالَ : رَأَيْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَامَ فَقُمْنَا وَرَأَيْنَاهُ قَعَدَ فَقَعَدْنَا.

2000. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: "Allah Elçisinin ﷺ cənazə üçün qalxdığını gördükdə biz də qalxardıq, oturduğunu gördükdə biz də oturardıq".

٢٠٠١ - أَخْبَرَنَا هَارُونُ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا أَبُو خَالِدٍ الأَحْمَرُ ، عَنْ عَمْرِو بْنِ قَيْسٍ ، عَنِ الْمِنْهَالِ بْنِ عَمْرٍو ، عَنْ زَاذَانَ ، عَنِ الْبَرَاءِ قَالَ : خَرَجْنَا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي جِنَازَةٍ ، فَلَمَّا انْتَهَيْنَا إِلَى الْقَبْرِ وَلَمْ يُلْحَدْ ، فَجَلَسَ وَجَلَسْنَا حَوْلَهُ كَأَنَّ عَلَى رُؤُوسِنَا الطَّيْرَ.

2001. ...Rəvayət edilir ki, əl-Bəra ﷺ demişdir: "Biz Allah Elçisi ﷺ ilə cənazə üçün çıxdıq. Qəbirin yanına çatdıqda cənazə qəbrə qoyulmamışdı, ona

görə Allah Elçisi ﷺ oturdu. Biz də sanki başımızda quş varmış kimi səssiz şəkildə oturduq".

٨٢ - مُوَارَاةُ الشَّهِيدِ فِي دَمِهِ

## 82-ci fəsil: Şəhidi qanlı halda dəfn etmək

٢٠٠٢ - أَخْبَرَنَا هَنَّادٌ ، عَنْ ابْنِ الْمُبَارَكِ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ عَبْدِ اللهِ بْنِ ثَعْلَبَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لِقَتْلَى أُحُدٍ : زَمِّلُوهُمْ بِدِمَائِهِمْ ، فَإِنَّهُ لَيْسَ كَلْمٌ يُكْلَمُ فِي اللهِ إِلاَّ يَأْتِي يَوْمَ الْقِيَامَةِ يَدْمَى ، لَوْنُهُ لَوْنُ الدَّمِ ، وَرِيحُهُ رِيحُ الْمِسْكِ.

2002. ...Rəvayət edilir ki, Abdullah ibn Sələbə ؓ demişdir: "Allah Elçisi ﷺ Uhud döyüşündə öldürülənlər üçün dedi: "Onları qanlı halda dəfn edin! Həqiqətən, Allah yolunda yaralanan (şəhid) Qiyamət günü yarasından qan axaraq gələcək. Onun rəngi qan rəngi, qoxusu isə müşk qoxusu olacaq".

٨٣ - أَيْنَ يُدْفَنُ الشَّهِيدُ

## 83-cü fəsil: Şəhid harada dəfn olunur?

٢٠٠٣ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا وَكِيعٌ ، قَالَ : حَدَّثَنَا سَعِيدُ بْنُ السَّائِبِ ، عَنْ رَجُلٍ ، يُقَالُ لَهُ : عُبَيْدُ اللهِ بْنُ مُعَيَّةَ ، قَالَ : أُصِيبَ رَجُلاَنِ مِنَ الْمُسْلِمِينَ يَوْمَ الطَّائِفِ فَحُمِلاَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَأَمَرَ أَنْ يُدْفَنَا حَيْثُ أُصِيبَا ، وَكَانَ ابْنُ مُعَيَّةَ وُلِدَ عَلَى عَهْدِ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2003. ...Rəvayət edilir ki, Ubeydullah ibn Muaviyə ؓ demişdir: "Taif günü müsəlmanlardan iki nəfər şəhid olmuşdu. Onlar Allah Elçisinin ﷺ yanına gətirildikdə o, onların şəhid olduqları yerdə dəfn olunmasını əmr etdi". Muaviyə Allah Elçisinin ؓ dövründə doğulanlardan idi.[1]

٢٠٠٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا الأَسْوَدُ بْنُ قَيْسٍ ، عَنْ نُبَيْحٍ الْعَنَزِيِّ ، عَنْ جَابِرِ بْنِ عَبْدِ اللهِ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمَرَ بِقَتْلَى أُحُدٍ أَنْ يُرَدُّوا إِلَى مَصَارِعِهِمْ ، وَكَانُوا قَدْ نُقِلُوا إِلَى الْمَدِينَةِ.

2004. ...Cabir ibn Abdullah ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ Uhud döyüşündə öldürülənlərin olduqları yerdə dəfn edilməsini əmr etdi, çünki onlar Mədinəyə gətirilmişdilər.

[1] Hədisin isnadı zəifdir.

٢٠٠٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ سُفْيَانَ ، عَنِ الأَسْوَدِ بْنِ قَيْسٍ ، عَنْ نُبَيْحٍ الْعَنَزِيِّ ، عَنْ جَابِرٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : ادْفِنُوا الْقَتْلَى فِي مَصَارِعِهِمْ.

2005. ...Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Şəhidləri öldükləri yerdə dəfn edin!”

٨٤ - بَابُ مُوَارَاةِ الْمُشْرِكِ

84-cü fəsil: Müşriklərin basdırılması

٢٠٠٦ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنِي أَبُو إِسْحَاقَ ، عَنْ نَاجِيَةَ بْنِ كَعْبٍ ، عَنْ عَلِيٍّ قَالَ : قُلْتُ لِلنَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ عَمَّكَ الشَّيْخَ الضَّالَّ مَاتَ فَمَنْ يُوَارِيهِ ؟ قَالَ : اذْهَبْ فَوَارِ أَبَاكَ ، وَلاَ تُحْدِثَنَّ حَدَثًا حَتَّى تَأْتِيَنِي ، فَوَارَيْتُهُ ثُمَّ جِئْتُ ، فَأَمَرَنِي فَاغْتَسَلْتُ ، وَدَعَا لِي ، وَذَكَرَ دُعَاءً لَمْ أَحْفَظْهُ.

2006. ...Rəvayət edilir ki, Əli ﷺ demişdir: “Mən Peyğəmbərə ﷺ dedim: “Sənin zəlalətdə olan əmin öldü, onu kim basdıracaq?” Peyğəmbər ﷺ dedi: “Get, atanı basdır! Mənim yanıma qayıdana qədər də heç nə danışma!” Atamı basdırdım və qayıtdım. Peyğəmbər ﷺ mənə qüsl almağımı əmr etdi, mən də qüsl aldım. O, mənim üçün dua etdi, lakin mən həmin duanı yadda saxlaya bilmədim”.

٨٥ - اللَّحْدُ وَالشَّقُّ

85-ci fəsil: Ləhd və şəqq[1]

٢٠٠٧ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ جَعْفَرٍ ، عَنْ إِسْمَعِيلَ بْنِ مُحَمَّدِ بْنِ سَعْدٍ ، عَنْ أَبِيهِ ، عَنْ سَعْدٍ قَالَ : أَلْحِدُوا لِي لَحْدًا ، وَانْصِبُوا عَلَيَّ نَصْبًا كَمَا فُعِلَ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

[1] İslamda qəbri iki formada – “Ləhd” və “Şəqq” formasında qazmaq olar. “Ləhd” formasında qəbrin qiblə tərəfindəki divarında meyiti qoymaq üçün oyuq hissə, yer açılır. “Şəqq” formasında isə qəbirin orta hissəsində meyiti qoymaq üçün yer açılır. Ölkəmizdə qazılan qəbirlər, adətən, “Şəqq” formasında olur. Peyğəmbərin ﷺ vaxtında qəbirlər hər iki formada qazılırdı. Peyğəmbərimiz ﷺ də məhz “ləhd” formalı qəbirdə dəfn edilmişdir. Ənəs ibn Malik ﷺ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ vəfat etdiyi vaxt Mədinə şəhərində iki nəfər qəbirqazan var idi. Onlardan biri “ləhd”, digəri isə “şəqq” formalı qəbir qazardı. Səhabələr dedilər ki, Allaha istixarə edək və onların ardınca adam göndərək. Hansı birinci gəlsə, o da qəbri qazsın. Beləliklə, qəbirqazanların ardınca adam göndərdilər. “Ləhd” formalı qəbir qazan birinci gəldi və Peyğəmbərin ﷺ qəbri “ləhd” formasında qazıldı. (İbn Məcə, 1557. Hədis səhihdir. Bax: Səhih Sunən İbn Məcə, 1264).

2007. ...Rəvayət edilir ki, Səd ﷺ demişdir: “Mən öldükdə qəbrimin içində Allah Elçisinin ﷺ qəbrindəki kimi qiblə tərəfdən ləhd düzəldin və üzərimə bir şey qoyun!”

٢٠٠٨ - أَخْبَرَنَا هَارُونُ بْنُ عَبْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا أَبُو عَامِرٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ جَعْفَرٍ ، عَنْ إِسْمَعِيلَ بْنِ مُحَمَّدٍ ، عَنْ عَامِرِ بْنِ سَعْدٍ ، أَنَّ سَعْدًا لَمَّا حَضَرَتْهُ الْوَفَاةُ قَالَ : أَلْحِدُوا لِي لَحْدًا ، وَانْصِبُوا عَلَيَّ نَصْبًا ، كَمَا فُعِلَ بِرَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2008. ...Amir ibn Səd ﷺ rəvayət edir ki, Səd ölümcül xəstəliyə tutulduqda dedi: “Mən öldükdə qəbrimin içində Allah Elçisinin ﷺ qəbrindəki kimi qiblə tərəfdən ləhd düzəldin və üzərimə bir şey qoyun!”

٢٠٠٩ - أَخْبَرَنَا عَبْدُ اللهِ بْنُ مُحَمَّدٍ أَبُو عَبْدِ الرَّحْمَنِ الأَذْرَمِيُّ ، عَنْ حَكَّامِ بْنِ سَلْمٍ الرَّازِيِّ ، عَنْ عَلِيِّ بْنِ عَبْدِ الأَعْلَى ، عَنْ أَبِيهِ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اللَّحْدُ لَنَا ، وَالشَّقُّ لِغَيْرِنَا.

2009. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Ləhd şəklində qazılan qəbir bizim üçün, şəqq şəklində qazılan qəbirlər isə qeyriləri üçündür”.

٨٦ - بَابُ مَا يُسْتَحَبُّ مِنْ إِعْمَاقِ الْقَبْرِ

## 86-cı fəsil: Qəbir nə dərinlikdə olmalıdır?

٢٠١٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا إِسْحَاقُ بْنُ يُوسُفَ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ أَيُّوبَ ، عَنْ حُمَيْدِ بْنِ هِلَالٍ ، عَنْ هِشَامِ بْنِ عَامِرٍ ، قَالَ : شَكَوْنَا إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَوْمَ أُحُدٍ ، فَقُلْنَا : يَا رَسُولَ اللهِ ، الْحَفْرُ عَلَيْنَا لِكُلِّ إِنْسَانٍ شَدِيدٌ ؟ فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : احْفِرُوا وَأَعْمِقُوا وَأَحْسِنُوا ، وَادْفِنُوا الاِثْنَيْنِ وَالثَّلَاثَةَ فِي قَبْرٍ وَاحِدٍ ، قَالُوا : فَمَنْ نُقَدِّمُ يَا رَسُولَ اللهِ ؟ قَالَ : قَدِّمُوا أَكْثَرَهُمْ قُرْآنًا ، قَالَ : فَكَانَ أَبِي ثَالِثَ ثَلَاثَةٍ فِي قَبْرٍ وَاحِدٍ.

2010. ...Rəvayət edilir ki, Hişam ibn Amir ﷺ demişdir: “Uhud döyüşündən sonra biz Allah Elçisinə ﷺ şikayət edərək dedik: “Ey Allahın Elçisi, şəhid olan bütün insanlara ayrı-ayrı qəbir qazmaq çətindir”. Allah Elçisi ﷺ dedi: “Dərin və gözəl şəkildə çuxur qazın! Bir qəbirə iki və ya üç nəfəri dəfn edin!” Səhabələr dedilər: “Hansını birinci qoyaq?” O dedi: “Quranı ən çox biləni əvvəl qoyun”. Mənim atam da üç şəhiddən birincisi idi”.

٨٧ - بَابُ مَا يُسْتَحَبُّ مِنْ تَوْسِيعِ الْقَبْرِ

## 87-ci fəsil: Qəbir nə qədər geniş olmalıdır?

٢٠١١ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ مَعْمَرٍ ، قَالَ : حَدَّثَنَا وَهْبُ بْنُ جَرِيرٍ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : سَمِعْتُ حُمَيْدَ بْنَ هِلَالٍ ، عَنْ سَعْدِ

بْنِ هِشَامِ بْنِ عَامِرٍ ، عَنْ أَبِيهِ ، قَالَ : لَمَّا كَانَ يَوْمُ أُحُدٍ أُصِيبَ مَنْ أُصِيبَ مِنَ الْمُسْلِمِينَ ، وَأَصَابَ النَّاسَ جِرَاحَاتٌ ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : احْفِرُوا وَأَوْسِعُوا ، وَادْفِنُوا الاِثْنَيْنِ وَالثَّلاَثَةَ فِي الْقَبْرِ ، وَقَدِّمُوا أَكْثَرَهُمْ قُرْآنًا.

2011. ...Səd ibn Hişam ibn Amr atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Uhud döyüşündə müsəlmanlardan bir çoxu şəhid olmuş, bir çoxu da yaralanmışdı. Allah Elçisi ﷺ buyurdu: “Geniş çuxurlar qazın! Sonra iki və üç nəfəri bir qəbirdə dəfn edin! Qurandan daha çox biləni birinci qoyun!”

٨٨ - وَضْعُ الثَّوْبِ فِي اللَّحْدِ

88-ci fəsil: Ləhdə paltarın qoyulması

٢٠١٢ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، عَنْ يَزِيدَ وَهُوَ ابْنُ زُرَيْعٍ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ أَبِي جَمْرَةَ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : جُعِلَ تَحْتَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حِينَ دُفِنَ قَطِيفَةٌ حَمْرَاءُ.

2012. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: “Allah Elçisi ﷺ dəfn olunduqda alt tərəfinə qırmızı parça qoyuldu”.

٨٩ - السَّاعَاتُ الَّتِي نُهِيَ عَنْ إِقْبَارِ الْمَوْتَى فِيهِنَّ

89-cu fəsil: Cənazənin dəfn olunmasının qadağan olunan vaxtları

٢٠١٣ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا مُوسَى بْنُ عَلِيِّ بْنِ رَبَاحٍ ، قَالَ : سَمِعْتُ أَبِي ، قَالَ : سَمِعْتُ عُقْبَةَ بْنَ عَامِرٍ الْجُهَنِيَّ قَالَ : ثَلاَثُ سَاعَاتٍ كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَنْهَانَا أَنْ نُصَلِّيَ فِيهِنَّ أَوْ نَقْبُرَ فِيهِنَّ مَوْتَانَا : حِينَ تَطْلُعُ الشَّمْسُ بَازِغَةً حَتَّى تَرْتَفِعَ ، وَحِينَ يَقُومُ قَائِمُ الظَّهِيرَةِ حَتَّى تَزُولَ الشَّمْسُ ، وَحِينَ تَضَيَّفُ الشَّمْسُ لِلْغُرُوبِ.

2013. ...Rəvayət edilir ki, Uqbə ibn Amir əl-Cuhəni ﷺ demişdir: “Üç vaxt var ki, Allah Elçisi ﷺ həmin vaxtlarda namaz qılmağı və cənazəni dəfn etməyi qadağan etmişdir: günəşin çıxdığı andan tam çıxana qədər, günəş zenitdə olan vaxt və günəş batmağa başlayandan batanadək olan vaxt”.

٢٠١٤ - أَخْبَرَنِي عَبْدُ الرَّحْمَنِ بْنُ خَالِدٍ الْقَطَّانُ الرَّقِّيُّ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، قَالَ ابْنُ جُرَيْجٍ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ جَابِرًا يَقُولُ : خَطَبَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَ رَجُلاً مِنْ أَصْحَابِهِ مَاتَ فَقُبِرَ لَيْلاً ، وَكُفِّنَ فِي كَفَنٍ غَيْرِ طَائِلٍ ، فَزَجَرَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يُقْبَرَ إِنْسَانٌ لَيْلاً إِلاَّ أَنْ يُضْطَرَّ إِلَى ذَلِكَ.

2014. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Allah Elçisi ﷺ xütbə verdi, xütbəsində səhabələrindən birinin öldüyünü və gecə dəfn edilərək

kəfəninin qısa edildiyini bildirdi. Allah Elçisi zərurət olmadığı müddətcə insanın gecə dəfn edilməsindən çəkindirdi".

## ٩٠ - دَفْنُ الْجَمَاعَةِ فِي الْقَبْرِ الْوَاحِدِ

## 90-cı fəsil: Bir qəbirdə bir neçə nəfərin dəfn edilməsi

٢٠١٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنْ سُلَيْمَانَ بْنِ الْمُغِيرَةِ ، عَنْ حُمَيْدِ بْنِ هِلَالٍ ، عَنْ هِشَامِ بْنِ عَامِرٍ قَالَ : لَمَّا كَانَ يَوْمُ أُحُدٍ أَصَابَ النَّاسَ جَهْدٌ شَدِيدٌ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : احْفِرُوا وَأَوْسِعُوا ، وَادْفِنُوا الِاثْنَيْنِ وَالثَّلَاثَةَ فِي قَبْرٍ ، فَقَالُوا : يَا رَسُولَ اللهِ ، فَمَنْ نُقَدِّمُ ؟ قَالَ : قَدِّمُوا أَكْثَرَهُمْ قُرْآنًا.

2015. ...Rəvayət edilir ki, Hişam ibn Amir ﷺ demişdir: "Uhud döyüşündə çoxlu adam şəhid edildikdə onların qəbirlərini qazmaq insanlara çətin oldu. Allah Elçisi ﷺ dedi: "Geniş şəkildə çuxur qazın! Bir qəbirə iki və ya üç nəfəri dəfn edin!" Səhabələr dedilər: "Ey Allahın Elçisi, birinci hansını qoyaq?" O dedi: "Quranı ən çox biləni əvvəl qoyun".

٢٠١٦ - أَخْبَرَنِي إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : أَنْبَأَنَا سُلَيْمَانُ بْنُ حَرْبٍ ، قَالَ : حَدَّثَنَا حَمَّادُ بْنُ زَيْدٍ ، عَنْ أَيُّوبَ ، عَنْ حُمَيْدِ بْنِ هِلَالٍ ، عَنْ سَعْدِ بْنِ هِشَامِ بْنِ عَامِرٍ ، عَنْ أَبِيهِ قَالَ : اشْتَدَّ الْجِرَاحُ يَوْمَ أُحُدٍ فَشُكِيَ ذَلِكَ إِلَى رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : احْفِرُوا وَأَوْسِعُوا وَأَحْسِنُوا ، وَادْفِنُوا فِي الْقَبْرِ الِاثْنَيْنِ وَالثَّلَاثَةَ ، وَقَدِّمُوا أَكْثَرَهُمْ قُرْآنًا.

2016. ...Rəvayət edilir ki, Səd ibn Hişam ibn Amir atasının ﷺ belə dediyini rəvayət etmişdir: "Uhud döyüşündən sonra yaralılar çox idi. Ona görə biz Allah Elçisinə ﷺ şikayət etdik. Allah Elçisi ﷺ dedi: "Geniş və gözəl şəkildə çuxur qazın! Bir qəbirə iki və ya üç nəfəri dəfn edin! Quranı ən çox biləni də əvvəl qoyun".

٢٠١٧ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ ، قَالَ : حَدَّثَنَا مُسَدَّدٌ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، عَنْ أَيُّوبَ ، عَنْ حُمَيْدِ بْنِ هِلَالٍ ، عَنْ أَبِي الدَّهْمَاءِ ، عَنْ هِشَامِ بْنِ عَامِرٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : احْفِرُوا وَأَحْسِنُوا ، وَادْفِنُوا الِاثْنَيْنِ وَالثَّلَاثَةَ ، وَقَدِّمُوا أَكْثَرَهُمْ قُرْآنًا.

2017. ... Hişam ibn Amir ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Gözəl şəkildə çuxur qazın! Bir qəbirə iki və ya üç nəfəri dəfn edin! Quranı ən çox biləni də əvvəl qoyun".

٩١ - مَنْ يُقَدَّمُ

## 91-ci fəsil: Dəfn edildikdə birinci kimi dəfn edilir?

٢٠١٨ - حَدَّثَنَا مُحَمَّدُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ حُمَيْدِ بْنِ هِلاَلٍ ، عَنْ هِشَامِ بْنِ عَامِرٍ قَالَ : قُتِلَ أَبِي يَوْمَ أُحُدٍ ، فَقَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : احْفِرُوا وَأَوْسِعُوا وَأَحْسِنُوا ، وَادْفِنُوا الاِثْنَيْنِ وَالثَّلاَثَةَ فِي الْقَبْرِ ، وَقَدِّمُوا أَكْثَرَهُمْ قُرْآنًا ، فَكَانَ أَبِي ثَالِثَ ثَلاَثَةٍ ، وَكَانَ أَكْثَرَهُمْ قُرْآنًا فَقُدِّمَ.

2018. ...Rəvayət edilir ki, Hişam ibn Amir ﵁ demişdir: “Atam Uhud döyüşündə öldürülmüşdü. Peyğəmbər ﷺ dedi: “Dərin və gözəl şəkildə çuxur qazın! Bir qəbirə iki və ya üç nəfəri dəfn edin! Quranı ən çox biləni əvvəl qoyun!” Atam üç nəfərdən biri idi və Quranı digərlərindən daha çox bildiyi üçün qəbirə öncə o qoyulmuşdu”.

٩٢ - إِخْرَاجُ الْمَيِّتِ مِنَ اللَّحْدِ بَعْدَ أَنْ يُوضَعَ فِيهِ

## 92-ci fəsil: Meyitin ləhdə qoyulduqdan sonra yenidən çıxarılması

٢٠١٩ - قَالَ الْحَارِثُ بْنُ مِسْكِينٍ : ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ ، عَنْ سُفْيَانَ ، قَالَ : سَمِعَ عَمْرٌو ، جَابِرًا يَقُولُ : أَتَى النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَبْدَ اللهِ بْنَ أُبَيٍّ بَعْدَ مَا أُدْخِلَ فِي قَبْرِهِ فَأَمَرَ بِهِ فَأُخْرِجَ ، فَوَضَعَهُ عَلَى رُكْبَتَيْهِ ، وَنَفَثَ عَلَيْهِ مِنْ رِيقِهِ ، وَأَلْبَسَهُ قَمِيصَهُ وَاللَّهُ أَعْلَمُ.

2019. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Abdullah ibn Ubey qəbirə qoyulduqdan sonra Peyğəmbər ﷺ gəlib onun çıxarılmasını əmr etdi. Onu dizlərinin üzərinə qoydu. Ona yüngülcə tüpürdü və öz köynəyini ona geyindirdi. Doğrusunu Allah bilir!”

٢٠٢٠ - أَخْبَرَنَا الْحُسَيْنُ بْنُ حُرَيْثٍ ، قَالَ : حَدَّثَنَا الْفَضْلُ بْنُ مُوسَى ، عَنِ الْحُسَيْنِ بْنِ وَاقِدٍ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ دِينَارٍ ، قَالَ : سَمِعْتُ جَابِرًا يَقُولُ : إِنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَمَرَ بِعَبْدِ اللهِ بْنِ أُبَيٍّ فَأَخْرَجَهُ مِنْ قَبْرِهِ ، فَوَضَعَ رَأْسَهُ عَلَى رُكْبَتَيْهِ ، فَتَفَلَ فِيهِ مِنْ رِيقِهِ ، وَأَلْبَسَهُ قَمِيصَهُ ، قَالَ جَابِرٌ : وَصَلَّى عَلَيْهِ وَاللَّهُ أَعْلَمُ.

2020. ...Rəvayət edilir ki, Cabir ﵁ demişdir: “Peyğəmbər ﷺ Abdullah ibn Ubeyin qəbirdən çıxarılmasını əmr etdi. Onun başını dizlərinin üzərinə qoydu. Ona yüngülcə tüpürdü və öz köynəyini ona geyindirdi”. Cabir deyir: “Onun üçün cənazə namazı da qıldı. Doğrusunu Allah bilir!”

٩٣ - بَابُ إِخْرَاجِ الْمَيِّتِ مِنَ الْقَبْرِ بَعْدَ أَنْ يُدْفَنَ فِيهِ

93-cü fəsil: Meyitin qəbirdən çıxarıldıqdan sonra başqa yerdə dəfn edilməsi

٢٠٢١ - أَخْبَرَنَا الْعَبَّاسُ بْنُ عَبْدِ الْعَظِيمِ ، عَنْ سَعِيدِ بْنِ عَامِرٍ ، عَنْ شُعْبَةَ ، عَنِ ابْنِ أَبِي نَجِيحٍ ، عَنْ عَطَاءٍ ، عَنْ جَابِرٍ قَالَ : دُفِنَ مَعَ أَبِي رَجُلٌ فِي الْقَبْرِ فَلَمْ يَطِبْ قَلْبِي حَتَّى أَخْرَجْتُهُ وَدَفَنْتُهُ عَلَى حِدَةٍ.

2021. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: “Qəbirdə atamla birlikdə başqa bir adam da dəfn edilmişdi. Qəlbim narahat oldu və onu çıxarıb başqa yerdə tək dəfn etdim”.

٩٤ - الصَّلاَةُ عَلَى الْقَبْرِ

94-cü fəsil: Qəbrin yanında cənazə namazını qılmaq

٢٠٢٢ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ أَبُو قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ بْنُ نُمَيْرٍ ، قَالَ : حَدَّثَنَا عُثْمَانُ بْنُ حَكِيمٍ ، عَنْ خَارِجَةَ بْنِ زَيْدِ بْنِ ثَابِتٍ ، عَنْ عَمِّهِ يَزِيدَ بْنِ ثَابِتٍ ، أَنَّهُمْ خَرَجُوا مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ يَوْمٍ فَرَأَى قَبْرًا جَدِيدًا ، فَقَالَ : مَا هَذَا ؟ قَالُوا : هَذِهِ فُلاَنَةُ مَوْلاَةُ بَنِي فُلاَنٍ ، فَعَرَفَهَا رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، مَاتَتْ ظُهْرًا وَأَنْتَ نَائِمٌ قَائِلٌ فَلَمْ نُحِبَّ أَنْ نُوقِظَكَ بِهَا ، فَقَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَصَفَّ النَّاسَ خَلْفَهُ ، وَكَبَّرَ عَلَيْهَا أَرْبَعًا ، ثُمَّ قَالَ : لاَ يَمُوتُ فِيكُمْ مَيِّتٌ مَا دُمْتُ بَيْنَ أَظْهُرِكُمْ إِلاَّ آذَنْتُمُونِي بِهِ ، فَإِنَّ صَلاَتِي لَهُ رَحْمَةٌ.

2022. ...Yəzid ibn Sabit ﷺ rəvayət edir ki, bir gün Allah Elçisi ﷺ ilə birlikdə çıxdıqda yeni bir qəbir gördülər. Allah Elçisi ﷺ dedi: “Bu kimin qəbridir?” Səhabələr dedilər: “Filan oğullarının köləlikdən azad etdikləri filan qadının qəbridir”. Allah Elçisi ﷺ onu tanıdı. Səhabələr dedilər: “O, zöhr vaxtı vəfat etmişdi, sən yatdığına görə səni oyandırmaq istəmədik”. Allah Elçisi ﷺ namaza durub insanları arxasında səfə düzdü və dörd dəfə təkbir edərək cənaza namazını qıldı. Sonra da dedi: “Mən aranızda olduğum müddətdə bir adam öldükdə mənə xəbər verin. Həqiqətən, mənim ona cənazə namazı qılmağım rəhmətdir”.

٢٠٢٣ - أَخْبَرَنَا إِسْمَعِيلُ بْنُ مَسْعُودٍ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، عَنْ سُلَيْمَانَ الشَّيْبَانِيِّ ، عَنِ الشَّعْبِيِّ ، أَخْبَرَنِي مَنْ مَرَّ مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى قَبْرٍ مُنْتَبِذٍ ، فَأَمَّهُمْ ، وَصَفَّ خَلْفَهُ ، قُلْتُ : مَنْ هُوَ يَا أَبَا عَمْرٍو ؟ قَالَ : ابْنُ عَبَّاسٍ.

2023. ...Süleyman əş-Şeybani Şabidən ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ ilə birlikdə bir qəbrin yanından keçən bir şəxs mənə xəbər verdi ki, Allah

Elçisi ﷺ onlara imam təyin etdi və onları onun arxasında səfə düzdü. Mən dedim: "O adam kim idi, ey Əbu Amr?" O dedi: "O, İbn Abbas idi".

٢٠٢٤ - أَخْبَرَنَا يَعْقُوبُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا هُشَيْمٌ ، قَالَ : الشَّيْبَانِيُّ أَنْبَأَنَا ، عَنِ الشَّعْبِيِّ ، قَالَ : أَخْبَرَنِي مَنْ رَأَى النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ مَرَّ بِقَبْرٍ مُنْتَبِذٍ فَصَلَّى عَلَيْهِ ، وَصَفَّ أَصْحَابَهُ خَلْفَهُ ، قِيلَ مَنْ حَدَّثَكَ ؟ قَالَ : ابْنُ عَبَّاسٍ.

2024. ...Rəvayət edilir ki, Şabi ؓ demişdir: "Allah Elçisini ﷺ görən bir nəfər mənə xəbər verdi ki, Allah Elçisi tək olan bir qəbrin yanından keçdikdə onları arxasında səfə düzərək və imamlıq edərək cənazə namazını qılmışdır". Ona dedilər: "Bunu sənə kim danışıb?" O dedi: "İbn Abbas".

٢٠٢٥ - أَخْبَرَنَا الْمُغِيرَةُ بْنُ عَبْدِ الرَّحْمَنِ ، قَالَ : حَدَّثَنَا زَيْدُ بْنُ عَلِيٍّ وَهُوَ أَبُو أُسَامَةَ ، قَالَ : حَدَّثَنَا جَعْفَرُ بْنُ بُرْقَانَ ، عَنْ حَبِيبِ بْنِ أَبِي مَرْزُوقٍ ، عَنْ عَطَاءٍ ، عَنْ جَابِرٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ صَلَّى عَلَى قَبْرِ امْرَأَةٍ بَعْدَ مَا دُفِنَتْ.

2025. ...Cabir ﷺ rəvayət edir ki, bir qadın dəfn edildikdən sonra Peyğəmbər ﷺ onun qəbrinin yanında ona cənazə namazı qıldı.

## ٩٥ - الرُّكُوبُ بَعْدَ الْفَرَاغِ مِنَ الْجَنَازَةِ

## 95-ci fəsil: Cənazədən sonra qayıdanda miniklə qayıtmaq

٢٠٢٦ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا أَبُو نُعَيْمٍ ، وَيَحْيَى بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا مَالِكُ بْنُ مِغْوَلٍ ، عَنْ سِمَاكٍ ، عَنْ جَابِرِ بْنِ سَمُرَةَ قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَلَى جِنَازَةِ أَبِي الدَّحْدَاحِ ، فَلَمَّا رَجَعَ أُتِيَ بِفَرَسٍ مُعْرَوْرًى ، فَرَكِبَ وَمَشَيْنَا مَعَهُ.

2026. ...Rəvayət edilir ki, Cabir ibn Səmura ؓ demişdir: "Allah Elçisi ﷺ Əbu Dəhdəhin cənazəsini dəfn etmək üçün çıxdı. Qayıdanda ona yəhərsiz bir at gətirdilər və Peyğəmbər ﷺ ona mindi. Biz də onunla birlikdə piyada getdik".

## ٩٦ - الزِّيَادَةُ عَلَى الْقَبْرِ

## 96-cı fəsil: Qəbrin üstündə əlavələr tikmək

٢٠٢٧ - أَخْبَرَنَا هَارُونُ بْنُ إِسْحَاقَ ، قَالَ : حَدَّثَنَا حَفْصٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، عَنْ سُلَيْمَانَ بْنِ مُوسَى ، وَأَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنْ يُبْنَى عَلَى الْقَبْرِ ، أَوْ يُزَادَ عَلَيْهِ ، أَوْ يُجَصَّصَ زَادَ سُلَيْمَانُ بْنُ مُوسَى : أَوْ يُكْتَبَ عَلَيْهِ.

2027. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ qəbirin üzərinin inşa edilməsini, qəbirin yüksəldilməsini və suvaqlanmasını qadağan etdi". Ravi Süleyman ibn Musa "Qəbirin üzərində yazı yazmağı da qadağan etdi" əlavəsini qeyd etdi".

### ٩٧ - الْبِنَاءُ عَلَى الْقَبْرِ

### 97-ci fəsil: Qəbirin üstündə bina tikmək

٢٠٢٨ - أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنْ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي أَبُو الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ جَابِرًا يَقُولُ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ تَقْصِيصِ الْقُبُورِ ، أَوْ يُبْنَى عَلَيْهَا ، أَوْ يَجْلِسَ عَلَيْهَا أَحَدٌ.

2028. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ qəbirlərin üzərində suvaqlayaraq nəyinsə tikilməsini, həmçinin onların üzərində oturulmasını qadağan etdi".

### ٩٨ - تَجْصِيصُ الْقُبُورِ

### 98-ci fəsil: Qəbirlərin üzərini suvaqlamaq

٢٠٢٩ - أَخْبَرَنَا عِمْرَانُ بْنُ مُوسَى ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ ، قَالَ : حَدَّثَنَا أَيُّوبُ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ جَابِرٍ قَالَ : نَهَى رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ عَنْ تَجْصِيصِ الْقُبُورِ.

2029. ...Rəvayət edilir ki, Cabir ﷺ demişdir: "Allah Elçisi ﷺ qəbirlərin üzərini suvaqlamağı qadağan etdi".

### ٩٩ - تَسْوِيَةُ الْقُبُورِ إِذَا رُفِعَتْ

### 99-cu fəsil: Qəbirlərin yer səviyyəsində edilməsi

٢٠٣٠ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، قَالَ : أَنْبَأَنَا ابْنُ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي عَمْرُو بْنُ الْحَارِثِ ، أَنَّ ثُمَامَةَ بْنَ شُفَيٍّ حَدَّثَهُ ، قَالَ : كُنَّا مَعَ فَضَالَةَ بْنِ عُبَيْدٍ بِأَرْضِ الرُّومِ ، فَتُوُفِّيَ صَاحِبٌ لَنَا فَأَمَرَ فَضَالَةُ بِقَبْرِهِ فَسُوِّيَ ثُمَّ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَأْمُرُ بِتَسْوِيَتِهَا.

2030. ...Rəvayət edilir ki, Sumamə ibn Şufey demişdir: "Bir dəfə Fədalə ibn Ubeyd ilə Rum torpağında bir yerdə idik. Bizim bir yoldaşımız vəfat etdi. Fədalə onun qəbrini yer səviyyəsində etməyi əmr etdi və belə dedi: "Mən Allah Elçisinin ﷺ qəbirlərin yer səviyyəsində edilməsini əmr etdiyini eşitmişəm".

٢٠٣١ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ حَبِيبٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ أَبِي الْهَيَّاجِ ، قَالَ : قَالَ عَلِيٌّ رَضِيَ اللَّهُ عَنْهُ : أَلاَ أَبْعَثُكَ عَلَى مَا بَعَثَنِي عَلَيْهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، لاَ تَدَعَنَّ قَبْرًا مُشْرِفًا إِلاَّ سَوَّيْتَهُ ، وَلاَ صُورَةً فِي بَيْتٍ إِلاَّ طَمَسْتَهَا.

2031. ...Rəvayət edilir ki, Əbul-Həyyəc ﵁ demişdir: "Əli ﵁ dedi: "Allah Elçisinin ﷺ məni göndərdiyi şey üçün səni göndərimmi? Yer səviyyəsindən hündür olan hər bir qəbiri yer səviyyəsinə salacaqsan. Hər evdəki surəti siləcəksən".

## ١٠٠ - زِيَارَةُ الْقُبُورِ

## 100-cü fəsil: Qəbirləri ziyarət etmək

٢٠٣٢ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ آدَمَ ، عَنْ ابْنِ فُضَيْلٍ ، عَنْ أَبِي سِنَانٍ ، عَنْ مُحَارِبِ بْنِ دِثَارٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : نَهَيْتُكُمْ عَنْ زِيَارَةِ الْقُبُورِ فَزُورُوهَا ، وَنَهَيْتُكُمْ عَنْ لُحُومِ الأَضَاحِيِّ فَوْقَ ثَلاَثَةِ أَيَّامٍ ، فَامْسِكُوا مَا بَدَا لَكُمْ ، وَنَهَيْتُكُمْ عَنِ النَّبِيذِ إِلاَّ فِي سِقَاءٍ فَاشْرَبُوا فِي الأَسْقِيَةِ كُلِّهَا وَلاَ تَشْرَبُوا مُسْكِرًا.

2032. ...Abdullah ibn Bureydə atasının ﵁ belə rəvayət etdiyini demişdir: "Allah Elçisi ﷺ buyurdu: "Sizə qəbirləri ziyarət etməyi qadağan etmişdim, indi ziyarət edə bilərsiniz. Qurban (bayramında kəsilən) ətləri üç gündən artıq saxlamağı qadağan etmişdim. İndi isə istədiyiniz qədər saxlaya bilərsiniz. Həmçinin xurma şərbətini sadəcə tuluqlarda saxlamağa icazə vermişdim, indi isə hər cür qabda saxlaya bilərsiniz. Amma sərxoşedici içkilərdən içməyin!"

٢٠٣٣ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ أَبِي فَرْوَةَ ، عَنِ الْمُغِيرَةِ بْنِ سُبَيْعٍ ، حَدَّثَنِي عَبْدُ اللهِ بْنُ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، أَنَّهُ كَانَ فِي مَجْلِسٍ فِيهِ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : إِنِّي كُنْتُ نَهَيْتُكُمْ أَنْ تَأْكُلُوا لُحُومَ الأَضَاحِيِّ إِلاَّ ثَلاَثًا ، فَكُلُوا وَأَطْعِمُوا وَادَّخِرُوا مَا بَدَا لَكُمْ ، وَذَكَرْتُ لَكُمْ أَنْ لاَ تَنْتَبِذُوا فِي الظُّرُوفِ الدُّبَّاءِ وَالْمُزَفَّتِ وَالنَّقِيرِ وَالْحَنْتَمِ انْتَبِذُوا فِيمَا رَأَيْتُمْ وَاجْتَنِبُوا كُلَّ مُسْكِرٍ ، وَنَهَيْتُكُمْ عَنْ زِيَارَةِ الْقُبُورِ ، فَمَنْ أَرَادَ أَنْ يَزُورَ فَلْيَزُرْ ، وَلاَ تَقُولُوا هُجْرًا.

2033. ...Abdullah ibn Bureydə atasından ﵁ rəvayət edir ki, bir dəfə o, Allah Elçisi ﷺ ilə bir məclisdə idi. Allah Elçisi ﷺ belə buyurdu: "Həqiqətən, mən Qurban (bayramında kəsilən) ətləri üç gündən artıq saxlayıb yeməyi qadağan etmişdim. Artıq özünüz yeyə, başqalarına yedirdə və (istədiyiniz qədər) saxlaya bilərsiniz. Sizə oyulmuş ağacdan düzəldilmiş qablarda

dubbəni[1], müzəffəti (yaxud müqəyyəri)[2], nəqiri[3], həntəmi[4] və şirə saxlamağı qadağan etmişdim. Artıq bütün qablarda şirə saxlaya bilərsiniz. Sərxoşluq gətirən hər şeydən çəkinin! Həmçinin sizə qəbirləri ziyarət etməyi qadağan etmişdim. Artıq kim istəsə, (qəbirləri) ziyarət edə bilər, lakin pis söz söyləməyin!"

١٠١ - زِيَارَةُ قَبْرِ الْمُشْرِكِ

101-ci fəsil: Müşrikin qəbrini ziyarət etmək

٢٠٣٤ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ عُبَيْدٍ ، عَنْ يَزِيدَ بْنِ كَيْسَانَ ، عَنْ أَبِي حَازِمٍ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : زَارَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَبْرَ أُمِّهِ ، فَبَكَى وَأَبْكَى مَنْ حَوْلَهُ ، وَقَالَ : اسْتَأْذَنْتُ رَبِّي عَزَّ وَجَلَّ فِي أَنْ أَسْتَغْفِرَ لَهَا فَلَمْ يُؤْذَنْ لِي ، وَاسْتَأْذَنْتُ فِي أَنْ أَزُورَ قَبْرَهَا فَأَذِنَ لِي ، فَزُورُوا الْقُبُورَ فَإِنَّهَا تُذَكِّرُكُمُ الْمَوْتَ.

2034. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Allah Elçisi ﷺ anasının qəbrini ziyarət etdi, ağladı və yanında olanları da ağlatdı, sonra dedi: "Rəbbimdən ﷻ anam üçün bağışlanma diləməyə izn istədim, izn vermədi. Qəbrini ziyarət etmək üçün izn istədim, izn verdi. Qəbirləri ziyarət edin, çünki qəbir ziyarəti ölümü xatırladır".

١٠٢ - النَّهْيُ عَنِ الاِسْتِغْفَارِ لِلْمُشْرِكِينَ

102-ci fəsil: Müşriklər üçün bağışlanma diləməyin qadağan olması

٢٠٣٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ وَهُوَ ابْنُ ثَوْرٍ ، عَنْ مَعْمَرٍ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِيهِ قَالَ : لَمَّا حَضَرَتْ أَبَا طَالِبٍ الْوَفَاةُ دَخَلَ عَلَيْهِ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، وَعِنْدَهُ أَبُو جَهْلٍ ، وَعَبْدُ اللهِ بْنُ أَبِي أُمَيَّةَ ، فَقَالَ : أَيْ عَمِّ قُلْ : لاَ إِلَهَ إِلاَّ اللَّهُ ، كَلِمَةً أُحَاجُّ لَكَ بِهَا عِنْدَ اللهِ عَزَّ وَجَلَّ ، فَقَالَ لَهُ أَبُو جَهْلٍ ، وَعَبْدُ اللهِ بْنُ أَبِي أُمَيَّةَ : يَا أَبَا طَالِبٍ ، أَتَرْغَبُ عَنْ مِلَّةِ عَبْدِ الْمُطَّلِبِ ؟ فَلَمْ يَزَالاَ يُكَلِّمَانِهِ حَتَّى كَانَ آخِرُ شَيْءٍ كَلَّمَهُمْ بِهِ عَلَى مِلَّةِ عَبْدِ الْمُطَّلِبِ ، فَقَالَ لَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لأَسْتَغْفِرَنَّ لَكَ مَا لَمْ أُنْهَ عَنْكَ ، فَنَزَلَتْ **{مَا كَانَ لِلنَّبِيِّ وَالَّذِينَ آمَنُوا أَنْ يَسْتَغْفِرُوا لِلْمُشْرِكِينَ}** وَنَزَلَتْ **{إِنَّكَ لاَ تَهْدِي مَنْ أَحْبَبْتَ}**.

2035. ...Səid ibn əl-Museyyib atasının ﵁ belə dediyini rəvayət etmişdir: "Əbu Talib ölüm ayağında ikən Allah Elçisi ﷺ onun yanına gəldi. Əbu

[1] Dubba – şərab saxlamaq üçün qurudulmuş boranıdan düzəldilmiş qab.
[2] Müzəffət, yaxud müqəyyər – şərab saxlamaq üçün yanları qatranla malalanmış qab.
[3] Nəqir – şərab saxlamaq üçün içi oyulmuş xurma kötüyündən düzəldilmiş qab.
[4] Həntəm – tərkibinə yun və qan qatılmış gildən düzəldilmiş yaşıl rəngli cürdək. Əvvəllər bu cür qablarda şərab saxlayardılar.

Cəhl və Abdullah ibn Əbu Umeyyə də orada idi. Allah Elçisi ﷺ dedi: "Əmican, "lə iləhə illəllah" kəlməsini de ki, Allah ﷻ yanında sənin (dediyinə) şahidlik edim". Bunu eşidəndə Əbu Cəhl və Abdullah ibn Əbu Umeyyə dedilər: "Ey Əbu Talib, Abdulmuttalibin dinindən dönməkmi istəyirsən?!" Onlar bunu o qədər təkrar etdilər ki, axırda Əbu Talibin onlara son sözü Abdulmuttalibin dinində qalacağı oldu. Onda Allah Elçisi ﷺ ona dedi: "Vallahi, bil ki, mənə qadağan edilənədək sənin üçün bağışlanma diləyəcəyəm". Sonra bu ayə nazil oldu: **"Müşriklərin Cəhənnəm sakinləri olduqları bəlli olduqdan sonra qohum olsalar belə, Peyğəmbərə və möminlərə onlar üçün bağışlanma diləmək yaraşmaz".** (ət-Tövbə, 113). Sonra da bu ayə nazil oldu: **"Şübhəsiz ki, sən istədiyini doğru yola yönəldə bilməzsən. Amma Allah istədiyini doğru yola yönəldir. O, doğru yolda olanları daha yaxşı tanıyır"** (əl-Qasəs, 56)".

٢٠٣٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِي إِسْحَاقَ ، عَنْ أَبِي الْخَلِيلِ ، عَنْ عَلِيٍّ قَالَ : سَمِعْتُ رَجُلاً يَسْتَغْفِرُ لأَبَوَيْهِ وَهُمَا مُشْرِكَانِ ، فَقُلْتُ : أَتَسْتَغْفِرُ لَهُمَا وَهُمَا مُشْرِكَانِ ؟ فَقَالَ : أَوَ لَمْ يَسْتَغْفِرْ إِبْرَاهِيمُ لأَبِيهِ ؟ فَأَتَيْتُ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرْتُ ذَلِكَ لَهُ ، فَنَزَلَتْ : **{وَمَا كَانَ اسْتِغْفَارُ إِبْرَاهِيمَ لأَبِيهِ إِلاَّ عَنْ مَوْعِدَةٍ وَعَدَهَا إِيَّاهُ}**.

2036. ...Rəvayət edilir ki, Əli رضي الله عنه demişdir: "Mən bir kişinin, valideynləri müşrik olduqları halda onlar üçün bağışlanma diləməsini eşitdim və dedim: "Onlar müşrik olduqları halda onlar üçün bağışlanma diləyirsən?" O dedi: "Məgər İbrahim öz müşrik atası üçün bağışlanma diləməmişdirmi?" Mən Peyğəmbərin ﷺ yanına gəldim və olanları ona danışdıqda bu ayə nazil oldu: "**İbrahimin öz atası üçün bağışlanma diləməsi isə sadəcə ona verdiyi vədə görə idi. Atasının Allaha düşmən olduğu ona bəlli olduqdan sonra isə ondan uzaqlaşdı. Həqiqətən, İbrahim Allaha çox yalvaran həlim bir kimsə idi"** (ət-Tövbə, 114)".

### ١٠٣ - الأَمْرُ بِالاِسْتِغْفَارِ لِلْمُؤْمِنِينَ

### 103-cü fəsil: Möminlər üçün bağışlanma diləməyin əmr edilməsi

٢٠٣٧ - أَخْبَرَنَا يُوسُفُ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنِ ابْنِ جُرَيْجٍ ، قَالَ : أَخْبَرَنِي عَبْدُ اللهِ بْنُ أَبِي مُلَيْكَةَ ، أَنَّهُ سَمِعَ مُحَمَّدَ بْنَ قَيْسِ بْنِ مَخْرَمَةَ يَقُولُ : سَمِعْتُ عَائِشَةَ تُحَدِّثُ ، قَالَتْ : أَلاَ أُحَدِّثُكُمْ عَنِّي ، وَعَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ قُلْنَا : بَلَى ، قَالَتْ : لَمَّا كَانَتْ لَيْلَتِي الَّتِي هُوَ عِنْدِي ــ تَعْنِي النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ــ انْقَلَبَ فَوَضَعَ نَعْلَيْهِ عِنْدَ رِجْلَيْهِ ، وَبَسَطَ طَرَفَ إِزَارِهِ عَلَى فِرَاشِهِ ، فَلَمْ يَلْبَثْ إِلاَّ رَيْثَمَا ظَنَّ أَنِّي قَدْ رَقَدْتُ ، ثُمَّ انْتَعَلَ رُوَيْدًا ، وَأَخَذَ رِدَاءَهُ رُوَيْدًا ، ثُمَّ فَتَحَ الْبَابَ رُوَيْدًا ، وَخَرَجَ رُوَيْدًا ، وَجَعَلْتُ دِرْعِي فِي رَأْسِي ، وَاخْتَمَرْتُ ، وَتَقَنَّعْتُ إِزَارِي ، وَانْطَلَقْتُ فِي إِثْرِهِ حَتَّى جَاءَ الْبَقِيعَ ، فَرَفَعَ يَدَيْهِ ثَلاَثَ

مَرَّاتٍ ، فَأَطَالَ ثُمَّ انْحَرَفَ ، فَانْحَرَفْتُ ، فَأَسْرَعَ ، فَأَسْرَعْتُ ، فَهَرْوَلَ فَهَرْوَلْتُ ، فَأَحْضَرَ فَأَحْضَرْتُ ، وَسَبَقْتُهُ فَدَخَلْتُ فَلَيْسَ إِلاَّ أَنْ اضْطَجَعْتُ ، فَدَخَلَ فَقَالَ : مَا لَكِ يَا عَائِشَةُ حَشْيَا رَابِيَةً ؟ ، قَالَتْ : لاَ ، قَالَ : لَتُخْبِرِنِّي أَوْ لَيُخْبِرَنِّي اللَّطِيفُ الْخَبِيرُ ، قُلْتُ : يَا رَسُولَ اللهِ ، بِأَبِي أَنْتَ وَأُمِّي ، فَأَخْبَرْتُهُ الْخَبَرَ ، قَالَ : فَأَنْتِ السَّوَادُ الَّذِي رَأَيْتُ أَمَامِي ؟ قَالَتْ : نَعَمْ ، فَلَهَزَنِي فِي صَدْرِي لَهْزَةً أَوْجَعَتْنِي ، ثُمَّ قَالَ : أَظَنَنْتِ أَنْ يَحِيفَ اللَّهُ عَلَيْكِ وَرَسُولُهُ ؟ ، قُلْتُ : مَهْمَا يَكْتُمُ النَّاسُ فَقَدْ عَلِمَهُ اللَّهُ ، قَالَ : فَإِنَّ جِبْرِيلَ أَتَانِي حِينَ رَأَيْتِ ، وَلَمْ يَدْخُلْ عَلَيَّ ، وَقَدْ وَضَعْتِ ثِيَابَكِ ، فَنَادَانِي فَأَخْفَى مِنْكِ ، فَأَجَبْتُهُ فَأَخْفَيْتُهُ مِنْكِ ، فَظَنَنْتُ أَنْ قَدْ رَقَدْتِ ، وَكَرِهْتُ أَنْ أُوقِظَكِ ، وَخَشِيتُ أَنْ تَسْتَوْحِشِي ، فَأَمَرَنِي أَنْ آتِيَ الْبَقِيعَ ، فَأَسْتَغْفِرَ لَهُمْ ، قُلْتُ : كَيْفَ أَقُولُ يَا رَسُولَ اللهِ ؟ قَالَ : قُولِي السَّلاَمُ عَلَى أَهْلِ الدِّيَارِ مِنَ الْمُؤْمِنِينَ وَالْمُسْلِمِينَ ، يَرْحَمُ اللَّهُ الْمُسْتَقْدِمِينَ مِنَّا وَالْمُسْتَأْخِرِينَ ، وَإِنَّا إِنْ شَاءَ اللَّهُ بِكُمْ لاَحِقُونَ.

2037. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Mən sizə Peyğəmbərdən ﷺ hədis danışımmı?” Biz: “Bəli!” dedik. O dedi: “Peyğəmbər ﷺ mənim yanımda qalan gecə idi. Ayaqqabılarını ayaqlarının yaxınlığında qoydu, paltarının bir tərəfini də yatağının üzərinə sərdi. Mənim yatdığıma əmin olana qədər gözlədi, sonra yavaşca ayaqqabılarını geyindi və paltarını götürərək yavaşca qapını açdı və çıxdı. Mən örtüyümü başıma örtüb paltarımı geyindim və onun arxası ilə getdim. Allah Elçisi ﷺ Bəqi qəbiristanlığına gəldi, üç dəfə uzun müddət əllərini qaldırıb tutdu. Sonra çevrildi, mən də çevrildim. Allah Elçisi ﷺ sürətli yeriməyə başladıqda, mən də sürətləndim. Allah Elçisi ﷺ daha sürətli yüyürməyə başladıqda, mən daha sürətli yüyürdüm. Allah Elçisi ﷺ qaçmağa başladı, mən də qaçmağa başladım və evə ondan əvvəl girdim. Allah Elçisi ﷺ mən uzandıqdan sonra evə girdi və dedi: “Sənə nə olub, ey Aişə, təngnəfəs olmusan?” Mən dedim: “Heç nə olmayıb”. Allah Elçisi ﷺ dedi: “Sən deməsən də, Lətif və hər şeyi bilən Allah mənə xəbər verəcək”. Mən də: “Ey Allahın Elçisi, anam-atam sənə fəda olsun!” deyib olanları ona danışdım. Allah Elçisi ﷺ dedi: “Məndən qabaqda gördüyüm qaraltı sən idin?” Mən dedim: “Bəli, mən idim”. O, əlinin iç tərəfi ilə yüngülcə mənim sinəmə vurdu və sinəm ağrıdı.[1] Sonra Allah Elçisi ﷺ dedi: “Allahın və Onun Elçisinin sənə haqsızlıq edəcəyinimi sandın?” Mən dedim: “İnsanlar nə qədər gizlətsələr də, Allah bilir”. Allah Elçisi ﷺ dedi: “Sən məni görəndə Cəbrail yanıma gəlmişdi. Paltarını çıxartmışdın deyə yanıma gəlmədi və mənə səsləndi, lakin səndən gizləndi. Mən də ona cavab verdim və onu səndən gizlətdim. Sənin yatdığını zənn etdim və oyandırmaq istəmədim, səni tək qoymaqdan da qorxdum. Lakin Cəbrail Bəqi qəbiristanlığına gəlməyimi və orada

[1] Burada Peyğəmbər ﷺ ədəbləndirmək məqsədilə Aişənin ﵂ sinəsinə yüngülcə vurmuşdur.

olanlar üçün bağışlanma diləməyimi istədi. Mən: "Nə deməliyəm?" dedim. O da "Belə de" buyurdu: "Bu diyarın mömin və müsəlman sakinləri! Sizə salam olsun! Allah bizdən əvvəl gedənlərə və qalanlara rəhmət etsin! Allahın izni ilə biz də sizə qovuşacağıq!"[1]

٢٠٣٨ - أَخْبَرَنِي مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنْ ابْنِ الْقَاسِمِ ، قَالَ : حَدَّثَنِي مَالِكٌ ، عَنْ عَلْقَمَةَ بْنِ أَبِي عَلْقَمَةَ ، عَنْ أُمِّهِ ، أَنَّهَا سَمِعَتْ عَائِشَةَ تَقُولُ : قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ذَاتَ لَيْلَةٍ فَلَبِسَ ثِيَابَهُ ، ثُمَّ خَرَجَ ، قَالَتْ : فَأَمَرْتُ جَارِيَتِي بَرِيرَةَ تَتْبَعُهُ ، فَتَبِعَتْهُ حَتَّى جَاءَ الْبَقِيعَ ، فَوَقَفَ فِي أَدْنَاهُ مَا شَاءَ اللَّهُ أَنْ يَقِفَ ، ثُمَّ انْصَرَفَ ، فَسَبَقَتْهُ بَرِيرَةُ ، فَأَخْبَرَتْنِي ، فَلَمْ أَذْكُرْ لَهُ شَيْئًا حَتَّى أَصْبَحْتُ ، ثُمَّ ذَكَرْتُ ذَلِكَ لَهُ ، فَقَالَ : إِنِّي بُعِثْتُ إِلَى أَهْلِ الْبَقِيعِ لِأُصَلِّيَ عَلَيْهِمْ.

2038. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Bir gecə Allah Elçisi ﷺ ayağa qalxıb paltarını geyindi və bayıra çıxdı. Mən də cariyəm Bəriraya Allah Elçisini ﷺ izləməsini əmr etdim. O da Allah Elçisini ﷺ Bəqi qəbiristanlığına qədər təqib etdi. Allah Elçisi ﷺ Bəqi qəbiristanlığının aşağı tərəfində Allahın istədiyi qədər dayandı, sonra geri döndü. Cariyəm mənim yanıma ondan əvvəl qayıtdı və olanları mənə xəbər verdi. Səhər olana qədər Allah Elçisinə ﷺ bir şey demədim, sonra gecə olanları ona dedim. Allah Elçisi ﷺ buyurdu: "Mən Bəqi əhlinə[2] dua etmək üçün göndərilmişdim".[3]

٢٠٣٩ - أَخْبَرَنَا عَلِيُّ بْنُ حُجْرٍ ، قَالَ : حَدَّثَنَا إِسْمَعِيلُ ، قَالَ : حَدَّثَنَا شَرِيكٌ وَهُوَ ابْنُ أَبِي نَمِرٍ ، عَنْ عَطَاءٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : كَانَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كُلَّمَا كَانَتْ لَيْلَتُهَا مِنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْرُجُ فِي آخِرِ اللَّيْلِ إِلَى الْبَقِيعِ فَيَقُولُ : السَّلَامُ عَلَيْكُمْ دَارَ قَوْمٍ مُؤْمِنِينَ ، وَإِنَّا وَإِيَّاكُمْ مُتَوَاعِدُونَ غَدًا أَوْ مُوَاكِلُونَ ، وَإِنَّا إِنْ شَاءَ اللَّهُ بِكُمْ لَاحِقُونَ ، اللَّهُمَّ اغْفِرْ لِأَهْلِ بَقِيعِ الْغَرْقَدِ.

2039. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: "Allah Elçisi ﷺ mənim yanımda qaldığı gecədə gecənin sonuna yaxın Bəqi qəbiristanlığına gedər və belə dua edərdi: "Möminlər topluluğunun diyarı! Sizə salam olsun! Biz sizinlə qovuşacağıq – və ya – bir-birimizə şəfaətçi olacağıq. Allahın izni ilə biz də sizə qovuşacağıq. Allahım, Bəqiul-Ğarqad qəbiristanlığında olanları bağışla!"

[1] əs-Sələ:mu alə əhlid-diyə:ri minəl-mu'mini:nə val-muslimi:n, yərhəmulla:hul-mustəqdimi:nə minnə: val-mustə'xiri:n! Va innə: in şə:ə Alla:hu bikum lə:hiqu:n!

[2] Bəqi əhli, yəni Bəqi qəbiristanlığında dəfn olunanlar.

[3] Hədisin isnadı zəifdir.

٢٠٤٠ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا حَرَمِيُّ بْنُ عُمَارَةَ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَلْقَمَةَ بْنِ مَرْثَدٍ ، عَنْ سُلَيْمَانَ بْنِ بُرَيْدَةَ ، عَنْ أَبِيهِ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ إِذَا أَتَى عَلَى الْمَقَابِرِ فَقَالَ : السَّلاَمُ عَلَيْكُمْ أَهْلَ الدِّيَارِ مِنَ الْمُؤْمِنِينَ وَالْمُسْلِمِينَ ، وَإِنَّا إِنْ شَاءَ اللَّهُ بِكُمْ لاَحِقُونَ ، أَنْتُمْ لَنَا فَرَطٌ وَنَحْنُ لَكُمْ تَبَعٌ ، أَسْأَلُ اللَّهَ الْعَافِيَةَ لَنَا وَلَكُمْ.

2040. ...Süleyman ibn Bureydə atasından ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ qəbiristanlığa gedəndə belə deyərdi: “Bu diyarın mömin və müsəlman sakinləri! Sizə salam olsun! Allahın izni ilə biz də sizə qovuşacağıq. Siz bizdən qabaq getdiniz, biz də sizin arxanızca gələcəyik. Allahdan özümüzə və sizə salamatlıq diləyirik!”[1]

٢٠٤١ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ أَبِي سَلَمَةَ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : لَمَّا مَاتَ النَّجَاشِيُّ ، قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : اسْتَغْفِرُوا لَهُ.

2041. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Nəcaşi vəfat etdikdə Peyğəmbər ﷺ dedi: “Onun üçün bağışlanma diləyin!”

٢٠٤٢ - أَخْبَرَنَا أَبُو دَاوُدَ ، قَالَ : حَدَّثَنَا يَعْقُوبُ ، قَالَ : حَدَّثَنَا أَبِي ، عَنْ صَالِحٍ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنِي أَبُو سَلَمَةَ ، وَابْنُ الْمُسَيَّبِ ، أَنَّ أَبَا هُرَيْرَةَ أَخْبَرَهُمَا ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ نَعَى لَهُمُ النَّجَاشِيَّ صَاحِبَ الْحَبَشَةِ فِي الْيَوْمِ الَّذِي مَاتَ فِيهِ ، فَقَالَ : اسْتَغْفِرُوا لأَخِيكُمْ.

2042. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ Həbəşistanın hökmdarı Nəcaşinin ölüm xəbərini onun öldüyü gün xəbər verərək dedi: “Qardaşınız üçün bağışlanma diləyin!”

## ١٠٤ - التَّغْلِيظُ فِي اتِّخَاذِ السُّرُجِ عَلَى الْقُبُورِ

## 104-cü fəsil: Qəbirlərin üzərində şam yandırmağın qadağan olması

٢٠٤٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الْوَارِثِ بْنُ سَعِيدٍ ، عَنْ مُحَمَّدِ بْنِ جُحَادَةَ ، عَنْ أَبِي صَالِحٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : لَعَنَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ زَائِرَاتِ الْقُبُورِ ، وَالْمُتَّخِذِينَ عَلَيْهَا الْمَسَاجِدَ وَالسُّرُجَ.

2043. ...Rəvayət edilir ki, İbn Abbas ﷺ demişdir: “Allah Elçisi ﷺ qəbirləri tez-tez ziyarət edən qadınları, qəbirləri məscid halına salanları və qəbirlərin üzərində şam yandıranları lənətləmişdir”.[2]

---

[1] Transkripsiyası: əs-Sələ:mu aleykum əhləd-diyə:ri minəl-mu'mini:nə val-muslimi:n, va innə: in şə:ə Alla:hu bikum lə:hiqu:n! Əntum lənə: fəratun va nəhnu ləkum təbəun, əs əlulla:həl-a:fiyətə lənə: va ləkum!

[2] Hədis zəifdir.

١٠٥ - التَّشْدِيدُ فِي الْجُلُوسِ عَلَى الْقُبُورِ

105-ci fəsil: Qəbirlərin üzərində oturmağın şiddətli şəkildə qadağan olması

٢٠٤٤ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، عَنْ وَكِيعٍ ، عَنْ سُفْيَانَ ، عَنْ سُهَيْلٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : لأَنْ يَجْلِسَ أَحَدُكُمْ عَلَى جَمْرَةٍ حَتَّى تَحْرُقَ ثِيَابَهُ خَيْرٌ لَهُ مِنْ أَنْ يَجْلِسَ عَلَى قَبْرٍ.

2044. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən birinizin paltarı yanana qədər yanan daşın üstündə oturmağı qəbir üzərində oturmasından daha xeyirlidir".

٢٠٤٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ عَبْدِ الْحَكَمِ ، عَنْ شُعَيْبٍ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنِ ابْنِ أَبِي هِلاَلٍ ، عَنْ أَبِي بَكْرِ بْنِ حَزْمٍ ، عَنِ النَّضْرِ بْنِ عَبْدِ اللهِ السَّلَمِيِّ ، عَنْ عَمْرِو بْنِ حَزْمٍ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لاَ تَقْعُدُوا عَلَى الْقُبُورِ.

2045. ...Amr ibn Hazm ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Qəbirlərin üzərində oturmayın!"

١٠٦ - اتِّخَاذُ الْقُبُورِ مَسَاجِدَ

106-cı fəsil: Qəbirlərin məscid halına salınması

٢٠٤٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ الْحَارِثِ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ قَتَادَةَ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَعَنَ اللَّهُ قَوْمًا اتَّخَذُوا قُبُورَ أَنْبِيَائِهِمْ مَسَاجِدَ.

2046. ...Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Allah Peyğəmbərlərin qəbirlərini məscidə halına gətirən toplumlara lənət etsin!"

٢٠٤٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الرَّحِيمِ أَبُو يَحْيَى صَاعِقَةُ ، قَالَ : حَدَّثَنَا أَبُو سَلَمَةَ الْخُزَاعِيُّ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ بْنُ سَعْدٍ ، عَنْ يَزِيدَ بْنِ الْهَادِ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ سَعِيدِ بْنِ الْمُسَيَّبِ ، عَنْ أَبِي هُرَيْرَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : لَعَنَ اللَّهُ الْيَهُودَ وَالنَّصَارَى اتَّخَذُوا قُبُورَ أَنْبِيَائِهِمْ مَسَاجِدَ.

2047. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Allah Peyğəmbərlərin qəbirlərini məscid halına salan yəhudi və nəsranilərə lənət etmişdir!"

### ١٠٧ - كَرَاهِيَةُ الْمَشْيِ بَيْنَ الْقُبُورِ فِي النِّعَالِ السِّبْتِيَّةِ

### 107-ci fəsil: Qəbirlərin arasında dəridən olan ayaqqabı ilə gəzməyin qadağan olması

٢٠٤٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا وَكِيعٌ ، عَنِ الأَسْوَدِ بْنِ شَيْبَانَ وَكَانَ ثِقَةً ، عَنْ خَالِدِ بْنِ سُمَيْرٍ ، عَنْ بَشِيرِ بْنِ نَهِيكٍ ، أَنَّ بَشِيرَ ابْنَ الْخَصَاصِيَةِ قَالَ : كُنْتُ أَمْشِي مَعَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَمَرَّ عَلَى قُبُورِ الْمُسْلِمِينَ ، فَقَالَ : لَقَدْ سَبَقَ هَؤُلاَءِ شَرًّا كَثِيرًا ، ثُمَّ مَرَّ عَلَى قُبُورِ الْمُشْرِكِينَ ، فَقَالَ : لَقَدْ سَبَقَ هَؤُلاَءِ خَيْرًا كَثِيرًا ، فَحَانَتْ مِنْهُ الْتِفَاتَةٌ ، فَرَأَى رَجُلاً يَمْشِي بَيْنَ الْقُبُورِ فِي نَعْلَيْهِ ، فَقَالَ : يَا صَاحِبَ السِّبْتِيَّتَيْنِ أَلْقِهِمَا.

2048. ...Rəvayət edilir ki, Bəşir ibn əl-Xasasiyə ﷺ demişdir: “Mən Allah Elçisi ﷺ ilə birlikdə piyada gedirdim. Allah Elçisi ﷺ müsəlmanların qəbirlərinin yanına gəlib dedi: “Bunlar bir çox pisliyi arxada tərk etdilər”. Sonra müşriklərin qəbirlərinə yanına çatıb dedi: “Bunlar da çox böyük xeyirlərdən məhrum oldular”. Allah Elçisi ﷺ çevrilib qəbirlərin arasında ayağında dəridən olan ayaqqabı ilə gəzişən bir kişini gördü və dedi: “Ey dəridən olan ayaqqabıları ilə gəzişən, ayaqqabılarını çıxart!”

### ١٠٨ - التَّسْهِيلُ فِي غَيْرِ السِّبْتِيَّةِ

### 108-ci fəsil: Ölən insanın ayaqqabıların səsini eşitməsi

٢٠٤٩ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ أَبِي عُبَيْدِ اللهِ الْوَرَّاقُ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ الْعَبْدَ إِذَا وُضِعَ فِي قَبْرِهِ وَتَوَلَّى عَنْهُ أَصْحَابُهُ إِنَّهُ لَيَسْمَعُ قَرْعَ نِعَالِهِمْ.

2049. ...Ənəs rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Həqiqətən, bəndə qəbrinə qoyulduqda yaxınları oradan gedərkən onların ayaq səslərini eşidir”.

### ١٠٩ - الْمَسْأَلَةُ فِي الْقَبْرِ

### 109-cu fəsil: Qəbirdə olan sorğu-sual

٢٠٥٠ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، وَإِبْرَاهِيمُ بْنُ يَعْقُوبَ بْنِ إِسْحَاقَ ، قَالاَ : حَدَّثَنَا يُونُسُ بْنُ مُحَمَّدٍ ، عَنْ شَيْبَانَ ، عَنْ قَتَادَةَ ، أَنْبَأَنَا أَنَسُ بْنُ مَالِكٍ قَالَ : قَالَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّ الْعَبْدَ إِذَا وُضِعَ فِي قَبْرِهِ وَتَوَلَّى عَنْهُ أَصْحَابُهُ إِنَّهُ لَيَسْمَعُ قَرْعَ نِعَالِهِمْ ، قَالَ : فَيَأْتِيهِ مَلَكَانِ ، فَيُقْعِدَانِهِ فَيَقُولاَنِ لَهُ : مَا كُنْتَ تَقُولُ فِي هَذَا الرَّجُلِ ؟ فَأَمَّا الْمُؤْمِنُ ، فَيَقُولُ : أَشْهَدُ أَنَّهُ عَبْدُ اللهِ وَرَسُولُهُ ، فَيُقَالُ لَهُ : انْظُرْ إِلَى مَقْعَدِكَ مِنَ النَّارِ قَدْ أَبْدَلَكَ اللَّهُ بِهِ مَقْعَدًا مِنَ الْجَنَّةِ ، قَالَ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَيَرَاهُمَا جَمِيعًا.

2050. ...Rəvayət edilir ki, Ənəs ibn Malik ﷺ demişdir: "Allahın Peyğəmbəri ﷺ belə buyurdu: "Həqiqətən, bəndə qəbirə qoyulduqda və yoldaşları ondan uzaqlaşdıqda onların ayaq səslərini eşidir. Sonra ona iki mələk yaxınlaşır, onu otuzdurur və ona deyirlər: "Sən bu kişi haqda nə deyirdin?" Əgər o kişi mömindirsə, deyir: "Mən onun Allahın qulu və elçisi olduğuna şahidlik edirəm". Ona deyirlər: "Oddan olan yerinə bax! Artıq Allah onu sənin üçün Cənnətdə olan yerə dəyişmişdir". Peyğəmbər ﷺ dedi: "O, iki yerini də görür".

## ١١٠ - مَسْأَلَةُ الْكَافِرِ

## 110-cu fəsil: Qəbirdə kafirin sorğu-sualı

٢٠٥١ - أَخْبَرَنَا أَحْمَدُ بْنُ أَبِي عُبَيْدِ اللهِ ، قَالَ : حَدَّثَنَا يَزِيدُ بْنُ زُرَيْعٍ ، عَنْ سَعِيدٍ ، عَنْ قَتَادَةَ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّ الْعَبْدَ إِذَا وُضِعَ فِي قَبْرِهِ وَتَوَلَّى عَنْهُ أَصْحَابُهُ إِنَّهُ لَيَسْمَعُ قَرْعَ نِعَالِهِمْ ، أَتَاهُ مَلَكَانِ فَيُقْعِدَانِهِ فَيَقُولاَنِ لَهُ : مَا كُنْتَ تَقُولُ فِي هَذَا الرَّجُلِ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ؟ فَأَمَّا الْمُؤْمِنُ فَيَقُولُ : أَشْهَدُ أَنَّهُ عَبْدُ اللهِ وَرَسُولُهُ ، فَيُقَالُ لَهُ : انْظُرْ إِلَى مَقْعَدِكَ مِنَ النَّارِ قَدْ أَبْدَلَكَ اللَّهُ بِهِ مَقْعَدًا خَيْرًا مِنْهُ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَيَرَاهُمَا جَمِيعًا ، وَأَمَّا الْكَافِرُ أَوِ الْمُنَافِقُ ، فَيُقَالُ لَهُ : مَا كُنْتَ تَقُولُ فِي هَذَا الرَّجُلِ ؟ فَيَقُولُ : لاَ أَدْرِي ، كُنْتُ أَقُولُ كَمَا يَقُولُ النَّاسُ ، فَيُقَالُ لَهُ : لاَ دَرَيْتَ وَلاَ تَلَيْتَ ، ثُمَّ يُضْرَبُ ضَرْبَةً بَيْنَ أُذُنَيْهِ فَيَصِيحُ صَيْحَةً يَسْمَعُهَا مَنْ يَلِيهِ غَيْرُ الثَّقَلَيْنِ.

2051. ...Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Həqiqətən, bəndə qəbirə qoyulduqda yaxınları və yoldaşları ondan uzaqlaşır, o da onların ayaq səslərini eşidir. Sonra ona iki mələk yaxınlaşır, onu otuzdurur və ona deyirlər: "Sən Muhəmməd adlı bu kişi haqqında nə deyirdin?" Mömînə gəlincə, o deyər: "Mən onun Allahın qulu və elçisi olduğuna şahidlik edirəm". Ona deyilər: "Sənin Cəhənnəmdə olan yerinə bax! Artıq Allah onu sənin üçün daha xeyirli olan yerlə əvəz etmişdir". Allah Elçisi dedi: "O, Cəhənnəmdən və Cənnətdən olan yerini görər. Kafir və ya münafiqə gəlincə, mələklər ona deyirlər: "Bu kişi haqda nə deyirdin?" O deyir: "Bilmirəm, mən insanların dedikləri kimi deyirdim". Ona deyilər: "Sən onu haqq saymadın və ona haqqı ilə tabe olmadın". Sonra başının arxasına qulaqlarının arası tərəfə elə zərbə vurular ki, onun səsini insanlardan və cinlərdən başqa hamı eşidər".

## ١١١ - مَنْ قَتَلَهُ بَطْنُهُ

## 111-ci fəsil: Qarın xəstəliyi səbəbi ilə vəfat edən

٢٠٥٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ الأَعْلَى ، قَالَ : حَدَّثَنَا خَالِدٌ ، عَنْ شُعْبَةَ ، قَالَ : أَخْبَرَنِي جَامِعُ بْنُ شَدَّادٍ ، قَالَ : سَمِعْتُ عَبْدَ اللهِ

بْنَ يَسَارٍ ، قَالَ : كُنْتُ جَالِسًا وَسُلَيْمَانُ بْنُ صُرَدٍ وخَالِدُ بْنُ عُرْفُطَةَ ، فَذَكَرُوا أَنَّ رَجُلاً تُوُفِّيَ مَاتَ بِبَطْنِهِ ، فَإِذَا هُمَا يَشْتَهِيَانِ أَنْ يَكُونَا شُهَدَاءَ جَنَازَتِهِ ، فَقَالَ أَحَدُهُمَا لِلآخَرِ : أَلَمْ يَقُلْ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : مَنْ يَقْتُلْهُ بَطْنُهُ ، فَلَنْ يُعَذَّبَ فِي قَبْرِهِ فَقَالَ الآخَرُ : بَلَى.

2052. ...Rəvayət edilir ki, Abdullah ibn Yəsar ﷺ demişdir: "Bir dəfə Süleyman ibn Surad və Xalid ibn Urfutanın yanında oturmuşdum. Onlar qarın xəstəliyindən vəfat edən adam haqqında söhbət etdilər. İkisi də onun cənazəsində iştirak etmək istəyirdilər. Biri digərinə dedi: "Məgər Allah Elçisi ﷺ "Qarın xəstəliyindən ölənə qəbir əzabı olmaz" deməyibmi?" O biri dedi: "Bəli, elədir".

## ١١٢ - الشَّهِيدُ

## 112-ci fəsil: Şəhid haqda

٢٠٥٣ - أَخْبَرَنَا إِبْرَاهِيمُ بْنُ الْحَسَنِ ، قَالَ : حَدَّثَنَا حَجَّاجٌ ، عَنْ لَيْثِ بْنِ سَعْدٍ ، عَنْ مُعَاوِيَةَ بْنِ صَالِحٍ ، أَنَّ صَفْوَانَ بْنَ عَمْرٍو حَدَّثَهُ ، عَنْ رَاشِدِ بْنِ سَعْدٍ ، عَنْ رَجُلٍ مِنْ أَصْحَابِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، أَنَّ رَجُلاً قَالَ : يَا رَسُولَ اللهِ ، مَا بَالُ الْمُؤْمِنِينَ يُفْتَنُونَ فِي قُبُورِهِمْ إِلاَّ الشَّهِيدَ ؟ قَالَ : كَفَى بِبَارِقَةِ السُّيُوفِ عَلَى رَأْسِهِ فِتْنَةً.

2053. ...Raşid ibn Səd ﷺ Peyğəmbərin ﷺ səhabələrindən olan bir kişidən rəvayət edir ki, bir nəfər dedi: "Ey Allahın Elçisi, nəyə görə şəhiddən başqa bütün möminlər qəbir fitnəsinə məruz qalır?" Peyğəmbər ﷺ dedi: "Başının üzərindəki qılıncların parıltısı ona imtahan olaraq kifayətdir".

٢٠٥٤ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ التَّيْمِيِّ ، عَنْ أَبِي عُثْمَانَ ، عَنْ عَامِرِ بْنِ مَالِكٍ ، عَنْ صَفْوَانَ بْنِ أُمَيَّةَ قَالَ : الطَّاعُونُ ، وَالْمَبْطُونُ ، وَالْغَرِيقُ ، وَالنُّفَسَاءُ شَهَادَةٌ ، قَالَ : وَحَدَّثَنَا أَبُو عُثْمَانَ مِرَارًا ، وَرَفَعَهُ مَرَّةً إِلَى النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ.

2054. ...Rəvayət edilir ki, Safvan ibn Umeyyə ﷺ demişdir: "Taundan (vəba-dan), qarın xəstəliyindən, suda boğulmaqdan və nifasdan ölənlər şəhiddir". Ravi Əbu Osman bunu bizə dəfələrlə danışıb bir dəfə də Peyğəmbərə ﷺ nisbət etdi.

## ١١٣ - ضَمَّةُ الْقَبْرِ وَضَغْطَتُهُ

## 113-cü fəsil: Qəbirin tutub sıxması

٢٠٥٥ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا عَمْرُو بْنُ مُحَمَّدٍ الْعَنْقَزِيُّ ، قَالَ : حَدَّثَنَا ابْنُ إِدْرِيسَ ، عَنْ عُبَيْدِ اللهِ ، عَنْ

نَافِعٍ ، عَنْ ابْنِ عُمَرَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : هَذَا الَّذِي تَحَرَّكَ لَهُ الْعَرْشُ ، وَفُتِحَتْ لَهُ أَبْوَابُ السَّمَاءِ ، وَشَهِدَهُ سَبْعُونَ أَلْفًا مِنَ الْمَلَائِكَةِ ، لَقَدْ ضُمَّ ضَمَّةً ، ثُمَّ فُرِّجَ عَنْهُ.

2055. ...İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "(Səd ibn Muazın ölümünə görə) Ərş silkələnmiş, səmanın qapıları açılmış və yetmiş min mələk onun cənazəsində iştirak etmişdir. Amma qəbir əvvəlcə onu tutub sıxmış, sonra onun üçün genişlənmişdir".

## ١١٤ - عَذَابُ الْقَبْرِ

## 114-cü fəsil: Qəbir əzabı

٢٠٥٦ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ مَنْصُورٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ الرَّحْمَنِ ، عَنْ سُفْيَانَ ، عَنْ أَبِيهِ ، عَنْ خَيْثَمَةَ ، عَنِ الْبَرَاءِ قَالَ : **{يُثَبِّتُ اللَّهُ الَّذِينَ آمَنُوا بِالْقَوْلِ الثَّابِتِ فِي الْحَيَاةِ الدُّنْيَا وَفِي الآخِرَةِ}** ، قَالَ : نَزَلَتْ فِي عَذَابِ الْقَبْرِ.

2056. ...Rəvayət edilir ki, əl-Bəra رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ bu ayəni **"Allah iman gətirənləri dünya həyatında da, axirətdə də möhkəm sözlə sabit saxlayar"** (İbrahim, 27) oxuduqdan sonra buyurdu: "Bu ayə qəbir əzabı barəsində nazil olmuşdur".

٢٠٥٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ بَشَّارٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدٌ ، قَالَ : حَدَّثَنَا شُعْبَةُ ، عَنْ عَلْقَمَةَ بْنِ مَرْثَدٍ ، عَنْ سَعْدِ بْنِ عُبَيْدَةَ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : **{يُثَبِّتُ اللَّهُ الَّذِينَ آمَنُوا بِالْقَوْلِ الثَّابِتِ فِي الْحَيَاةِ الدُّنْيَا وَفِي الآخِرَةِ}** ، قَالَ : نَزَلَتْ فِي عَذَابِ الْقَبْرِ ، يُقَالُ لَهُ : مَنْ رَبُّكَ ؟ فَيَقُولُ : رَبِّيَ اللَّهُ ، وَدِينِي دِينُ مُحَمَّدٍ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَذَلِكَ قَوْلُهُ : **{يُثَبِّتُ اللَّهُ الَّذِينَ آمَنُوا بِالْقَوْلِ الثَّابِتِ فِي الْحَيَاةِ الدُّنْيَا وَفِي الآخِرَةِ}**.

2057. ...Rəvayət edilir ki, əl-Bəra ibn Azib رضي الله عنه demişdir: "Peyğəmbər ﷺ bu ayəni **"Allah iman gətirənləri dünya həyatında da, axirətdə də möhkəm sözlə sabit saxlayar"** (İbrahim, 27) haqda buyurdu: "Bu ayə qəbir əzabı barəsində nazil olmuşdur". (Bərzəx həyatında[1]) ona deyiləcək: "Rəbbin kimdir?" O deyəcək: "Rəbbim Allahdır, dinim də Məhəmmədin ﷺ dinidir". Bu da: **"Allah iman gətirənləri dünya həyatında da, axirətdə də möhkəm sözlə sabit saxlayar"** (İbrahim, 27) ayəsində öz təsdiqini tapmışdır".

[1] Bərzəx, yəni dünya ilə Axirət həyatı arasında mövcud olan qəbir həyatı qəsd edilir. (ən-Nihayə, 1/118; Lisanul-Ərəb, 3/8).

٢٠٥٨ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : حَدَّثَنَا عَبْدُ اللهِ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ سَمِعَ صَوْتًا مِنْ قَبْرٍ فَقَالَ : مَتَى مَاتَ هَذَا ؟ قَالُوا : مَاتَ فِي الْجَاهِلِيَّةِ ، فَسُرَّ بِذَلِكَ ، وَقَالَ : لَوْلاَ أَنْ لاَ تَدَافَنُوا لَدَعَوْتُ اللَّهَ أَنْ يُسْمِعَكُمْ عَذَابَ الْقَبْرِ.

2058. ...Ənəs ﷺ rəvayət edir ki, bir dəfə Peyğəmbər ﷺ bir qəbirdən səs eşitdi və dedi: "Bu, nə zaman ölüb?" Səhabələr dedilər: "Cahiliyyə dövründə". Peyğəmbər ﷺ buna sevindi və dedi: "Əgər sizin ölənlərinizi dəfn etməyəcəyinizdən qorxmasaydım, qəbirdə olan əzabın səsini eşitməyiniz üçün Allaha dua edərdim".

٢٠٥٩ - أَخْبَرَنَا عُبَيْدُ اللهِ بْنُ سَعِيدٍ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ شُعْبَةَ ، قَالَ : أَخْبَرَنِي عَوْنُ بْنُ أَبِي جُحَيْفَةَ ، عَنْ أَبِيهِ ، عَنِ الْبَرَاءِ بْنِ عَازِبٍ ، عَنْ أَبِي أَيُّوبَ قَالَ : خَرَجَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْدَ مَا غَرَبَتِ الشَّمْسُ فَسَمِعَ صَوْتًا فَقَالَ : يَهُودُ تُعَذَّبُ فِي قُبُورِهَا.

2059. ...Rəvayət edilir ki, Əbu Əyyub ﷺ demişdir: "Bir dəfə günəş batdıqdan sonra Allah Elçisi ﷺ (evdən) bayıra çıxdı və bir səs eşidib dedi: "(Bunlar) qəbirlərində əzab çəkən yəhudilərdir".

## ١١٥ - التَّعَوُّذُ مِنْ عَذَابِ الْقَبْرِ

## 115-ci fəsil: Qəbir əzabından Allaha sığınmaq

٢٠٦٠ - أَخْبَرَنَا يَحْيَى بْنُ دُرُسْتَ ، قَالَ : حَدَّثَنَا أَبُو إِسْمَعِيلَ ، قَالَ : حَدَّثَنَا يَحْيَى بْنُ أَبِي كَثِيرٍ ، أَنَّ أَبَا سَلَمَةَ حَدَّثَهُ ، عَنْ أَبِي هُرَيْرَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ أَنَّهُ كَانَ يَقُولُ : اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ ، وَأَعُوذُ بِكَ مِنْ عَذَابِ النَّارِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ.

2060. ...Əbu Hureyra ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurmuşdur: "Allahım, qəbir əzabından Sənə sığınıram! Cəhənnəm odundan Sənə sığınıram! Həyatın və ölümün fitnəsindən Sənə sığınıram! Məsih Dəccalın fitnəsindən Sənə sığınıram!"[1]

٢٠٦١ - أَخْبَرَنَا عَمْرُو بْنُ سَوَّادِ بْنِ الأَسْوَدِ بْنِ عَمْرٍو ، عَنِ ابْنِ وَهْبٍ ، قَالَ : حَدَّثَنَا يُونُسُ بْنُ يَزِيدَ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْدَ ذَلِكَ يَسْتَعِيذُ مِنْ عَذَابِ الْقَبْرِ.

---

[1] Transkripsiyası: Alla:hummə, inni: əu:zu bikə min azə:bil-qabr, va əu:zu bikə min azə:bin-nə:r, va əu:zu bikə min fitnətil-məhyə: val-məmə:ti, va əu:zu bikə min fitnətil-məsi:hid-dəccə:l!

2061. Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: "Mən Allah Elçisinin ﷺ bundan sonra qəbir əzabından Allaha sığındığını eşitdim".

٢٠٦٢ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، أَخْبَرَنِي عُرْوَةُ بْنُ الزُّبَيْرِ ، أَنَّهُ سَمِعَ أَسْمَاءَ بِنْتَ أَبِي بَكْرٍ تَقُولُ : قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرَ الْفِتْنَةَ الَّتِي يُفْتَنُ بِهَا الْمَرْءُ فِي قَبْرِهِ ، فَلَمَّا ذَكَرَ ذَلِكَ ضَجَّ الْمُسْلِمُونَ ضَجَّةً حَالَتْ بَيْنِي وَبَيْنَ أَنْ أَفْهَمَ كَلَامَ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، فَلَمَّا سَكَنَتْ ضَجَّتُهُمْ قُلْتُ لِرَجُلٍ قَرِيبٍ مِنِّي : أَيْ بَارَكَ اللَّهُ لَكَ ، مَاذَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فِي آخِرِ قَوْلِهِ ؟ قَالَ : قَدْ أُوحِيَ إِلَيَّ أَنَّكُمْ تُفْتَنُونَ فِي الْقُبُورِ قَرِيبًا مِنْ فِتْنَةِ الدَّجَّالِ.

2062. ...Rəvayət edilir ki, Əsma bint Əbu Bəkr ﵄ demişdir: "Allah Elçisi ﷺ ayağa durub bir kişinin qəbrində gördüyü əzab haqda danışdı. Allah Elçisi ﷺ bu haqda danışdıqda müsəlmanlar elə bir səs saldılar ki, onun nə dediyini başa düşə bilmədim. Onlar sakitləşdikdə mənim yaxınlığımda olan bir kişiyə dedim: "Allah sənə bərəkət versin, Allah Elçisi ﷺ danışığının sonunda nə dedi?" O dedi: "Allah Elçisi buyurdu: "Mənə vəhy olundu ki, siz qəbirdə Dəccalın fitnəsi kimi bir fitnəyə məruz qalacaqsınız".

٢٠٦٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنْ أَبِي الزُّبَيْرِ ، عَنْ طَاوُوسٍ ، عَنْ عَبْدِ اللهِ بْنِ عَبَّاسٍ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يُعَلِّمُهُمْ هَذَا الدُّعَاءَ ، كَمَا يُعَلِّمُهُمُ السُّورَةَ مِنَ الْقُرْآنِ قُولُوا : اللَّهُمَّ إِنَّا نَعُوذُ بِكَ مِنْ عَذَابِ جَهَنَّمَ ، وَأَعُوذُ بِكَ مِنْ عَذَابِ الْقَبْرِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَسِيحِ الدَّجَّالِ ، وَأَعُوذُ بِكَ مِنْ فِتْنَةِ الْمَحْيَا وَالْمَمَاتِ.

2063. ...Abdullah ibn Abbas ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ onlara bu duanı Qurandan bir surə öyrətdiyi kimi öyrətmişdir: "Allahım, Cəhənnəm əzabından Sənə sığınırıq! Qəbir əzabından Sənə sığınıram! Məsih Dəccalın fitnəsindən Sənə sığınıram! Həyatın və ölümün fitnəsindən Sənə sığınıram!"[1]

٢٠٦٤ - أَخْبَرَنَا سُلَيْمَانُ بْنُ دَاوُدَ ، عَنْ ابْنِ وَهْبٍ ، قَالَ : أَخْبَرَنِي يُونُسُ ، عَنْ ابْنِ شِهَابٍ ، قَالَ : حَدَّثَنِي عُرْوَةُ ، أَنَّ عَائِشَةَ قَالَتْ : دَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَعِنْدِي امْرَأَةٌ مِنَ الْيَهُودِ وَهِيَ تَقُولُ : إِنَّكُمْ تُفْتَنُونَ فِي الْقُبُورِ ، فَارْتَاعَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَالَ : إِنَّمَا تُفْتَنُ يَهُودُ ، وَقَالَتْ عَائِشَةُ : فَلَبِثْنَا لَيَالِيَ ، ثُمَّ قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّهُ أُوحِيَ إِلَيَّ أَنَّكُمْ تُفْتَنُونَ فِي الْقُبُورِ ، قَالَتْ عَائِشَةُ : فَسَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بَعْدُ يَسْتَعِيذُ مِنْ عَذَابِ الْقَبْرِ.

---

[1] Transkripsiyası: Alla:hummə, innə: nəu:zu bikə min azə:bi Cəhənnəm, va əu:zu bikə min azə:bil-qabr, va əu:zu bikə min fitnətil-məsi:hid-dəccə:l, va əu:zu bikə min fitnətil-məhyə: val-məmə:t!

2064. ...Rəvayət edilir ki, Aişə ﵂ demişdir: “Allah Elçisi ﷺ yanıma gəldikdə mənim yanımda yəhudi bir qadın var idi və belə deyirdi: “Siz qəbirdə imtahan olunacaqsınız”. Allah Elçisi ﷺ bunu eşitdikdə dedi: “Yəhudilər də imtahan olunacaqlar”. Aişə deyir: “Bir neçə gecə keçdikdən sonra Allah Elçisi ﷺ dedi: “Həqiqətən, sizin qəbirdə imtahan olunacağınız mənə vəhy olundu”. Aişə deyir: “Mən Allah Elçisinin ﷺ qəbir əzabından Allaha sığındığını eşitdim”.

٢٠٦٥ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ يَحْيَى ، عَنْ عَمْرَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ كَانَ يَسْتَعِيذُ مِنْ عَذَابِ الْقَبْرِ ، وَمِنْ فِتْنَةِ الدَّجَّالِ ، وَقَالَ : إِنَّكُمْ تُفْتَنُونَ فِي قُبُورِكُمْ.

2065. ...Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ qəbir əzabından və Dəccalın fitnəsindən Allaha sığındı və belə dedi: “Siz qəbirlərinizdə imtahan olunacaqsınız”.

٢٠٦٦ - أَخْبَرَنَا هَنَّادٌ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ شَقِيقٍ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ ، دَخَلَتْ يَهُودِيَّةٌ عَلَيْهَا فَاسْتَوْهَبَتْهَا شَيْئًا ، فَوَهَبَتْ لَهَا عَائِشَةُ ، فَقَالَتْ : أَجَارَكِ اللَّهُ مِنْ عَذَابِ الْقَبْرِ ، قَالَتْ عَائِشَةُ : فَوَقَعَ فِي نَفْسِي مِنْ ذَلِكَ ، حَتَّى جَاءَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَذَكَرْتُ ذَلِكَ لَهُ فَقَالَ : إِنَّهُمْ لَيُعَذَّبُونَ فِي قُبُورِهِمْ عَذَابًا تَسْمَعُهُ الْبَهَائِمُ.

2066. ...Aişə ﵂ rəvayət edir ki, bir yəhudi qadın gələrək ondan bəzi şeylər istədi. Aişə də onun istədiyini verdikdə qadın dedi: “Allah səni qəbir əzabından qorusun!” Aişə deyir: “O qadının bu sözü başımı qarışdırdı və Allah Elçisi ﷺ gələn kimi bunu ona dedim. O dedi: “Onlar qəbirlərində elə əzab görəcəklər ki, səslərini heyvanlar eşidəcək”.

٢٠٦٧ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ أَبِي وَائِلٍ ، عَنْ مَسْرُوقٍ ، عَنْ عَائِشَةَ قَالَتْ : دَخَلَتْ عَلَيَّ عَجُوزَتَانِ مِنْ عُجُزِ يَهُودِ الْمَدِينَةِ ، فَقَالَتَا : إِنَّ أَهْلَ الْقُبُورِ يُعَذَّبُونَ فِي قُبُورِهِمْ ، فَكَذَّبْتُهُمَا وَلَمْ أُنْعِمْ أَنْ أُصَدِّقَهُمَا ، فَخَرَجَتَا وَدَخَلَ عَلَيَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقُلْتُ : يَا رَسُولَ اللهِ ، إِنَّ عَجُوزَتَيْنِ مِنْ عُجُزِ يَهُودِ الْمَدِينَةِ قَالَتَا : إِنَّ أَهْلَ الْقُبُورِ يُعَذَّبُونَ فِي قُبُورِهِمْ ، قَالَ : صَدَقَتَا إِنَّهُمْ يُعَذَّبُونَ عَذَابًا تَسْمَعُهُ الْبَهَائِمُ كُلُّهَا ، فَمَا رَأَيْتُهُ صَلَّى صَلاَةً إِلاَّ تَعَوَّذَ مِنْ عَذَابِ الْقَبْرِ.

2067. ...Rəvayət edilir ki, Aişə demişdir: “Mədinə yəhudilərindən iki yaşlı qadın yanıma gəlmişdilər. Onlar dedilər: “Qəbirdə olanlar qəbirlərində əzab görəcəklər”. Mən onların dediklərini yalan sandım və qəbul etmək istəmədim. Onlar getdikdən sonra Allah Elçisi yanıma gəldi. Mən dedim: “Ey Allahın Elçisi, Mədinənin yaşlı iki yəhudi qadını gəlmişdi və “qəbirdə olanlar qəbirlərində əzab görəcəklər” dedilər”. Allah Elçisi ﷺ dedi: “Onlar

düz deyirlər! Onlar qəbirlərində elə əzab görəcəklər ki, səslərini bütün heyvanlar eşidəcək”. Bundan sonra Allah Elçisinin ﷺ hər namazda qəbir əzabından Allaha sığındığını gördüm”.

## ١١٦ - وَضْعُ الْجَرِيدَةِ عَلَى الْقَبْرِ
## 116-cı fəsil: Qəbirin üzərinə xurma budağı sancmaq

٢٠٦٨ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ قُدَامَةَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ مُجَاهِدٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : مَرَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِحَائِطٍ مِنْ حِيطَانِ مَكَّةَ أَوِ الْمَدِينَةِ سَمِعَ صَوْتَ إِنْسَانَيْنِ يُعَذَّبَانِ فِي قُبُورِهِمَا ، فَقَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُعَذَّبَانِ وَمَا يُعَذَّبَانِ فِي كَبِيرٍ ، ثُمَّ قَالَ : بَلَى ، كَانَ أَحَدُهُمَا لاَ يَسْتَبْرِئُ مِنْ بَوْلِهِ ، وَكَانَ الآخَرُ يَمْشِي بِالنَّمِيمَةِ ، ثُمَّ دَعَا بِجَرِيدَةٍ فَكَسَرَهَا كِسْرَتَيْنِ ، فَوَضَعَ عَلَى كُلِّ قَبْرٍ مِنْهُمَا كِسْرَةً ، فَقِيلَ لَهُ : يَا رَسُولَ اللهِ ، لِمَ فَعَلْتَ هَذَا ؟ قَالَ : لَعَلَّهُ أَنْ يُخَفَّفَ عَنْهُمَا مَا لَمْ يَيْبَسَا أَوْ إِلَى أَنْ يَيْبَسَا.

2068. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: “Allah Elçisi ﷺ Məkkə və ya Mədinə küçələrindən birinin yanından keçərkən qəbirlərində əzab çəkən iki adamın səsini eşitdi. Allah Elçisi ﷺ dedi: “(Bunlar) əzab çəkirlər, amma böyük bir şeyə görə əzab çəkmirlər”. Sonra (bunun səbəbini bildirib) dedi: “Bəli, onlardan biri sidikdən qorunmazdı, digəri isə söz gəzdirərdi”. Sonra o, bir xurma budağı gətirməyi əmr etdi. Budağı iki yerə böldü. Hər qəbrin üstünə yarısını sancdı. Səhabələr ondan: “Ey Allahın Elçisi, nə üçün belə etdin?”– deyə soruşdular. O dedi: “Ola bilsin ki, bunlar quruyanadək onların əzabı yüngülləşsin”.

٢٠٦٩ - أَخْبَرَنَا هَنَّادُ بْنُ السَّرِيِّ ، فِي حَدِيثِهِ ، عَنْ أَبِي مُعَاوِيَةَ ، عَنِ الأَعْمَشِ ، عَنْ مُجَاهِدٍ ، عَنْ طَاوُوسٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : مَرَّ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِقَبْرَيْنِ فَقَالَ : إِنَّهُمَا لَيُعَذَّبَانِ وَمَا يُعَذَّبَانِ فِي كَبِيرٍ ، أَمَّا أَحَدُهُمَا فَكَانَ لاَ يَسْتَبْرِئُ مِنْ بَوْلِهِ ، وَأَمَّا الآخَرُ فَكَانَ يَمْشِي بِالنَّمِيمَةِ ، ثُمَّ أَخَذَ جَرِيدَةً رَطْبَةً فَشَقَّهَا نِصْفَيْنِ ، ثُمَّ غَرَزَ فِي كُلِّ قَبْرٍ وَاحِدَةً ، فَقَالُوا : يَا رَسُولَ اللهِ ، لِمَ صَنَعْتَ هَذَا ؟ فَقَالَ : لَعَلَّهُمَا أَنْ يُخَفَّفَ عَنْهُمَا مَا لَمْ يَيْبَسَا.

2069. ...Rəvayət edilir ki, İbn Abbas رضي الله عنهما demişdir: “Allah Elçisi ﷺ iki qəbirin yanından keçərkən dedi: “Həqiqətən, bunlar əzab çəkirlər, amma böyük bir şeyə görə əzab çəkmirlər. Bunlardan biri sidikdən qorunmazdı, digəri isə söz gəzdirərdi”. Sonra o, yaş bir xurma budağı götürüb iki yerə böldü. Hər birinin qəbrinin üstünə yarısını sancdı. Səhabələr ondan: “Ey Allahın Elçisi, nə üçün belə etdin?”– deyə soruşdular. O dedi: “Ola bilsin ki, bu budaqlar quruyanadək onların əzabı yüngülləşsin”.

٢٠٧٠ - أَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : أَلاَ إِنَّ أَحَدَكُمْ إِذَا مَاتَ عُرِضَ عَلَيْهِ مَقْعَدُهُ بِالْغَدَاةِ وَالْعَشِيِّ ، إِنْ كَانَ مِنْ أَهْلِ الْجَنَّةِ فَمِنْ أَهْلِ الْجَنَّةِ ، وَإِنْ كَانَ مِنْ أَهْلِ النَّارِ فَمِنْ أَهْلِ النَّارِ ، حَتَّى يَبْعَثَهُ اللَّهُ عَزَّ وَجَلَّ يَوْمَ الْقِيَامَةِ.

2070. ...İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: “Həqiqətən, biriniz öldükdə ona səhər və axşam (Cənnətdəki və Cəhənnəmdəki) yeri göstərilir. Bu, Qiyamət günü Allah ﷻ sizi dirildənə qədər belə davam edəcək”.

٢٠٧١ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : أَنْبَأَنَا الْمُعْتَمِرُ ، قَالَ : سَمِعْتُ عُبَيْدَ اللهِ يُحَدِّثُ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يُعْرَضُ عَلَى أَحَدِكُمْ إِذَا مَاتَ مَقْعَدُهُ مِنَ الْغَدَاةِ وَالْعَشِيِّ ، فَإِنْ كَانَ مِنْ أَهْلِ النَّارِ فَمِنْ أَهْلِ النَّارِ ، قِيلَ : هَذَا مَقْعَدُكَ حَتَّى يَبْعَثَكَ اللَّهُ عَزَّ وَجَلَّ يَوْمَ الْقِيَامَةِ.

2071. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Siz öldükdə hər birinizə səhər və axşam yeriniz göstərilir. Kim Cəhənnəm əhlindəndirsə, ona Cəhənnəmdəki yeri göstərilir və deyilir: “Bu, Qiyamət günü Allah ﷻ səni dirildənə qədər olan yerindir”.

٢٠٧٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ سَلَمَةَ ، وَالْحَارِثُ بْنُ مِسْكِينٍ ، قِرَاءَةً عَلَيْهِ وَأَنَا أَسْمَعُ وَاللَّفْظُ لَهُ ، عَنِ ابْنِ الْقَاسِمِ ، حَدَّثَنِي مَالِكٌ ، عَنْ نَافِعٍ ، عَنِ ابْنِ عُمَرَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِذَا مَاتَ أَحَدُكُمْ عُرِضَ عَلَى مَقْعَدِهِ بِالْغَدَاةِ وَالْعَشِيِّ ، إِنْ كَانَ مِنْ أَهْلِ الْجَنَّةِ فَمِنْ أَهْلِ الْجَنَّةِ ، وَإِنْ كَانَ مِنْ أَهْلِ النَّارِ فَمِنْ أَهْلِ النَّارِ ، فَيُقَالُ : هَذَا مَقْعَدُكَ حَتَّى يَبْعَثَكَ اللَّهُ عَزَّ وَجَلَّ يَوْمَ الْقِيَامَةِ.

2072. ...İbn Ömər ﵄ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Sizdən biriniz öldükdə səhər və axşam Cənnətdəki və Cəhənnəmdəki yeriniz göstərilir. Kim Cənnət əhlindəndirsə, ona Cənnətdəki yeri göstərilir. Kim Cəhənnəm əhlindəndirsə, ona Cəhənnəmdəki yeri göstərilir və deyilir: “Bu, Qiyamət günü Allah ﷻ səni dirildənə qədər olan yerindir”.

## ١١٧ - أَرْوَاحُ الْمُؤْمِنِينَ

## 117-ci fəsil: Möminlərin ruhları

٢٠٧٣ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، عَنِ ابْنِ شِهَابٍ ، عَنْ عَبْدِ الرَّحْمَنِ بْنِ كَعْبٍ أَنَّهُ أَخْبَرَهُ ، أَنَّ أَبَاهُ كَعْبَ بْنَ مَالِكٍ كَانَ يُحَدِّثُ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّمَا نَسَمَةُ الْمُؤْمِنِ طَائِرٌ فِي شَجَرِ الْجَنَّةِ حَتَّى يَبْعَثَهُ اللَّهُ عَزَّ وَجَلَّ إِلَى جَسَدِهِ يَوْمَ الْقِيَامَةِ.

2073. ...Kəb ibn Malik ﵁ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, möminin ruhu Qiyamət günü Allah onu bədəninə qaytarana qədər Cənnətdə olan ağacda quşdur”.

٢٠٧٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا سُلَيْمَانُ وَهُوَ ابْنُ الْمُغِيرَةِ ، قَالَ : حَدَّثَنَا ثَابِتٌ ، عَنْ أَنَسٍ قَالَ : كُنَّا مَعَ عُمَرَ بَيْنَ مَكَّةَ وَالْمَدِينَةِ أَخَذَ يُحَدِّثُنَا عَنْ أَهْلِ بَدْرٍ ، فَقَالَ : إِنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ لَيُرِينَا مَصَارِعَهُمْ بِالأَمْسِ ، قَالَ : هَذَا مَصْرَعُ فُلاَنٍ إِنْ شَاءَ اللَّهُ غَدًا ، قَالَ عُمَرُ : وَالَّذِي بَعَثَهُ بِالْحَقِّ مَا أَخْطَئُوا تِيكَ ، فَجُعِلُوا فِي بِئْرٍ ، فَأَتَاهُمُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَنَادَى : يَا فُلاَنُ بْنَ فُلاَنٍ ، يَا فُلاَنُ بْنَ فُلاَنٍ ، هَلْ وَجَدْتُمْ مَا وَعَدَ رَبُّكُمْ حَقًّا ؟ فَإِنِّي وَجَدْتُ مَا وَعَدَنِي اللَّهُ حَقًّا ، فَقَالَ : عُمَرُ : تُكَلِّمُ أَجْسَادًا لاَ أَرْوَاحَ فِيهَا ، فَقَالَ : مَا أَنْتُمْ بِأَسْمَعَ لِمَا أَقُولُ مِنْهُمْ.

2074. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “Bir dəfə Məkkə ilə Mədinə arasında Ömər ilə bir yerdə idik. O, bizə Bədr əhli haqda danışaraq belə dedi: “Allah Elçisi ﷺ axşam (döyüşdən qabaq kafirlərin öldürüləcəkləri) yerləri göstərərək dedi: “Filankəs Allahın izni ilə sabah burada olacaq!” Ömər dedi: “Onu haqq ilə Göndərənə and olsun! Onlar göstərilən yerdə öldürüldülər və hamısı quyuya atıldılar. Peyğəmbər ﷺ quyunun başına gəlib belə nida etdi: “Ey filankəsin oğlu filankəs! Ey filankəsin oğlu filankəs! Rəbbinizin sizə vəd etdiyi haqqı tapdınızmı?! Həqiqətən, mən Rəbbimin mənə vəd etdiyi haqqı tapdım!” Ömər dedi: “Sən ruhları olmayan cəsədlərlə danışırdı?” Allah Elçisi ﷺ buyurdu: “Onlara dediyimi siz daha yaxşı eşitmirsiniz”.[1]

٢٠٧٥ - أَخْبَرَنَا سُوَيْدُ بْنُ نَصْرٍ ، قَالَ : أَنْبَأَنَا عَبْدُ اللهِ ، عَنْ حُمَيْدٍ ، عَنْ أَنَسٍ قَالَ : سَمِعَ الْمُسْلِمُونَ مِنَ اللَّيْلِ بِبِئْرِ بَدْرٍ وَرَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَائِمٌ يُنَادِي : يَا أَبَا جَهْلِ بْنَ هِشَامٍ ، وَيَا شَيْبَةُ بْنَ رَبِيعَةَ ، وَيَا عُتْبَةُ بْنَ رَبِيعَةَ ، وَيَا أُمَيَّةَ بْنَ خَلَفٍ ، هَلْ وَجَدْتُمْ مَا وَعَدَ رَبُّكُمْ حَقًّا ؟ فَإِنِّي وَجَدْتُ مَا وَعَدَنِي رَبِّي حَقًّا ، قَالُوا : يَا رَسُولَ اللهِ ، أَوَ تُنَادِي قَوْمًا قَدْ جَيَّفُوا ؟ فَقَالَ : مَا أَنْتُمْ بِأَسْمَعَ لِمَا أَقُولُ مِنْهُمْ ، وَلَكِنَّهُمْ لاَ يَسْتَطِيعُونَ أَنْ يُجِيبُوا.

2075. ...Rəvayət edilir ki, Ənəs ﵁ demişdir: “O gecə müsəlmanlar Bədr quyusunun başında Allah Elçisinin ﷺ ayaq üstə nida edərək belə dediyini eşitdilər: “Ey Əbu Cəhl ibn Hişam, ey Şeybə ibn Rabia, ey Utbə ibn Rabia, ey Umeyyə ibn Xələf! Rəbbinizin sizə vəd etdiyi haqqı tapdınızmı?! Həqiqətən, mən Rəbbimin mənə vəd etdiyi haqqı tapdım!” Səhabələr dedilər: “Ey Allahın Elçisi, çürümüş leşlərəmi səslənirsən?” Allah Elçisi ﷺ

[1] Yəni “onlar mənim dediyimi sizin kimi aydın eşidirlər”.

buyurdu: "Onlara dediyimi siz məndən daha yaxşı eşitmirsiniz, lakin onlar cavab vermək iqtidarında deyillər".

٢٠٧٦ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ آدَمَ ، قَالَ : حَدَّثَنَا عَبْدَةُ ، عَنْ هِشَامٍ ، عَنْ أَبِيهِ ، عَنْ ابْنِ عُمَرَ ، أَنَّ النَّبِيَّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ وَقَفَ عَلَى قَلِيبِ بَدْرٍ ، فَقَالَ : هَلْ وَجَدْتُمْ مَا وَعَدَ رَبُّكُمْ حَقًّا ؟ ، قَالَ : إِنَّهُمْ لَيَسْمَعُونَ الآنَ مَا أَقُولُ لَهُمْ ، فَذُكِرَ ذَلِكَ لِعَائِشَةَ ، فَقَالَتْ : وَهِلَ ابْنُ عُمَرَ ، إِنَّمَا قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : إِنَّهُمُ الآنَ يَعْلَمُونَ أَنَّ الَّذِي كُنْتُ أَقُولُ لَهُمْ هُوَ الْحَقُّ ، ثُمَّ قَرَأَتْ قَوْلَهُ **{إِنَّكَ لاَ تُسْمِعُ الْمَوْتَى}** حَتَّى قَرَأَتِ الآيَةَ.

2076. ...İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ Bədrdə quyusunun başında durub dedi: "Rəbbinizin sizə vəd etdiyi haqqı tapdınızmı?!" Sonra dedi: "İndi onlar mənim nə dediyimi eşidirlər". Bunu Aişəyə xəbər verdikdə o dedi: "Yəqin ki, İbn Ömər səhv edib, çünki Allah Elçisi ﷺ belə buyurmuşdu: "Onlar indi mənim dediklərimin haqq olduğunu anladılar". Sonra Aişə bu ayəni axıra kimi oxudu: **"Sözsüz ki, sən nə ölülərə haqqı eşitdirə bilərsən, nə də dönüb gedən karlara çağırışı çatdıra bilərsən"**. (ən-Nəml, 80)".

٢٠٧٧ - أَخْبَرَنَا قُتَيْبَةُ ، عَنْ مَالِكٍ ، وَمُغِيرَةُ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : كُلُّ بَنِي آدَمَ ــ وَفِي حَدِيثِ مُغِيرَةَ ــ : كُلُّ ابْنِ آدَمَ يَأْكُلُهُ التُّرَابُ إِلاَّ عَجْبَ الذَّنَبِ مِنْهُ خُلِقَ ، وَفِيهِ يُرَكَّبُ.

2077. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə buyurdu: "Torpaq hər bir Adəm övladının cəsədini yeyəcək, yalnız büzdüm sümüyündən başqa. Adəm övladı o sümükdən yaradılmışdır və ondan da bərpa olunacaqdır".

٢٠٧٨ - أَخْبَرَنَا الرَّبِيعُ بْنُ سُلَيْمَانَ ، قَالَ : حَدَّثَنَا شُعَيْبُ بْنُ اللَّيْثِ ، قَالَ : حَدَّثَنَا اللَّيْثُ ، عَنْ ابْنِ عَجْلاَنَ ، عَنْ أَبِي الزِّنَادِ ، عَنِ الأَعْرَجِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ ، قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : كَذَّبَنِي ابْنُ آدَمَ ، وَلَمْ يَكُنْ يَنْبَغِي لَهُ أَنْ يُكَذِّبَنِي ، وَشَتَمَنِي ابْنُ آدَمَ ، وَلَمْ يَكُنْ يَنْبَغِي لَهُ أَنْ يَشْتُمَنِي ، أَمَّا تَكْذِيبُهُ إِيَّايَ ، فَقَوْلُهُ : إِنِّي لاَ أُعِيدُهُ كَمَا بَدَأْتُهُ ، وَلَيْسَ آخِرُ الْخَلْقِ بِأَعَزَّ عَلَيَّ مِنْ أَوَّلِهِ ، وَأَمَّا شَتْمُهُ إِيَّايَ ، فَقَوْلُهُ : اتَّخَذَ اللَّهُ وَلَدًا وَأَنَا اللَّهُ الأَحَدُ الصَّمَدُ ، لَمْ أَلِدْ وَلَمْ أُولَدْ ، وَلَمْ يَكُنْ لِي كُفُوًا أَحَدٌ.

2078. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Allah Elçisi ﷺ belə dedi: "Allah ﷻ buyurur: "Adəm oğlu Məni yalançı hesab edir. Halbuki ona (belə etmək) yaraşmaz. Habelə Adəm oğlu Məni təhqir edir.[1] Halbuki

[1] Müşriklər və kafirlər Allaha Ona layiq olmayan naqis sifətlər isnad etməklə Ona qarşı ədəbsizlik edirlər.

ona Məni təhqir etmək yaraşmaz. Onun Məni yalançı hesab etməsinə gəlincə, bu onun: "Allah məni ilk dəfə yaratdığı kimi yenidən yarada bilməz"- deməsidir. Mənim üçün məxluqatı ikinci dəfə yaratmaq birinci dəfə yaratmaqdan çətin deyil. Onun təhqirinə gəldikdə "Allah Özünə övlad götürmüşdür" deməsidir. Halbuki Mən Tək, Möhtac olmayan, doğmayan, doğulmayan və bənzəri olmayan Allaham".

٢٠٧٩ - أَخْبَرَنَا كَثِيرُ بْنُ عُبَيْدٍ ، قَالَ : حَدَّثَنَا مُحَمَّدُ بْنُ حَرْبٍ ، عَنِ الزُّبَيْدِيِّ ، عَنِ الزُّهْرِيِّ ، عَنْ حُمَيْدِ بْنِ عَبْدِ الرَّحْمَنِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَقُولُ : أَسْرَفَ عَبْدٌ عَلَى نَفْسِهِ حَتَّى حَضَرَتْهُ الْوَفَاةُ ، قَالَ لأَهْلِهِ : إِذَا أَنَا مُتُّ فَأَحْرِقُونِي ، ثُمَّ اسْحَقُونِي ، ثُمَّ اذْرُونِي فِي الرِّيحِ فِي الْبَحْرِ ، فَوَاللَّهِ لَئِنْ قَدَرَ اللَّهُ عَلَيَّ لَيُعَذِّبَنِّي عَذَابًا لاَ يُعَذِّبُهُ أَحَدًا مِنْ خَلْقِهِ ، قَالَ : فَفَعَلَ أَهْلُهُ ذَلِكَ ، قَالَ اللَّهُ عَزَّ وَجَلَّ لِكُلِّ شَيْءٍ أَخَذَ مِنْهُ شَيْئًا : أَدِّ مَا أَخَذْتَ ، فَإِذَا هُوَ قَائِمٌ ، قَالَ اللَّهُ عَزَّ وَجَلَّ : مَا حَمَلَكَ عَلَى مَا صَنَعْتَ ؟ قَالَ : خَشْيَتُكَ ، فَغَفَرَ اللَّهُ لَهُ.

2079. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: "Mən Allah Elçisinin ﷺ belə buyurduğunu eşitmişəm: "Həyatını boş keçirən bir bəndə ölüm ayağında olanda ailəsini yanına çağırıb dedi: "Mən öldükdə məni yandırarsınız. Sonra qalıqlarımı toz halına salıb küləkli bir gündə dənizə səpərsiniz! Allaha and olsun ki, əgər Allah məni diriltməyə qadir olarsa, mənə yaratdıqlarından heç bir kəsə verməddiyi əzabı verər". Ailəsi onun dediyi kimi etdi. (Qiyamət günü) Allah ﷻ həmin adamın külünün səpələndiyi yerlərə əmr edərək buyurur: "Aldıqlarınızı geri qaytarın!" O insan dirildikdən sonra Allah ﷻ buyurur: "Sən nəyə görə belə etmisən?" O: "Sənin qorxundan!" – deyir. Allah da onu bağışlayır".

٢٠٨٠ - أَخْبَرَنَا إِسْحَاقُ بْنُ إِبْرَاهِيمَ ، قَالَ : حَدَّثَنَا جَرِيرٌ ، عَنْ مَنْصُورٍ ، عَنْ رِبْعِيٍّ ، عَنْ حُذَيْفَةَ ، عَنْ رَسُولِ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : كَانَ رَجُلٌ مِمَّنْ كَانَ قَبْلَكُمْ يُسِيءُ الظَّنَّ بِعَمَلِهِ ، فَلَمَّا حَضَرَتْهُ الْوَفَاةُ قَالَ لأَهْلِهِ : إِذَا أَنَا مُتُّ فَأَحْرِقُونِي ، ثُمَّ اطْحَنُونِي ، ثُمَّ اذْرُونِي فِي الْبَحْرِ ، فَإِنَّ اللَّهَ إِنْ يَقْدِرْ عَلَيَّ لَمْ يَغْفِرْ لِي ، قَالَ : فَأَمَرَ اللَّهُ عَزَّ وَجَلَّ الْمَلاَئِكَةَ فَتَلَقَّتْ رُوحَهُ ، قَالَ لَهُ : مَا حَمَلَكَ عَلَى مَا فَعَلْتَ ؟ قَالَ : يَا رَبِّ ، مَا فَعَلْتُ إِلاَّ مِنْ مَخَافَتِكَ ، فَغَفَرَ اللَّهُ لَهُ.

2080. ...Huzeyfə ﷺ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Sizdən qabaq yaşayanlardan bir kişi etdiyi əməllər haqda pis zənnə düşərək ölüm ayağında olanda ailəsinə belə dedi: "Mən öləndə məni yandırın, qalıqlarımı toz halına salıb küləkli bir gündə dənizə səpin. Əgər Allah məni diriltməyə qadir olarsa, məni bağışlamayacaq". Allah ﷻ mələklərə əmr etdi və onun parçaları ruhu ilə birləşdi. Allah ona dedi: "Səni belə

etməyə nə vadar etdi?" O dedi: "Ey Rəbbim, yalnız Səndən qorxduğum üçün belə etdim!" Allah da onu bağışladı".

### ١١٨ - الْبَعْثُ

### 118-ci fəsil: Öldükdən sonra dirilmək

٢٠٨١ - وأَخْبَرَنَا قُتَيْبَةُ ، قَالَ : حَدَّثَنَا سُفْيَانُ ، عَنْ عَمْرٍو ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ قَالَ : سَمِعْتُ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ يَخْطُبُ عَلَى الْمِنْبَرِ يَقُولُ : إِنَّكُمْ مُلاَقُو اللَّهَ عَزَّ وَجَلَّ حُفَاةً عُرَاةً غُرْلاً.

2081. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Mən Allah Elçisinin ﷺ minbərin üzərində xütbə verərək belə buyurduğunu eşitmişəm: "Həqiqətən, siz Allahla ﷻ ayaqyalın, lüt və sünnət olunmamış halda qarşılaşacaqsınız".

٢٠٨٢ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ الْمُثَنَّى ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنْ سُفْيَانَ ، قَالَ : حَدَّثَنِي الْمُغِيرَةُ بْنُ النُّعْمَانِ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنْ ابْنِ عَبَّاسٍ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يُحْشَرُ النَّاسُ يَوْمَ الْقِيَامَةِ عُرَاةً غُرْلاً ، وَأَوَّلُ الْخَلاَئِقِ يُكْسَى إِبْرَاهِيمُ عَلَيْهِ السَّلاَمُ ، ثُمَّ قَرَأَ : **{كَمَا بَدَأْنَا أَوَّلَ خَلْقٍ نُعِيدُهُ}**.

2082. ...İbn Abbas ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Qiyamət günü insanlar lüt və sünnət olunmamış halda diriləcəklər. Yaradılanlar arasında ilk geyindiriləcək şəxs İbrahim ﵇ olacaq". Sonra Peyğəmbər ﷺ bu ayəni oxudu: **"Məxluqatı ilk dəfə yaratdığımız kimi yenə əvvəlki halına qaytaracağıq"**. (əl-Ənbiya, 104)".

٢٠٨٣ - أَخْبَرَنِي عَمْرُو بْنُ عُثْمَانَ ، قَالَ : حَدَّثَنَا بَقِيَّةُ ، قَالَ : أَخْبَرَنِي الزُّبَيْدِيُّ ، قَالَ : أَخْبَرَنِي الزُّهْرِيُّ ، عَنْ عُرْوَةَ ، عَنْ عَائِشَةَ ، أَنَّ رَسُولَ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : يُبْعَثُ النَّاسُ يَوْمَ الْقِيَامَةِ حُفَاةً عُرَاةً غُرْلاً ، فَقَالَتْ عَائِشَةُ : فَكَيْفَ بِالْعَوْرَاتِ ؟ قَالَ : **{لِكُلِّ امْرِئٍ مِنْهُمْ يَوْمَئِذٍ شَأْنٌ يُغْنِيهِ}**.

2083. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: "Qiyamət günü insanlar ayaqyalın, lüt və sünnət olunmamış halda diriləcəklər". Aişə dedi: "Onlar lüt olacaqlar?" Peyğəmbər ﷺ buyurdu: **"O gün onlardan hər birinin yetərincə işi olacaq".** (Abəsə, 37)".

٢٠٨٤ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، قَالَ : حَدَّثَنَا أَبُو يُونُسَ الْقُشَيْرِيُّ ، قَالَ : حَدَّثَنِي ابْنُ أَبِي مُلَيْكَةَ ، عَنِ الْقَاسِمِ بْنِ مُحَمَّدٍ ، عَنْ عَائِشَةَ ، عَنِ النَّبِيِّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ قَالَ : إِنَّكُمْ تُحْشَرُونَ حُفَاةً عُرَاةً ، قُلْتُ : الرِّجَالُ وَالنِّسَاءُ يَنْظُرُ بَعْضُهُمْ إِلَى بَعْضٍ ؟ قَالَ : إِنَّ الأَمْرَ أَشَدُّ مِنْ أَنْ يُهِمَّهُمْ ذَلِكَ.

2084. ...Aişə ﵂ rəvayət edir ki, Allah Elçisi ﷺ belə buyurdu: “Həqiqətən, siz ayaqyalın və lüt diriləcəksiniz”. Mən dedim: “Bəs kişilər və qadınlar bir-birinə baxmayacaqlar?” Allah Elçisi ﷺ dedi: “O gün elə qorxunc gündür ki, onları bu maraqlandırmayacaq”.

٢٠٨٥ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ عَبْدِ اللهِ بْنِ الْمُبَارَكِ ، قَالَ : حَدَّثَنَا أَبُو هِشَامٍ ، قَالَ : حَدَّثَنَا وُهَيْبُ بْنُ خَالِدٍ أَبُو بَكْرٍ ، قَالَ : حَدَّثَنَا ابْنُ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : يُحْشَرُ النَّاسُ يَوْمَ الْقِيَامَةِ عَلَى ثَلاَثِ طَرَائِقَ : رَاغِبِينَ رَاهِبِينَ ، اثْنَانِ عَلَى بَعِيرٍ ، وَثَلاَثَةٌ عَلَى بَعِيرٍ ، وَأَرْبَعَةٌ عَلَى بَعِيرٍ ، وَعَشْرَةٌ عَلَى بَعِيرٍ ، وَتَحْشُرُ بَقِيَّتَهُمُ النَّارُ تَقِيلُ مَعَهُمْ حَيْثُ قَالُوا ، وَتَبِيتُ مَعَهُمْ حَيْثُ بَاتُوا ، وَتُصْبِحُ مَعَهُمْ حَيْثُ أَصْبَحُوا ، وَتُمْسِي مَعَهُمْ حَيْثُ أَمْسَوْا.

2085. ...Rəvayət edilir ki, Əbu Hureyra ﵁ demişdir: “Allah Elçisi ﷺ belə buyurdu: “Qiyamət günü insanlar üç zümrəyə (bölünüb) məhşərə toplanılacaqlar: (birinci zümrə Allahın rəhmətinə) ümid bəsləyib (əzabından) qorxan kimsələr olacaq; (ikinci zümrə) iki-iki, üç-üç, dörd-dörd, on-on dəvələrə minib (həşr) olunacaqlar. Qalanlarını isə od məhşərə toplayacaq. Onlar dincəldikdə də, gecələdikdə də, səhərə çıxdıqda da, axşama çıxdıqda da od onlarla birlikdə olacaq”.

٢٠٨٦ - أَخْبَرَنَا عَمْرُو بْنُ عَلِيٍّ ، قَالَ : حَدَّثَنَا يَحْيَى ، عَنِ الْوَلِيدِ بْنِ جُمَيْعٍ ، قَالَ : حَدَّثَنَا أَبُو الطُّفَيْلِ ، عَنْ حُذَيْفَةَ بْنِ أَسِيدٍ ، عَنْ أَبِي ذَرٍّ قَالَ : إِنَّ الصَّادِقَ الْمَصْدُوقَ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ حَدَّثَنِي : أَنَّ النَّاسَ يُحْشَرُونَ ثَلاَثَةَ أَفْوَاجٍ : فَوْجٌ رَاكِبِينَ طَاعِمِينَ كَاسِينَ ، وَفَوْجٌ تَسْحَبُهُمُ الْمَلاَئِكَةُ عَلَى وُجُوهِهِمْ وَتَحْشُرُهُمُ النَّارُ ، وَفَوْجٌ يَمْشُونَ وَيَسْعَوْنَ يُلْقِي اللَّهُ الآفَةَ عَلَى الظَّهْرِ فَلاَ يَبْقَى ، حَتَّى إِنَّ الرَّجُلَ لَتَكُونُ لَهُ الْحَدِيقَةُ يُعْطِيهَا بِذَاتِ الْقَتَبِ لاَ يَقْدِرُ عَلَيْهَا.

2086. ...Rəvayət edilir ki, Əbu Zərr ﵁ demişdir: “Doğru danışan və doğruluğu təsdiq olunan Peyğəmbər ﷺ mənə belə dedi: “Qiyamət günü insanlar üç zümrəyə (bölünüb) məhşərə toplanılacaqlar: (birinci zümrə) minik üzərində tox və geyimli olacaqlar. Digər zümrə insanlar mələklər tərəfindən üzü üstə Cəhənnəmə süründürüləcəklər. Üçüncü zümrə isə iti yerişlərlə yeriyəcək. Allah onların mindikləri dəvələrə ölüm göndərəcək. Onlar dəvəsiz qalacaqlar. Onlardan birinin böyük bağçası olsaydı, dəvəni almaq üçün o bağçanı verərdi”.[1]

[1] Hədis zəifdir.

## ١١٩ - ذِكْرُ أَوَّلِ مَنْ يُكْسَى
## 119-cu fəsil: Qiyamət günü ilk geyindirilən

٢٠٨٧ - أَخْبَرَنَا مَحْمُودُ بْنُ غَيْلاَنَ ، قَالَ : أَخْبَرَنَا وَكِيعٌ ، وَوَهْبُ بْنُ جَرِيرٍ ، وَأَبُو دَاوُدَ ، عَنْ شُعْبَةَ ، عَنِ الْمُغِيرَةِ بْنِ النُّعْمَانِ ، عَنْ سَعِيدِ بْنِ جُبَيْرٍ ، عَنِ ابْنِ عَبَّاسٍ قَالَ : قَامَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ بِالْمَوْعِظَةِ فَقَالَ : يَا أَيُّهَا النَّاسُ ، إِنَّكُمْ مَحْشُورُونَ إِلَى اللهِ عَزَّ وَجَلَّ عُرَاةً ، قَالَ أَبُو دَاوُدَ : حُفَاةً غُرْلاً ، وَقَالَ وَكِيعٌ وَوَهْبٌ : عُرَاةً غُرْلاً ، **{كَمَا بَدَأْنَا أَوَّلَ خَلْقٍ نُعِيدُهُ}** قَالَ : أَوَّلُ مَنْ يُكْسَى يَوْمَ الْقِيَامَةِ إِبْرَاهِيمُ عَلَيْهِ السَّلاَمُ ، وَإِنَّهُ سَيُؤْتَى – قَالَ أَبُو دَاوُدَ : يُجَاءُ ، وَقَالَ وَهْبٌ وَوَكِيعٌ – : سَيُؤْتَى بِرِجَالٍ مِنْ أُمَّتِي فَيُؤْخَذُ بِهِمْ ذَاتَ الشِّمَالِ ، فَأَقُولُ : رَبِّ أَصْحَابِي ، فَيُقَالُ : إِنَّكَ لاَ تَدْرِي مَا أَحْدَثُوا بَعْدَكَ ، فَأَقُولُ كَمَا قَالَ الْعَبْدُ الصَّالِحُ : **{وَكُنْتُ عَلَيْهِمْ شَهِيدًا مَا دُمْتُ فِيهِمْ فَلَمَّا تَوَفَّيْتَنِي}** إِلَى قَوْلِهِ **{وَإِنْ تَغْفِرْ لَهُمْ}** الآيَةَ ، فَيُقَالُ : إِنَّ هَؤُلاَءِ لَمْ يَزَالُوا مُدْبِرِينَ ، قَالَ أَبُو دَاوُدَ : مُرْتَدِّينَ عَلَى أَعْقَابِهِمْ مُنْذُ فَارَقْتَهُمْ.

2087. ...Rəvayət edilir ki, İbn Abbas ﵄ demişdir: "Allah Elçisi ﷺ xütbədə belə buyurdu: "Ey insanlar! Siz Allahın ﷻ hüzuruna lüt olaraq gələcəksiniz". Əbu Davud dedi: "Lüt və sünnət olunmamış". Vəki və Vəhb isə dedilər: **"Məxluqatı ilk dəfə yaratdığımız kimi yenə əvvəlki halına qaytaracağıq"**. (əl-Ənbiya, 104) ayəsində olduğu kimi "lüt və sünnət olunmamış". "Qiyamət günü paltar geyindirilən ilk şəxs İbrahim ﵇ olacaq. Ümmətimdən bir qismi gətiriləcək. (Əbu Davud "gələcək", Vaki və Vəhb isə "gətiriləcək" dedilər) və sorğu-sualı sol tərəfdən edilənlərin arasına atılacaq. Mən deyəcəm: "Onlar mənim səhabələrimdir!" Mənə deyiləcək: "Sən onların aralarından ayrıldıqdan sonra onların nələr etdiklərini bilmirsən!" Mən də əməlisaleh qul İsa dediyi kimi deyəcəm: **Mən onlara ancaq Sənin mənə əmr etdiyini: "...Nə qədər ki, onların arasında idim, mən onlara şahid idim. Sən məni onların arasından götürdükdən sonra isə onlara nəzarət edən Özün oldun. Sən hər şeyə şahidsən. Əgər onlara əzab versən, sözsüz ki, onlar Sənin qullarındır. Əgər onları bağışlasan, şübhəsiz ki, Sən Qüdrətlisən, Müdriksən!"** (əl-Maidə, 117-118). Mənə deyiləcək: "Sən onların aralarından ayrılan kimi onlar geriyə dönərək dindən çıxdılar". Ravi Əbu Davud deyir: "Sən onların aralarından ayrılan kimi onlar geriyə dönərək mürtəd oldular".

## ١٢٠ - فِي التَّعْزِيَةِ
## 120-ci fəsil: Cənazə yiyəsinə təziyə etmək (başsağlığı vermək)

٢٠٨٨ - أَخْبَرَنَا هَارُونُ بْنُ زَيْدٍ وَهُوَ ابْنُ أَبِي الزَّرْقَاءِ ، قَالَ : حَدَّثَنَا أَبِي ، قَالَ : حَدَّثَنَا خَالِدُ بْنُ مَيْسَرَةَ ، قَالَ : سَمِعْتُ مُعَاوِيَةَ بْنَ قُرَّةَ ، عَنْ أَبِيهِ ، قَالَ : كَانَ نَبِيُّ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ إِذَا جَلَسَ يَجْلِسُ إِلَيْهِ نَفَرٌ مِنْ أَصْحَابِهِ ، وَفِيهِمْ رَجُلٌ لَهُ ابْنٌ صَغِيرٌ يَأْتِيهِ

مِنْ خَلْفِ ظَهْرِهِ ، فَيُقْعِدُهُ بَيْنَ يَدَيْهِ ، فَهَلَكَ فَامْتَنَعَ الرَّجُلُ أَنْ يَحْضُرَ الْحَلْقَةَ لِذِكْرِ ابْنِهِ ، فَحَزِنَ عَلَيْهِ ، فَفَقَدَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَقَالَ : مَالِي لاَ أَرَى فُلاَنًا ؟ قَالُوا : يَا رَسُولَ اللهِ ، بُنَيُّهُ الَّذِي رَأَيْتَهُ هَلَكَ ، فَلَقِيَهُ النَّبِيُّ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ فَسَأَلَهُ عَنْ بُنَيِّهِ ، فَأَخْبَرَهُ أَنَّهُ هَلَكَ ، فَعَزَّاهُ عَلَيْهِ ، ثُمَّ قَالَ : يَا فُلاَنُ ، أَيُّمَا كَانَ أَحَبُّ إِلَيْكَ أَنْ تَمَتَّعَ بِهِ عُمُرَكَ ، أَوْ لاَ تَأْتِي غَدًا إِلَى بَابٍ مِنْ أَبْوَابِ الْجَنَّةِ إِلاَّ وَجَدْتَهُ قَدْ سَبَقَكَ إِلَيْهِ يَفْتَحُهُ لَكَ ، قَالَ : يَا نَبِيَّ اللهِ ، بَلْ يَسْبِقُنِي إِلَى بَابِ الْجَنَّةِ فَيَفْتَحُهَا لِي لَهُوَ أَحَبُّ إِلَيَّ ، قَالَ : فَذَاكَ لَكَ.

2088. ...Muaviyə ibn Qurra atasının ﷺ belə dediyini rəvayət etmişdir: “Bir məclisdə Peyğəmbər ﷺ olarkən səhabələrindən bir neçə nəfər də orada olardı. Onların arasında balaca oğlunu kürəyində gətirib önündə otuzduran bir kişi vardı. Onun uşağı vəfat etdi. O, uşağını xatırlayıb məclisin ahəngini pozmaq qorxusuna görə söhbətlərə gəlmədi. Peyğəmbər ﷺ onu görmədikdə dedi: “Filankəsə nə olub, onu görmürəm?” Səhabələr dedilər: “Ey Allahın Elçisi, yanında gördüyün oğlu vəfat edib”. Allah Elçisi ﷺ o adamı tapıb ondan uşağını soruşdu, o da öldüyünü dedi. Allah Elçisi ﷺ ona təziyə etdi və belə buyurdu: “Ey filankəs, yaşadığın müddətdə ondan faydalanmağın yaxşıdır, yoxsa Qiyamət günü Cənnətin qapılarından bir qapıya gəldikdə uşağının səndən qabaq orada səni gözləməyi və qapını sənə açmağı?” O dedi: “Ey Allahın Peyğəmbəri, əlbəttə, məndən qabaq Cənnət qapısını mənə açması mənim üçün daha sevimlidir”. Peyğəmbər ﷺ dedi: “Elə belə də olacaq”.

## ١٢١ - نَوْعٌ آخَرُ
## 121-ci fəsil: Başqa növ

٢٠٨٩ - أَخْبَرَنَا مُحَمَّدُ بْنُ رَافِعٍ ، عَنْ عَبْدِ الرَّزَّاقِ ، قَالَ : حَدَّثَنَا مَعْمَرٌ ، عَنْ ابْنِ طَاوُوسٍ ، عَنْ أَبِيهِ ، عَنْ أَبِي هُرَيْرَةَ قَالَ : أُرْسِلَ مَلَكُ الْمَوْتِ إِلَى مُوسَى عَلَيْهِ السَّلاَمُ ، فَلَمَّا جَاءَهُ صَكَّهُ ، فَفَقَأَ عَيْنَهُ ، فَرَجَعَ إِلَى رَبِّهِ ، فَقَالَ : أَرْسَلْتَنِي إِلَى عَبْدٍ لاَ يُرِيدُ الْمَوْتَ ، فَرَدَّ اللَّهُ عَزَّ وَجَلَّ إِلَيْهِ عَيْنَهُ ، وَقَالَ : ارْجِعْ إِلَيْهِ ، فَقُلْ لَهُ يَضَعُ يَدَهُ عَلَى مَتْنِ ثَوْرٍ ، فَلَهُ بِكُلِّ مَا غَطَّتْ يَدُهُ بِكُلِّ شَعْرَةٍ سَنَةٌ ، قَالَ : أَيْ رَبِّ ، ثُمَّ مَهْ ؟ قَالَ : الْمَوْتُ ، قَالَ : فَالآنَ ، فَسَأَلَ اللَّهَ عَزَّ وَجَلَّ أَنْ يُدْنِيَهُ مِنَ الأَرْضِ الْمُقَدَّسَةِ رَمْيَةً بِحَجَرٍ ، قَالَ رَسُولُ اللهِ صَلَّى اللهُ عَلَيْهِ وَسَلَّمَ : فَلَوْ كُنْتُ ثَمَّ ، لأَرَيْتُكُمْ قَبْرَهُ إِلَى جَانِبِ الطَّرِيقِ تَحْتَ الْكَثِيبِ الأَحْمَرِ.

2089. ...Rəvayət edilir ki, Əbu Hureyra ﷺ demişdir: “Ölüm mələyi Musanın ﷺ yanına göndərildi. Mələk Musanın yanına gəldikdə, Musa onu vurdu və onun gözü çıxdı. Mələk Rəbbinin yanına qayıdıb dedi: “Sən məni ölmək istəməyən bir bəndənin yanına göndərmisən”. Allah ﷻ onun gözünü yerinə qaytardı və buyurdu: “Qayıt ona de: “Əlini öküzün belinə qoysun.

Əlinə gələn tüklərin sayı qədər hər bir tükün müqabilində ömrü bir il artacaq”. Musa dedi: “Ey Rəbbim, sonra nə olacaq?” Allah buyurdu: “Sonra öləcəksən”. Musa dedi: “Elə isə indi (ölmək istəyirəm)”. Sonra da Allahdan ﷻ onu atılmış bir daşın uçub düşdüyü məsafə qədər müqəddəs torpağa yaxınlaşdırmasını dilədi”. Allah Elçisi ﷺ dedi: “Əgər orada olsaydım, sizə onun yolun kənarında, qırmızı qum təpəsinin altında (yerləşən) qəbrini göstərərdim”.

Allahın yardımı ilə ikinci cildi bitirdik.
Müvəffəqiyyət Allahdandır!
Həmd aləmlərin Rəbbi Allaha məxsusdur!

## Kitabda keçən bəzi terminlərin izahı

| | |
|---|---|
| Amin | Allahım, dualarımızı qəbul et! |
| Cənabət halı, cənabətli olmaq, cünub olmaq | cinsi yaxınlıqdan və ya məninin şəhvətlə çıxmasından sonra qüsl alana qədər olan hal |
| Ehram | həcc və ümrə edənlərin özlərini iki ağ parça ilə örtdükləri geyim |
| Fəcr | dan yeri sökülən vaxt, Sübh namazının daxil olduğu vaxt |
| Heyz | həddi-büluğa çatmış qızlarda, həmçinin qadınlarda hər ay uşaqlıqdan qan ifrazı halıdır; buna adət, aybaşı, analıq halı da deyirlər. |
| Hims və ya Homs | Suriyada şəhər, Dəməşq şəhərindən təqribən 160 km şimalda yerləşir |
| İzar | qurşaqdan aşağı bədən əzalarını örtmək üçün belə bağlanan parça və ya fitədir. |
| Qiraət | namaz qılanda və ya digər vaxtlarda Qurani-Kərimin oxunması |
| Qiyam | namaz qıldıqda ayaq üstə durmaq |
| Qövm | toplum |
| Ləhd | Bu formada olan qəbirdə qiblə tərəfdəki divarda meyiti qoymaq üçün oyuq hissə, yer açılır. |
| Məni | cinsi yaxınlıq zamanı kişinin cinsiyyət üzvündən çıxan sperma |
| Mina | Mina - Həcc ziyarətinə gedən zəvvarlar Zil-Hiccə ayının 10-dan 12-dək Məkkənin yaxınlığında yerləşən “Mina” adlı vadidə qalırlar. Həcc ziyarətinin rükünlərindən olan böyük, orta və kiçik cəmərələrə daş atma, eləcə də Qurban bayramına aid əməllər burada yerinə yetirilir. |
| Misvak | ərak ağacından ağızı və dişləri təmizləmək üçün düzəldilmiş təbii fırça. Misvakla ağız və dişlər təmizlənir. |
| Müfəssəl surələr | Quranın “Qaf” surəsindən “ən-Nas” surəsinədək olan surələrə “müfəssəl surələr” deyilir |
| Muavvizat | əl-Fələq və ən-Nəs surələrinin ümumiləşmiş adı |
| Musallə | namazgah. Peyğəmbər ﷺ adətən bayram namazlarını, günəşin və ayın tutulması namazlarını, yağışın yağması üçün qılınan namazı məsciddə deyil, camaatı yığaraq açıq yerdə qılardı. |

| | |
|---|---|
| Nafilə | Vacib olan beş namazdan başqa könüllü olaraq qılınan namazlar |
| Nəşid | avaz ilə deyilən şeirdir. Müasir nəşidlər isə İslam alimlərinə görə dinə gətirilmiş yenilikdir. |
| Pollusiya | yuxuda ikən qeyri-ixtiyari olaraq məninin, yəni spermanın ifraz olması |
| Ravi | hədisi rəvayət edənlər zəncirində olan rəvayətçilər |
| Rida | qurşaqdan yuxarı bədən əzalarını örtmək üçün çiyinə atılan parça |
| Saa | qədim ölçü vahidi bir saa təxminən 2 kilo 800 qram edir. |
| Şəqq | bu formada olan qəbirdə orta hissədə meyitin qoyulması üçün açılan yer. |
| Tavarruk | üç və dörd rükətli vacib (fərz) namazların son rükətlərindəki təşəhhüd oturuşunda sağ ayağı dik tutaraq ayaq barmaqlarını qıbləyə yönəltmək, sol ayağı sağ ayağın baldırının altına salaraq yanı yerə qoymaqdır. Qeyd edək ki, tavarruk oturuşunun bir neçə forması var. |
| Təsbih | zikr etmək, həmçinin "Subhən-Allah" zikrinə də təsbih deyilir. |
| Təzək | iribuynuzlu mal-qaranın qurumuş peyini |

# Mündəricat

**Azərbaycan Demokratik Respublikasının 1919-cu ildə Paris Sülh Konfransında Beynəlxalq cəmiyyət tərəfindən qəbul edilmiş xəritəsi**



**Azərbaycan SSR, 1920-ci il, 28 aprel-noyabr ayları, müəllif: A. A. Mamedov**



**Azərbaycan SSR, 1921-1922, müəllif A. A. Mamedov**



